Mais Əmrah, Məhsəti Maisqızı

# ŞƏKİDƏ TƏHSİL

## Tarix, inkişaf yolu



***MAİS ƏMRAH***
***MƏHSƏTİ MAİS QIZI***

# ŞƏKİDƏ TƏHSİL:
# TARİX, İNKİŞAF YOLU

**Bakı — 2015**

***AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutu Elmi Şurasının qərarı ilə çap olunur***

**Elmi redaktoru:** **T.H.MUSAYEVA,**
*Azərbaycan Respublikası Dövlət Mükafatı laureatı, əməkdar elm xadimi, tarix üzrə elmlər doktoru, professor*

**Redaktoru:** **S.M.MUSTAFAYEVA**,
*tarix üzrə fəlsəfə doktoru, dosent*

**Rəyçilər:** **F.A. RÜSTƏMOV,**
*Əməkdar elm xadimi, pedaqogika üzrə elmlər doktoru, professor*
**M.M.ƏMİROV,**
*pedaqogika üzrə elmlər doktoru, professor*
**Ə.M. MƏMMƏDOV,**
*tarix üzrə elmlər doktoru, professor*

**Mais Əmrah., Məhsəti Mais qızı**. **ŞƏKİDƏ TƏHSİL: tarix, inkişaf yolu.** Bakı-2014. 522 səh, şək.

***Kitab üzərində işləmişlər:***
***Ön söz, I, II, IV, VI fəsillər – M.Əmrah, III, V fəsillər – Məhsəti Mais qızı***

Kitabda Nuxanın (Şəkinin) tarixinə qısa nəzər salınmış, ilk qəza məktəbinin açılması və inkişafı, bu məktəblərdə təhsil alan gənclər və onların sonrakı taleyi, Nuxanın (Şəkinin) əməkdar müəllimləri və Şəki təhsilinin yetirmələri haqqında biobiblioqrafik məlumatlar yer almışdır. Kitabda Şəki təhsilinin XX əsr tarixinə xüsusi yer ayrılmış, ümumtəhsil, texniki peşə, orta ixtisas və ali təhsil müəssisələri haqqında məlumat verilmiş, müstəqillik illərində Şəkidə təhsilin inkişafı sahəsində həyata keçirilən tədbirlər və onların nəticələri işıqlandırılmışdır.

Kitab geniş oxucu auiditoriyası üçün nəzərdə tutulmuşdur. Ondan ümumtəhsil, texniki peşə, orta ixtisas və ali təhsil müəssisələrinin müəllimləri, həmçinin təhsil tarixi ilə məşğul olanlar faydalana bilərlər.

$$© \frac{1947216814}{1957(H)201400} - 2014$$

**© M.Əmrah, 2014**
**© M.Mais qızı, 2014**



**Azərbaycanın hər bir gənci öz xalqının, millətinin qədim zamanlardan indiyə qədər olan tarixini gərək yaxşı bilsin. Əgər bunu bilməsə, o, həqiqi vətəndaş ola bilməz. Əgər bunu bilməsə, o millətini qiymətləndirə bilməz.**

***Heydər Əliyev***
***Ümummilli lider***



**Biz maddi dəyərlərimizi, iqtisadi potensialımızı insan kapitalına çevirməliyik. Çünki insanın savadı, biliyi onun gələcək həyatını müəyyən edir, ölkənin hərtərəfli inkişafına xidmət edir və beləliklə, ölkənin intellektual potensialı da möhkəmlənir.**

***İlham Əliyev***
***Azərbaycan Respublikasının Prezidenti***

# MÜNDƏRİCAT

# YURD SEVGİSİ İLƏ HAZIRLANMIŞ YADDAŞ KİTABIMIZ

Əziz oxucu! «**Şəkidə təhsil: tarix, inkişaf yolu**» kitabını vərəqləyərək səni düşünür, ulu tariximizə, mərd oğullarımızın həyat tarixçəsinə-bir sözlə, dünənimizə və bu günümüzə həsəd aparıram. Sizə təqdim olunan kitab bu vaxta qədər tədqiqatçıların çox az hallarda müraciət etdiyi bir mövzuya-təhsil tarixinə həsr olunmuşdur. Kitabın önəm kəsb edən cəhətlərindən biri bölgə təhsili tarixinin işlənməsidir. Etiraf edək ki, kitabdakı fakt və məlumatlarla, Şəkidə doğulub boya-başa çatmış görkəmli şəxsiyyətlərin tərcümeyi-halı ilə tanış olduqca qürur hissi keçirdik. Əslində müəlliflər bu kitab üzərində işləməklə oxucunu təəccübləndirməyi qarşısına məqsəd qoymamışdır. Sadəcə bir qrup ziyalıları Sizə yenidən tanıtmaqla demək istəmişlər ki, ey vətən övladı, Nuxanın (Şəkinin) bizə məlum olan 3 min ildən artıq tarixində minlərlə igid vətən oğulları yetişmiş, tarixdə iz qoymuş ziyalılarımız nəinki bir bölgənin, bütövlükdə Azərbaycanımızın tərəqqisi yolunda fədakarlıqla çalışmış, hətta repressiyaya məruz qalmışlar.

**«Şəkidə təhsil: tarix, inkişaf yolu»** kitabını sadəcə təhsil məsələlərinə həsr olunmuş kitab hesab etmək düzgün olmazdı. Oxucu kitabda onu maraq landıran hər bir suala cavab tapa biləcəkdir. Ən önəmlisi odur ki, kitabın hər sətri yurd sevgisi ilə yazılıb. Odur ki, kitabı diqqətlə oxuyun, o sadəcə təhsil tarixi deyil, yaddaş kitabımızdır. Yaddaşınız möhkəm, torpaq sevginiz tükənməz olsun.

Dəyərli həmvətənlərimiz, kitabla ilə tanış olarkən Siz **Nuxa, Nuxa (Şəki) və Şəki** yazılışına rast gələcəksiniz. Məlumdur ki, bölgə qədim zamanlarda Şəki, 1841-ci ildən sonra Nuxa, 1968-ci ildən sonra Şəki adlanıb. Odur ki, müəlliflər bölgənin adını zamanında necə olubsa, eləcə də yazmağa çalışıblar. Adın qoşa işlənməsi isə qəzanın əhatə etdiyi məntəqələri fərqləndirmək məqsədi daşıyıb. Məsələn, ***Nuxa (Şəki), Nuxa (Xaçmaz), Nuxa (Qəbələ)*** və s.

Kitabdakı fotoların əksəriyyəti arxivlərdən, dost-tanışdan, bəzən də təsadüf nəticəsində əldə olunmuşdur və ilk dəfədir ki, çap olunur. Kitabda verilən fotolarda əksi olan insanların bir hissəsini müəlliflər tanımasalar da, siz tanıyacaqsınız, bəlkə də, onlar sizin yaxınlarınız, qohumlarınız, dost-tanışlarınızdır. Onların fotolarının evinizdə olmamasında təəccüblü heç nə yoxdur. Onda nə üçün onları bir daha xatırlamayaq, fotolarını böyüdərək evimizin fəxri yerlərinə qoymayaq. Axı, bu fotolar sizin əzizlərinizindir. Elə isə yaddaşınızın bir hissəsi olan fotolara diqqətlə baxın. İmkan daxilində onlar haqqında müəlliflərə

məlumat verin ki, gələcək tədqiqatlarda onlara yardımçı olsun. Tanrı Sizin də yardımçınız olsun!

**Şəki** Azərbaycanın dövlətçilik tarixində xüsusi yeri olan bir bölgədir. Azərbaycan müstəqillik əldə etdikdən sonra Şəkidə də həyatın bütün sahələrində köklü dəyişikliklər baş vermiş, yeni istehsal sahələri istifadəyə verilmiş, bölgə əhalisinin həyat şəraitinin yaxşılaşdırılması sahəsində əməli tədbirlər həyata keçirilmişdir.

Son 20 ilin təhlili göstərir ki, Azərbaycan xalqı əsası ümummilli lider Heydər Əliyev tərəfindən qoyulmuş xalqın maddi rifah halının yaxşılaş dırılmasına yönələn siyasət Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev tərəfindən müvəffəqiyyətlə davam etdirilir. Müstəqillik illərində respublikada həyata keçirilmiş islahatlardan biri də, təhsilin dünya standartları səviyyəsinə qaldırılması, təhsildə İnformasiya Kommunikasıya Texnologiyalarının tətbiqi, XXI əsrdə yaşayacaq yeni nəslin yetişdirilməsi təşkil etmişdir. «Yeniləşən Azərbaycana yeni məktəb» proqramı əsasında son illərdə H.Əliyev Fondunun prezidenti Mehriban xanım Əliyevanın təşəbbüsü və bilavasitə rəhbərliyi altında həyata keçirilən tədbirlər, xüsusilə məktəbəqədər tərbiyə müəssisələrinin və ümumtəhsil məktəblərinin dünya standartları səviyyəsində inşa olunaraq istifadəyə verilməsi bu sahədə əldə edilən ən yüksək nailiyyətlər sırasındadır.

Bu gün Azərbaycan cəmiyyətində bütün sahələrdə olduğu kimi, təhsildə də keyfiyyət dəyişiklikləri baş verir və özünün ictimai, iqtisadi və mədəni xarakteri ilə daha dərin köklərə malik olduğunu göstərir. Azərbaycanın əvəzolunmaz tarixi ənənələri, xüsusən ümummilli lider Heydər Əliyevin ötən əsrin 70-ci illərindən Azərbaycanda formalaşdırdığı zəngin tarixi irs müasirliyimizin, bu günkü təhsil sisteminin özülünü təşkil edir. Ümummilli liderin «Təhsil millətin gələcəyidir» fikri təhsil sahəsində çalışan hər bir şəxs üçün fəaliyyət proqramına çevrilmişdir.

Azərbaycan təhsilinə göstərilən qayğı təkcə məktəb binalarının tikintisi ilə məhdudlaşmamış, hər ilin yekunlarına görə təhsil işçilərinin əməyinin qiymətləndirilməsi, pedaqoji kadrlar hazırlığı sahəsində qəbul olunan proqramlar, yeni «Təhsil Qanunu» nun qəbul edilməsi və Azərbaycan təhsili tarixinə qayğının nəticəsi olan qocaman məktəblərin yubileylərinin keçirilməsi ənənə halını almışdır. 2010-cu ilin dekabr ayında Şuşa məktəbinin 180 illiyinin təntənə ilə qeyd edilməsi bir daha göstərdi ki, Azərbaycan təhsili Azərbaycan Respublikasının Rrezidenti İlham Əliyevin daim diqqət mərkəzindədir.

Azərbaycanda fəaliyyətə başlayan ilk qəza məktəblərindən biri də, **1831-ci ilin dekabr ayının 30-da Nuxada** (indiki Şəki) açılmışdır. Məktəbin 150 illiyi 1982-ci ilin sentyabrında təntənə ilə qeyd olunmuş, yubiley münasibətilə «Böyüməkdə olan nəslin təlim və tərbiyəsində xidmətlərinə görə və yaradılmasının 150 illiyi ilə əlaqədar olaraq» Şəki şəhərindəki 5 nömrəli ümumtəhsil məktəbi Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin **Fəxri fərmanı** ilə təltif edilmişdir. Məktəbin müəllimləri **Axundova Diləfruz Baxşəli qızı** və **Hü-**

**seynova Ruqiyyə Rza qızına «Azərbaycan SSR əməkdar müəllimi»** fəxri adı verilmiş**, Ağamirzəyeva Mənsurə Cəlil qızı** və **Əhmədova Zeynəb Şirəli qızı Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri fərmanı ilə** təltif olunmuşlar.

2011-ci ilin dekabr ayında Nuxa qəza məktəbinin fəaliyyətə başlamasının 180 illiyi tamam olmuşdur. Бu qocaman təhsil ocağının yubileyi ilə əlaqədar tədbilər keçirilmişdir.

Oxuculara təqdim olunan «**Şəkidə təhsil: tarix, inkişaf yolu**» kitabında Nuxanın (Şəkinin) tarixinə qısa nəzər salınmış, ilk qəza məktəbinin açılması və inkişafı, bu məktəblərdə təhsil alan gənclər və onların sonrakı taleyi, əməkdar müəllimlər və Şəki təhsilinin yetirmələri haqqında biobiblioqrafik məlumatlar yer almışdır. Kitabda Şəki təhsilinin XX əsr tarixinə xüsusi yer ayrılmış, ümumtəhsil, texniki peşə, orta ixtisas və ali təhsil müəssisələri haqqında məlumat verilmiş, müstəqillik illərində Şəkidə təhsilin inkişafı sahəsində həyata keçirilən tədbirlər və onların nəticələri işıqlandırılmışdır.

Kitabın müəllifləri *(müəlliflərdən olan Məhsəti Mais qızı Nuxa qəza məktəbinin varisi olan 5 nömrəli məktəbin məzunudur)* respublikanın pedaqoji ictimaiyyətinə Azərbaycanın gələcək qurucuları olacaq yeni nəslin yetişdirilməsində müvəffəqiyyətlər arzulayırlar. Müəllimlərimiz yaddan çıxarmamalıdırlar ki, ümummilli lider Heydər Əliyevin dediyi kimi, ***«Azərbaycanın hər bir gənci öz xalqının…tarixini yaxşı bilməlidir. Əks halda, o, həqiqi vətəndaş ola bilməz, millətini qiymətləndirə bilməz».*** Bu baxımdan hər bir Azərbaycan müəlliminin və məktəblisinin qarşısında çox mühüm vəzifələr durur. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin dediyi kimi, qarşıda duran vəzifələrdən biri də, «***…ondan ibarətdir ki, Azərbaycanda insan kapitalına qoyulan sərmayə gündən-günə artsın…yeni orta məktəblərin, ali məktəblərin yaradılması bir məqsəd güdür ki, Azərbaycanda təhsilin səviyyəsi bizi qane edən səviyyəyə qalxsın...*»**.** Hesab edirik ki, təhsil işçiləri bu vəzifələrin həyata keçirilməsi üçün qüvvə və bacarıqlarını əsirgəməyəcəklər.

Müəlliflər kitabın ərsəyə gəlməsində göstərdikləri köməyə görə Azərbaycan Respublikası Təhsil Nazirliyinin Xalq Təhsili Muzeyinin direktoru Lalə Bayramova, sabiq fond müdiri Aliyə Abbasova, ekspozisiya şöbəsinin müdiri Qaratel Qafarova, AMİ-nin Şəki filialının əməkdaşları Gülnarə Abdurahmanova və Şəhla Əsgərova, Şəki ŞTŞ-nin müdiri Südabər İsmayılovaya, metodik kabinetin direktoru Firəngiz İbrahimova, inspektorlar Qalib Məmmədov, Mais Müslümov, Bəhyəddin Qüvvətov, metodistlər Məmməd Qədirov, Abdurahman Məmmədov və Rəşad Rəşidova-bir sözlə, əməyi keçən hər kəsə minnətdarlıq edirlər.

Kitab geniş oxucu auiditoriyası üçün nəzərdə tutulmuşdur. Ondan ümumtəhsil, texniki peşə, orta ixtisas və ali təhsil müəssisələrinin müəllimləri, həmçinin təhsil tarixi ilə məşğul olanlar faydalana bilərlər.

# I FƏSİL

# QƏDİM SAK YURDUNUN YADDAŞ KİTABINDAN SƏTİRLƏR

*Nadir bir irsin varisləriyik. Hər bir Azərbaycan vətəndaşı bu irsə layiq olmağa çalışaraq böyük bir tarixi keçmişi, zəngin mədəniyyəti, yüksək mənəviyyatı olan ölkəmizin həm dünəninə, həm də gələcəyinə dərin bir məsuliyyət hissi ilə yanaşmalıdır…*

***Heydər Əliyev***
***Ümummilli lider***

*«Şəki qədim olduğu qədər də çox gözəl diyardır, ...zəngin və füsünkar təbiəti vardır...»*

***İlham Əliyev***
***Azərbaycan Respublikasının Prezidenti***



***Şəkinin əzəmətli giriş qapıları***

***Şəki*** Qafqaz Albaniyasının ən qədim şəhərlərindən biridir. Hələ qədim zamanlardan Azərbaycan ərazisində yerli soylarla yanaşı, uzaq yerlərdən, xüsusilə Mərkəzi Asiyadan köçüb gəlmiş soylar da yaşamışlar.[1] Belə tayfalardan biri **skif - saklardır (saqalardır).** [2]

«E.ə.VII əsrin əvvəllərində kimmer-skit dalğaları ilə Ön Asiyaya düşmüş sak tayfaları Albaniyanın ərazisində məskən salmışlar. Onlar Albaniyada, Kür çayının sağ sahilindən (Kür-Araz qovşağı daxil olmaqla) Qafqaz dağətəklərinə qədərki ərazini tuturdular. Burada onlar sakasin (şakaşin–türkcə «saka bənzər», «saka oxşar», yaxud «sak adamı, sak tayfası») adı altında məlum idilər. Albaniyanın ərazisində sak//şak etnonimi erkən orta əsr Şakaşen (qədim Sakasena) vilayətinin və Şəki (tarixən Şaki) şəhərinin adında yaşayır.[3] Bu baxımdan, Murad Acinin yazdığı «heç bir ölkədə türk adət-ənənələri Azərbaycanda olduğu qədər güclü olmamışdır» fikri özünü doğruldur.

*Kimdir saklar*? Saka etnonimi qaynaqlarda ***ş a k a*** kimi də yazılır. Çin mənbələrində sakların adı ilk dəfə təxminən e.ə. VI əsrin sonunda, 514 və ya 512-ci ildə çəkilir. Bu adı Çin tarixçiləri «San» və yaxud «San-vanq» kimi işlətmişlər. Yunan və İran mənbələrində «sak» adı eramızdan əvvəl VI əsrdən başlayaraq çəkilir.

Strabon yazırdı ki, skitlər eyni zamanda **sak** adlanırdılar. Assur mixi yazılarında ilk dəfə sak adı e.ə. VII əsrin ortalarına aiddir, sonra isə Bisutun qaya yazılarında çəkilmişdir**.**

Qədim hind qaynaqlarında da sakların adına rast gəlinir. Hind mənbələrinə görə, saklar e.ə. 150-100-cü illərdə bu ölkəyə gəlmiş və burada məskunlaşmışlar.

Qaynaqların verdiyi məlumatlara görə, skit-saklar köçəri həyat sürdüklərinə görə tez-tez məkanlarını dəyişmişlər. Əldə olunan ilk məlumatlara görə, bu tayfalar Ön Asiyada yaşamış, e.ə.VIII əsrin əvvəllərindən başlayaraq onların

köçü baş vermiş, dünyanın bir çox ölkələrinə, habelə Azərbaycana gələrək bu yerlərdə məskunlaşmışlar. Herodot təsdiq edir ki, təxminən eramızdan əvvəl VIII əsrin ikinci yarısında baş vermiş bu axın nəticəsində onlar Araz çayının sahillərinə qədər axışıb gəlmişlər. [4]

Roma tarixçisi Plini I əsrdə yazırdı: «Yaksartda (Sırdərya) skif tayfaları yaşayır. Farslar onları ***s a k*** adlandırırlar. Bu tayfalardan ən məşhurları saklar, massagetlər… və s.-dir».[5] Yunan coğrafiyaşünası Strabon (I əsr) qeyd etmişdir ki, saklar Soqdadan şərqdə yaşamışlar. Sırdəryanın şimal hissəsində yaşayan saklar isə yunan mənbələrində ***skiflər*** kimi göstərilmişdir.

Skiflər (sakalar) Qərbi Azərbaycanda, Urmiya gölünün qərbində və şimalında, hətta Manna dövlətinin ayrı-ayrı vilayətlərində də məskən salmışlar. Ehtimala görə, kimmer tayfaları da Manna dövlətinin ərazisinə gəlmişlər.

Sakların başlıca peşəsi maldarlıq olmuşdur. Onlar e.ə. II minillikdə və daha qədim dövrdə Orta Asiya, Sayan-Altay dağlarının şimal-qərbində, Yenisey çayı sahillərində mal-qaralarını, qoyun sürülərini, at ilxılarını saxlamışlar.

E.ə. II minilliyin sonu - I minilliyin birinci yarısında türklərin axını və ya yerdəyişmələri daha geniş ərazidə baş vermişdir. Onların bir hissəsi Altaydan Şərqə doğru yayılmış, bir qolu isə Uralı aşaraq Volqa çayı sahillərinə və oradan da Qərbə doğru getmişlər. Sakların böyük bir hissəsi Qara dənizin şimal bölgələrində məskunlaşmışlar. Bu barədə yunan mənbələrində məlumat vardır. Arxeoloqlar bu yerlərdə qazıntı işləri apararkən e.ə. VI-III əsrlərə aid xeyli skif kurqanları aşkar etmişlər.

Kimmer və sakların Azərbaycanda məskunlaşmasını bu ərazidəki toponomik adlar da təsdiqləyir. Məlumdur ki, Gəncə-Qazax bölgəsi qədim qaynaqlarda: yunanlarda ***Sakasena***, erməni mənbələrində ***Şakaşena*** adlandırılmışdır. Bu sakların e. ə. 8-7-ci yüzillikdə Altaydan qərbə doğru əvvəlcə Orta Asiyaya, oradan Qara dənizin şimal sahillərinə, sonra bir qismi Xəzərin cənubuna, Ön Asiyaya və e.ə. 673-cü ildə Azərbaycana axın etmələrindən irəli gəlir. Qaynaqlara görə, onların bir qismi Gəncə-Qazax bölgəsində bir çarlıq yaratmışlar. Musa Kalankatlının yazdığı **«Gəncə Şakaşenada meydana gəlmişdir**»[6] ifadəsi də bunu təsdiqləyir.




*Qafqaz Albaniyası antik dövrdə*

Rus tarixçisi İ.Dyakonov Sak çarlığının Cənubi Azərbaycanın da xeyli hissəsini əhatə etdiyini, V.Piotrovski isə sak-skif çarlığının Urmiya gölü ətrafında yarandığını qeyd etmişlər.

Azərbaycan tarixçisi İqrar Əliyev sak-skif çarlığının «Azərbaycan skif çarlığı» adlandırılmasını təklif edirdi, ona görə, Azərbaycan ərazisində sak-skif çarlığı 80 il mövcud olmuşdur.

Tarixi həqiqəti inkar etməyə cəsarəti çatmayan S.Yeremyan bu çarlığın Gəncə yaxınlığında Şakaşena düzənliyində yerləşdiyini, L.Yelinski ön Qafqazda, daha çox Atropatena Midiyası ərazisində yarandığını etiraf etmişlər. Azərbaycan alimi Yusif Yusifov bu çarlığın Cənubi Azərbaycanın qərbində meydana gəldiyini əsaslandırmışdır.

Bəzi tədqiqatçılara görə, sak- skif çarlığı daha geniş ərazini - Sakasena, Kaspiana, Qərbi Azərbaycan (indiki Ermənistan) və Kappadokiyanı əhatə edirdi.

Sakların Azərbaycan ərazisində qeyd olunan ərazilərdə məskunlaşdığını etnonimlər təsdiqləyir. Qaynaqların məlumatına görə, sakların tərkibində olan **Gəncək** adlı bir türk tayfası e.ə. V yüzillikdə Sak çarlığının ana şəhərinin əsasını qoyur, inşa edir və öz adı ilə ***G ə n c ə k*** adlandırır.[7]

***Gəncək adını incələyək***. Məlumdur ki, e.ə. 2-ci yüzillikdə Atropatenanın paytaxtı Qanzak olmuşdur. Antik müəlliflərdən Strabon, Plini, Ptolomey və b. bu şəhəri **Qazaka** kimi qeydə almışlar. Qazakanın Araz çayından 2400 stad aralı

yerləşdiyi və 350 ildən artıq Atropatenanın paytaxtı olduğu güman edilir [8]. *Farslar bu şəhəri **Gənzək**, erməni tarixçiləri isə **Qandzak** adlandırmışlar. Ancaq qətiyyətlə deyə bilərik ki, bu adlar **Gəncək və ya Gəncə** etnoniminin təhrif formasıdır. Bəs həqiqət necədir?*

Urmiya gölünün cənub və şərqində, Marağanın 6 fərsəngliyində yerləşən Gəncə şəhərində azər türklərinin od məbədi yerləşirdi. Mənbələrin məlumatına görə, ölkənin hökmdarları taxta çıxmazdan əvvəl məbədi ziyarət edərmişlər. IX əsrdə yaşamış anonim ərəb coğrafiyaçısı həmin şəhəri ***Gəznək*** kimi, XI əsr ərəb səyyahı Yaqut Həməvi isə onu ***Gənzək*** kimi göstərmişlər.

«Dərbəndnamə»də Gəncənin əsasının VII əsrin axırı, VIII əsrin əvvəl lərində qoyulduğu qeyd olunur. Münəccimbaşının əsərinə daxil olan «Şirvan və əl-Babın tarixi» ndə Gəncənin tikilməsindən bəhs olunaraq göstərilir ki, 245-ci ildə (859) Məhəmməd ibn Xalid ibn Yezid ibn Məzyəd Arran vilayətində Gəncə şəhərini tikdirdi. Bu şəhərin salınmasına səbəb bu idi ki, o Cubant yaxınlığında 3 təpə olan yerdə qaldığı zaman 3 gecə dalbadal yuxu görür ki, ortadakı təpədə xəzinə (gənc) vardır. Ucadan bir səs ona demişdir: «Təpəyə qalx, atını orada saxla, sənin atın dırnağı ilə yeri döyəcləyəndə, əmr et, yeri qazsınlar və orada nə varsa çıxart, tapdığına şəhər sal, adını qoy Gəncə (Xəzinə)… O da üç qazan tapdı, biri dinar, ikisi dirhəm. Həmin pula şəhər saldı. Bağdada qayıtdıqda xəlifəyə xəzinə və şəhər haqqında məlumat verdi...»

Alimlərin çoxu (E.Benvenist, Y.Arkvart və b.) Gəncə sözünün kökünün İran dillərindəki «ğaznaka» dan («Xəzinə») alındığını söyləmişlər. Bu söz bir çox dillərə (Elam, yunan, sanskrit, rus, ərəb və b.) keçmişdir. Fars dilində «gənc», ərəb dilindəki «xəzinə», rus dilindəki «kazna» sözləri də buradandır.

Gəncə adına alimlərin münasibəti müxtəlif olmuşdur. E.Resler Gəncə adını Azərbaycan dilindəki «gen (gencə) yer» sözündən, Fəridə Məmmədova isə tayfa adından alındığını söyləmişlər.

XIV əsr müəllifi H.Qəznəvi Gəncədən danışarkən «xəzinə» və «gencə» sözlərinin hər ikisindən istifadə etmişdir:

Seçmə şəhərlər var-cəmi bir neçə,
Bütöv xəzinədir Arranda Gəncə.
Varı bol, suyu saf, barlı – bəhrəli,
İqlimi mülayim, torpağı gencə.[9]

*Göründüyü kimi, hər ikisində ad təhrif olunmuşdur. Sonralar bu türk sözünü fars dilinə aid edib «Xəzinə» kimi vermişlər. Təəssüf doğuran odur ki, səhv adlandırma «Azərbaycan tarixi» dərsliklərində də yer almışdır.*

Tarixi mənbələr isə bizə tamamilə başqa məlumatlar verir. Mahmud Qaşqayın (Kaşqarlı) yazdığına görə, çox-çox qədimdə Orta Asiyada sakların yaşadığı ərazidə ikinci komponent olan «Cək» türk dilində metafezeyaya uğramış, **«s» «c»**

ilə əvəzlənmişdir. Əslində «cək» «sak» etnonimini əks etdirir. Gəncəbad, Gəncə, Gəncərud kəndlərinin adları da Gəncək tayfasının adı ilə bağlıdır.[10]

Qazax, qırğız, özbək və türkmənlərdə indi «Gəncə», «Kəncə» adlı tayfalar və onların adlarını daşıyan Gəncə adlı yaşayış məskənləri vardır.

19-cu əsrdə Qafqazın şimalında Gəncə-Aul, Gəncə çay, Gəncə və s. kənd adları qeydə alınmışdır.

*Deməli, «Gəncə» adının tayfa (tarixi sak tayfalarının adı ilə bağlıdır) adından alındığını söyləyən Fəridə Məmmədova haqlıdır.*

Tarixi mənbələrə istinadən deyə bilərik ki, Sak çarlığı öz ərazilərini genişləndirərək Zəngəzur torpaqlarını da əhatə etmiş və burada məskunlaşmışlar. Bu əyalət sonradan erməni mənbələrində Syüunik (Sunik), fars və ərəb mənbələrində Sisakan kimi qeyd olunmuşdur.

VIII əsrə aid Suriya mənbələrində bu əyalətin adı *Sisakan* şəklində işlənmişdir. Sonralar bu xronim qısaldılaraq *Sisak, Sisyan* sözü ilə əvəz olunmuşdur. Sisakan torpaqları bolşeviklərin «səxavəti» nəticəsində «yox yerdən yaradılmış» Ermənistana bağışlanmış və Sisyan rayonu kimi indi də qalır. Sovet işğalına qədər **Qarakilsə** adı ilə tanınan bu ərazidə türk tayfaları yaşamış və onların «Şəki» (sək, sak) adlı kəndi mövcud olmuşdur. Sisyan mahalı Ermənistana qatılana qədər Qarabağ xanlığına məxsus olan Şəki kəndi İbrahimxəlil xan tərəfindən Gövhər ağanın anasına-gürcü knyazı Abaşidzenin qızına bağışlanmışdır. Gövhər ağanın anası öz yaxınlarından bir qismi ilə Şəki kəndinə köçmüş və burada yaşayanlar özlərinə «Knyaz Şəkinski» ləqəbini götürmüşlər. Gövhər ağanın nəvəsi-hamımızın yaxşı tanıdığı Barat xanım Şəkinskaya da həmin nəsildəndir.

Yuxarıda qeyd etdik ki, Gəncə-Qazax bölgəsi yunanlarda Sakasena adlandırılmışdır. Elə isə ***Sakasena*** adına nəzər salaq.

M.Kalankatlının məlumatına görə, Albaniyanın vilayətlərindən biri olan Sakasena Gəncə və onun ətrafını əhatə etmişdir. Astara rayonunda Sakaşen və Sakşon toponimləri bu gün də qalmaqdadır.

Məlum olduğu kimi, Sak padşahlığı Şimali və Qərbi Azərbaycan (indiki Ermənistan – müəlliflər) ərazilərini əhatə edirdi. Deməli, indiki Ermənistan ərazisində ilk dövlət qurumu qədim türk mənşəli Sak padşahlığı olmuşdur. «Bibliya» da bu padşahlıq «Aşkenaz» adlanır. V əsr erməni tarixçisi Koryonun «Haylar Aşkenazın (skif) nəslindəndir» məlumatı da bununla əlaqədardır.[11]

Qeyd etmək lazımdır ki, erməni mənbələrində indiki Dağlıq Qarabağa münasibətdə işlədilən «Arsak» termini də qədim türkcədir. Q.Qeybullayev toponimi «Artsak» kimi qeyd edir və onun birinci hissəsi «art» türk dilində «dağlıq ərazi», «yuxarı» mənasını verir. Mirəli Seyidov isə bu sözün «ər» və «sak» hissələrindən ibarət olduğunu göstərmişdir.[12] «Ər» qədim türk dilində «kişi», «cəsur», «qırmızı» mənasındadır. «Arsak» sözü hərfən «sak kişisi» mənasını verir. Rus müəllifi A.Xazanov da təsdiq edir ki, «Qarabağ əyalətlərindən biri olan Arsak öz adını sakların «cəsarətli» və «kişi» sözlərindən götürmüşdür.[13]

Təbii ki, arsaklılar da albanlar olmuşdur. Belə olmasaydı XVIII əsrin 20-ci illərində rus çarı I Pyotra müraciət edən arsaklılar özlərini albanlar adlandırmazdı. Çünki Veliçkonun yazdığı kimi «ermənilər Zaqafqaziya aborigenləri deyillər və ona görə də Kür sahilləri və Arsak heç cür əsl erməni torpaqları və Ermənistanın köklü vilayəti ola bilməzdi», «…cəmi 3-4 əsr əvvəllər erməniləşmiş Qarabağ sakinlərinin əsl soy kökü albanlara bağlıdır».[14] Bir az da dərinə getsək görərik ki, Ərməniyyənin ilk hökmdarları da sak mənşəli hakimlər olmuşlar.[15]

III əsrə aid mənbələrdə Balasakan adına təsadüf edilir. Sonralar Paytarakan vilayəti adlanan bu ərazi Muğan və Mil düzənliyini əhatə etmişdir. Balasakan sözü də «sak düzü» mənasını ifadə edir.[16]

E.ə. VII əsrin sonunda Urartu və Manna dövləti ilə yanaşı skit padşahlarının da adları çəkilir. Bu padşahlığın Urmiya gölünün sahillərində, bu gölün şimal və qərb hissəsində olması ehtimal olunur. Bu fikri toponomik adlar və arxeoloji materiallar da təsdiq edir.

Alban tarixçisi Musa Kalankətli yazır ki, xristian təliminin Albaniyada yayılmasında Şəki xüsusi rol oynamışdır. Alban partiarxlığının beş yepiskop luğundan birinin Şəkidə təsis edilməsi və xüsusi yepiskop kafedrasının Şəkidə-**Kişdə** yerləşməsi göstərir ki, bura dövlətin dini-ideoloji mərkəzlərindən biri kimi daim diqqət mərkəzində olmuşdur. Başqa sözlə, Qafqazın xristianlıq tarixinin mərkəzlərindən olan ***K i ş*** Azərbaycanın, o cümlədən Şəkinin qədim yurd yerlərindən biridir.

**K i ş** *adına nəzər salaq*. Kiş çox geniş yayılmış toponimlərdən biridir. Kiş adlı yaşayış məntəqələrinə Tyan-Şandan tutmuş Ön Asiyayadək bir çox yerlərdə, hətta Avropada-Macarıstanda da rast gəlmək mümkündür. İkiçayarasında Şumer sivilizasiyasının təşəkkül tapmasında mühüm rol oynayan ***Kiş şəhər dövləti*** təxminən 4800 il bundan əvvəl mədəni mərkəz kimi tanınmışdır. Məlumdur ki, Şumer şəhər dövlətləri e. ə. III minilliyin birinci yarısında meydana gəlmişlər. Şumerdə mövcud olan dövlətlər, adətən, erkən sülalələr adı daşıyırdılar. Erkən sülalələr dövrü e.ə. XXVIII-XXIV əsrləri əhatə edir. Birinci erkən sülalə dövründə (e.ə. XXVIII-XXVII əsrlər) **Kiş şəhər dövləti** siyasi üstünlük əldə etmişdir. [17]

Şəkidəki ***«Kiş» ə*** *gəldikdə isə onun ən azı* ***3000 il*** *yaşı vardır*. Kiş kəndi Böyük Qafqaz sıra dağlarının cənub ətəklərində, Qədim Şəkinin şimal-qərbində yerləşir. Kiş kəndinin sağ sahili ilə axan və onu Şəkidən ayıran çay tarixi ədəbiyyatda **Kiş çayı**, yerli əhali arasında isə **Böyük çay** adlanır. Kiş kəndi şərqdən, qərbdən və şimaldan dağlarla əhatə olunmuşdur. Kəndin ortası ilə kiçik bir çay axır ki, ona ***Qurcana*** deyirlər.[18]

Kiş kəndi meşələrlə əhatə olunmuşdur. Meşə örtüyü 6.272 hektardır. Bunun 622 ha. Marxal, 2.414 ha. Qaynar, 2.414 ha. Doğrunca, 822 ha. isə Duluzlar meşə örtüyünün payına düşür. Meşələrdə bol meyvə yetişir.

Şumer «***Kiş***»i ilə Azərbaycan «***Kiş***»i arasında coğrafi yaxınlıq və tarixi uzaqlıq nə qədər paradoksal olsa da, şumerlərin Şərqdən gəlmə faktını inkar etmir. Qafqazda, Orta Asiyada, Avropada Kiş adlı yaşayış məntəqələrinin möv-

cudluğu ***k a s*** tayfalarının tarixi coğrafi yayılma parametrlərini müəyyənləşdirmək imkanı verir.[19]

Strabon yazırdı ki, «…kaspiana da albanların ölkəsinə mənsubdur». Etnonimin kökünü ***k a s*** adı və «**pi**» cəm şəkilçisi təşkil edir. Kas adını Zaqroş dağlarının qədim sakinləri ***kaşu/gissi*** etnosunun adı ilə eyniləşdirmişlər. Çox guman ki, ***kas/kaş/kiş*** etnonimi Albaniyada (eləcə də bütün Azərbaycanda və cənub istiqamətində) yaşayan türk etnoslarının digər adı olmuşdur. Son araşdırmalara görə, ***k a s*** etnonimini bir sıra Orta Asiya və Altay türk tayfaları da daşıyırdı.[20]

Azərlərin etnik tərkibində iştirak etmiş ***Kaspi*** *(Qaspi)* tayfasından bəhs edən görkəmli dilçi Ə.Dəmirçizadə maraqlı fikirlər irəli sürmüşdür. O belə hesab edirdi ki, bu ad onlara sonralardan verilmişdir. O yazır: «Qədim dillər üzərində aparılmış tədqiqatdan məlum olur ki, bu sözün sonuncu hecası «pi» Bisutun qayalarındakı mixi yazıların qolunun bir dilindən - elam dilindən göründüyü kimi, cəm bildirən şəkilçidir. Bu yazılarda həmin şəkilçi – «pi», «ap», «pe», «pi» şəkillərində tayfa və ölkə bildirən adların sonuna bitişdirilərək işlənilmiş və belə sözlər həmin şəkilçi ilə birlikdə «el», «tayfa», «qəbilə», «yurd», «ölkə» mənalarını ifadə etmişdir. Məs:. Assurpan – «Assuriya», Madane - «Midiya» və s.

Sözün bu şəkildə tərkib hissələrindən ibarət olduğunu nəzərə aldıqda belə nəticəyə gəlmək olur ki, «Qaspi» (yaxud «Kaspi») tayfasının əsil adı Kas/Qasdır.»[21] ***Fikrimizcə, K A S adı sonralar fonetik dəyişikliyə uğrayaraq K İ S , QİS, K İ Ş kimi səslənmişdir***.

Ə.Dəmirçizadəyə görə, kaspilər də, xəzərlər də əsasən bir tayfadır, bundan əlavə ***kas*** tayfasının müəyyən hissəsi skif tayfa ittifaqına daxil olandan sonra, skiflər, yaxud onların müəyyən hissəsi eyni zamanda, «Xəzər» adlanmışlar və skif tayfalar birliyinə məhz bu tayfaların qarışmaları, nəinki xəzərlərin, həm də skiflərin, deməli saqların (sakların) türkdilli olması mülahizəsinin doğmasına səbəb olmuşdur.[22]

Albaniya dövləti 12 əyalətdən və 2 vilayətdən (nahanq və havar) ibarət idi. Bunlar aşağıdakılar olmuşdur: ***Kaspiana, Arsak (Ərsak), Uti, Girdiman, Kambisena, Sakasena (Şakaşena), Sünik (Sisakan), Kabalaka (Qəbələ), Şəki, Əcəri (Eceri, Heceri, Uçar), Lpina, Çola.*** Adları sadalanan ilk 6 əyalət – *Kaspiana, Arsak (Ərsak), Uti, Girdiman, Kambisena, Sakasena (Şakaşena)* Kür çayının sağ sahilində, digər əyalətlər- *Sünik (Sisakan), Kabalaka (Qəbələ), Şəki, Əcəri (Eceri, Heceri, Uçar), Lpina, Çola* sol sahilində yerləşmişdir.

Kaspiananın hüdudları Şimaldan «Kaspi keçidi»ndən (Dərbənd qapılarından) başlayaraq indiki Gürcüstan ərazisi olan Dəryal dərəsi, cənubda Elburus dağınadək uzanmışdır. Gürcü salnaməsi «*Kartlis Sxobreva*» da da Kaspi adlı şəhər-qalanın olduğu və **buntürklər** tərəfindən salındığı göstərilir. Yəni, indiki Borçalı torpaqlarının əzəli sakinləri olmuş **buntürklərin** bir qismi (28 min ailə) e.ə.VI əsrdə İberiyanın qədim paytaxtı Msxetidən qərbə köçərək bu torpaqlarda məskunlaşmış, zaman ötdükcə adlarını dəyişib ***mesxeti türkləri*** olmuşlar. Stalin repressiyası zamanı kütləvi şəkildə Özbəkistana, Fərqanə vadisinə sürgün edilmişlər.[23]

*Belə isə,* ***nə üçün düşünməyək ki, bəlkə İkiçayarasındakı Kiş sakinləri elə Şəkidəki «Kiş» in sakinləri olmuş, şərqə gedərkən Kiş adlı yaşayış məskənini yadigar qoymuşlar.*** *Yaxud da, belə anlama gəlmir ki,* ***kişlilər (kaslar) saklardan əvvəl, çox sonralar Şəki adlandırılan torpaqda məskun olmuş, sakların bu yerlərə gəlmələri ilə Şəki adı formalaşmışdır.*** *Hər halda Ptolomeyin xəritəsində Nuxanın* **Niqa** *kimi verilməsi, A.Bakıxanovun, «Nuxa şəhəri…həmin Naxiya və ya Nağiya şəhəridir…».*[24] *deməsi, sonralar Şəki adının formalaşması, Nuxa ilə Şəki adlarının tarixin müxtəlif dönəmlərində qoşa işlənməsi bu yerlərin tarixinin yenidən araşdırılmasını gündəmdə saxlayır.*



***Müasir Kiş kəndinin ümumi görünüşü***
***(yuxarıda Kiş alban məbədi)***



*Kiş alban məbədi təmir-bərpadan əvvəl*



***Kiş alban məbədinin təmir-bərpadan sonrakı görünüşü***

Azərbaycanın ən qədim şəhərlərindən olan **Şəkinin** adı orta əsərlər mənbələrində **Şəkə, Şaki, Şaka, Şakki, Şakke, Şeken, Şakkan** kimi qeyd edilmişdir.

Yuxarıda qeyd olunduğu kimi, Alban partiarxlığının beş yepiskopluğundan biri Şəkidə təsis olunmuşdur. Musa Kalankətlinin nəql etdiyinə görə, İsa peyğəmbərin şagirdi (həvari) Faddey xristian təlimini təbliğ etmək, yaymaq və tərəfdarlar toplamaq üçün Şərqə göndərilir. Lakin o Artarda erməni ***hökmdarlarının*** fitvası ilə qətlə yetirilir. Onun səfər yoldaşı olan şagirdi müqəddəs Yelisey baş verənlər haqqında Qüdsə döndükdən sonra xristian müqəddəslərinə məlumat verir. İsa peyğəmbərin qardaşı müqəddəs Yakovun (Yaqub) məsləhəti ilə Yelisey Faddeyin işini davam etdirmək üçün Qüdsdən İrana gəlir, xristian ideyalarını yaya-yaya Məskütə, oradan Çolaya (Dərbəndə) yollanır. O, üç nəfər şagirdi ilə indiki Ağdaşın yaxınlığındakı Surxarın qalasına gəlib çıxır…Şagirdlərin biri şəhid olur. İki şagird isə ondan ayrı düşür. Nəhayət, o, Kişdə qərar tutur və burada «Alban kilsələrinin anası» sayılan Kiş məbədinin əsasını qoyur».[25] Musa Kalankətlinin yazdığına görə, bu hadisələr eramızın birinci əsrində baş vermişdir. Yelisey Zərqu dərəsini (ola bilsin ki, Qəbələ rayonunun Zarağan kəndini) keçib bütpərəstlərin səcdəgahlarının olduğu yerə getmiş və orada şəhid olmuşdur.[26]

Azərbaycan VII əsrin ortalarında xilafət tərəfindən zəbt olundu. Şəki əyaləti iqamətgahı Bərdə olan **III əmirliyin** tərkibinə daxil edildi. Şəki mahal mərkəzi idi. Tarixçi Mahmud İsmayılov «Şəki» kitabında yazır: «Şəkidə müstəqil knyazlıq yarandı. Bu knyazlığın başında alban knyaz nəslindən olan Qriqor Xammamın nəticələri Ader Nerse (915-950) və Sevada İşxan (950-ci ildən) dururdu».[27]

Ərəb tarixçisi Məsudi yazır: «Sanariya çarlığının yaxınlığında Şekinlər yerləşir…Şəki hökmdarı…Adeo Nersedir». Göründüyü kimi, X əsrdə Şəkidə alban xaçpərəst çarlarının varisləri hökmranlıq edirdilər. Yerli əhalinin bir qismi müsəlmanlığı qəbul etmişdi.

X əsrin 30-40-cı illəri *Şəki hakimlərinin* Şirvanşahlarla mübarizəsi ilə zəngindir. Tarixi faktlar göstərir ki, bu dövrdə baş verən qarşıdurmalardan yaxa qurtaran Şəki nominal müstəqilliyini saxlaya bilmişdir.

XI-XIV əsrlər Şəki tarixində qanlı müharibələr dövrü kimi xarakterizə olunur. Şəki əhalisi 1070-ci ildə səlcuq hökmdarı Alp Arslanın bu bölgəyə, sonra isə Gürcüstana yürüşünün şahidi oldu, 1120-ci ildə gürcü çarı David Şəkini qarət etdi. Şəki monqolların törətdiyi fəlakətlərin acı nəticələrini aradan qaldırmalı olmuşdur.

Məlumdur ki, 1382-ci ildə Kəsranilər sülaləsinin nümayəndəsi Hüşəngin taxtdan salınması ilə hakimiyyətə Dərbəndilər sülaləsindən İbrahim gətirildi. Bu hadisədən bəhs edən A.A.Bakıxanov yazırdı: *«…Bu zaman **Şeyx İbrahim Dərbəndi ibn Sultan Məhəmməd ibn Keyqubad Şirvanşah** Şirvan şəhərlərindən sayılan **Şəkidə** yoxsul bir halda əkinçiliklə məşğul olurdu. Əyninə paltar və başına əmmamə qoyaraq, gətirib padşahlığa oturtdular».*[28]



***Şirvanşah I İbrahim Xəlilullah (1382-1417)***

Şirvanşah İbrahimin ağıllı siyasətinin nəticəsi olaraq nəinki Şirvan, həmçinin **Şəki** Teymurla düşmənçilikdən əl çəkərək əməkdaşlığa üstünlük verdi, hətta Şəki döyüşçüləri 1402-ci ildə Teymurla Sultan Bəyazid arasında baş verən Ankara döyüşündə iştirak etdi.[29]

Hakimlik uğrunda mübarizə hətta qardaşlar arasında da nifaq salmış, əvvəllər bir yerdə olan, qanı qanından, canı canından olan övladlar bir-birinə düşmən kəsilmişlər. 1412-ci ilin sonunda Kür sahilində baş verən döyüşü bu gün də tarix kitablarından oxuduqca bu mübarizənin iç dünyasına nifrət edirik.

Kür sahilindəki döyüşdə yenicə yaranmış Qaraqoyunlu dövlətinin hökmdarı Qara Yusifin hərbi qüvvələri ilə Şirvanşah İbrahim, Şəki hakimi Seyid Əhməd və Kaxetiya çarı II Konstantinin qoşunları qarşılaşırlar. Döyüş müttəfiqlərin əsir düşməsi ilə nəticələnir. Kaxetiya çarı öldürülür. Şirvanşah İbrahim və Seyid Əhməd Qrlat Qara Yusifin vassallığını qəbul etdikləri üçün müstəqilliklərini saxlaya bilirlər. Ancaq tezliklə Şirvanla münasibətlər yenidən pozulur. Şəki hakimi Şah Hüseyn Qəbələni ələ keçirir və bu hadisə Şirvanla düşmənçiliyə səbəb olur. Şəki hakimi Ağqoyunlu hökmdarı Rüstəmə ümid bəsləyir. Doğrudur, Rüstəm köməyə 15 minlik qoşun göndərir, ancaq sonradan Şah Hüseynin ölümünə fərman verir.[30]

Göründüyü kimi, XIV əsrin sonu, XV əsrin əvvəllərində Şəkinin istər siyasi, istərsə də iqtisadi durumu yaxşı olmamışdır.

***Bu sahədə oxucuların bilgilərinin azlığını nəzərə alaraq Şəki ölkəsinin XIV əsrin sonu XV əsrin əvvəllərindəki vəziyyətinə və Əmir Teymurun bu yerlərə gəlişinə diqqəti yönəltməyi məqsədəuyğun hesab edirik.***

XIV əsrin sonu, XV əsrin əvvəllərində Şəki ölkəsinin ərazisi Tiflisdən bir qədər sonra başlayır, onun cənub sərhəddini Kür çayı müəyyən edirdi. Bu ölkənin şərq sərhəddi Qəbələ şəhərinin yaxınlığından keçirdi.

Bu ölkədə Tənqut, yaxud Səkğut (Zaxur?), Ağcab, Bərtaz vilayətləri, Bərtaz eli, Kür çayı yaxınlığında isə Sorxab Qarabağı, yaxud Kiçik Qarabağ adlı yer və Sorxab adlı bir qala olmuşdur. Çox güman ki, indiki Kiş çayı o vaxtlar «Ağ su» adlanırmış. Mənbələrdə koordinatlar konkret göstərilməsə də, «**Ağ su dərəsi**», yəni «**Ağ su»** adlı çayın mənbəyi «**Gəl – Gör – Get»** qalası və «mağaralıq» deyilən yer, heç şübhəsiz bu ölkədə idi və onlardan birincisini indiki Kiş dərəsi, yaxud Kiş çayının mənbəyi, ikincisini isə elə həmin ərazidə yerləşən indiki məşhur «Gələrsən-Görərsən» qalası hesab etmək mümkündür.[31]



***Orta əsrlər Şəki küçələrində birinin görünüşü***

Şəkidə əsasən müsəlmanlar hakimiyyətdə olsalar da, ölkənin ərazisinin dağlıq yerlərində xristianların knyazlıqları, möhtəşəm qalaları olmuşdur. Xristianların əksəriyyəti pravoslav olsa da, ölkənin şimal-şərqində yaşayan ləzgilər katolik idi. Gürcülərin pravoslav olmasına baxmayaraq, onlar məxsusi dini mərasimlər icra edirdilər. Şəki ölkəsinin köklü sakinləri, başqaları tərəfindən «tatar» adlandırılan türkdillilər və albanların törəmələri ləzgilər idilər. Albanlar hələ I əsrin I yarısında xristianlığı qəbul etməyə başlamış və Kişdə həvari-apostol kilsəsi tikmişdilər. Katoliklər isə həmin məzhəbə Avropadan gəlmiş missionerlərin təsiri altında yenicə keçmişdilər. Burada yaşayan müsəlmanlar isə, islam dinini qəbul etmiş albanlar, yaxud albanların törəmələri idi.

Şəki dövrün mənbələrində suyu, çörəyi, heyvanları, ipəyi və düyüsü olduqca bol olan bərəkətli və gözəl bir ölkə kimi təsvir edilir və göstərilir ki, burada qoz-fındıq ağacları və məhsul bol olduğundan yerli əhali yeməyi qoz-fındıq yağı ilə hazırlayır, hətta evlərini işıqlandırmaq üçün neft əvəzinə qoz-fındıq yağından istifadə edirmişlər. Ölkənin ərazisində həddən ziyadə ov heyvanları, xüsusilə də ceyran var idi.



XIV əsrin birinci yarısında Hulakülər dövlətinin süquta uğraması ilə **Orlat sülaləsi Şəki hakimliyinin başına gəldi.** Lakin qısa müddətli müstəqilliyi ***Teymurun*** yürüşü pozdu, *Şəki talan olundu*, Teymurun ordusu Qəbələdə qərar tutdu.

***Tanıtma:***

***Barlas türk tayfasından olan Əmir Teymur Turğay oğlu Bahadur hicri tarixinin 736-cı ilin şəban ayının 5-də (miladi tarixinin 9 aprel 1336-cı ilində) Keş qəsəbəsində anadan olmuşdur. Bu qəsəbə yaşıllığa qərq olduğundan o «Şəhri-siyabz» («Yaşıl şəhər») adlanırdı.***

***Teymurun atası Turğay Barlas qəbiləsinin rəisi və ağası olduğuna görə, Qazan xan Keş və Nəxşab vilayətinin idarə olunmasını ona tapşırmışdı. Turğay ömrünün sonlarına qədər (1360) Qazan xanın (əmirin) ən sadiq xidmətçilərindən olmuşdur.***[32]

***Uşaqlıq və gənclik dövründə Teymurun şücaət və qeyrətini, süvarilik məharətini görən atası ona son dərəcə diqqət yetirmiş, islam əqidəsi ruhunda təlim və tərbiyə vermişdir.***

***Teymur dostları və sevimliləri tərəfindən gözəl və xoş simalı, sağlam və mütənasib bədənli, ağıllı - kamallı, kişilərə məxsus gözəlliyə malik olan bir şəxs kimi təsvir edildiyi halda, düşmənləri tərəfindən o, çirkin cöhrəli, zəif, nataraz əndamlı, eybəcər görünüşlü təsvir olunmuşdur.***[33]

***Öz əli ilə yazdığı tərcümeyi-halında Teymur qeyd edirdi ki, mən 12 yaşında olanda özümdə fövqəladə bir fərasət və əzəmət hiss etdim. Məni ziyarət edən hər kəsi ciddi və izzətlə qəbul edirdim. 18 yaşında olanda mən özümün süvarilik və ovçuluqda olan ustalıqlarım barəsində düşünməyə başladım. Əksər vaxtımı Quran oxumaqda, şahmat oynamaqda və xüsusən süvarilik məşğələlərində keçirdim.***[34]

***Teymurun əsas və etibarlı dayağı ordu idi. Teymurun ordusu Mərkəzi Asiyada ən yaxşı ordu hesab olunurdu. Onun ordusu onluq, yüzlük, minliklərə bölünüb atlı və piyada əsgərlərdən ibarət idi. Əmir Xoca Seyfəddin, Şeyx Əli Bahadur, Davud Barlas və oğlanları Cahangir, Miranşah, nəvələri Pirməhəmməd, Uluğbəy sərkərdə kimi yetişmişdilər.***

***Teymur öz döyüş yoldaşlarından sədaqətli olmalarını tələb edirdi. O, şəxsi igidlik göstərər, qılınc oynatmaqda sərkərdələrinə və əsgərlərinə nümunə olardı. Dərin zəka sahibi olan Əmir Teymur atasına və ustadına ehtiram göstərər, bilmədiklərini öyrənməyə cəhd edərdi. Hələ kiçik yaşlarından müəllimi və yaxın məsləhətçisi Seyid Bərəkənin məsləhəti ilə Qurani-Kərimi oxumağı və türkcə***

***yazıb-oxumağı öyrənmişdir. Teymur at üstündə cəng etməyi, şahmat oynamağı sevirdi.***

***Teymur uzaqgörənliyi, səmimiliyi, dostluqda vəfalı olması və igidliyi sayəsində Mərkəzi Asiyanın qüdrətli hökmdarına çevrilmişdir. Bununla belə, şöhrət nərdivanının ən uca pilləsinə yüksələnə qədər rastlaşdığı xəyanətlər, məğlubiyyətlər, yaxın silahdaşlarının itkisi, arxadan vurulan zərbələr onda həm də qəddarlıq hissləri tərbiyə etmişdir.***

***Əmir Teymur dövrünün ağıllı və müdrik insanlarına himayəçilik edər, tez-tez onların məclislərində iştirak edərək onlarla mübahisələrə girər, onun fikirləri ilə razılaşmayan elm adamlarına böyük hörmət və qayğı ilə yanaşar, onların arzu və ehtiyaclarını nəzərə alıb mükafatlandırardı. İşğal etdiyi ölkələrdə elm-sənət adamlarına, sənətkarlara, din xadimlərinə, tacirlərə toxunmazdı. Məşhur sənətkarları imperiyasının paytaxtı Səmərqəndə göndərər, şəhərin yenidən qurulmasını və abadlaşdırılmasını nəzarətdə saxlayardı.***

***Teymur Səmərqənddə (Səmərqənd-böyük kənd deməkdir) Göy-Saray, Bibi-xanım məscidi və mədrəsə kompleksi, Şahı Zində mavzoleyi, Səmərqənd ətrafında bağlar və saraylar – Bağı-Çinar, Bağı-Şamalş, Bağı-Dilguşə, Bağı-Behişt, Bağı-Növ və b. binalar tikdirmiş, Kuxak və Zərəfşan çayları üzərində körpülər salmış, yollar çəkdirmişdir. Amu-Dərya və Sır-Dərya üzərindəki körpülər, kanallar, irriqasiya tikililəri, Buxara, Şəhri-syabz, Fərqanə və Türküstandakı karvansaraylar dövrün memarlıq inciləridir.***

Əmir Teymur 1385-ci ildə ikinci İran yürüşünə başlamamışdan öncə, həmin istiqamətdəki hakimlər, o cümlədən Cənubi Qafqazdakı hakimlərlə əlaqə yaratmış, onları tərəfdaşlığa dəvət etsə də, bir çoxu o cümlədən... **Şəki əmiri** tərəfdaşlıqdan imtina edərək Teymura qarşı yaradılmış koalisiyaya qoşulmuşdur. Doğrudur, Əmir Teymurun 1-ci İran yürüşü zamanı Kiçik Lor hakimi Məlik İzzəddin, Cəlair padşahı Sultan Əhməd (1382–1393; 1405–1412), Kürdüstan məlikləri, Gürcü çarı V Baqrat (1360–1393), Şirvanşah İbrahim (1382–1417) və Şəki hökmdarı Əmir Teymura qarşı birgə mübarizə apara bilərdilər. Ancaq Teymur onları ayrı-ayrılıqda tabe etmək, itaətə gəlməyənləri isə cəzalandırmaq istəmişdir. Lakin müttəfiqlərə qarşı Qızıl Orda xanı Toxtamış kimi ikinci bir fövqəldüşmənin peyda olması səbəbli bu «koalisiya» dağıldı.Bu vəziyyət onların ərazilərinin Əmir Teymur tərəfindən asanlıqla işğalına şərait yaratdı...[35]

1385-ci ilin əvvəllərində Toxtamış xanın 90 minlik ordusu Şirvandan keçərək Azərbaycana soxuldu. Qızıl Ordalılar Təbrizi 8 gün mühasirədə saxlayıb sonda hiylə ilə ələ keçirdilər. Eyni vaxtda Əmir Teymur Kiçik Lor və Kürdüstana yürüş etdi. Qızıl Ordalılar Azərbaycan vilayətindən 200 min nəfəri əsir apardılar[36]. Bu zaman Əmir Teymur əvvəlcə, öz adamlarından bir qrupunu, hələ ilk İran yürüşü zamanı onun tərəfinə keçmiş olan Cəlair əmirlərindən Adil ağa ilə Təbrizə göndərdi. Bunlara qarşı heç bir ciddi müqavimətin baş vermədiyini gördükdən sonra özü də ordusunun əsas hissələri ilə buraya gəldi... 1385-ci ildə Təbrizdə üzərində Cağatay ulusunun xanı–Soyurqatmış (1367–1389) və baş əmir-

Əmir Teymurun adları həkk olunmuş sikkələr zərb edildi. Beləliklə, Əmir Teymur Azərbaycan vilayətini çox asanlıqla ələ keçirdi. 1386-cı ilin payızın əvvəllərində Teymur Təbrizdən çıxıb şimal-qərb istiqamətində hərəkət edərək Gürcüstana çatıb, oradan ***Şəkiyə*** keçdi.

**Əmir Teymurun Şəkiyə 1-ci hücumunu** öyrənmək üçün əlimizdə iki eyniadlı mənbə – N. Şami və Ş. Ə. Yəzdinin «Zəfərnamə» ləri vardır. N. Şamiyə görə, Əmir Teymur Tiflisdən sonra Şəkiyə hərəkət etmiş və yol boyu ovla məşğul olmuşdur. Teymurun qoşunları yol boyu əraziləri qarət etmiş, bir qrup isə Bərdə tərəfə yollanmışlar.

Ş. Ə. Yəzdi hadisələri təsvir edərək yazır ki, Tiflisdən sonra çadırların qurulan yeri ***Ş ə k i v i l a y ə t i*** oldu, Həzrət sahibqiran kafirlərin kökünü kəsmək və çıxarıb atmaq üçün qoşunu dəstə-dəstə buranın hər yerinə göndərdi. Əmir Cahanşah bəzi üməra ilə fərmanın hökmü üzrə bütün ləzgilərə hücum edib qarət elədilər və onlardan bir çoxunu cihad qılıncından keçirdilər, qoşunlar apara bildikləri qədər onlardan apardı. İtaət etməyənlər dağlarda ələ keçirildi, əsir və kölə vəziyyətinə salındılar və qarət olundular. Sahibqiran Kürdən keçib Bərdəyə yollandı.[37]

Əmir Teymur 1387-ci ilin yaz fəslinin əvvəllərinə qədər Qarabağda qalır. Həmin müddətdə əsir düşmüş Gürcü çarı V Baqrat hiylə işlədib qaçmağa müvəffəq olur, Şirvanşah Şeyx İbrahim hədiyyələrlə Teymurun yanına gəlir və hörmətlə qarşılanır.

Əmir Teymur yayı Göyçə gölü ətrafına keçirir, Cəlairlərin yeganə müqavimət ocağı olan Alıncaq qalasının (Əlincə qalası-müəlliflər) mühasirəsində şəxsən iştirak edir. Lakin heç bir müvəffəqiyyət qazana bilmir. O, qışı Rey yaxınlığında keçirməyi planlaşdırdığı vaxt xəbər gəlir ki, Toxtamış xanın qoşunları Buxara və Səmərqəndə yürüş edibdir. Buna görə də, öz ordusu ilə təcili surətdə ora qayıtmağa məcbur olur.[38]

Əmir Teymurun Orta Asiyaya dönməsindən sonrakı 6 il ərzində Cəlair sultanı Bağdaddan kənara çıxmadığından və vilayətlərin idarəsini yerli əyanların öhdəsinə buraxdığından Azərbaycan və İraq-i-Əcəm vilayətlərində anarxiya yaranır, hakimiyyəti ələ almaq istəyən feodallar həm Teymurun canişinlərinə qarşı, həm də öz aralarında vuruşurlar.

6 ildən sonra *3-cü dəfə* İran istiqamətində yürüş edən Əmir Teymur 1393-cü il yanvar ayının 27-də Sultaniyyədə məskən salır. 3-cü İran yürüşü də **Şəkidən** yan keçmir. Əmir Teymur Gürcüstandan sonra 1394-cü ilin sentyabr ayında **Şəkiyə hücum edir**. N. Şami yazır ki, Əmir Teymur Tiflis şəhərinə və oradan…Şəki vilayətinə gəldi. Vilayət əhalisini itaət altına almaq üçün əsgərlərin…çıxmalarına əmr buyurdu. Əmir Hacı Seyfəddin, Cahanşah bahadur və digər əmirlər, fərmana tabe olub yola çıxdılar. Vilayəti itaət altına aldılar, itaət etməyənləri yağma etdilər. Şeyx Nurəddin bahadur bir ordu ilə dağlar tərəfə getməyə qərarlaşdı. Seyid Əli (Sidi Əli-Şəki hakimi-müəl.) mal və mülkündən

keçərək qaçmaq yolunu tutdu. Onun vilayətlərini xaraba və viran etdilər və əsgərlər bu vəzifəni yerinə yetirdikdən sonra Əmir Teymurun yanına getdilər.[39]

Ş. Ə. Yəzdi də yazır ki, «o…şikar etməyə geri dönüb **Şəki** düzlərinə girdi… Əmir Hacı Seyfəddin və Cahanşah bahadırı…basqına göndərdi və onlar fərmanın hökmü üzrə təcili yola düşüb büsbütün dağ və çöl Bərtazı qarət etdilər. Şeyx Nurəddin Sarıbuğanı həddindən artıq ləşgərlə dağlıq yerlər tərəfə göndərdi və o, elə ki dağlıq yerlərə girdi, Seyid Əli Şəki Orlat o hücumçunun xofundan mülk və malını atıb qaçmaq yolunu tutdu. Şeyx Nurəddin onun evlərini necə ki düşmənin qəlbi kimi boş və xarab etdi və tarac küləyinə verib atəş vurdu….»[40]

Əmir Teymur 1394-cü ilin sonunda ordusunu **Şəki** ərazisindən çıxarıb, Kür mənsəbi yaxınlığındakı Mahmudabad şəhəri ətrafına, qışlamağa aparır. 1395-ci il fevralın 28-də, ordunu şimal istiqamətində hərəkətə gətirib Toxtamış xan üzərinə yürüşə başlayır. 1396-cı ilin yazında geri dönən Əmir Teymur, Dərbənd, Şabran, Ərdəbil və Sultaniyyədən keçməklə Həmədana gəlir, iyulun 18-də Səmərqəndə yola düşür. [41]

Əmir Teymur Səmərqənddə çox qalmır, 1398-ci ilin avqustunda Hindistana yürüş edir. O, bundan əvvəl, İrandan qayıdarkən Azərbaycan vilayətinin və onun ətrafındakı ərazilərin idarəsini öz oğlu Miranşahın ixtiyarına verir. Ş. Ə. Yəzdiyə görə, Əmirzadə Əmiranşah (Miranşah) Azərbaycan taxtını və Hülaku xan ulusunu elə məharətlə idarə edirmiş ki, heç bir padşah zamanında itaət etməmiş sərdarlar onun yanına gəliblərmiş. *Həmin müəllifin bu sözlərinə və həmçinin hadisələrin sonrakı gedişini qələmə almış N. Şaminin yazdıqlarına əsasən güman edə bilərik ki, 1396-cı ilin payızına qədər yəqin ki,* ***Şəki hökmdarı Seyid Əli Orlat*** *da Miranşahın yanına gedibmiş.* «Zəfərnamə»lərdən məlum olur ki, Miranşah Xoy ətrafında ov edərkən atdan yıxılmış və beyni silkələnmişdir. Bu hadisədən sonra isə ağlında sürətlə azalma başlamış, nəticədə idarəetmədə nöqsanlara yol vermiş, 1397-ci ildə, (yaxud 1398-cü ilin payızında) atasının əsas ordusunun ondan çox-çox uzaqlarda olmasını nəzərə alaraq ***Şəkiyə qoşun çəkmiş*** və ölkəni qarət etmişdir. Əvəzində, Şəki hökmdarı Seyid Əli Orlat 1399-cu ilin başlanğıcında gürcüləri də götürüb, **Əlincə qalasını** mühasirədə saxlayan teymurilərin üstünə getmişdir.

Əlincə qalası haqqıda çox yazılsa da, qalanın mühasirəsi səbəbləri və Teymurun inadla qalanı mühasirədə saxlamasına tam aydınlıq gətirilməyib. Mahiyyətə diqqət yetirək.

Naxçıvan şəhəri yaxınlığındakı **Əlincə** qalasında Cəlairlərin illər boyu topladıqları böyük bir xəzinə saxlanılırdı. Mühasirə dövrlərində Əlincə qalasını görmüş İspaniya səfiri Klavixo (1411-ci ildə vəfat etmişdir) yazırdı ki, «…O, (qala-müəlliflər) dağın başında yerləşib, divar və bürclərlə əhatə olunub, divarlardan içəridə isə çoxlu üzümlüklər, bağlar, becərilmiş sahələr, çoxlu su və otlaqlar, dağın lap başında isə qəsr durur». Qala uzun müddət idi ki, Sultan Əhmədin oğlu Sultan Tahir və Cəlair əmirlərindən Əmir Altunun başçılığı ilə müvəf-

fəqiyyətlə müdafiə olunurdu. Qalada 300 nəfərdən artıq döyüşçü vardı[42].Teymuri əmirləri isə növbə ilə qalanı mühasirədə saxlayırdılar. Sonda qalanın müdafiəsi Hacı Seyfəddinin oğlu Sultan Səncərə və Miranşahın xüsusi qoşunlarına tapşırılmışdı. Lakin uzun müddətli mühasirə qala daxilində və qoşunlar içərisində intizamın zəifləməsinə səbəb olmuş, qalanın müdafiəsinə cavabdeh olan şəxslər arasında çəkişmələr başlamışdır. İbn Ərəbşahın yazdığına görə, hətta iş o yerə gəlib çatmışdı ki, qalanı müvəqqəti tərk etmiş Əmir Altun geri döndükdə onu içəri buraxmamışdılar…[43]

Həmin illərdə Sultan Əhməd Cəlairin əlində yalnız Bağdad və İraq-i Ərəbin bir hissəsi qalmaqda idi. Lakin gürcü çarı Georgi hələ də Cəlairlərin ali hakimiyyətini tanımaqda idi və Tiflisdə kəsdirdiyi sikkələr üzərində Sultan Əhmədin adını öz adından əvvəl vurdururdu. ***Fikrimizcə, 1399-cu ilin başlanğıcında gürcülərlə Şəki hökmdarının Əlincə qalasına birlikdə etdikləri hücumun sifarişçisi də Sultan Əhməd olmuşdur*** və bu işdə əsas məqsəd Əmir Teymurun gözlənilən növbəti İran yürüşünə qədər xəzinənin ələ keçirilməsi ola bilərdi. Ş. Ə. Yəzdinin yazdığına görə, elə bu səbəbdən də, Miranşah Seyid Əli Orlatdan şübhələnmiş və **Şəkini qarət etdirmişdir**. Bu fürsətdən istifadə edən gürcülər və **Seyid Əli** Sultan Tahiri xilas etmək məqsədilə Əlincəyə üz tuturlar. Bundan xəbər tutan Sultan Səncər qaladan çəkilir və Təbrizə gedir. Hadisədən xəbər tutan Miranşah oğlu Əbubəkri, Sultan Səncər, Hacı Abdulla, Məhəmməd Qəzğun və Şeyx Məhəmməd Tavazi kimi əmirləri Əlincəyə göndərir. Bu zaman gürcülər də Əlincəyə yetişirlər. Sultan Tahir xəzinəni götürüb, yaxın adamlarından ibarət bir dəstə ilə aşağı düşür və onlarla birləşir. Qalanın müdafiəsi Hacı Saleh və Seydi Əhməd Oğulşana və üç nəfər gürcü aznauruna tapşırılır. Gürcülərin məqsədi Sultan Tahiri xilas etmək idi. Onlar məqsədlərinə çatdıqdan sonra geri dönəndə Təbriz qoşunları onlara çatır, gürcülər Təbriz ləşgərinin sağ və sol cinahına hücum edirlər. Bu vaxt Seydi Əli mərkəzdən irəli çıxıb Əbubəkrin üstünə gedir. ***Şahzadə oxla Seyid Əlini vurur.*** Amma gürcülər qalib gəldiyindən qoşun geri çəkilir və gürcülər öz məkanlarına qayıdırlar.[44]

Əmir Teymur sözügedən hadisədən Hindistanda ikən xəbərdar olur və bu səbəbdən də, yürüşdən təcili olaraq geri dönür. Teymur öz «memuar» ında yazır: «Hindistanı zəbt elədiyim vaxtlarda, Rum qeysərinin mənim məmləkətlərimə basqın elədiyi, gürcülərin isə öz yurdlarından çıxaraq mənim qoşunumun mühasirədə saxladığı bəzi qalalara gedib, həmin qalaların içərisindəki adamlara yardım elədikləri haqqında mənə xəbər gətirdilər. Öz-özümlə genəşdim (məsləhətləşdim): Əgər Hindistanda bir az da qalsam İran məmləkətlərimə zərər yetişəcəyi mümkün idi. Buna görə də, Hindistanın paytaxtındakı işlərimi tezliklə nizama salıb yürüş elədim. Yolda bir neçə gün Mavərənnəhrdə dayandım. Oradan Ruma və Gürcüstana doğru yola düşdüm[45].

Bu hadisədən düz bir il sonra Əmir Teymur 1399-1400-cü illərin qışında Qarabağda olarkən, Əlincə qalası ilə bağlı məlum hadisənin təhqiq olunması üçün məhkəmə qurdurur.

Əmir Teymur 1399-cu ilin sentyabr ayının 22-də Səmərqənddən İran istiqamətində 4-cü yürüşə başlayır. Ş. Ə. Yəzdi yazır ki, …Teymur qoşunları Qaradərə və Ərdəbil yolundan Qarabağ tərəfə üz tutdu və Muğan və Aqtam səhralarında ov etdirib Araz çayı kənarına düşürdü və bu çay üzərində qayıqlardan körpü bağladıb… salamatlıqla çayı keçirdi. [46]

**Şəki hakimi Seyid Əli oğlu Seyid Əhməd** Şirvanşah Şeyx İbrahimin vasitəçiliyi ilə Teymurun hüzuruna gəlir və onunla ittifaq bağlayır. [47] Ümumiyyətlə, Əmir Teymur 1404-cü ilin yazında Səmərqəndə qayıdana qədər, bir neçə dəfə Gürcüstanı çapıb-taladı. Onun Gürcüstana ən axırıncı, 1403-cü ilin ikinci yarısına təsadüf edən hücumu zamanı isə ***Səkinin xristianlar yaşayan şimal hissəsi*** də qırğın, talan və qarətə məruz qaldı. [48]

***Şəki XVI əsrin əvvəllərində yaranan Səfəvilər dövlətinin hədəflərindən biri olmuşdur***. I Şah İsmayıl taxta əyləşdikdən sonra Şəki hakimi onun hakimiyyətini tanıyır. Bunu 1519-cu ildə Şah İsmayılın Təbrizdəki sarayında vassal dövlət başçılarının yığıncağında Şəki hakiminin iştirakı da təsdiq edir. 1552-ci ildə Kaxetiya çarı Şəki üzərinə hücum edəndə Şəki hakimi I İsmayıldan kömək istəmişdi. Kaxetiya çarı öz hərəkətlərinə görə Şah İsmayıldan üzr istəyir. **1524-cü ildə Şah İsmayıl Şirvana, oradan isə Şəkiyə gəlir, Şəki hökmdarı Həsən bəy onu təntənə ilə qarşılayır**. Lakin İsmayıl gedən kimi ***Levon verdiyi sözə xilaf çıxaraq yenidən Şəkiyə hücum edir***. Şəkililər döyüşdə məğlub olurlar. Hadisəni Kərim ağa Fateh belə nəql edir: «Şah İsmayıl ölən ildə (1524-cü ildə-müəlliflər) Gürcüstan valisi Levand xan ***(Şəkidə sözünün üstündə durmayan adama Ləvənd deyirlər)*** qoşun götürüb gəlir, Həsən Sultan da qoşun ilə onun qabağına gedib dava elədilər. Davada Həsən Sultan öldü. Sonra Şəki vilayətinin böyükləri Həsən Sultanın oğlu Dərviş Məhəmməd xanı özlərinə hakim elədilər».[49]

İsmayılın ölümü Səfəvilər xanədanında vəziyyəti dəyişdiyi kimi, vassalların həyatında da dəyişikliyə səbəb oldu. Şirvan müstəqilliyini itirdi, şah Təhmasib tərəfindən Əlqas Mirzə Şirvana bəylərbəyi təyin olundu.[50] Buğurd qalasının müdafəsində Şahruxla birgə Səfəvilərə qarşı döyüşən Dərviş Məhəmməd xan hakimiyyətini saxlamaq üçün Təhmasiblə yaxınlaşdı, 1539-cu ildə onun dul qalmış bacısı, Şirvaşah II Xəlilüllahın qadını Pəricahan xanımla evləndi. Lakin çox çəkmədi ki, Pəricahan xanımın vəfatı səbəbli münasibətlər yenidən kəskinləşdi və gözlənilmədən Şirvan bəylərbəyi təyin olunan I Təhmasibin qardaşı Əlqas Mirzə üsyan qaldırdı.[51] Əlqas Mirzənin tərəfində olan **Dərviş Məhəmməd xan** qardaşı Şahnəzərin başçılığı ilə köməyə dəstə göndərdi. Əlqas Mirzənin üsyanı 1548-ci ildə yatırıldı. Təhmasib üsyanın digər iştirakçısı olan Dərviş Məhəmməd xanı cəzalandırmaq məqsədi ilə **Şəkiyə** cəza dəstələri

göndərdi. Kiş qalasını möhkəmləndirib «Gələrsən-görərsən» də gizlənən Dərviş Məhəmməd xan ölümdən xilas olsa da, ətraf talan olundu.

Nəhayət, 1551-ci ildə Şah I Təhmasib Şəkinin müstəqilliyinə son qoymaq qərarına gəlir. Ərəşdə dayanan qızılbaş qoşunlarına Səfəvilərin vassalı olan Kaxetiya çarı Levon da qoşulur. Dərviş Məhəmməd xanın onları qarşılamağa gəlməməsi hücum üçün bəhanə olur. Qızılbaşların şəkililərin sığındığı qalaya üç istiqamətdən hücumu başlayır. Qorçubaşı *Sevindik bəy, Bəd xan və Şahqulu Soltan Ustaclı* Kiş qalası üzərinə göndərilir. Şəkililər düşmənin üstünlüyünə baxmayaraq, inadlı müqavimət göstərirlər. 20 gündən sonra Kiş qala divarları və bürclər dağıdılır. Sonrakı hadisələrdən bəhs edən Kərim Ağa Fateh yazır: «*…Kiş qalasına gedən xanlar qalaya top və tüfəng vurdular. Qala əhli gördü ki, qala xarab olur, qalanın açarlarını özləriylə gətirib padşahın hüzuruna gəldilər… Sığnaq əhli…padşahın hüzuruna gəlib ərzi-izhar elədilər.*

*Və Dərviş Məhəmməd xan…yalqız qalmağını görüb* ***«Gələrsən – görərsən»*** *dən çıxdı ki, qaça, gedə. Bir para xanlar ki, Əlvənd xan ilə belə o həvalədə dur-muşdular, Dərviş Məhəmməd xanın getməgin qoşun əhli bilib bunları qovurdular.*



***«Gələrsən-görərsən» qalasının qalıqları***

*Bir az yol getməmiş bunlara çatıb dava elədilər…Dərviş Məhəmməd xan özü şamlu **Çərəndab Soltanın nökəri Kosa Pirq**ulu adlı adam ilə bərabər gəlib dava elədilər. Kosa Pirqulu buna artıq gəlib, başın kəsib padşahın hüzuruna gətirdi. Padşah buna çoxlu pul və xələt verdi və Şəki vilayətini zəbt etdi».*[52]

Beləliklə, Şəki hökmdarlığı ləğv edildi və onun ərazisi Səfəvilər dövlətinin tərkibinə qatıldı. **Toygün bəy Qacar Şəkinin ilk qızılbaş hakimi təyin olundu.**[53]

Səfəvi dövlətinin əyalətinə çevriləndən sonra Şəkidə ***məliklik*** adlanan idarəetmə sistemi tətbiq edildi.

XVIII əsrin əvvəllərindən başlayaraq Səfəvi dövləti siyasi, iqtisadi və maliyyə böhranı keçirir. Boşalmış xəzinəni əhali hesabına doldurmaq cəhdləri əhalinin narazılığını bir az da artırır. *1709-cu ildə Gəlzayi adlanan əfqan tayfasının nümayəndəsi Qəndəhar kələntəri Mir Veysin başçılığı ilə üsyan, 1711-ci ildə Car camaatının üsyanı və bu üsyanda **Şəki hakiminin də iştirakı**, 1715-1716-ci illər kürdlərin və əfqanların üsyanı, 1722-ci ildə Rusiyaya arxalanaraq IV Vaxtanqın başçılığı ilə gürcülərin üsyanı bu narazılığın təzahürü idi.*

Yaranmış vəziyyətdən yararlanmaq istəyən Rusiya Qafqazın işğalına can atır, XVIII əsrin 20-ci illərində Xəzərsahili vilayətlərin ələ keçirilməsi planlarını reallaşdırmağa başlayır.

Osmanlı ordusu da süqutu yaxınlaşan Səfəvi dövlətinin ərazisinə göz dikmişdi. Nəhayət, 1724-cü il iyunun 12-də İstanbulda bağlanan sülh müqaviləsinə görə İrəvan, Gürcüstan və Xəzəryanı bölgələr istisna olmaqla, bütün Azərbaycan ərazisi Osmanlıya verildi. Başqa sözlə, bütün Xəzəryanı vilayətlər Rusiyanın, Cənubi Qafqazın qalan hissəsi isə Osmanlı dövlətinin tərkibinə daxil edilirdi.[54]

*XVIII əsrin ikinci yarısı Şəkinin tarixinin ən ağrılı-acılı səhifələrindən birini təşkil edir.* 1772-ci ildə şəhərin qərbindəki Kiş çayından gələn güclü sel şəhərin bir hissəsini dağıdır, o vaxtdan şəhər bir qədər şərqdə – **Nuxa** kəndi ərazisində inkişaf etməyə başlayır. «Qafqaz» qəzeti 1846-cı il 15 iyul tarixi nömrəsində o zamankı fəlakətdən bəhs edərək yazmışdır: «…Dəhşətli daşqın əmələ gətirən Kiş çayı Şəkini xarabazara döndərdi, onun bütün evlərini bünövrəsindən qopardı…Minlərlə adam bu dəhşətli selin qurbanı oldu…o vaxtdan şəkililər vadinin şərq sahilinə – dağların ətəklərinə çəkildilər. İndiki Nuxa şəhəri elə burada əmələ gəlmişdir».[55] Araşdırmalar göstərir ki, ***XVIII əsrin axırlarınadək Nuxa kəndi olmuşdur***.

***Xatırlatma:***

***Kişçayda güclü sellər 1772, 1896, 1901, 1903, 1910, 1911, 1916, 1926, 1936, 1937, 1941, 1955, 1957, 1958, 1959, 1982, 1988, 2004-cü illərdə olmuşdur. Sel daşqınları Şəki şəhərini, şəhərin Dodu hissəsini, Kiş, Oxut, Baltalı, Qaradağlı kəndlərini təhlükə altında qoymuşdur. Selin əmələ gəlmə sahəsi 1.500 hektardan çoxdur.*** [56]

XVIII əsrin 40-cı illərindən başlayaraq Azərbaycanda azadlıq hərəkatı yeni mərhələyə qədəm qoyur. Nadir şahın hakimiyyəti illərində əhalinin vəziyyətinin daha da ağırlaşması, müxtəlif dövlətlərin işğalçılıq müharibələrinin girdabında inləyən xalqın soyulub talan edilməsi mərkəzi hakimiyyətdən narazılığı daha da artırır. Belə bölgələrdən biri də, ***Ş ə k i*** idi. Nadir şahın Şəkidəki nümayəndəsi Məlik Nəcəfin əhali ilə bəd rəftarı, vergi toplanmasındakı özbaşınalıq Şəki əyanlarının Nadir şaha şikayəti ilə nəticələnir. Şikayətnamədə məliyin başqa birisi ilə əvəz olunması xahiş olunur. Şəki əyanlarının önündə isə Hacı Çələbi dururdu.

Sözsüz ki, Nadir şah öz hakimini azad etməzdi. Odur ki, Məlik Nəcəfin işinə nəzarət edilməsi üçün yerli əyanlardan birinin seçilməsini məsləhət bilir. Belə şəxslərdən bir ***Hacı Çələbi*** olur. Məlik Nəcəf də baş vermiş hadisədən razı olmadığından ilk fürsətdə Hacı Çələbidən şaha şikayət edir. Hadisələrin təfərrüatı «Azərbaycan tarixi» dərsliklərində kifayət qədər izah olunduğundan təkcə onu bildiririk ki, hadisələrin sonu Hacı Çələbinin Şəkinin gerçək hakiminə çevrilməsi ilə nəticələnir.[57]

Nadir şah 1744-cü ilin qışında **Şəki** üzərinə yürüşə başlayır. Kərim Ağa Fateh nəql edir: *«Şah qoşun götürüb, gəlib Daşbulaq kəndinin yanında **Kotan düzü** deyərlər, orada ordunu qoyub, bir para zübdə qoşun götürüb Gələrsən (və)*

*görərsən tərəfə gedər. Çoq dava edərlər, (hər) iki tərəfdən çoq adam ölür. Hətta şahın qabağında pişxidmətini vururlar. Şahın üləmaları ərz elərlər ki, sənə fada olaq, bir para ac, bimənfəət adamlardan ötrü qoşunu necə hasət qırdırırsan. Sora şah qəbul edib, qayıdıb ordusunda bir neçə vaxt əgləşib».*[58]



***Hacı Çələbi Nadir şahın hüzurunda (Şəkidəki R.Əfəndiyev adına Tarix-diyarşünaslıq muzeyindəki isllüstrasiya (rəssam İsmət)***

1745-ci ilin fevralında Nadir şah **Şəkiyə** daha bir yürüş etsə də, məğlub olur. 1746-cı ilin mart ayında Hacı Çələbi Nadir şahla saziş bağlayır.

Tariximizə xanlıqlar mərhələsi kimi daxil olmuş XVIII əsrin ikinci yarısı, həm də feodal qurumları arasında ziddiyyətlər dövrü oldu. Ölkəni birləşdirmək istəyən Hacı Çələbi Nadir şah öldürüldükdən sonra Qəbələ və Ərəş mahallarını **Şəki xanlığına** qatdı, Təbrizə yürüş etdi, Gəncə və Qarabağ torpaqlarına iddia irəli sürdü. «Hacı Çələbinin Təbriz hakimi Əmir Aslanın müqavimətini qıra bilməməsi bir yana qalsın, onu Şəkiyə endirdiyi cavab zərbəsinin qarşısını alarkən oğlu Həsən ağanın öldürülməsi, Bayat qalasının uğursuz mühasirəsindən sonra Azərbaycanın bir sıra xanlarının gürcü hakimləri ilə müttəfiq olaraq Şəki xanlığına qarşı vahid cəbhədə birləşməsi Hacı Çələbi xanı və təmsil etdiyi Şəki xanlığının əhalisini ağır sınaqlara məruz qoydu».[59]

1751-ci ildə Kartli-Kaxetiya çarı Teymuraz və oğlu II İrakli böyük hərbi

qüvvə ilə Alazan çayını keçərək Car vilayətinə soxulur. Hacı Çələbi carlıların köməyinə gəlir, fevral ayında baş vermiş döyüşdə gürcülər məğlub olur. Bundan sonra II İrakli atası Teymurazın məsləhəti ilə Azərbaycan xanlarını Hacı Çələbiyə qarşı ittifaqda birləşdirmək qərarına gəlir. Qarabağ xanı Pənah xan, Gəncə xanı Şahverdi xan, Qaradağ xanı Kazım xan, İrəvan xanı Hüseynəli xan, Naxçıvan xanı Heydərqulu xan bu ittifaqa daxil olurlar. Hadisələrin sonrakı gedişi maraqlı sonluqla bitir. Kərim ağa Fateh hadisəni belə təsvir edir: «Bir neçə vaxtdan sonra xoylu Əhməd xan və qaradağlı Kazım xan və qarabağlı Pənah xan və gəncəli Şahverdi xan həsəd edirlər ki, Hacı Çələbi neçin belə böyük olmaq gərək. Bunlar dördü Gürcüstan valisinə adam və kağız göndərirlər ki, biz və sən qoşun götürüb Hacı Çələbiyə tənbeh eləyək.

(Və) vali qoşun götürüb gəlir; o dört xanlara adam göndərir, onlar da gəlirlər. Vali onların dörtünü də tutub öz qoşunu ilə Çələbinin üstünə gəlir. Xanları da öz yanında dustaq gətirir.

Hacı Çələbi bunu eşidib, bu da qoşun götürüb, gedib Şəmkir tərəfində vali ilə dava eləyir. Vali çoq pis basılıb, çoq adamları ölüb, qayıdıb gedibdir. Hacı Çələbi o dört xanları da valinin əlindən alıb mürəxxəs eləyib, (onlar) öz ölkələrinə gedibdirlər».[60]

Hacı Çələbi bu qələbədən sonra Qazax və Borçalı mahallarını da öz nəzarəti altına alır və oğlu Ağakişi bəyi bura hakim təyin edir. Görkəmli tarixçi alim Süleyman Məmmədovun yazdığı kimi, tariximizə «Qızıl qaya» xəyanəti adı ilə daxil olmuş bu hadisə bir daha göstərdi ki, Azərbaycan xanları birləşməli və ümumi düşmənə qarşı vahid cəbhədə mübarizə aparmalı idilər.[61] Sonrakı hadisələr göstərdi ki, Hacı Çələbi Teymurazla qonşuluq münasibətlərini bərpa etmək istəmiş, lakin çar Teymuraz Kabardadan göndərilən 2.000 nəfərlik qoşunun köməyi ilə Ağakişi bəyi Borçalı və Qazaxı tərk etməyə məcbur etmişdir.[62]

Hacı Çələbi 1755-ci ildə Şirvanı öz hakimiyyəti altına almaq məqsədilə Ağsunu mühasirəyə alır. Rəşid bəy İsmayılov bu hadisədən bəhs edərək yazır: «Hacı Çələbinin Şirvanı təsəvvür etmək qəsdiylə Ağsunu mühasirə etdi, vali məğlub olub çəkildi. Kəsrəti-qeyrətdən bu dərdə davam etməyib Hacı Çələbi iki aydan sonra öldü».[63]

Nuxa xanlığı 1743-1826-cı illərdə mövcud olub. Doğrudur, 1819 -cu ildə çar idarəsi xanlığı ləğv etmişdir, lakin xanın oğlu Hüseyn xan Şəkidə hakimiyyəti ələ keçirmiş, üç ay-1826-cı ilin avqustundan-oktyabr ayınadək xanlıq etmişdir.

### *1743-1819-cu illərdə Nuxa xanlığının başında*

Hacı Çələbi xan Qurban bəy oğlu: **1743-1755**
Ağakişi xan Çələbi xan oğlu: **1755-1759**
Məhəmmədhüseyn xan Həsən ağa oğlu: **1759-1780**
Hacı Əbdülqadir xan Hacı Çələbi xan oğlu: **1780- 21.12.1783**

Məhəmmədhəsən xan Məhəmmədhüseyn xan oğlu: **21.12.1783- 12.1795**
Səlim xan Məhəmmədhüseyn xan oğlu: **12.1795-1797**
Məhəmmədhüseyn xan Həsən xan oğlu: **1797-1805**
Fətəli xan Məhəmmədhüseyn xan oğlu: **1805- ci ilin başlanğıcı (2-3 ay)**
Səlim xan Məhəmmədhüseyn xan oğlu: **1805-6.1806**
Fətəli xan Məhəmmədhüseyn xan oğlu: **1806-1.1807 ( bir neçə ay)**
Xoylu Cəfərqulu xan Dünbüli: **1.1807-26.8.1814**
İsmayıl xan Cəfərqulu oğlu: **9.1814 -15.8.1819**
Hüseyn xan Səlim xan oğlu: **avqust – oktyabr 1826**
durmuşlar.[64]

Hacı Çələbinin ölümündən sonra hakimiyyət uğrunda mübarizə qızışdı. Qubalı Fətəli xan, şamaxılı Mustafa xan, qarabağlı İbrahim xan və Ağaməhəmməd şah Qacar Nuxada hakimiyyət uğrunda mübarizədə iştirak etdilər. Ağakişi xanın qayınatası Qazıqumuq xanı Məhəmməd xan qoşunla Ərəş mahalına gələrək kürəkəni ilə görüş bəhanəsi ilə Ərəş sultanı Məlik Əli ilə birləşərək Ağakişi xanı öldürüb Şəkini ələ keçirdi. 40 günlük ağalığı dövründə o, əhaliyə əzab-əziyyət verdi. Nəhayət, cana doyan Nuxa əhli 1759-cu ildə ayağa qalxaraq onu qovdu. Xalq hərəkatının rəhbəri Hacı Çələbinin nəvəsi Məhəmmədhüseyn xan Həsən xan oğlu xanlığa yiyələndi. Lakin çox çəkmədi ki, Çələbinin oğlu Cəfər ağa ilə onların arasında münaqişə yarandı. Nəticədə Cəfər ağa öldürüldü. Bundan sonra hakimiyyət uğrunda mübarizəyə Hacı Çələbinin sağ qalan oğlu Hacı Əbdülqadir qoşuldu. O, atasının əmisi oğlu Hacı Rəsul bəyin, Ərəş məlikliklərinin və Nuxa əyanlarının köməyi ilə 1779-cu ildə Məhəmmədhüseyn xanı öldürüb hakimiyyəti əlinə aldı və üç il hakimiyyətdə qala bildi.

Məhəmmədhüseyn xanın Qarabağa qaçmış oğlu Səlim xan Əbdülqadir xanın qubalı Fətəli xanla yaxınlaşmasından əndişələnərək bu yaxınlaşmanı Qarabağ üçün təhlükə hesab etdiyindən Cara gedib qoşun topladı və İbrahimxəlil xanın əli ilə Nuxada hakimiyyəti ələ keçirmək üçün hücum etdi. Əbdülqadir xan Şirvana qaçaraq Ağasi xana sığındı. Ancaq Ağasi xan Əbdülqadir xanı Məmmədhəsən xana verdi və Məhəmmədhəsən xan babası Həsən ağanın doğma qardaşı Əbdülqadir xanı və 7 nəfər azyaşlı övladını məhv etdi.

1783-1795-ci illərdə Nuxada xanlıq edən Məhəmmədhəsən xan özünə rəqib hesab etdiyi atabir anaayrı qardaşı, bizə tanış olan Kərim ağa Fatehin




***Şəcərə Z.Ə.Cavadovanın «Şimal-Qərbi Azərbaycan (tarixi-demoqrafik tədqiqat)» kitabından (Bakı: «Altay» nəşriyyatı, 1999, 106 s., səh.87 ) götürülmüşdür***

atası Fətəlinin gözlərini çıxartdırdı,[65] digər qardaşı Səlim xanı sıxışdırmağa başladı. Səlim xan qorxusundan Car vilayətinə qaçdı və 1795-ci ildə Nuxaya hücum etdi. Məhəmmədhəsən xan Xaçmaza qaçsa da, şahın sərkərdəsi Dəvəli Mustafanın əlinə keçdi və onun gözləri çıxardılaraq Təbrizə göndərildi. Fətəli xanın başına gələnləri unutmayan Səlim xan 1795-ci ildə hakimiyyəti ələ alaraq Məhəmmədhəsən xanın 7 nəfər azyaşlı uşağını məhv etdi.

Məlum olduğu kimi, 1797-ci ildə Ağaməhəmməd şah Qacar ikinci dəfə Azərbaycana hücum edərkən Təbrizdə olan kor Məhəmmədhəsən xanı da özü ilə götürmüşdü.[66] Bu xəbəri eşidən Səlim xan qaçdı. Məhəmmədhəsən xan Şirvan xanı Mustafa xanın köməyi ilə yenidən Nuxa xanı oldu. 8 illik ikinci hakimiyyəti illərində o, Mustafa xanla münasibətləri ayırd etməyə cəhd etsə də, sonda hər iki tərəf məsələni güc yolu ilə həll etmək qərarına gəldi. Kərim ağa Fateh yazır ki. «Şəki əhli böyük – kiçik yığılıb, mənim atam Fətəli xanın üstünə cəm olub, andlar içib, bərk ittifaq edib tarixi-islamiyyə min iki yüz on doqquzda olanda (1805) xan elərlər. İki-üç ay xanlıq edər».[67]

1801-ci ildə Şərqi Gürcüstanın və Gürcüstandan asılı olan Qazax və Şəmsəddil sultanlıqlarının Rusiyaya birləşdirilməsi Azərbaycanın işğalına yol açdı.[68] İlk vaxtlar ayrı-ayrı xanlıqları ələ almaq və müxtəlif vasitələrlə onları öz tərəfinə çəkmək yolu tutan Rusiya məqsədinə nail olmadıqda hərbi yola üstünlük verdi.

Qafqazdakı rus qoşunlarının baş komandanı, general Sisianovun ilk hədəfi Car-Balakən oldu. 1803-cü ilin yazında Balakəni viran edən rus qoşunları Gəncə xanlığını ələ keçirmək istədi. Çünki Gəncə qalası rus qoşunlarının Azərbaycanın içərilərinə doğru sonrakı irəliləyişinin açarı idi.[69] Lakin Cavad xanın təslim olmaq istəməməsi yeni hərbi müdaxilə üçün bəhanə oldu. Gəncədəki namərd ermənilərin dəstəyinə arxayın olan Sisianov 1804-cü il yanvarın 3-də Gəncə qalasına hücum etdi. Gəncəlilərin inadlı müqavimətinə baxmayaraq, rus qoşunları şəhəri işğal edə bildilər. Xanın döyüşçülərindən 250 nəfər şəhid oldu, 500 nəfər əsir aparıldı. Döyüşdə Cavad xan və oğlu Hüseynqulu ağa qəhrəmancasına həlak oldu. Gəncə xanlığı ləğv olunaraq dairəyə çevrildi. Şəhər I Aleksandrın arvadının şərəfinə ***Yelizavetpol*** adlandırıldı.[70]

1805-ci ilin yazında Gəncə yaxınlığında düşərgə salmış Sisianov Qarabağ xanlığından mövqeyini bildirməyi tələb etdi. Başqa sözlə, Sisianov Qarabağ xanlığını Rusiya tabeliyinə keçməyə məcbur etdi. Mayın 14-də Kürəkçay sahilində bağlanmış müqaviləyə görə, Qarabağ xanı Rusiyanın vassalı olmağa razı oldu, xarici dövlətlərlə müstəqil münasibətlər saxlamaq hüququnu Rusiyaya verdi, çar xəzinəsinə hər il 8 min çervon bac verməyi öhdəsinə götürdü.[71]

Kürəkəni İbrahimxəlil xandan sonra ***Nuxa xanı Səlim xan da Sisianovun iqamətgahına gəlib, 1805-ci il mayın 21-də Gəncə yaxınlığında Rusiya ilə Nuxa xanlığı arasında müqavilə imzaladı və Nuxa xanlığı Rusiyanın himayəsinə*** **keçdi.**[72]

Səlim xan dövlət xəzinəsinə ildə 7 min çervon xərac verməli, Nuxada 500 nəfərlik rus hərbi hissəsini yerləşdirməli və onların bütün ehtiyaclarını ödəməli idi.[73] Xanın oğlu kiçik olduğundan (4 yaşlı idi) sədaqət əlaməti olaraq onun

əvəzinə beş bəyin uşağını əmanət verməli, iki ildən sonra öz oğlunu daimi yaşamaq üçün Tiflisə göndərməli idi.[74] Lakin bir il sonra Qarabağ xanı öz ailəsi ilə öldürüldü. Bu hadisə barədə Mir Mehdi Xəzani yazır: «Onlardan əlavə 17 nəfər bəy və bəyzadə, mirzə və nökər qətlə yetirilmişdilər ki, adları təfsil ilədir:

- İbrahim xan özü, Tubu bəyim-şəkili Hüseyn xanın qızı-hərəmi-xan, Səltənət bəyim-səbiyəy-xan, Abbasqulu ağa-fərzəndi-xan, Hacı Hüseynəli bəy Kəbirli, Mirzə Haqverdi Kəbirli, Hümmət bəy Cavanşir, Həsən ağa ibn Gülmalı bəy Sarıcalı, Mirzə Tağı Əfşar, Əlipənah-pişxidmət, Xacə Həsən ibn Əcəmoğlu Kəbirli, Qaranın iki oğlu, başqa iki nəfər, birinin adı Teymur, iki nəfər də şuşalı».

Səlim xan bacısının İbrahim xanla birlikdə qətlə yetirilməsindən əsəbləşərək itaətdən çıxmaq əlaməti olaraq Şəkidə yerləşdirilmiş rus qarnizonunu xanlığın hüdudlarından çıxardı.[75] 1806-cı il oktyabrın 22-də Nuxa yaxınlığında baş verən həlledici döyüşdə Səlim xanın qoşunu məğlub edildi. 1807-ci ilin yanvar ayında Cəfərqulu xan Xoylu Nuxaya xan təyin olundu.

Rus general-qubernatoru Nebolsinin başçılıq etdiyi dəstənin ələ keçirdiyi qənimətlər içərisində xanlığın ***6 bayrağı*** da olmuşdur. Onlardan üçü Azərbaycan Tarixi Muzeyində saxlanılır.[76]

***Oxucuların Azərbaycan xanlıqlarının, o cümlədən Nuxa xanlığının bayraqları haqqında bilgilərinin az olduğunu nəzərə alaraq onlar haqqında ətraflı məlumat verməyi gərəkli hesab etdik.***

Ölçülərinə görə Nuxa xanlığına məxsus bayraqların ***ən böyüyü*** 245x237 sm. olub beşbucaqlı formasındadır.

***Moruq rəngli orta hissəsi ipək saplarla və güləbətinlə işlənmiş ornamentlərlə örtülmüşdür. Bayraq quması xara (zərxara) parçadandır. Bayrağın kənarlarına yaşıl xara parçadan enli haşiyə salınmışdır. Ortada, güləbətin saplarla işlənmiş şaquli istiqamətli xətlər arasında, sapı ipək saplarla cərgə-cərgə səkkiz guşə və altıguşə ulduzlar, həndəsi qab fiqurları çəkilmiş, onların arasında isə, dəyirmi, rombvarı və üçbucağa oxşar kiçik fiqurlar salınmışdır.***

***Bayrağın yaşıl xaradan olan haşiyəsi üzərində sarı ipək saplarla şahmat qaydasında səkkizguşə ulduzlar çəkilmişdir.***

***Eyni təsvirlər bayrağın astar tərəfində də işlənmişdir. Bayrağın parça hissəsinin bəzi yerləri zədəlidir. Açıq-qəhvəyi boya ilə rənglənmiş bayraq sapı (uzunluğu 289 sm. kəsikdə diametri 3,8 sm.) bir çox yerlərdən çatlamışdır. Dəmir ucluq (uzunluğu 52 sm.) üç hissədən ibarətdir. Konusvari borunun üst tərəfində qabarıq kəmərlik qoyulmuş, başına içi boş «alma» taxılmışdır. «Alma» nın üst hissəsinə dəmirdən dördtilli süngü keçirilmişdir.***[77]



*Nuxa xanlığının bayrağı (böyük bayraq – 245x237 sm.)*

**İkinci bayraq həm ölçülərinə, həm də tikilişinə görə birincidən fərqlənir.** ***Tarixdən məlumdur ki, Nadir şahın bir qədər əvvəl Nuxa valisi təyin etdiyi Hacı Çələbi Nuxa vilayətini müstəqil xanlıq, özünü isə xan elan etmişdir. Yalnız uzun müddət davam edən qanlı döyüşlərdən sonra «Gələrsən-görərsən» qalasında mühasirəyə alınmış Hacı Çələbi Nadir şahın hakimiyyətini tanımışdır. Nadir şaha məxsus bayraq elə həmin dövrdən Nuxa xanlığının bayraqlarından biri olmuşdur. Lakin əlimizdə bu bayrağın hədiyyə olduğu və ya savaş zamanı əldə olunduğu barədə dəqiq məlumat yoxdur. Bayraq 1605-cı ildə hindistanlı Hacı Hüseyn tərəfindən hazırlanmışdır. Nadir şahın Hindistan yürüşündə əldə etdiyi qənimətlərdən olmuşdur. Bayrağın üz tərəfində sarıya çalan açıq qəhvəyi (bej) tirmə parçanın yerində cərgə ilə butalar salınmışdır.***

***Düzbucaqlı üçbucaq formasında olan ikinci bayrağın ölçüləri 143x105x93,5 sm.-dir. Üz və astar tərəfləri müxtəlif növ parçalardan tikilmişdir. 1806-cı ildə məğlub edildikdən sonra xan adından məhrum edilmiş nuxalı Səlim xana mənsub olan döyüş bayrağı ruslar tərəfindən ələ keçirilmişdir. Qırmızı çiçək və yaşıl yarpaqlardan tərtib edilmiş butaların bir cərgəsi sola, digəri isə sağa tərəfdir. Bayrağın açıq qəhvəyi rəngli saya parçadan olan astar hissəsinin üzərində əvvəldən olan sanskrit yazılarla yanaşı, sonradan ərəb və fars dillərində əlavələr edilmiş, Quranın müxtəlif surələrindən ayələr, eləcə də həmin ayələrin başlanğıcında mənası, məqsəd və mahiyyəti bu gün də alimlər üçün anlaşılmaz olaraq qalan, «Allahın sirri» hesab edilən bir və ya bir neçə hərf verilmişdir. Böyük kvadratın aşağı haşiyələrində və bütövlükdə bayrağın kənarlarında da Quran ayələri verilmişdir (mim, ha, mim, dəl: dəl, mim, ha və s.).***



*Nuxa xanlığının bayrağı*
*(ikinci bayraq, 143x105x93,5 sm.)*

***Bayraq qumaşı üzərindəki yazılar onu üç hissəyə – ortada yerləşən böyük kvadrata və kənarlarda yerləşən iki düzbucağa bölür. Böyük kvadrat hər birində Quran ayələrindən ayrı-ayrı sözlər olan kiçik kvadrat xanalara (100x100) bölünüb. Düzbucaqlı üçbucaqlarda da içərisində Quran yazıları olan kvadrat xanalar, müxtəlif ayə və kiçik sürələr yerləşdirilmiş, Allahın epitetləri qeyd edilmiş, sağ düzbucaqlıda, həmçinin döyüşdə qələbəyə inam və ümid yaradan «Kömək allahdandır və yaxın qələbə» Quran ayəsi verilmişdir.***

***Bayrağın sapı 297 sm-dir. Qara və yaşıl rənglərlə boyanmışdır. Mis ucluq üç hissədən ibarətdir. Konusvari borunun başına əzilmiş alma formasında olan «alma» taxılmışdır. Üst hissə ortası qabarıq, yarpaq formasında kəsilmiş içi boş ucluqdan ibarətdir. Bütün ucluq qızıl suyuna salınmışdır. Yarpağın uzunluğu 26 sm., eni 16 sm., qalınlığı 16 sm-dir.***[78]

**Üçüncü bayraq düzbucaqlı üçbucaq formasında olub ikiqat parçadan əl ilə tikilmişdir.** ***Ölçüləri 224x178x137 sm-dir. Naxışlı cəhrayı qanovuzdan olan bir üzündə mavi və qızılı saplarla gül budağı üstündə oturmuş və dimdik-dimdiyə dayanmış quş və balıq təsvirləri toxunmuşdur. Bayrağın göy xara ipəkdən olan o biri üzünə, qızılı ipək saplarla toxunmuş uzunsov yarpaqvari damaların içinə qızılı və yaşıl saplarla gül ornamenti salınmışdır. Bayrağın iki tərəfdən kənarlarına saçaq çevrilmiş, nazik zərxara köbə üzərində quş, dovşan, gül və yarpaq təsvirlərindən ibarət ornament salınmış, köbənin qırağına güləbətin saplardan saçağı olan ensiz qızılı lent tikilmişdir. Qumaşın bayraq ağacına taxılması üçün qara, altı sarı qəhvəyi rəngdə olan nazik ipək torbacıq tikilmişdir. Bayraq ağacının uzunluğu 228 sm-dir. Qara boya ilə örtülmüşdür. Qızıl suyuna salınmış üç hissəli mis ucluq (uz.52 sm, eni 12 sm) konusvari borudan, ona taxılmış içi boş «alma» dan və «alma» nın üst hissəsinə birləşdirilmiş ortası qabarıq, kənarları qırçınlı içi boş yarpaqdan ibarətdir.***[79]

Rus qoşunlarının hücumlarını şəkililər hiddətlə qarşıladılar. Üsyan 1807-ci il aprelin 28-də başlandı. Üsyana Baş Göynük kənd sakini ***Sultan Murad*** başçılıq edirdi. Kənd əhalisi yaşayış yerlərini tərk edərək Burc (Dağıstan ərazisində yerləşir) kəndi yaxınlığında düşərgə salır və Nuxa xanı Cəfərqulu xanın göstərişlərinə əməl etməkdən, dolayısı ilə Rusiya hakimiyyətindən imtina edirlər. Üsyançılar Şirvan xanı ilə də əlaqə yarada bilmişdilər.



***Nuxa xanlığının bayrağı (üçüncü bayraq, 224x178x137)***

Üsyanın miqyasının genişlənməsindən qorxan hakim dairələr mayor Qrekovu 100 nəfər əsgər və hərbi sursatla üsyançıların üzərinə göndərir. Cəfərqulu xanla İlisu sultanlığının 1.000 nəfərlik birləşmiş qüvvələri də onlara qoşulur.[80] Birləşmiş qüvvələrlə üsyançılar arasındakı döyüş üsyançıların məğlubiyyəti ilə nəticələnir. Mustafa xandan gözlənilən köməyin gəlməməsi, toplardan açılan atəşlə üsyançıların arasına çaşqınlıq salınması üsyançıların təsliminə gətirib çıxarır. Üsyan rəhbəri Sultan Murad ailəsi ilə birlikdə dağlara qaçsa da, bir neçə gündən sonra ələ keçir.

1807-ci il üsyanı yatırılsa da, 1808-ci ildə yenidən narazılıqlar başlanır, azadlıq mübarizəsi baş qaldırır. Bu mübarizəyə İrana qaçmış ***Səlim xan*** rəhbərlik edir. Səlim xanın yerli tərəfdarlarına göndərdiyi məktubdan xəbər tutan Cəfərqulu xan Səlim xanla əlaqəsi olanları və yaxın qohumlarını girov götürərək qalaya saldırır.[81] Nəhayət, Səlim xan 1808-ci ilin iyununda Kür çayına yaxınlaşır. Buradakı yerli qüvvələri səfərbərliyə alaraq Nuxaya hücuma

hazırlaşır. Bu xəbəri eşidən Nuxa xanı Cəfərqlu xan Kür sahillərinə gəlir. General-mayor Nebolsinin və polkovnik Lisaneviçin başçılığı altında olan 600 piyada və bir top Cəfərqulu xana köməyə göndərilir. Bu vaxt Cəfərqulu xanın olmamasından istifadə edən Nuxa əhalisi üsyan qaldıraraq Səlim xanın tərəfdarlarına qoşulurlar. Səlim xanın məmuru Məmməd bəy 500 nəfərlik qoşunla Nuxa qalasına yaxınlaşır. Lakin Səlim xan Kür sahillərində qarşılaşmaqdan vaz keçir və İrana qayıdır. Vəziyyətdən istifadə edən Cəfərqulu xan üsyanı asanlıqla yatıra bilir. Üsyançılara divan tutulur, bir hissəsi döyülərək cəzalandırılır, bəylər isə mühakimə üçün Tiflisə göndərilir. Onlar orada mühakimə edilərək Sibirə sürgünə göndərilirlər.

*Cəfərqulu xan 1814-cü il avqustun 22-də qızdırma xəstəliyindən vəfat edir*. Yerli əhalinin kəskin müqavimətinə baxmayaraq onun yerinə oğlu **İsmayıl** xan təyin olunur. Xanın rəsmən elan edilməsi məqsədilə gələn general-mayor Axverdov Nuxadan gedən kimi narazılıq bir az da güclənir. Üsyançılar yeni xanı tanımayacaqlarını bəyan edirlər. Həmin vaxt Nuxada yerləşdirilmiş Sevastopol piyada polkunun kapitanı Danibekov üsyan təhlükəsindən qoxuya düşür. O İsmayıl xanla məsləhətləşərək üsyan başçıları ilə danışıqlara girir, lakin vədinə xilaf çıxaraq danışığa gələn 4 nəfəri həbs edir. Üsyançılar vəziyyətin gərginliyini başa düşərək şəhər ətrafına çəkilirlər. Danibekov 70 əsgər və bir topla üsyançılar üzərinə hərəkət edir. Silahsız üsyançılar qeyri-bərabər döyüşdən imtina edərək öz evlərinə qayıdırlar, zahirən də olsa nisbi sakitlik yaranır. Üsyançıların bir dəstəsi Tiflisə gedərək Ratişşevlə görüşmək istəsələr də, nail ola bilmirlər. Yalnız 16 nəfər generalla görüşməyə müvəffəq olur, lakin Ratişşev onların şikayətinə qulaq asmır, onları hərbi məhkəməyə verir. Üsyançıların bir hissəsi Sibirə sürgün olunur, qalanlar isə cəzalandırılması üçün İsmayıl xanın sərəncamına göndərilir. Beləliklə, **1814-cü il Nuxa üsyanı** yatırılır.

Nuxada baş verən hadisələr Rusiya hakimiyyətinin İsmayıl xana olan inamını azaldır. Bu inamsızlığı hiss edən xan fürsət düşən kimi ailəsi ilə qaçmağı planlaşdırır. Belə bir vaxtda milliyyətcə erməni olan general V.Q.Madatov Nuxaya gəlir. O, Nuxa komendantı mayor fon Disterlova İsmayıl xan öldükdə onun möhürünü götürməyi, vergilər üzərində nəzarəti gücləndirməyi, sakitliyi qorumağı tapşırır. Başqa sözlə, İsmayıl xanın qətlinə fərman verir. Bu göstərişdən 4 gün sonra ***-1819-cu il iyulun 24-də İsmayıl xan «vəfat edir».*** Onun zəhərlənərək öldüyü bildirilir. İsmayıl xanın ölümündən sonra Rusiya hökuməti yeni varis təyin etmir və **1819-cu il iyulun 31-də Nuxada xanlıq üsul-idarəsi ləğv edilir.**[82]

XIX əsrin birinci yarısında baş verən Rusiya-İran müharibələri Azərbaycan torpaqlarının Rusiya ilə İran arasında bölünməsi ilə nəticələndi. 1826-cı ildə Azərbaycan ərazisində mövcud olan xanlıqlar ləğv edildi. Yeni yaradılmış ərazi vahidlərini-əyalətləri Qafqazın baş komendantı tərəfindən təyin edilən çar zabitləri – komendantlar idarə etməyə başladılar.

1828-1829-cu illərdə Rusiya ilə Türkiyə arasında müharibə baş verdi. Türkmənçay müqaviləsindən sonra davam edən rus-türk müharibələrində iştirak etmək üçün işğal edilmiş Cənubi Qafqazın müsəlman vilayətləri əhalisindən, o

cümlədən azərbaycanlılardan ibarət **müsəlman alayları** və **Kəngərli süvari dəstəsi** formalaşdırıldı. 1828-1829-cu illər rus-türk müharibəsi iştirakçısı general N.N.Muravyov-Karski yazırdı ki, General Paskeviç qarşıdakı türk səfərinə hazırlaşarkən itaətimiz altında olan Zaqafqaziya əhalisindən müvəqqəti hərbi hissələr təşkil etmək fikrini irəli sürdü. Azərbaycanlılardan təşkil olunacaq ordu hissəsinin beş alaydan ibarət olması nəzərdə tutulurdu.

**Birinci** alay *qarabağlılardan,* **ikinci** alay *şirvanlılardan*, **üçüncü** alay ***nuxalılardan***, Azərbaycanın qərb zonasında olan *beş distansiyadan* bir alay, *irəvanlılarla naxçıvanlılardan* isə daha bir **alay** təşkil olunmalı idi. Hər bir alay 500 nəfərdən ibarət olub beş hissəyə bölünməli idi. Alayları bir-birindən fərqləndirmək üçün onlara xüsusi bayraqlar verilməsi nəzərdə tutulurdu.[83] Azərbaycan atlı alaylarına veriləcək bayraqlar bir tərəfdən həmin alayların vahid hərbi hissə kimi rəsmiləşdirildiyini təsdiq edirdisə, digər tərəfdən onların cəsarət və igidliklərini əks etdirirdi.

Təşkil olunan alaylardan üçüncüsü ***Nuxa alayı** idi.*

*Üçüncü alayın (Nuxa) bayrağının rəngi sarıdır. Ətrafı zər saçaqlarla əhatə olunmuşdur. Bayrağın ağac dəstəsinin ucunda sarı rəngli kürə vardır. Kürənin ucuna taxta bərkidilmişdir. Bayrağın uzunluğu və eni 107 sm-dir.*



***Üçüncü Azərbaycan (Nuxa) süvari alayının bayrağı***

Komendant üsul-idarəsinin ömrü uzun sürmədi. Tezliklə Azərbaycanın müxtəlif bölgələrində, o cümlədən Nuxada çar idarə-üsuluna qarşı üsyan başladı.

***1837-ci ildə Nuxada başlayan üsyana*** İranda vəfat etmiş Nuxa xanı *Hüseyn xanın oğlu Məhəmməd bəy* başçılıq edirdi.

Məhəmməd bəy 1838-ci il avqustun 8-də həbsxanadan qaçaraq, Quba mahalının yuxarı hissəsində gizlənir[84]. Həmin ilin avqust ayında o, 5 minədək atlı və piyada dəstə ilə Rutuldan olan Ağa bəylə birlikdə Nuxa üzərinə hücuma hazırlaşmağa başlayır. Avqustun 30-da Xaçmaz dağını aşaraq Nuxa əyalətinə girən dəstəyə qarşı Nuxa komendantı Minçenko silahlı dəstə toplamağa başlayır. Lakin lazımi sayda dəstə toplamağa müvəffəq olmadığından Nijeqorod draqun polkunun komandiri S.D. Bezobrazova müraciət edir. Nuxaya artilleriya ilə birlikdə 2 diviziya və Zaqatala qalasından 2 rota göndərilir[85]. Tarixçi Z.Cavadova hadisəni belə izah edir: «Polkovnik S.D. Bezobrazov Nuxaya gələn zaman üsyançılarla birləşməyə cəhd göstərən dağlı qoşunu artıq şəhərə yaxınlaşmışdı. Qışlaq adlanan ərazidə köməyə gələn dağlı qoşunu ilə Nuxada yerləşdirilmiş rus qoşunu arasında şiddətli döyüş başlayır. Şəhər yarğanlar və sıx bağlarla əhatə olunduğundan azsaylı qoşunlar üçün üsyançılara qarşı vuruşmaq və şəhəri əldə saxlamaq çətinlik yaradırdı. Ona görə də polkovnik Bezobrazov öhdəsində olan qoşunla Qışlaq ərazisində həlledici döyüşə girməyi qərara alır. Nijeqorodsk draqun polkunun kapitanı knyaz Çavçavadze milis dəstələri ilə birlikdə Qışlaq və Zəyzid yolu ilə hərəkətə başlayır. Bu dəstəni Gürcüstan xətt batalyonunun 2 rotasından təşkil edilmiş dəstə müşayət edir. Zəyzid kəndi yaxınlığında milis dəstələri ilə üsyançılar arasında atışma başlayır. Piyada qoşunlarına başçılıq edən polkovnik Bezobrazov milis dəstəsinə kömək etmək üçün Zəyzid yoluna çıxdığı an onların üstünə atılır, lakin piyadalar süngü zərbələri ilə bu kütləni geri oturdur və qaçmağa məcbur edir…».[86]

Döyüş zamanı hər iki tərəf ağır itki verir. Tezliklə üsyançılar qaladan 15 sajen aralıda yerləşən karvansaranı və ona yaxın olan tikililəri ələ keçirirlər. Şəhərdəki rus qarnizonu qalada gizlənir. Vəziyyətin ağırlaşdığını görən Bezobrazov qətiyyətli hərbi əməliyyat keçirmək qərarına gəlir.

Üsyan amansızlıqla yatırılır. Üsyanın başçısı Məhəmməd bəy yenidən Cənubi Azərbaycana qaçır. Üsyan yatırıldıqdan sonra şəhərdə kütləvi həbslər başlayır, 100 nəfər həbs olunur.[87]

*Ümumiyyətlə, Nuxa xanlığının Rusiyaya ilhaqından keçən 30 il müddətində Nuxada* ***6 üsyan*** *baş vermişdir.*

1840-cı il islahatı ilə əlaqədar inzibati ərazi dəyişiklikləri edilir. *1841-ci il yanvarın 1-də Kaspi vilayətinin tərkibində* ***Nuxa qəzası*** *yaradılır.* Qəza 1846-cı ildən Şamaxı, 1859-cu ildən Bakı, 1888-ci ildən Yelizavetpol quberniyasının tərkibində olmuşdur. Mərkəzi Nuxa şəhəri idi. Nuxa Xaçmaz, Qəbələ, Ərəş məntəqələrindən ibarət olmuşdur. Hakimiyyət qəza rəisinin əlində cəmləşmişdir.1896-cı ildə qəzanın ümumi sahəsi 38.087 kvadrat kilometr, əhalisi 94.767 nəfər olub.[88]

XIX əsrin ikinci yarısından Nuxa qəza mərkəzi kimi böyüyür, yeni binalar, körpülər, karvansaraylar, məscidlər və minarələr tikilir, şəhər əhalisi artır. Azərbaycanın Bakı, Şamaxı, Gəncə, Şuşa və digər şəhərlərində olduğu kimi, Nuxada da bəzi sənət növləri əkinçilikdən ayrılır və müstəqil sahələrə çevrilir. Azərbay-

can şəhərləri içərisində sənətkarların sayı baxımından Şamaxı ilə yanaşı Nuxa da fərqlənir. Xüsusilə başmaqçılıq, dabbaqçılıq və toxuculuq sənəti geniş yayılır.[89]

Nuxa hələ qədim zamanlardan öz zərif ipəyi ilə nəinki Zaqafqaziyada, habelə Rusiyadan kənarda da məşhur olmuşdur. Şimali Azərbaycanın Rusiyaya ilhaqından sonra Nuxa Zaqafqaziyanın əsas ipək sənayesi mərkəzinə çevrilir. Zaqafqaziyada ilk dəfə olaraq ipəkçilik manufakturası 1827-ci ilin iyun ayında Nuxada yaradılır ki, bu da həmin dövr üçün əhəmiyyətli hadisə idi. Eyni zamanda Zaqafqaziya üzrə yaradılan «İpəkçilik və sənaye ticarətinin yayılması» adını daşıyan yeni cəmiyyətin mərkəzi də Nuxa olur.[90]



***Nuxa qəzasının 1843-cü il gerbi***

1830-cu ildə Azərbaycanda ilk dəfə olaraq Nuxada ipəksarıma manufakturasının əsası qoyulur, ***1843-cü ildə «Təcrübə ipəkçilik məktəbi»*** açılır. İpək sənayesinin inkişafı həmin sahədə çalışan fəhlələrin sayının artmasına səbəb olur. Əhalinin sayı artır. 1830-cu ildə Nuxa şəhərində 14 min nəfər, 1886-cı ildə 24.739 nəfər əhali yaşayırdı.[91] Sənayenin tələbatını ödəmək üçün yeni istehsal sahələri əmələ gəlir.

Zaqafqaziyada ilk dəfə olaraq ipəkçilik manufakturasının Nuxada yaradılmasının və yeni yaradılan ipəkçilik cəmiyyətinin Nuxa şəhərini mərkəz seçməsinin Azərbaycanın ipək sənayesinin inkişafında böyük rolu olur. Nuxada yaradılan ilk ipəkçilik manufakturası tədricən əl əməyinə əsaslanan daha iri sənaye müəssisələrinə keçmək üçün yol açır, işçi qüvvəsinin bir yerə toplanmasına, onların formalaşdırılmasına, nəhayət, əməklə kapital arasında ziddiyyət lərin kəskinləşməsinə zəmin yaradır. Nəzərə alsaq ki, Nuxada manufaktura yaradılmazdan əvvəl saysız-hesabsız ipək emalatxanaları ev şəraitində fəaliyyət göstərirdi və həmin emalatxanalarda əsasən ailə üzvləri çalışırdı, onda yeni manufakturaların ictimai əhəmiyyəti nin ölçüyəgəlməz olduğu sübhəsizdir. *Başqa sözlə, Nuxada yaradılan ipəkçilik manufakturası şəhərdə ilk mütəşəkkil fəhlə sinfi dəstəsinin meydana gəlməsində müstəsna rol oynayır.*

Nuxadakı manufakturada bütün işlər avropasayağı təşkil edilmişdir. Manufakturanın yerləşdiyi ərazidə idarə binası, mağaza, çarxana, baramanı

qurutmaq üçün ayrıca sahə, ipək anbarı və sairə olurdu. Zaqafqaziyada həmin manufakturanın yerləşdiyi ərazi Nuxanın «kampaniyası» adı ilə məşhur idi.[92]

Professor V.V.Lindenin 1940-cı ildə Moskvada nəşr olunmuş «İpəkçiliyə dair dərslik» kitabında Nuxa ipəkçilik manufakturası yaxşı nümunə kimi verilmişdir. Professor V.V.Linde qeyd edir ki, 1841-ci ildə manufakturanın yerləşdiyi «kampaniya» Çarabad adını daşımağa başlamışdır. Az sonra Çarabad Zaqafqaziya ipək sənayesinin elmi-sınaq mərkəzinə çevrilmiş və Zaqafqaziyada ilk dəfə olaraq ipəkçilik məktəbi açılmışdır.[93]

1863-cü il iyun ayının 15-də Çarabad manufakturasının yerləşdiyi ərazidə Alekseyev və Voronin qardaşlarının yeni baramaaçan fabriki işə düşür. «Öz dövrünə görə həmin baramaaçan fabrik dünyanın nəhəng ipək müəssisəsi hesab edilirdi. Fabrikdə 452 dəzgah quraşdırılmışdır. Fabrik işə düşdüyü birinci ildə 900 puddan çox xam ipək verərək məhsul istehsalına görə dünyada birinci yeri tuturdu. Fabrikdə istehsal olunan xam ipək öz keyfiyyətinə görə Moskva və Marseldə istehsal olunan xammaldan geridə qalmırdı.[94]

1910-cu ildə Nuxa şəhərində 7 mindən çox fəhləni özündə birləşdirən 90-a yaxın ipək müəssisəsi vardı. Həmin müəssisələrdən 75-i buxar maşınları ilə işləyirdi. Nuxanın ipək müəssisələri ildə 6-7 milyon manatlıq (rublluq) xam ipək istehsal edirdi. 1913-cü ildə Tiflisdə buraxılmış «Закафказский календарь» da bildirilirdi ki, «Zaqafqaziyada ilk dəfə olaraq Nuxada yaradılan ipəkçilik manufakturası 12 ailənin emalatxanasını öz ətrafında birləşdirmişdir. Burada 42 çarxda barama döyülür və ipək açılırdı».[95]

Rusiyanın digər bölgələrində olduğu kimi, Nuxanın ipək müəssisələrində işləyən fəhlələrin də vəziyyəti ağır idi. İş saatı 10-14 saat davam edirdi. Əmək haqqı tələbatı ödəmirdi. Bu səbəbdən də, Nuxanın ipək sənayesi müəssisələrində çalışan fəhlələrin 1912-ci il may tətili Zaqafqaziya fəhlələrini ayağa qaldırmışdır. Bu tətildən 60 il sonra -1972-ci ildə «Kommunist» qəzeti Nuxa ipəkçilərinin may tətilinin 60 illiyi münasibətilə «Şanlı mübarizə tariximizdən» adlı məqalədə yazırdı: «Tətillərdə ipəkçi fəhlələrin iştirakına görə, Nuxa 1912-ci ildə Rusiyada birinci yerdə gedirdi. Onu demək kifayətdir ki, bəhs olunan ildə Rusiya ipək sənayesində baş vermiş 13 tətildə cəmi 5.260 nəfər, yəni orta hesabla hər bir tətildə 404 nəfər iştirak etdiyi halda, Nuxada təkcə may tətilində 6 min nəfərə qədər fəhlə iştirak etmişdir».[96]

Birinci dünya müharibəsinin başlanması digər sahələrdə olduğu kimi, ipək sənayesində də vəziyyəti gərginləşdirdi. Yanacaq çatışmazlığı, sənaye üçün gərəkli olan vasitələrin və xammalın olmaması müəssisələrə öz məhsullarını reallaşdırmaq imkanı vermirdi. Bu dövrdə Nuxanın ipək sənaye müəssisələri demək olar ki, öz fəaliyyətini tam dayandırmışdı.[97]

1917-ci il təqviminə görə, Nuxanın ərazisi 3.685 kv. verst (4201 kv.km), qəzanın əhalisi 133.505 nəfər olmuşdur. Əhalinin 73.819 nəfəri (55,3 %) kişi, 5.686 nəfəri (44,7%) qadın, 131.132 nəfəri yerli sakin, 1.373 nəfəri müvəqqəti yaşayanlar idi. Qəzanın əsas əhalisini azərbaycanlılar təşkil edirdi. Nuxa şəhərinin əhalisi isə 52.243 nəfər olmuşdur.[98]

1920-ci ildə Azərbaycanda sovet hakimiyyəti qurulduqdan sonra da Nuxa ipəkçiləri öz ənənələrinə sadiq qaldı. 1920-ci ildə 96 ipəksarıma və 30 ipəkburma fabrikindən ibarət olan Azərbaycan ipək sənayesi milliləşdirildi və dövlət idarəçiliyinə verildi[99]. Sovet məmurlarının özbaşınalığı, dövlət əmlakının mənimsənilməsi, verdikləri vədə əməl etməmələri, yerli xüsusiyyətlərin nəzərə alınmaması əhalinin narazılığına səbəb oldu, nəticədə üsyanların başlanmasına şərait yarandı. Azərbaycan SSR Ali Məhkəməsi İşlər şöbəsinin müdiri Babaxanovun imzaladığı Nuxa Rayon Xalq Məhkəməsinin ştat cədvəlinin artırılması zərurətindən bəhs edən sənəddə bildirilirdi ki, hal-hazırda Nuxa Rayon Xalq Məhkəməsinin icraatında dövlət əmlakının mənimsənilməsi ilə bağlı 650 iş var və artmaqda davam edir.[100]

***Nuxada*** başlanmış çıxışlara qarşı sovetlərin mübarizəsi tamam fərqli olur. Öncə üsyan iştirakçılarının əmlakı müsadirə olunur, hətta varlıların evləri əllərindən alınır. Nuxa Qəza İnqilab Komitəsi *Məmməd Ağa Qədimbəyov, Hacı Səlim oğlu, Mehdi Qulu Zülfüqarov, Məşədi Zülfüqarov, Yaqub Səfər Əlioğlu, Mehdi Hüseynov, Süleyman Mustafaoğlu, Həmzə Əsədullayev, Məşədi Əsədullah Qafarov, Azad Mustafayev* və onlarca başqalarını güllələdikdən sonra onların əmlak larını müsadirə edir.

***Nuxada üsyan 1921-ci ilin baharında başlayır***. Üsyanın səbəblərinə dair Nuxa Qəza Milis rəisi və Siyasi Büro sədri Rüstəmovun 1921-ci il 26 may tarixli 63 № li raportunda göstərilir ki, mayın 14-də Xaçmazda sovet əleyhinə çıxanların həbs olunması üsyana səbəb olmuşdur. Həbslərə etiraz edənlərlə milislər arasında baş verən qarşıdurmada bir neçə milis öldürülür. Üsyançılar kəndi tərk edərək Vartaşen kəndinə (indiki Oğuz) sığınırlar. Milislərə dəstək üçün 32 əsgər və bir topçu dəstə göndərilir. Milis dəstəsi rəisinin müavini Müseyib Əfəndiyev və başqalarının rəhbərliyi ilə dəstələr Xaçmaz kəndinə doğru hərəkət edir, gecə vaxtı kəndin ətrafında pusqu qururlar. Az sonra döyüş başlanır. Ancaq döyüş uzun sürmür. Ciddi döyüşlər şəhər ətrafında davam edir. Yarımsaatlıq atışmada bir əsgər öldürülür. Kəndlilər və ətrafdakılar türk Hüseyn Əfəndinin rəhbərliyi altında hücuma keçirlər. Güclü təzyiq nəticəsində sovet dəstələri Vartaşenə (Oğuza) çəkilirlər. Üsyanı yatırmaq üçün Zaqataladan Atakarılovun rəhbərliyi ilə alay köməyə göndərilir. Döyüşlərdə türklərdən Şərif Əfəndi öldürülür. Geri çəkilmək məcburiyyətində qalan üsyançılar dağ kəndlərinə, əsasən Filfilli kəndinə toplanırlar.

Üsyanın yatırılmasına ermənilər dəstək verirlər. Hüseyn Əfəndinin dəstələrinin məğlub edilməsində Armenak Lalazarov xüsusi rol oynayır. A.Lalazarov sonralar Əsədullah bəyin qohumlarını döydüyü üçün 4 il həbs cəzasına məhkum edilir, ancaq ermənilərlə əlbir olan bolşeviklər Brufens və Babayev Azərbaycan FK-nın şöbə rəisi Həmid Sultanova 1923-cü il 11 iyul tarixli məktubla müraciət edərək onun azad edilməsini xahiş edirlər. A.Lalazarov sərbəst buraxılır.

Nuxa üsyanı amansızcasına yatırılır və üsyançılar cəzalandırılırlar. Onlardan bir qismi güllələnir, bir hissəsi həbs olunur, qalanları isə sürgünə göndərilirlər.[101]

Ümumiyyətlə, 1920-1924-cü illərdə rus ordusunun istilaçılıq hərəkətlərinə qarşı Azərbaycanda 54 silahlı üsyan baş vermişdir. Baş vermiş üsyanların səbəbləri araşdırılarkən məlum olmuşdur ki, bütün çıxışların kökündə erməni, rus və gürcü hakim dairələrinin antiazərbaycan siyasəti durur. Sovet hökuməti Azərbaycanı ruslaşdırır, yerli kadrlar vəzifələrə buraxılmırdılar. Respublikada formalaşan ***«sovet inzibati-amirlik sistemi»*** cəmiyyətin bütün sahələrinə, o cümlədən sovetlərin fəaliyyətinə güclü təsir edir. Rəsmi dairələr üsyançılara «bandit», «silahli quldur dəstəsi» adı verərək Fövqəladə Üçlüklərin sərəncamına verirlər.[102]

Sinfi mübarizənin sərt qanunları iqtisadi və siyasi böhranı yaxınlaşdırdı. Bütün ölkədə olduğu kimi, Azərbaycanda da qolçomaqlara qarşı mübarizə gücləndi. Qolçomaq ailə başçısı antisovet, antikommunist, əksinqilabçı kimi həbs olunur, güllələnir, yaxud sürgün edilirdi.

XX əsrin 30-cu illərində bölgənin mərkəzi olan Nuxa coğrafi mövqeyinə görə Mərkəzin diqqətində idi. Ərazisi cənubdan Yevlax, Zaqatala və Gürcüstana qədər uzanan bölgə şimalda Dağıstan, Qərbdə Zaqatala və Gəncə, cənubda və şərqdə Şirvanla həmsərhəd idi. Bölgə dağlar və meşəliklərlə əhatə olunmuşdur. Nuxa eli keçmiş **Göynük** və **Cəfərabad** dairələrinin birləşməsindən yaranmışdır. Bu dairələrdə yaşayan **30.403 nəfərlik əhalinin 29.000 nəfərini türklər** təşkil edirdi. Çox az bir qismi ləzgilər və başqalarından ibarət idi. ***1926-cı il məlumatına görə Nuxa qəzasında 71.000 nəfər əhali yaşayırdı.***[103]***1929-cu ildə Azərbaycan SSR-in rayonlaşdırılması zamanı Nuxa qəzası ləğv edilmişdir.***[104]

Nuxa dairəsində **1930-cu ildə 84.000 nəfər** əhali yaşayırdı. Əhalinin **90 %-ni türklər,** 9 %-ni ləzgilər, udin və dağ yəhudiləri təşkil edirdi. Dairədə 26 kənd soveti vardı. Şəhər əhalisinin sayı 24-27.000 nəfər arasında idi. 1916-cı illə müqayisədə şəhər əhalisinin sosial strukturunda dəyişikliklər baş vermişdir. Əhalinin əsas hissəsini fəhlə sinfi təşkil edirdi-15.916 nəfər. Kolxozçuların sayı 3.053 nəfər, kustar kooperativlərdə işləyənlər 1.237 nəfər, qeyri-kustar kooperativlərdə işləyənlərin sayı 2.306 nəfər olmuşdur.

Kənd əhalisi əsasən arpa və buğda becərir, barama qurdu bəsləyir, qoz və fındıq yetişdirirdi. Kəndlərdə sənaye obyektləri olmadığından çəltikdən başqa heç bir məhsul ixrac olunmurdu.[105]

Bölgənin sərhədlərinə Vartaşen (indiki Oğuz) və Qax daxil idi. Burada 21.186 nəfər yaşayırdı. 12 kənd soveti vardı. Ümumilikdə, bölgə əhalisinin əsas məşğuliyyətini ipəkçiliklə yanaşı qoz və fındıq tədarükü, ət və dəri məhsulları istehsalı, meyvəçilik, tütünçülük və heyvandarlıq təşkil edirdi.

20-ci illərin sonunda fərdi kəndli təsərrüfatlarını birləşdirərək kollektiv təsərrüfatlar yaradılması, ümumilikdə Sovet hökümətinin həyata keçirdiyi aqrar siyasət Azərbaycanın bir sıra bölgələrində üsyan həddinə çatan müqavimət hərəkatı ilə müşayət olundu. Müqavimət hərəkatı yalnız sosial-iqtisadi xarakteri ilə deyil, həm də siyasi mahiyyəti ilə fərqlənirdi. Belə üsyanlardan biri də, 1930-cu ilin aprel ayında **Nuxada** baş vermişdi.[106]

Üsyan ərəfəsində Nuxada sosial-iqtisadi və mənəvi-psixoloji vəziyyət olduqca gərgin idi. 1930-cu ildə Nuxa qəzasında yaşayan əhalinin 24 mindən yuxarısı şəhərdə məskunlaşmışdı. Bölgədə 6 ipək fabriki fəaliyyət göstərirdi. Şəhərdəki fabriklərdə 1.944 nəfər fəhlə və qulluqçu çalışırdı. Fəhlələrin sayı 1928-ci illə müqayisədə aşağı düşmüşdü. Əmək haqqı da müvafiq olaraq dəyişmişdi[107] . Nuxa-Vartaşen (Oğuz) dairəsindəki 68 kollektiv təsərrüfatda 6281 fərdi təsərrüfat birləşdirilmişdi.[108]

Hakimiyyət nümayəndələri «düşmən ünsürlərinə qarşı mübarizə» şüarı altında xalqın maddi və mənəvi həyatına müdaxilə edirdi. «Mübariz allahsızlar» cəmiyyəti tərəfindən törədilən qeyri-əxlaqi hərəkətlər yerlərdə narazılıqları artırmışdı. Vergilərin ağırlığı nəticəsində Nuxada sənətkarlıq demək olar ki, iflas həddinə çatmışdı. Hətta bir qrup dabbaq - *Ələkbər Hacı Mustafa oğlu, İdris Hacı Salam oğlu, Hüseyn Salam oğlu, Rəsul Məhərrəm oğlu, İsmayıl Cəfər oğlu* və digərləri kustar istehsala qarşı yeridilən siyasətdən, fəhlələrlə kəndlilər arasında yol verilən ayrı-seçkilikdən narazı olmaları barədə XKS-nin sədrinə ərizə yazmışdılar.



***Mustafa Şeyxzadə***



Şəki üsyanının başında Baş Şabalıd kənd sakini **Molla Mustafa Məmməd oğlu Şeyxzadə** dururdu.[109]

Molla Mustafa savadlı bir şəxs idi. Onunla yanaşı polkovnik **Bəhram bəy Nəbibəyov** da üsyan rəhbəri kimi çıxış edirdi.

**Tanıtma:**

***Şəkidə dünyaya göz açan Bəhram bəy Nəbibəyov Kutaisi realnı məktəbində və Sankt-Peterburqdakı Konstantin topçu mək təbində təhsil almış, 1904-cü ildən Rusiya ordusunun Qafqazdakı topçu briqadasında xidmətə başlamışdır. İkinci dərəcəli «Müqəddəs Anna» və «Müqəddəs Stanislav» ordenləri ilə təltif edilmişdir.[110]***

***1918-ci il noyabrın 27-də B. Nəbibəyov Azərbaycan topçu briqada sına təyinat almış, sonra isə 2-ci topçu***

***briqadasının 3-cü batareya komandiri vəzifəsində xidmət etmişdir. 1919-cu ilin noyabrında Şüvəlan-Türkan istiqamə tində Bakının dənizdən müdafiəsinin təşkili B. Nəbibəyovun rəhbərliyi ilə 3-cü topçu batareyasından və 5-ci piyada alayının bir bölüyündən təşkil edilmiş dəstəyə tapşırılmışdır.[111]***

***Denikin qüvvələrinin dənizdən ehtimal edilən təhlükəsinin qarşısını almaq üçün B. Nəbibəyov Şüvəlan-Türkan-Qala xətti üzrə dəniz sahili boyunca müdafiə mövqeləri tutmuşdur. B. Nəbibəyov 1920-ci ilin mart-aprel aylarında Cümhuriyyət hərbi qüvvələrinin Qarabağda erməni-daşnak işğalçılarına qarşı apardığı əməliyyatlarda fəal iştirak etmişdir. Onun komandiri olduğu batareya 1920-ci il aprelin 8-də Malıbəyli-Şuşikənd ətrafında gedən döyüşlərdə xüsusilə fərqlənmişdir.***



*Nəbibəyov qardaşları*

*General H.Səlimovun hərbi nazir S.Mehmandarova göndərdiyi teleqramda B.Nəbibəyovun xidmətləri xüsusi qeyd olunmuşdur.*

*B.Nəbibəyov Aprel işğalından (1920) sonra bir müddət sovet ordusu sıralarında xidmət etmiş, Nuxanın hərbi komissarı və bu vəzifədə olarkən 1930-cu ildə Nuxa-Zaqatala bölgəsində sovet hakimiyyətinə qarşı baş vermiş xalq üsyanının rəhbər lərindən biri olmuş, həmin ilin iyulunda üsyanın yatırılması üçün göndərilmiş çoxsaylı sovet hərbi qüvvələri ilə döyüşdə həlak olmuşdur.[112]*

*Üsyan hərəkatında fərqlənən şəxslərdən biri də, **Əsədulla Sadıxov** olmuşdur. Vaxtilə Hacı Zeynalabdin Tağıyevin yanında qulluq etmiş Ə. Sadıxov rus dilində təhsil almışdı. Hərəkat vaxtı Göynük kənd kooperativində mühasib işləmişdi.*

*Əslən Anadoludan olan **İsmayıl Hacı əfəndi, Mustafa bəy Əlicanbəyov** və vaxtilə Oxut kəndində baramaaçan müəssisə sahibi olmuş **Kor Umar** da üsyanın təşkilində fərqlənmişdilər.*

**Üsyan 1930-cu il aprelin 13-də başlayır**. Böyük əksəriyyəti süvarilərdən ibarət olan 200 nəfər üsyançı həmin gün Göynük (şimal-qərb) və Zəyzid - Bideyiz (cənub-şərq) istiqamətlərindən şəhərə hücum edib onu ələ keçirirlər. AK (b) P Nuxa Rayon Komitəsinin birinci katibi Riza Babayevin Bakıya verdiyi məlumatda bildirilirdi ki, Nuxaya hücum edən üsyançıların sayı 500 nəfərdən artıq olmuşdur. Şəhər üç gün üsyançıların əlində qalır. 1930-cu il aprelin 16 və 17-də Bakıdan gələn ordu hissələri üsyanı amansızlıqla yatırır. Üsyanın yatırılmasında 64-cü Qafqaz polku, 66-cı Qafqaz eskadronunun 9-cu polkunun bir rotası və 4-cü polkun rotası iştirak edirlər.

Qoşun dinc əhaliyə divan tutur, üsyanın baş verdiyi kəndlər yandırılır. Aprelin 12-dən 17-dək 180 adam öldürülür, 150 nəfər yaralanır, 865 nəfər həbs olunur, onlardan 226 nəfər üsyanın təşkilində ittiham olunur. Üsyanın yatırılmasında iştirak edən hökumət qüvvələrindən 73 nəfər həlak olur, 98 nəfər yaralanır[113]. Üsyançıların bir hissəsi müqavimət göstərə bilmədikləri üçün dağlara çəkilir, qaçaqçılıqla məşğul olurlar.

Nuxada qaçaqçılıq hərəkatı 10 ildən artıq davam etmişdir.[114] Rayonun Baş Zəyzid kənd sakini Abbas, Xudu İbrahim, Vartaşenin (indiki Oğuz rayonu) Muxas kəndindən olan Tapdıq, Nuxanın Bideyiz kəndindən olan Cəfər, Baş Göynük kənd sakinləri Yunus və Kərim dağlara çəkilərək öz ətraflarına yerli sakinləri toplayırlar. Qaçaqların fəaliyyəti yuxarı dairələri «narahat» etdiyindən onlar qəti tədbirlər görülməsini tələb edirlər. L.Beriya Tiflisdən üsyançılara qarşı mübarizə üçün aşağı sovet fəallarından ibarət dəstələr yaradılması, onların üsyançılardan və yerli əhalidən alınan silahlarla təchiz edilməsi barədə M.C.Bağırova göstəriş verir.

Mərkəzin göstərişi əsasında təşkil olunan dəstələr qaçaqların nəzarəti altında olan Dəhnə kəndinə hücum edirlər. 1930-cu il aprelin 17-də *Molla Sübhan Yusif oğlu, Hacı Məhəmməd Sadiq oğlu, Həbillah Mustafa oğlu, Hacı Hümmət Qasım oğlu, Məmmədhəsən Cəlil oğlu, Hacı İbrahim, Mustafa Salman oğlu* **kənddə güllələnirlər**. **İyirmi üç nəfər kənd sakini** – *Məhəmməd Mikayıl oğlu, Zülqədər Musa oğlu, Hüseyn Süleyman oğlu, Əli Hacı Qasım oğlu, Zəkəriyyə Kazım oğlu, İskəndər Kazım oğlu, Hacı Quzu Sadiq oğlu, Mahmud Hacı Quzu oğlu, Məhəmməd Musa oğlu, Abdurahman Abdulla oğlu, Qaffar Süleyman oğlu, İsaq Löyman oğlu, Muxtar Məmməd oğlu, Yusif Məmməd oğlu, Əliəşrəf İbadulla oğlu, Camal İbadulla oğlu, Əyri İbadulla oğlu, Ziyad Cəlal oğlu, Hacı Yusif Kümçüzadə, Hamil Cəmaləddin oğlu, Nəsrullah Məmməd oğlu, Maqsud Qədir oğlu və Əziz Cəmil oğlu* **sürgünə göndərilirlər**.[115]



*Qaçaq Abbas*

Nuxa qaçaqlarından ***Abbasın*** kəndlilər arasında böyük nüfuzu var idi. Əvvəllər milis işçisi olmuş Abbas xalqa olan zülmün şahidi olmuşdur. Nəhayət, dayısı Hidayəti həbs etmək haqqında ona verilən göstəriş Abbasın səbr kasasını doldurur. O, dostu Xudu İbrahimlə Tanrıverdi, Şərif, Əhməd, Hümbət, Hayıl, Hidayət, Alı, Aslan, İsfəndiyar, Əşrəf, Kor Umar və Abdullanı ətrafına toplayaraq qaçaqçılığa başlayır.

Kəndlilərin Abbasın ətrafına toplanması, kəndlərin əhalisinin ona dəstək verməsi yuxarıları narahat etməyə başlayır. Azərbaycanın hüquq mühafizə orqanlarında özlərinə yuva salmış daşnaklar-prokuror ***Aşot İşxanyan, Dövlət Siyasi İdarəsinin əməkdaşları Ter-Qriqoryan, Zaven Ayriyan, Ravel Şalomer, İvan Yeromin*** Qaçaq Abbası ələ keçirmək üçün plan hazırlayırlar. Ter-Qriqoryan və Suren Mıkırtıçyan ipək fabrikini yandırmaq, bunun Abbas və onun tərəfdarları tərəfindən törədildiyini yaymaqla qaçaqları xalqın gözündən salmağı planlaşdırırlar. Erməni fırıldağından xəbər tutan Abbas Nuxaya gələrək fəhlələri bu niyyətdən xəbərdar edir və Sureni öldürür.

*Qaçaq Abbasın* fəaliyyətindən qorxuya düşən Dövlət Siyasi İdarəsi (DSİ) əslən Lənkərandan olan Əhmədi Zəyzid ətrafındakı dağ meşələrinə meşəbəyi təyin edir. Verilən tapşırığa görə, Əhməd kənd əhalisi, o cümlədən Abbasın ailəsi ilə yaxınlaşmalı, kənddə nüfuz qazanmalı idi. Az müddət keçdikdən sonra Xub Əhməd adı ilə tanınan casus meşəbəyi Abbasın ailəsi ilə əlaqə yarada bilir.

Xub Əhmədin «fəaliyyəti» nəticəsində qısa müddətdə Abbasın qardaşları Məmməd və İsrail həbs olunaraq güllələnir, anası Mədinə, oğlanları Fərrux və Bəlyar, qızı Fizalə həbs edilirlər. Xub Əhməd əvvəlcədən siyasi idarə ilə razılaşdırılmaya əsasən şəhərə gələrək Abbasın ailəsini zaminə götürür, əvəzində isə Mədinə anaya bildirir ki, bütün bunların müqabilində oğlanlarından birinin üzə çıxması vacibdir. Bu məlumat Abbasa çatdıqdan sonra o, Xub Əhmədə inanmadığını bildirir. Aradan az müddət keçdikdən sonra Əhməd Fizalə ilə evlənərək ailənin üzvünə çevrilir. Bundan sonra Abbas qardaşları Əhməd və Yusifin üzə çıxmasına razılıq verir. Lakin qardaşlar təyin olunan yerə gələn kimi həbs olunurlar. Əhməd bu işdə əli olmadığını məktub vasitəsilə Abbasa bildirsə də, Abbas bu işin onun tərəfindən törədildiyini anlayır. Ona görə də, növbəti görüşdə Abbas Xub Əhmədi güllələyir, Əhmədin Fizalədən olan iki uşağını uşaq evinə verirlər. Nəhayət, qaçaq Abbas da pusquya düşür. Pusquda duran dəstəyə rəhbərlik edən *Badalyan və Vartanın* dəstəsi ilə Abbasın dəstəsi arasında döyüş başlanır. Mühasirəyə düşən Abbasın silahdaşları vurulur, Abbas özü isə bir neçə yerdən yara almasına baxmayaraq axıra qədər vuruşur və son gülləsini özünə vurur[116]. 1939-cu ildə zəyzidli Xudu İbrahim Abdulla oğlunun və bideyizli Cəfər Mirzə oğlunun dəstələri də ləğv edilir.

30-cu illərin dəhşətli hadisələrinin şahidi olan Oxutlu Vahid kişi üsyandan sonra qaçaqlara qoşulan Kor Umarın və onun yoldaşlarının başına gələnləri belə xatırlayır: ***«30-cu illərin aprel ayı idi. Kənddə Kor Umar adlı şəxsin ipək zavodu var idi. Kənddə mərkəzi hökumətin qərargahı fəaliyyət göstərirdi. Ştaba Mirabdulla Qədirov, Şabanbəyov və mənşəcə erməni olan Bədəlov rəhbərlik edirdilər. Onlar Kor Umara aldadıcı vədlər verərək onu öz tərəflərinə çəkmək istəyirlər. Lakin bu məğrur insan onların vədlərinə aldanmadı. Kor Umarı yola gətirə bilməyən siyasi rəhbərlik bu işdə kəndin nüfuzlu adamlarından-Molla Həmiddən, Usta Kərəm və Kor Əsgərdən istifadə etdi. Qaçaqlar aldadılaraq kəndin «Su dərəsi» adlı ərazisinə gətirildilər. Dərəyə yeridilmiş silahlı qarnizon qaçaqları həbs edərək kəndin mərkəzinə gətirdilər və camaatın gözü qabağında güllələndilər. Güllələnənlər içərisində Molla İbrahim, Kor Umarın qayınatası Fəzlullah kişi, qaçaq Üzeyirin qayınatası Əhməd kişi, dabbaq Cabbarın oğlu Hidayət, Hacı İslam və b. var idi. Siyasi rəhbərlik güllələnənlərin cəsədlərinin dəfn olunmasını qadağan edir. Kəndin Hacıalxaslar nəslinin ən hörmətli nümayəndələrindən olan Hümmət kişi Şahmərdan adlı bir nəfərlə Molla Abdullanın cəsədini oğurlayaraq gecə saat 3 radələrində kəndin kənarında, su bəndinin yuxarı hissəsində dəfn edirlər».***

Nuxa-Zaqatala dairəsində qaçaqçılıq hərəkatının məşhur simaları sırasında Vartaşen (indiki Oğuz) rayonunun Muxas kəndindən olan Tapdıq Üzeyir oğlu Mikayılov, əslən Nuxanın Zəyzid kəndindən olan Məcid İsmayıl oğlu Mah mudov da vardı. Dəstə bölgənin hörmətli və varlı insanları ilə əlaqə yaratmışdı. Digər bölgələrdə olduğu kimi, burada da üsyan amansızlıqla yatırıldı.[117]

Faşist Almaniyasının SSRİ-yə hücumu respublikanın hər yerində olduğu kimi, Nuxada da hiddətlə qarşılandı. Bütün Azərbaycan vətəndaşları kimi, Nuxa əhalisi də səfərbərliyə alındı. Nuxalılar qəddar düşmənlə mübarizəyə qalxdı. Böyük şair Səməd Vurğunun

***Bilsin ana torpaq, eşitsin Vətən***
***Müsəlləh əsgərəm mən də bu gündən –***

sözləri dillər əzbəri oldu. Müharibənin ilk günlərindən Nuxa gəncləri ərizə ilə hərbi komissarlığa müraciət edərək cəbhəyə göndərilmələrini xahiş etdilər.

Müharibənin ilk günlərindən həmyerlilərimizin döyüş meydanlarında qəhrəmanlıqları haqqında xəbərlər gəlməyə başladı, cəbhə və respublika qəzetləri onların igidlikləri haqqında yazılar dərc etdilər.



Döyüş cəbhələrində mərdliklə vuruşan Nuxa gənclərindən biri də, müharibədən sonra məişət xidməti kombinatında işləyən, ***«Şöhrət» ordeninin tam üç dərəcəsinə*** layiq görülmüş *Eldar Süleymanov* idi.[118]

**Tanıtma:**

**Süleymanov Eldar Ələsgər oğlu** ***1922-ci ilin may ayının 9-da Nuxada doğulmuşdur. 1942-ci ildə ordu sıralarına çağırılmışdır. Baş serjant, top komandiri olmuş, 7 dəfə yaralanmış, Stalinqraddan Çexoslovakiyayadək döyüş yolu keçmişdir.***

***S.Eldarov Oryol-Kurs ətrafındakı vuruşma larda göstərdiyi şücaətə görə III dərəcəli «Şöhrət» ordeninə, Jitomir – Kiyev döyüşlərinə görə II dərəcəli «Şöhrət» ordeninə, Ostrava ətrafında almanlar üzərində qəti qələbədəki igidliyinə görə I dərəcəli «Şöhrət» ordeninə layiq görülmüşdür. O, 1945-ci ilin iyunun 24-də Moskvada keçirilən Qələbə rəsmi keçidinin iştirakçısı olmuşdur.***[119]



***Muxtar Süleymanov***

Müharibə başlananda Nuxa rayonunun Təpəcənnət kənd məktəbində müəllimlik edən **Muxtar Süleymanov** ilk günlərdən döyüşə girmişdir.

Qəhrəman müəllim Moskva ətrafında, Ukrayna və Belorusiya uğrunda döyüşlərdə, Varşavanın azad edilməsində igidlik və şücaət göstərmişdir.

Sıçovka-Jizdra rayonunda düşmənin arxasına keçərək Oryol-Kursk marşrutunda dəmir yol körpülərinin partladılmasına rəhbərlik etmək Muxtar Süleymanova tapşırılır. Tapşırıq M.Süleymanovun rəhbərlik etdiyi dəstə tərəfindən ləyaqətlə yerinə yetirilir. Əsgər və zabitlərdən 170 nəfəri orden və medallarla təltif olunurlar. Nümunəvi rəhbərlik etdiyi üçün M.Süleymanov «*Aleksandr Nevski» ordeninə* layiq görülür.

«Nuxa fəhləsi» qəzeti 1943-cü il oktyabr nömrəsində yazıdı: «Döyüş cəbhəsinin ölməz qəhrəmanı, vaxtilə Nuxanın gözəl təbiətli kəndlərindən birində müəllimlik etmiş gənc Muxtar Süleymanovun vuruş meydanlarında misilsiz və saysız qəhrəmanlıqları Nuxa gənclərinə ölməz şərəf qazandırmışdır…gənc Muxtar cənub-qərb cəbhələrində və Moskva ətrafındakı şiddətli döyüşlərdə həmişə düşmənə qələbə çalmışdır. O, öz atının tərkində bir alman zabitini ştaba gətirdiyi zaman onun həqiqi bir qəhrəman olduğuna şübhə etmirdik. Döyüş qəhrəmanlığına görə o, iki dəfə ordenlə təltif edilmişdir».[120]

Qvardiya mayoru olan Muxtar Süleymanov 11 dəfə yaralanmış, iki «Qırmızı bayraq», birinci dərəcəli «Vətən müharibəsi», «Qırmızı Ulduz» *ordenləri və 9 medalla* təltif olunmuşdur.

Gənc müəllim ***Saleh Məmmədov*** döyüş cəbhələrində həqiqi qəhrəmanlıq göstərmiş, həmyer lilərinin başını ucaltmışdır. Onun xidmət etdiyi polkun komandiri Salehin ailəsinə yazmışdı: «Saleh Məmmədovun «Qızıl Ulduz» ordeni ilə təltif



***Saleh Məmmədov***

edilməsi münasibəti ilə Sizi təbrik edirəm. Sərrast atıcı snayperçi olan Saleh bu yaxınlarda bizim cəbhənin qabaq hissəsində az vaxt içərisində 51 faşisti öldürüb».[121]

416-cı diviziyanın döyüşçüsü, Zunud kənd sakini **İsaq Qurbanov** minamyot atan dəstənin komandiri kimi Mozdokdan Berlinədək döyüş yolu keçmişdir. Dnepr sahilində düşmənin 3 tankını sərrast atəşlə məhv etdiyi, Visla çayı ətrafında faşistlərə tələfat verdiyi, Oder çayı boyunda almanların tankını susdurduğuna görə 1-ci və 2-ci dərəcəli «Vətən müha ribəsi», «Qırmızı Ulduz» ordenləri, «Qafqazın müdafiəsinə görə», «Berlini almaq üçün», «Almaniya üzərində qələbəyə görə» medalları ilə təltif olunmuşdur.[122]

Düşmənə qarşı mübarizədə bir addım da geri çəkilməyən ***Allahyar Haqverdiyev*** Oryol-Kursk, Şərqi Prussiya, Moqilyov, Orşa, Minsk, Kaunas, Alenburq, İnsterburqun düşməndən azad olunmasında, Neman çayının qəhrəmancasına keçilməsində qorxmazlıq nümunələri göstərmiş, «*Qırmızı bayraq*», *«Aleksandr Nevski», birinci dərəcəli «Vətən müharibəsi»* ordenləri ilə təltif olunmuşdur.[123]



***Gülü İlyasov** həla 17 yaşı tamam olmamış öz xahişi ilə ordu sıralarına getmişdir. Yenicə tibb texnikumunu bitirmiş gənc Gülü ilk gündən özünü təkcə feldşer kimi deyil, həm də qəhrəman döyüşçü kimi göstərmişdir. O, 416-cı Taqanroq diviziyasında vuruşmuş, Qafqazdan Berlinədək şanlı döyüş yolu keçmiş, Polşada Soxaçiyev, Skerneviye və Lvov şəhərləri uğrunda vuruşlarda, Visla çayı boyu hücümda, Kustrin, Brandenburq və Berlinin alınmasında fəal iştirak etmiş, baş leytenant rütbəsinədək yüksəlmişdir. 416-cı diviziyanın 1368-ci atıcı polku nun komandiri V.Kurakatşvili hərbi feldşer, tibb xidməti leytenantı G.İlyasovun döyüşlərdə göstərdiyi igidlik və qəhrəmanlığına görə dəfələrlə komandanlıq tərəfindən təşəkkür aldığını bildirirdi.[124]*

***G.İlyasov birinci dərəcəli «Vətən müharibəsi», «Qırmızı Ulduz» ordenləri, «Qafqazın müdafiəsinə görə» medalı, ümumiyyətlə 6 orden və medalla təltif olunmuşdur.[125]***



*Əsabəli Ağamirzəyev*

1936-cı ildə Moskvada zabitlər hazırlayan məktəbi bitirərək leytenant rütbəsi alan ***Əsabəli Ağamirzəyev*** 416-cı diviziyanın 1368-ci atıcı alayının birinci batalyonunda komissar vəzifəsinə irəli çəkilmiş, döyüşlərdə göstərdiyi qəhrəmanlığa görə ikinci dərəcəli «Vətən müharibəsi» ordeni və 5 medalla təltif olunmuşdur.

Qoxmuq kəndindən Məmmədovlar ailəsindən 4 qardaş-*Bəybala, Əlibala, Əhəd və Ədil* cəbhəyə yollanmış, evdə kiçik qardaş Fikrət qalmışdır. Qar-

daşlardan Bəybala və Əlibaladan «qara kağız» alınmış, Əhəd və Ədil qəhrəmanlıqla vuruşmuşlar.

*Əhəd Məmmədov* Stalinqraddan başlamış Budapeştə kimi şanlı döyüş yolu keçmiş, düşmənin bir neçə tankını, avtomobilini və hərbi texnikasını sıradan çıxartmışdır. Əhəd düşmənin Yassı-Kişinyov birləşmələrinin məhv edilmə sində, Belqrad-Budapeşt uğrundakı vuruşmalarda igidlik göstərmişdir. Hərbi hissənin komandiri, general-mayor Çistyakov Qoxmuq kənd sakini balaca Fikrətə göndərdiyi məktubda yazırdı: «Qorxmaz, cəsur, öz vətəninin sadiq oğlu döyüşçü Əhədin qardaşı Fikrətə,…sənə məlum edirik ki, sevimli…qardaşın Stalinqraddan başlamış Budapeştə kimi şanlı döyüş yolu keçmişdir. O, vuruşa-vuruşa istəkli topu ilə düşmənin 11 tankını … məhv etmiş, 36 avtomobilini və başqa bir çox texnikasını, canlı qüvvəsini sıradan çıxarmışdır…»[126]

*Mirəli, Əsabəli, Əli və Qurbanəli Bəhlulov* qardaşları da cəbhədə igidlik göstərmişlər. Qardaşlardan Qurbanəli Novorossiysk, Tuapse, Mariopol, Taqanroq, Tamansk, Kerç və Praqanın azad edilməsində iştirak etmişdir.

***İsrail Əmrahov, Hüseyn Əkbərov, Piri Məmmədov, Novruz Osmanov, Məhyəddin Abbasov, Musa İbrahimov, İsmayıl Səmədov, Əhməd Qədirov, Məmməd Sultanov, Məmmədəli İbrahimov, İsfəndiyar Salmanov, Zahid İbrahimov, Nurəddin Səmədov, Məmməd Əhmədov, Tacəddin Əfəndiyev, Əsabəli Əsgərov, Soltan Əzizov, Ramazan Əliyev, Hüseyn Rəsulov*** və başqaları döyüş cəbhələrindəki igidliklərinə görə orden və medallarla təltif olunmuşlar.



Kişilərlə çiyin-çiyinə döyüşən ***Pakizə Manafova, Dürrə Məmmədova, Əsmər Həsənova, Zərifə Mustafayeva, Lətafət Məmmədova, Ziynət Manafova, Məlakə Qasımova, Zərnişan İmamverdiyeva, Əsmayə Məmmədova, Lətifə Sadıqova, Mülayim Cəfərova*** və başqaları Moskvanın, Stalinqradın, Sevastopolun, Odessanın, Krımın müdafiəsində fəal iştirak etmişlər. **Onlardan bir neçəsinin həyat və döyüş yolundan qısa sətirlər:**

## Tanıtma:

**Manafova Pakizə Yaqub qızı** ***1921-ci ildə Nuxada anadan olmuşdur. Nuxa Tibb Məktəbini bitirmişdir. 1941-ci ilin payızında orduya səfərbər olunan Pakizə Manafova yüzlərlə yaralını ölümdən xilas etmiş, yeri gələndə əsgərlərlə yanaşı döyüşmüşdür.***

***P.Y.Manafova 1943-cü il fevral ayının 28-də Azov dənizi sahilində gedən döyüşlər zamanı həlak olmuşdur.***



*P.Manafova döyüş xidmətlərinə görə orden və medallarla təltif edilmişdir. Şəkidəki küçələrdən biri P.Manafovanın adını daşıyır.*

**Abbasova Cəvahir Rzaqulu qızı** - *1919-cu ildə Nuxada dünyaya gəlmişdir. 1937-ci ildə Nuxa Tibb Məktəbini, 1942-ci ildə Azərbaycan Dövlət Tibb İnstitutunu bitirmişdir. 1942-1946-cı illərdə ordu sıralarında olan Cəvahir Abbasova Şimali Qafqazda, Şərqi Sibirdə tibb sanitar batalyonlarında, səhra hospitallarında cərrah kimi fəaliyyət göstərmişdir.*

*1946-cı ilin iyul ayında hərbi xidmətdən kapitan rütbəsində tərxis olunan C.Abbasova Nuxa Səhiyyə şöbəsində müxtəlif vəzifələrdə işləmiş, cərrahlıqla yanaşı, nevropatoloq ixtisasına yiyələnmiş, həm də Şəki Tibb Məktəbində dərs demişdir. Məqalələri çap olunmuşdur. Tibb üzrə fəlsəfə doktoru, «Səhiyyə əlaçısı», «Yüksək dərəcəli həkim» (1978) Cəvahir Abbasova bir çox orden və medallarla təltif olunmuşdur.*

*Cəvahir Rzaqulu qızı Abbasova 2003-cü ildə dünyasını dəyişmişdir.*[127]

**Məmmədova Dürrə Abbas qızı** *1923-cü ildə Nuxada anadan olmuşdur. 1940-cı ildə Bakı Əczaçılıq Texnikumunu bitirmişdir. Müharibə başlayana qədər Nuxada 85 № li aptekdə işləmiş, könüllü cəbhəyə getmişdir. Novorossiysk şəhəri 43 nömrəli hərbi-dəniz donanmasının sərəncamına göndərilən gənc Dürrə sonralar Novorossiysk Hərbi-Dəniz donanmasının sanitar anbarına köçürülmüş, tibb işçisi kimi 18-ci ordunun Qara dəniz hərbi hissələrinin dərmanlarla, sarğı ləvazimatları və tibbi avadanlıqlarla təchizi məsələləri ilə məşğul olmuş, yaralılara yardım göstərmişdir.*[128]



*D.A.Məmmədovanın döyüş şücaətləri «Qırmızı Ulduz» ordeni, 13 medal və fəxri fərmanlarla qiymətləndirilmişdir.*

*1948-ci ildə ordudan tərxis olunan D.Məmmədova tibb xidməti leytenantı rütbəsi almış, 1949-1951-ci illərdə Leninqradda (indiki Sankt-Peterburq), 1951-1961-ci illərdə Uzaq Şərqdə hospitallarda işləmiş, 1961-ci ildən Baş Apteklər İdarəsində çalışmışdır. 1965-ci ildə Müharibə Veteranları Sovet Komitəsinin Bakı şöbəsinin sədr müavini, 1978-ci ildən Respublika əhəmiyyətli fərdi*



*pensiyaçı olan D.Məmmədova «Tibb xidməti əlaçısı» döş nişanına və «Azərbaycanın əməkdar səhiyyə işçisi» fəxri adına layiq görülmüşdür. Onun döyüş yolu haqqında oçerk, şeir və povest yazılmışdır. D.A.Məmmədova gənclərin hərbi-vətənpərvərlik tərbiyəsində fəal iştirak etmişdir.*

*Dürrə Abbas qızı Məmmədova 2010-cu ildə vəfat etmişdir.*

**Həsənova Əsmər Əkbər qızı** *1920-ci ildə Nuxada anadan olmuşdur. İlk təhsilini şəhər 10 nömrəli məktəbdə almış, 1937-ci ildə Nuxa Tibb Məktəbini bitirərək Ağdaş rayonunda əmək fəaliyyətinə başlamışdır. 1939-cu ildə iş yerini Nuxa Mərkəzi Rayon Xəstəxanasına dəyişən gənc tibb bacısı Əsmər Həsənova 1941-ci il iyunun 22-də cəbhəyə getmişdir. Əsgəri xidmətə Kerçdə başlayan Ə.Həsənova həmin ilin avqustunda Sevastopola, 7-ci Hərbi-Dəniz briqadasına feldşer göndərilmişdir.*



*Ə.Həsənova 1942-ci ilin sentyabrında döyüşlərin birində kontuziya almış, müalicədən sonra Nuxadakı mərkəzi xəstəxanada tibb bacısı kimi işə başlamışdır.*

*Ə.Ə.Həsənova döyüş xidmətlərinə görə orden və medallarla təltif olunmuş 1990-cı ildə dünyasını dəyişmişdir.*[129]

**Məmmədova Lətafət Rəsul qızı** *1921-ci ildə Nuxada anadan olmuş, 1939-cu ildə Nuxa Tibb Məktəbini bitirmişdir. Müharibə başlayanda cəbhəyə könüllü gedən Lətafət Məmmədova feldşer kimi fəaliyyət göstərmişdir. Müharibədən sonra Respublika Daxili İşlər Nazirliyinin 4 nömrəli əmək-islah düşərgəsində işləmiş, 1950-1952-ci illərdə Bakı Ali Partiya Məktəbində təhsil almış, 1960-cı ilin may ayına qədər Nuxa Şəhər Partiya Komitəsində təlimatçı işləmişdir.*

*L.Məmmədova 1963-cü ildə Azərbaycan Xalq Təsərrüfatı İnstitutunu (indiki İqtisad Universiteti) bitirmişdir.*

*L.R.Məmmədova orden və medallarla təltif olunmuşdur.*

**Manafova Ziynət Qaffar qızı** *1923-cü ildə Nuxada dünyaya gəlmişdir. 1938-ci ildə Nuxa Tibb Məktəbini bitirən Z.Manafova rayonun Aşağı Şabalud kəndində əmək fəaliyyətinə başlamış, müharibə başlayanda səfərbərliyə alınmışdır. 1941-1943-cü illərdə döyüş cəbhələrində olan Z.Manafova iki dəfə ağır yaralanmış, Kerç, Novorossiysk, Kislovodsk və Qazax hospitallarında müalicə olunmuşdur.*



***Tibb leytenantı Z.Manafova «Qafqazın müdafiəsinə görə» və «Almaniya üzərində qələbəyə görə» medalları ilə təltif olunmuşdur.***

***Müharibədən sonra Z.Manafova müxtəlif vəzifələrdə işləmiş, lakin sevdiyi tibb bacısı peşəsindən ayrılmamışdır. Beş övlad anası Ziynət xanım Şəkinin ictimai həyatında fəal iştirak etmiş, gənclərin hamisi olmuşdur. 2011-ci ildə dünyasını dəyişmişdir.***

Nuxalı döyüşçülər ***Əhmədiyyə Cəbrayılov, Nuru Abdullayev*** *Fransada*, ***Şəhbaba Məcidov*** *İtaliyada*, ***Abbas Abbasov*** *Belorusiyada*, ***İsmayıl Nəbiyev*** *Ukraynada* partizan hərəkatında iştirak etmişlər.



Azərbaycanlı döyüşçülər müharibə illərində Fransanın Rodes şəhərinin faşistlərdən azad edilməsində qəhrəmanlıq göstərmişlər. ***Nuru Abdullayev*** Fransanın cənubunda, Rodes rayonunda formalaşan ilk Azərbaycan polku ilə əlaqə saxlamağa müvəffəq olmuşdur. Polkun komandiri Hüseynrza Məmmədov, təşkilatın üzvləri *Hadı Qiyasbəyov, İsmayıl Heydərov, Feyzulla Qurbanov, Xələf Hacıyev* və başqaları Fransa şəhərlərinin faşistlərdən azad edilməsində iştirak etmişdir.

N.Abdullayev əsirlikdən qaçaraq 1944-cü ilin avqust ayının 15-də Fransa partizanlarına qoşula bilmiş, Fransanın Lion, Tuluza, Marsel və başqa şəhərlərində almanlara qarşı partizan hərəkatında iştirak etmişdir. [130]

Polkovnik Rişad bildirmişdir ki, «Fransa azərbaycanlı hərbi əsirlərin igidliyini unutmayacaqdır. Övladlarımız, nəvə və nəticələrimiz də biləcəklər ki, uzaq azərbaycanlı dostlarımız Fransanın faşizmdən azad edilməsi yolunda canlarını əsirgəməmişlər. Həlak olan qəhrəmanların sürətləri əbədi olaraq qəlbimizdə yaşayacaqdır». [131]

Gənclərin və tələbələrin Moskvada keçirilən VI Ümumittifaq festivalında iştirak edən Mişel Leqan demişdi ki, 1944-cü ildə kapitan Hüseynrza Məmmədov başda olmaqla azərbaycanlı döyüşçülərin Rodes şəhərini işğalçılardan azad etməsini şəhərin hər bir sakini çox yaxşı xatırlayır**.**

**Nuru Abdullayev**

## Fransada partizan hərəkatının işti rakçısı Cəbrayılov Əhmədiyyə Mikayıl oğlu



***1920-ci il sentyabr ayının 22-də Nuxanın Oxut kəndində anadan olmuşdur.*** *Armed Mişel, Xarqo, Fraci, Kuraci, Rus Axmed, Deqol Əhmədiyyə* ***və s. adlarla məşhurdur. Fransa müqavimət hərəkatının iştirakçılarından olmuşdur.***

***Ə.Cəbrayılov 1942-ci ildə ordu sıralarına səfərbər olunmuş, 1942-ci ilin may ayında yaralan dığından əsir düşmüş və Fransadakı Montobon həbs düşərgəsinə göndərilmişdir. Düşərgənin xidmət çisinin köməyi ilə əsirlikdən qaçan Ə.Cəbrayılov fransız partizanlarının dəstəsinə qoşulmuş, alman-faşist işğalçılarına qarşı əməliyyatlarda iştirak etmiş, döyüş dostlarının rəğbətini qazanmışdır. O, Fransanın Hərbi Xaç, Könüllü xidmətə görə Xaç, Hərbi medal, Fəxri Legionun Ali Ordeni ilə təltif olunmuşdur. Təltiflərini*** *Şarl de Qoll və Morez Torezdən* ***qəbul etmişdir.***

***Ə.Cəbrayılov mühari̇bədən qayıtdıqdan sonra SSRİ-də repressiya olunmuş, uzun müddət təqiblərə və təhqirlərə məruz qalmışdır. Nəhayət, 1975-ci ildə Fransaya getmək və partizan dostları ilə görüşməyə imkan tapmışdır.***

***Ə.Cəbrayılov 1994-cü ildə avtomobil qəzası səbəbli dünyasını dəyişmişdir.***

4167 № li əsir Əhmədiyyə Cəbrayılov 1942-ci ildə Marsel altındakı əsir düşərgəsindən qaçır və Müqavimət hərəkatı sıralarına daxil olur. Parlaq saçlı gənc tez bir zamanda fransız və alman dillərini öyrənir və istedadlı kəşfiyyatçıya çevrilir. Armed Mişel adı fransız dostlarının dilindən düşmür, o alman kapitanı formasında partizan əməliyyatlarında iştirak edir, Müqavimət hərəkatı iştirakçılarının Almaniyaya aparılan 500-dək uşağını xilas edir. Uşaqların xilas olunması əməliyyatında yaralanan Əhmədiyyə alman formasında olduğundan müalicə üçün alman hospitalına göndərilir. Müalicə başa çatdıqdan sonra qatar üzərindən uçuşda göstərdiyi qəhrəmanlığa görə Tuluzadan çoxda uzaqda olmayan Albi şəhərçiyindəki alman qarnizonuna komendant təyin edilir. Səkkiz ay burada qalan Əhmədiyyə tezliklə rəhbərliyin və tabeliyindəkilərin hörmətini qazanır. Alman komendantlığındakı fəaliyyəti Fransa Müqavimət hərəkatının rəhbəri Şarl de Qoll tərəfindən müntəzəm izlənilir. Bir dəfə Albi komendantının tələbi ilə şəhər yollarının təmiri məqsədilə hərbi əsirlərin işə aparılması ona tapşırılır. Bu tapşırığın yerinə yetirilməsi prosesində əsirlərin bir hissəsi meşəyə qaçmağa müvəffəq olur. Bu hal Şarl de Qollu çox sevindirir. Əhmədiyyə isə almanların sərəncamında qalmaqdan «bezir» və tezliklə qaçaraq yenidən fransız partizanlarına qoşulur.[132]

Müharibə qurtarandan sonra Əhmədiyyə Fransa Respublikası Prezidentinin dəftərxanasında işləməyə başlayır. Fransız qadını ilə evlənir. Artıq onun iki oğlu, yaxşı mənzili var idi. Ə.Cəbrayılov-Armed Mişel Müqavimət Hərəkatı veteranlarının ən hörmətli üzvlərindən birinə çevrilmişdir.

Artıq onun 27 yaşı var idi. Vətənə qayıtmaq hissi onu bir an da olsa tərk etmirdi. O, yenidən Əhmədiyyə Cəbrayılov olmaq, kəndə qayıtmaq istəyirdi. Yoldaşlarının onu dilə tutması, Fransa hökumətinin zavod sahibliyi, hətta ABŞ-da vətəndaşlıq təklifi də onu fikrindən döndərə bilmir. Nəhayət, Ə.Cəbrayılov vətənə – doğma Oxut kəndinə qayıdır, aqronom işləyir, ailə həyatı qurur. Ancaq həyat burada onun üzünə gülmür. Onu əsir düşməkdə, vətənə xəyanətdə təqsirləndirirlər, bütün təltifləri əlindən alınır, kənddə çoban işləməyə məcbur olur. Əhmədiyyəni ən çox təsirləndirən «Hərbi xaç» ın əlindən alınması idi. Axı,

G.K.Jukovdan başqa heç bir sovet generalı və marşalı bu cür fransız ordeni ilə təltif olunmamışdır.

İllər keçir. Bir gün ona Moskvadan çağırış gəlir. Fransa veteranlar şurasının ona böyük məbləğdə pul hədiyyə etdiyi bildirilir. Hadisə qeyr-adi idi və onu N.S.Xruşşovun qəbuluna dəvət edirdilər. Qəbulda Mərkəzi Komitənin Birinci katibi ona «Pulu qəbul etmə, məndə hər şey var de və geri qaytar» deyir. Əhmədiyyə təklifə cavab vermir. Nikita Sergeyeviç Xruşşov başqa variant təklif edir: Əhmədiyyə pulu sovet sülh fonduna köçürür və bu barədə Fransa veteranlar şurasına məlumat verir. Əvəzində Əhmədiyyəyə mərkəzdə mənzil, MK-nın sanatoriyasına göndəriş təklif edilirdi.

Əhmədiyyə isə tamamilə başqa variant təklif etdi: Yaddaşını qaytarsınlar. Onun bütün orden və medallarını, foto şəkillərini qaytarırlar. Aqronom Əhmədiyyə Fransa müqavimət hərəkatının iştirakçısı və veteranı Armed Mişel olduğunu etiraf edir.




***Keçmiş partizan Əhmədiyyə Cəbrayılov döyüş dostları ilə (foto kompozisiya)***

1966-cı ildə baş vermiş hadisə Ə.Cəbrayılovun həyatını büsbütün dəyişdirir. Belə ki, SSRİ-yə gəlişindən bir az əvvəl Şarl de Qoll hava limanında onu qarşılayacaq dostları arasında döyüş dostu Armed Mişelin də olmasını arzu edir. Ə.Cəbrayılov Moskvaya, De Qolla görüşə dəvət edilir.[133]

Yenə də yüksək qonağın döyüş dostu ilə söhbət keçirilir, bildirilir ki, ola bilsin ki, qonaq döyüş dostunun Oxut kəndindəki evinə baş çəksin. Bunun üçün qonşularının evi ilə onun evi və həyətyanı sahəsi birləşdirilməlidir. Əhmədiyyə bu alçaldıcı təklifdən imtina edir.

Yeni ssenarinin işlənməsinə başlanır. Əhmədiyyə işin xatirinə kiçik bir yalan təklif edir: əgər general soruşsa, o kolxoz sədri olduğunu bildirəcək.

Nəhayət, vaxt yetişir. Təyyarənin trapında Şarl de Qoll N.Xruşşovla, digər rəsmi şəxslərlə görüşür, Armed Mişeli görür və dostlar qucaqlaşırlar. Beləliklə, ancaq general Şarl de Qollun səfərindən sonra Əhmədiyyənin arzuları həyata keçməyə başlayır, Parisdəki birinci ailəsi və döyüş dostları ilə əlaqəsi bərpa olunur[134]. Bu hadisədən sonra şəkililər onu «Deqol-Əhmədiyyə» deyə çağırmağa başlayırlar.

Kitabın müəlliflərindən biri – Mais Əmrah keçən əsrin 70-80-ci illərində Şəki Şəhər Partiya Komitəsində işləyərkən Əhmədiyyə Cəbrayılovla uzun müddət təmasda olmuşdur.

Ə.Cəbrayılov əvvəl Oxut kəndindəki kolxozun sədri, sonra tərəvəzçilik müəssisəsinin direktoru olarkən işinə çox məsuliyyətlə yanaşmışdır. Sonralar Fransa səfirliyi ilə əlaqələrin yaradılması, ev muzeyinin təşkili, gənclərin hərbi-vətənpərvərlik tərbiyəsində onun iştirakı bütünlükdə rayon müharibə veteranlarına nümunə olmuşdur.

Ə.Cəbrayılovun oğlu Mikayıl Şəki Rayon (Şəhər) Rolis Şöbəsində işləmiş, Qarabağ döyüşlərində şəhid olmuş, Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülmüşdür.



***Qəhrəman ata və Milli Qəhrəman oğulun doğma kənddə-<br>Şəkinin Oxut kəndində qəbirüstü abidəsi***

Müharibə illərində nuxalılar arxa cəbhədə «Hər şey qələbə üçün, hər şey cəbhə üçün!» şüarı ilə çalışaraq cəbhənin döyüş sursatı və ərzaqla təchizinə köməklik göstərmişlər. Rayonda 200-çülər hərəkatı genişlənmişdir. 1943-cü ilin oktyabr ayında 40 nəfər toxucu plandan əlavə 12 min metr ipək parça toxumuşdur [135] . S.Rəsulova, L.İsmayılova, N.Ələkbərova bu sahədə daha çox fərqlənmişdilər. 1944-cü ildə Nuxa ipək fabriklərində *856 nəfər* qabaqcıl var idi. 1944-cü ilin yanvar ayının 22-də *4 nəfər fəhlə «Şərəf nişanı» ordeni, 5 nəfər isə «Əməkdə fərqlənməyə görə» medalı* ilə təltif olunmuşdur. 1945-ci ilin yazında SSRİ Xalq Toxuculuq Sənayesi Komissarlığı Nuxa ipək sənayesi işçilərindən 10 nəfərini «SSRİ toxuculuq sənayesi əlaçısı» nişanı ilə təltif etmişdir. Təltif olunanlar arasında İsaq Məmmədov, Abidə Süleymanova, Töhfə Məmmədova, Abdulla Məhərrəmov da olmuşdur.[136]

Nuxanın kənd əməkçiləri fədakarlıqla işləmişlər. Rayonun Çay Qaraqoyunlu, Dərəcənnət, Cəfərabad, Kiş, Baş və Aşağı Göynük, Böyük və Kiçik Dəhnə kəndləri və digər kəndlərin əməkçiləri yüksək əmək nəticələri göstərmişlər. 1942-ci ildə Şəkinin Kiş kənd sakini 70 yaşlı Feyzulla Kərim oğlu 612 əməkgün, 65 yaşlı Hacı Eyvaz Məhərrəmov 608 əməkgün, Qoxmuq kəndindən 70 yaşlı Xasməmməd Səfərov 402 əməkgün qazanmışlar. Rayon üzrə 1944-cü ildə dövlətə heyvandarlıq məhsulları satışı planı 7 ay əvvəl yerinə yetirilmişdir.[137]

Kənd təsərrüfatında bütün işlərin ağırlığı qadınların və qızların üzərinə düşmüşdür. Kiçik Dəhnə kəndinin qızları Tubu Bayraməli qızı, Vəsilə Nurəhməd qızı, Məsmə İbadulla qızı kotançı peşəsinə yiyələnmişdilər.

1945-ci ilin əvvəlində SSRİ Ali Soveti Rəyasət Heyətinin qərarı ilə Nuxa rayonundan 215 nəfər «Qafqazın müdafiəsinə görə» medalı ilə təltif olunmuşdur.

Nuxalılar orduya ümumxalq yardımının fəal iştirakçısı olmuşlar. Təkcə 1942-ci ildə orduya 426 kürk, 22 gödəkçə, 410 qulaqlı papaq, 226 döşlük, 270 pambıq şalvar, 152 dəst isti tuman-köynək, 1301 dəst alt geyimi, 9.840 cüt yun əlcək, 1.336 kq. yun, 504 cüt corab və s. göndərmişlər. [138] «Azərbaycan kolxozçusu» tank dəstəsi yardım fonduna 1943-cü ilin sentyabr ayında 5 milyon manat pul toplanmışdır. Böyük Dəhnə kəndinin kolxozçuları bu fonda 170 min manat köçürmüşlər. Nuxa kolxozçuları «Azərbaycan kolxozçusu» tank dəstələri və hərbi eskadrilyalar üçün 3.322 min manat pul və 24 ton taxıl vermişlər.[139]

Döyüşçü ailələrinə yardım edilmiş, əsgər uşaqları körpələr evinə və uşaq evlərinə yerləşdirilmiş, dərs ləvazimatı və yeməklə təmin olunmuşlar. 1943-cü ilin 10 ayı ərzində Nuxa rayonu üzrə 1.152 nəfər əsgər ailəsinə 22 ton taxıl, 186 ailəyə 3 ton 250 kq. çəltik, 3.173 nəfərə 3.875 dəst geyim şeyləri, 1.400 nəfərə 1.673 cüt ayaqqabı, 403 nəfərə müxtəlif sənaye malları verilmişdir.

Nuxa İcraiyyə Komitəsinin 2 iyul 1942-ci il tarixli 70 № li qərarı ilə «Sıravi kiçik naçalnik heyətindən olan hərbi qulluqçuların ailələrinə təqaüd təyin edilməsi və verilməsi qaydası haqqında» qərarına[140] uyğun olaraq 268 komandirə və onların 605 nəfər ailə üzvünə aylıq pul ödənməsinə nəzarət edən komissiyanın işi üzərində diqqət artırılmışdır. [141]

Nuxanın əmək adamları faşist işğalından azad olmuş rayonlara kömək etdilər. Stavropol ölkəsinin Georgiyevsk şəhəri hamiliyə götürülmüş, 1943-cü ilin oktyabr ayına kimi həmin rayona 20 tondan çox taxıl, 30 başdan artıq mal-qara verilmişdir.



Ümumiyyətlə, Nuxa rayonundan **14.334 nəfər** cəbhəyə səfərbər olunmuş, onlardan **10.515 nəfəri** cəbhədə həlak olmuşdur [142]. Nuxanın 3 mindən artıq gənci döyüş cəbhələrindəki qəhrəmanlıqlarına görə orden və medallarla təltif olunmuşlar.

Müharibə dövründə hərbi xidmətlərini şərəflə yerinə yetirən Nuxa gəncləri müharibədən sonra da hərbi xidmətlərini davam etdirdilər. Onlardan üç nəfərinin - ***general-polkovnik*** **Tofiq Ağahüseynov,** ***general-leytenant*** **Məmmədşərif Həmidov və** ***general-leytenant*** **Ziya Yusifzadənin həyat yolu gənclərə nümunədir.**

## Tanıtma:

**Ağahüseynov Tofiq Yaqub oğlu** ***1929-cu ildə Nuxada anadan olmuşdur. 1941-ci ildə ordu sıralarına çağırılmış, 1942-ci ildə Artilleriya məktəbini bitirmiş, Arxangelsk rayonunda Hava Hücumundan Müdafiə qoşunlarında xidmətə başlamışdır.***

***T.Ağahüseynov müharibə illərində taqım koman diri, qərargah rəisinin köməkçisi olmuş, Visla-Oder və Berlin əməliyyatlarında iştirak etmişdir.***

***Müharibədən sonra müxtəlif hərbi vəzifələrdə çalışan T.Ağahüseynov 1954-cü ildə F.E Dzerjinski adına Ali Artilleriya Akademiyasını bitirmiş, diviziya, alay və ordu birləşmələrinin komandanı olmuş, 1975-ci ildən Bakı Hava Hücumundan Müdafiə Dairəsi komandanının birinci müavini işləmişdir.***

***T.Ağahüseynov general-polkovnik rütbəsinədək yüksəlmişdir.***



**Həmidov Məmmədşərif Həbibulla oğlu** ***1917-ci ildə anadan olmuşdur. Kiçik yaşlarından Nuxa ipək fabrikində işləməyə məcbur olan Məmmədşərif Həmidov axşam şöbəsində təhsilini davam etdirmiş, 1940-cı ildə ordu sıralarına çağırılmışdır. Müharibə dövründə taqım komandirinin müavini, batalyon qərargahının rəisi, diviziya qərargahının əməliyyat bölmə rəisinin köməkçisi olmuşdur.***



***M.H.Şərifov 1945-ci ildə Ali Hərbi Məktəbi bitirmiş, 1946-1949-cu illərdə Xaçmaz Rayon hərbi komissarı olmuşdur. Qulluq sahəsindəki xidmətlərinə görə M. Həmidov irəli çəkilərək 1949-1956-cı illərdə Respublika Hərbi Komissarlığında şöbə müdiri, 1956-1960-cı illərdə Bakı şəhəri hərbi komissarı, 1960-1969-cu illərdə Azərbaycan SSR Hərbi Komissarı olmuşdur.***

***Bakı Dövlət Universitetinin tarix fakültəsini bitirən M.H.Həmidov 1962-ci ildə general-leytenant rütbəsi almış, Azərbaycan SSR Ali Sovetinin 7-ci çağırış deputatı seçilmiş, 2-ci dərəcəli «Vətən müharibəsi», 2 «Qırmızı Ulduz» ordenləri və medallarla təltif olunmuşdur.***

***Məmmədşərif Həbibulla oğlu Həmidov xidməti vəzifəsini yerinə yetirərkən faciəli sürətdə həlak olmuşdur.***

**Yusifzadə Ziya Məmmədiyyə oğlu** ***1929-cu ildə Nuxada anadan olmuşdur. 1952-ci ildə Moris Torez adına Moskva Dövlət Pedaqoji Xarici Dillər İnstitutunu bitirmişdir.***

***Z.Yusifzadə 1952-1955-ci illərdə Respublika Maarif Nazirliyində məsul vəzifələrdə işləmiş, 1956-cı ildə Respublika Nazirlər Soveti yanında Dövlət Təhlükəsizliyi Komitəsi orqanlarında işə qəbul olunmuş, 1976-1980-ci illərdə Komitə sədrinin birinci müavini, 1980-1988-ci illərdə komitə sədri vəzifələrində çalışmışdır.***

***Z.Yusifzadəyə 1977-ci ildə general-mayor rütbəsi verilmiş, orden və medallarla təltif olunmuşdur. Hazırda Azərbaycan Respublikası Milli Təhlükəsizlik Nazirliyinin Akademiyasının rektoru vəzifəsində işləyir.***

Müharibədən sonra bütün ölkədə olduğu kimi, Nuxada da abadlıq və quruculuq işləri geniş vüsət alır. İlk növbədə, şəhər sənayesinin inkişafına diqqət yetirilir, istehsal edilən ipək məmulatının həcmi və çeşidi artırılır. 1957-ci ildə Nuxada 13 artikulda və 202 rəngdə ipək parça buraxılırdısa, 1958-ci ildə kombinatda «Neva», «Azərbaycan krepi», «Krepdişin» və s. çeşidli yüksək keyfiyyətli parçalar toxunmağa başlanır.

Nuxa ipəkçilərinin SSRİ-nin digər toxuculuq müəssisələri ilə əlaqələri genişlənmişdir. Təkcə bir fakt kifayətdir ki, Nuxadan 75 müəssisəyə ipək parça, 84 müəssisəyə ipək sap göndərilirdi[143].1975-ci ildə ipək birliyinə çevrilən **(şəhər 1968-ci ildən Şəki adlanmağa başlandı)** Şəkinin ipək kombinatında 8 iri müəssisə fəaliyyət göstərirdi. 1979-cu ildə bu müəssisə 179 milyon 170 min manatlıq məhsul istehsal edib satmışdır. Birlik təkcə 1979-cu ildə 264 ton xam ipək, 17 milyon 598 min metr parça və 32 milyon 375 min metr hazır parça

istehsal etmişdir. Şəkinin ipək parçaları ölkənin 250 ticarət bazasına göndərilirdi.[144]

Bəhs olunan dövrdə Şəki İpək İstehsalat Birliyində SSRİ Ali Sovetinin deputatı Fatma Həsənova, Respublika Dövlət Mükafatı laureatı, Azərbaycan SSR Ali Sovetinin deputatı Əmanət Abbasova kimi adlı-sanlı əmək adamları çalışırdı.

İpək sənayesi ilə yanaşı yeyinti sənayesi də inkişaf edirdi. 70-ci illərin sonunda Şəki yeyinti sənaye kombinatı respublikanın 32 rayonuna və Bakının ticarət şəbəkələrinə müxtəlif çeşiddə şirniyyatlar göndərirdi.

Tikinti məmulatları istehsalı artırılmışdı. Şəhərdəki kərpic sexinin gücü 4 milyon ədədə çatdırılmışdı. Xalça fabriki tikilmiş, texniki peşə məktəbi istifadəyə verilmişdir.

XX əsrin 70-80-ci illərində Şəkidə abadlıq-quruculuq işləri sürətlənmişdir. 1975-1980-ci illərdə 19 min 439 kvadratmetr ictimai mənzil sahəsi tikilmiş, 28.832 nəfər sakinin yaşayış şəraiti yaxşılaşdırılmışdır. Yalnız 1979-cu ildə 2 min 359 fərdi yaşayış evi tikilmiş, 116 ictimai binaya qaz xətti, 4 mindən artıq fərdi evə su xətti çəkilmişdir. İldə 11 milyon şərti banka gücü olan konserv zavodu, 3 milyon şərti banka istehsal edən şirə sexi, 50 min dekalitr gücə malik ilkin şərab emalı müəssisələri yaradılmış, yeyinti məhsulları kombinatı, tütün fermentləşdirmə, çörək və pendir zavodları, xalça fabriki, məişət avadanlıqlarını təmir edən 10 müəssisəsi, minik avtomobillərinə texniki xidmət göstərən 10 stansiyası və digər müəssisələr istifadəyə verilmişdir.[145]

XX əsrin 70-80-ci illəri Şəkinin həyatında inkişaf dinamikası ilə yadda qalmışdır. Şəkidə ümumi daxili məhsulun həcmi *5 dəfə yüksəlmiş, 1970-ci ilə nisbətən taxıl istehsalı 1982-ci ildə 2,3 dəfə, tütün istehsalı 3,8 dəfə, tərəvəz istehsalı 2,2 dəfə artmış, bostan məhsulları istehsalı 966 tona, üzüm istehsalının həcmi 17,8 min tona çatmışdır.* [146]

Şəkidə kənd təsərrüfatı sahəsində əldə olunan müvəffəqiyyətlərin əsas səbəbi həmin dövrdə respublikada yaradılan sağlam mənəvi iqlim, H.Əliyevin rəhbərliyi altında respublika partiya təşkilatının həyata keçirdiyi məqsədyönlü siyasət olmuşdur. Məhz H.Əliyevin təşəbbüsü ilə Şəkidə kənd təsərrüfatının elmi əsaslar üzərində inkişafı üçün şərait yaradılmış, bu sahənin inkişafında Azərbaycan SSR EA Şəki Zona Elmi Bazasının, Ümumittifaq Qaragülçülük İnstitutunun, Azərbaycan Əkinçilik İnstitutunun Şəki Dayaq məntəqələrinin rolu böyük olmuşdur. Rayonda kənd təsərrüfatı sürətlə və yeni istiqamətdə inkşaf etməyə başlamışdır. 1970-ci ildə rayonda hər hektardan 10, 4 sentner taxıl yığılmış, hər inək-camışdan 780 litr süd sağılmışdır.

70-ci illərin əvvəllərində **Sadıq Nəbi oğlu Murtuzayevin** Şəki Şəhər Partiya Komitəsinə birinci katib təyin olunmasından sonra digər sahələrdə olduğu kimi, kənd təsərrüfatı sahəsində də dəyişikliklər baş vermiş, kadrlara tələbkarlıq artırılmış, təsərrüfatlarda təmərgüzləşdirmə və ixtisaslaşdırma xətti yeridilmişdir. 70-80-ci illərdə Azərbaycanda ilk dəfə Şəkidə cins mal-qara, qaragül qoyunçuluğu, bağçılıq və üzümçülük, ətlik-maldarlıq, düyəyetişdirmə,

yemçilik kompleksləri və birlikləri yaradılmış, farel balıqçılığı və xəz-dəri üçün qunduzçuluq təsərrüfatları təşkil edilmişdir.

1980-ci ildə Şəkidə 17 kolxoz, 10 sovxoz, 8 təsərrüfatlararası birlik və kompleks fəaliyyət göstərirdi. Təkcə birliklərdə 12.324 baş cins qara-mal, 3.887 baş qaragül qoyunu bəslənilir, 980 hektar meyvə bağları və 800 hektar üzümlüklər vardı. Həyata keçirilən kompleks tədbirlər nəticəsində taxıl istehsalı artaraq 1970-ci ildəki 34,4 min tondan 1980-ci ildə 80,9 min tona çatdırılmışdır.[147]

1970-ci ildə istehsal edilmiş kənd təsərrüfatı məhsulunun ümumi dəyəri 14 milyon 942 min manat olduğu halda, 1978-ci ildə 42 milyon 274 min manata, kənd əməkçilərinin aylıq gəliri həmin dövdə 71 manatdan 136 manata yüksəlmişdir.[148]

Əhalinin məişəti və rifahında irəliləyişlər hiss olunmağa başlamışdır. 1980-ci ildə Şəki rayonunda 3.000-dən çox, o cümlədən 1.700-ə yaxın şəxsi avtomobil olmuşdur. Şəhərdə əhaliyə 250 köşk, mağaza, univermaq, restoran, pavilyon, bufet xidmət göstərirdi. Bu ticarət şəbəkələrində 1.300 nəfər işləyirdi. İki avtomat və bir yarımavtomat telefon stansiyası, şəxsi avtomaşınlara texniki xidmət göstərən iki stansiya, dəmiryolu və təyyarə biletləri satan kassalar, üç aptek, müxtəlif müalicə və mədəni-maarif müəssisələri, kino və konsert salonları, atelye və emalatxanalar, 230 yerlik üç məişət evi və s. əhaliyə xidmət sahəsində öz aralarında yarışa girmişdilər.

Bəhs olunan dövrün ən mühüm hadisələrindən biri 1975-ci ildə Şəkidə S.Rəhman adına Dövlət Dram Teatrının fəaliyyətə başlaması olmuşdur. Bu teatr sonralar nəinki respublikada, həmçinin bir sıra Avropa və Amerika ölkələrində qastrol səfərində olmuş, Azərbaycan teatr sənətinin dünyada təbliğ olunmasında səmərəli fəaliyyət göstərmişdir. Şəki teatrı ilə yanaşı 44 klub və mədəniyyət evi, 3 muzey, 8 yeni kino qurğusu işə salınmışdır. 5 sanatoriya və istirahət evi, 3 yeni xəstəxana istifadəyə verilmişdir.[149]

Ümumilikdə, ötən əsrin 70-80-ci illərində Şəki rayonu üzrə istifadəyə verilmiş əsas fondların ümumi dəyəri 19,7 min manat, istifadə edilmiş kapital qoyuluşunun həcmi 22,1 min manat təşkil etmişdir ki, bu da 1969-cu ilə nisbətən 5,4 dəfə artım deməkdir.

Şəkinin qədim simasının bərpasında və abadlaşdırılmasında 1983-1988-ci illərdə Şəki Şəhər Partiya Komitəsinin birinci katibi işləmiş **Hadı Musa oğlu Rəcəbovun** xüsusi xidmətləri olmuşdur.

*Şəki planetimizin şimal yarımkürəsində, subtropik qurşağın sərhəddində, Böyük Qafqazın cənub ətəklərinin Qanıx Əyriçay dərəsi ilə birləşdiyi yerdə, güclü selləri ilə bütün dünyada məşhur olan Kiş çayının sol sahilində yerləşir. X əsr ərəb müəlliflərindən olan Əl-Müqəddəsinin yazdığına görə, Şəki düzənlikdə yerlə şirmiş. Şəki okean səviyyəsindən 500-850 metr, düz xətlə şəhərdən cəmisi 10-15 km. aralı olan Baş Qafqaz silsiləsinin qarlı zirvələrinin yüksəkliyi bəzi yerlərdə 3000-3500 m-ə çatır.* [150]

*Şəhər üç tərəfdən hündür sıra dağlarla əhatə olunmuşdur. Şəhərin ərazisi Xan yaylağı dağının cənub-şərq yamaclarından başlayıb dağətəyi düzənliyə enir. Xan yaylağı 1.800 metr, Qızıl Qaya dağı 3.000 metr, Bazar Düzü isə 4.480 metr ucalıqdadır*[151]*. Şəkinin* ***ərazisi 2, 43 kv. km., əhalisinin sayı 170 min*** *nəfərdən artıqdır. Rayonda* ***71 yaşayış məntəqəsi*** *vardır. Şəhərin ərazisindən 2 çay – Kiş və Qurcana çayları axır. Rayon şimaldan Dağıstan Muxtar Respublikası, şimali qərbdən Qax, şərqdən Oğuz, cənubdan Ağdaş və Yevlax rayonları ilə həmsərhəddir.*

Yuxarıda göstərilənlərdən və son illərdə aparılmış tədqiqatlardan çıxış edərək deyə bilərik ki, Şəkinin ***yaşayış məskəni kimi təxminən 3000 illik tarixi vardır.*** Şəhərin keçmiş adı **- Şəki adı** Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin 15 mart 1968-ci il tarixli Fərmanı ilə bərpa olunmuşdur.[152]

Azərbaycanın həm siyasi, həm də ədəbi xəritəsində Şəkinin öz yeri var. Əlbəttə, başqa bölgələrdə olduğu kimi, Şəkidə də ədəbiyyat ilk dəfə şifahi şəkildə meydana gəlib, dildən-dilə, eldən-elə keçib. İstər şifahi, istərsə də yazılı şəkildə bu ədəbiyyat zaman boyunca möhtəşəm və özünəməxsus olub. Əsatir, əfsanə, rəvayət, zərb-məsəl, lətifə, layla, bayatı, oxşama və s. şifahi xalq ədəbiyyatı nümunələri ilə zəngin olan Şəkidə yazılı ədəbi nümunələrə XVIII əsrin ortalarından rast gəlinir.[153]



***Dayanıb bir dağ təki***
***Dağlar qoynunda Şəki****.*

Klassik şairlərin əsərlərində Şəkinin adı dəfələrlə çəkilib. 1038-1039, 1066-1067-ci illərdə Gəncəyə səfər etmiş Qətran Təbrizi Şəddadilər sülaləsinin hökmdarlarından biri olan Əbülhəsən Əli Ləşkəriyə ünvanlanmış mədhiyyələrinin birində Şəkini tərif etmişdir. XII əsrdə yaşayıb yaratmış Nizami Gəncəvi "Leyli və Məcnun" əsərində Zeynəbin gözəlliyini təsvir edərkən onun çənəsini Şəki almasına bənzətmişdir.

Tük kimi incəydi beldən o dilbər,
Ağzı xırdacaydı qarışqa qədər.
Şəki almasıtək çənəsi vardı,
Məkkə qumundan da çox yandırardı.

Şəki Bolqarıstanın güllər diyarı Kazanlıqla, İtaliyanın cənubunda geniş üzüm və zeytun plantasiyaları olan Potensa, Himalay dağlarının cənub ətəklərində yerləşən Srinaqar şəhərləri ilə əkizdir.

Şəkidə olan qonaqlar bu diyarın təbiəti, insanları və onların məşğuliyyəti haqqında dəyərli fikirlər söyləmişlər. A.S.Puşkinin dostlarından olan rus süvari generalı M.M.Rayevski Nuxada olmuş və şəhəri yüksək dərəcəli Baxçasaraya bənzətmişdir.

XIX əsrin ortalarında Şimali Azərbaycana səyahət edən Aleksandr Düma (ata) «Qafqaz səfəri» adlı kitabında yazmışdır: *«Bərqərar olduğu Qafqaz sıra dağlarının dilbər bir güşəsinə qısılmış Nuxa onu yaşıllığa qərq edən, qoynunda gizlədən ağacların arasından güclə görünür»* [154].Lev Tolstoy «Hacı Murad» əsərində Nuxanın təbiət mənzərələrindən həyəcanla söz açmışdır.

Şəki tarixi abidələrlə zəngindir. Şəki abidələrindən aldığı təəssüratı Azərbaycan Respublikasının Prezidenti İ.Əliyev belə ifadə etmişdir: «...Şəkidə Azərbaycan mədəniyyətinin dəyərli abidələri vardır. Biz bu abidələri qoruyub saxlamalı və bərpa etməliyik. Onlar bizim milli sərvətimiz, mədəniyyətimiz və tariximizdir».

Şəki tarixi abidələrinin gözü **Şəki xanlarının** sarayıdır.



***Şəki xanlarının sarayından bir görünüş***

Xan sarayı 1762-ci ildə şamaxılı memar Abbasqulu tərəfindən inşa edilmişdir. Xan sarayı iki mərtəbəli olub 6 otaq, 4 dəhliz və 2 eyvandan ibarətdir. Binanın uzunluğu 31, 7 metr, eni 8,5 metr, hündürlüyü 10 metrdir. Sarayın inşasında yerli materialdan istifadə olunmuşdur. Saray yeni Şəki qalasının şimal-şərq hissəsində, dəniz səviyyəsindən 874 metr yüksəklikdə yerləşir. Binanın qarşısındakı qollu-budaqlı çinar 250 ildən artıqdır ki, sarayı günəşdən, yağış və qardan mühafizə edir.



***Şəki xanlarının sarayının otaqlarından birinin görünüşü***

Qədim ticarət və sənətkarlıq diyarı olan Şəkinin tarixi abidələri içərisində **karvansaray binalarının** özünəməxsus yeri vardır. XVIII-XIX əsrlərdə Şəkidə İsfahan, Təbriz, Şamaxı, Təzə karvansaray və b. adlarla böyük karvansaray binaları fəaliyyət göstərmişdir.

Bunlardan ikisi-yuxarı və aşağı karvansaraylar zəmanəmizədək qalmışdır. Yuxarı karvansaray keçən əsrin 80-ci illərində Azərbaycan KP Şəki Şəhər Komitəsinin birinci katibi vəzifəsində işləyən ***H.M.Rəcəbovun*** təşəbbüsü və rəhbərliyi ilə təmir və bərpa olunmuşdur. Hazırda mehmanxana kimi istifadə olunur. Bu karvansarayın ümumi sahəsi 6.000 kvadrat metr, hündürlüyü Şəki küçəsinə baxan hissədə 14 metr, içəri hissədən 8 metrdir. Binada 200-dən artıq otaq və zirzəmi vardır. Binanın zirzəmisindən ticarət mallarının saxlanması üçün istifadə olunmuş, birinci mərtəbədə mal-heyvan saxlanılmış, yuxarı mərtəbədən isə gecələmək üçün istifadə olunmuşdur. Darvazaların içəri hissəsinin tavanı kərpicdən tağlı kümbəzlərdir. Buradakı əsas giriş darvazası qarşısındakı gümbəz Yaxın Şərqdə ən böyük kərpic tağlı gümbəzlərdən biri sayılır.[155]

Aşağı karvansarayın ümumi sahəsi 8.000 kvadrat metrdir. Hündürlüyü Şəki küçəsi tərəfdən 12 metr, şərq və qərb tərəfdən isə 10 metrdir. Binada 242 otaq və zirzəmi vardır. Karvansarayın dörd tərəfdən giriş qapısı olduğundan darvazalar bağlanandan sonra qalanı xatırladır. Aşağı karvansarayda hazırda təmir və bərpa işləri davam edir.



***Yuxarı karvansarayın – turizm kompleksinin həyətindən görüntü***

***Şəkixanovların evi, Cumay məscidi, Küləkli minarəsi, M.F.Axundovun anadan olduğu ev*** Şəkiyə gələnlərin marağına səbəb olur.

Şəhərdəki ***qədim su kəməri, Ağvanlar hamamı, Qurcana çayı üzərində XVII-XIX əsrlərə aid tağlı kərpic körpü, XIX əsrin birinci yarısında tikilmiş Dairəvi məbəd, onlarca yaşayış binası, şəbəkəli pəncərələr, sənətkarlıqla yaradılmış buxarılar, qəbir daşları üzərində oyma və çıxıntılı xətkarlıq kitabələri, tağlı darvazalar*** Şəkinin qədim tarixindən xəbər verir.

Şəkinin yaşayış evləri özünün örijinallığına, tikinti üslubuna, memarlıq həllinə görə bölgənin digər yaşayış evlərindən kəskin surətdə fərqlənir.

Şəhərin şimal-şərqində, dəniz səviyyəsindən 850 metr yüksəklikdə səfalı dağ döşündə yerləşən «Mustafabəyin bağı» adlanan hissədə gözəl bir istirahət güşəsi vardır.

Şəki sənətkarlar diyarıdır. Qədim və orta əsr sənətkarlarının misilsiz sənət ənənələrini, onların əməli təcrübəsini davam etdirən Şəki sənətkarlarının fədakar əməyi sayəsində bu şəhərdə zəngin tarixi mədəni irs yaranmışdır.



***Şəki sənətkarlarının hazırladığı zərgərlik məmulatı***[156]

Şəkinin şəhər həyatı ilə əkiz yaranan sənət sahələrinin xeyli hissəsi yaxın keçmişədək davam etməkdə idi. Dəmirçilik, silahsazlıq, nalbəndlik, misgərlik, qalayçılıq, zərgərlik, duluzçuluq, dabbaqlıq, papaqçılıq, başmaqçılıq, dərzilik, xalçaçılıq, boyaqçılıq, xarratlıq, şəbəkəçilik, şirniyyatçılıq və s.qədim köklərə malik olan bir çox istehsal sahəsi Şəkinin sənət məbədinin sütunlarını təşkil edir.

**Şəki** *Şərq fəlsəfi fikrinə demokratik düşüncə gətirən* **Mirzə Fətəli Axundovun,** ədəbiyyatımızın şah əsərlərini toplayaraq xalqımıza çatdıran **Salman Mümtazın**, çağdaş ümumtürk poetik fikrinin zirvəsinə yüksələn **Bəxtiyar Vahabzadənin,** çağdaş Azərbaycan komediyasının təməlini qoyan **Sabit Rəhmanın** vətənidir.

«Rahabı» dinləyəndə ***Şəkili Ələsgər yada düşür***. Bakıdakı möhtəşəm Nizami Gəncəvi, Səməd Vurğun, Mehdi Hüseynzadə,…Orta Asiya və Monqolustanın paytaxtlarında İbn Sina, Rudəki, Sədrəddin Ayni, Suxe-Bator, Çoybalsan…abidələrini şəkili ***Fuad Əbdürrəhmanov*** ucaltmışdır. Teatr və kino sənətçiləri sırasında öndə duran ***İsmayıl Osmanlı,*** milli simfoniyamızı yaradanların ilk sırasında qərar tutan ***Cövdət Hacıyev, ,*** dünya şöhrətli cazmen ***Vaqif Mustafazadə***, gülüş ustası ***Lütfəli Abdullayev,*** «İstintaq», «Həm ziyarət, həm



***Şəki meydanlarından birinin görünüşü***

ticarət» və s. kinofilmləri ilə məşhur olan rejissor ***Rasim Ocaqov***, Azərbaycanda maarifçilər sülaləsi kimi tanınan Əfəndiyevlər nəslinin yadigarı, satira ustası ***Hikmət Ziya***, Azərbaycan opera sənətində Məcnun, Qərib, Kərəm və Şah İsmayıl rollarının bənzərsiz ifaçısı ***Əlövsət Sadıqov***, Şərq mədəniyyəti tarixinə opera yazan ilk qadın bəstəkar kimi daxil olan ***Şəfiqə Axundova,*** bəstəkarlar ***Emin Sabitoğlu, Cavanşir Quliyev*** Şəkidə dünyaya göz açmışdır**.** [157]

XX əsr Ümumtürk ədəbiyyatına yeni ab-hava gətirən və öz yaradıcılığında türkçülüyü ilə fərqlənən ***Vaqif Aslan*** bu gün Şəkidə yaşayıb yaradır. Qətiyyətlə deyə bilərik: XIX əsr «**Mirzə Fətəli əsri**», XX əsr «**Bəxtiyar Vahabzadə əsri»** olmuşdursa, XXI əsr «**Vaqif Aslan əsri»** olacaqdır. Başqa sözlə, ***hər üç əsrin qarşısında Şəkinin adı böyük hərflərlə yazılacaq, əsrlərin yaddaşı ilə qoşa səslənəcəkdir!*** Bunun üçün isə biz doğma Şəkiyə və onun təhsilinə borcluyuq.

Özünün təkrarsız milli kalo riti, füsunkar təbiəti, nadir tarixi memarlıq abidələri, zəngin sənət aləmi, gözəl mətbəx mədəniyyəti ilə seçilən Şəki həmişə bura gələn qonaqları heyran edən əsrarəngiz bir yerdir.



Şəkiyə gələnlər «***Marxal» ı***, «***Soyuqbulaq***»ı görməmiş, hazır lanma texnologiyası və dadı ilə bütün şərqdə məşhur olan «***Şəki pitisi***» ndən yeməmiş getməzlər.

Şəkili həmişə qayğılı və narahatdır, qənaətcil və bədxərcdir. Torpaq və ailəcanlıdır. Qonaqpərvər Şəki camaatı həm də yaxşı təsərrüfatçıdır. [158]

***Marxal istirahət zonasında mehmanxana***

Şəkililərin şirin ləhcəsi vardır. Onlar həqiqətləri yumor nümunələri ilə çatdırmaq qabiliyyəti, qarşısındakının nöqsanlarını lətifələrlə anlatmaq xüsusiyyətilə digər bölgələrin əhalisindən köklü surətdə fərqlənirlər.

Şəkililər ürəyi yumşaq və mülayim olsalar da, prinsipialdırlar, haqsızlığa və ədalətsizliyə dözümsüzdürlər.



*Şəkinin müasir gerbi* ***(müəllif Tahir Həmidli)***

# II FƏSİL

# NUXA QƏZA MƏKTƏBİNİN TƏŞKİLİ. TƏHSİL SİSTEMİNDƏ DƏYİŞİKLİKLƏR

*Təhsil cavanlara kamal, yoxsullara dövlət,*
*qocalara təsəlli, yaşlılara isə yaraşıq verir.*

***Diogen***

## 2.1.Türk-islam mədəniyyətinin təşəkkül etdiyi Azərbaycanın təhsil tarixindən

***Əziz oxucu! İndi səninlə qarşı-qarşıya dayanıb təhsil tariximizə nəzər salacaq, olub keçənlərin üstündən xətt çəkmədən ədalətli və qərəzsiz tarixi birgə vərəqləyəcəyik. Çox götür-qoy etdikdən sonra fikirləşdik ki, Nuxanın təhsil tarixi araşdırma hədəfimizdirsə, deməli bu məktəb həm də Azərbaycan təhsil tarixinin bir hissəsidir. Bu tarixlə ancaq fəxr etmək olar. Odur ki, səbrinizi basıb qeyd olunanları yaxşı-yaxşı oxuyun, qazandıqlarımızı və itirdiklərimizi birər-birər incələyin, dərdlərimizi birgə bölüşdürək, əldə etdiklərimizi isə qoruyaq və yaşadaq. Onda doğma Azərbaycanımız daha güclü, daha əzəmətli olar. Bir də ki, onsuz da dəyərlərimizə «yiyələnmək istəyənlər» kifayət qədərdir. Heç olmazsa, qan qardaşlarımız bizimlə birgə olsun.***

Bəşər tarixinin səhifələrini vərəqlədikcə insanın inkişafı, onun həyatın müxtəlif sahələrində əldə etdikləri biliklər, minilliklərin sorağını verən məişət əşyaları, maddi mədəniyyət qalıqları müasir insanları daim düşünməyə vadar etmiş, onlar qədim insanların bu inkişafına təkan verən amillərin müəyyənləşdirilməsinə cəhd göstərmişlər.

Bəşəriyyətin inkişafı tarixi qanunauyğun proses olub, cəmiyyət həyatının maddi və mənəvi tələbatı ilə əlaqədardır. Sonrakı dövrlərdə insanın ətraf mühiti dərk etməsi, insanın təkamül prosesi, ayrı-ayrı mərhələlərdə baş verən dəyişikliklər ümumi prosesin bir hissəsi olub, maddi mədəniyyət nümunələrində bizim dövrə qədər gəlib çıxmışdır.

Azərbaycan bəşər sivilizasiyasının ayrılmaz tərkib hissəsi olmuş və bu gün də qalmaqdadır. Aparılan arxeoloji qazıntılar zamanı tapılan abidələr, onlarda aşkar olunan dəfn adətləri, tapılmış maddi-mədəniyyət nümunələri, cəmiyyətin ayrı-ayrı mərhələlərində yaranan adət və ənənələr, elmi biliklərin yaranması və təkmilləşməsi bizi düşünməyə vadar edir. Azıx mağarasının açılması, Qazax rayonunda aşkar olunmuş mezolit və neolit dövrünə aid abidələr göstərdi ki, bu ərazidə yaşayan insanların dünyagörüşü getdikcə təkmilləşmişdir.[159]

Azərbaycan təhsil tarixindən danışarkən öncə Qobustan göz önündə canlanır. Qaya təsvirləri ölümlə həyatın əlaqəsi haqqında təsəvvürlərin kompleksidir. Sözsüz ki, sonrakı dövrdə yaranan dini görüşlər də bunların nəticəsi idi.[160]

Azərbaycanda elmi fikrin meydana gəlməsi Qobustan qaya təsvirlərində əks olunmuşdur. Qaya təsvirləri Azərbaycanda təhsilin inkişafı mərhələlərinə canlı şahiddir.[161]

Azərbaycan qədim insan məskənlərindən biridir. Böyük tarixi abidələrimiz olan Qobustan, Gəmiqaya, Kültəpə, Orxon-Yenisey kitabələri, digər yazılı abidələrimiz yazı yazmaq, oxumaq, hesablamaq, rəsm çəkmək, yallı getmək, müxtəlif rəqslər etmək və s. mədəni təhsil vərdişlərimizdən xəbər verir. Diqqət yetirək: Dünyanı heyran qoyan Qobustan qayaüstü rəsmlərində 1000-dən artıq şəkil və yazı işarələri vardır. Bu rəsmlərdə insanların düşüncə tərzi və istəyi öz əksini tapmışdır, başqa sözlə, təlim və tərbiyə prinsipləri primitiv də olsa ibtidai cəmiyyətin əsasında durmuş, yerli etnosların bədii təfəkkür tərzi, bilik və dünyagörüşü öz ifadəsini tapmışdır. Təbii ki, getdikcə təkmilləşən vərdişlər, qarşılıqlı əlaqə digər əxlaqi keyfiyyətlərin formalaşmasına təsir göstərmişdir.

XVIII-XIX yüzilliklərdə qədim yazı nümunələrinin oxunması insan zəkasının müəmmalarını müəyyənləşdirməyə marağı artırsa da, yenə də insanların minillər əvvəllər bilikləri necə əldə edilməsinə nail olmaları sirr olaraq qalır.

Cəmiyyət sadədən mürəkkəbə doğru inkişaf edir. «Elə bu səbəbdən də, hələ Qədim Şərq ölkələrində toplanmış biliklər elmlərin ilkin şərtlərini müəyyənləşdirmiş, sonralar dövrün mütəfəkkirləri dünyanın yaranmasının təbii qanunauyğunluqlarını dərk etməyə çalışmış, nəhayət ayrı-ayrı bilik sahələri yaranmışdır».[162]

*«Elm»* ərəb sözü olub, bilik, məlumat mənasını verir. Ümumiyyətlə, elm təbiət, cəmiyyət və idrak haqqında biliklər sistemidir. Elm o deməkdir ki, mahiyyət öyrənilsin. K.Marks yazırdı ki, şeylərin mahiyyyəti onların üzərinə yazılmış olsa idi, o zaman heç bir elmə ehtiyac qalmazdı. Bu səbəbdən də, elmin qarşısında öyrənmək kimi mühüm bir vəzifə durur.

Elmin mahiyyəti, onun cəmiyyət həyatındakı rolu haqqında minlərlə dahiyanə fikirlər söylənmişdir. Beşikdən qəbrə qədər öyrənməyi vacib sayan Məhəmməd Peyğəmbər (ə.s) insanları daim axtarışda olmağa, bilikləri mənimsəməyə çağırmış, ətrafındakılara elmi və mərifəti ilə nümunə olmağı tövsiyə etmişdir. Bu baxımdan Məhəmməd Peyğəmbərin (ə.s) söylədiyi: ***«Elm, təhsildən ötrü lap Çində də olsa dalınca get»*** fikri həmişə olduğu kimi, bu gün də aktualdır.

Bəllidir ki, təlim və tərbiyə daim vəhdətdə olmuşdur. Təlim prosesi bilik, bacarıq və vərdişlər verir və mənimsənilir.

*Təlim* o zaman uğurlu olur ki, öyrədən və öyrənən qarşılıqlı əlaqədə olsun.

*Tərbiyə* şəxsiyyətin ictimai və mədəni həyatda, istehsalatda fəal iştirakına nail olmaq üçün məqsədyönlü, sistemli surətdə formalaşdırılması prosesidir. Fransız yazıçısı Viktor Hüqonun dəyərləndirdiyi kimi, ***tərbiyə nəfslə, təhsil biliklə*** bağlıdır. İnsan yetkinləşdikcə bu iki proses bir-birini tamamlayır.

«Təhsil» ərəb sözüdür, hasil etmə, qazanma, öyrənmə, əldə etmə mənasını verir. Təhsil sözünün mənasında elmi biliklər əsas yeri tutur. Başqa sözlə, «Bəşər dünyamız təhsil və təlimsiz irəli gedə bilməz».[163]

Azərbaycan xalqının təhsil, təlim və tərbiyə ənənələri çox qədimdir. Yazılı abidələrimiz, əlifbamız, «Dədə Qorqud» kimi sənət abidələrimiz təhsil tariximizdə əsas yer tutur. Hər bir Azərbaycan ziyalısı, hər bir Azərbaycan vətəndaşı bu tarixi abidələrimizi dərindən öyrənməli, təhsil sistemimizin inkişafında istifadə olunmalıdır.

Azərbaycan xalqı dünyanın ən qədim dövlətçilik ənənələrinə malikdir. E.ə. III minillikdə Urmiya gölü hövzəsində yaranmış ilk dövlət qurumları, onların Şumer, Akkad və Assur dövlətləri, Kiçik Asiyadakı Het dövləti ilə əlaqələri, e.ə. I minillikdə Azərbaycan torpaqlarında mövcud olan Manna, İskit şahlığı, Atropatena və Albaniya dövlətləri iqtisadi-mədəni cəhətdən inkişaf etmiş Azərbaycanda dövlət idarəçiliyindən, elmin, maarifin, təlim və tərbiyənin inkişafından xəbər verir. Azərbaycan xalqının mədəni inkişafında, o cümlədən təhsilin təşkilində Azərbaycanın Kiçik və Orta Asiya, İran, Suriya, Misir, Gənubi Qafqaz ölkələri, Rusiya və Uzaq Şərqlə ikitərəfli əlaqələri, xüsusilə elm və mədəniyyət sahəsindəki əlaqələr Azərbaycan ərazisində uzun müddət davam edən etnik və digər proseslərin başa çatmasına, türkdilli Azərbaycan xalqının yaranmasına gətirib çıxarmışdır.

Bunun üçün dövrün milli təfəkkürünü ifadə edən dastanlara nəzər salmaq kifayətdir.

Qədim Azərbaycanda məhsuldar qüvvələrin inkişafı, ibtidai icma quruluşunun dağılması və xüsusi mülkiyyətin meydana çıxması, həmçinin cəmiyyətdə siniflərin meydana gəlməsi cəmiyyətin həyatının müxtəlif sahələrində, o cümlədən dini ayinlər sistemində də dəyişikliklər yaratdı. Məhz bunların nəticəsi olaraq Cənubi Azərbaycan ərazisində dünyanın ən qədim dinlərindən olan ***zərdüştilik*** meydana çıxdı.

Zərdüşti dini onun banisi Zərdüştün adı ilə bağlıdır və qeyd edək ki, bu dini etiqad yalnız Azərbaycan ərazisində yaşayan tayfaların deyil, eyni zamanda İranda, Orta Asiyada və digər bölgələrdə yaşayan tayfaların da dini etiqadına çevrilmişdir.

Zərdüşti dininin əsas müddəası ondan ibarətdir ki, dünyada bir-biri ilə daim vuruşan iki qüvvə vardır. Biri xeyir-**Hörmüz**, digəri isə şər-**Əhriməndir**. Zərdüştün dini təlimində baş ilahi qüvvə odu təmsil edir. Bu səbəbdən də, Zərdüşti dininə inananlar atəşgahlar tikir, orada od yandırır və bu odu qoruyub saxlayıdılar. Onlara görə, od müqəddəs bir qüvvədir, o, təbiətdə mövcud olan

napak ünsürlərdən qorunmalıdır.[164] Zərdüşti dininə inananlara görə, həyatın əsasını ***su, od, torpaq və hava*** (külək) təşkil edir. Bu səbəbdən də, onlar bu dörd ünsürün təmiz qalmasına səy göstərirdilər. ***Od*** isə dörd ünsürün içərisində ən müqəddəs, baş ilahi qüvvə hesab olunur. Onlar od qarşısında səcdə qılır, ona sitayiş edir, onun şərəfinə qurbanlar kəsir, baş verən fəlakətlərin səbəbkarını Əhrimən hesab edirdilər.

Antik müəlliflər Zərdüştü maq təriqətinin və yaxud məzdəizmin banisi hesab edirlər. Əlbəttə, məzdəizmdən danışarkən qeyd etməliyik ki, başqa dinlərin daxilində baş vermiş təbəddülat Zərdüştilikdən yan keçməmişdir. Elə bu səbəbdəndir ki, Hörmüz ilə Əhrimən nur ilə zülmət, xeyir ilə şər, sülh ilə müharibə arasında gedən mübarizə olub iki ictimai və təbii kökə malikdir. Başqa sözlə, Hörmüz və Əhrimənin görüşü həqiqi dualizmdir.

Xatırladaq ki, Zərdüştün haradan olması bu gün də mübahisəlidir. Zərdüşt haqqında ilkin məlumat verən yunan tarixçisi Xsanti (e.ə. 465-425) olmuşdur. 17 il İran sarayında yaşayıb əsərini dövlət arxivi əsasında yazan Ktesidən istifadə edən Diodor Zərdüştün Bəlxdən olduğunu bildirmişdir. Plasta istinad edən Ammian Marselli də Zərdüştün Bəlxdən olduğunu göstərmişdir. Bəzi müəlliflər isə onun Atropatenada anadan olduğu qənaətindədirlər.

Yunan mənbələrində göstərilir ki, Zərdüşt Q*azakada*, ərəblərdə *Cənzədə,* müasir dövrdə *Təxt-e Süleyman* adlanan yerdə anadan olmuşdur. Müasir dövrdə Zərdüşti dininə inananların əqidəsinə görə Zərdüştün e.ə. 660-589-cu illər arasında yaşaması zənn edilir.[165] Bir sıra mənbələrdə Zərdüştün özünü e.ə. 595-ci ildə peyğəmbər elan etməsi bildirilir. Ərəb müəllifi Məsudi Zərdüştün dövründən İskəndərə qədər olan dövrü (İskəndərin hücumuna qədər olan dövr nəzərdə tutulur - müəlliflər) 258 il, Əbu Reyhan Biruni isə 250 il hesab edir.

Bir qrup müəlliflər isə Zərdüştün Azərbaycandan olduğu iddiasındadırlar. Bəllidir ki, o dövrdə bütün atəşgahlar arasında Qazakada olan məbəd daha məşhur olmuş və Yaqut Həməvinin göstərdiyi kimi, *Cənzə (Qazaka)* Marağa ilə Zəncan, Zur və Dinəvər şəhərləri arasında yerləşmişdir. İbn Xordadbeh təsdiq edir ki, Sasani şahları tacqoymadan sonra Mədainə piyadə gələrək atəşgahı ziyarət edərmişlər. Qeyd edək ki, dövrün ən görkəmli adamları da Cənzədə təhsil aldıqdan sonra digər atəşgahlara göndərilirdilər. Hər halda hələlik Zərdüştün yaşayıb yaratdığı dövr və haradan olması mübahisəlidir.

Zərdüştiliyin müqəddəs kitabı olan «Avesta» çoxtəbəqəlidir və müxtəlif hadisələri özündə birləşdirir. Təkrarlar və ziddiyyətlərdən xali deyildir. «Avesta»nın dili, oradakı ayrı-ayrı fraqmentlər müxtəlif tayfa və qəbilələrin şifahi dilini əks etdirir. Bir sıra ölkələrdə təkallahlığın meydana çıxmasında «Avesta»nın rolu olmuşdur. Bu kitab tunc dövrünün məhsuludur. İran alimi Purdavud onun meydana çıxdığı dövrü e.ə. II minilliyin sonuna aid edir.

«Avesta»nın meydana çıxdığı yer və vaxt haqqında da müxtəlif fikirlər vardır. Holland alimi Pileyə görə, «Avesta» eramızdan 800 il əvvəlin məhsuludur. Bir sıra tədqiqatçılar «Avesta» nın Mərkəzi Asiyada, bir qrup tarixçilər isə onun İranın şərqində meydana çıxdığını iddia edirlər.

«Avesta»nın hissələri ***Yəsna, Videvdad, Vispared və Yəşt****dir*. Ancaq ilkin «Avesta» bizə gəlib çıxmamışdır. Mənbələrin məlumatına görə, ilkin «Avesta» Makedoniyalı İskəndərin İrana hücumu zamanı, Persepol (Təxt-e Cəmşid) alındıqda onun tərəfindən yandırılmışdır. Əlimizdə olan «Avesta» ya gəldikdə isə bu təkmil olmayan kitabdır, Parfiya və Sasanilərin hakimiyyətinin ilk dövründə həqiqi «Avesta» əsasında toplanmış hissələrdən ibarətdir. 1771-ci ildə Fransız alimi Angetil dü Berron ilk dəfə olaraq «Avesta»nı fransız dilinə tərcümə edib nəşr etdirmişdir.[166]

«Avesta» sözünün mənası «əsas», «bünövrə», «sığınacaq» mənasındadır. Bu kitab fars ədəbiyyatında *Besta, İsta, Abesta* formasında göstərilmiş, onun hissə- ləri əvvəllər şifahi şəkildə əzbərlənərək nəsildən-nəsilə keçmişdir. Məlumatlarda göstərilir ki, Əhəmənilər dövründə «Avesta»nın iki nüsxəsi olmuşdur. Bəzi məlumatlara görə, İskəndərin əmri ilə onun birinci nüsxəsi yandırılmış, ikinci nüsxəsi isə yunan dilinə tərcümə edilmişdir. Hər halda Dara tərəfindən Bisutun qayasında e.ə. 520-ci ildə yazılmış kitabədə «Avesta»nın adının çəkilməsi göstərir ki, «Avesta» artıq həmin dövrdə yazılı şəkildə mövcud olmuşdur.

«Avesta» 12 min öküz dərisinə yazılmışdır. Pəhləvi mənbələrində mövcud olmuş «Avesta» 1000 fəsil və yaxud 21 cilddən ibarət imiş. Sasanilərin dövründə yazılmış «Avesta» isə **345.700** sözdən ibarət olub 348 fəslə, yaxud «**Həsk**»ə bölünmüşdür. Sasanilər dövrü «Avesta»nın **345.700** sözündən **83.000** kəlməsi bizə gəlib çatmışdır. Bu dinə inanan hər kəs öz gündəlik həyatında düz danışmalı, yalançılığa yol verməməli, cəmiyyətin fəal üzvü kimi çalışmalıdır.

Zərdüşti dininin əxlaqi təlimi 3 əsas-***yaxşı düşüncə, gözəl bəyan* və *xeyirxahlıq*** üzərində qurulmuş, dinin təlimlərində ailə və övlad tərbiyəsinə xüsusi fikir verilmişdir.[167]

Avesta»da təlim-tərbiyəyə böyük yer verilir. Orada göstərilir ki, hər bir şəxs müəllim və tərbiyəçilər vasitəsi ilə yazıb oxumağı öyrənməklə yanaşı özünün sağlamlığına da fikir verməlidirlər. Zərdüştiliyin geniş yayıldığı Azərbaycana gəldikdə isə, burada dini ayinlər əsasında yaranmış təlim-tərbiyə üsulu mövcud olmuşdur. Mənbələrə istinadən demək olar ki, Azərbaycan ərazisində bina edilmiş mühüm atəşgahların nəzdində istər dini, istərsə də digər təhsil növləri kifayət qədər olmuşdur. Bu dövrdə **saray, atəşgah və ailə məktəbləri** fəaliyyət göstərmiş, Sasanilərin hakimiyyəti dövründə bunların sırasına **ibtidai məktəblər və peşə məktəbləri** əlavə olunmuşdur.

Saray məktəblərində əyan və rütbə sahiblərinin uşaqları, şahzadələr təhsil almış, bu məktəblərdə dövləti idarə edəcək məmurlar hazırlanmışdır. Təlim-tərbiyə ocaqlarında ancaq yuxarı sinfin-saray adamlarının, qoşun başçılarının, böyük torpaq sahiblərinin və azatların uşaqları təhsil alırdılar.

Məktəblər dörd silkə xidmət məqsədilə 4 bölməyə – ***yaşlılara, uşaqlara, cavanlara və kişilərə*** bölünmüşdür.

Təhsil səhər tezdən başlayırdı. Atəşgahlarda təhsil alanlar bütün günü təhsil alır və orada gecələyirdilər. Dini təhsil alanların xərci atəşgahların hesabına ödənilirdi. Herodotun və Strabonun məlumatlarına görə, uşaqlar 5 yaşında təhsilə başlayır dılar. Əyan uşaqlarının təhsil müddəti Herodotda 20, Strabonda isə 24 yaş göstərilir.[168]



*Alban əlifbası*

Saray məktəblərinin təlim-tərbiyə proqramı 3 mühüm hissədən-dini-əxlaqi, fiziki (idman) və yazıb-oxumaqdan ibarət olmuşdur. Gənclərin təlim-tərbiyəsi ilə şahza dələr və ustaddarlar məşğul olurdular. 7-15 yaş arasında bir gün bayram edilirdi. Yaxın adamların iştirak etdiyi həmin məclisdə uşaqlar məbəddə dini ayinləri yerinə yetirdikdən sonra müqəddəs köynək geyir, müqəddəs kəmər bağlayır və Zərdüşti dinini qəbul edirdilər. 15 yaşına çatan gənc həddi-buluğa çatmış hesab edilir və həmin gündən dini ayinləri yerinə yetirməyə borclu olurdu.

Tədqiqatlar göstərir ki, hələ e.ə.III minillikdə Cənubi Azərbaycanda mixi yazı növü ilə tanış idilər. Mixi yazını oxuyan və bu yazı ilə hökmdara məxsus abidələrə mətn yazan mirzələr vardı. Ola bilsin ki, Urmiya gölü hövzəsi ölkələrində məktəblər fəaliyyət göstərmişdir. Mannada da mixi yazını oxuyan mir zələr olmuşdur.[169]

Ərəblərin Azərbaycana gəlişi ilə *tanrıçılıq və atəşpərəstlik* yerini **islama** verdi. İslam dininin müqəddəs kitabı «Qurani-Kərim» in möcüzələrdən xəbər verən kəlamları dünyanın sirli-sehirli nöqtələrinin açılmasında alimlərin yolgöstərən işıqlı ulduzuna çevrilmişdir. Bir sözlə, hər bir tərəqqi, nailiyyət və kəşflər bizim təhsilə olan münasibətimizi dəyişməyə sövq edir. Nəzərə alsaq ki, cəmiyyətin formalaşması və inkişafı, əslində təhsilin səviyyəsini müəyyənləşdirir, onda sübuta ehtiyac yoxdur ki, elmi olmayanın gücü olmaz, təbiət qanunlarından xəbərsiz olanlar cəmiyyətdə əhəmiyyətli dəyişikliklərə nail ola bilməzlər. **Plutarxın yazdığı kimi, *İnsan təbiətində iki ali məqam var: - Zəka və nitq - hər ikisi ancaq təhsil vasitəsi ilə inkişaf etdirilir.***

Azərbaycanda yeni islam dəyərləri formalaşmağa başladı. Bunu «Kitabi Dədə Qorqud» dastanında daha aydın görmək olar. Dastandan aydın olur ki,

tərbiyə vasitəsi kimi dini və milli bayramlardan, müxtəlif oyun və xalq mahnılarından istifadə edilirdi.[170]

Vətən əxlaqı, vətən torpağının hər qarışı uğrunda mübarizə Azərbaycan türklərinin istinad nöqtəsi olmuşdur. Çünki, Ziya Göyalpın yazdığı kimi, «Vətən əxlaqımız qüvvətli olmasa, nə müstəqilliyimizi, nə azadlığımızı, nə də vətənimizin böyüklüyünü qoruya bilərik».[171]

Azərbaycanda əhalinin islam dinini qəbul etməsi ilə ümümtürk mədəniyyəti islam dini ilə sintez olundu, yeni **türk-islam mədəniyyəti** forma laşdı.

Şərq elminin kəşfləri Avropa elmini də inkişaf etdirdi. Başqa sözlə, ABŞ şərqşünası Q.E.Qrünebaunun təbirincə desək, memarlıq, tikinti və gəmiçilik və s. sahələrdə *Avropa həmişə Şərqə borcludur*. Şərqi, daha dəqiq söyləsək türk dünyasını elm və mədəniyyət çayına bənzətsək bu çay üzərindəki körpü Azərbaycan idi, Qərbə gedən yollar buradan keçirdi. Çox təəssüf ki, sonralar bu körpü çaydan uzaq düşdü, Qərb ölkələri keçmişi ilə fəxr edən Şərqi, xüsusilə türkləri mədəniyyətsiz, barbar adlandırdı. Bəxtiyar Vahabzadənin poeziya dili ilə desək «**Körpü çaydan uzaq düşüb».**[172]

VIII əsrdən etibarən Azərbaycan ərazisində tədricən müsəlman məktəbləri yayılmağa başladı. İlk müsəlman məktəbinin açılışı VIII əsrin birinci yarısına təsadüf edir. Zaman ötdükcə təlim-tərbiyə məsələləri dəyişikliyə uğradı, yeni proqram, maliyyə sistemi, qayda-qanunlar formalaşmağa başladı.

Ərəb istilasının nəticəsi olaraq bir çox ölkələrlə iqtisadi və siyasi əlaqələr genişləndi. Erkən orta əsrlərdə islamı qəbul etmiş digər ölkələrlə yanaşı, Azərbaycanda da təhsil islam prinsipləri əsasında qurulmağa başlandı, maarif və mədəniyyət, yeni əxlaqi dəyərlər meydana çıxdı.

XIX əsrin əvvəllərinə qədər Azərbaycanda uşaq və gənclər islam ideolo giyası əsasında tərbiyə edilirdilər. Müsəlman şərqində yaranan dini məktəblər ***kətəbə – məktəb*** adlanırdı. Əsas tədris fənləri ərəb əlifbasının öyrədilməsi və «Quran» nın oxunması idi. İbtidai məktəblər dini məktəblərə çevrilərək, məscidlərin nəzdində təşkil edilirdi. Sözsüz ki, zaman keçdikcə təlim-tərbiyə müəssisələri dəyişikliklərə uğradı, ilk təlim mərkəzləri meydana gəldi.

İslamda ilk məktəb Məhəmməd peyğəmbərin (ə.s.) adı ilə bağlıdır. Məhz onun təklifi ilə «Dar-Əl-Əqrəm» (Əl-əqrəm evi) təsis edilmiş, burada yarı açıq, yazı gizli şəkildə müsəlmanlara islamın əsasları öyrədilmiş, onları islam ruhunda tərbiyə etmişlər.

İslam aləmində məscidlər Allah evi hesab edilir, əsas vəzifələri ilə yanaşı həm elm ocağı, həm də qazı idarəsi rolunu oynayırdı. İslam məktəb təcrübəsində həm cismani cəzalar, həm də rəğbətləndirmə növləri tətbiq olunurdu.

VII-IX əsrlərdə islam ökələrində ali təhsil verən ayrıca mədrəsələr olmasa da, bir çox iri şəhərlərdə dövrün görkəmli alimləri olan əl-Xarəzmi, İbn Məskuyə, ***Əbu Əli İbn Sinanın*** ayrıca tədris dairələri olmuşdur.



**Tanıtma**:

**Əbu Əli İbn Sina (980-1037)**- ***Buxara yaxınlığındakı Əfşah kəndində anadan olmuşdur. Buxara ibtidai müsəlman məktəbində oxumuşdur. İbn Sina 16 yaşında məşhurlaşmışdır. O, Buxara əmirinin saray kitabxanasından istifadə edərək fəlsəfə, məntiq, fizika, riyaziyyat, həndəsə, astronomiya, musiqi, tibb elmlərinin əsaslarını öyrənmişdir. Onun elmin ayrı-ayrı sahələrinə dair 450 əsəri vardır. Bunlardan 150-si bizə gəlib çatmışdır. «Danişnamə» («Bilik kitabı»), «Kitab-il-insaf» («Ədalət kitabı»), «Tibb elminin qanunu», «Müalicə elmi kitabı», «Nicat kitabı» və s. əsərlər İbn Sinanın elmi dünyagörüşünü əks etdirir.***

IX-XII əsrlər bütün ərəb xilafətində olduğu kimi, Azərbaycanda da yüksəliş, oyanış dövrü olmuşdur. *Əbülhəsən Bəhmənyar, Qətran Təbrizi, Xətib Təbrizi, Şihabəddin Sührəvərdi, Xaqani Şirvani, Nizami Gəncəvi* kimi dahilər yetişmişdir.

XI-XIII əsrlər Azərbaycanda hakimiyyət dəyişiklikləri ilə xarakterizə olunur. Əvvəlcə səlcuqilərin, sonra isə monqolların gəlişi idarəçilikdə olduğu kimi, təhsil sahəsində də dəyişikliyə səbəb oldu. Ərəb dili sıxışdırılmağa, əvəzində fars dilinin tədrisinə diqqət artırılmağa başlandı. Bu bir tərəfdən təhsildə ikitirəlik yaradır, digər tərəfdən isə fars dilində yeni dərs vəsaitlərinin yaranmasına səbəb olurdu. Daha çox dərslik kimi istifadə olunacaq didaktik əsərlərdən, həmçinin ərəb və fars dilindəki məcmuələrdən istifadə olunmağa başlandı.

XII əsr Şərq intibahı dövrü hesab olunur. Bu dövrdə sənətkarlıq və ticarət mərkəzləri olan şəhərlər artmış, nəticədə beynəlxalq elmi, mədəni və ticari əlaqələr genişlənmiş, elm, incəsənət, poeziya və fəlsəfə sahəsində ümumdünya əhəmiyyətli dahilər yetişmişdir. Onların yaradıcılığı, sonrakı mərhələlərdə Avropa intibahına mühüm təsir göstərmişdir. Nizami Gəncəvinin yaratdığı «ideal cəmiyyət» modeli, ***Nəsirəddin Tusinin*** yaratdığı Marağa rəssədxanası, elmin müxəlif sahələrində ümumdünya miqyaslı kəşflərin edilməsi həmin dövrün təhsilnin səviyyəsindən xəbər verir.[173]



**Tanıtma:**

**Məhəmməd ibn Həsən (Nəsirəddin Tusi) (1201-1274)** ***Azərbaycanın ensiklopedist alimidir. Tus şəhərində təhsil aldığı üçün Tusi ləqəbini götürmüşdür. İlk müəllimi atası, sonra isə Bəhmənyar və İbn Sina məktəbinə mənsub alimlər olmuşlar.***

***N.Tusinin təsis etdiyi Marağa astronomiya rəssədxanası qısa müddətdə böyük elmi mərkəzə çevrilmiş, onun rəhbərliyi ilə elmin müxtəlif sahə lərinə aid elmi əsərlər yaradılmışdır. «Zic Elxani» (Elxani cədvəlləri), «Şənl ul-Qita» (Kəsişmələr şəkli), «Təhrir Əl-Məcəsti» (Məcəstinin şəhri), «Təzkireyi Nəsiriyyə», «Əxlaqi Nasiri», «Cavahirnamə», «Mahiyyət barəsində» və s. əsərlərin müəllifidir.***[174]

Dövrün ən mühüm əsərləri sırasında ***N.Tusinin*** «Əxlaqi-Nasiri» (1259) əsəri mühüm yer tuturdu. Son 700 ildə fars dilində yazılmış ən mükəmməl əsərlərdən olan «Əxlaqi-Nasiri»də elmlərin və insan fəaliyyətinin bütün sahələri əksini tapmışdır[175]. Əsərdə antik yunan fəlsəfəsinin, qədim İran tərbiyə nəzəriyyəsinin, klassik Ərəb Şərqi əqidəsinin əsasları, Azərbaycanın iqtisadi və siyasi təcrübəsi vəhdət halında sistemə salınmış, əxlaqın təmizliyi, ailə tərbiyəsi və idarəetmə siyasətinə dair mütəfəkirin fikirləri verilmiş, tərbiyənin insanı formalaşdıran əvəzsiz vasitə olduğu diqqətə çatdırılmışdır.

**XII-XIII əsrlərdə** ***təhsil sistemi ibtidai təhsil verən məktəblərdən, orta və ali təhsl verən mədrəsələrdən, xanəgahlardan, fərdi ev təhsilindən, saray təhsilindən və universitetlərdən ibarət olmuşdur.***

Tədris müəssisələrində təhsil müddəti müxtəlif olmuşdur. Bu hal daha çox şagirdlərin və müəllimlərin hazırlığından, tədrisin təşkilindən asılı olurdu. Müsəlman dini məktəblərinə qəbul üçün xüsusi qəbul qaydası olmadığından nəticə proqramın mənimsənilməsi ilə müəyyənləşdirilirdi.

XIII-XIV əsrlərdə Təbriz yaxınlığında böyük elm və təhsil ocağı olan «Rəb-e-Rəşdi» kompleksi inşa edilmişdir. Universitet şəhərciyi tipində olan bu təhsil ocağında 7 min tələbənin təhsili ilə 450 müəllim məşğul olurdu. Tələbələrin 1.000 nəfəri azərbaycanlı idi.[176]

XIV əsrin əvvəllərində Azərbaycan şəhərlərində yeni təhsil ocaqları açılmışdır. 1301-ci ildə Bakıda Cümə məscidinin yanında tikilmiş mədrəsə buna nümunədir.[177]

XIII-XV əsrlərdə Azərbaycan dilinin ədəbi dil kimi formalaşması başa çatdı. Bu dövrdə yaşayıb-yaradan Əssar Təbrizi, Əhvədi Marağayi, sonralar yazıb-yaradan İmadəddin Nəsimi, Məhəmməd Füzuli, **Şah İsmayıl Xətai**[178] öz əsərlərində elm və təhsilə xüsusi yer vermişlər. XVI əsrdə Azərbaycanda mədrəsələrin sayı artır.



**Tanıtma**:

***Azərbaycan Səfəvilər dövlətinin qurucusu Şah İsmayılın atası Şeyx Heydər, anası Ağqoyunlu hökmdarı Uzun Həsənin qızı Aləmşah bəyim olmuşdur. Şah İsmayılın 25-ci babası Əbülqasım Həmzənin, 15-ci babası Qızılbörk Firuzun qəbirləri Ərdəbil yaxınlığındakı Şeyx Kəhrəlan kəndində indi də durur. Yerli əhali bu qəbirlərə ziyarətgah kimi baxır.***

***Şah İsmayıl 1487-ci il iyunun 23-də Ərdəbil şəhərində anadan olmuşdur. 1488-1492-ci illərdə Ağqoyunlu hökmdarı Sultan Yaqubun əmri ilə qardaşları Sultanəli və İbrahimlə birgə həbsdə qalmış, İsmayılın sonrakı həyatı Lahicanda-Gilan hakiminin sarayında keçmişdir. 1501-ci ildə hakimiyyət başına gəlmiş, 1524-cü ildə dünyasını dəyişmişdir.***[179]

Şah İsmayıl Xətai maarifpərvər dövlət başçısı olmuş, yeni məktəb və mədrəsələrin açılması, klassik əsərlərin toplanması, xəttatların hazırlanması, nadir əlyazmaların üzünün köçürülməsi və onlara miniatürlərin işlənməsi məsələlərinə diqqət yetirilmişdir. Bu da təhsilin inkişafına təkan vermişdir. Məktəblərdə tərcümə əsərlərindən istifadə olunurdu. Bəzi məktəblərdə hesab öyrədilirdi.

Ana dilində əsərlər də tədris olunmağa başlanmışdır.

## 2.2. Mədrəsədən «rus – tatar» məktəbinə

XVII əsr Azərbaycan xalqının tarixində milli məktəb və maarifin inkişafı ilə seçilir. Bu dövrdə Azərbaycan dilinin istifadə dairəsinin genişlənməsi, ana dilində təlimin aparılması milli mədəniyyətin, xüsusilə milli maarifin inkişaf səviyyəsini təsdiq edir.[180]

XVII əsrin 40-cı illərində Azərbaycana gəlmiş Ö.Çələbinin məlumatına görə, 1647-ci ildə Təbriz şəhərində 47 iri mədrəsə və 600 məktəb var idi. Azərbaycanın Gəncə, Ərəş, Ərdəbil, Naxçıvan, Nuxa, Bakı və s. kimi şəhərlərində çoxlu məktəb və mədrəsə fəaliyyət göstərirdi. Azərbaycanın şəhərlərində «müxtəlif elmləri bilən çoxlu alim və mütəfəkkirlər yaşayırdı». Ümumiyyətlə, orta əsr mədrəsələri Azərbaycanda elm və ədəbiyyatın inkişafında böyük rol oynamışdır.

XIX əsrə qədər Azərbaycan xalqının təhsil sistemi əsrlərdən bəri davam edən ənənəvi məktəb və mədrəsə təhsili ilə bağlı olmuşdur. XIX əsrin əvvəllərində Azərbaycanın siyasi, iqtisadi və mədəni həyatında baş verənlər, Gülüstan, daha sonra Türkmənçay müqavilələri ilə ikiyə bölünən Azərbaycanda xalq maarifi və məktəb ölkənin həyatında baş verən dəyişikliklərə uyğun olaraq yeniləşməyə başladı. Azərbaycanın Rusiyanın tərkibinə daxil edilməsi ilə burada yerli dillərin tədris edildiyi məktəblər açmaq zərurəti yarandı.[181]

Azərbaycanda bu dövrdə adi məktəblərdən başqa xüsusi ruhani məktəbləri-*mədrəsələr* də fəaliyyət göstərirdi. Şagirdlərin bir qismi təhsillərini ali müsəlman təhsil müəssisəsi sayılan mədrəsədə davam etdirirdi. Mədrəsə binaları daha böyük və abad idi. Bu məktəblər adətən böyük məscidlərin nəzdində açılır və onların hesabına saxlanılırdı. Mədrəsələrdə təhsil və yaşamaq pulsuz idi. Məktəbdən fərqli olaraq, mədrəsələrin pansionu və yataqxanası olmuşdur. Mədrəsəyə 16 yaşından yuxarı, türk və fars dillərini bilən, ruhani olmağa hazırlaşan gənclər qəbul edilirdilər. Burada tədris edilən əsas fənlər ***ərəb dili, ilahiyyat və müsəlman hüquqşunaslığı*** idi. Bundan əlavə, mədrəsələrdə ***tarix, psixologiya, məntiq, hesab, riyaziyyat, coğrafiya, fəlsəfə, ədəbiyyat, təbabət, həndəsəyə*** dair biliklər verilirdi. Həmin fənlər islam mövqeyindən tədris olunurdu. Onların sayı dəqiq məlum

deyildir, çünki müvafiq məmurlar məktəblər haqqındakı ümumi məlumatlarda onları ayırmırdılar. Mədrəsəni bitirənlər ərəb dilinə mükəmməl yiyələnirdilər, adətən, ərəb dilinin öyrədilməsinə 2-3 il həsr edilirdi.

**Mədrəsələr** iki növə-**ibtidai və ali dərəcələrə** bölünürdü. Ali müsəlman mədrəsələri Təbrizdə, Tehranda və başqa şəhərlərdə yerləşirdi. Məktəblərdə olduğu kimi, mədrəsələrdə də təhsilin müddəti qəti müəyyən edilməmişdi. Bir qayda olaraq, təhsil 6 ildən 10 ilədək davam edirdi. Mədrəsələrin dəqiq müəyyənləşdirilmiş proqramı yox idi, burada gənclərlə yanaşı, yaşlılar (30 yaşına qədər) da oxuyurdular. Onlar mədrəsəni bitirən zaman dini rütbə alırdılar.

Mədrəsədə tədrisin keyfiyyəti əsasən onun rəhbərinin təhsil səviyyəsindən asılı olurdu. Mədrəsələrə əsasən xarici ölkələrdə-İranda, Türkiyədə, Misirdə ali dini təhsil almış müdərrislər başçılıq edirdilər. Barmaqla sayılacaq qədər az olan Şərq universitetlərində oxumaq hər adamın işi deyildi.

***Mollaxanalar*** məscidlərin həyətindəki hücrələrdə yerləşirdi. Bu hücrə lərdə mollalar uşaqlara dərs verirdilər. Bu səbəbdən də, molla dərs verən hücrələrə mollaxana deyirdilər. **Nuxada** XIX əsrin axırında 26 məscid var idi. Böyük məscidlərin yanında iki, üç, beş mollaxana olduğu halda, bəzi xırda məscidlərin yanında mollaxana yox idi. Şəhərdə cəmisi 27 mollaxana var idi. Hər mollaxanada 15-20 şagird oxuyurdu. Evlərdə qızlar üçün qadın mollaxanası fəaliyyət göstərirdi. Belə qadın mollaxanalarının sayı 10-12 olub, onların hər birində 10-12 nəfər qız oxuyurdu. Qızlara ancaq quran oxumaq öyrədilirdi. Oğlanlarla məktublaşmamaq üçün qızlara yazı öyrətmirdilər.[182]

Mollaxanaların iş prinsipi və əsas vəzifələri Rəşidbəy Əfəndiyevin əlyazmasında daha dolğun ifadə olunmuşdur. Böyük pedaqoq R.Əfəndiyev yazırdı: «Əski zamandan bəri mollaxanada və mədrəsələrdə maarif intişar etməkdə idi. Məscidlərdə ərəb dilində ruhaniliyə aid kitablar tədris olunurdu. İbtidai təlim üçün hücrələrdə «Quran» hecasından ötrü molla tərəfindən yazılmış çərəkədən xırda şagirdlərə yazı olmadan dərs verilirdi. «Quran» hecasını bitirəndən sonra fars dilində dərs verməyə başlanılırdı. Tacirlər arasında yazılan məktublar, siyahı və s. farsca yazılırdı. Çünki o zaman təkcə İrana tabe olan Azərbaycanda deyil, hətta Belucistan (indiki Tacikistan), Hindistan, Əfqanıstan, Buxara, Xivə, Türkmənistan və s. xanlıqlar da fars dilinin rəsmi nəvişat canatını əda edirdilər.[183] Bu səbəbdən bütün Şərq məmləkətlərində mövcud olan məktəblər iki qisim idi. Biri mədrəsələr-dini-ruhani məktəb sayılırdı. O biri isə müaif (hökumət lisanına) rəsmiyyə xidmətedici fars məktəbi idi. Ana dili o məktəblərdə tədris olunmazdı. Ana dilində tədris kitabı yox idi. Ərəb və fars kitabları ilə bərabər «tumar» dan dərs verilirdi. Bu tumar lenta kimi biri-birinin ayağına yapışdırılmış məktublar, sənədlər, icarənamələr, şputnamələr və apir vəsiqələrdən ibarət idi. (Vəsiqələr o tumarlarda toplanırdı). Maddi cəhətdən mədrəsələr «zəkat» və «xüms» varidatilə təmin olunurdu. Hücrələrdəki mollaxanalar isə: ***«ustanın əsası, ananın kasası, atanın kisəsi»*** ilə davam etməkdə idi. Mollalar öz büdcəsini artırmaqdan ötrü hər işə əl atırdı, əfsun salırdı, dua yazırdı, muzula tuturdu, sərxubad oxuyurdu, yuxu yozurdu, fala baxırdı, qurd ağzı bağlayırdı, ruh ölçürdü, tas qururdu, cadu və

tilisim düzəldirdi, qırx oxuyurdu və s. mövhumatı işlərlə məşğul olurdu. Müştəri nəzəriylə baxılsaydı bu iki qisim məktəblər əhali üçün maarif ocağı olmayıb, «mövhumat yuvası» vəzifəsini yerinə yetirdiyini görmək olardı».[184]

«Məktəbdar mollaya «usta» və tələbəsinə «şagird» demək qədimdən qalmışdır. Çox bilən və ağıllı bir tələbəni molla öz məktəbində xəlifə kimi saxlayırdı. Mollaxanada on, on beş il oxuyurdular. Səkkiz ildə şagirdlər yalnız Quranı hecalayıb oxumaq öyrənirdilər. Mollaxananı oxuyub başa çatdıran çox az olurdu. Oxuyub başa çatdıranlar isə mollalığa gedirdilər. Uşaqların çoxu mollaya və mollaxananın şəraitinə nifrət edərək mollaxananı atıb və mollaya bir neçə ağır, yaramaz cavablar verərək gedirdi. Onları bir sənətə qoyurdular. Tək-tək hallarda bəzi şagirdlərdən 10-15 il oxuyub ondan sonra fərasətlərinin sayəsində yazıçı, şair və ədib çıxırdı».[185]





***Mollaxanada oxuyan oğlan və qızın geyimi (Azərbaycan Respublikası Təhsil Nazirliyinin Xalq Təhsili Muzeyindən fotoşəkil)***



.

*Mürəkkəb qabı və qələm (Azərbaycan Respublikası Təhsil Nazirliyinin Xalq Təhsili Muzeyindən fotoşəkil)*

Əhməd bəy Nəbiyev xatirələrində yazır ki, «…mollalar və mollaxana şagirdləri yazı yazmaq üçün əldə qayırma mürəkkəb (çernil) işlədirdilər. Onu alan uşaqlar qara sümükdən olan çəkilmiş dava bir az ipək çıxarı, bir az mürəkkəb sındırıb salır, bir az da su töküb o mürəkkəbi orda tez həll edirdilər. Mürəkkəb qabındakı ipək çıxarı o mürəkkəbin suyunu axmağa qoymur və ipək özü də suda çürümürdü. Bu mürəkkəblə yazılmış yazıları su yuya bilməzdi. O zaman pero olmadığından qələm üçün yumru qələm ağacı yoğunluğunda və təxminən 15-17 santimetr uzunluğunda İrandan tünd şabalıdı rəngində qamışlar gətirilirdi. 5-7 buğumlu 1 və ya 2 qəpiyə satılırdı. Dəymiş qamışın rəngi tünd olurdu. Onu ancaq mollalar biçə bilirdilər. Hər adam onu biçməyi (çətrməyi) bacarmazdı. Qələmi biçməyin qaydası belə idi: Qamışı sol əlinə alır, quyruğun çölə biçilməsi üçün başı baş barmağı tərəfindəki yumşaq dabanına qoyub sağ əlindəki bıçaqla döşünə sarı bıçağı çəkirdi. Biçəndən sonra ucunu düz kəsir və ortasından bıçaqla bir az ayırırdı.

Təxminən XIX əsrin sonlarında «aspid lövhəsi» (Аспидная доска) meydana çıxdı. Bu da dördkünc və kənarları taxta ilə çərçivələnmiş nazik qaradaş idi. O Lifel ilə ağ yazırdı. İstədiyi vaxt əski ilə silib yenidən yazmaq mümkün olurdu. Silgi üçün əskidən balaca torba tikib içinə pambıq və yaxud əski qırığı doldurub yastıq hazılanırdı. Əgər yazı çətin silinirdisə, onda yastığı bir az nəmləyirdilər. Bir müddət sonra çernil, pero və dəftər meydana çıxdı».[186]

Şimali Azərbaycanın işğalından başlanan XIX əsr xalqımızın tarixi müqəddəratında kəskin dönüş yaratmış, Cənubi və Şimali Azərbaycanda müxtəlif sosial-iqtisadi, siyasi şərait onların mədəni inkişaf yollarına müəyyən təsir göstərmişdi.

Bəhs edilən dövrdə Rusiya maarifin inkişafına görə Avropa dövlətlərindən geridə qalırdı. Dövrün mütərəqqi dəyişiklikləri maarif sisteminə çətin yol tapırdı. Təhsil silki səciyyə daşıyırdı.

Rusiyanın əsarətində olan Şimali Azərbaycanda məktəb və ali təhsil sahəsində daha acınacaqlı siyasət yeridilirdi. Maarif sahəsində görülən işlər müstəmləkəçilik siyasətinin həyata keçirilməsinə xidmət edirdi. Azərbaycanda əvvəlki tarixi dövrlərdə məktəb və mədrəsələrin həyatında əldə olunan nailiyyətlər inkar olunur, onların əhəmiyyəti heçə endirilir, ruslaşdırma yolu ilə çarizmə sədaqətli məmurlar hazırlanmasına yönəldilən təhsil sisteminin yaradılmasına cəhd edilirdi. Bu da özlüyündə çarizmin siyasi və iqtisadi mövqeyinin möhkəmlənməsinə kömək etməli idi. Lakin bu dövrdə təhsil sisteminin quruluşunda hələ aydınlıq yox idi. Ona görə də, diyarda maarifin bir çox məsələləri həll edilməmiş qalırdı.

Doğrudur**,** çarizm Zaqafqaziyada məktəb açmaq və yerli xalqların dillərinin tədisini vacib bilməklə özünün imperiya məqsədlərini həyata keçirmək istəyirdi. Yerli xalqları itaətə gətirmək, ruslaşdırma siyasəti yeritmək, çarizmə qarşı xalq

həyacanlarının qarşısını almaq, xalqları Rusiyaya yaxınlaşdırmaq, dolayısı ilə Rusiyanın bu yerlərdə hökmranlığını möhkəmləndirmək başlıca məqsəd idi. Beləliklə, əsrlərdən bəri fəaliyyət göstərən məktəblərin yerində yeni üsullu məktəblər yaranmağa başladı. Nəticədə, yeni üsullarla dərs deyəcək müəllimlər ordusu formalaşmağa başladı. Dərslər əsasən rus dilində aparılsa da, ana dili və şəriət dərslərinə də yer verilir, yeni dərsliklər yazılırdı. Mütərəqqi ideyalarla silahlanan yeni müəllimlər dəstəsi yetişirdi. Artıq rus mədəniyyəti, məktəbi, ictimai və pedaqoji ideyaları pedaqoji fikrin qabaqcıl xadimləri vasitəsi ilə Azərbaycana nüfuz edirdi. Bununla bərabər, çar Rusiyasının müstəm ləkəçilik siyasətinə baxmayaraq Azərbaycan iqtisadiyyatında və mədəniyyətində yeni məktəblər mütərəqqi rol oynayırdılar.

Maarif sahəsinə cüzi vəsait buraxılırdı. Təhsilə sərf olunan vəsait inzibati idarələrin saxlanılmasına çəkilən xərclərdən bir neçə dəfə az idi. Cənubi Qafqazda maarif işlərinə 40 il ərzində bir milyon manat (gümüş pulla) buraxıldığı halda, quberniya və qəza idarələrinin 1840-cı ildəki xərci 1.075 min manat olmuşdur. Belə bir vəziyyət, heç şübhəsiz ki, maarifin normal inkişafına mane olurdu.[187]

Təhsilin təşkilinə rəhbərlik müxtəlif vaxtlarda ayrı-ayrı idarələr tərəfindən həyata keçirilmişdir. Belə idarələrdən biri də, 1829-cu ildə yaradılmış və Şimali Azərbaycanı da əhatə edən Qafqaz Tədris Dairəsi idi.

Şimali Azərbaycanda kapitalizmin inkişafı nəticəsində mədəniyyətdə həlledici dəyişikliklər dövrü başlandı. Əsrin sonunda artıq iri sənaye mərkəzi olan Bakı eyni zamanda Azərbaycan mədəniyyətinin mərkəzinə çevrildi. Şamaxı, Nuxa, Şuşa, Gəncə, Naxçıvan kimi şəhərlər inkişaf etməyə başladı.

Çarizmin müstəmləkəçilik və ruslaşdırma siyasətinə baxmayaraq, bu dövrdə Şimali Azərbaycan mədəniyyəti tərəqqipərvər xadimlərin bütöv bir nəslini yetişdirdi. M.F.Axundovla bərabər məşhur maarifçi-pedaqoq, alim və mütəfəkkir H.Məlikov (Zərdabi), məşhur Azərbaycan dramaturqu N.Vəzirov, pedaqoq və maarifçi S.Ə.Şirvani, xalq maarifi xadimləri H.İ.Mahmudbəyov, S.M.Qənizadə, Rəşid bəy Əfəndiyev və bir çox başqalarını buna misal  göstərmək olar.

Milli burjuaziyanın H.Z.Tağıyev, M.Nağıyev və digər nümayəndələri maarif sahəsində və başqa xeyriyyə işlərində cəsarətli addımlar atırdılar. Onlar məktəblər açır, teatr binası tikdirir, ayrı-ayrı qəzetlərin nəşrinə vəsait ayırır, gənclərin başqa ölkələrə təhsil almağa göndərilməsinə yaxından köməklik göstərirdilər.

Şimali Azərbaycanda müşahidə olunan mədəni canlanma, yeni tipli məktəb və mədəni-maarif müəssisələrinin açılması, milli mətbuatın və teatrın yaranması, əhalinin qabaqcıl ziyalılarının xalqın milli şüurunun oyanmasına təsiri və s. bütün bunlar mədəniyyətin başlıca xarakterik xüsusiyyətləri idi.

Sadalanan çətinliklərə baxmayaraq, **XIX əsr** maarif sahəsində Azərbaycanda **yeni bir dövrü** təşkil edir. Zəngin mədəni irsə malik olan xalqımızın qabaqcıl ziyalıları dünya mədəniyyətinin nailiyyətlərindən bəhrələnərək Azərbaycanda xalq maarifini yüksəltməklə xalqın savadlanması qayğısına qalır, yeni tipli təhsil ocaqları açmaq üçün hakim dairələrə müraciətlər edir, çox çətinliklə də olsa, öz məqsədlərinə nail olurdular.

Şimali Azərbaycan Rusiya tərəfindən işğal edildikdən sonra çar hökuməti ölkədə öz siyasi və iqtisadi mövqelərinin möhkəmlənməsinə yardım etməyə qadir olan məmurlar ordusu hazırlamağı təmin edən yeni xalq təhsili sisteminin tətbiq edilməsi zərurəti ilə qarşılaşdı. Çarizmin Azərbaycandakı məktəb siyasəti Rusiyanın milli müstəmləkə siyasətinin bir hissəsi idi. Bununla belə o, hər halda gələcəkdə Azərbaycan əhalisinin yeni, mütərəqqi yolla təhsil alması üçün zəmin hazırladı. Bu dövr Azərbaycan xalqının maarifçilik tarixində ibtidai rus məktəblərinin təşkili ilə yanaşı, ənənəvi təhsil formalarının inkişafı ilə səciyyəvi idi.

1801-ci ildə Gürcüstan Rusiyaya birləşdirildikdən sonra Azərbaycan xanlıqları da Rusiya tərəfindən işğal olunmağa başladı. 1801-ci ildə Tiflisdə rus dilində təhsil verən ilk məktəblər yaradılmağa başlandı. Zaqafqaziyada hökmranlığını möhkəmləndirmək istəyən çar hökuməti öz tələblərinə cavab verən məktəblərin açılmasının zəruri olduğunu başa düşürdü. Beləliklə, 1802-ci ildə Tiflisdə ilk rus məktəbinin əsası qoyuldu. **«Tiflis nücabə məktəbi»** adlanan bu tədris müəssisəsində Gürcüstanın yuxarı dairələrinin və rus məmurlarının uşaqları təhsil almağa başladılar.[188]

«Tiflis nücabə məktəbi» ndə Qafqazda daha çox yayılmış olan Azərbaycan dili də tədris olunurdu. Bu bir tərəfdən Azərbaycan dilini bilən tərcüməçilərə olan ehtiyacdan irəli gəlirdisə, digər tərəfdən qonşu dövlətlərlə əlaqələr yerli əhali içərisində təhsilə, rus dilini öyrənməyə meyl və həvəsi gücləndirdi. Tiflis general-qubernatoru, general-adyutant Sipyagin 1827-ci ildə Zaqafqaziyanın bir sıra şəhərlərində, o cümlədən **Nuxada**, Qazaxda, Şamaxıda, Bakı və Qubada qəza məktəbi açmaq fikrini irəli sürdü. Hökumətin məktəb açmaq niyyətini əhali dəstəklədi və maliyyə vəsaiti ilə köməyə hazır olduqlarını bildirdilər. Beləliklə, ***XIX əsrin 30-cu illərində Azərbaycanda qəza məktəbləri adı ilə tədris ocaqları açılmağa başladı***.

«Tiflis nücabə məktəbi» 1828-ci il yanvarın 13-də gimnaziyaya çevrildi. **1829-cu il avqustun 2-də Zaqafqaziya məktəblərinin ilk Nizamnaməsi təsdiq olundu**. Nizamnaməyə əsasən 20 qəza məktəbi açılmalı idi. Onlardan 9-nun Azərbaycanın **Gəncə, Qazax nahiyəsi, Şuşa, Nuxa, Şamaxı, Quba, Bakı, Naxçıvan və Ordubad** şəhərlərində təsis edilməsi nəzərdə tutulurdu. Həmin Nizamnaməyə görə qəza məktəblərində *1) şəriət və tarixi müqəddəs; 2) qiraət; 3) hüsnxətt; 4) hesabdan dörd əməliyyat; 5) rus dili; 6) yerli dilin* tədris olunması nəzərdə tutulmuşdu.[189]

Təhsilə nəzarət məqsədilə yaradılan Qafqaz Tədris Dairəsi (*Кафказский Учебный Округ)* Tiflis, Kutaisi, Stavropol və Qara dəniz sahillərindən ibarət 4 direktorluğa bölündü. Azərbaycan məktəblərinin əksəriyyəti Tiflis məktəblər direktorluğuna, Naxçıvan qəza məktəbi ilə Ordubad ibtidai məktəbi İrəvan quberniyası ilə birlikdə Kutaisi məktəblər direktorluğuna tabe idi.[190]

Azərbaycanda yaşayan digər xalqların təhsili kilsə və xüsusi məktəblərdə cəmlənmişdi. Şamaxı və Şuşada erməni məktəbləri var idi. Burada uşaqlar erməni dili ilə yanaşı, Azərbaycan dilini də öyrənirdilər. 1827-ci ildə Gəncə yaxınlığındakı

Yelenendorfda (indiki Göygöl) və Anenfelddə alman kolonistləri, Zaqatalada ingiloylar, Qubada tat əhalisi üçün savad məktəbləri fəaliyyətə başladı**.**

Beləliklə, Zaqafqaziyada ilk qəza məktəbi 1830-cu il dekabrın 31-də Şuşa, **1831-ci il dekabrın 30-da Nuxa şəhərində açıldı**.[191] Məktəbin açılması üçün yerli əhali bina kirayə etmiş və 4.613 man 44 qəpik vəsait toplamışdı.[192]

## 2.3. Nuxa qəza məktəbinin təşkili və fəaliyyəti

1834-cü ilin məlumatına görə, Zaqafqaziyada Telavi, Qori, Kutais, Şuşa, Siqnax, Axalsıx, İrevan (İrəvan), Bakı, Nuxa, Gəncə qəzalarında və Minqirel knayzlığında qəza məktəbləri təşkil edilmişdi. «Bu məktəblərdən hər biri Zaqafqaziya məktəbləri haqqındakı qanuna əsasən iki sinifdən ibarət olmuşdur. Onlarda həm də elm ilahi, rus və yerli dillərin başlanğıcı, dörd hesab əməliyyatının əvvəli öyrədilirdi». Uvarova göndərilən 8 fevral 1834-cü il tarixli məktubda bildirilirdi ki, «Rus məmurlarının uşaqlarının yerli dilləri əsaslı öyrənməyə meylləri azdır. Rus məmurlarının yerli dilləri bilməməsi Zaqafqaziya ölkəsini idarə etməkdə çətinlik və maneçilik yaradır. Bunun üçün yerli məktəblərdə oxuyan rus məmurlarının uşaqlarına yerli dilləri əsaslı surətdə öyrətməyə çalışmalıdırlar. Xüsusilə Zaqafqaziya ölkəsinin boyük hissəsində tatar dili lazımdır. Hökumət məqsədə nail olmaq üçün səmərəli, bir qədər həvəsləndirici ölçü götürməli, kasıblara müəyyən miqdarda pul buraxılmalıdır».[193]

Qeyd olunduğu kimi, qəza məktəbləri Kutais, Nuxa, Şuşa, Bakı və Qubada təşkil edilmişdir. Məktəblərdə iki müəllim-baş və kiçik müəllim ştatı olmuşdur. Baş müəllimə 300 manat, kiçik müəllimə ildə 250 manat maaş nəzərdə tutulmuşdu.[194]

1**831-ci il dekabrın 30-da Nuxa şəhərində açılan** ***qəza məktəbi*** *iki sinifdən ibarət olmuşdur. Kirayə edilmiş xüsusi binada yerləşən bu məktəbdə üç müəllim işləyirdi. Müəllimlərdən biri müdir, biri elm fənn müəllimi, digəri isə Azərbaycan dili və şəriət müəllimi idi. Ana dilinin tədrisi üçün siniflərin birində həftədə iki dərs olmaqla cəmi dörd dərs müəyyən edilmişdi. Hər sinif üzrə həftəlik dərslərin sayı 16, saatların sayı 24 idi.*[195]

Nuxa qəza məktəbinin təşkili haqqında «Qafqaz təqvimi» ndən məlum olur ki, qəza məktəbinin müdiri *Konstantin Petrov İlinski* olmuşdur. Məktəbin şəriət müəllimi müsəlman məzhəbli molla Hüseyn Xan oğlu, müəllimlər Serebryanov, Salam Yakov Küzanov olmuşlar.

Şəhər məktəbi tələbələrinin ehtiyacı üçün yaradılan maddi yardım cəmiyyətinin sədri ***Şirəli bəy Əmircanov, üzvü Abdulla bəy Əfəndiyev, katibi İlya İsayeviç Kliqer*** idi.[196]

Nuxada qəza məktəbinin açılması şəhərin mədəni həyatına təsir etdi. İlk növbədə məktəb kitabxanasının əsası qoyuldu. Artıq 1835-ci ildə qəza məktəbinin kitabxanasında 360 adda kitab və tədris vəsaiti vardı.[197]

1834-cü ildə məktəbdə 28 şagird oxuyurdu. Tərkibinə görə onların 21 nəfəri tacir uşaqları, 7 nəfəri bəy uşaqları idi.[198] Uşaqların sayı az olduğundan yeni məktəb binası tikilməsinə ehtiyac duyulmurdu.

**1835-ci ildə Zaqafqaziya məktəblərinin ikinci Nizamnaməsi təsdiq edildi.** Nizamnamədə Azərbaycan üzrə 4 qəza məktəbini, o cümlədən Şuşa qəza məktəbini təkmilləşdirmək nəzərdə tutulmuşdu.[199] Şuşa qəza məktəbi yeni Nizamnamə ilə işləməyə başladı. II-III siniflərdə rus dilinin qrammatikası, coğrafiya, tarix, hesab, Azərbaycan dili, hüsnxətt, rəsm fənləri tədris edilirdi. Azərbaycan dili ruslar üçün də məcburi fənn kimi həftədə 6 saat keçilirdi.

Həmin Nizamnaməyə görə, ikisinifli məktəblər üçsinifli məktəblərə çevrilir, tədris edilən fənlərin dairəsi genişləndirilir, rus və Azərbaycan dilləri ilə yanaşı erməni dilinin də tədrisi nəzərdə tutulurdu. Tədris olunan fənlər sırasına coğrafiya, tarix, hesab və həndəsədən ilk məlumat, hüsnxətt, rəsm və rəsmxəttin tədris olunması vacib hesab edilirdi. Azərbaycan dilinin tədrisinə xüsusi diqqət verilirdi. Nizamnamədə 3 müəllim ştatı əvəzinə 5 müəllim ştatı təsdiq olunmuşdu. 1843-cü ildə bütün rus məktəblərində 476 nəfər, 1856-cı ildə 822 nəfər uşaq oxuyurdu. Azərbaycanlı şagirdlərin sayı ildən-ilə artırdı.[200]

***Nuxada məktəb şagirdlərinin sayı və tədris olunan fənlər aşağıdakı cədvəldəki kimi idi:***

***Cədvəl 2.3.1***

| | Üç sinfin hamısında yerli dillərin öyrənilməsi | Məktəbin birinci sinfində şagirdlər oxuyacaqlar. Qiraət, yazı və 4 hesab əməliyyatının əvvəlini rus dilində | İki sinif lərdə oxunacaq hesab, şəkil çəkmək və rəsmxət | İki yuxarı siniflərdə rus dili, coğrafiya, tarix və hüsnxət |
|---|---|---|---|---|
| | | Birinci sinif | İkinci sinif | Üçüncü sinif |
| ***Nuxada*** | 1 | - | - | - |
| Tatar | 1 | 1 | 1 | 1 |
| Erməni | - | - | - | - |

Nuxada məktəb üçün ayrıca binanın olmaması və kadr çatışmazlığı Nizamnamənin ləng həyata keçirilməsinə səbəb olurdu.

Tam olmayan məlumata görə, 1842-ci ildə Azərbaycanda 713 məktəb və mədrəsə var idi. Burada 7.306 şagirdin təhsili ilə 715 molla və müdərris məşğul olurdu. 1858-ci ildə təkcə Şamaxı quberniyasında 4.700 şagirdin təhsil aldığı 299 məktəb və mədrəsə fəaliyyət göstərirdi. 1853-cü ildə Nuxa qəzasnda 153, 1859-cu ildə isə 168 məktəb və mədrəsənin olması mənbələrdə qeydə alınmışdır.[201]

1842-ci ildə Nuxa şəhərində 60 məktəb fəaliyyət göstərmiş, bu məktəblərdə 500 şagirdin təlim-tərbiyəsi ilə 60 müəllim məşğul olmuşdur. [202] Nuxa qəzasında 120 məktəbdə 900 şagird təhsil alırdı. Məktəblərdə 120 müəllim işləyirdi. Dövrün arxiv sənədlərinə görə, Nuxa qəzası məktəb, müəllim və şagird sayına görə, ancaq Şirvan qəzasından geridə qalırdı. Şirvan qəzası ərazisində 200 məktəb, 2.000 şagird oxuyurdu. Nuxada üçüncü sinif 1844-cü il sentyabrın 1-də açılmışdır.[203]

1844-cü ildə artıq Nuxa qəza məktəbində 70 şagird təhsil alırdı. Onlardan 40 nəfəri birinci sinifdə, 20 nəfəri ikinci sinifdə, 10 nəfəri III sinifdə oxuyurdu.[204]

Şagirdlərin milli tərkibi də dəyişmişdi. 1837-ci ildə təhsil alan 65 şagirdin təxminən yarısı - 32 nəfəri azərbaycanlılar, 3 nəfəri isə digər millətlərin nümayəndələri idi.[205]

1847-1850-ci illərə aid sənədlərdə göstərilir ki, Nuxa şəhərində 89 məktəbdə 1.378 nəfər şagird təhsil almışdır. Şagirdlərin 1.299 nəfəri rəiyyət, 88 nəfəri bəy uşaqları olmuşdur. [206] Nuxa qəza məktəbinin səmərəli fəaliyyəti nəticəsində əhalinin rus dilinə, dünyəvi təlimə olan marağının artması səbəbli, 1850-ci ilə şəhərdə ***«müsəlman məktəbi***» adlı yeni və xüsusi tədris müəssisəsinin təşkilinə şərait yaranmışdı.[207]

**1848-ci il dekabrın 18-də Zaqafqaziya məktəblərinin yeni Nizamnaməsi qəbul edildi.** Yeni Nizamnaməyə görə, qəza məktəblərinin qarşısında yeni vəzifələr qoyulurdu. Sözsüz ki, bundan sonra məktəblərdə oxuyan şagirdlərin sayı artmağa başlayır. Artıq 1865-ci ildə Şuşa qəza məktəbində 240 şagird oxuyurdu.[208]

XIX əsrin ortalarında müsəlman məktəbləri meydana gəldi. Bu işdə Qafqaz canişini M.S. Vorontsovun mühüm rolu oldu. **1849-cu ildə** Şuşa, **Nuxa** və Şamaxıda, 1851-ci ildə Bakı, Salyan və Lənkəranda, 1853-cü ildə Zaqatalada belə məktəblər açıldı. Məktəblərdə şagirdlərin sayı ildən-ilə artmağa başladı. 1850-ci ildə fəaliyyət göstərən 12 qəza məktəbində 165 azərbaycanlı şagird oxuyurdusa, yeni təşkil olunmuş təkcə **bir məktəbdə** onların sayı 581 nəfər idi. 1849-cu ildə təsis edilmiş Nuxa sünni məktəbində 1950-1957-ci illərdə şagirdlərin sayı orta hesabla 58-59 nəfər olmuşdur:[209]

Azərbaycanın qabaqcıl ziyalıları, xüsusən Rusiyada təhsil alan ziyalılar Azərbaycanda mütərəqqi ictimai və pedaqoji fikrin yayılmasına çalışır, Rusiya-Azərbaycan mədəni əlaqələrinin möhkəmlənməsinə səy göstərirdilər. Ziyalılar təkcə şəhərdə deyil, kəndlərdə də dünyəvi təhsil verən məktəblərin açılmasını tələb edirdilər. M.F Axundov yazırdı: «Əgər desək ki, kənd camaatı qalsın, ancaq şəhər əhli elm öyrənsin, o zaman bir gül ilə bahar olmaz, çünki şəhər camaatı kənd camaatının yanında dəniz müqabilində bir qətrə kimidir. Elmin faydası o zaman məlum olur ki, bizim çobanlarımız da Prussiya xalqı kimi oxumaq və yazmaq bilsinlər. Qadınlarımız da oxumağı bacarsınlar».[210]

Məktəblərin və şagirdlərin sayının artması dərsliklərin hazırlanmasını gündəmə gətirdi. Nəticədə 30-cu illərin sonunda ilk dərsliklər yaranmağa başladı. **N.Dementyev** «*Yazı nümunələri» («Əlifba»), «Türk-tatar əlifbası», «İlk oxu üçün*

*təmsillər və povestlər» (1839*) adlı dərslikləri hazırladı. Sonralar bu sahədə işlər genişləndi. 1839-cu ildə **M.Kazımbəyin** *«Türk-tatar dilinin qrammatikası»,* 1844-cü ildə **A.Z.Budaqovun** *«Türk-tatar dilinin əlifbası»* dərslikləri çap olundu. Azərbaycan dilindəki dərsliklərdən biri də, **M.Ş.Vazeh və İ.Qriqoryevin** 1850-ci ildə tərtib etdikləri «*Kitabi-türki*» dərsliyi idi. **Mirzə Yusif Şahnəzərovun** *«Ərəb, fars, türk və Azərbaycan dillərində danışıq qaydaları», «Yazı qaydaları», «Tatar əlifbası», «Oxu nümunələri»***,** **İ.Qriqoryevin** *«Müsəlmanlar üçün rus əlifbası», «Fars ədəbiyyatı haqqında mülahizələr»*, **A.Bakıxanovun** *«Qanuni-Qüdsi», «Fars dilinin müxtəsər qrammatikası»*, **M.Ə.Vəzirovun** *«Tatar-Azərbaycan dili dərsliyi. Müntəxabatla birlikdə» (1861)* və s. vəsaitlər gimnaziya və qəza məktəblərində tədrisdə mühüm rol oynadılar.[211]

Qeyd olunduğu kimi, məktəbin inkişaf etməsi, Azərbaycan qəzalarında yeni məktəblərin açılması ana dilində tədrisi gündəmə gətirmişdi. Sözsüz ki, ana dili təliminin meydana gəlməsində rus məktəbləri böyük rol oynadılar. Bu səbəbdən də, o dövrdə meydana gələn məktəblərin tədris planına Azərbaycan dili müstəqil fənn kimi daxil edildi. Bu o deməkdir ki, 1200 il ərzində doğma dilimizi sıxışdıran ərəb və fars dili yerini yavaş-yavaş Azərbaycan dilinə verməyə başlamışdı. Ana dilinin sonrakı inkişafında Zaqafqaziya Müəllimlər Seminariyasının müstəsna rolu oldu. XIX əsr maarifçiləri, ilk olaraq A.Bakıxanov və M.Ş.Vazeh, ikinci dövrdə M.F Axundov, H.Zərdabi, S.Ə.Şirvani, N.B.Vəzirov, A.O.Çernyayevski, M.Şaxtaxtlı, R. Əfəndiyev, F. Köçərli, C.Məmmədquluzadə, N.Nərimanov ana dilinin tədrisi uğrunda mübarizə apardılar.[212]

Anadilli məktəb uğrunda mübarizə XIX əsrin ikinci yarısında daha da gücləndi. M.F.Axundov bu mübarizədə ilkin olaraq ərəb əlifbasının dəyişdirilməsi fikrini irəli sürdü və mübarizənin önünə çıxdı. O, 1869-cu ildə yazırdı: «Ərəblər, bizim min illik səltənətimizi yıxdılar, şan və şövkətimizi bərbad etdilər, vətənimizi elə xarabadan xaraba etdilər ki, bu günə qədər abad etmək mümkün olmadı. Üstəlik onlar bizim boynumuza elə bir yazı bağladılar ki, onun sayəsində ümumi müyəssər olan savadı əldə etmək bizim üçün işlərin ən çətini olmuşdur».[213]

Yeni əlifba uğrunda M.F.Axundovun mübarizəsi sözün həqiqi mənasında gələcək azadlıq uğrunda mübarizə ideyalarının qaynaqlanması idi və xalq kütlələri sonrakı illərdə - əsrin əvvəlində bu ideyanı müdafiə etməyə başladılar. Bu mübarizə H.B.Zərdabinin «Əkinçi» qəzeti ilə davam etdirildi.

H.B.Zərdabi təkcə ana dili uğrunda deyil, həm də dünyəvi məktəb uğrunda mübarizə aparırdı. Bu gün də millətini sevən hər kəs böyük ədiblərin «ana dilini qoruyun» vəsiyyətini yaddan çıxarmamalı, F.Köçərlinin yazdığı kimi, hər kəs öz anasını və vətənini sevdiyi kimi, ana dilini də sevməlidir.

Göründüyü kimi, ana dilində təhsil dövrün ziyalılarının diqqət mərkəzində olmuşdur. Rus pedaqoqu Uşinskinin yazdığı kimi, «…təhsil və tərbiyədə ana dilini başqa dillə əvəz etdikdə…o, öz vətəninin yad vətəndaşı kimi yetişəcək… Belələri heç vaxt öz xalqını anlaya bilməyəcək, xalqın faydasız üzvünə çevriləcək və üzünə nə qədər vətənpərvərlik maskası taxsa da, o, öz ölkəsinin həqiqi vətəndaşı ola bilməyəcək… Vətənin siması, iqlimi, havası, çölləri, dağ və düzənlikləri, meşə və

çayları, fırtına və tufanları, xalq ruhunun bütün yaradıcılıq qüvvəsi ana dilində fikirlərə, şəkillərə və səslərə çevrilir… ana dilində bütün millət, onun varlığı, mənəvi dünyası təzahür edir. Xalqın hər şeyini əlindən alsanız, o, onların hamısını qaytara bilər. Lakin onun əlindən ana dilini alsanız, o, heç vaxt onu qaytara bilməz. Xalq hətta yeni Vətən də yarada bilər». Faruq Qədri Teymurtayın dediyi kimi, «… dil Vətən qədər, tarix qədər və törə qədər əzizdir. Dil də bayraq kimi, ailə kimi müqəddəstandır, bəlkə, həpsinin ifadəsi, əksi onda olduğu üçün həpsindən öndədir. Dil olmayınca millət olmaz, milliyyət olmaz. Milli kültürün baş ünsürü dildir»[214].Ana dili yoxsa, millət də yoxdur, Vətən də».[215]

XIX əsrin 60-cı illərinin ictimai-pedaqoji hərəkatı Azərbaycanda kənd məktəblərinin açılmasına təsir göstərə bildi. İlk kənd məktəbləri əsasən rus kəndlərində yaranmağa başladı. 1857-ci ildə yerli əhalinin vəsaiti hesabına Lənkəran qəzasının *I Andreyevka, Astraxanovka*, 1860-cı ildə *Nikolayevka və Pirişib*, 1873-cü ildə *Privolnu* kəndlərində dünyəvi təhsil verən camaat və xalq məktəblərinin əsası qoyuldu. 1866-cı ildə A.O.Çernyayevski tərəfindən Şamaxı qəzasının Mərəzə kəndində ibtidai məktəb açıldı.[216]

70-ci illərdən başlayaraq Azərbaycanın rus kəndlərində olduğu kimi, azərbaycanlı kəndlərində də dünyəvi məktəblər açıldı. *1875-ci il yanvarın 2-də* Kazan sakini T. Mamleyev tərəfindən ***Salahlı kəndində ilk dünyəvi təhsil məktəbi*** təşkil edildi. Hökumətin **«Zaqafqaziyada tədris hissəsinin təşkili haqqında»** 1873-cü il 22 noyabr tarixli qanunu ilə hər quberniyada xəzinə hesabına 3-ə qədər kənd məktəbi açmağa icazə verildi.[217] Bir və ya ikisinifli, təhsil müddəti isə 3-5 il olan ilk kənd məktəbləri Azərbaycan ərazisində ***ilk dəfə Qazax qəzasının Dağ Kəsəmən, Zənəgəzur qəzasının Gorus, Cəbrayıl qəzasının Cəbrayıl kəndində açıldı.***[218] Həmin illərdə Bakı quberniyasında, ***Göyçayda (1878), Altıağacda (1879) və Salyanda (1880)*** kənd məktəbləri təsis edildi.[219]

Cəbrayıl məktəbinin tədris planına şəriət, rus və Azərbaycan dilləri, hesab, hüsnxət və rəsmxət fənləri daxil idi. Məktəbə 34 şagird qəbul olunmuşdu. E.Q.Dvinov məktəbə müəllim təyin edilmişdi. Ştatı bir nəfərdən ibarət olan məktəbin illik xərci 700 manat idi və onun 400 manatını yerli əhali ödəməli idi.[220]

Cəbrayıl kənd məktəbi **7** ildən sonra ikisinifli məktəbə çevrildi. *1890-cı ildə məktəbə Səlim bəy Rüstəmbəyov müdir təyin olundu. N.Rüstəmzadə (1907-1912), A.M.Şərifov (1912-1914), T.İ.Quliyev (1914-1918)* və başqaları məktəbdə müəllim işləmişlər.[221] 1895-ci ildə məktəbdə 91 şagird, o cümlədən 4 nəfər azərbaycanlı oxuyurdu. Getdikcə məktəb böyümüş, orada təhsil alanların sayı atrmışdı. Artıq bir il sonra, 1896-cı ildə məktəbdə 117 şagird təhsil alırdı. Qəzanın digər kəndlərində də məktəb açıldı. Nəhayət, 1912-ci ilin sentyabrında Cəbrayıl kəndində qız məktəbi fəaliyyətə başladı.[222]

Qazax qəzasının Salahlı kəndində məktəb 1875-ci il yanvarın 2-də açıldı.[223] İlk dəfə məktəbə 23 şagird cəlb olunmuşdu. Şagirdlərin 3 nəfəri təhsil haqqından azad edilmişdi. Bu məktəb həm də «rus-Azərbaycan» məktəbi sayılırdı.[224]

Salahlı məktəbi 1877- ci ildə Yelizavetpol və İrəvan quberniyaları xalq məktəbləri direktorluğunun tabeliyinə keçdi. Məktəbin xərci Zemstvo

vəsaitindən ödənildi. Məktəb birsinifli normal kənd məktəbi adlanırdı. Salahlı birsinifli Zemstvo məktəbinin üç şöbəsi var idi. Təhsil müddəti bir il idi. Məktəbə 7 yaşından yuxarı oğlan uşaqları qəbul edilirdi. Məktəbdə 1876-cı ildə 24, 1878-1879-cu illərdə 30, 1880-cı ildə 35, 1881-ci ildə 41 şagird oxuyurdu.[225]

Salahlı məktəbi məzunları içərisində görkəmli hərbçi, rus topçuluğunun atası sayılan general Əli ağa Şıxlinski, ilk azərbaycanlı həkimlərdən olan Məmməd Rza Mansır oğlu Vəkilov, Birinci dünya müharibəsinin fəal iştirakçısı, ilk azərbaycanlı hərbi təyyarəçi Fərux ağa Qayıbov, xalq şairi Səməd Vurğun və başqaları olmuşdur.

1881-ci ildə qədim Azərbaycan torpağında-İrəvan şəhərində İrəvan gimnaziyası və İrəvan Müəllimlər Seminariyası, eyni zamanda Uluxanlı kənd məktəbi fəaliyyətə başlayır. Əslində gimnaziya açılana qədər İrəvanda 30-cu illərdə qəza məktəbi olmuş, sonra həmin məktəb progimnaziyaya, daha sonra gimnaziyaya çevrilmişdir. Azərbaycanlı müəllimlər Molla Tağı Mahmud oğlu (1836-1858-ci ilədək), Mirzə Molla Ələkbər Elxanov (1856-cı ildən 1885-ci ilədək), Firidun bəy Köçərli (1885-1895-ci illər) gimnaziyada dərs demişlər.[226]

İrəvan gimnaziyası və İrəvan Müəllimlər Seminariyası erməni daşnaqlarının törətdiyi fəlakətlər nəticəsində 1918-ci ildə bağlanmışdır. İrəvan gimnaziyasının məzunları içərisində *Əziz Məmmədkərim oğlu Əliyev, Həbib bəy Səlimov, Nəriman bəy Nərimanbəyov, Mirabbas Mirbağırzadə, Məmməd Məhərrəmov, Mehdibəy Məlikaslanov, Bülbülxanım Ağaxan qızı, Qambay Məmməd oğlu Vəzirov, Ələkbər bəy Qədirbəyov, Mirhüseyn Mirbağırov, Miryusif Mirbabayev, Teymur bəy Makinski, Əkbər ağa Şeyxülislamov, Mehdi Erivanski, Adil bəy, Əkbər bəy və Gülxar xanım Qazıyevalar, Adil və Əslidar Muğanlinskilər, Rza bəy, Mehdi bəy və Məhəmməd bəy Topçubaşov qardaşları, Mustafa bəy Ağa bəy oğlu Topçubaşov, Abbas ağa Fərəcov, akademik Əhməd Rəcəbli* və başqaları vardı.[227]



**Firidun bəy Köçərli** İrəvan gimnaziyasının Azərbaycan bölməsinin müdiri, Azərbaycan dili müəllimi və gimnaziyanın tərkibindəki pansionatın müdiri vəzifələrində işləmişdir.

**Tanıtma**:

**Köçərli Firidun bəy Əhməd ağa oğlu (26.01.1863-20.05.1920)** ***bəy ailəsində dünyaya gəlmişdir. «Müsavat» partiyasının fəal üzvlərindən olmuşdur. Şuşada mollaxanada (1870-1972), Mirzə Kərim Münşizadənin məhəllə məktəbində (1872-1875), 2-ci dərəcəli sənət məktəbində (1876-1879) təhsil almış, Qori şəhərindəki Zaqafqaziya Müəllimlər Seminariyasını (bundan sonra-ZMS) bitirmişdir (1885).***

***Firidun bəy Köçərli 1895-1896-cı illərdə İrəvan gimnaziyasında, 1896-1917-ci illərdə ZMS-nın Azərbaycan şöbəsində müəllim işləmişdir. Pedaqoji***

***işdəki müvəffəqiyyətlərinə görə «коллежски секретар», «титуляр советник», «штатски советник» kimi rütbələrə layiq görülmüşdür.***

***F.Köçərli gimnaziyada çalışdığı illərdə Zöhrabzadə ilə birlikdə «Təlimi-lisani-türki» adlı dərslik tərtib etmiş, «Təlimati-Sokrat» (1891) adlı fəlsəfi əsərini nəşr etdirmiş, Puşkindən, Lermontovdan, Tolstoydan, Koltsovdan tərcümələr etmiş, maarif məsələlərinə dair məqalələr yazmışdır.***

***F.Köçərli Rusiyadakı Fevral inqilabından sonra Xüsusi Zaqafqazia Komitəsi sədrinin 1917-ci il 17 avqust tarixli əmri ilə Azərbaycan şöbəsinin inspektoru təyin olunmuş, 1918-ci ildə ZMS-nın Azərbaycan şöbəsini Qazax şəhərinə köçürmüş, onu müstəqil seminariyaya çevirmiş və ilk direktoru olmuşdur (1918-1920).***

***İstiqlal bəyannaməsini imzalayanlardan olan F.Köçərli AXC-nin qurulmasından sonra ölkənin siyasi həyatında fəal iştirak etmişdir.***

***F.Köçərli 1920-ci ilin mayında Qazax kommunistləri tərəfindən milli xəyanətdə ittiham edilərək Qazax İnqilab Komitəsinin Gəncə Fövqəladə Komitəsinə yazdığı təqdimat əsasında həbs olunmuş, 20-ci diviziyanın 7-ci xüsusi bölməsinin xüsusi şöbəsində şahidlər dindirilmədən, verilmiş izahatlar nəzərə alınmadan onun güllələnməsi haqqında qərar çıxarılmışdır. Qərar 7-ci xüsusi bölmənin rəisi Liberman və fövqəladə komissar Həmid Sultanov tərəfindən təsdiq olunmuş, hökm yerinə yetirilmişdir.***[228]

Uluxanlı məktəbi 1881-ci ildə fəaliyyətə başlamışdır. Məktəb *Allahverdi Hacı Hüseyn oğlunun* evində yerləşmiş, müdiri dövrünün tanınmış maarifçisi Muxin, şəriət müəllimi Hacı Məşədi Hüseyn oğlu, fənn müəllimi Xanlar bəy Həsənbəyov təyin edilmişlər. Sonralar *Məmməd bəy Lütvəli bəy oğlu Qazıyev, Əbdüləli Bağır oğlu Muxtarov, Hacı Molla Kərim Rzaquliyev* və başqaları məktəbdə işləmişlər. Məmməd bəy Qazıyev azad edildikdən sonra onun yerinə Cəlil Məmmədquluzadə təyin olunmuşdur.[229]

1892-ci ildə Uluxanlı məktəbində 41 şagird, 1900-cu ildə isə 64 şagird oxuyurdu. Məktəbin sonrakı məzunları sırasında, *filologiya üzrə elmlər doktorları Əsgər Zeynalov, Teymur Əhmədov, texnika üzrə elmlər doktorları Telman Əsgərov, Firidun Xəlilov, tibb üzrə elmlər doktoru Maqsud Qasımov, memarlıq üzrə elmlər doktoru Gülçöhrə Məmmədova, biologiya üzrə elmlər doktoru Fərrux Məmmədov, kimya üzrə elmlər doktorları Zakir Rzayev, Abbas Quliyev, iqtisadiyyat üzrə elmlər doktoru Rafiq Əliyev, fizika-riyaziyyat üzrə elmlər doktoru Orucəli Rzayev* və başqaları vardı.[230]

Göstərilən kənd məktəblərinin təşkili kəndlərdə ***savad məktəbi*** adlı təhsil ocaqlarının meydana gəlməsinə şərait yaratdı. Bu məktəblərin tədris proqramına bir qayda olaraq yazı, oxu və şəriət daxil idi. Savad məktəblərinin müəllimləri «Müsəlman məktəbi» adlı xüsusi təhsil müəssisələrini bitirənlər idi. Onların içərisində xüsusi adamların yanında dini təhsil almış mütərəqqi şəxslər də var idi. Əslində bu adamlar məhəllə mollası idilər və uşaqlara elementar savad öyrədirdilər. Ancaq bu adamlar ruhani təhsili aldıqlarından, Azərbaycan, rus, ərəb və fars dillərini bildiklərindən cahil mollalardan kəskin sürətdə

fərqlənirdilər. Ən vacibi isə, bu məktəblərdə əsasən yazmaq və oxumaq öyrədilirdi. Başqa sözlə, savad məktəbləri məscid məktəblərinin yeni üsullu məktəblərə çevrilməsinə hazırlıq idi, digər tərəfdən rus dilində təhsil verilən ilk kənd məktəblərinin yeni üsullu ana dili məktəbləri açmaq yolunda ilk addımlar hesab olunmalıdır.[231]

Azərbaycan ərazisində ilk savad məktəbləri ən çox Yelizavetpol quberniyasına daxil olan məktəblərdə açılmışdı. *1881-ci ildə Horadiz, 1891-ci ildə Böyük Bəhmənli savad məktəbnin əsası qoyuldu.* Horadiz məktəbinin banisi Mirzə Məmmədqulu Hacı Molla Abdulla oğlu olmuş, Bəhmənli məktəbinin əsasını Molla Baba Məşədi Bayram oğlu qoymuşdur. 1895-ci ildə Horadiz məktəbində 52 şagird, o cümlədən 2 qız, Böyük Bəhmənli məktəbində 15 şagird oxuyurdu.[232] Savad məktəblərində təhsil pullu idi.

Qafqaz Tədris Dairəsi üzrə 1900-cü ildə 12 xüsusi, 9 dövlət ibtidai məktəbi, 1901-ci ildə 8 xüsusi və 4 dövlət ibtidai məktəbi bağlanmışdı.[233]

Bəhs olunan illərdə xalq maarifi üzrə sərf olunan vəsait də müxtəlif olmuşdur. Belə ki, **1897-ci il**də 16.605, **1898-ci ildə** 22.093, **1899-cu ildə** 122.059, **1900-cu ildə** 22.906, **1901-ci ildə** 33.406, **1902-ci ildə** 61.556, **1903-cü ildə** 107.244, **1904-cü ildə** 133.182, **1905-ci ildə** 110.632, **1906-cı ildə** 132.17, **1907-ci ildə** 210.400, **1908-ci ildə** 218.734, **1909-cu ildə** 185.399, **1910-cu ildə** 171.137, **1911-ci ildə** 181.335 rubl xərclənmişdir. Ümumilikdə, 15 il müddətində (1897-1911-ci illər) xalq maarifinə 1.619.418 rubl sərf olunmuşdur.[234]

Məlum olduğu kimi, XIX əsrin II yarısında Rusiya öz tarixi inkişafının yeni mərhələsinə qədəm qoydu. Rusiyada 1861-ci ildə təhkimçilik hüququnun ləğvi yeni ictimai münasibətlərin yaranmasına təkan verdi. İslahatdan 9 il keçdikdən sonra çar hökuməti Azərbaycanda feodal asıllılığını ləğv etməyə razı oldu. Kəndli islahatından sonra Azərbaycanda məhkəmə və şəhər islahatları keçirildi. Təbii ki, həyata keçirilən islahalar yerli xalqların istismar altında saxlanmasına xidmət edirdi. Qafqazda ali hakimiyyət çar canişininin əlində idi.

İslahatdan sonra inzibati quruluşda  dəyişikliklər həyata keçirildi. A.İ Baryatinskidən sonra II Aleksandrın kiçik qardaşı Mixail Nikolayeviçin canişinliyi zamanı (1862-1882) Zaqafqaziyanın inzibati idarələrinin yenidən qurulması işi davam etdirildi. 1963-1867-ci illərdə Bakı, İrəvan, Kutais, Stavropol və Tiflis quberniyalarında keçrilən təftişlər yerli inzibati idarələrin işində nöqsanlar aşkar etdiyindən 1867-ci il dekabrın 9-da *«Qafqaz və Zaqafqaziya ölkəsinin idarə olunmasının dəyişdirilməsi haqqında»* imperator **Fərmanı** dərc olundu və 1868-ci il yanvarın 1-dən qüvvəyə mindi [235].

1867-ci ildə **Qafqaz və Zaqafqaziya məktəblərinin yeni Nizamnaməsi** qəbul edildi. Nizamnaməyə əsasən qəza məktəbləri yenidən təşkil olundu. Üç sinifdən əlavə ayrıca hazırlıq sinifləri də açıldı. İlk dəfə olaraq təhsil haqqı tətbiq edildi, pansionat təşkil olundu. Tədris planına latın və Avropa dilləri daxil edildi. **Nuxa qəza məktəbinin** tədris planına ***fransız dilinin*** tədrisi əlavə olundu. Bu isə məktəbi bitirənlərin gimnaziyaya daxil olmasına imkan yaradırdı. Məktəbdə tədrisin keyfiyyətinin yüksəldilməsi sahəsində əməli işlər görüldü. Məktəbdə

həyata keçirilən tədbirlər dairə müfəttişləri tərəfindən daim izlənilirdi. Bu münasibətlə **Nuxa** qəza məktəbində olmuş müfəttiş 1868-ci ildə yazmışdı: *«Məktəbdə təlim ümumiyyətlə yaxşı gedir. Lakin mənim fikrimcə hazılıq sinfi daha çox tərifəlayiqdir. Sinif üç şöbəyə bölünmüşdür və müəllim dərsin gedişində onların heç birini nəzərdən qaçırmır. Hər şeydən əvvəl, o, rus dilinin düzgün və aydın tələffüzünə nail olur, durğu işarələrində dayanmaqla hər bir sözün açıq-aydın tələffüz edilməsinə çalışır; oxu zamanı buraxılan səhvlər digər şagirdlər tərəfindən dərhal düzəldilir, vurğulara xüsusi fikir verilir. Hər bir söz ya qabaqcıl şagirdlər və ya da müəllim tərəfindən aydınlaşdırılır. Bu onunla nəticələnir ki, yuxarı şöbədə Qruberin hesab kitabı ilə, ilin sonunda isə yazı taxtasında məsələ həll etməklə məşğul olurlar».* [236] Hazırlıq siniflərində K.D.Uşinskinin «Uşaq aləmi» vəsaitindən istifadə olunurdu.

60-cı illərdə həyata keçirilən islahatlar qəza məktəblərinin həyatına təsir göstərdi. *1864-cü il iyunun 14-də «İbtidai xalq məktəbləri haqqında Əsasnamə» və həmin ilin noyabr ayının 19-da «Gimnaziya və progimnaziyaların Nizamnaməsi», 1863-cü il iyunun 18-də ali məktəb Nizamnaməsi təsdiq edildi.* [237]

1872-ci ildə ***«Şəhər məktəbləri Nizamnaməsi»*** hazırlandı. Nazamnaməyə görə, ***qəza məktəbləri öz yerini şəhər məktəblərinə*** verirdi. Şəhər məktəblərinin tədris planı qəza məktəblərindən fərqli olub, təhsil müddəti müxtəlif idi. Bir sinifli şəhər məktəbində təhsil müddəti 2 il, ikisiniflidə 4 il, 3 və 4 siniflidə isə 6 il idi.

1877-ci ildə Nuxa qəza məktəbi üçsinifli şəhər məktəbinə çevrildi. Məktəbin müdiri F.S.Kabaşidze…olmuşdur.[238] Nuxa şəhər məktəbində bu fənləri bir müddət ***Abbas Mirzə Axundov və Molla Çələbi oğlu*** tədris etmişdir.[239] Məktəbin 133 tələbəsi olmuşdur.

Məktəbin tədris planına Azərbaycan və rus dilləri, hesab, həndəsə, rəsm, rəsmxətt, tarix, coğrafiya, təbiətşünaslıq və şəriət fənləri daxil edilmişdir. Təhsil pullu idi. Nuxa şəhər məktəbində Azərbaycan dili və şəriət fənlərini dövrün görkəmli adamları tədris edirdilər.

Qəza məktəbləri əhalinin rəğbətini qazanmışdı. Şagirdlərin sayı ildən-ilə artırdı. 1890-cı ildə bu məktəbdə 136, 1895-ci ildə 167 şagird təhsil alırdı. Şagirdlər arasında kəndli uşaqları da var idi. Məktəbin 12 buraxılışı olmuş, məktəbi 125 nəfər bitirmişdir.

Şəhər qəza məktəbində müxtəlif mədəni-kütləvi tədbirlər təşkil edilirdi. Ədəbi-bədii gecələr və səhərciklər keçirilir, teatr tamaşaları göstərilirdi. Belə tamaşalardan birini Şirəli bəy Əmircanov təşkil etmiş, tamaşadan toplanan 92 man 67 qəpik məktəbin kasıb uşaqlarına xərclənmişdi.[240]

**Nuxa** şəhər məktəbində musiqi sinfi də təşkil edilmişdi. 1882-ci ildə bu sinifdə 25 şagird təhsil alırdı. Şagirdlərin iştirakı ilə müsiqi tədbirləri keçirilirdi.

XIX əsrin axırlarında **Nuxa** şəhərində qeyrət sahibli iki varlı şəxs- Hacı Əbdürrəhim ağa və Hacı Məmmədsadıq Əliyev *ibtidai məktəb* binaları tikdirdi. Hacı Əbdürrəhim ağanın tikdirdiyiı binada 1894-cü ildə «xalq məktəbi» açıldı.

Məmmədsadıq Əliyev Daşlıbazarın üstündə-axund məscidinin yanında ibtidai məktəb üçün bina tikdirdi.

**Nuxa** xanlığının Rusiya tərkibinə daxil edilməsinə və XX əsrin ortalarına qədər Nuxada təhsil sistemi ənənəvi məktəb və mədrəsə ilə bağlı olmuşdur. 1846-cı ildə «Qafqaz» qəzetində **«Nuxa»** başlığı altında dərc edilmiş məqalədə deyilirdi: «Nuxada qəza məktəbindən başqa hər bir məscid nəzdində məktəb vardır ki, burada mollalar oğlan uşaqlarına tatar (burada müsəlman) savadı öyrədirdilər».[241] Məqalədən məlum olur ki, həm məsciddə, həm də evdə oxuyan uşaqların sayı 450 nəfərə yaxın imiş. Təhsil haqqı hər bir şagird üçün 7 gümüş pul ilə ayda 20 qəpik olmuşdur.[242] Qızların təhsili ayrı-ayrı qadın məktəbdarların, mollabacıların evində və ya ailələrdə həyata keçirilirdi. Mütəşəkkil olmasa da, bu məktəblərdə qızlara az- çox dünyəvi biliklər də verilirdi. Qadın təhsilinə olan ögey münasibət yüzlərlə, minlərlə qadının oxumaq arzusunu ürəyində qoyurdu.

1894-cü ilini payızında qalanın altında köhnə aptekin köhnə binasında müvəqqəti ***«Usul sövtiyyə məktəbi» (səs üsulu ilə)*** fəaliyyətə başlayır. Bu məktəbin açılmasında 3 nəfər- ***Hacı ağa Məhərrəm Hüseynov, Hacı Süleyman Hüseynov və saatsaz Mustafa Bədəlovun*** xüsusi rolu olmuşdur. Ziyalılar çar hökumətini məktəbdə ancaq rus dərsi ilə şəriət dərsi keçiləcəyinə inandırmışdılar.



**Şəkildə soldan: Hacıağa Məhərrəm Hüseynov, Hacı Süleyman Hüseynov**

**və saatsaz Müstafa Bədəlov**

Məktəbə Dağıstanın Azqur kəndindən xoca **Hafiz Məmməd Əmin Şeyxzadə** və Omər Faiq əfəndi Nemanzadə, seminariya qurtarmış Qəzənfər bəy Cavanşir, türk xətti ilə gözəl yazmaq üçün molla **Tacəddin İmamzadə** və ibtidai siniflərdə dərs keçmək üçün **Hacı Zəkəriyyə Cavanşir** müəllimliyə dəvət olunmuşdular.

Məktəb üç aydan sonra birinci cümə məscidinin yanında Hacı Əbdürrəhim ağanın bu məktəb üçün tikdiyi binaya köçürülmüşdür.

Məktəbdə «Quran»ı ***Məmməd Əmin Şeyxzadə*** tədris edirdi.[243] O, Qarsda oxumuş, bir müddət Ərzurumda yeni tipli məktəbdə dərs demiş, Tiflisdə xüsusi imtahan verib müəllimlik şəhadətnaməsi almışdır. M.Şeyxzadə Nuxa məktəbinin qaydaya düşməsində xeyli əmək sərf etmiş, 1906-cı ildə «Həyat» qəzetində özünün yazdığı kimi, bu məktəb Qafqazda yeganə olub ancaq Naxçıvanda ona oxşar məktəb var idi. Mollaların, həmçinin avam camaatın qəzəbinə gəlməmək üçün M.Şeyxzadə tez-tez uşaqları məscidə namaz qılmağa aparar, tənəffüslərdə zəng vurmaq əvəzində hörmət əlaməti olaraq əl çaldırardı.



***M.Ə.Şeyxzadə***

***Qəzənfər bəy*** rusca oxumaq və hesab, rusca və türkcə nəğmələr keçirdi.



***Qəzənfər bəy***

*Ömər Faiq Əfəndi Nemanzadə* türk qiraətini, həmçinin hökumətdən gizli olaraq həndəsə, coğrafiya, hesab və tarixi türk dilində tədris edirdi.

Ömər Faiq Nemanzadənin Şəkiyə gəlişi 1894-cü ilin payızına təsadüf etmişdir. Əlbəttə, onun gəlşinin başlıca məramı yeni məktəb açmaq, millətin balalarını bu məktəblərə cəlb etmək idi. Həm də, bu zaman artıq **Nuxada**, həmçinin qəzanın Qoxmuq və Baş Göynük kəndlərində məktəblər fəaliyyət göstərirdi. Bu məktəblərin açılmasında yuxarıda qeyd olunduğu kimi, yerli ziyalılar da əhəmiyyətli rol oynamışdılar. Təbii ki, **Ömər Faiq əfəndinin** Nuxaya gəlişi ziyalılarda bir stimul yaratmışdır.

*Tanıtma*:

**Ömər Neman oğlu Nemanzadə** **(1872, Axalsix qəzası, Azqur kəndi (indiki Gürcüstan Respublikası) -1937, Tiflis)** ***ilk təhsilini Azqurda mollaxanada və ibtidai rus məktəbində (1878-1882), İstanbulda «Fateh» və Darüşşəfəq» mədrəsələrində (1882-1891) almışdır.***



***Ö.F.Nemanzadə İstanbulda Qalatasaray poçtxanasında çalışmış (1891-1894), Nuxada (1894-1896); (1898-1900), Şamaxıda (1900-1902) müdərris, M.H.Şeyxzadənin açdığı «üsuli-cədid» məktəbində müəllim işləmişdir.***

***Ö.F.Nemanzadə «Şərqi-rus» qəzet ilə əməkdaşlıq etmiş, «Qeyrət» mətbəəsi onun «Dəvət» əsərini çap etmişdir. «Molla Nəsrəddin»də fəal iştirak edən ədibin «Həyat», «Tərcüman», «İrşad», «Tərəqqi», «İqbal», «Yeni iqbal». «Açıq söz». «Qardaş köməyi» qəzet və jurnallarında Azərbaycan və rus dillərində müxtəlif imzalarla məqalələri dərc olunmuşdur.***

***Ömər Faiq əfəndi Nemanzadə Nuxada təkcə müəllimliklə işini bitirməmişdir. O, Nuxanın mədəni həyatında fəal iştirak etmiş, gənc müəllimləri ətrafına toplayaraq teatr tamaşaları vermiş, təşkil olunan mədəni tədbirlər əhali tərəfindən rəğbətlə qarşılanmışdır.***

***1919-cu ilin mayında Bakıya gələn Ömər Faiq Azərbaycan Xalq Cümhuriyyəti hökuməti tərəfindən rəğbətlə qarşılanmışdır. 1924-1927-ci illərdə Gəncə kənd təsərrüfatı texnikumunda müdir işləyən ədib təqaüdə çıxandan sonra bir sıra məqalələr yazmışdır.***

***Ö.F.Nemanzadə 1937-ci ildə Azqur kəndində həbs olunmuşdur. Tiflisdə Xüsusi İstintaq Komissiyası nəzdindəki «üçlüyün» qərarı ilə güllələnmişdir.***

1894-1903-cü illərdə Nuxa, Şamaxı, Gəncə, Axalsix, Tiflis və Bakı kimi şəhərlərdə müəllimlik etmiş Faiq əfəndi sonralar dövrü mətbuatda çıxış etmiş, İstanbulda təhsilini başa vurduqdan və vətənə dönəndən sonra da milli məktəblər açmaq fikrindən dönməmişdir. TİflisdƏ işləyərkən orada azərbaycanlıların təhsil alması üçün məktəbin olmaması onu narahat edir, bu sahədə fəaliyyət göstərməyin çətinliyini gördükdən sonra Bakıya gəlmək istəyir, lakin təsadüf onu Nuxaya gətirib çıxarır. Bu təsadüf təkcə Nuxa əhalisi üçün deyil, ümumilikdə qəzanın əhalisi üçün bir tanrı payı olmuşdur.

XX əsrin ziyalıları kimi, Ömər Faiq əfəndi Nemanzadə də köhnəliyin, geriliyin, ətalətin əleyhinə idi. O, dövrün digər ziyalıları kimi cəmiyyətin yeniləşməsini, ədalətlə idarə olunmasını istəyirdi. Ö.F.Nemanzadə millətin tərəqqi dərəcəsini müəllimlərin dərəcəsi ilə ölçər, müəllim məsələsini millətin ölüm-dirim məsələsi hesab edərdi. Müəllimsizlik dövrün ziyalılarının ən ağır dərdi idi. Faiq əfəndi ilə birlikdə işləmiş, sonralar pedaqoji fəaliyyətini Azərbay-

can Dövlət Pedaqoji İnstitutunda (indiki ADPU) davam etdirmiş Abdulla Əfəndiyev 1924-cü ildə institutun ilk buraxılışı zamanı yazmışdır: «Müəllim başqa ixtisas sahiblərinə bənzəməz. O, gərək əhalinin içərsində böyüsün, onun dilinə, tarixinə, ədəbiyyatına, hər dürlü kültürünə və hər dürlü ehtiyacına bələd olsun, fikrən, xəyalən və hissən ən incə cərəyanlarını başqasının danışığından, hərəkətlərindən seçə və anlaya bilsin və eyni zamanda hər fikri, hər hissi və hər xəyalı yer əhlinə onun öz dilində anlada və öyrədə bilsin. Mənsub olduğu elin cocuqlarının əhval-rühiyyəsinə bələd olsun, onların mərtəbəsinə enib onlarla yüksəlsin, həm qiymətli bir alim və həm də həqiqi bir mürəbbi olsun»[244]. Abdulla Əfəndizadənin müəllim üçün vacib saydığı keyfiyyətlər Ömər Faiq Neman zadəyə xas idi.

***Nuxa «Üsul-sövtiyyə» məktəbi dördsinifli idi***. Təhsil pulsuz idi. Məktəbdə 4 müəllim çalışırdı: *Ömər Faiq, M.Şeyxzadə, Molla Tacəddin və Qəzənfər bəy*. Sonralar bu məktəbə Hacı Zəkəriyyə, «Axalsix müftizadələrindən məktəbi-aliyə»ni bitirmiş Ələddin Əfəndizadə də gəlmişdir.

Məktəbin tədris planında

I sinfində ***ana dili, quran, şəriət;***

II sinifdə ***ana dili, hesab, quran, təcvid, şəriət;***

III sinifdə ***ana dili, rus dili, hesab, quran, təcvid, şəriət;***

IV sinifdə *ana* ***dili, rus dili, hesab, tarix, coğrafiya, imla, quran, şəriət;*** keçirilməsi müəyyənləşdirilmişdi.[245]

«Usul-sövtiyyə» məktəbi **Nuxadakı** mollaxanalara böyük zərbə vurdu. Bir qrup molla öz şagirdlərinin mollaxanalardan çıxmasının qarşısını almaq üçün mollaxanalara skamyalar və sinif taxtası qoyurdu. Amma yenə də bu axıntının qabağını almaq mümkün olmurdu. Xalq arasında rusca oxutmağa maraq güclənməyə başlamışdı. Artıq əhali mollaxanada hər uşağa ayda 20-30 qəpik verməyib, ayda bir manata məktəbə göndərirdi.[246]

1896-cı ilin may ayında çar Nikolayın tacqoyma mərasiminin keçirilməsi ilə əlaqədar yeni məktəblərdə tədbirlər təşkil olunmuşdur. Əhməd Nəbiyev xatirələrində yazır ki, «biz şagirdləri müəllimlərlə birlikdə məktəbin həyətinə yığıb iki-iki sıraya düzüb, qabaqdakı iki balaca uşağa – Hüseyn Zülfüqarov və Salam Yusifovun sinələrinə «padişahım çox yaşa» yazılmış lent bağlayıb, iki böyük uşaqların hərəsinə bir böyük bayraq verib onları qalanın altındakı bulvara apardılar. Yol boyu nəğmələr oxuya-oxuya getdik. Oraya çatan kimi camaatı aralayıb bizə ön sırada yer verdilər. Biz balacaları qabaqda, böyükləri isə arxada üç sıra düzdülər. Biz Azərbaycanca nəğmə oxuduq, rusca nəğmə oxumağa başlayanda rus zabitləri və rus qulluqçuları və arvadları qarşımıza gəldilər. Müəllimimiz Qəzənfər bəy onlara yaxınlaşıb görüşdü. Onlar da bizə baxıb iki saat orada dayandıqdan sonra qayıdıb məktəbin qabağındakı həyətdə şəkil çəkdirdik. Bizim bu rəsmimizi müəllimlər «Tərcüman» qəzetinə göndərmişdilər».

Məktəbdə rus dili dərsi A.O.Çernyayevskinin «Рускaя реç» kitabından tədris olunurdu. Azərbaycanca əvvəlcə A.O.Çernyayevskinin «Vətən dili» kita-

bından, sonralar Rəşid bəy Əfəndiyevin «Uşaq bağçası» və «Bəsirətül - ətfal» kitablarından dərs keçilirdi.

1894-cü ildə M.Şeyxzadənin zövcəsi Əsmər - Soltan xanım öz qızı Şəfiqə xanımla birlikdə kirayədə oturduğu Bazarbaşında Hacı Cumayın evində «Usul-sövtiyyə» məktəbi tipində qız məktəbi açır. Kiçik yaşlı oğlan uşaqları da bu məktəbə qəbul olunurdular. Buranın üçüncü şöbəsini bitirən oğlanları «Usul-sövtiyyə» məktəbi» nə köçürürdülər. Təhsil haqqı ayda 1(bir) manat idi. Bu məktəb 4 il fəaliyyət göstərir. M.Şeyxzadə məktəb açmaq üçün Şamaxıya dəvət olunduğundan ailəsi ilə oraya köçməyə məcbur olur. O gedən gündən uşaqların çoxu məktəbdən çıxır. M.Şeyxzadənin yerinə yerli sakin molla Ağakişi müəllim təyin olunur.

**Tanıtma:**

**Əfəndizadə Şəfiqə Hafiz Məmmədemin Şeyxzadə qızı-(19.03. 1883 - Tiflis quberniyasının Azqur kəndi-29.07.1959 Bakı)** ***Azərbaycanın ilk maarifpərvər qadınlarından biri olmuş, ali təhsil almış, Qafqaz müsəlmanları Ruhani İdarəsində və Bakıda III Aleksandr kişi gimnaziyasında imtahan verərək, ibtidai məktəbdə türk dili və şəriət müəllimi vəsiqəsi almış, Aleksandr qız «Rus-müsəlman» məktəbində (1907-1909) və şəhər qız «Rus-müsəlman» məktəbində müəllim işləmişdir.***



***Ş.Əfəndizadə Qafqaz müsəlman qadın müəllimlərinin Kazan şəhərində çağırılmış (1917) qurultayına nümayəndə seçilmiş və qurultayda çıxış etmişdir. Şəfiqə xanım 1918-ci il soyqırımından sonra qaçqın düşmüş, Qubada, Azqurda, İstanbulda yaşamışdır. 1919-cu ilin aprelində Bakıya qayıtmış, pedaqoji işə bərpa olunmuş, 1920-ci ilin fevralında istefaya çıxmışdır.***

Ş.Əfəndizadə sovet hakimiyyəti illərində mədəni quruculuq işlərində iştirak etmiş, darülmüəllimatda dərs demiş (1920-1926), 1932-cü ildə nəşrə başlayan «Şərq qadını», «Məktəb» jurnallarında məqalələri, uşaqlar üçün hekayələri dərc olunmuşdur.[247]

Məktəb illərini xatırlayan Əhməd Nəbiyev yazır: «Yay tətili nəzərə alınmazsa məktəbdə 3-4 il bütün il boyu dərs keçilirdi. Müəllimlər məktəbliləri şəhərin ətrafındakı bağlara: Qışlaq bağlarına, Oxuta gəzməyə aparırdılar. Hər bir uşaq özü üçün pendir-yağ çörək götürürdü. Getdiyi yerlərdə bulaqlar olduğundan çay əvəzinə su içirdilər. Bağlara gəzməyə gedəndə və qayıdanda yol uzunu məktəblilər müxtəlif nəğmələr oxuyurdular… Belə tənəzzöhlər uşaqlarda ruh yüksəkliyi oyadırdı».[248]

Yuxarıda göstərilən məktəblərin əsasını qoyanlar uşaqları həvəsləndirmək üçün vaxtaşırı uşaqları ziyarət edirdilər. Hər gələndə özləri ilə bir neçə böyük dəmir qutuda konfet gətirib tələbələrə…paylayırdılar. Hər il imtahan zamanı

məktəbin təsisçiləri müxtəlif xırda kitablar göndərir və onlar imtahanı müvəffəqiyyətlə verən tələbələrə verilirdi».

«Azərbaycanın hər yerində və ələlxüsus Nuxada hökumət açan rus şəhər məktəblərinə azərbaycanlılar uşaq verməzdilər. Səbəbi də bu idi ki, ruhanilər əhalini qandırmışlar ki, rusca oxuyan kafir olar. Ümumtəhsil üçün çar höküməti yalnız Azərbaycan balalarını Qori Seminariyasının «Tatar şöbəsi» açıb xəzinə xərcilə beş il oxudub kənd müəllimləri sifətində hər qəzaya göndərirdi. Nuxa qəzasında məktəblər açan oranı təzə qurtarmış müəllimlər idi və onlar buraya ezam edilmişdilər.

Bu müəllimlərə ruhanilər rəqabət nəzəriylə baxırdı. Əhali arasında mövhumatı aradan qaldırmaq istəyən yeni fikirli müəllimlərin nüfuzunu qırmaq üçün əhali içərisində ruhanilər, hacılar, kərbalayılar, mərsiyəxanlar və sairlər təbliğat aparmağa başladılar: «Filan müəllim namaz qılmaz, baş qoydurar (qırxdırmaz), içki içər və sair nəhy olan işlərlə məşğul olan bir dinsizdir.



***«Üsul- sövtiyyə» məktəbinin şagirdləri.***
***...da Qəzənfər bəy Cavanşir** və **Ömər Faiq Əfəndi Nemanzadə**.*
***...da:** Hacı ağa Məhərrəm Hüseynov, Hacı Süleyman Hüseynov və saatsaz Mustafa Bədəlov*

Onun yanına uşaq qoysan qiyamət günündə məsul olacaqsan!»…Bu sözlər ilə xalqı əğfal edib məktəb ilə əhali arasında keçməz bir xəndək qazmaq fikrində olan mövhumatçılar məqsədlərinə nail ola bilmədilər»[249]. Mollalar bu məktəblərin tərəqqisindən narahat olub «məktəbdə müəllimlərin hökumətdən gizli türk dilində bəzi fənləri tədris etdikləri barədə məktublar» yazırlar. Elə bu səbəbdən də, 1898-ci ildə qəflətən Nuxa məktəbinə 3 nəfər jandarma gəlib çıxır. Yaranmış imkandan istifadə edən Faiq əfəndi siniflərə girib uşaqlara tarix və coğrafiya kitablarını gizlətməyi tapşırır. Uşaqlar partaların üstünə rus dili kitablarını qoyub «qonaqları gözləyirlər».

Yoxlayanlar partaların üstündə ancaq rus dili kitabını görürlər. Onlar sinifləri gəzir, partaların içinə, üstünə baxıb bir şey tapmayıb gedirlər. Jandarmalar məktubda yazılanların doğru olmadığına inanırlar. Bu hadisədən qeyzlənən uşaqlar Məclis ruhani idarəsini daşa tuturlar. Uşaqlar iki gün məktəbə getmirlər. Məsələnin başqa rəng alması və müəllimə ziyan toxunmamaq üçün valideynlər uşaqları yenidən məktəbə göndərirlər.

1895-ci ildə Nuxada **bazar günü məktəbi və kursları** açılır. Şəhər bazar günü məktəbi 1896-cı il noyabrın 8-də Nijni Novqorodda açılmış Ümumrusiya sərgisinin mükafatına layiq görülmüş, Bakı bazar günü məktəbi sərginin *ikinci*, **Nuxa bazar günü məktəbi isə sərginin *dördüncü diplomunu*** almışdır.

XIX əsrdə Cənubi Qafqazda azərbaycanlıların təhsil aldığı dövlət məktəb ləri ilə yanaşı ənənəvi məktəb və mədrəsələrin də sayı artdı. 1863-cü ildə **Nuxa** qəzasında 234, Şuşa qəzasında 27, Şamaxı qəzasında 63, Lənkəran qəzasında 50, Bakı qəzasında 141 məscid məktəbi fəaliyyət göstərirdi. Bu məktəblərdə 6

mindən çox şagird təhsil alırdı. 1867-ci il məlumatına görə, Zaqatala dairəsində 181 məktəbdə 1.712 şagird oxuyurdu. 1878-ci ildə Dağıstan vilayətində 88, Yelizavetpol (Gəncə) quberniyasında 232, Bakı quberniyasında 277, İrəvan quberniyasında 60 məscid məktəbi fəaliyyət göstərirdi.[250]

XIX əsrin 80-ci illərindən başlayaraq digər qəzalarda olduğu kimi, Nuxa qəzasının kəndlərində – *Xaçmaz, Padar və Vəndam (1883), Aşağı Göynük və Qoxmuq (1884), Vartaşen (indiki Oğuz) (1887), Bum (1890)* və digər yerlərdə məktəblərin əsası qoyuldu.[251]

Qəzanın kəndliləri məktəblər açılması üçün vəsait toplamağa başlayırlar. **Daşbulaq** kəndinin əhalisi 1897-ci ildə bu məqsəd üçün 3.500 manat toplamışdı. **Nic, Ağpilləkan** (indiki Aydınbulaq sovetliyinə daxil idi- müəlliflər), **Yaqublu** kəndlərində bu hərəkat daha qüvvətli idi. Nəticədə, 1898-ci il sentyabrın 29-da Nuxa qəzasının **Nic**, həmin ayın 30-da **Yaqublu** və **Ağpilləkanda,** oktyabrın 1-də **Göybulaqda**, oktyabrın 2-də **Daşbulaqda** kənd məktəbi açıldı. Qəzanın Zaraf və Cəfərabad kəndlərində də məktəblər fəaliyyətə başladı. Nic kənd məktəbinə ilk dəfə 120, Yaqublu kənd məktəbinə 31, Ağpilləkan kənd məktəbinə 40, Göybulaq kənd məktəbinə 17, Daşbulaq kənd məktəbinə 36 şagird qəbul edilmişdi.[252]

***Nuxa qəzasının kəndlərində açılan məktəblər aşağıdakı kimi olmuşdur.***[253]

**Cədvəl 2.3.3**

| Sıra № -si | Məktəblərin açıldığı ərazi | Məktəblərin açıldığı tarix |
|---|---|---|
| 1 | Qutqaşen (indiki Qəbələ) | 12.09.1882 |
| 2 | Xaçmaz | 28.10.1883 |
| 3 | Vəndam | 30.10.1883 |
| 4 | Padar | 01.11.1883 |
| 5 | Göynük | 1884 |
| 6 | Qoxmuq | 1884 |
| 7 | Vartaşen (indiki Oğuz) | 1887 |
| 8 | Bum | 1890 |
| 9 | Nic | 29.09.1898 |
| 10 | Yaqublu | 30.09.1898 |
| 11 | Ağpilləkan | 30.09.1898 |
| 12 | Göybulaq | 01.10.1998 |
| 13 | Daşbulaq | 02.10.1898 |

XX əsrin əvvəllərində qəzalarda yeni məktəblər təsis edildi. Bunlardan ikisi Nuxa qəzasında açılmışdı. Bununla da, Nuxada yeni bir məktəbin-Nuxa «**rus-Azərbaycan**» məktəbinin təşkilinə imkan yaranmışdı. 1896-cı ildə 104 şagirdlə fəaliyyətə başlayan və bir sinifdən ibarət olan bu məktəb yerli sakin **Hacı Əbdül** ağanın evində açılmışdı. İkinci «**rus-Azərbaycan» məktəbi** 1897-ci il iyunun 25-də tacir **Hacı Məmməd Sadıq Əliyevin** evndə açıldı və məktəbə ilk olaraq 75 şagird qəbul edildi. Bu məktəblərin biri sünnilər, digəri isə şiələr üçün idi. Hər iki məktəb əhalidən ianə kimi toplanmış vəsaitlə idarə olunurdu. Bakı müsəlman əhalisi Nuxa şiə məktəbi üçün 2.000 manat vəsait toplamış və göndərmişlər. Rus dilini sünni məktəbində **Qəzənfər ağa Cavanşir**, şiə məktəbində **Təhmasib bəy Qulubəyov** tədris edirdi. Dövrün mətbuat materialları və arxiv sənədlərində həmin məktəblərdə tədrisin yaxşı təşkil olunduğu bildirilir. 1897-ci ildə **Nuxa** sünni «rus-Azəbaycan» məktəbinin rəy dəftərində qeyd olunmuşdur ki, «…şagirdlər rus dilində cəld oxuyur, bir sıra şeir və duaları əzbər bilirlər… Məktəb yaxşı binaya malikdir».[254]

1898-ci ildə şəhər camaatı yuxarıda bəhs olunan məktəbləri 2 sinifli məktəbə çevirməyə, əlavə olaraq şəhərin Qışlaq adlanan hissəsində əlavə 2 məktəb açmağa təşəbbüs edir və bu məqsədlə hər tüstüdən 60 qəpik pul toplanır. Lakin müxtəlif səbəblərdən bu məktəblərdən yalnız biri açılır.

XIX əsrin 90-cı illərində məscid məktəblərinin yenidən qurulması sahəsində ilk addımlar atılır. Məmməd Əmin əfəndinin sədr olduğu baş məscidin həyətində dörd sinifdən ibarət məktəb açılır.[255] Məktəb iki mərtəbəli binada yerləşirdi. Məktəbin tədris planına ***şəriət, Azərbaycan, ərəb və rus dilləri, hesab və Rusiya coğrafiyası*** dərsləri daxil idi. Onlardan hesab və coğrafiya Azərbaycan dilində keçirilirdi. Ən vacibi o, idi ki, ana dili təlimi səs üsulu ilə («Usul-sövtiyyə») aparılırdı. Məktəbdə şagirdlərin sayı 200 nəfərdən artıq idi. Kənd uşaqları məktəbə pulsuz qəbul olunmuşdular. Məktəbdə tədrislə məşğul olan 4 nəfər müəllim içərisində *Ömər Faiq Nemanzadə və Qəzənfər bəy Cavanşir* də var idi. Müəllimlər Avropasayağı geyinirdilər. Yalnız baş müəllim molla kimi çalma bağlayır, arxalıq geyirdi.

Təhsil sahəsində həyata keçirilən islahat mətbuat səhifələrində özünə yer tapırdı. XIX əsrin sonu və XX əsrin əvvəllərində nəşr olunan «Əkinçi» (1875-1977), «Ziya» və «Ziyayi Qafqaziyyə» (1879-1884), «Kəşkül» (1883-1891), «Füyuzat» (1906-1907), «Tərəqqi» (1908-1909) və digər mətbuat vasitələrində xalq təhsili, təlim-tərbiyə məsələləri işıqlandırılırdı. Pedaqoji hərəkatın önündə «Molla Nəsrəddin» jurnalı gedirdi.

H.B.Zərdabinin nəşr etdirdiyi «Əkinçi», C.Əfəndi Ünsizadə tərəfindən nəşr edilən «Kəşkül», M.A. Şaxtaxtlının nəşr etdiyi «Şərqi rus» qəzetləri, M. Mahmudbəyovun nəşr etdirdiyi «Rəhbər», uşaqlar üçün nəzərdə tutulmuş «Məktəb» və «Dəbistan» jurnalları bu sahədə daha fəal idilər.[256]

«Əkinçi» yazırdı ki, biz də qeyri-millətlər kimi elmi-əbdanı elmi ədyandan ayırmalı, onun üçün də yeni məktəbləri bina edib oraya yeni müəllimlər-elmi əbdanı (dünyəvi elmləri) bilən müəllimlər təyin etməliyik. Qəzet məktəblərdə uşaqlara çismani cəza verilməsi əleyhinə çıxır, «xalq arasında yayılmış «molla, əti sənin sümüyü mənim» tezisini tənqid edirdi. «Əkinçi» dünyəvi elmlərin tədrisini vacib sayırdı. «Əkinçi»nin bu məramını alqışlayan F.Köçərli H.Zərdabinin fikirlərini müdafiə edirdi. M.F.Axundov 1877-ci ildə «Əkinçi» qəzetində «Vəkili naməlum» adlı məqaləsində yazırdı ki, «…Məktəb işin ibtidasıdır. Məktəbdən çıxandan sonra uşaqlar qəzet, jurnal, kitab oxumalıdırlar».[257]



***H.Zərdabi***

«Kəşkül» öz səhifələrində cəhaləti, nadanlığı kəskin tənqid edərək yazırdı ki, «Biz maarif sahəsində cəmiyyətlər yaratmalıyıq. Biz müəllimlər hazırlayan müəssisə açmalıyıq. Biz bu yol ilə küçələrdə başlı-başına qalıb dilənçiliklə həyat keçirən uşaqlarımızı elmə, maarifə cəlb edə bilərik».

«Şərqi-rus» qəzetinin redaktoru Məmmədağa Şahtaxtlı təhsilli, maarifpərvər, xeyirxah bir maarifçi idi. Qəzet «Ey ata-babalarımızın hökmran xanlarından, bəylərindən, ağalarından yadigar əsrimizin xanzadələri, bəyzadələri… Ata-babalarımıza vəfa qılmayan dünya malı-mülkünün sizə vəfa etməməsinə əminəm, küçələrdə, bazarlarda, xarabalıqlarda səfil, sərkərdan, qarnı ac, əli qoynunda, gözü qanyaşlı atasız-anasız yetim qalan balalarımıza baxıb rəhm qılın, məktəb (uşkol) açıb, yetim balalarımıza təhsil verin» deyə xalqa müraciət edərək onları elm arxasınca getməyə səsləyirdi.[258]

XX əsrin əvvəllərində 10-dan artıq qəzet və jurnalın nəşri, o cümlədən uşaq nəşrləri, «Rus-müsəlman» məktəblərinin inkişafı, «Xeyriyyə» cəmiyyətləri olan «Nəşr-maarif», «Nicat», «Səadət» və s. fəaliyyəti, birinci və ikinci müəllimlər qurultayının çağırılması, yeni milli proqram və dərsliklər təhsilin təşkilinə öz təsirini göstərdi. Qabaqcıl ziyalılar genişlənməkdə olan sosial-pedaqoji hərəkata qoşuldular. Onların sırasında, N. Nərimanov və Ü.Hacıbəyov öndə idilər. N.Nərimanov yazırdı: «Ziyalılar ibtidai məktəb işlərinə artıq diqqət edib «Üsuli-cədid» məktəblərinə camaatı daha ziyadə rəğbətləndirirlər – «rus-tatar» məktəbləri üçün tərəqqi yolu arayırlar».[259]

Məktəb məsələlərinə camaatın diqqət yetirməsi Ü.Hacıbəyovun da nəzərindən yayınmamışdı. O, yazırdı: «Bizə türk məktəbləri – milli məktəblər lazımdır. Mən milli məktəblər ona deyirəm ki, orada bütün elmlər öz ana dilimizdə tədris olunur».[260]

«Molla Nəsrəddin» jurnalını tribunaya çevirən M.Ə.Sabir və C.Məmmədquluzadə  yeni məktəb uğrunda mübarizədə fəallıq göstərirdilər.

Müsəlmanlar arasında savadı yaymaq sahəsində yaradılmış cəmiyyətlər əməli rol oynadılar. Beləlırindən biri də, «Nicat» cəmiyyəti idi. 1906-cı ildə yaradılan cəmiyyətin üzvləri sırasında H.Zərdabi, sonralar isə M.Mahmudbəyov da olmuşdur. Cəmiyyətin 1906-cı il avqustun 22-də təsdiq olunan Nizamnaməsində müsəlmanlar arasında maarifi, savadı yaymaq və müsəlman uşaqlarına ibtidai, orta və ali təhsil vermək, ana dili və ədəbiyyatı inkişaf etdirməyə kömək etmək əsas məqsəd idi. Cəmiyyətin sədri Murtuza Muxtarov, İsabəy Aşurbəyov, katibi M.B. Hacıbababəyov idi.

Bakı quberniyasında müsəlmanlar arasında savadı yaymaq üçün yaradılmış ikinci cəmiyyət «Nəşr-maarif» idi. 1906-cı ildə təşkil olunmuş cəmiyyətin Nizamnaməsi avqustun 1-də təsdiq olunmuşdu. Cəmiyyətin sədri H.Z.Tağıyev, M.H.Hacınski, katibi isə A.İ. Cəfərov olmuşdur.[261]

1911-ci ildə Nuxada dövlət tərəfindən təsdiq edilmiş xeyriyyə cəmiyyəti təşkil olundu. Cəmiyyətin məqsədi ***Nuxa*** şəhərində və ətrafında sakin müsəlman camaatı arasında elm və maarifi, xüsusən ibtidai təlimi ana dilində yaymaq idi[262]. Cəmiyyətin Nizamnaməsində mövcud olan məktəb və mədrəsələrə maddi köməklik etmək; yeni məktəb və mədrəsə açanları həvəsləndirmək, onlara köməklik etmək, həmçinin cəmiyyətin vəsaiti ilə məktəb, mədrəsələr açmaq; camaat üçün, həmçinin cəmiyyət üzvləri və kənar adamlar üçün qiraətxana və kitabxana, gecə kursları təşkil etmək, teatrlar, ədəbi müsamirələr keçirmək nəzərdə tutulmuşdur. Nizamnamədə, həmçinin hökumətdən icazə almaq şərtilə kasıb müsəlman şagirdlərinin ibtidai və ali məktəblərə qəbuluna yardım etmək, kasıb və yetim müsəlman balalarını himayəyə almaq, onlar üçün dərs vəsaiti nəşr etmək, məktəb və mədrəsələrdən ötrü təcrübəli müəllim və müəllimələr tapılması vacib hesab edilirdi.[263]

Əlbəttə, həyata keçirilməsi nəzərdə tutulan tədbirlər Azərbaycanda məktəb şəbəkəsinin genişlənməsinə, məktəblərdə təhsil alan şagirdlərin sayının artmasına kömək edir. 1914-cü ildə Azərbaycan ərazisində 942 məktəb var idi. Onlardan 920-si aşağı ibtidai məktəb olmuşdur. Təhsil alan 62.786 nəfər şagirdin 22.161 nəfəri azərbaycanlı idi.

Azərbaycanda xalq maarifi və məktəbin inkşafı çox zəngin və mürəkkəb bir tarixə malikdir. Azərbaycanın Rusiya tərəfindən işğal edilməsi, çarizmin məxfi məqsədlərindən asılı olmayaraq xalq maarifi və məktəb təhsilinin inkişafında yeni mərhələ təşkil edir.[264] Bu mərhələdə Abasqulu ağa Bakıxanov, Seyid Əzim Şirvani, Həsən bəy Zərdabi, Cəlil Məmmədquluzadə, Rəşid bəy Əfəndiyev, Firidun Köçərli, Nəriman Nərimanov, Sultan Məcid Qənizadə və digər ziyalılar əsərlərində məktəb və xalq maarifindən bəhs etmişlər.

Azərbaycanda **ilk ümumtəhsil məktəbi *1875-ci ildə Gəncə quberniyasının Salahlı kəndində* təşkil edildi.** Bu məktəb milliyyətcə tatar olan Kazan sakini Tauxiddin Mamleyev tərəfindən açıldı. Məktəbə qəbul olunan 23 şagirdin 3- u pulsuz təhsil almalıydı.

XIX əsrin ortalarında ümumilikdə Azərbaycanda 700-dən artıq məktəb olmuşdu. Məktəblərdə təhsil pullu idi. Təhsil haqqı şagirdlərin yaşından və ailə vəziyyətindən asılı olaraq dəyişirdi.

Azərbaycanda olan məktəblər üç tipə bölünürdülər: ***1) məktəb və mədrəsələr; 2) dövlət məktəbləri; 3) müsəlman məktəbləri.*** Məktəblərdə şagirdlərin sayı da artırdı. Məsələn, Şuşa şəhərindəki 10 məktəbdə 280 şagird, Şamaxı quberniyasındakı 299 məktəb və mədrəsədə 4.700 nəfər oxuyurdu. *Nuxa qəzasında 1853-cü ildə **163,** 1854-cü ildə **195,** 1858-ci ildə **168** məktəb fəaliyyət göstərirdi ki, onlarda müvafiq olaraq **389, 659, 1430** şagird təhsilə cəlb olunmuşdur.* [265]

XIX əsrin 80-90-cı illərində kəndlərdə ümumtəhsil məktəbləri açmaq hərəkatı genişlənir. Ancaq müəllim kadrlarının çatışmazlığı bu işi xeyli ləngidirdi. **Nuxanın** qəza məktəbi 1877-ci ildə 3 sinifli şəhər məktəbinə çevrildi. Məktəbin müdiri F.S.Kabaşidze, şəriət müəllimi molla Mustafa Çələbi oğlu,…olmuş və 133 tələbəsi var idi[266]. Nəhayət, 1879-cu ildə Qori şəhərində Zaqafqaziya Müəllimlər Seminariyasının nəzdində Azərbaycan şöbəsinin təşkili və İrəvanda müəllimlər seminariyasının açılması müəllim kadrları hazırlığında xeyli irəliləyişə səbəb oldu.

**Nuxada** yeni məktəblərin açılması sahəsində yerli ziyalılar fəallıq göstərdilər. 1883-cü ildə kəndlilərin vəsaiti ilə ***Nuxa*** qəzasının *Vəndam, Padar və Xaçmaz, 1884-cü ildə Aşağı Göynük, Qoxmuq,* 1887-ci ildə Vartaşen (indiki Oğuz) və 1890-cı ildə Bum kəndlərində məktəb açıldı.[267]

Kənd məktəblərində şagirdlərin milli tərkibinin əsasını azərbaycanlılar təşkil edirdi. Bəzilərində ermənilər və ruslar təhsil alırdı. Silki tərkib etibari ilə şagirdlərin əksəriyyəti kəndli uşaqları olub, əsasən oğlanlardan ibarət idi. Bəzi məktəblərdə tək-tək qızlar da oğlanlarla birlikdə təhsil alırdılar. Bu səbəbdən də, camaat qızlar üçün ayrıca məktəb təşkilini vacib hesab edirdilər. Kənd məktəbləri təkcə təhsil verməklə öz işlərini bitmiş hesab etmir, kənddə mədəni-maarif və səhiyyə işləri ilə də məşğul olurdular.[268]

## 2.4. Zaqafqaziya Müəllimlər Seminariyası və onun Nuxada təhsilin inkişafında rolu

XIX əsrin 70-ci illərinə kimi ümumilikdə Zaqafqaziyada müəllim kadrları hazırlayan məktəb yox idi. Müəllimlərin əsas hissəsini Rusiyadan dəvət olunanlar, qismən də Tiflis gimnaziyasının məzunları təşkil edirdi. Müəllim kadrları hazırlayan Kuban Müəllimlər Seminariyası Qafqaz məktəblərinin ehtiyacını ödəyə bilmirdi. Bu səbəbdən də, müəllimlik hüququ olmayan şəxslər məktəb lərə cəlb olunduğundan ibtidai təhsilin inkişafı ləngiyirdi. Nəhayət, Qori şəhərində ***Zaqafqaziya Müəllimlər Seminariyası*** açılandan, xüsusilə 1879-cu ildə Azərbaycan şöbəsinin təsisindən sonra kadr təminatında qismən irəliləyiş hiss olunmağa başladı.

**Zaqafqaziya Müəllimlər Seminariyası Qori şəhərində 1876-cı il sentyabrın 12-də açıldı**[269]**.** Seminariya əvvəlcə üç şöbədən: rus, gürcü və erməni şöbələrindən ibarət idi. Birinci il seminariyaya 50 nəfər qəbul olundu. Seminaristlərin içərisində bir nəfər də azərbaycanlı olmamışdır.

**Zaqafqaziya Müəllimlər Seminariyasının nəzdində 1879-cu il sentyabrın 23-də Azərbaycan şöbəsi açıldı**[270]**.** Bu şöbənin təşklində A.O.Çernyayevskinin (1840-1894) böyük rolu oldu.

*Azərbaycan şöbəsinin ilk inspektoru vəzifəsinə A.O.Çernyayevski, şiə təriqəti üzrə şəriət müəllimi vəzifəsinə* ***molla Əbdülsalam Axundzadə****, hazırlıq sinfinin müəllimi vəzifəsinə* ***K.Q. Urusov*** *təyin edilmişlər. Şöbənin nəzdində təşkil edilən ibtidai məktəbdə Azərbaycan dili müəllimi vəzifəsi ilk vaxtlar boş qalmış, sonralar həmin vəzifəyə şöbənin ilk məzunlarından olan* ***Səfərəli Vəlibəyov*** *təyin edilmişdir.*[271]

**Tanıtma**:

**Çernyayevski Aleksey Osipoviç** ***(1840, Şamaxı - 1894, Tiflis)- əmək fəaliyyətinə 1867-ci ildə kənd poçtunda başlamış, 1866-cı ildə Mərəzə kəndində xalq məktəbi yaratmış, 1879-1893-cü illərdə Zaqafqaziya (Qori) Müəllimlər Semina riyasının Azərbaycan şöbəsinin ilk inspektoru olmuşdur. Şərqdə səs (sövti) üsulu ilə ilk «Vətən dili» (Azərbaycan dilində 1882-ci ildə eyni adlı əsərin 2-ci hissəsini 1888-ci ildə S.Vəlibəyovla birlikdə) və «Rus dili» (1883) dərsliklərinin müəllifidir. Azərbaycanda ziyalılarının, xüsusən müəllim kadrlarının hazırlanmasında F.Köçərli, R.Əfəndiyev, M.Mahmudbəyov, T.Bayram əlibəyov, S.Vəlibəyov. S. S.Axundov, C.Məmmədquluzadə, N.Nərimanov və b. ilə birlikdə xidmətləri olmuşdur.***

***1981-ci ildə A.O.Çernyayevskinin anadan olmasının 140 illiyi qeyd olunmuşdur. İsmayıl Şıxlının «Dəli Kür» romanında A.O.Çernyayevskinin obrazı yaradılmışdır.***[272]



Seminariyanın *Azərbaycan şöbəsinin və onun nəzdində olan ibtidai məktəbin Əsasnaməsi 1880-cı il mayın 13-də təsdiq edildi.* Əsasnaməyə görə, şöbənin vəzifəsi Zaqafqaziya ölkəsinin azərbaycanlı kəndlərindəki ibtidai məktəblər üçün bilikli və təcrübəli müəllimlər hazırlamaq idi. *Azərbaycan dili və sünni təriqəti üzrə şəriət müəllimi vəzifəsinə* ***molla Mirzə Hüseyn əfəndi Qayıbzad****ə təyin olundu.*

**Tanıtma:**

**Qayıbzadə Mirzə Hüseyn əfəndi** ***Qazax qəzasının Salahlı kəndində anadan olmuşdur. 1881-1917-ci illərdə Zaqafqaziya müftisi olmuş, Zaqafqaziya Müəllimlər Seminariyasının Azər baycan şöbəsinin açılmasının ilk təşəbbüs karlarından biridir.***

***Qayıbzadə Hüseyn əfəndi Azərbaycanda qızların dünyəvi təhsil almasının şəriətə zidd olmadığı haqqında mətbuatda çıxış etmiş, qızların məktəbə çadrasız getmələrinə, ictimai işlərdə iştirakına tərəfdar olmuşdur.***

***M.H. Qayıbzdənin 4 cilddən ibarət «Azərbay canda məşhur olan şüaranın əşarına məcmüədir» adlı əlyazması vardır. Əlyazmada XVIII-XIX əsrlərdə yaşayan 100-dən çox şairin əsərlərindən nümunələr verilmişdir.***

Seminariyaya ilk dəfə 32 nəfər qəbul olunmuşdur. Onların 24 nəfəri A.O.Çernyayevski tərəfindən yerlərdən seçilmiş, qalanları isə öz arzuları ilə gəlmişdilər. Seminariyaya ilk qəbul olunanlar içərisində *S.Vəlibəyov, F.Köçərli, R.Əfəndiyev, M.Mahmudbəyov,* sonralar *Cəlil Məmmədquluzadə (1882), Süleyman Sani Axundov (1885), Üzeyir Hacıbəyov (1889), Müslim Maqomayev (1889)* və b. olmuşlar.



Zaqafqaziya Müəllimlər Seminariyası və onun Azərbaycan şöbəsinə 10 yaşdan az olmayaraq 40 nəfərin, ibtidai məktəbə isə azyaşlılardan 20 nəfərin qəbul olunması müəyyən edilmişdir. Bunların hamısı dövlət hesabına saxlanılır, Azərbaycan dilini bilən ayrıca tərbiyəçinin-inspektorun himayəsi altında ümumi yataqxanada yaşayırdılar. Qəbul imtahanlarından müvəffəq olmayanlar üçün hazırlıq sinfi nəzdində aşağı şöbə təşkil edilmişdir.[273]

1879-cu ildən 1893-cü ilə kimi Azərbaycan şöbəsini 67 nəfər bitirmişdi ki, onların 53 nəfəri bilavasitə xalq məktəblərində fəaliyyət göstərirdi.[274] A.O.Çernyayevski sonralar yazırmışdı ki, «Bu şöbədən buraxılan ilk müəllimlərlə, şöbənin nəzdində olan ibtidai məktəb nümunəsində müsəlman kəndlərində düzgün təşkil edilmiş xalq məktəbləri açılmağa başlandı ki, kənd əhalisi içərisində xalq təhsili də məhz bu vaxtdan yayılmağa başladı».[275]

Zaqafqaziya Müəllimlər Seminariyasının Azərbaycan şöbəsinin ilk məzunlarının buraxılışı ilə əlaqədar Azərbaycan kəndlərində rus dilində təhsil verilən dünyəvi məktəblər meydana gəldi və inkişaf etməyə başladı. 1882-ci il sentyabrın 23-də **Nuxa** qəzasının Qutqaşen (Qəbələ) kəndində, sentyabrın 25-də Ərəş qəzasının Ağdaş kəndində ilk məktəblərin əsası qoyuldu.

Şagirdlərin milli tərkibində dəyişikliklər nəzərə çarpırdı. Məsələn, Nuxa qəza məktəbində təhsil alan ***76 şagirdin 25 nəfəri azərbaycanlı, 5 nəfəri rus, … 2 nəfəri gürcü*** idi.[276]

Xalq məktəblərinin təşkili və inkişafı bu məktəblərdə oxuyan azərbaycanlıların sayının artmasına səbəb oldu. Artıq XIX əsrin sonunda bütöv Qafqazda

yaşayan 288.000 nəfər müsəlmandan 438 nəfəri orta, 578 nəfəri şəhər, 2.336 nəfəri isə xalq məktəblərində təhsil alırdı. Bundan əlavə, 23.900 nəfər (o cümlədən 2.199 qız) məktəb və mədrəsələrə davam edirdi. Məktəbyaşlı uşaqların 27.252 nəfəri bu və ya digər məktəblərdə təhsilə cəlb olunmuşdur. Orta hesabla əhalinin hər 106 nəfərinə **bir şagird** düşürdü.[277]

Bu gün adlarını iftixarla çəkdiyimiz Azərbaycan ziyalılarının böyük bir nəsli ilk təhsilini «Rus-Azərbaycan» məktəblərində almışlar. Belə məktəblərdən biri də, 1896-cı ildə **Nuxada** fəaliyyətə başladı. Hələ 1895-1896-cı illərdə Nuxada məscid məktəblərinin yenidən qurulmasına başlanmış, «Nuxa müsəlmanları 1895-ci ildə yerli Məhəmməd ruhanilərinin təsiri altında öz məktəblərindən birini «rus-tatar» məktəbinə (*Məscid nəzdində təşkil edilən yeni üsullu məktəblərdə rus dili tədris edildiyi üçün sonralar həmin məktəblər «rus-tatar» məktəbləri adlanmağa başlanmışdı – müəlliflər)* çevirməyə cəhd etdilər və 1896-cı ildə buna nail oldular».[278]

Nuxada birinci «rus-tatar» məktəbi (sünni uşaqları üçün) 1896-cı ildə yerli sakin **Hacı Əbdül Rəhim** ağanın evində, ikincisi tacir **Məmməd Sadıq Əliyevin** evində açıldı. Hər iki məktəb üçün binalar təmənnasız verilmişdi. Artıq 1897-ci ildə hər iki məktəbdə şagirdlərin sayı 200 nəfərə çatırdı. Bakı müsəlman əhalisi Nuxa məktəbi üçün 200 manat vəsait toplamışdı. Hər iki məktəbdə Azərbaycan, fars, ərəb və rus dilləri, hesab və şəriət tədris edilirdi. Sünni «rus-Azərbaycan» ***Məmməd Sadıq Əliyev*** məktəbi Baş Cümə məscidi nəzdində idi və orada rus dilini ZMS-nın məzunu Qəzənfər bəy Cavanşir, şiə «rus-Azərbaycan» məktəbində rus dilini Təhmasib bəy Qulubəyov tədris edirdi.



***Hacı Məmməd Sadıq Əliyev***

Nuxa şəhər camaatı hər iki məktəbin ikisinifli məktəbə çevrilməsini istəyir, əlavə olaraq ***Nuxa Qışlağı*** adlı yerdə hər biri ikisinifli olmaqla iki «rus-Azərbaycan» məktəbi açmaq üçün hər tüstüdən 60 qəpik pul topladılar. Amma hökumətin bu sahədə marağı olmadığından onlardan yalnız biri açıldı.[279]

Azərbaycanda açılan «rus-Azərbaycan» məktəblərində ana dili səs üsulu ilə A.O.Çernyayevskinin «Vətən dili» (I-II hissə), fars dili Sədinin «Gülüstan», rus dili M.Volperin «Rus dili» (I, II, III, IV hissə), hesab Yevtuşevskinin «Məsələlər kitabı» üzrə tədris edilirdi.[280]

1895-ci il məlumatına görə, **Nuxa** şəhər məktəbində **136 şagird** təhsil alırdı. 1895-ci ildə şagirdlərin sayı **167 nəfərə** çatmışdı. Bunlardan **112 nəfəri** şəhər sakinlərinin uşaqları idi.[281]

1898-ci ildə Daşlıbazarın şərqində ***Hacı Məmməd Sadıq Əliyev*** öz vəsaiti ilə ibtidai məktəb üçün 3 sinifdən ibarət böyük bir bina tikdirir. 1898-ci ildə bu

binada axund **molla Fərəc** tərəfindən «üsuli-cədid» məktəbi açılır. «Məktəbə tədris üçün rus dili müəllimi *Təhmasib bəy Qulubəyov*, ana dili və fars dili müəllimləri molla *Kazım Axundzadə*, *Əli Qulu* axund və qeyriləri cəlb olunurlar. Məktəbdə uşaqların sayı sürətlə artır və 2 sinifli məktəb halına düşür. Sonra məktəbə *Mir-Musa Ağamirov* və ikinci rus dili müəllimi Aslan və daha bir şəriət mollası göndərilir. 1907-ci ildə bu xalq məktəbi hökumətə verilir.[282]

İkisinifli Nuxa şəhər məktəbinin müdiri Rəşidbəy Əfəndiyev, şəriət müəllimi Mir Həmzə Mustafa Əfəndi oğlu Əfəndiyev, rus dili müəllimi Davud Yəniyev… idi. 1908-1909-cu tədris ilində məktəbdə oxuyan **281 tələbənin 8 nəfəri rus, 2 nəfəri gürcü, … 152 nəfəri tatar** idi. Tələbələrin 31 nəfəri mülkədar, 3 nəfəri məmur oğlu, 10 nəfəri ruhani balası, 208 nəfəri şəhərli əhalı və 29 nəfəri kəndçi olmuşdur.[283]

Məktəbin xüsusi Nizamnamə qaydası var idi. Səhərlər hər gün birinci dərsdən əvvəl uşaqlar həyətdə üç dəstə halında - Azərbaycan, rus,... toplaşırdılar. Əvvəl rusca, sonra müsəlmanlar ərəbcə dua oxuyub qurtarandan sonra siniflərə keçərdilər. Dərslər rus dilində aparılırdı. Uşaqlar başlarına **şapka** qoyurdular. *Ona görə də, valideylərin çoxu övladlarını məktəbə vermirdilər. Uşaqlar dərsə gedəndə başlarına papaq qoyar, məktəbə çatanda papaqlarını məktəbə yaxın dükanlarda qoyub şapkalarını geyərdilər. Evdən dərsə gedəndə şapklarını dükanda qoyub papaqla evə gedirdilər. Beləliklə, onlar küçələrdən papaqla keçərdilər. Amma bu uzun çəkməmişdi. Başqa şəhərlərdən gələn tələbələrin, seminariya tələbələri və müəllimlərin şəhərdə şapka ilə gəzmələri səbəbli sonralar şəhər məktəbinə gedən tələbələr şapka ilə getməyə çətinlik çəkmədilər.*

Sənədlərdən və xatirələrdən aydın olur ki, şəhər məktəbinin aşağıda-Qışlağın başında böyük bir bağı vardı. Bağban işləyən qışlaqlı qoca Məmməd kişi ailəsi ilə orada yaşayardı. Bağda cürbəcür meyvə ağacları əkilmişdi. Tələbələr yazbaşı bağa gedər, yeni ağac əkər və calaq edər, ağacların quru budaqlarını kəsib atardılar. Bağda iş tətil vaxtınadək davam edərdi.

1905-ci il inqilabı digər sahələrdə olduğu kimi, məktəblərin də işinə mənfi təsir etdi. 1905-ci il inqilabı dövründə Zaqafqaziyanın böyük şəhərlərində – Tbilisi, Bakı, Gəncə və Qoridə məktəblər bağlandığından onların müəllimləri, tələbələri və bəzi qulluqçuları **Nuxaya** gəlirlər. Ziyalıların Nuxaya toplanması xalqın arasında maarifə dönüşə səbəb oldu.

1906-cı ilin yayında ziyalılar yuxarı cümə məscidinin həyətində axundların, əfəndilərin, qazının, qəza rəisi və pristavların iştirakilə burada «Cəmiyyəti xeyriyyə» və «Nəşri-maarif» cəmiyyətlərinin əsasını qoydular. Bu cəmiyyətlər sədr və idarə heyəti seçir, vəsait toplanırdı. Hər iki cəmiyətin məqsədi maarif işini yüksəltmək idi. Şübhəsiz, bu təşəbbüs o zaman çar hökumətinin Azərbaycanda maarif işinə fikir verməməsindən irəli gəlmişdir. Toplanan vəsaitlə Təzə-Karvansaray darvazasının qabağında (saatsaz Məmməd-Kərim Mahmud ağa oğlunun dükanının qabağında) xalçalarla bəzənmiş yerdə qiraətxana açıldı. Qiraətxanaya Əli Bala Lətif oğlu müdir təyin olundu. Qiraətxanaya «Kaspi» (1906), «Həyat», «Tərcüman» (1906), «İrşad», «Həqiqət» (1906-1911) «Наша

жизнь» (1906-cı il) qəzetləri, Molla Nəsrəddin, (1906-1909), «Dəbistan» (Bakı, 1906-1908), «Aləmi-nisan» (Baxçasaray,1906), «Füyuzat» (Bakı, 1906-1907), «Rəhbər» (Bakı,1906,1907, 1909), «Zənbur» (Bakı, 1906-1909), «Bəhlul» (Bakı, 1907) kimi jurnal və məcmuələr toplandı.

Yuxarıda adları qeyd edilmiş qəzetlər və məcmuələrdən əlavə qiraətxanaya müxtəlif kitablar gətirilmişdi. Yerli müəllimlər hər gün qiraətxanaya gəlib qəzet və məcmüələri oxuyurdular. Yayda başqa şəhərlərdən gələn tələbələr: ***Həşim bəy Əmircanov, Məmməd bəy Əfəndiyev, Əsəd Məmməd Hüseyn oğlu, Vasil Qukasov, Saşa Makedonski, Mabud Hacı Cəlil oğlu Mustafayev*** qiraətxanada məşğul olardılar.

Adları qeyd edilən tələbələr-həvəskar artistlər 1905-ci ildən 1910-cu ilə kimi tamaşalar göstərmişlər. Dövrün mətbuat materiallarından və xatirə sənədlərindən bizə 1910-cu ildən 1919-cu ilə qədər tamaşalar təşkil edən həvəskar artistlərdən aşağıdakıların adları məlumdur: Abdul Cabbar Əsəd oğlu, Yusif Bədəlov, həkim Hüseyn Kərbalayı Qulu oğlu, Nəsif Tağı oğlu, Məmmədəli Rzayev, Əhməd Himli, Beyqafıl Musa və b. Abdul Cabbar Əliyev 1919-cu ildə Nuxaya qastrol səfərinə gələn Sarabski ilə «Leyli Məcnun», «Hacı Qara», «Dursunəli Ballıbadı» tamaşalarında oynamışdı.

Tamaşalardan toplanan puldan xərclənmiş vəsait çıxıldıqdan sonra qalan pullar cəmiyyətlərin xəzinəsinə verilirdi.1906-cı ildə Nuxa qiraətxanasının xeyrinə teatrda oynanılan «Qan ocağı» tamaşasından 350 manat pul toplanmışdı.[284]

Gəncəli məhəlləsində maarifpərvər Molla Fərəc axund Pişnamazzadə 1906-cı ildə «Nəşr maarif» cəmiyyətinin vəsaitindən Abbas Qulubəy Lütfəlibəyovun evində ***ibtidai qız məktəbi*** üçün pul toplamışdı.[285]

İbtidai qız məktəbinin ömrü qısa oldu. Müəllimələrin başqa şəhərə getmələri səbəbli iki ildən sonra məktəb fəaliyyətini dayandırdı. 1906-cı ildə **Qaragözlərin məscidinin** həyətində iki otaqdan ibarət hücrədə «üsuli-cədid» tipində bir ibtidai məktəb açıldı. Həmin məktəbin təşkilinə **Musab bəy Hacısanov, Hacı Xəlilbəyli, Əbdüsəlam ağa Qazıyev** və bir neçə digər maarifpərvər şəxslər kömək etdilər. Məktəbdə molla Hüseyn Aydınzadə müəllimlik edirdi. Kasıb uşaqlarından təhsil haqqı alınmırdı. Bir ay üçün müəyyənləşdirilmiş 50 qəpik təhsil haqqı müntəzəm toplanmırdı.

Məktəbdə uşaqların sayı 50 nəfər idi və iki otaqda yerləşmişdilər. Uşaqlar 4-5 şöbədə oxuyurdular. Məktəb 1918-ci ilə kimi davam etmişdir. Bu məktəbdə vaxtaşırı **Ələddin əfəndi, molla Həsən, Rəşid bəy, Hacı Mir Həmzə əfəndi, Hacıbala Əfəndiyev, molla Lətif oğlu** müəllimlik etmişlər.[286]

Bakı müəllimlərindən biri, Nuxalı Abdulla bəy Əfəndiyev (Rəşid bəy Əfəndiyevin qardaşı) 1907-ci ildə Nuxa şəhər məktəbinə müdir təyin olunur. 1910-cu ildə şəhər məktəbi aşağı Dabbaqxanada Calğalı bulağın qabağındakı köhnə binadan bankın üstünə Qurcana çayının kənarında təzə binaya köçür.

Məktəb buraya köçəndən sonra məktəbə daxil olanların sayı artdı. Əgər məktəb aşağıda yerləşən zaman burada azərbaycanlı tələbələrinin sayı 25-30

nəfər idisə, məktəb yeni binaya köçəndən sonra onların sayı 300 nəfərəə çatıdı. Nəhayət, 1913-cü ildə Nuxada yeni 7 № li ibtidai qız məktəbi açıldı.[287]



***İbtidai məktəbin rəsmi açılışına aid foto.*** [288]**1906-cı il**

*Soldan sağa*: **Hacı Xəlil bəy, Abdulsalam ağa Qazıyev, Musab Hacısanov, Rəşid bəy Əfəndiyev, Hacı Əziz İmam, Məmməd bəy Hüseynbəyov.**
*Soldan sağa oturanlar:* **Alxas Rəsulov, Hacı Abdulla Manafov, pristav Abdurrahman bəy Əfəndiyev, Rəşid bəy Əfəndiyev, Şəhər Bələdiyyə idarəsi müdiri, müəllim Kərim Əfəndi, müəllim Nuru əfəndi Ağa Yunus Məmmədov (fabrikant), Hacı Cəlil Mustafayev**
*Ayaq üstə duranlar:* **Mirzə Abbasəli Məmmədzadə, papaqçı Hacı Rəcəb və müəllim Həşim əfəndi Məmmədov**

Yeni açılan ibtidai məktəb şəhərin yuxarı hissəsində fəaliyyət göstərirdi. Nuxanın maarifpərvər ziyalıları şəhərin aşağı hissəsində də məktəb açılmasına səy göstərirdilər. Lakin şəhərin aşağı hissəsində, yəni Dabbaqxana məscidinin dövrəsində məktəb açılmasına mane olanlar çoxluq təşkil edirdilər. Nəhayət, dabbaq Hacı Nəsrulla Hacı İsrafil oğlu əfrafındakıların inadını sındırır, 1908-ci ildə ikinci cümə məscidinə bitişik məktəbin təntənəli surətdə açılışı olur. Məktəbə müəllim kimi Kənan, Nuru Əfəndi, Həşim əfəndi Məmmədzadə və

başqaları cəlb olunurlar. Məktəb uzun illər davam etmiş, yüzlərlə uşaq burada savad almışdır. Məktəbə «Cəmiyyəti xeyriyyə» maddi yardımı göstərmişdir.

Nuxada maarif ocaqlarının sayı artdıqca qız məktəbinin olmasına böyük ehtiyac duyulurdu. Bu yolda Rəşid bəy Əfəndiyevin qardaşı **Abdulla bəy Əfəndiyev və Molla Oruc** ciddi səy göstərirlər. Abdulla bəy rayon inspektoru V.A. Yemelyanovun qarşısında Nuxada ibtidai qız məktəbi açılması məsələsini qaldırır. V.A. Yemelyanov 1913-cü ildə Maral xanım Nəbiyevanı Nuxadakı ***7 №li ibtidai qız məktəbinə*** müdirə və Xanım Tahirovanı şəriət müəllimәsi təyin edir. Həmin il avqustun axırında məktəbə qızlar qəbul olunur və avqustun 31-də bu məktəb Bazarbaşında ləzgi Həmzənin evində rəsmən açılır. Açılışda Mabud əfəndi Əfəndiyev, Mir-Musa Ağamirov, Əhməd Nəbiyev, İmam Həsən Tairov və qeyriləri iştirak etdilər.[289]

Bir müddət sonra yeni milli məktəblər və 1910-cu ildən Dabbaqxana cümə məcidinin yanındakı Kənanın «Vətən» məktəbi hökumətin ixtiyarına keçir və onlara «rus-tatar» adı verilir. ***Qiraətxanın binasındakı axund Mir-Musa məktəbi 2 №li, Kənanın məktəbi 3 № li, ikisinifli erməni məktəbi 4 №li, keçmiş Ağamirovun sövtiyyə məktəbi 5 №li, Qışlaq məktəbi 6 №li «rus-tatar» məktəbi*** adlandırılır. 1913-cü ildə ***1 №li məktəbin müdiri Əhməd Nəbiyev, 2№li məktəbin müdiri Mir Musa Ağamirov, 3№li məktəbin müdiri Ələkbər Qədirov, 4 №li məktəbin müdiri (məlum deyil), 5 №li məktəbin müdiri Məmmədəli Xəlfəzadə, 6 №li məktəbin müdiri Əhmədağa Qazıyev, 7 №li qız məktəbinin müdirəsi Maral xanım Nəbiyeva*** olurlar.[290]

Bu məktəbi bitirən oğlanlar şəhər məktəbinə daxil olurdular. Şəhər məktəbində təhsil müddəti 4 il, təhsil haqqı 12 manat idi. Məktəbin məzunları müəllimliyə və şəhərdə yerləşən idarələrə – xəzinəyə (banka), poçta, ictimai binalara, şəhər bələdiyyə idarəsinə, qəza milis idarəsinə, xalq məhkəməsinə, meşə idarəsinə və s. idarələrə mirzə, yazıçı və başqa vəzifələrə daxil olurdular. Qulluğa daxil ola bilməyənlər ataları ilə ticarətlə məşğul olurdular. Varlılar övladlarını Gəncə, Bakı, Tbilisi və Qori şəhərlərinə gimnaziyalara, realnı məktəblərə və seminariyalara təhsil üçün göndərirdilər.

Nuxada maarif ocaqlarının sayı artdıqca tam orta məktəbə (gimnaziyaya) ehtiyac yaranır. Abdulla bəy və Molla Fərəc gimnaziya (tam orta məktəb) açılmasına çalışırlar.

Bu zaman bütün Azərbaycanda yalnız Bakı ilə Gəncədə gimnaziya, Şuşada realnı məktəb və Lənkəranda 4 sinifli gimnaziya var idi. Bunun səbəblərindən biri də, çar hökumətinin millətlərin tərəqqisinə digərlərindən az diqqət yetirməsi, xüsusən azərbaycanlıların təşəbbüsü və təkliflərinə biganə qalması olmuşdur. Məsələn, Gürcüstanda 11.000 əhalisi olan Qori şəhərində gimnaziyalar, qızlar üçün progimnaziya, ruhani və pedaqoji seminariyalar olduğu halda, 54.000 nəfərdən artıq əhalisi olan böyük ticarət və sənaye şəhəri Nuxada tam orta məktəb (gimnaziya) yox idi.



***Nuxa «Vətən» məktəbinin təntənəli açılışı.***
***Hazırkı yuxarı karvansaray. 1908-ci il*** [291]

Elə bu səbəbdən də,1912-ci ildən başlayaraq Abdulla bəy ilə axund Molla Fərəc Nuxada gimnaziya açılması üçün Qafqaz tədris dairə müdiri (Попечител Кафказский учебного округа) Rudolfa və Zaqafqaziya Canişini (sədri) Vorontsov Daşkova dəfələrlə müraciət edirlər. Onlar məsələnin həllinə etiraz etməsələr də, əməli işlər də həyata keçirmirlər. Nəhayət, uzun sürən müzakirələrdən sonra, Nuxa əhalisi gimnaziya binasını göstərilən plan üzrə tikib hökumətin ixtiyarına verəcəyi halda, Rudolf gimnaziyanın açılmasına razı olur. Nuxa əhalisi əlacsız qalaraq bu ağır təklifə razı olur və binanın tikilməsinə qərar verilir. Abdulla bəy və axund Mola Fərəc bununla kifayətlənməyərək gimnaziya binası tikilib qurtarınca əhalinin xərcinə qeyri rəsmi (özəl) gimnaziya açmağa icazə alırlar.

Bundan sonra Hacı Məmməd Sadıq Əliyevin təzə binasında ***1914-cü il sentyabrın 1-də gimnaziyanın rəsmi açılşı olur.*** Açılışa şəhərin hər tərəfindən – Nuxa qəzasının Vartaşen (indiki Oğuz), Nic, Qutqaşen (indiki Qəbələ), Basqal və Zaqataladan tələbələr qəbul olunurlar. Tələbələrin milli tərkibi müxtəlif idi. Məktəbdə azərbaycanlı,…udin, ləzgi uşaqları təhsil alırdılar.[292]



***Gimnaziya binası. 1914-cü il***
***(Hazırkı qarışıq tipli internat məktəbin tədris korpusu)***

Nuxa klassik gimnaziyasının müdiri **Aleksandr Konstantinoviç Verşov,** şəriət müəllimləri *şəriət mollası* **Səlim əfəndi Əfəndiyev** və **qazı Seyid Salam idi.**

**Gimnaziya müdiri** A.K.Verşov az sonra istefa verdiyindən, onun yerinə **Məmməd bəy Əfəndiyev** müdir təyin olunmuşdur. Bu gimnaziya 1920-ci ilə kimi fəaliyyət göstərmişdir. Azərbaycan sovetləşəndə hökumət hesabına keçir. Məmməd bəy Əfəndiyev 1921-ci ildə Bakıda açılan Ali Pedaqoji İnstituta riyaziyyat müəllimi dəvət olunur.

Gimnaziya üçün bina tikintisinin başlanmaması yerli ziyalıları narahat edir. Maarifpərvər ziyalı Hacı Məmməd Sadıq Əliyev təşəbbüs edərək 1915-ci ilin iyul ayında evinə 50-ə qədər qonaq dəvət edir. Dəvət olunan qonaqların arasında **Rudolf və ona yaxın məmurlar,** ***Gəncə qubernatoru Poyarov, Gəncə quberniya maarif şöbəsi müdiri S. Petrunin, Nuxa qəza rəsi A.İ. Klimentov, müavini Cahangir bəy Şıxlinski,*** **gimnaziyanın açılmasının təşbbüskarları axund** ***Molla Fərəc, Abdulla bəy Əfəndiyev, məhkəmə sədri Mürsəl bəy Şahmaliyev, məhkəmə icraçısı Hacı Məmməd Kərim bəy Əfəndiyev, vergi müfəttişinin müavini Ələsgər bəy Axundov, şəhər idarə rəisi Məmməd bəy Fərzəlibəyov, sabiq şəhər idarə rəisi Əhməd bəy Əfəndiyev, qazı Hüseyn əfəndi Əfəndiyev, Şirəli bəy Əmircanov,***

***Rəşid bəy Əfəndiyev, Məşədi Mehdi Qulu Zülfüqarov, Hacı Hüseyn bəy Hüseynbəyov, Məşədi Əsədulla Qafarov, Məşədi Yusif Hüseynov, Məşədi Əli Hüseyn (baba), Məşədi Xəlil Dadanov, usta Bağır Qasımov, Nurməmməd əfəndi*** **və başqaları var idilər.**



**Şəkildə:** *Seminariya tələbələri*: ***Rəcəb Əfəndiyev, Ələkbər Qədirov, Musa Muradov, Mabud Sərkərov, Ələfəsər Hacıyev (qara Ələşrəf)***
*Gimnazistlər:* ***Mustafa Quliyev, Mabud Nəbiyev, Əmin Əfəndiyev, Abbas Yusifov, Kərim Qasımağayev, Mehdi İsmayılov, Mustafa İsmayılov, Əmircan bəy Mürsəl bəy oğlu, Məmməd Hacı ağa Məhərrəm oğlu Hüseynov, Bəhram Əlicanbəyov, Rəsul Hacıyev, İsmayıl və Abbas Əliyarovlar, Mustafa Hüseynbəyov, Qafur Əfəndiyev, Əkbər ağa Musa oğlu, Soltan bəy Əmircanov, İsfəndiyar bəy Əmircanov, Maqsud bəy Müttəlibbəyov, Əli Əhmədov, Kosti Makedonski, Məmməd Əmin Əfəndiyev (Şəkinski)***
*Müəllimlər:* ***Rəşid bəy və Abdulla bəy Əfəndiyevlər, Mirzə Əbdül Kərim bəy İsmayılov, Mir Rövşən Əfəndiyev, Yusuf Əfəndiyev, Əbdül Mabud Əfəndiyev, Ələkbər Mahmudov (Mir Musa Ağamirov), Əhmədağa Qaziyev (Yusif Kənan), Hacı bəy Əmircanov, Əhməd Nəbiyev***[293]

Qonaqlar qalanın altında özülqoyma mərasimində iştirak edirlər. Özül qoyulma mərasimində binanın özülqoyma tarixi, iştirak edənlərin siyahısı yazılmış sənəd bir butulkanın içərisinə qoyulub bünövrəyə atılır. Mərasimdən sonra Rudolf öz dəstəsilə gimnaziyanı və keçmiş «üsul- sövtiyyə» məktəbini

ziyarət edir, ziyafətdən sonra Zaqatalaya gedərkən yol üstündə Qoxmuq kənd məktəbinə baş çəkir, ***məktəbin müdiri Şükür Həşimovun*** işindən razı qalır.

1914-1915-ci tədris ilində Azərbaycanda 21 ali ibtidai məktəb fəaliyyət götərmişdir. Bu məktəblərdə təhsil müddəti 4 il idi. Bu məktəblərə 3-4 illik ibtidai məktəbi bitirənlər daxil ola bilərdi. Onlardan biri də ***Nuxa ali ibtidai məktəbi*** idi ki, orada 102 şagird təhsil alırdı.[294]

***1915-ci ildə Nuxada «Заведение Святой Ниньı» adında tam orta məktəb açılır.*** Bu məktəb Hacı Əbdürrəhim ağanın Bazarbaşında ərdəki qızı Fatma xanıma tikdirdiyi evdə yerləşirdi. Məktəbin hazırlıq şöbəsi var idi. Bu məktəbə 50 nəfərə qədər şagird qız toplanmışdı. Məktəbin müdiri Dariya Tixonovna Mişşenko, şəriət müəllimləri provoslav keşişi David Utiyev və Maral xanım Nəbiyeva, müəllimlər Zinaida Andreyevna Ryabçenko, Yelizaveta İvanovna Kolpaxçeva, Rinsima Aleksandrovna Nasibova, Anna Abramovna [295] idilər.

1917-ci il çevrilişindən sonra müdir T. Mişşenko vəzifəsindən azad olunduğundan onun yerinə Hüseyn əfəndi Əfəndiyev təyin olunur. Müəllimlər Yelizaveta İvanovna Kolpaxçeva və Anna Abramovna Matinyans çıxıb getdi yindən Dilara xanım Əmircanova, Xanım Əmircanova (sonralar Mahmudova) və Humay xanım Əmircanova müəllim təyin olunurlar. 1918-ci ildə Mahtaban xanım Əfəndiyeva Rinsima Aleksandrovna Nasibovanın yerinə təyin edilir. Bu məktəb fəaliyyətini 1920-ci ildə dayandırır.[296]

Lakin gimnaziya binası tikintisi nəzərdə tutulan vaxtda başa çatmır. Birinci dünya müharibəsinin başlaması ilə əlaqədar binanın tikintisi ləngiyir və 1917-ci il çevrilişindən sonra tamamilə dayanır, özülə qoyulmuş daşlar çıxarılıb yerinə ağaclar əkilir və əvvəlki vəziyyətinə gətirilir.

1917-ci ilin martında Abdulla Abdurrahmanov və müəllim Veysəl Mustafayevin təşəbbüsü ilə Nuxada «Hürriyyət maarif cəmiyyəti» təşkil olunur. Birinci il ərzində ianədən və teatr tamaşalarından 11.600 manat pul toplanır. Cəmiyyət bu vəsaitlə şəhərdə və Nuxa qəzasında məktəblərə müəllimlər hazırlamaq üçün yay mövsümü kursu açır. Kursa Rəşid bəy Əfəndiyev, Abdulla bəy Əfəndiyev, Rəcəb Əfəndiyev, Məmmədəli Xəlfəzadə, Veysəl Mustafayev, Haşım əfəndi Məmmədzadə müəllim kimi dəvət olunurlar. İyunun əvvəlində açılan kursa şəhərdən, o cümlədən qəzanın hər yerindən, hətta Şamaxı və Karyagin (indiki Füzuli) kimi uzaq yerlərdən 50-ə qədər tələbə gəlir. Bu tələbələrin içərisində 3 nəfər özbək də var di. Təcrübə dərsi aparmaq üçün ibtidai nümunə sinfi təşkil olunmuşdur. Üç ay davam edən kusun sonunda imtahandan müvəffəq olan 35 tələbəyə ibtidai məktəblərdə müəllimlik şəhadətnaməsi verilmişdir.

Cəmiyyət kəndlərdə də məktəblərin açılmasına vəsait sərf etmiş, əhalinin köməyi ilə 25-ə qədər məktəb açmışdı.[297]

1917-ci ilin aprel ayının 1-də Nuxanın bir qrup ziyalısı «Nuxa şəhərində və qəzasında sakin türk millətdaşlarının arasında elm və maarif nəşr etmək və mədəniyyət aləminə sövq etmək» məqsədilə **«Nuxa Hürriyyəti-Maarif Cəmiyyəti»** ni təsis etmək haqqında qərar qəbul edirlər.[298] Cəmiyyətin **sədri**

*Nurməhəmməd əfəndi İmamzadə*, **sədr muavini və xəzinədar** *Abdulla Abdulrəhmanzadə,* **katibliyinə** *Veysəl Mustafazadə*, *Rəşid Əfəndizadə, Zahid İbrahimxəlilzadə, Mirhəsən Ağaməhəmmədzadə, Rəcəb Əfəndizadə, təftiş komissiyasına Əbdülkərim İmamzadə, Həsən Əbdülrəhmanzadə, Cəfərqulu Bəşir oğlu, Ələkbər Hacı Məhəmməd oğlu, Vahab Sadıqzadə* **seçilmişlər**.[299]

Cəmiyyətin 18 nəfər fəxri üzvü, 76 nəfər həqiqi üzvü olmuşdur.[300] «Nuxa Hürriyyəti-Maarif Cəmiyyəti» nin məramnaməsində aşağıdakı məsələlər yer almışdır:

1. a) «Cəmiyyət» in hal-hazırda Nuxa şəhərində və qəzasında mövcud məktəb və mədərəsələrə maddi və mənəvi kömək etməsi;

b) Təzə məktəb və mədrəsə açanları təqib və təsvir edir və onlara müavinətdə bulunması;

c) Cəmiyyət lazım bildiyi məhəllədə və məkanda öz xərcinə ibtidai milli məktəblər açması;

ç) Rüşdi edadı və darülfünunlarda oxuyan və oxumaq istəyən türk tələbələrinə maddi və mənəvi yardım etməsi;

d) Nuxa şəhəri və qəzasında olan fəqir və yetim müsəlman balalarını Cəmiyyətin öz himayəsinə alması və onların ibtidai təlim və tərbiyəsi haqqında lazımi tədbirlər görməsi;

2. Məktəb sinfinə qədər olan 5-7 yaşlı uşaqları tərbiyə üçün Cəmiyyətin uşaq bağçaları (darüttərbiyyələr) təsis etməsi;

3. Camaat üçün qiraəti-ümumi məclisi və ümumi milli qiraətxana və kitabxana açması;

4. Camaat üçün gecə kursları, cümə məktəbləri və xalq darülfununları açması;

5. Mütaliə üçün və məktəblərdə tədris olunmaq üçün hər qisim ədəbi, elmi, fənnlər üzrə və tarixi kitablar təbliğ və nəşr etməsi və qüvveyi-maliyyəsi artdıqca türk dilində qəzetə və məcmuə nəşr etməsi;

6.Millətimizin ədib və şairlərinin əsərlərini toplamaq üçün ədəbiyyat məcmuələri nəşr etməsi;

7.Məktəb və mədrəsələrdən ötrü müqtədir müəllim və müəllimələr tapmaq üçün lazım gələn yerlərə müraciət etməsi;

8.Milli ibtidai məktəblərə müəllim və müəllimələr hazılamaq üçün Qafqazda, Türkiyədə və sair məmləkətlərdə olan darülmüəlliminlərə təhsil almağa istedalı müəllim və müəllimələr göndərməsi;

9.Müəllim və müəllimələr üçün təlim və tərbiyəyə dair məclislər, müəllimlər şurası və müəllimlər qurultayı düzəldir;

10.Hər zaman teatr, ədəbi müsamirələr, elmi və fənni söhbət məclisləri, …və s. kimi məclislər təşkil etməsi;

11.Milli musiqini və mahnılarımızı ehya etmək üçün Cəmiyyət lazım bildiyi məktəblərə musiqişünas müəllimlər və müğənnilər dəvət edir və yainki musiqi kursları təşkil etməsi;

12.Cəmiyyətin milli idman meydançaları təsis etməsi;

13.Millətimizin tarixi və milli asari-ətiqələrini toplamaq üçün meyxana təşkil etməsi;

14.

15.[301]

Cəmiyyət 6 nəfər tələbənin təhsil aldığı ibtidai məktəbələr üçün müəllimlər hazırlayan kurslar açmışdı. Kursda yalnız Nuxa qəzasından deyil, Şamaxı, Cəbrayıl kimi uzaq bölgələrdən gələn tələbələr də təhsil almışdılar.[302]

Qısa müddət ərzində «Nuxa Hüriyyəti-Maarif Cəmiyyəti» tərəfindən qəzada 25 məktəb, təhsildən kənarda qalan 200 nəfər üçün «Vətən məktəbi» açıldı. İmkansız ailələrdən olan uşaqların pulsuz paltar və dərs ləvazimatı ilə təchiz edilməsi, müəllimlərin əmək haqqının ödənilməsi, Nuxa qəzasında açılan qiraətxanalar, konsert və teatr truppalarının fəaliyyəti bu «Cəmiyyət» in adı ilə bağlıdır.

«Cəmiyyət» maliyyə problemlərini yerli sahibkarlar, ziyalılar və sənətkarlar vasitəsi ilə həll edirdi. Tacir Cəfər Əbdürəhmanzadə 300 manat, Mustafa bəy Əlibəyov 200 manat, Hacı Məmməd Sadıq Əliyevin vəfatı ilə əlaqədar ehsan olaraq 200 manat, Süleyman Məmmədzadə 100 manat, Həmid Qasımov 100 manat yardım göstərmişdilər. Ümumilikdə cəmiyyətə 300 nəfərə yaxın adam yardım göstərmiş, toplanmış vəsait 1.000 manata qədər olmuşdur.[303]

«Cəmiyyət» in 1918-1919-cu illərdə topladığı 11 min manatdan artıq vəsait hesabına qəzalarda yeni məktəblər, bu məktəblərdə dərs demək üçün müəl limlər hazırlayan savad kursları, şəhərin yuxarı baş hissəsində qız məktəbləri açılmışdı. «Cəmiyyət» in işində şəhər məktəblərinin keçmiş müəllimləri iştirak edirdilər.

«Cəmiyyət» in fəaliyyətinə sonralar Əbdülrəşid Əfəndizadə, Əskərağa Məmmədzadə, Mirhəsən Axundzadə, Rəcəb Əfəndizadə, Ələkbər Mahmudov, həmçinin fabrikantlar Hacıqədir Hacı Əhməd oğlu, Hidayət Hacı Əfəndi oğlu, Yusif Xəlilzadə, Musa Mərdanov fəal iştirak etmişdilər.

1917-ci il Qafqaz təqviminə görə Nuxa qəzasının ərazisi 3685 kv. verst (4.201 kv. km.) idi. Qəzanın əhalisi 133.505 nəfər olmuşdur. Əhalinin 73.819 nəfəri (55,3 %) kişi, 59.686 nəfəri (44,7 %) qadın, 131.132 nəfəri yerli sakin, 2373 nəfəri müvəqqəti yaşayanlar idi. Azərbaycanlılar 93.557 nəfər və ya 70, 1 % təşkil edirdi. Nuxanın şəhər əhalisi 52.243 nəfər olmuşdur.[304]

## 2.5. Azərbaycan Xalq Cümhuriyyətinin təhsil quruculuğu sahəsində tədbirləri və Nuxada maarifin inkişafı

Azərbaycan Xalq Cümhuriyyəti hökuməti ilk gündən xalq maarifinin, elm və mədəniyyətin inkişafına xmüstəsna əhəmiyyət verməyə başladı. Gəncədə formalaşan ikinci hökumət kabinetinin Azərbaycan xalqına ünvanlanmış 1918-ci il 17 iyun müraciətində xalq maarifi, təhsil müəssisələrinin milliləşdirilməsi, maarif ocaqlarında tədrisin ana dilində aparılması, anadilli məktəblər şəbəkəsinin

genişləndirilməsi,…təhsildə milliləşdirmə prosesinin tədricən həyata keçirilməsi bildirildi.[305]

Azərbaycan Xalq Cümhuriyyəti hökumətinin ilk tədbirlərindən biri Zaqafqaziya (Qori) Müəllimlər Seminariyasının Azərbaycan (tatar) şöbəsinin Azərbaycana köçürülməsi haqqında 22 iyun 1918-ci il tarixli qərarı oldu.[306]

Azərbaycan Xalq Cümhuriyyəti hökuməti fəaliyyətinin Gəncə dövründə (17.06.1918-17.09.1918) təhsil müəssisələrinin milliləşdirilməsi, türk dilinin (Azərbaycan dilinin) dövlət dili elan edilməsi haqqında 27 iyun 1918-ci ildə qərar qəbul etdi. Həmin qərarla Azərbaycan türkcəsi Azərbaycan Xalq Cümhuriyyətinin dövlət dili elan edildi, bütün dövlət orqanları, məhkəmə, təhsil müəssisələri və digər inzibati orqanlarda dövlət dilində danışmağı və yazmağı bilən milli kadrlar çatışmadığından müstəsna hal kimi, milli mütəxəssislər yetişənədək rəsmi yazışmalarda rus dilindən istifadə edilməsinə icazə verildi.[307] Bu sahədəki çatışmazlığın aradan qaldırılmasında «İbtidai, ali ibtidai və ümumi orta təhsil müəssisələrinin milliləşdirilməsi» haqqında 28 avqust 1918-ci il tarixli qərar mühüm rol oynadı.[308] Sonralar təhsil müəssisələrinin milliləşdirilməsi sahəsində baş verən dəyişikliklər nəticəsində Azərbaycan türkcəsi dövlət dili statusu qazandı, anadilli məktəblər şəbəkəsi yarandı, anadilli proqram və dərsliklər hazırlandı, Azərbaycan dilində təhsil xalqın milli mənlik, milli özünüdərk şüurunun formalaşmasına təkan verdi.[309]

ADR hökumətinin xalq maarifi sahəsində ilk ciddi tədbirlərindən biri Bakıda Universitetin açılması oldu. 1919-cu ilin mart ayının sonunda o zaman Tiflisdə fəaliyyət göstərən Zaqafqaziya Universitetinin səmərəli işləməməsini nəzərə alan Universitet Elmi Şurası rektor V.İ.Razumovskinin təklifini nəzər alaraq Universitetin Bakıya köçürülməsi haqqında qərar verdı. 1919-cu ilin yazında bu məqsədlə Bakıya gələn Zaqafqaziya Universitetinin komissiya üzvləri-professorlar N.A.Dubrovinski, L.A.İşkov və İ.S.Sitoviçin Azərbaycan hökuməti və müxtəlif içtimai-siyasi dairələrin nümayəndələri ilə apardıqları danışıqlarda Azərbaycan tərəfinin Bakıda Universitet açılması arzusunda olduğu aydınlaşdı. 1919-cu ilin aprelində Tiflisə gələn ADR hökuməti Xalq Maarif nazirinin müavini Həmid Şaxtaxtinski ADR hökuməti adından Bakıda Universitetin təşkili məsələsini Tiflis Universiteti rəhbərliyinin öz üzərinə götürməsini xahiş etdi.[310] Bu məqsədlə yaradılan komissiyanın tərkibinə prof. V.İ. Razumovski (sədr), A.M.Levin, İ.S. Sitoviç, N.A. Dubrovinski, L.A. İşkov, habelə ADR Xalq Maarif Nazirliyinin nümayəndələri V.A.İrzayev, M.A. Şaxtaxtinski, Bakı şəhər bələdiyyə idarəsindən A.X. Orucəliyev, Bakı neft sənayeçiləri qurultayı təşkilatından A.N.Saparov, məşvərətçi səslə o zaman Bakıda yaşayan və işləyən alimlər-Məlikbəy Sultanov, Y.A.Gindes, L.Q. Qurviç, A.N.Derjavin, İ.K.Qolberq daxil edildilər. Təşkilat komitəsinin səmərəli işi nəticəsində Bakıda Universitetin təşkili haqqında Qanun layihəsi, Universitetin Nizamnaməsi və 1919-1920-ci dərs ili üçün universitet sistemi və orada işləyəcək professor-müəllim heyətinin tərkibi müəyyən edildi. [311]



1919-cu il mayın 27-də ADR Nazirlər Şurasının sədri Nəsib bəy Yusifbəyli Zaqafqaziya Universiteti nümayəndələrini və Bakı Universiteti təşkilat komitəsinin üzvlərini qəbul edib Universitetin təşkili vəziyyəti ilə tanış oldu.[312] 1919-cu il iyun ayının sonunda Nazirlər Şurası Universitetin açılması üçün qızıl pulla 5 milyon manat vəsait ayırdı və bu qərarı ADR Xalq Maarif naziri **Rəşid xan Qaplanov** komissiyanın nəzərinə çatdırdı.[313]

**Tanıtma**:

**Rəşid xan Zavid oğlu Qaplanov** ***(1883-1937) Dağıstanın Xasavyurd qəzasının Ağsaray kəndində anadan olmuşdur. Milliyyətcə qumuqdur. Vladiqafqazda realnı məktəbi, 1910-cu ildə Parisdə Sarbonna Universitetinin hüquq fakültəsini bitirmişdir. 1913-cü ildə İstanbul Universitetində dərs demişdir. Həmin ildə Vladiqafqaza qayıtmış, şəhər dairə məhkəməsində andlı müvəkkil müavini vəzifəsində çalışmışdır.***

***R.Qaplanov 1919-cu ilin əvvəllərində Bakıya köçmüş, Azərbaycan Xalq Cümhuriy yətinin IV hökumət kabinetində maarif və dini etiqad naziri, V hökumət kabinetində maliyyə naziri təyin olunmuşdur. 1920-ci ilin iyununda Bakıda həbs olunmuş, əvvəcə Vladiqafqaza, sonra Moskvaya göndərilmişdir. Moskvada Şərq Xalqları Universitetində «Osmanlı imperiyasının tarixi» ndən dərs demiş, həm də vəkil kimi sərbəst fəaliyyət göstərmişdir. Repressiyaya məruz qalmışdır***.

*Bakı Dövlət Universitetinin açılmasında **M.Ə.Rəsulzadənin** böyük xidmətləri olmuşdur.*

Bakı Universitetinin açılması haqqında Qanun layihəsi Parlamentdə ciddi müzakirə edilmişdir. M.Ə.Rəsulzadənin başçılıq etdiyi «Müsavat» partiyasını parlamentdə təmsil edən deputatlar universitetin açılması lehinə səs vermiş,[314] sosialistlər partiyasını təmsil edən deputatlar Ə.H. Qarayev və S.A. Ağamalıoğlu «Müsavat»ın mövqeyini müdafiə etmiş, «Slavyan-rus cəmiyyəti» və «Daşnaksütyun» partiyaları Qanun layihəsinin əleyhinə olmuşdur.[315] 1919-cu ilin sentyabr ayının 1-də parlament universitetin təsisi haqqında Qanunu qəbul etmişdir. Həmin gün parlament eyni zamanda 100 nəfər azərbaycanlı gəncin Avropa və Türkiyənin ali məktəblərində təhsil almağa göndərilməsi haqqında qərar qəbul etmişdir.[316]

Bakıda ingilis hərbi komandanlığı rəhbərliyi ilə aparılan uzun müddətli danışıqlardan sonra Britaniya hərbi hospitalının yerləşdiyi kommersiya məktəbinin binası (keçmiş Nikolayev küçəsi - indiki İstiqlaliyyət küçəsi 6 saylı bina – Azərbaycan Dövlət İqtisad Universitetinin binası) və birinci Bakı Gimnaziyasının binası Universitet üçün ayrıldı[317].

Universitetin təşkili və qərarlaşmasına ADR hökuməti ilə yanaşı milli burjuaziyanın qabaqcıl maarifçi nümayəndələri, neft sənayesi sahibləri də köməklik göstərdilər. Görkəmli maarifçi və mesenat, neft sahibkarı, *Birinci Gildiya ticarətçisi (1882), Həqiqi Dövlət Müşaviri (1907), Rusiyanın 2-ci və 3-cü dərəcəli «Müqəddəs Stanislav» ordeni, 1-ci, 2-ci, 3-cü dərəcəli «Şir» və «Günəş» Fars Ordeni və 2-ci dərəcəli «Buxara Qızıl Ulduzu» ordenləri ilə təltif olunmuş* [318] ***H.Z.Tağıyevin*** *maarifin və təhsilimizin inkişafındakı xidmətlərini saymaqla qurtarmaq olmaz. O, Bakıda, Gəncədə, Şamaxıda, Naxçıvanda, habelə Azərbaycandan kənarda-Tiflisdə, Dərbənddə, Vladiqafqazda və digər şəhərlərdə təhsil müəssisələrinin təsis edilməsinə maddi yardım göstərmişdir. Bakıdakı orta texniki və kommersiya məktəblərinin, Marinski qadın gimnaziyalarının fəxri hamisi, Tiflisdəki müsəlman məktəbinin fəxri nəzarətçisi vəzifələrini daşıyan* H.Z. Tağıyev universitetə xeyli maliyyə yardımı etmişdir. 1919-cü ilin sentyabrın 15-də keçirilən seçkilərdə prof. V.İ.Razumovski Bakı Universitetinin rektoru, prof. N.A. Dubrovinski tarix-filologiya fakültəsinin, prof. İ.İ.Şirokoqorov isə tibb fakültəsinin dekanı vəzifələrinə seçildilər. 1919-cu ilin noyabrın ortalarında Universitet 602 nəfər tələbə ilə tədrisə başladı. Təhsil alanlar əsasən varlı balaları idi. Onların arasında 156 nəfər azərbaycanlı, o cümlədən 12 azərbaycanlı qız var idı. 1919-cu ilin payızında universitetə əlavə yeni qəbul başa çatdırıldı. Universitetin 877 nəfər tələbəsi, 217 azad dinləyici oldu.[319]





***Tarix-filologiya fakültəsinin ilk binası. 1919-cu il***
***(indiki Azərbaycan Dövlət Pedaqoji Universiteti)***



***Tibb fakültəsinin ilk binası. 1919-cu il***
***(indiki 4 saylı M.Əfəndiyev adına şəhər klinik xəstəxanası)***



***Cümhuriyyət tərəfindən ali təhsil almaq üçün xaricə göndərilən tələbələrdən bir qrup***

1919-cu ildə Bakı Politexnik və kommersiya məktəbləri, iki kişi və üç qız gimnaziyası istisna olmaqla, bütün orta məktəblər milliləşdirildi [320]. Artıq 1919/1920-ci tədris ilinin əvvəllərində Azərbaycanda 637 ibtidai və 23 orta ixtisas təhsili məktəbi fəaliyyət göstərirdi. İbtidai məktəblərdə 48.070, orta məktəblərdə isə 9.611 şagird təhsil alırdı.[321]

Orta məktəblər arasında **6 kişi, 6 qadın gimnaziyası, 5 realnı məktəb, 3 milli azlıqlar seminariyası, 3 müqəddəs Nina qız tədris müəssisəsi, politexnik məktəb və kommersiya məktəbi** var idi. 1919-cu ilin əvvəlində Bakı qadın müəllimlər seminariyası kişi müəllimlər seminariyasına çevrildi. 1919-cu ilin iyununda Lənkəran kişi və qadın gimnaziyaları Xalq Maarifi Nazirliyinin sərəncamına keçirildi. Həmin ilin avqustun 11-də XMN-nin qərarı ilə Bakı, Gəncə və **Nuxadakı** müqəddəs Nina qız tədris müəssisələrinin adları dəyişdirilərək Bakıdakı *birinci dərəcəli Azərbaycan qız gimnaziyası, Gəncə və **Nuxadakılar** qız gimnaziyaları* adlandırıldı. 1919-cu ildə XMN Göyçay şəhərində realnı məktəb, Bakıda qız, ***Nuxada kişi və qız***, Şuşada kişi məktəb və seminariyaları açmaq barədə Azərbaycan Parlamentinə qərar layihəsi təqdim etdi. Parlament respublikanın imkanlarını nəzərə alaraq, onlardan ancaq birini-1919-cu ildə Göyçayda realnı məktəb açmaq haqqında qanun layihəsini təsdiq etdi.[322]

1919-1920-ci tədris ilində Azərbaycanın orta məktəblərində (müəllim seminariyalarında oxuyanlar istisna olmaqla) 9.611 şagird təhsil alırdı ki, onların 3.115-i azərbaycanlı, 6.496 nəfəri isə başqa millətlərin nümayəndələri idi.[323]

Yaşlılar arasında savadsızlığın ləğvi məqsədilə tədbirlər həyata keçirildi. 1919-cu il sentyabrın 15-dən etibarən Bakı, Gəncə, Şuşa, **Nuxa,** Zaqatala və Qazaxda yaşlılar üçün Azərbaycan dilini öyrədən kurslar, bu kurslarla yanaşı ADR Parlamentinə Nuxadan üzv olan Abdulla bəy Əfəndiyevin rəhbərliyi ilə milli məktəblər üçün xüsusi müdərris kursları açıldı.[324]

Kitabxanaların təşkili diqqətdən kənarda qalmadı. 1920-ci il aprel çevrilişi ərəfəsində Azərbaycanda kitab fondu 95.000 nüsxə olan 11 kitabxana vardı.[325]

Yeni məktəblərin müəllim kadrlarına olan ehtiyacını ödəmək məqsədilə Bakı, Şamaxı, Salyan, Qusar, Şuşa Qazax və Gəncədə müəllim hazırlayan kurslar açıldı və bu kurslara 1000 nəfər cəlb edildi. Bakı, **Nuxa** və Gəncədə qızlar üçün, **Nuxa,** Şuşa və Şamaxıda kişilər üçün yeni seminariyalar yaradıldı.[326]

1919-cu ilin yayında **Nuxadakı 7 №li qız məktəbinin** binasında-ləzgi Həmzənin evində Abdulla bəy Əfəndiyevin təşəbbüsü ilə qızlardan müəllimələr hazırlamaq üçün iki aylıq kurs açıldı. *Kursun müəllimləri **Rəşid bəy Əfəndiyev, Ələkbər Mahmudov, Məmmədəli Xəlfəzadə, Əhməd Bayramov, Veysəl Mustafayev, Həşim əfəndi Məmmədov*** və qeyriləri olmuşlar.

Kursun müdavimləri içərisində ***Cəmilə və Siddiqə Əfəndiyevalar, Dilarə, Rübabə və Humay Əmircanovalar, Diləfruz və Humay Hacıyevalar, Rəxşəndə***

***Naibova, Ruqiyyə Nəbibəyova, Barat Məmmədova, Şəhrəbanu və Sitarə Əhmədovalar, Bilqeyis Lütü (həkim) qızı Həşimova*** da var idi.

## 2.6. Sovet təhsil sisteminin yaradılması. Nuxa təhsil müəssisələri 1920-1940-cı illərdə

Azərbaycan Xalq Cümhuriyyəti 1920-ci il aprelin 28-də süqut etdi. Bolşeviklər hakimiyyəti ələ keçirdikdən sonra ayrı-ayrı sahələrdə olduğu kimi, təhsil sahəsində də dəyişikliklər edildi. Sovet hakimiyyətinin ilk günlərindən ümumi təhsilə keçirilməsi qarşıya qoyuldu. 1920-ci il mayın 12-də köhnə tipli məktəblərin dəyişdirilməsi haqqında hökumətin dekreti qəbul edildi. Dekretə görə, köhnə məktəb tipi politexnik məktəblə əvəz edilirdi. Yeni məktəb iki dərəcədən: təhsil müddəti **beş il olan bir dərəcəli** və təhsil müddəti **4 il olan iki dərəcəli** məktəblər yaradılırdı… Azərbaycanın bütün məktəb lərində …hər cür təhsil haqqı ləğv edilirdi.[327]

Azərbaycan SSR Xalq Maarif Komissarlığının kollegiyası həmin dekretə uyğun olaraq 1920-ci il mayın 17-də «Azərbaycan Sovet Sosialist Respublikasının vahid zəhmət məktəbi haqqında Əsasnamə» ni, I və II dərəcəli məktəblər üçün tədris planı və proqramları təsdiq etdi, Azərbaycan dilində dərsliklərin tərtibi üçün komissiya yaradıldı.

1920-1921-ci dərs ilində ümumilikdə respublikada 294 yeni məktəb açıldı. Aparılmış işlərin nəticəsi olaraq Azərbaycanda təhsil müddəti 5 il olan I dərəcəli məktəb, təhsil müddəti 4 il olan II dərəcəli məktəb, yeddiillik, doqquzillik məktəblər, I dərəcəli məktəbdən sonra ikiillik kəndli gənclər məktəbi, təhsil müddəti iki il olan sənət texniki məktəbi, Fabrik-zavod şagirdliyi (FZŞ) məktəbləri və I dərəcəli məktəblərin əsasında dördillik texnikumlar yaradıldı. Bu əslində Azərbaycanın yeni məktəb sisteminin əsasını təşkil edirdi.

1920-ci ildə Azərbaycanda sovet hakimiyyəti qurulduqdan sonra **Nuxada iki seminariya – bir qız, bir oğlan və bir ibtidai nümunə məktəbi açıldı**. Məktəbin hər biri ayrı-ayrı binalarda – **qız seminariyası Məşədi Mehdi Qulu Zülfüqarovun evində, oğlan seminariyası Hacı Məmməd Sadıq Əliyevin evində yerləşmişdi**. Bu iki seminariyaya Nuxa şəhərindən və qəzasından, Qutqaşen (indiki Qəbələ), Göyçay, Ağdaş, Xaldan, Qax və Zaqataladan oğlan və qızlar qəbul olunmuşdular. Şagirdlər iki seminariyanın binalarındakı yaşayış otaqlarında yerləşmişdilər. Geyim və yataq ləvazimatları dövlət tərəfindən verilirdi. Hər bir seminariyanın ayrıca aşbazı və mətbəxi vardı.

Seminariyalar həm yerli, həm də Bakıdan göndərilən müəllimlər hesabına təmin olunmuşdular. Qız seminariyasının müdirəsi *Mahtaban xanım Əfəndiyevə (sonra Rüstəmova)* idi. *Rəşid bəy Əfəndiyev, Məmmədəli Xəlfəzadə, Əhməd əfəndi Bayramov, Əhməd Nəbiyev* seminariyada dərs verirdilər.

Kargüzar Baba Qabulov təyin edilmişdir. Mahtaban xanım bir ildən sonra tibb institutuna qəbul olunmaq üçün Bakıya getdiyindən onun yerinə Rəşid bəy Əfəndiyev müdir təyin edildi. Lakin xəstəlik səbəbli Mahtaban xanım təhsilini davam etdirə bilmədi, yenidən Nuxaya qayıdıb məktəbə müəllim təyin olundu.[328] *Məmmədəli Xəlfəzadə, Mabud əfəndi Əfəndiyev, Əbdürrəhim Əfəndiyev, Baba Qabulov, Ələşrəf Hacıyev məktəbdə müəllim işləmişlər.*




***Qız seminariyasının müəllimləri*:**

**1.***Müdir:* ***Yusif Əfəndiyev,*** 2.Müdir müavini: ***Xəbirə xanım Zeynalova,*** 3.Əvvəlki müdir: ***Rəşid bəy Əfəndiyev***, 4.Seminariyanın əsasını qoyan müdirə ***Mahtaban xanım Rüstəmova, 5.Südabə xanım Əiyeva, 6.Məktəb mürəbbiyəsi Fatma xanım Əfəndiyeva, 7.Məmməd Mədətov, 8.Əhməd Bayramov, 9.Əhməd Nəbiyev, 10.K.Feodorov, 11. Müqəddənisa Qiyasbəyova***[329]

Bir ildən sonra Rəcəb Əfəndiyev seminariyaya müdir təyin olundu. Məktəbin 2 ehtiyat və bir əsas sinfi var idi. Nuxa qadın gimnaziyasının şəxsi tərkibi aşağıdakı kimi olmuşdur: ***1. Əfəndiyeva Mahtaban xanım, 2. Əfəndiyev Rəşid bəy, 3. Əmircanova Xanım, 4. Nəbiyeva Məryəm, 5.Məmmədova Xədicə, 6. Mütəllibova Əftab, 7. Bayramova Firuzə, 8. Felzar A.R., 9. Şəkixanova Anası, 10.Yusifova Züleyxa, 11. Əfəndiyev İbrahim (həm də kişi gimnaziyasında işləyirdi), 12. Əfəndiyev Məmməd (həm də kişi gimnaziyasında işləyirdi), 13. Saffət xanım, 14. Loqinova K.l., 15. Həsənov Əbülqasım, 16. Qədimov Əli Abbas***[330]

1920-ci ildə Nuxada pedaqoji məktəb, 1923-cü ildə sənaye və tibb texnikumları açıldı.[331]

1920-ci ilin oktyabrında Azərbaycan SSR XMK Kollegiyasının qərarına uyğun olaraq bir sıra şəhərlərlə yanaşı **Nuxada** kişi pedaqoji kursları təşkil edildi. Ümumilikdə, 1920-1923-cü illərdə 2365 müəllim qısamüddətli kurslarda təkmilləşmişdi. Onların 179 nəfəri qadın idi.[332]

1921-ci ildə hər iki seminariyaya tədris komitəsi tərəfindən xalça-palas, qab-qacaq, pianino verildi. Bakıdan qızlar və oğlanlar üçün paltoluq ipək və mahud parçalar göndərildi. **Müəllimlərdən** *Dilara xanım Əmircanova, Xanım Mahmudova və Məmmədəli Xəlfəzadə* xaric olunduqlarından Bakıdan onların yerinə Məmməd Mədətov, Südabə xanım Əliyeva, Müqəddənisə xanım Qiyasbəyova müəllim təyin edildilər. Yusif Əfəndiyevn yoldaşı *Fatma xanım tərbiyəçi, Kəbirə xanım Zeynalova müdir müavini, Mariya Orlova tikiş dərsi müəlliməsi* vəzifəsinə qəbul olundular.




***Seminariya müdavimləri may bayramı şənliyində.***
***Ortada Rəşid bəy Əfəndiyev***

1920-ci ildə oğlan seminariyasına hələlik müdir təyin olunmadığından Mahtaban xanım hər iki seminariyanı idarə edir. Hər iki məktəbin katibi Baba Qabulov idi. Tələbələr bir müddət gimnaziyanın binasında məşğul olmuş, bir ildən sonra Hacı Məmməd Sadıq Əliyevin yuxarıdakı evinə köçmüşdür. Bir ildən sonra Rəcəb Əfəndiyev seminariyaya müdir təyin olunmuşdur. Məktəbin 2 ehtiyat və bir əsas sinifi var idi. *Məmmədəli Xəlfəzadə, Mabud əfəndi Əfəndiyev, Əbdürrəhim Əfəndiyev, Baba Qabulov, Ələşrəf Hacıyev məktəbin müəllimləri*

*idilər.* 1922-ci ildə *Mahmud Nəbiyev, Abdulla Əfəndiyev və Abdulla bəy Paşabəyov iş yerlərini dəyişirlər.* 1923-cü ildə *Baba Qabulov xaric olunduğundan onun yerinə Nəsir bəy Nəcəfqulubəyov* məktəbə müəllim təyin olunur.




***Oğlan seminariyasının tələbələri:***
***Soldan sağa oturanlar**: 1) Fazil Əfəndiyev, 2) Əhməd Rəhimli, 3) Qaffar İbadzadə, 4) Həmid Hacızadə, 5)…*
***Ayaq üstə duranlar:** 6) Məmmədəli Balacayev,7) Şaban Pirxan(Zaqatala), 8)Heydər Əfəndiyev, 9) Əliheydər Mustafazadə, 10) Hüseyn Əfəndiyev*

1920-ci ilin may-iyun aylarında Məmməd Sadiq Əliyevin evində, (hazırda Şəki Pedaqoji Kolleci yerləşdiyi binada) «Kadet Korpusu» təşkil edilmişdir. Burada 150 nəfərə qədər tələbə oxuyurdu. Tələbələrin əksəriyyəti şəhərdən idi. Şuşa, Tovuz, Qazax, Qax, və Zaqataladan da tələbələr vardı. Bu məktəbin **müdiri** *Yusif Kənan Rəhimov*, **tədris hissə müdiri** *Gəray bəy Vəkilov,* **müəllimlər**: *Məmmədəli Xəlfəzadə, Əhməd əfəndi Bayramov, Əhməd Nəbiyev, Şirəli Səmədov, Ələşrəf Hacıyev,* **hərb müəllimi** *Cabbar çavuş, Mahmud Bayramov*, məktəbin **həkimi** *Hüseynbəy Sübhanquluyev idi.* «Kadet Korpusu» nun da ömrü qısa olmuş, 1921-ci ilin aprel ayında bağlanmışdır.

1920-ci ilin dekabrında Nəriman Nərimanov Nuxaya gəlmiş, onun klubda müəllimlər və müəllimələrlə görüşü keçirilmişdir.

1921-ci ildə müəllimlər və qızlar klubun səhnəsində gecələr müsamirələr keçirir və dram əsərləri tamaşaya qoyulur. Klubun səhnəsində «Hacı Qara», «Qan ocağı», «Məşədi İbad», «Saqqalın kəraməti», «Dursun əli Ballıbadı» və başqa əsərlərin tamaşası göstərilmişdi. O zaman qadınlar kişilərdən gizləndik

lərindən kişi rolunu da qızlar ifa edirdilər. Tamaşalarda **qızlardan *Cəmilə, Nəimə Əfəniyevalar (Rəşid bəyin qızları), Siddiqə Əfəndiyeva (Hüseyn əfəndinin qızı), Humay xanım Əmircanova, Nahidə, Sitarə, Zərif, Vəsilə Əhmədovalar (lahıcdan), Nazilə Hacı ağa Məhərrəm qızı Hüseynova, Şayəstə Məşədi Hüseyn qızı Axliyeva,* oğlanlardan ancaq *Zahid Mahmudov (Nəbiyev)*** iştirak etmişdir.



***Şəkildə tamaşalarda iştirak edənlərdən bir qrup. orta sıradan**: 3) Züleyxa Bəkir qızı, 2) müdir Mahtaban Əfəndiyeva, 4) Kubra Abbaszadə, 1) sabiq müdir Xanım Mahmudova, 6) Maral Əbdurrəhim əfəndi qızı, 7) Maral, 8) Sara, 9) Ruqiyyə, 10) Cəmilə, 1) Süsən, 12) Əminə, 13) Mehdi, 14) Zeynəb, 15) İsfəndiyar, 16) Məryəm, 17) Əbdül-Həmid*[333]

1921-ci ildə rayon maarif şöbəsinin sərəcamına görə Nuxada Rəşid bəy Əfəndiyevin rəhbərliyi altında şəhər məktəbi binasında müəllim və müəllimələr üçün kurs açılmışdır. Kursun müdavimləri aşağıdakılar olmuşdur:

**Qızlar:** *Dilarə, Xanım, Rübabə və Humay Əmircanovalar, Diləfruz və Humay Hacıyevalar, Rəxşəndə Nəbiyeva, Ruqiyyə Həbibova, Barat Məmmədova, molla Sura, Şəhrəbanu, Nahidə və Sitarə Əhmədovalar, Əzizə Abdürrahmanova, Şayəstə Axliyeva, Xanım Musabəyova (Qutqaşenli), Keysu xanım Şəkixanova, Köylü qızı Gülara;*

**Oğlanlar**: *Kürən Mustafa və Teymur Cabbarzadələr, Hüseyn (kişli), Həbibulla (çayqıraxlı), Həbibulla-Oxutlu, Həmid (kişli), Əbdürrəşid və Məmmə diyyə Əfəndiyevlər, Yusif, molla Məmməd (oxutlu), Abdulla bəy, Kərim, Yusif*

*Qasımzadə (Göynük), Məmməd Ləlazadə, Şirəli Səmədov, Məmməd-Qasım Tairov, Saleh Əskərov, Şakir İmamzadə, Yusif Məmmədzadə*

**Müəllimlər:** *Ələkbər Mahmudov, Məmmədəli Xəlfəzadə, Əhməd və Mahmud Bayramovlar, Əbdül-Mabud Əfəndiyev, Veysəl Mustafayev, Haşım Məmmədzadə, Rəsul Hüseynov, Rəşid bəy Əfəndiyev*



***Müəllimlər kursunun müdavimləri***



***1925-ci il martın axırında müəllimlər iclasında tələbə təşkilatından 2 nəfər nümayəndə Samirə Tairova və Zərifə Əbdürrəhimbəyovanın***

*iştirakını əks etdirən foto*[334]

1925-ci ildə müdir Yusifzadə əfəndi may bayramı münasibətilə seminariya şagirdlərinin müəllimlərlə birlikdə Yuxarıbaşda Almalıqda gəzintisini təşkil etmişdi. Bu ziyafətə Xanəndə Ələskər Abdullayev, Bakıdan gəlmiş Azərbaycan MİK-dən Musa Şəmsəddinski və onun 4 nəfər yoldaşı dəvət olunmuşdu. Tədbirdə Rayon Partiya Komitəsinin katibi İbrahim Tağıyev, komsomol komitə katibi Məmmədiyyə Rəsulov, həmkarlar ittifaqı tərəfindən Həmid Rüstəmov və Bağır Hacıyev, oğlan seminariyasından Rəcəb əfəndi Əfəndiyev, Əhməd Nəbiyev, Əhməd Bayramov və Məmməd Mədətzadə iştirak etmişdilər.

Yuxarı bina 1926-cı ildə tamamilə yandığından qız və oğlan seminariyası birləşdi və ona «Pedaqoji Texnikum» adı verildi.

Azərbaycanda ilk yeddiillik məktəb 1924/25-ci dərs ilində, birinci doqquzillik məktəb isə 1926/27-ci dərs ilində açıldı. 1926/27-ci dərs ilində respublikada 27.000 şagirdi əhatə edən 185 məktəb binası tikildi, həmin tədris ilində xalq maarifinə 17.183.000 manat xərcləndi.[335] Artıq 1926/27-ci tədris ilində respublikada 145.183 şagirdi əhatə edən 1.418 birinci dərəcəli, 1.974 şagirdi əhatə edən 49 ikinci dərəcəli, 4.405 şagirdi əhatə edən 17 yeddiillik məktəb var idi. Ümumilikdə respublikada olan 1.488 məktəbdə 162.253 şagird təhsil alırdı.

Bütün bunlara baxmayaraq, mövcud məktəb şəbəkəsi məktəbyaşlı uşaqların hamısının təhsilə cəlbinə imkan vermirdi. Statistik məlumatlara görə, 8-12 yaşlı uşaqların yalnız 39,4 faizi təhsilə cəlb olunmuşdur. Yaranmış vəziyyət 1927-ci ilin noyabrında çağırılan Azərbaycan KP VIII qurultayında müzakirə edildi. Qurultay XMK R.Axundovun məruzəsini dinləyərək qərara aldı ki, «…bu il pulsuz ümumi ibtidai təhsilə keçirilməsi hazırlığına başlansın və nəzərdə tutulan 10 il ərzində yerinə yetirilsin».[336]



***Məktəbin həyətində alma ağacının altında çəkilmiş foto. 1925-ci il mart***[337]

1920-1927-ci illərdə Azərbaycan xalq təhsili sistemi uşaq bağçası, I dərəcəli məktəb, II dərəcəli məktəb, yeddiillik məktəb, doqquzillik məktəb və kəndli-gənclər məktəbindən ibarət idi. Bu məktəblərin hər biri öz tədris planları ilə işləyirdi.

*1926-1929-cu illərdə Nuxa qəzasında fəaliyyət göstərən* ***kəndli-gənclər məktəbləri*** *aşağıdakı cədvəldəki kimi olmuşdur*:

**Cədvəl 2.3.4**

| Sıra №-si | Dairənin adı | Məktəbin yerləşdiyi məntəqə | Şagirdlərin sayı | Məktəbin yarandığı tədris ili |
|---|---|---|---|---|
| 1 | Nuxa | Vartaşen kəndi | 27 | 1927/1928 |
| 2 | Nuxa | Balacıq kəndi | 50 | 1927/1928[338] |

VI Azərbaycan Sovetlər Qurultayı (1929-cu il) Azərbaycan SSR Mərkəzi İcraiyyə Komitəsinin III sessiyasında qəbul olunan qərarı bəyənərək şəhər yerlərində, bəzi rayonlarda və məktəb dairələrində 8 yaşlı uşaqlar üçün ümumi

icbari təhsilə keçməyin zəruriliyini qeyd etdi. Qəbul olunmuş qərarların icrasının nəticəsi olaraq 1928/29-cu tədris ilindən başlayaraq bütün eyni tipli məktəblər üçün icbari olan tədris planları və proqramları təsdiq olundu, birinci və ikinci dərəcəli Azərbaycan məktəblərində dərslər yeni əlifba ilə keçildi.

**Azərbaycan SSR MİK-nin 1928-ci ilin may ayında keçirilən III sessiyası 10 il müddətində ümumi icbari təhsilin həyata keçirilməsi zəruriliyini qeyd etdi və 1928-ci il iyunun 9-da Azərbaycan SSR Mərkəzi İcraiyyə Komitəsi və Azərbaycan SSR Xalq Komissarları Soveti «*Azərbaycan SSR-də ümumi ibtidai təhsilin tətbiqi və şəbəkə komissiyaları haqqında»* qərar qəbul etdi.**

***1929-cu il fevralın 1-dən Azərbaycanda yeni əlifbaya keçildi. Dərsliklərin latın qrafikalı əlifba ilə hazırlanması və nəşri tam reallaşdı.***

ÜİK (b) P-nin XVI qurultayında ümumi ibtidai icbari təhsilə keçilməsi və savadsızlığın ləğv edilməsi müzakirə olundu. Qurultayın qərarına uyğun olaraq ÜİK(b)P MK 1930-cu il iyulun 25-də «*Ümumi icbari ibtidai təhsil haqqında»* qərar qəbul etdi. Qərarda 8 yaşından başlayaraq uşaqların və 11-15 yaşlı yeniyetmələrin məcburi oxudulması, habelə yeddiillik icbari təhsilə tədricən keçilməsi üçün konkret tədbirlər müəyyən edildi. Mərkəzin qərarını rəhbər tutan Azərbaycan SSR Xalq Komissarları Soveti 1930-cu il avqustun 29-da *«Azərbaycan SSR-də ümumi icbari ibtidai təhsilin həyata keçirilməsinə dair»* xüsusi qərar qəbul etdi. Qərarda bildirilirdi ki, «…Azərbaycan SSR-də… ümumi icbari ibtidai təhsil iki il ərzində elə tətbiq edilsin ki, 1932/33-cü dərs ilində icbari təhsil Azərbaycan SSR-in bütün ərazisində yerinə yetirilmiş olsun».[339]

Xalq Maarif Komissarlığı ümumi icbari təhsilin həyata keçirilməsi üçün bir sıra tədbirlər həyata keçirdi. Mövcud orta və ali məktəblərin şəbəkəsi genişləndirildi, müəllim hazırlığı üçün kurslar təşkil edildi, büdcədən ayrılan vəsaitin miqdarı artırıldı. Başqa məqsədlər üçün istifadə edilən məktəb binaları boşaldılaraq məktəblərin sərəncamına verildi, binalar avadanlıqlarla təchiz edildi. Görülən tədbirlərin nəticəsi idi ki, 1930/31-ci tədris ilində ümumi təhsil planı 95,9 faiz yerinə yetirildi, 1932/33-cü dərs ilində məktəblərin sayı 2.038-ə, şagirdlərin sayı 186.784 nəfərə çatdı.[340]

1933-cü ildən **Nuxa qəza məktəbi** 7-illik təhsil verməyə başladı.

Təhsil məsələlərinə dair birinci beşillik planda müəyyən edilmiş tədbirlər ikinci beşillikdə də davam etdirildi. SSRİ XKS və ÜİK(b)P MK-nın *«İbtidai və orta məktəb üçün dərsliklər haqqında»* ***1933-cü il 12 fevral tarixli****, «SSRİ ibtidai və orta məktəbin quruluşu haqqında»* ***1934-cü il 15 may tarixli****,*[341] *«İbtidai, tam olmayan orta məktəblərdə tədris işinin təşkili və daxili qayda haqqında»* ***1935-ci il 3 sentyabr tarixli****,*[342] *«Xalq Maarif Komissarlığı sistemində pedaloji təhriflər haqqında»* ***1936-cı il 4 iyul tarixli***[343] *qərarları, Azərbaycan SSR XKS və Azərbaycan KP MK-nın «Məktəb proqram və dərsliklərinin ümumiləşdirilməsi haqqında»**1933-cü il 20 may tarixli,** «Uşaqların məktəbə qəbul edilməsi və məktəbin şagirdlərlə komplektləşdirilməsi haqqında»* ***1933-cü il 29 may tarixli****, «İbtidai və orta məktəblər üçün stabil dərsliklərin nəşrinə dair»* ***1934-cü il 3 may***

***tarixli*** *qərarları* məktəb işinin təkmilləşdirilməsinə təkan verdi. [344] Görülmüş işlərə VIII Azərbaycan Sovetlər qurultayı yekun vurdu.

*1934-cü ildə Azərbaycanda xalq təhsili sistemi məktəbəqədər tərbiyə, ibtidai məktəb (I-IV siniflər), natamam orta məktəb (V-VII siniflər) və orta məktəbdən (VIII-IX siniflər) ibarət idi.*

1939-cu ildə latın qrafikalı əlifbanın tətbiqinə son verildi. İyulun 11-də latın əlifbasının dəyişdirilməsinə qərar verildi. Heç bir hazırlıq işi aparılmadan ***1940-cı il yanvarın 1-dən bütün təhsil müəssisələrində kril (rus) qrafikalı Azərbaycan əlifbasının tətbiqinə başlanıldı.*** [345]

Qeyd olunduğu kimi, 1920-ci ilin aprelin 27- dən 28 - nə keçən gün XI rus-sovet ordusunun Azərbaycana müdaxiləsi və onu işğal etməsi nəticəsində ADR hökuməti süqut etdi. Aprelin 28-də Bakıda, sonralar isə tədricən Azərbaycanın qəzalarında hakimiyyəti zorla zəbt edən bolşeviklər, bütün sahələrdə olduğu kimi maarif və təhsil sistemində, xüsusilə ***ali təhsil sistemində*** yeni sovet qaydaları adı altında antiazərbaycan maarif və mədəniyyət siyasəti yeritməyə başladılar. Azərbaycan milli təhsil tarixində özünə vətəndaşlıq hüququ qazanmış Şərq təhsil ənənələri nəzərə alınmadan Sovet Rusiyasının ali təhsil sistemi tətbiq edilməyə başlanıldı. Azərbaycan Hərbi İnqilab Komitəsinin 1920-ci il 10 və 22 may tarixli dekretləri ilə Bakı Universitetinin professor-müəllim, tələbə və işçi kollektivi arasında «təmizlənmə aparılaraq» varlı sinfə mənsub olanlar universitetdən xaric olundular. «Bakı Universitetinin yenidən təşkili» adı altında ali təhsil ocağının müstəqilliyi ləğv olundu, universitet sovet hökumətinə xidmət edən və ondan asılı olan təhsil ocağına çevrildi, rus elmi-pedaqoji qüvvələri «qardaşlıq köməyi» adı altında «kifayət qədər milli kadrların olmaması» bəhanə gətirilərək universitetdə yeləşdirildi, Azərbaycandakı Politexnik İnstitutunda, iki Ali Pedaqoji İnstitutda, Ali Rəssamlıq Məktəbində, Konservatoriyada və başqa ali məktəblərdə tədris-pedaqoji kadrların əsasını rus alimlərindən və «beynəlmiləl tələbələrdən»-əsasən rus, erməni, yəhudi və digər millətlərdən olan «kollektiv heyət» formalaşdırıldı. Bununla da, respublikada «yeni ali məktəb sistemi qurucluğunun» əsası qoyuldu.

Azərbaycan Sovet hökumətinin rus bolşeviklərinin rəhbərliyi ilə həyata keçirdiyi mədəni tədbirlər siyasəti kommunist rejimi siyasətindən narazı olub, xaricə mühacirət etmiş maarifçi ziyalıların etirazına və narazılığa səbəb oldu. Bu şəxslər 1921-1922-ci illərdə İstanbulda M.Ə.Rəsulzadənin başçılığı ilə «Yeni Azərbaycan mədəni-milli komitəsi» adlı təşkilat yaratdılar. Bu təşkilata heç bir əsas olmadan siyasi baxışlarına görə Azərbaycan ali məktəblərindən xaric edilmiş bəy, mülkədar və sahibkarların uşaqları, habelə ADR hökumətinin Qərbi Avropaya və Türkiyəyə ali təhsil almağa göndərdiyi tələbələr qoşulmuşdular.

Sovet hökuməti öz xislətinə sadiq qalaraq ali məktəb tələbələri və müəllimlər arasında «sinfi düşmən axtarmağa» başladı və yüzlərlə günahsız ali məktəb müəllimləri «ifşa edildilər». Bunların sırasında 1923-cü ildə Azərbaycan Xalq Maarif Komissarlığının dəvəti ilə Türkiyədən Bakıya gələrək Ali Pedaqoji

İnstitutda türk dili və ədəbiyyatından dərs deyən İsmayıl Hikmət, Ali Pedaqoji İnstitutda çalışan Mustafa Tofiq, Akifbəy, Abdulcəfər Əfəndiyev [346] və b. vardı.

Bütün bunlarla yanaşı həyata keçirilən tədbirlər nətcəsində ali məktəblərin və onlarda yerli millətlərdən olan tələbələrin sayı artırdı. 1924-1925-ci dərs ilində respublikanın 6 ali məktəbində oxuyan 5.254 nəfərin 1063 nəfəri, 1925-1926-cı dərs ilində 6 ali məktəbdə təhsil alan 5.583 nəfər tələbənin 1.177 nəfəri azərbaycanlı idi. Respublikanın ali məktəblərində 428 nəfər müəllim işləyirdi ki, bunun 132 nəfərini azərbaycanlılar təşkil edirdi.[347]

1926-1927- ci dərs ilində respublikada 5228 nəfər tələbəsi olan 5 ali məktəb fəaliyyət göstərirdi ki, burada oxuyanların 27,5 fazini azərbaycanlılar təşkil edirdi.[348]

Respublikada azərbaycanlılardan müəllimlər hazırlanmasında Ali Pedaqoji İnstitutun xüsusi xidmətləri olmuşdur. 1923-1924-cü dərs ilində Ali Pedaqoji İnstitutun 28 nəfərdən ibarət ilk buraxılışı oldu. Məzunlardan 2 nəfəri **nuxalı** gənclər idi. Həmin məzunlardan **Əfəndizadə Əbdül-Rəşid və Bayramzadə Mahmud** təbiət-coğrafiya fakültəsinin təbiət şöbəsini bitirmişdi.[349]

Azərbaycan SSR Xalq Maarif Komissarlığı kollegiyasının 1924-cü il 24 may tarixli iclasının qərarı ilə institutu bitirənlər Bakı, Gəncə, Şuşa, Qazax, Naxçıvan müəllimlər seminariyalarına, qalanları isə digər maarif müəssisələrinə, o cümlədən Nuxaya göndərilmişdilər.

Kadr hazırlığı sahəsində müəyyən müvəffəqiyyətlər əldə olunsa da, çatışmazlıqlar qalmaqda idi. Bunu nəzərə alan Azərbaycan hökuməti 1927-ci ildən başlayaraq respublikada qiyabi təhsilin yeni forması olan sadə pedaqoji texnikumlar açdı. 1929-cu ilin payızında Xalq Maarifi İşçilərinin İxtisasartırma İnstitutu, habelə Bakıda İkiillik Müəllimlər İnstitutu açıldı. Ali Pedaqoji İnstitut yenidən təşkil edildi. 1930-cu il martın 13-də Azərbaycan K (b) P MK katibi Ağa Sultanovun və respublika Xalq Maarif Komissarı Ayna Sultanovanın iştirakı ilə ali pedaqoji təhsil müəssisələri rəhbərlərinin xususi müşavirəsi çağırıldı. Müşavirədə Ali Pedaqoji İnstitutun təşkilinə hazırlıq haqqında P.A.Qasımovun və professor P.P. Fridrolinin məlumatı dinlənilib müzakirə edildi.

Respublikada ali təhsilin, o cümlədən ali pedaqoji təhsilin yenidən qurulmasında Azərbaycan SSR XKS-nin 1930-cu il 19 iyun tarixli *«Azərbaycan SSR ali məktəblərinin və ali texniki məktəblərin yenidən təşkili və rayonlaşdırılması, onların müvafiq təsərrüfat idarələri və Xalq Komissarlıqları tərkibinə verilməsi haqqında»* qərarı xüsusi rol oynadı. Həmin qərarda V.İ.Lenin adına BDU-nun ayrı-ayrı fakültələrinin bazası əsasında müstəqil sahə institutları təşkil edildi. Bu qərara əsasən universitetin pedaqoji fakültəsinin bazası əsasında Azərbaycan Dövlət Pedaqoji İnstitutu yaradıldı. 1930-cu ildə müstəqil sahə institutlarının təşkilindən sonra universitet müvəqqəti olaraq öz fəaliyyətini dayandırdığı üçün Azərbaycan Dövət Pedaqoji İnstitutuna V.İ.Leninin adının verilməsi məqsədəmüvafiq hesab edildi.

1930-1931-ci dərs ilində Azərbaycan Dövət Pedaqoji İnstitutunun pedaqoji fakültəsi nəzdində məktəbəqədər şöbə yaradıldı[350], şöbəyə ilk dəfə 9 nəfər

tələbə qəbul edildi və sonrakı 10 ildə (1931-1941-ci illər) fakültəyə 120 tələbə qəbul olunmuşdur.

30-cu illərdə ADPİ-nin əsas fakültələrindən bir olan pedaqoji fakültədə ibtidai məktəblər üçün yüksək ixtisaslı müəllimlər hazırlandı. 1931-1940-cı illərdə fakültəni 142 nəfər qurtardı [351]. Nəticədə ali təhsilli müəllimlərin sayında əsaslı kəmiyyət və keyfiyyət dəyişiklikləri baş verdi. Bu isə öz növbəsində digər bölgələrdə olduğu kimi, **Nuxada** da təhsildə keyfiyyət dəyişikliklərinə səbəb oldu.

Ümumiyyətlə, 30-cu illərdə respublikanın ali və orta ixtisas pedaqoji təhsil ocaqlarını 13 minə qədər müəllim bitirdi ki, onun 12.500 nəfəri azərbaycanlı, bunun da 10 min nəfəri kişi, 2500 nəfəri qadın idi.[352]

**1933-cü ildən yeddiillik təhsil verməyə başlayan Nuxa qəza məktəbi** 1939-cu ildə səkkizillik məktəbə çevrildi. Lakin müharibənin başlanması məktəbin həyatına öz təsirini göstərdi.

## 2.7. Nuxa təhsil müəssisələri 1941-1945-ci illər müharibəsi dövründə

***1941-ci il.*** Faşist Almaniyasının SSRİ-yə hücumu ölkə həyatının bütün sahələrində, o cümlədən təhsil sahəsində başlanmış işləri yarımçıq qoydu. On minlərlə məktəbli oğlan və qız əmək cəbhəsinə gedərək zavod və fabriklərdə, kolxoz tarlalarında işləməyə məcbur oldular.

Müharibə xalq maarifi və məktəblər qarşısında yeni vəzifələr qoydu. Məktəb şəbəkəsinin qorunub saxlanılması, müharibə şəraitində kənd yerlərində ibtidai icbari təhsilin, şəhərlərdə 7 illik icbari təhsilin həyata keçirilməsi və genişləndirilməsi qarşıda duran mühüm məsələlərdən idi. Əsas problemlərdən biri də, istehsalata könüllü gedən yuxarı sinif şagirdlərinin təhsilinin, cəbhəyə kömək uğrunda ümumxalq hərəkatında məktəblilərin və müəllimlərin iştirakının təşkili, valideyn himayəsindən məhrum olan, valideynlərini itirmiş uşaqların uşaq evlərində yerləşdirilməsi idi. [353]

Müharibə illərində ümumi icbari təhsil və məktəblərin işi haqqında SSRİ XKS-nin 1941-ci il 21 iyul tarixli «Məktəbdə təhsilin keyfiyyətini yaxşılaşdırmaq tədbirləri haqqında», ÜİK (b) P MK və SSRİ XKS-nin 16 sentyabr 1941 - ci il tarixli «Orta məktəblərin yuxarı sinif şagirdlərinə, texnikum və ali məktəb tələbələrinə kənd təsərrüfatı peşələrinin öyrədilməsinə dair», SSRİ XKS və ÜİK (b) P MK-nın 1941-ci il 17 noyabr tarixli «Məktəblilərin 1942-ci il kənd təsərrüfatı işlərində iştirakı haqqında»[354], SSRİ XKS-nin 1942-ci il 23 yanvar tarixli «Valideynsiz qalmış uşaqların yerləşdirilməsi haqqında» qərarları qəbul edildi[355]. Bu qərarlara müvafiq olaraq Azərbaycan SSR XKS və Azərbaycan K(b) P MK-da da qərarlar qəbul olundu.

Müharibənin çətinlikləri ilə əlaqədar respublikada məktəb şəbəkəsi və şagird kontingenti azaldı. 1940/1941-ci dərs ilində respublikada 3.575 məktəb

olduğu halda, 1943 /1944-cü dərs ilində onların sayı azalaraq 3.159-a, o cümlədən ibtidai məktəblərin sayı 1.668-dən 1.372-ə endi[356]. Şagirdlərin sayında da azalma baş verdi. 1940/1941-ci tədris ilində ümumtəhsil məktəblərində 654.902 nəfər oxuyurdusa, 1943/1944-cü dərs ilində onların sayı azalaraq 454.195 nəfər oldu. Müvafiq olaraq ibtidai məktəblərdə də şagirdlərin sayı 406.153-dən 288.418-ə endi.[357]

Müharibə respublikanın xalq maarifi orqanlarının işində bir sıra çətinliklər yaratdı. Bir sıra məktəb binalarının hospitalların, hərbi-tədris məntəqələrinin sərəncamına verilməsi nəticəsində məşğələlər bir-iki növbədən çoxnövbəli məşğələlərlə əvəz olundu[358].Ümumtəhsil məktəblərinin yuxarı siniflərində, xüsusən kənd orta məktəblərində şagird kontingentinin azalması sinifdənkənar və məktəbdənxaric işin zəifləməsi ilk növbədə məktəblilərin davamiyyətinin və təhsil müvəffəqiyyətinin aşağı düşməsi ilə nəticələndi. Bu səbəbdən də, 1942-ci ilin dekabrında Azərbaycan SSR XKS və Azərbaycan K(b)P Mərkəzi Komitəsi «Müəllimlərin və şagirdlərin mədəni - məişət şəratini yaxşılaşdırmaq tədbirləri haqqında» qərar qəbul edərək xalq maarif orqanları və digər təşkilatlara «Valideynləri Qızıl Ordu sıralarına səfərbərliyə alınmış, ehtiyacı olan uşaqlara yemək, paltar, ayaqqabı, dərsliklər və tədris vəsaiti, həmçinin başqa məktəb ləvazimatı verməklə müntəzəm yardım təşkil etmək» [359], müəssisələr və kolxozların məktəblərə hamilik etməsi, məktəb bufetlərinin zəruri ərzaq məhsulları ilə təmin edilməsi, ata-analarını itirmiş uşaqların oğulluğa və qızlığa götürülməsini təşkil etmək, onların sənət kooperasiyalarında və sənaye kombinatlarında işə düzəlməsi sahəsindəki işi genişləndirmək [360] haqqında göstəriş verdi.

Respublikada icbari təhsil qanunun yerinə yetirilməsi sahəsində Azərbaycan SSR XKS-nın 1943-cü il 21 sentyabr tarixli «Uşaqların və yeniyetmələrin nəzarətini təşkil etmək və ümumi icbari təhsil haqqında qanunun yerinə yetirilməsinə nəzarət haqqında» təlimatından sonra 15 nəfərdən az olmayaraq məktəb yaşlı uşağı olan və ən yaxın məktəbdən 3 və daha çox kilometr məsafədə olan kiçik yaşayış məntəqələrində bir komplektli məktəblər açmaq haqqında 1943-cü il 26 noyabr tarixli qərarının mühüm rolu oldu.

SSRİ XKS-nın 1943-cü il 16 iyul tarixli qərarı ilə 1943-cü ildə ittifaq və muxtar respublikaların paytaxtlarında, ölkə, vilayət və iri sənaye şəhərlərindəki məktəblərdə oğlanların və qızların ayrılıqda oxumaları təşkil edildi. Bu qərarın verilməsində məqsəd oğlanlarla qızların bir yerdə oxuması prosesində təlim - tərbiyə işindəki nöqsanları, oğlanların və qızların fiziki tərbiyəsindəki çatışmazlıqları, onların əməyə hazırlanması, praktik fəaliyyəti və hərbi işi öyrənmələrindəki çətinlikləri aradan qaldırmaq idi. 1943-1944-cü dərs ilində Bakının 25 məktəbində, 1944-1945-ci dərs ilindən etibarən isə Kirovabad (Gəncə), Naxçıvan, Lənkəran, Ağdam, o cümlədən **Nuxa**nın bəzi məktəblərində oğlanlar və qızlar ayrılıqda təhsil almağa başladılar.[361]

1943-cü il sentyabr ayının 3-də SSRİ XKS yeddi yaşından başlayaraq uşaqların ümumi təhsili haqqında qərar qəbul etdi. Bu qərara görə yeniyetmələr yed-

diillik təhsili 14 yaşında başa vurmalı idilər. Qərar uşaq bağçası ilə (6 yaş) məktəbyaşı arasındakı (8 yaş) boşluğu ləğv edirdi.

SSRİ XKS-nın 1944-cü il 21 iyun tarixli «Məktəbdə təlim keyfiyyətini yaxşılaşdırmaq tədbirləri haqqında» qərarı ilə ibtidai və yeddiillik məktəbi qur taran şagirdlərin buraxılış imtahanları və orta məktəbi qurtaran şagirdlərin kamal attestatı imtahanı verməlırini, həmçinin kamal attestatı imtahanlarında müvəffəqiyyət qazanmış və əxlaqdan əla qiymət alan orta məktəb şagirdlərinin qızıl və gümüş medalla təltif olunmaları qaydasını müəyyən etdi. Azərbaycan SSR XMK-nın kollegiyası SSRİ hökumətinin yuxarıda qeyd olunan qərarından irəli gələn vəzifələrin yerinə yetirilməsi gedişinə uyğun olaraq 1944-cü il oktyabrın 4-də «Orta məktəb attestatlarından sui-istifadə edilməsinə qarşı mübarizə tədbirləri haqqında» məsələ müzakirə edərək bir sıra rayonlarda bu sahədə buraxılan nöqsanları göstərdi və onların aradan qaldırılması üçün tədbirlər hazırladı.[362]

1944-cü ilin noyabr ayında xalq maarif işçilərinin respublika müşavirəsi keçirildi. Müşavirə həmin ildə ilk dəfə tətbiq edilən buraxılış imtahanları, habelə orta məktəbi qurtaranlara qızıl və gümüş medallar verilməsi qaydalarının qorunması, təlim-tərbiyə işlərinin vəziyyəti, şagirdlərin biliklərə yiyələnmələri sahəsində görülmüş işlərin vacibliyini qeyd etdi. [363]

Müharibə illərində rus dillinin tədrisinə diqqət artırıldı. Azərbaycan SSR XMK - nın kollegiyası 1943-cü il dekabrın 22-də «Azərbaycan məktəblərində rus dili tədrisini yaxşılaşdırmaq haqqında» məsələ müzakirə etdi.

İstehsalatda işləyən gənclərin təhsili yaddan çıxmadı. Bu sahədə SSRİ XKS-nin 15 iyun 1943-cü il tarixli «Müəssisələrdə işləyən yeniyetmələrin təhsili haqqında» qərarı əhəmiyyətli rol oynadı.[364] Artıq 1943/1944-cü tədris ilində respublikada fəaliyyət göstərən 27 fəhlə-gənclər məktəbində 2.089 fəhlə *oxuyurdu*[365]. 1944-cü ilin oktyabr ayında Bakı və onun rayonlarında 32 axşam məktəbi açıldı. Onlarda 10.500 gənc təhsil alırdı[366]. 1945-ci ildə fəhlə-gənclər məktəbində 6.047 gənc oxuyurdu.[367]

SSRİ XKS-nin 1944-cü il 6 iyul tarixli «Axşam kəndli-gənclər məktəblərinin təşkili haqqında» qərarı axşam kəndli-gənclər məktəblərinin şəbəkəsinin genişlənməsində əhəmiyyətli rol oynadı**.** [368]1944-cü ildə kəndli gənclər məktəbləri ilk tədris ilinə başladı. Həmin ilin noyabr ayının 1-də respublikada 175 kəndli-gənclər məktəbi fəaliyyətdə idi. Yerli orqanların və Azərbaycan SSR XMK-nın açdığı bu məktəblərdə 15.222 gənc oxuyurdu.[369]

Texniki peşə təhsili müharibə illərində ixtisaslı kadr hazırlığı sahəsində səmərəli fəaliyyət göstərdi. 1940-cı ildə respublikada fəaliyyət göstərən bütün növtexniki peşə məktəbləri Azərbaycan SSR Nazirlər Soveti yanında Dövlət Əmək Ehtiyatları Baş İdarəsinin tabeliyinə verildi. Peşə məktəblərinin strukturunda dəyişikliklər baş verdi, onların şəbəkəsi genişləndirildi, şagird kontingenti artdı. 1941-ci ildə müharibənin başlanması ilə əlaqədar olaraq Dövlət Əmək Ehtiyatları sistemi yeni iş rejiminə keçdi.

1942-ci ilin ikinci yarısında respublikada daha 10 yeni Fabrik Zavod Təlimi (FZT) məktəbi yaradıldı. Artıq həmin ildə Dövlət Əmək Ehtiyatları Baş İdarəsi-

nin tabeliyində olan 42 texniki peşə təhsili məktəbindən 28-i FZT, 12-si sənət, 2-si dəmiryol məktəbi idi. 18 FZT məktəbində yalnız neft sənayesi üçün ixtisaslı işçilər hazırlanırdı.

1942-ci idə respublikada 42 texniki peşə məktəbi fəaliyyət göstərirdi. Onlara 13 min oğlan və qız qəbul edilmişdir. İstehsalata 7.350 ixtisaslı fəhlə göndərilmişdir.[370]

Texniki peşə məktəblərinin yetirmələri cəbhədə qəhrəmanlıqla vuruşdular. Bakıdakı 13 saylı FZT məktəbinin məzunu Mehdi Quliyev 1943-cü iln noyabrında Sovet İttifaqı Qəhrəmanı adına layiq görülmüşdür.

1945-ci ildə respublikada 30 texniki peşə təhsili müəssisəsi fəaliyyət göstərirdi.[371]

Ümumiyyətlə, texniki peşə təhsli məzunlarından 1 nəfər Sovet İttifaqı Qəhrəmanı, 14 nəfər Sosialist Əməyi Qəhrəmanı, 1 nəfər «SSRİ Xalq müəllimi», 5 nəfər «Azərbaycan SSR əməkdar texniki» və «Azərbaycan SSR əməkdar peşə təhsili işçisi» fəxri adına layiq görülmüşdür.[372]

Məktəblilərin hərbi-vətənpərvərlik tərbiyəsi sahəsində aparılan işlərə də diqqət artırıldı. Ümumilikdə, məktəblilərin hərbi hazırlığını yaxşılaşdırmaq və hərbi-vətənpərvərlik tərbiyəsini gücləndirmək sahəsində ÜİK (b) P MK-nın «Məktəblilərin hərbi təhsili haqqında» 1941-ci ilin sentyabr və 1942-ci ilin oktyabrında qəbul etdiyi qərarlar, SSRİ XKS-nin «FZŞ məktəbləri, dəmir yol məktəbləri və peşə məktəbləri şagirdlərinin ibtidai hərbi hazırlığı haqqında» xüsusi qərarı məktəb təhsilinin təşkilində əhəmiyyətli rol oynadı. Bu işlərin düzgün təşkilində Azərbaycan K(b) P MK-nın «Orta məktəbin yuxarı sinif şagirdlərinin hərbi və fiziki hazırlığını gücləndirmək haqqında» 9 sentyabr 1941-ci il tarixli qərarını xüsusi qeyd etmək lazımdır.[373] Qərarda hərbi-idman və hərbi-sanitar hazırlığının tədris saatlarının artırılması, [374] nəzərdə tutulurdu. Azərbaycan K(b) P MK-nın 3 noyabr 1942-ci il tarixli qərarı əsasında natamam orta məktəblərin və pedaqoji məktəblərin planlarına ilk və çağırışaqədər hərbi hazırlıq kursu fənni daxil *edildi.*[375] 1943-cü ilin yanvarından etibarən Azərbaycan SSR XMK-nın nəzdindəki məktəblərin bütün siniflərində hərbi hazırlıq dərslərinə başlandı .

1943-cü ildə məktəblərdə 2.387 nəfər hərbi rəhbər çalışırdı. [376] Yuxarıda sadalanan qərarlar, həyata keçirilən tədbirlər bütün respublikada olduğu kimi, ***Nuxanın*** təhsil müəssisələrində də həyata keçirilirdi.

Pedaqoji kadrlarının hazırlanması məsələsi müharibə illərində diqqət mərkəzində idi. 1940/1941-ci tədris ilində Azərbaycanın 16 ali məktəbində 14,6 min tələbə təhsil alırdı ki, onların 4.500 nəfəri qadınlar və qızlar idi.[377]

Müharibənin başlanması ilə əlaqədar olaraq bir sıra texnikumlar bağlandı, bəziləri isə başqaları ilə birləşdirildi. 1941-ci ildə Qusar, Salyan, Şamaxı, Ordubad, Naxçıvan pedaqoji texnikumları, Bakı Xalq Maarif şöbəsinin məktəbəqədər və siyasi-maarif məktəbləri bağlandı. **Nuxadakı** Mədəni-Maarif Texnikumu pedaqoji texnikumla birləşdirildi.

Cəbhədə vəziyyətin dəyişməsi, sovet qoşunlarının əsaslı qələbələr əldə etməsi yerlərdə aparılan işlərə müsbət təsir etdi. Yaranmış şərait orta ixtisas təhsilli

kadr hazırlığına təkan verdi. 1943/1944-cü dərs ilində Cəlilabad və Laçında yeni pedaqoji məktəblər təşkil edildi. Orta pedaqoji təhsili olmayan qiyabiçi müəllimlərə kömək məqsədilə respublikanın Astraxanbazar (indiki Cəlilabad), Laçın, Göyçay, Qaryagin (indiki Füzuli), Şamaxı və Zaqatala şəhərlərində Maarif Komissarlığı xətti ilə müəllimlər üçün məsləhət məntəqələrində hazırlıq kursları təşkil edildi. [378]

Ağır müharibə şəraitinə baxmayaraq orta ixtisas təhsilli pedaqoji kadrlar hazırlığı sahəsində **Nuxa Pedaqoji Texnikumu** səmərəli fəaliyyət göstərdi. Texnikumda

1940/1941-ci tədris ilində **185 nəfər,**
1941/1942-ci tədris ilində **55 nəfər,**
1942/1943-cü tədris ilində **36 nəfər**,
1943/1944-cü tədris ilində **33 nəfər,**
1944/1945-ci tədris ilində **75 nəfər** orta ixtisaslı kadr hazırlandı.

Respublika dövlət büdcəsindən kadr hazırlığı üçün vəsait ayrılması yaxşılaşdı. 1941-ci ildə bu rəqəm 25 mln. 574 min, 1942-ci ildə 15 mln.829 min manat təşkil edirdisə[379], 1944-cü ilin büdcəsindən ümumilikdə xalq maarifinə 473 milyon manat ayrılmışdı ki, bunun 325 milyonu Xalq Maarif Komissarlığı üçün nəzərdə tutulmuşdu. [380]

Müəllim hazırlığını yaxşılaşdırmaq, müharibə ilə əlaqədar əmələ gəlmiş ehtiyacı ödəmək üçün bir sıra institutlar Azərbaycan Dövlət Universiteti ilə birləşdirildi.[381] 1943-cü ildən başlayaraq müharibənin gedişindəki dönüş ali təhsilin inkişafına diqqəti artırmağa imkan verdi. ***Nuxa,*** Quba, Ağdam və Qazaxda yeni müəllimlər institutları açıldı. [382] 1939-1940-cı tədris ilində fəalyyətə başlayan **Nuxa Müəllimlər İnstitutunda** 1944/1945-ci dərs ilində 197 nəfər tələbə oxuyurdu. [383]

1943-cü ilin dekabrında SSRİ XKS-nın qəbul etdiyi «Qiyabi pedaqoji təhsil sisteminin möhkəmləndirilməsinə dair tədbirlər haqqında» qərarından sonra qiyabi təhsil genişləndirildi. 1944-cü ilin yanvar ayından başlayaraq ADU, APİ, Kirovabad Pİ, **Nuxa,** Qazax, Quba, İmişli, Naxçıvan Müəllimlər İnstitutu, Astraxanbazar (indiki Cəlilabad), Laçın, Göyçay, Qaryagin (indiki Füzuli), Ağdam, Şamaxı və Zaqatala Pedaqoji məktəbləri yanında qiyabi təhsil alan müəllimlər üçün məsləhət məntəqələri təşkil edildi.

**Nuxanın** təhsil işçiləri müharibə illərində kütləvi siyasi işdə fəal iştirak etdilər. Müəllimlər təşviqat məntəqələrinin təşkilində yerli hakimiyyət orqanlarına kömək edir, mühazirəçi, məruzəçi və təşviqatçı kimi dəmiryol stansiyalarında, hospitallarda, körpülərdə və vağzallarda kütlələr arasında iş aparırdılar. Müəllimlərin təkcə 1942-ci ildə oxuduğu mühazirələri 91.500 nəfər dinləmişdi.[384]

Təhsil işçiləri cəbhəyə yardım hərəkatında fəal iştirak etdilər. 1942-ci ildə Bakı və **Nuxa** da daxil olmaqla respublikanın 49 rayonunda müəllimlər öz şəxsi qənaətlərindən 761.000 rubl pul, 809.000 rublluq istiqraz topladılar. Hər ay həmin rayonlardan müdafiə fonduna 209.766 rubl verildi. Bakı və respublikanın 50 rayonundan 2.395 kq.yun, 3.260 cüt yun corab, 1728 ədəd gödəkcə, 2.563 cüt

yun əlcək cəbhəyə göndərildi. [385] **Nuxa İkiillik Müəllimlər İnstitutunun** əməkdaşları tank dəstəsi yaratmaq fonduna 16.250 manat pul, 21.000 manatlıq istiqraz verdilər.

«Azərbaycan kolxozçusu» tank dəstəsi, «Azərbaycan müəllimi» təyyarə eskadrilyası yaradılması fonduna vəsait toplanışında təhsil işçiləri fəallıq göstərdilər. Ağdam, Qax, ***Nuxa,*** Qusar, Dəvəçi, Quba, Zaqatala rayonlarının müəllimləri və digər maarif işçiləri təşəbbüslə çıxış etdilər.

«Azərbaycan müəllimi» təyyarə eskadrilyası yaratmaq fonduna vəsait toplanması hərəkatına **Nuxa,** Ağdam, Qusar, Dəvəçi, Zaqatala, Şuşa, Naxçıvan MR və başqa rayonların pedaqoji kollektivləri bir səslə qoşuldular.

Məktəblilərin kənd təsərrüfatı işlərində iştirakına dair ÜİK (b) P MK və SSRİ XKS-nin 17 noyabr 1941-ci il tarixli qərarına uyğun olaraq məktəblilər müəllimlərin rəhbərliyi ilə kənd təsərrüfatı işlərinə cəlb olundular.

Məktəblilər kolxoz tarlalarında ailə üzvlərinə kömək edirdilər. **Nuxanın *Cəfərabad, Vərəzət, Baş Göynük, Daşbulaq, Cəyirli, Qayabaşı kənd məktəbliləri*** bu sahədə nümunə oldular.

Vərəzət məktəbliləri 1943-cü ilin yay dövründə 6.830 kiloqram sünbül toplayıb fonda təhvil verdilər [386]. Daşbulaq məktəbliləri 1944-cü ilin yay dövründə 7 gün ərzində 2.100 kiloqram sünbül yığdılar, Təpəcənnət məktəbliləri 160 ha. yer şumladılar, 12 ha. sahənin taxılını biçdilər.[387]

Müəllimlər müharibə illərində sahibsiz və nəzarətsiz qalmış minlərlə uşağın uşaq evlərində yerləşdirilməsində iştirak etdilər. Bakı şəhərində cəbhəçi uşaqlar üçün xüsusi yeməkxana yaradıldı. Həmin yeməkxanadan 4.000 məktəbli, o cümlədən 1.000 nəfəri isə pulsuz yemək yeyirdi.

Azərbaycan SSR XKS və Azərbaycan K (b) MK-nın qərarına əsasən nəzarətsiz qalmış uşaqlar toplanaraq uşaq evlərinə yerləşdirilməklə *yanaşı*[388]*,* onların tam uçota alınması üçün 7-17 yaşlı uşaq və gənclərin hesabı aparılmışdı. [389]

Dövlət xətti ilə müharibə illərində 458 məktəbəqədər müəssisə, dövlət və kooperativ müəssisələr və təşkilatların hesabına 102 məktəbəqədər tərbiyə müəssisəsi tikilib istifadəyə verildi [390]. Ümumilikdə, 1941-1945-ci illərdə respublikanın uşaq müəssisələrinə 187,3 min uşaq yerləşdirildi. 200 mindən çox cəbhəçi uşağı bu müəssisələrdə tərbiyə edildi. 100 mindən çox uşaq pioner düşərgələrində istirahət edirdi. [391]

**Nuxa** rayonunda əsgər uşaqlarından 2.340 nəfəri uşaq bağçalarına, 839 nəfəri uşaq evlərinə cəlb edilmişdi, 3.223 nəfər məktəb bufetlərində pulsuz yeməklə təmin olunmuşdu. Şəhərdə fəaliyyət göstərən 7 uşaq evində 700 sahibsiz uşaq tərbiyə olunurdu. 1944-cı ildə **Nuxada** açılmış 3 uşaq evində 500 sahibsiz uşaq vardı. [392]

Azərbaycan müəllimləri ön cəbhədə Azərbaycan ziyalılarına məxsus mərdlik, igidlik nümunələri göstərdilər. 1941-1945-ci illər sovet-alman müharibəsi illərində qəhrəmanlıqları ilə fərqlənən ***müəllimlərdən Səməd Abdullayev, Qəzənfər Əkbərov, Şəmsulla Əliyev, Fariz Səfərov və Nikolay Şeverdyayev Sovet İttifaqı Qəhrəmanı adına layiq görüldülər***.[393]

Faşizmə qarşı mübarizədə ***nuxalı müəllimlər–Təpəcənnət kənd məktəbinin müəllimi Muxtar Süleymanov, Baş Göynük kənd məktəbinin müəllimi Mustafa Məmmədov, Oxut məktəbinin müəllimləri Nuru Məmmədov, Əsabəli Qafarov, Bəlyar Məmmədov, Baş Zəyzid məktəbinin müəllimləri Yaqub Əzimov, Əhməd Yusifov*** *v*ə onlarca başqaları qəhrəmanlıq nümunələri göstərərək orden və medallarla təltif olundular.

Müharibə illərində müəllimlərin apardığı iş hökümət tərəfindən yüksək qiymətləndirildi. Müharibə dövründə ***323 müəllimə əməkdar müəllim*** adı verilmiş, ***107 nəfər müəllim Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri fərmanı*** ilə təltif edildi.

«Müəllim vətən müharibəsi məşəqqətinin də çox ağır payını çiynində, qəlbində, həyatında, güzəranında daşıdı. Əli silah tutan müəllimlər cəbhəyə ön cərgədə getdilər. Müəllim sıravi əsgər oldu, komandir, siyasi rəhbər vəzifəsini yerinə yetirdi. Müəllim ağır günlərdə ellərin qayğıkeşi, əzabkeşi oldu. Biri üçünü əvəz etdi, yetimlik, korluq çəkən balaları məktəbdən, tərbiyədən kənarda qoymadı. Özü də korluq çəkən, çörəyə, bir salım çaya, bir qəlib sabuna ehtiyac duyan, üst-başı tökülən müəllim hər məqamda öz ləyaqətini saxladı, öz müəllimliyini unutmadı. Müəllim tərbiyəçi, təbliğatçı, qara kağızların xalqa gətirdiyi ələmlərin şəriki oldu. Müəllim hər iki cəbhənin dadına yetdi. Vətəni canından əziz tutan balalar yetişdirdi. Müəllim elin ağsaqqalı, məsləhət, toxtaxlıq verəni oldu. Əli qələm də, silah da, bel də tutdu, müəllim taxıl əkdi, suçuluq da etdi, zəmi də biçdi, başaq da yığdı. Müdafiə xəndəkləri də qazdı. Lakin hər yerdə müəllim oldu, adını mühafizə etdi». [394]

Müharibənin başa çatması ilə **Nuxa** təhsil müəssisələrinin işində dəyişikliklər baş verdi. 1945-46-cı tədris ilində qəza məktəbi onillik məktəbə çevrildi. O dövrdə oğlanlarla qızlar ayrılıqda oxuduqlarından qəza məktəbi qız məktəbi kimi fəaliyyət göstərdi, 1946-47-ci tədris ilində məktəbi 17 qız bitirdi. Şagirdlərin təlim-tərbiyəsi ilə bacarıqlı müəllim kollektivi məşğul olurdu.



***1946-cı ildə Nuxa qəza məktəbində işləyən müəllimlərdən bir qrup***[395]

1946-1950-ci illərdə orta məktəb kimi fəaliyyət göstərən Nuxa qəza məktəbində 1953-cü ildən yenidən oğlanlarla qızlar birlikdə oxumağa başladılar. Şagirdlərin sayı 400-dən 600-ə qədər artdı. Lakin bina şəraiti imkan vermədiyindən məktəb 1958-ci ildə yenidən səkkizillik məktəbə çevrildi.

Məktəbin müəllimləri arasında «Lenin» ordenli riyaziyyat müəllimi ***Sürəyya Gülüzadə,*** «Qırmızı Əmək Bayrağı» ordenli tarix müəllimi ***Rza Cəlilov,*** respublikanın əməkdar müəllimi, Azərbaycan dili və ədəbiyyatı müəllimi ***Ələsgər Yusifov***[396] şagirdlərin və şəhər ictimaiyyətinin hörmətini qazanmışdılar.

## 2.8. Təhsilin inkişafında yeni mərhələ

Azərbaycan təhsilinin inkişafında yeni mərhələ XX əsrin 70-ci illərindən başlamış və ümummilli lider H.Əliyevin adı ilə bağlıdır. Həmin dövrdə məktəbəqədər tərbiyə müəssisələrinin sayı 1.600-dən 1.875-ə çatdı, ümumtəhsil, texniki peşə və orta ixtisas məktəblərinin, ali təhsil müəssisələrinin şəbəkəsinin inkişaf etdirilməsi H.Əliyevin diqqət mərkəzində oldu.

1970-80-cı illərdə 683,1 min şagird yerləşəcək 1.191 ümumtəhsil məktəbi tikilib istifadəyə verildi.[397] 1970-ci ildə respublikada 6 texniki peşə məktəbində 40,9 min şagird təhsil alırdısa, 1987-ci ildə 186 texniki peşə məktəbində 115 min şagird 200-dən artıq peşəyə yiyələnirdi.

Respublikada 1970-ci ildə 710, 1980-cı ildə 1.276 məktəbdənkənar müəssisə fəaliyyət göstərirdi. Həmin müəssisələrə 1970-ci ildə 386 min, 1980-ci ildə 618 min uşaq cəlb olunmuşdu.[398]

1971-1975-ci illər üçün Azərbaycan xalq təsərrüfatının inkişaf planında 85.900 ali təhsilli mütəxəssis hazırlanması nəzərdə tutulmuşdu.[399]1970-1982-ci illərdə Azərbaycanda 5 yeni ali məktəb fəaliyyətə başladı.

1970-1980-ci illərdə H.Əliyevin şəxsi təşəbbüsü ilə Azərbaycandan kənarda, keçmiş SSRİ-nin 50-dən artıq böyük şəhərlərinin ən məşhur ali məktəblərində respublikanın xalq təsərrüfatı, elm, təhsil və mədəniyyətinin 80-dən artıq sahəsini əhatə edən və zəruri ehtiyac duyulan 250-dən çox ixtisas üzrə 15 mindən artıq azərbaycanlı gəncin ali təhsil almasına imkan və şərait yaradıldı.[400]

Nuxa qəza məktəbinin varisi olan ***Şəki şəhərindəki 5 nömrəli ümumtəhsil məktəbi XX əsrin 70-80-ci illərində sözün həqiqi mənasında inkişaf yolu keçdi***.[401] ***Məktəb*** həmin illərdə Mirzə Ələkbər Sabirin adını daşıyır və şəhərin yuxarı hissəsində yerləşirdi. 1983-cu ildə məktəb 1886-cı ildə tikilmiş indiki binaya köçürüldü.

40 ildən artıq ayrı-ayrı məktəblərə rəhbərlik etmiş təcrübəli pedaqoq Adışirinov Arif Hümmət oğlu 1983-cü ildə məktəbə direktor təyin edilir. A.Adışirinov xatırlayır ki, həmin vaxt məktəbə ətraf ərazilərdən uşaq toplayaraq 185 uşaqla tədrisə başla mışdılar. 1986-cı ildə artıq məktəbdə şagirdlərin sayı 333 nəfərə çatmışdı. 1986-cı ildə A.Adışirinov 9 nömrəli məktəbə direktor təyin olunduğu üçün həmin vəzifəyə direktor müavini İ.Surxayev rəhbər təyin edilmişdir.

***5 saylı məktəbin 150 illik yubileyi 1982-ci ildə keçirildi***. *Məktəbin yubileyi ilə əlaqədar Azərbaycan KP MK-nın qərarında deyilirdi: «Əsr yarım bundan əvvəl Şəki şəhərində açılmış qəza məktəbi Azərbaycanda maarif və mədəniyyət ocaqlarından biri olmuş, rus və Azərbaycan xalqları mədəniyyətlərinin geniş qarşılıqlı təsirinə, bu xalqlar arasında dostluğun inkişafına və möhkəmlənməsinə kömək etmişdir. Sovet dövründə məktəb 5 nömrəli səkkizillik ümumtəhsil məktəbinə çevrilmişdir».*[402]

Məktəb Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin 30 sentyabr 1982-ci il tarixli Fərmanı ilə **Fəxri fərmanla** təltif edilmiş, məktəbin müəllimləri Axundova Diləfruz Baxşəli qızı və Hüseynova Ruqiyyə Rza qızına «Azərbaycan SSR «Əməkdar müəllimi» fəxri adı verilmiş**,** Ağamirzəyeva Mənsurə Cəlil qızı və Əhmədova Zeynəb Şirəli qızı Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri fərmanı ilə təltif olunmuşlar.[403]

180 illik yubiley ərəfəsində -2010-2011-ci tədris ilində məktəbin 30 sinif komplek tində 563 şagird təhsil almışdır. Onların təlim-tərbiyəsi ilə məşğul olan 77 nəfər müəllimdən 51 nəfəri ali təhsilli olmuşdur. Hazırda məktəbdə (2014-ci ildə) 600-dən yuxarı şagird təhsil alır. Onların təlim-tərbiyəsi ilə 100 nəfərədək müəllim məşğul olur. Müəllimlərin 80 %-i ali, 20 %-i orta ixtisas təhsillidir.

**ШӘКИ ШӘҺӘРИНДӘКИ 5 НӨМРӘЛИ ҮМУМТӘҺСИЛ МӘКТӘБИНИН АЗӘРБАЈЧАН ССР АЛИ СОВЕТИ РӘЈАСӘТ ҺЕЈ'ӘТИНИН ФӘХРИ ФӘРМАНЫ ИЛӘ ТӘЛТИФ ЕДИЛМӘСИ ҺАГГЫНДА**

АЗӘРБАЈЧАН ССР АЛИ СОВЕТИ РӘЈАСӘТ ҺЕЈ'ӘТИНИН ФӘРМАНЫ

Бөјүмәкдә олан нәслин тә'лим вә тәрбијәсиндә хидмәтләринә көрә вә јарадылмасынын 150 иллији илә әлагәдар олараг Шәки шәһәриндәки 5 нөмрәли үмумтәһсил мәктәби Азәрбајчан ССР Али Совети Рәјасәт Һеј'әтинин **Фәхри фәрманы** илә тәлтиф едилсин.

**Азәрбајчан ССР Али Совети Рәјасәт Һеј'әтинин сәдри**

**Г. ХӘЛИЛОВ**

**Азәрбајчан ССР Али Совети Рәјасәт Һеј'әтинин катиби**

**Р. ГАЗЫЈЕВА**

Бакы шәһәри, 30 сентјабр 1982-чи ил.

Müəllimlərin 90 %-ni qadınlar, 10 %-ni kişilər təşkil edir. Müəllimlərin 90%-i İKT kursundan keçmişdir.

Məktəbdə təhsil ***tələbyönümlülük, şəxsiyyətyönümlülük və nəticəyönümlülük*** prinsipi əsasında qurulmuşdur. **«Hər gün artmayan bilik, günbəgün azalır»** devizi ilə işləyən məktəbin pedaqoji kollektivi *hər bir şagirdin dövlət standartları səviyyəsində bilik və bacarıqlara yiyələnməsini təmin etmək; şagirdlərə həyati və tətbiqi bacarıqlar aşılamaq, onlarda tədqiqatçılıq bacarığını formalaşdırmaq; hər bir şagirdə fərdi yanaşmanı təmin etmək; şagirdlərin vətənpərvərlik və azərbaycançılıq ruhunda tərbiyə edilməsinə və rəqabətə davamlı yetişməsinə səy göstəmək* kimi problemlər üzərində iş aparırlar.




*Məktəbin devizini və iş prinsipini əks etdirən sxem*

Məktəb metodiki şurasının fəaliyyəti diqqətəlayiqdir. Metodiki şurada vaxtaşırı olaraq təhsilin aktual problemləri müzakirə edilir, qabaqcıl təcrübənin tətbiqi diqqət mərkəzində saxlanılır. Yeni fənn kurikulumlarının tətbiqi sahəsində uğurlar əldə olunmuşdur. Müəllimlər fənn kurikulum larının tətbiqi ilə bağlı yenilikləri izləyir, seminarlarda iştirak edir, «dəyirmi masa» lar, müzakirələr təşkil edilir.

Müəllimlərin ixtisasartırma kurslarına cəlbində məktəb fənn metodbir ləşmələri önəmli rol oynayırlar. Hər dərs ilinin sonunda tədrisin yekunları müzakirə olunur, ixtisaslar üzrə kurslara, seminarlara və treninqlərə göndəriləcək müəllimlər müəyyənləşdirilir və məktəb rəhbərliyinə məlumat verilir.

Məktəb fənn birləşmələri müəllimlərin təkmilləşdirilməsində önəmli halqanı təşkil edən dayaq məntəqələri ilə sıx əlaqə saxlayır. Azərbaycan dili və ədəbiyyatı, riyaziyyat və coğrafiya fənləri üzrə dayaq məntəqələri 5 nömrəli məktəbdə yerləşir.




*Məktəb metodki şurasının quruluşunu əks etdirən sxem*

Məktəbin maddi-texniki bazasının möhkəmləndirilməsi sahəsində əməli işlər görülmüşdür. Dövlət Proqramı xətti ilə məktəbə 15 kompüter dəsti və bir printer verilmişdir. Məktəb sürətli İnternetə (ADSL) qoşulmuş və elektron dərsliklərlə təmin olunmuşdur. Dərslərdə kompüter texnologiyalarından, elektron dərs versiyalarından istifadə edilir.

Məktəbin zəngin kitabxanası vardır. Kitabxana dünya və Azərbaycan ədəbiyyatının nümunələri, antologiyalar və ensiklopediyalarla təmin olunmuşdur. Kitab fondunun əsasını pulsuz dərsliklər təşkil edir.

Məktəbdə xarici dillərin tədrisi diqqət mərkəzindədir. Məktəb rus dilinin interaktiv tədrisi layihəsinə qoşulan 50 pilot məktəbdən biridir.

Məktəbdə fənn olimpiadalarına hazırlıq daim diqqət mərkəzində saxlanılır. Şagirdlərdən Gülər İbrahimova 2009-cu ildə, Nərmin Rəsulzadə 2010-cu ildə biologiya üzrə respublika fənn olimpiadasında IV yeri, Mədinə Məlikzadə Azərbaycan dili və ədəbiyyatı fənni üzrə 2011-ci ildə IV yeri, Günel Fəttahova fizika fənni üzrə respublika fənn olimpiadasında IV yeri tutmuşdur. Xəzər Universite-

tinin 2010-2011-ci illərdə XI siniflər arasında keçirdiyi VII, VIII olimpiadalarda Ulduz Babayeva II, Leyla Alxasova III dərəcəli diplomla təltif olunmuşlar.

5 nömrəli məktəbdə şagirdlərin fiziki tərbiyəsi daim diqqət mərkəzindədir. Şagirdlər rayon və respublika idman yarışlarında uğurla çıxış edirlər. Nəticələrə nəzər salaq:

Məktəbin şagirdləri Süleymanov Yaqub (8 yaş) – respublika şahmat birinciliyində – I yer (2011), Ələfsərli Ələfsər– Beynəlxalq karate turnirində – III yer (2011), İlyasov Elşad-sərbəst güləş idman növü üzrə şəhər turnirində – I yer (2010), Məktəbin oğlanlardan ibarət komandası stolüstü tennis idman növü üzrə şəhər birinciliyndə-I yer (2011), Məktəbin oğlanlardan ibarət komandası şahmat üzrə şəhər birinciliyndə – I yeri (2011) tutmuşlar.

Məktəbin beynəlxalq əlaqələrinin coğrafiyası ildən-ilə genişlənir. 2006-2008-ci tədris illərində «Sülh» korpusunun könüllüsü Çarli Şılt ingilis dilinin tədrisi keyfiyyətini yaxşılaşdırmaq məqsədilə məktəbin ingilis dili müəllimləri ilə birgə çalışmışdır. 2007-ci ildə rus dili müəllimi Filyar İbrahimova Moskva şəhərində MDB və Baltikyanı ölkələrin rus dili müəllimlərinin ixtisasartırma kursunda oxumuşdur. Məktəbin ingilis dili müəllimi A. Məmmədova 2011-ci ildə Böyük Britaniyada ingilis dili müəllimlərinin ixtisasartırma kursunda təcrübə keçmişdir.

Sözsüz ki, tədrisin keyfiyyətinin artırılmasına yönələn səylər öz nəticələrini ali və orta ixtisas məktəblərinə qəbulda göstərmişdir. 2008-ci ildə ali məktəblərə qəbul olunanların sayı 56 % təşkil edirdisə, 2014-cü ildə bu göstərici 70 % olmuşdur. Son illərdə məktəbi bitirən məzunlardan 18 nəfəri 600-dən yuxarı bal toplamış, 4 nəfəri Prezident təqaüdünə layiq görülmüşdür. 5 nəfər məzun yüksək bal toplayaraq dövlət hesabına xaricdə təhsil almaq hüququ qazanmışdır. Hazırda onlardan 2 nəfəri Koreyada, bir nəfəri Almaniyada, 2 nəfəri Türkiyədə təhsil alır.

Yubiley ilində-2010-2011-ci tədris ilində məktəbi bitirən 55 nəfər məzundan 2 nəfəri əla qiymətlərlə attestat almış, 26 nəfər ali məktəbə daxil olmuş, 4 nəfər 600 baldan yuxarı, 7 nəfər 500 baldan yuxarı nəticə göstərmişlər. Əla qiymətlərlə attestat almış məzunlardan **Leyla Alxasova** *685 balla Azərbaycan Tibb Universitetinə* daxil olmuş, *Prezident təqaüdünə layiq görülmüşdür*. Məzunlardan **Ulduz Babayeva** *670 balla Qafqaz Universitetinə*, **Araz Babayev** *659 balla Azərbaycan Neft Akademiyasına*, **Gülarə Paşayeva** *610 balla Tibb Universitetinə* daxil olmuşlar.

Son 10 ildə (2004-2014) məzunlardan 20 nəfər 600-dən yuxarı, 35 nəfər 550-dən yuxarı bal toplamışlar. Qəbul imtahanlarında 550 baldan yuxarı bal toplamış məzunlar aşağıdakılardır:

**2004-2005-ci tədris ili**

1.Mahmudova Sevda - 557 bal
2.Əhmədova Gülnar - 577 bal

3.Süleymanov Aqil - 642 bal
4.Abdullayev Elçin - 626 bal
5.Sadıqov Abdulkərim - 605 bal

**2005-2006-cı tədris ili**

1.Əmikişiyev Elşən-685 bal
2.Əliyeva Gülşən-616 bal
3.Qaffarov Elçin-595 bal

**2006-2007-ci tədris ili**

1. Zəkəriyyəyeva Arzu-602 bal
2.Lətifzadə Fidan-601 bal
3.Mustafayev Cavidan-587 bal

**2007-2008-ci tədris ili**

1.Əhmədzadə Xəyal-667 bal
2.Haqverdiyev Fərhad-627 bal
3.Yunusova Ülviyyə-597 bal
4.Məmmədov Pərviz-586 bal

**2008-2009-cu tədris ili**

1.Abdürəhimli Cəlil-650 bal
2.Mustafayev Nurlan-645 bal
3.Məmmədova Zərifə-642 bal
4.M.Rəhimli Adikə-642 bal
5.Səttarlı Mabud-610 bal
6.Nəsimi Səba-601 bal

**2009-2010-cu tədris ili**

1.Rəsulzadə Nailə-670 bal
2.Rəhimli Aytən-632 bal

**2010-2011-ci tədris ili**

1.Rəsulzadə Nərmin-662 bal
2.Əliyeva Zərnigar -662 bal
3.Rəhimov Təbriz-662 bal
4.Həsənzadə Türkan-563 bal
5.Kərimli Elman-560 bal

6.Məmmədov Tərlan-10 bal
7.Nüyvərzadə Süsən-503 bal

**2011-2012-ci tədris ili**

Piriyev Müşfiq Tofiq-655
Əlizadə İlahə Ələfsər-620
Balayeva Nərmin Rüfət-602
Mustafayev Nurəhməd Əhəd-591
Osmanlı Bayram Cavanşir-578 bal
Sabirzadə Gülnar Fərman-565
Rəhmanova Ləman İlham-531
Agaəliyeva Səhla Rəsul-512

**2012-2013-cü tədris ili**

Alxasova Şəhla Vasif-686
Əbdürrəhmanzadə Münəvvər Sahib-674
Zəkəryəzadə Şəlalə Namiq-673
Bəxtiyarova Rəvanə Elçin-666
Malikzadə Mədinə Səbuhi-630

**2013-2014-cü tədris ili**

Xursudova Minayə İbrahim-685
Məmmədli Elşanə Elşad-672
Fəttahova Günel Vasif-662
Müslumzadə Nicat Amil-644
Xalıqzadə Surət Şahin-613
Cəlalov Yusif Fərhad-576
Novruzov Allahverdi Fehruz-557
Abbaslı Nadir Nazim-557
Salehov Saleh Əyyub-551
Əmədov Rəhman Arzu-540
Ənvərli Əmrah Ehtibar-501

Məktəbin məzunları ana dili, fizika, riyaziyyat, kimya və digər fənlər üzrə rayon və respublika olimpiadalarında yüksək nəticə göstərmişlər.

Ümumiyyətlə, 1982-ci ildən (150 illik yubileydən sonra) 2014-cüilədək məktəbin XI sinfini 800 nəfərdən artıq məzun bitirmiş, onlardan 500 nəfərdən

çox məzun respublikamızın, 11 nəfər Türkiyənin ali məktəblərinə qəbul olunmuş, 5 nəfər ali hərbi məktəblərin tələbəsi adını qazanmışdır.

2006-cı ildə prezident təqaüdçüsü olmuş **Gülşən Əliyeva,** 2007-ci ilin prezident təqaüdçüsü olmuş **Xəyal Əhmədzadə,** 2006-cı ildə Türkiyə Respublikasında dövlət hesabına təhsil almaq hüququ qazanmış **Elşən Əmikişiyev,** 2007-ci ildə Koreya Respublikasında dövlət hesabına təhsil almaq hüququ qazanmış **Fərhad Haqverdiyev, 2008-ci ildə bu huquqa sahib olmuş Adikə Məmmədrəhimli məktəbin fəxri məzunlarıdır.**




Prezident təqaüdçüsü






P. Çinarə – 610 bal




Qəbul imtahanlarında yüksək bal toplamış şagirdlər

Əldə olunan uğurlarda məktəbin riyaziyyat müəllimi ***Mahmud Teymurov*,** fizika müəllimi ***Rahim Cabbarov***, coğrafiya müəllimi ***Dilbazi Cəlilov***, tarix müəllimi ***Bünyad İsmayılov*,** Azərbaycan dili və ədəbiyyatı müəllimi ***Anar Əzizov***, biologiya müəllimi ***Arzu İsmayılovanın*** *böyük əməyi vardır. Onlar* şagird və müəllim kollektivinin, həmçinin valideynlərin hörmətini qazanmışlar.





***Dilbazi Cəlilov***



***Mahmud Teymurov***



Məktəbdə əldə olunan müvəffəqiyyətlərdə 1986-2011-cı illərdə məktəbə rəhbərlik etmiş **İdris Surxayevin** xüsusi əməyi olmuşdur.

**Surxayev İdris Abduləlim oğlu** *1936-cı ildə Nuxa rayonunun Oxut kəndində anadan olmuşdur. Oxut kənd məktəbini gümüş medalla başa vuran İdris Surxayev ADPU-nun fizika fakultəsini bitirmiş, 1961-1970-ci illərdə Şəki şəhər 11 nömrəli məktəbdə, 1970-1983-cü illərdə 19 nömrəli məktəbdə müəllim, direktor müavini, direktor, 1983-1986-cı illərdə 5 №li məktəbdə direktor müavini və 1986-cı ildən həmin məktəbdə direktor vəzifələrində işləmişdir. Şəkinin tanınmış fizika müəllimi olan İdris Surxayev Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin, Azərbaycan SSR Maarif Nazirliyinin Fəxri fərmanları ilə təltif olunmuş, 2011-ci ildə vəfat etmişdir***.**

2011-ci ildə məktəbə **F. İbrahimova** direktor təyin edilmişdir.

## Tanıtma:

**İbrahimova Filyar** ***Oruc qızı 1962-ci il yanvar ayının 10-da Nuxa rayonunun Orta Zəyzid kəndində anadan olmuşdur.***

***1979-cu ildə Orta Zəyzid kənd orta məktəbini bitirmişdir. 1980-cı ildə Bakı Slavyan Universitetinə (keçmiş M.F.Axundov adına Azərbaycan Pedaqoji Rus dili və Ədəbiyyatı İnstitutu) daxil olmuş, 1985-ci ildə institutu fərqlənmə diplomu ilə bitirdikdən sonra təyinatla Şəki şəhər 43 №li Texniki Peşə məktəbinə göndərilmiş və ixtisası üzrə müəllim təyin edilmişdir.***



***1992-ci ildə Şəki şəhər Təhsil Şöbəsinə metodist vəzifəsinə irəli çəkilən F.İbrahimova fəaliyyəti dövründə xarici dilin (rus dilinin) daha səmərəli yollarla mənimsənilməsinə dair maraqlı təcrübələr aparmış, qabaqcıl təcrübənin öyrənilib yayılması sahəsində fərqlənmişdir. O, 2007-ci ilin avqust ayında Moskva şəhərində Moskva Açıq Təhsil İnstitutunda MDB və Baltikyanı ölkələrinin rus dili müəllimlərinin ixtisasartırma kursunda iştirak etmişdir.***

*Filyar İbrahimova 2014-cü ildə «Azərbaycan Respublikasının Əməkdar müəllimi» fəxri adına layi görülmüşdür.*

**2011-ci il dekabrın 30-da Nuxa (Şəki) qəza məktəbinin təsis olunmasının 180 ili tamam olmuşdur.** Məktəbin yubileyi ilə əlaqədar Şəki Şəhər İcra Hakimiyyətinin başçısı Elxan Usubov sərəncam vermiş, yubileylə əlaqədar təşkilat komitəsi yaradılmışdır. Sərəncama əsasən məktəbin binasında əsaslı təmir işlərinə, əlavə tədris korpusunun tikilməsinə başlanmışdır.

Şəhər İcra Hakimiyyətinin sərəncamını əldə rəhbər tutan Şəki Şəhər Təhsil Şöbəsi yubileyin təşkili üçün Təşkilat komitəsi formalaşdırmış, geniş tədbirlər planı tərtib etmiş, plan təlim-tərbiyə müəssisələrinin rəhbərlərinin iştirakı ilə Təhsil Şurasında müzakirə olunmuş, hər bir tədris müəssisəsinə konkret tapşırıqlar verilmişdir. Görüləcək işlər sırasına qəza məktəbinin tarixinə dair monoqrafiyanın yazılması, müsabiqələrin keçirilməsi, qabaqcıl məktəblərin, müəllimlərin və məktəblilərin müəyyənləşdirilməsi və s. daxil edilmişdir.

Yubiley ərəfəsində məktəb daha bir uğura imza atmışdır. Azərbaycan Respublikası Prezidenti İ.Əliyevin 20 iyun 2012-ci il tarixli «2011/2012-ci il tədris ilində keçirilmiş «Ən yaxşı ümumi təhsil müəssisəsi» qaliblərinin mükafatlandırılması haqqında» Sərəncamına əsasən ***5 nömrəli məktəb «Ən yaxşı ümumi təhsil müəssisəsi» müsabiqəsinin qalibi*** olmuşdur.




*Şəki rayonunun xəritəsi*

## Tanıtma:

## 3.1.Şəkinin kəndləri (qəsəbələri)

**Abbas, Aran, Aşağı Daşağıl, Aşağı Göynük, Aşağı Kəldək, Aşağı Künküt, Aşağı Laysqı, Aşağı Şabalud, Aydınbulaq, Babaratma, Baqqal, Baltalı, Baş Göynük, Baş Kəldək, Baş Künküt, Baş Laysqı, Baş Şabalud, Baş Zəyzid, Bideyiz, Birinci Biləcik, Bolludərə, Böyük Dəhnə, Cəfərabad, Cəyirli, Cumakənd, Cunud, Çapağan, Çayqaraqoyunlu, Çeşməli, Çələbixan (qəsəbə), Çolaqlı, Daşbulaq, Daşüz, Dərəcənnət, Əliyar, Fazıl, Göybulaq, İbrahim kənd, İkinci Biləcik, İnçə, Kəhrizoba, Kiçik Dəhnə, Kiş, Kosalı, Köbər Zəyzid, Köndələn, Küdürlü, Qaradağlı, Qaratorpaq, Qırxbulaq, Qayabaşı, Qızılarx, Qoxmuq, Qozlubulaq, Qudula, Qumux, Oxut, Oraban, Orta Zəyzid, Öryət, Sarıca, Selbasan, Suçma, Şəki kəndi, Şin, Şirinbulaq, Şorsu, Təpəcənnət, Turan (qəsəbə), Vərəzət, Zunud**

## 3.2. Məktəbəqədər təhsil müəssisələri və ümumi təhsil məktəbləri

### *3.2.1. Məktəbəqədər müəssisələr*

1.Şəki şəhər 1 nömrəli uşaq bağçası
2.Şəki şəhər 2 nömrəli uşaq bağçası
3.Şəki şəhər 3 nömrəli uşaq bağçası
4.Şəki şəhər 4 nömrəli uşaq bağçası
5.Şəki şəhər 5 nömrəli uşaq bağçası
6.Şəki şəhər 6 nömrəli uşaq bağçası
7.Şəki şəhər 7 nömrəli uşaq bağçası
8.Şəki şəhər 8 nömrəli uşaq bağçası
9.Şəki şəhər 9 nömrəli uşaq bağçası
10.Şəki şəhər 10 nömrəli körpələr evi-uşaq bağçası
11.Şəki şəhər 11 nömrəli uşaq bağçası
12.Şəki şəhər 14 nömrəli uşaq bağçası
13.Şəki şəhər 15 nömrəli uşaq bağçası
14.Şəki şəhər 16 nömrəli uşaq bağçası
15.Şəki şəhər 17 nömrəli uşaq bağçası
16.Şəki şəhər 18 nömrəli uşaq bağçası
17.Şəki şəhər 19 nömrəli körpələr evi-uşaq bağçası
18.Şəki şəhər 20 nömrəli uşaq bağçası
19.Şəki şəhər 21 nömrəli uşaq bağçası
20.Şəki şəhər 22 nömrəli uşaq bağçası
21.Şəki şəhər 23 nömrəli uşaq bağçası
22.Şəki şəhər 24 nömrəli uşaq bağçası
23.Şəki şəhər 25 nömrəli uşaq bağçası
24.Şəki şəhər 26 nömrəli uşaq bağçası

25.Şəki şəhər 27 nömrəli uşaq bağçası
26.Şəki şəhər 28 nömrəli körpələr evi-uşaq bağçası
27.Şəki şəhər 29 nömrəli uşaq bağçası
28.Şəki şəhər 30 nömrəli uşaq bağçası
29.Oxut kənd uşaq bağçası
30.Qoxmuq kənd uşaq bağçası
31.Inçə kənd uşaq bağçası
32.Baltalı kənd uşaq bağçası
33.Aşağı Göynük kənd uşaq bağçası
34.Selbasan kənd uşaq bağçası
35.Baş Layısqı kənd körpələr evi-uşaq bağçası
36.Şin kənd uşaq bağçası
37.Baş Göynük kənd körpələr evi-uşaq bağçası
38.Cumakənd kənd körpələr evi-uşaq bağçası
39.Şorsu kənd uşaq bağçası
40.Daşbulaq kənd uşaq bağçası
41.Göybulaq kənd uşaq bağçası
42.Daşüz kənd uşaq bağçası
43.Çələbixan qəsəbə uşaq bağçası
44.Göybulaq kənd uşaq bağçası
45.Cəfərabad kənd körpələr evi-uşaq bağçası
46.Kiçik Dəhnə kənd uşaq bağçası
47.Böyük Dəhnə kənd körpələr evi-uşaq bağçası
48.Aran kənd uşaq bağçası
49.Şəki kənd körpələr evi-uşaq bağçası
50.Turan qəsəbə uşaq bağçası
51.Cəyirli kənd uşaq bağçası
52.Qayabaşı kənd uşaq bağçası
53.Sarıca kənd uşaq bağçası
54.Bolludərə kənd uşaq bağçası
55.Qaratorpaq kənd körpələr evi-uşaq bağçası
56.Aydınbulaq kənd körpələr evi-uşaq bağçası
57.Öryət kənd uşaq bağçası
58.Baş Zəyzid kənd uşaq bağçası
59.Çeşməli kənd uşaq bağçası
60.Aşağı Küngüt uşaq bağçası
61.Orta Zəyzid kənd uşaq bağçası
62.Kiş kənd uşaq bağçası

### *3.2.2.Ümumtəhsil məktəbləri*

**Şəhər məktəbləri:**

1 № li tam orta məktəb
2 № li tam orta məktəb
3 № li tam orta məktəb
4 № li tam orta məktəb
5 № li tam orta məktəb
6 № li tam orta məktəb
7 № li tam orta məktəb
8 № li beynəlmiləl tam orta məktəb
9 № li tam orta məktəb
10 № li tam orta məktəb
11 № li tam orta məktəb
12 № li tam orta məktəb
14 № li tam orta məktəb
17 № li tam orta məktəb
18 № li tam orta məktəb
19 № li tam orta məktəb
20 № li tam orta məktəb
21 № li tam orta məktəb
Şəhər fizika-riyaziyyat və humanitar təmayüllü lisey
Şəhər qarışıq tipli internat məktəbi

**Qəsəbə məktəbləri**

Turan qəsəbə tam orta məktəbi
Çələbixan qəsəbə tam orta məktəbi

**Kənd məktəbləri:**

1.Aşağı Layısqı kənd tam orta məktəbi
2.Aşağı Göynük kənd tam orta məktəbi
3.Aşağı Küngüt kənd tam orta məktəbi
**4.**Aydınbulaq kənd tam orta məktəbi
5.I Biləcik kənd tam orta məktəbi
6.II Biləcik kənd tam orta məktəbi
7.Baş Küngüt kənd tam orta məktəbi
8.Baş Şabalıd kənd tam orta məktəbi
9.Baş Zəyzid kənd tam orta məktəbi
10.Baş Layısqı kənd tam orta məktəbi
11.Baş Göynük kənd 1№ li tam orta məktəbi
12.Baş Göynük kənd 2 №li tam orta məktəbi

13.Böyük Dəhnə kənd 1 №-li tam orta məktəbi
14.Böyük Dəhnə kənd 2 №-li tam orta məktəbi
15.Baltalı kənd tam orta məktəbi
16.Bolludərə kənd tam orta məktəbi
17.Bideyiz kənd tam orta məktəbi
18.Cəfərabad kənd tam orta məktəbi
20.Cumakənd kənd tam orta məktəbi
21.Cunud kənd tam orta məktəbi
22.Çayqaraqoyunlu kənd tam orta məktəbi
23.Çeşməli kənd tam orta məktəbi
24.Daşüz kənd tam orta məktəbi
25.Dərəcənnət kənd tam orta məktəbi
26.İnçə-Zunud kənd tam orta məktəbi
27.İbrahimkənd kənd tam orta məktəbi
28.Kiş kənd 1 №-li kənd tam orta məktəbi
29.Kiş kənd 2 №-li kənd tam orta məktəbi
30.Kiş kənd 4 №-li kənd tam orta məktəbi
31.Kiçik Dəhnə kənd 1№ li tam orta məktəbi
32.Kiçik Dəhnə kənd 2№ li tam orta məktəbi
33.Köbər Zəyzid kənd tam orta məktəbi
34.Köndələn kənd tam orta məktəbi
35.Qayabaşı  kənd tam orta məktəbi
36.Qaratorpaq kənd tam orta məktəbi
37.Qozlubulaq kənd tam orta məktəbi
38.Qoxmuq kənd tam orta məktəbi
39.Qudula kənd tam orta məktəbi
40.Qumux kənd tam orta məktəbi
41.Orta Zəyzid kənd 1№ - li tam orta məktəbi
42.Orta Zəyzid kənd 2№ - li tam orta məktəbi
43.Oraban kənd tam orta məktəbi
44.Oxut kənd tam orta məktəbi
45.Sarıca kənd tam orta məktəbi
46.Süçma kənd tam orta məktəbi
47.Şəkikənd kənd tam orta məktəbi
48.Şorsu kənd tam orta məktəbi
49.Şin kənd ümumi orta məktəbi
50.Vərəzət kənd tam orta məktəbi
51.Aşağı Şabalıd kənd tam orta məktəbi
52.Aşağı Daşağıl  kənd tam orta məktəbi
53.Aran kənd ümumi orta məktəbi
54.Baş Kəldək kənd ümumi orta məktəbi

55.Babaratma kənd ümumi orta məktəbi
56.Baqqal kənd ümumi orta məktəbi
57.Çapağan kənd ümumi orta məktəbi
58.Daşbulaq kənd ümumi orta məktəbi
59.Dəryaçay kənd ümumi orta məktəbi
60.Əliyar kənd ümumi orta məktəbi
61.Fazıl kənd ümumi orta məktəbi
62.Göybulaq kənd ümumi orta məktəbi
63.Küdürlü kənd ümumi orta məktəbi
64.Qaradağlı kənd ümumi orta məktəbi
65.Qırxbulaq kənd ümumi orta məktəbi
66.Oxut kənd ümumi orta məktəbi
67.Vərəzət kənd köçkünlər ümumi orta məktəbi
68.Yeni Göynük kənd ümumi orta məktəbi
69.Öryət kənd ümumi orta məktəbi
70.Təpəcənnət kənd ümumi orta məktəbi
71.Şirinbulaq kənd ümumi orta məktəbi
72.Selbasan kənd ümumi orta məktəbi
73.Aşağı Göynük kənd ibtidai məktəbi
74.Baş Küngüt  kənd köçkünlər ümumi orta məktəbi
75.Kiş kənd 3 №- li ümumi orta məktəbi
76.Salmandərə kənd ümumi orta məktəbi

## 3.3.Təhsil sahəsində islahatlar: uğurlar, perspektivlər

XXI əsrin astanasında öz müstəqilliyini və yeni iqtisadi quruluşda yaşamaq qismətini əldə etmiş Azərbaycan xalqı böyük şəxsiyyət, prezident Heydər Əliyevin rəhbərliyi altında dövlət quruculuğu sahəsində ölkənin gələcəyinə, onun strateji məqsədlərinə yönəldilmiş işlərin ardıcıllıqla həyata keçirilməsinə başlanmışdır.

Azərbaycan təhsili H.Əliyevin xalqın tələbi ilə ikinci dəfə hakimiyyətə qayıdışından sonrakı dövrdə də diqqət mərkəzində olmuşdur.1995-2001-ci illərdə müəllimlərin əmək haqqlarının 9 dəfə artırılması, 6 aparıcı ali məktəbə maliyyə müstəqilliyi verilməsi, 2 yeni ali məktəbin yaradılması, 7 ali məktəbə «universitet» statusu verilməsi, 300 nəfərdən artıq təhsil işçisinin orden və medallarla, fəxri adlarla təltif olunması, istedadlı uşaq və gənclərin maddi və mənəvi həvəsləndirilməsi üçün «Qızıl kitab» ın təsis edilməsi təhsil sisteminin inkişafına dövlət qayğısının təzahürüdür.

Əsası ulu öndər H.Əliyev tərəfindən qoyulmuş siyasi və iqtisadi inkişaf kursunun ölkə prezidenti İlham Əliyev tərəfindən uğurla davam etdirilməsi nəticəsidir ki, digər sahələrdə olduğu kimi, təhsil sahəsində də uğurlu nəticələr əldə

olunmuşdur. Təhsilə olan qayğının təzahürü təhsil sisteminə ayrılan xərclərdə özünün göstərir. 2003-cü illə müqayisədə bu xərclər 6 dəfədən çox artaraq 2010-cu ildə 1,2 milyard manata çatmışdır. Ölkə prezidenti tərəfindən 2009/2010-cu tədris ilində təhsillə bağlı 45 sərəncam və 3 fərman imzalanmış, 2009-cu ildə 470 nəfərin, 2010-cu ildə isə 200-dən çox təhsil işçisinin əməyi qiymətləndirilmişdir. Son üç ildə «Ən yaxşı müəllim» və «Ən yaxşı ümumi təhsil məktəbi» müsabiqəsinin qalibi olmuş 300 müəllimə və 150 məktəbə yüksək mükafatlar verilmişdir.[404]

Müstəqillik illərində ölkədə təhsillə bağlı 16 inkişafyönümlü dövlət proqramı təsdiq olunmuşdur. Son 20 ildə bir məktəbəqədər təhsil müəssisəsi tikilmədiyi halda, təkcə 2009-2010-cu illərdə ölkə üzrə 31 uşaq bağçası tikilib istifadəyə verilmiş, 37 məktəbəqədər təhsil müəssisəsi əsaslı təmir olunmuş, 134 müəssisə avadanlıqlarla təmin edilmişdir.

Son illərdə Azərbaycanda 200-dən artıq məktəb yenidən tikilmiş, əlavə korpuslar inşa edilmiş və əsaslı təmir olunmuşdur. Bu sahədə Heydər Əliyev Fondu müstəsna xidmətlər göstəmişdir.

2009-cu ildə 68 yeni məktəb binası və əlavə korpuslar tikilmiş, 28 məktəb əsaslı təmir olunmuş, 87 məktəbin istilik sistemi bərpa edilmişdir. 2010-cu ildə 17.434 yerli 49 yeni məktəb inşa edilmiş, 10 məktəb üçün 1.418 yerlik əlavə korpuslar tikilmiş, 7 məktəb əsaslı təmir edilmiş, 356 məktəbdə təmir işləri aparılmış, 6.980 yerlik 25 məktəb binasının tikintisinə başlanılmışdır. Müvafiq proqrama əsasən 2005-2010-cu illərdə 1100 məktəb zəruri avadanlıqlarla təmin olunmuşdur.[405]

Məlum olduğu kimi, 2008-2009-cu tədris ilində ümumtəhsil məktəblərinin I siniflərində tədrisə yeni fənn kurikulumları və müasir dərsliklərlə başlanmış, hazırda bu proses davam edir. Yeni məzmuna keçidlə əlaqədar olaraq yeni nəsil dərsliklərin hazırlığı diqqət mərkəzində olmuşdur. 2010-2011-ci tədris ili üçün 127 adda 4,6 milyon nüsxədə dərslik və müəllim üçün metodik vəsait çap olunmuşdur. Məktəb kitabxanalarına 140 adda 1,4 milyon nüsxə tədris – əyani vəsait verilmişdir.

Təhsilin informasiyalaşdırılması sahəsində həyata keçirilən tədbirlər ürəkaçandır. Təhsil tariximizdə ilk dəfə olaraq fənlər üzrə elektron tədris resursları hazırlanaraq məktəblərə verilmiş, 20 məktəbdə «Elektron məktəb» layihəsi həyata keçirilməyə başlanmış, həmin məktəblərə 300 kompüter, 336 ədəd netbuk verilmiş, məktəblər fiberoptik kabel vasitəsi ilə «Azərbaycan təhsil şəbəkəsi»nə qoşulmuş və onların yüksək sürətli internetə çıxışı təmin olunmuşdur.

Təhsildə yeni sistemə keçid kadr təminatı sahəsində islahatların həyata keçirilməsini gündəmə gətirmişdir. Kadr təminatı sahəsində 2005-2009-cu illəri əhatə edən Proqramın icrası başa çatdırılmış, ümummilikdə 6.179 müəllim stimullaşdırıcı tədbirlər tətbiq edilməklə ucqar kənd yerlərinə göndərilmişdir.

Müstəqillik illərində peşə təhsilinə marağın artması səbəbli bu sahəyə maliyyə vəsaiti artırılmış, 11 texniki peşə təhsili məktəbi əsaslı təmir edilmiş və zəruri avadanlıqlarla təmin olunmuşdur.

Ali təhsil sahəsində nəzərəçarpacaq nailiyyətlər əldə edilmişdir. Azərbaycan Boloniya prosesinə qoşulmuş, 23 ali təhsil müəssisəsi akkredi tassiyadan keçirilmiş, bütün ali təhsil müəssisələrində kredit sistemi tətbiq edilmişdir. Dünya Bankı tərəfindən son 10 ildə təhsil sahəsindəki əməkdaşlıq və həyata keçirilən uğurlu islahatlar nəzərə alınaraq Azərbaycan pilot ölkəsi kimi müəyyənləşdirilmiş, Azərbaycan təcrübəsinin öyrənilməsi tövsiyə olunmuşdur.

Son illərin ən mühüm hadisələrindən biri də, «Təhsil haqqında» Azərbaycan Respulikasının Qanununun qəbul edilməsi olmuşdur. Təhsil sahəsində əməkdaşlığın genişləndirilməsi, Avropa İttifaqı, Avropa Şurası, YUNESCO, İSESCO, BMT kimi nüfuzlu beynəlxalq təşkilatlarla birgə layihələr həyata keçirilməsi, xarici ölkələr və beynəlxalq təşkilatlarla təhsil sahəsində imzalanmış saziş və protokolların həyata keçirilməsi Azərbaycan təhsilinə əlavə sərmayələrin cəlbinə imkan yaratmışdır. BMT-nin İnsan İnkişafına dair hesabatında 2005-ci ildə Azərbaycan 101-ci yerdə olmuşdursa, 2010-cu ildə 67-ci yerə yüksəlmişdir. Azərbaycanda savadlılıq səviyyəsi 99,5 %, ibtidai təhsillə əhatə səviyyəsi 116,2 %, orta təhsillə əhatə səviyyəsi 96 % təşkil edir.[406]

Dövlətin strateji məqsədlərinə yönəldilmiş işlərdən biri də Təhsil İslahatıdır. 1999-cu il iyunun 15-də «Azərbaycan Respublikasının Təhsil sahəsində İslahat Proqramı» imzalanmışdır. Ümummilli lider bu proqramı imzalamaqla bir daha sübut etdi ki, təhsil millətin inkişafının başlıca istiqamətlərindən biridir.

«Azərbaycan Respublikasının Təhsil sahəsində İslahat Proqramı» **ümumi şərh**dən, giriş və ***4 bölmədən*** ibarətdir. **«Respublikada təhsil sisteminin real vəziyyəti»** adlanan ***birinci bölmədə*** respublikamızın təhsil sisteminin indiki vəziyyəti ətraflı şərh olunmuş və islahat aparılacaq bütün istiqamətlərin problemlərinin şərhi verilmişdir.

***II bölmə*** **«İslahatların əsas istiqamətləri**» adlanır. Burada təhsil sisteminin strukturunda, təlimin və tərbiyənin məzmununda, kadr hazırlığı və təminatında, təhsil sisteminin informasiya, tədris və elmi-metodiki təminatında, təhsil sisteminin idarə olunmasında, onun maddi-texniki bazasının təkmilləşdirilməsi sahəsində aparılacaq islahatlar və onların istiqamətləri əhatə olunmuşdur.

***III bölmədə*** **«Proqramın həyata keçirilməsi tədbirləri»** öz əksini tapmışdır. **«Gözlənilən nəticələr»** adlanan ***IV bölmədə*** islahat proqramının tam həcmdə həyata keçirilməsi, əldə ediləcək yekun nəticələr şərh olunmuşdur.

«Azərbaycan Respublikasının Təhsil sahəsində İslahat Proqramı» nı və «Təhsil haqqında Azərbaycan Respublikası Qanunu»nu əldə rəhbər tutan və həyata keçirilməsi üçün tədbirlər müəyyənləşdirən **Şəkinin təhsil işçiləri** son illərdə təlimin keyfiyyətinin yüksəldilməsi sahəsində xeyli iş görmüşlər. Odur ki, bu sahədə əldə olunmuş nailiyyətlərin xronoloji ardıcıllıqla oxucuların nəzərinə çatdırılması məqsədəmüvafiq hesab edilmişdir.

**1999/2000-ci tədris ilində** Şəkidə 65 orta, 23 əsas, 7 ibtidai məktəb fəaliyyət göstərmişdir. 87 məktəbdə dərslər Azərbaycan dilində, 4 məktəbdə isə Azərbaycan və rus dillərində tədris olunmuşdur. 1876 sinifdə 32.185 şagird təhsilə cəlb edilmişdir ki, onlardan 3.396 nəfəri I siniflərə, 1.784 nəfəri X siniflərə

qəbul olunanlardır. Şəhər orta ümumtəhsil internat məktəbi nəzdində əqli və fiziki cəhətdən qüsurlu uşaqlar üçün 9 sinif təşkil olunmuş və 37 nəfər şagird təhsillə əhatə olunmuşdur. 30 gündüz ümumtəhsil məktəbinin nəzdində 1.261 nəfər şagird axşam-qiyabi və qiyabi siniflərdə və qruplarda təhsillə əhatə olunmuşlar.[407]

Şəki ŞTŞ üzrə **1999-2000-ci tədris ili** üçün məktəb şəbəkəsi aşağıdakı kimi olmuşdur.[408]

**Cədvəl 3.3.1**

| Sıra №si | Göstəricilər | şəhər | kənd | cəmi |
|---|---|---|---|---|
| 1 | Gündüz ümumtəhsil məktəb lərinin sayı | 23 | 72 | 95 |
| | O cümlədən: | | | |
| | ibtidai | 1 | 6 | 7 |
| | əsas | - | 24 | 24 |
| | orta | 22 | 44 | 66 |
| 2 | Məktəblərin ümumi sayından internat | 1 | - | 1 |
| 3 | Cəmi sinif komplektləri | 671 | 1205 | 1876 |
| | O cümlədən: | | | |
| | hazırlıq | - | 6 | 6 |
| | I-IV siniflər | 273 | 519 | 792 |
| | V-IX siniflər | 310 | 533 | 863 |
| | X-XI siniflər | 88 | 129 | 217 |
| 4 | Gündüz məktəblərində şagirdlərin sayı-cəmi | 12.256 | 20.559 | 32.815 |
| | O cümlədən: | | | |
| | hazırlıq siniflərində | - | 94 | 94 |
| | I-IV siniflərdə | 5.089 | 8.847 | 13.936 |
| | V-IX siniflərdə | 5.812 | 9.541 | 15.353 |
| | X-XI siniflərdə | 1.355 | 2.077 | 3.432 |
| 5 | Şagirdlərin ümumi sayından internat məktəblərində oxu-yanların sayı-cəmi | 98 | - | 98 |
| 6 | Birsinifli komplektin orta sıxlığı | 18,3 | 17,03 | 17,5 |
| 7 | Xüsusi məktəblərin sayı | - | - | - |

| | | | | |
|---|---|---|---|---|
| 8 | Məktəbyanı internatların sayı<br>Onlarda şagirdlərin sayı<br>Bunlardan tam dövlət təmina tında olan uşaqların sayı | 2<br>70<br><br>70 | -<br>-<br><br>- | 2<br>70<br><br>70 |
| 9 | Günüuzadılmış məktəblərin sayı | - | - | - |
| 10 | Məktəblərin nəzdində günüuzadılmış qrupların sayı<br><br>Onlarda uşaqların sayı | 17<br><br>341 | 47<br><br>955 | 64<br><br>1256 |
| 11 | Axşam (növbəli) ümumtəhsil məktəblərinin sayı | - | - | - |
| 12 | Gündüz ümumtəhsil məktəbləri nəzdində axşam (əyani-qiyabi) siniflərin sayı<br>Onlarda şagirdlərin sayı | 22<br><br>336 | 68<br><br>925 | 90<br><br>1261 |
| 13 | Gündüz məktəblərinin və ya internat məktəblərin nəzdində əqli və fiziki cəhətdən qüsurlu uşaqlar üçün açılmış sinif komplektlərinin sayı<br>Onlarda uşaqların sayı | 9<br><br>57 | -<br><br>- | 9<br><br>57 |

1999/2000-ci tədris ilində məktəbəqədər müəssisələrin işi diqqətdə saxlanılmışdır. İlk növbədə bu müəssisələrin maddi-texniki bazasının yaxşılaşdırılması və şəbəkəsinin genişləndirilməsi, azyaşlı uşaqların təlim-tərbiyəsi və onların sağlamlığının qorunub saxlanılması sahəsində tədbirlər həyata keçirilmişdir.

Məlum olduğu kimi, 1998/99-cu tədris ilində bir neçə rayonun, o cümlədən Şəkinin ümumtəhsil məktəblərinin XI sinif şagirdlərinin respublikada ilk dəfə olaraq ədəbiyyat, kimya, Azərbaycan tarixi, cəbr və analizin başlanğıcı fənnindən test üsulu ilə imtahan vermələri müəyyənləşdirilmiş və 2000-ci il iyunun 5-də test üsulu ilə imtahan vermişlər.

1999/2000-ci tədris ilinin nəticələrinə görə Şəki ŞTŞ-nin tabeliyində olan ümumtəhsil orta məktəblərini bitirən 1.856 məzun attestat, IX sinfi bitirən 2.083 nəfər şəhadətnamə almışdır. Təhsildə göstərilən yüksək nəticəyə görə 13 məzun fərqlənmə attestatına, 7 nəfər fərqlənmə şəhadətnaməsinə layiq bilinmişdir.

İmtahan nəticələri ümumilikdə qənaətbəxş olsa da, bəzi nəticələr sevindirici olmamışdır. Belə ki, imtahana buraxılan 1.978 nəfər şagirddən 111 nəfəri imtahana gəlməmiş, 12 nəfər imtahanlardan qeyri-kafi qiymət almışlar. Ən uğursuz nəticə Azərbaycan tarixi fənni üzrə qeydə alınmışdır. İmtahan verən 1.978 nəfərdən 720 nəfər Azərbaycan tarixi fənnini seçməmiş, 8 nəfər həmin fənndən «2» qiymət almışdır[409]. Dərs ilinin yekunlarına görə, 218 nəfər payız imtahanına qalmış, 283 nəfər təkrar sinifdə saxlanılmışdır.

Yuxarıda bəhs olunan tədris ilində olimpiadaların respublika turunda Şəkinin məktəbliləri fəal iştirak etmiş və mükafata layiq yerlər tutmuşlar. Şagirdlərdən 2 nəfəri I dərəcəli, 2 nəfəri II dərəcəli, 4 nəfəri III dərəcəli diplom, 6 nəfər isə fəxri fərmana layiq görülmüşlər. Şəki Özəl Türk liseyinin şagirdləri Allahverdiyev Rasim İlkin oğlu fizika fənni üzrə, Rüstəmov Fəryaz Rüstəm oğlu kimya fənni üzrə I dərəcəli, Əfəndiyev Məzahir Mahir oğlu informatika, Məmmədov Zaur Nizami oğlu kimya fənni üzrə II dərəcəli, Şəki fizika-riyaziyyat və humanitar təmayüllü liseyin şagirdi Mikayılov Elmar Həmid oğlu Azərbaycan tarixi fənni üzrə II dərəcəli diplom almışlar.[410]

Şagirdlərin ali məktəblərə daxil olmasında da irəliləyiş olmuşdur. Şəki şəhər fizika-riyaziyyat və humanitar təmayüllü liseyin məzunlarından 38 nəfəri, Şəki Özəl Türk liseyinin məzunlarından 38 nəfəri, şəhər 10 və 11 nömrəli orta məktəblərin məzunlarından 20 nəfəri ali məktəblərə daxil olmuşlar. Ali məktəblərə qəbulun yekunlarına dair TQDK-nın təhlilindən aydın olur ki, ali məktəblərə qəbul zamanı 5, 18, 19 nömrəli şəhər, Kiçik Dəhnə 1 və 2 nömrəli, Orta Zəyzid, Aşağı Köynük, Qayabaşı, Bideyiz kənd məktəblərinin məzunları sanballı bilik nümayiş etdirmişlər.

Ayrı-ayrı məzunların topladığı bal sevindirici olmuşdur. Belə ki, Şəki Özəl Türk liseyinin məzunu Məmmədov Zaur Eldar oğlu 667 bal toplayaraq BDU-nun beynəlxalq iqtisadi münasibətlər fakültəsinə, Şəki fizika-riyaziyyat və humanitar təmayüllü liseyin məzunu Nadirov Anar Yunus oğlu 618 bal toplayaraq Azərbaycan Dövlət İqtisad Universitetinin ümumi iqtisadiyyat fakültəsinə, yenə həmin liseyin məzunu Əzimova Günel Arif qızı 619 bal toplayaraq Azərbaycan Tibb Universitetinin müalicə işi fakültəsinə, Aşağı Göynük kənd orta məktəbinin məzunu Əhmədov Mübariz Tahir oğlu 590 bal toplayaraq Azərbaycan Respublikası Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının hüquqşünaslıq fakültəsinə daxil olmuşlar.[411]

Göründüyü kimi, 1999/2000-ci tədris ilində təlimin keyfiyyətinin yaxşılaşdırılması, kadrlara olan tələbkarlığın artırılması nəticəsində yüksək nailiyyətlər əldə olunmuşdur. Lakin təhlillər göstərir ki, əldə olunan müvəffəqiyyətlər əslində bir qrup məktəbin hesabına əldə olunmuşdur[412]. Məsələn, 65 orta məktəbdən 25-dən **bir nəfər** də olsa ali məktəblərə qəbul olmamışdır. Eyni göstəricilər olimpiadalarda iştiraka da aiddir.

Məktəblərin ixtisaslı müəllimlərə olan ehtiyacının ödənilməsi məqsədilə Respublika Təhsil Nazirliyinə 25 ixtisas üzrə 72 nəfər müəllim sifariş verilmişdir. Müəllimlərin ixtisasının artırılması, yenidən hazılanması və təkmilləşdirilməsi məsələləri diqqətdə saxlanmış, 292 nəfər müəllim ixtisasartırma kurslarından keçirilmişdir.

Müəllimlər müxtəlif layihələrdə, müsabiqə və treninqlərdə iştirak etmişlər. Şəhər 10 nömrəli məktəbin ingilis dili müəllimi Ziyafət Məmmədova Azərbaycan Açıq Cəmiyyətinin «Debat» proqramı üzrə ingilis dilində keçirilən seçmə turnirdə iştirak etmiş, 20 nömrəli məktəbin fransız dili müəllimi Əsmayə Əkbərova Fransanın Bezanson şəhərindəki «Beynəlxalq dilçilik mərkəzi»ndə

fransız dilinin tədrisinin qabaqcıl metodikasını öyrənmək məqsədilə bir aylıq kursda olmuş, attestat almışdır. Tədris ili müddətində «İlin ən yaxşı metod birləşməsi» müsabiqəsi keçirilmiş, şagirdlər «Şəhidlər unudulmur», «Doğma Vətən», «Böyük Vətən müharibəsində Qələbənin 55 illiyi» müsabiqələrində müvəffəqiyyətlə iştirak etmişlər.

**2000/2001-ci tədris ilində** Şəkidə 96 gündüz ümumtəhsil məktəbi, o cümlədən 66 orta, 24 əsas, 6 ibtidai məktəb fəaliyyət göstərmişdir. 93 məktəbdə dərslər Azərbaycan dilində, 4 məktəbdə isə Azərbaycan və rus dillərində tədris olunmuşdur. 1.913 sinifdə 33.105 şagird təhsilə cəlb edilmiş, onlardan 3.373 nəfər I siniflərə, 1.423 nəfəri X siniflərə qəbul olunmuşdur. Şəhər orta ümumtəhsil internat məktəbi nəzdində əqli və fiziki cəhətdən qüsurlu uşaqlar üçün 9 sinif təşkil edilmiş və 57 şagird orada təhsillə əhatə olunmuşdur. 31 gündüz ümumtəhsil məktəbi nəzdində 1.162 nəfər şagird axşam və qiyabi təhsil sinifləri və qruplarında oxumuşlar.

Şəki ŞTŞ üzrə 2000-2001-ci tədris ili üçün məktəb şəbəkəsi aşağıdakı kimi olmuşdur.[413]

**Cədvəl 3.3. 2**

| Sıra №si | Göstəricilər | şəhər | kənd | cəmi |
|---|---|---|---|---|
| 1 | Gündüz ümumtəhsil məktəb lərinin sayı<br>O cümlədən:<br>ibtidai<br>əsas<br>orta | 23<br><br>1<br>-<br>22 | 53<br><br>5<br>24<br>44 | 96<br><br>6<br>24<br>66 |
| 2 | Məktəblərin ümumi sayından internat | 1 | - | 1 |
| 3 | Cəmi sinif komplektləri<br>o cümlədən:<br>hazırlıq | 672<br>- | 1241<br>7 | 1913<br>7 |
| | I-IV siniflər | 262 | 509 | 771 |
| | V-X siniflər | 328 | 602 | 930 |
| | X-XI siniflər | 82 | 123 | 205 |
| 4 | Gündüz məktəblərində şagirdlərin sayı -<br>cəmi<br>o cümlədən:<br>hazırlıq siniflərində<br>I-IV siniflərdə<br>V-X siniflərdə | 12.306<br><br>-<br>4958<br>6.142 | 20.799<br><br>106<br>8649<br>10.115 | 33.105<br><br>106<br>13.607<br>16.257 |

| | | | | |
|---|---|---|---|---|
| | X-XI siniflərdə | 1206 | 1929 | 3135 |
| 5 | Şagirdlərin ümumi sayından internat məktəblərində oxuyanların sayı | 106 | - | 106 |
| 6 | Birsinifli komplektin orta sıxlığı | 18,31 | 16,76 | 17,31 |
| 7 | Xüsusi məktəblərin sayı | - | - | - |
| 8 | Məktəbyanı internatların sayı<br>Onlarda şagirdlərin sayı<br>Bunlardan tam dövlət təminatında olan uşaqların sayı | 1<br>35<br>35 | -<br>-<br>- | 1<br>35<br>35 |
| 9 | Günüuzadılmış məktəblərin sayı | - | - | - |
| 10 | Məktəblərin nəzdində günüuzadılmış qrupların sayı | 12 | 40 | 52 |
| 11 | Axşam (növbəli) ümumtəhsil məktəblərin sayı | - | - | - |
| 12 | Gündüz ümumtəhsil məktəbləri nəzdində axşam (əyani-qiyabi) siniflərin sayı<br>Onlarda şagirdlərin sayı | 21<br>336 | 67<br>826 | 88<br>1162 |
| 13 | Gündüz məktəblərinin və ya internat məktəblərinin nəzdində əqli və fiziki cəhətdən qüsurlu uşaqlar üçün açılmış sinif komplektlərinin sayı<br>Onlarda uşaqların sayı | 9<br>57 | -<br>- | 9<br>57 |

Dərs ilinin nəticələrinə görə, ümumtəhsil məktəblərində oxuyan 33.221 nəfər şagirddən 32.117 nəfəri dərs ilinin sonunda yuxarı siniflərə keçirilmişdir. 167 nəfər payız imtahanlarına, 273 nəfər təkrar sinifdə saxlanmışdır. Dərsə müntəzəm davam etmədiyindən 119 nəfər şagirdin biliyi qiymətləndirilməmişdir. 2.676 nəfər məzun əsas təhsil haqqında şəhadətnamə, 1.663 nəfər XI sinif məzunu orta təhsil haqqında attestat almışdır. IX sinif məzunlarından 5 nəfəri fərqlənmə şəhadətnaməsinə, XI sinif məzunlarından 1 nəfəri fərqlənmə attestatına layiq görülmüşdür.[414]

Təhsil sistemində aparılan əsaslı dəyişikliklər, təhsil prosesində şagirdlərin şəxsiyyət kimi formalaşmasından ötrü onun fərdi xüsusiyyətlərinə ciddi diqqət yetirilməsinə, təlim-tərbiyənin şagirdin meyl və bacarıqlarına görə qurulmasına, habelə dünyanın ayrı-ayrı ölkələrində şagirdlərin təlim müvəffəqiyyətlərinin müxtəlif bal sistemi ilə qiymətləndirilməsi təcrübəsi respublikanın ümumtəhsil məktəblərində şagirdlərin biliyinin qiymətləndirilməsinin yeni sisteminə keçilməsinə zərurət yaratmışdır. Bununla əlaqədar olaraq təhsil nazirliyinin

müvafiq əmrinə əsasən 1998/99-cu dərs ilindən Bakı şəhərinin Nərimanov və İsmayıllı rayonlarının ümumtəhsil məktəblərində şagirdlərin bilik, bacarıq və vərdişlərinin 9 ballı sistem ilə qiymətləndirilməsi üzrə eksperimentə başla nılmışdır.

Şagirdlərin bilik, bacarıq və vərdişlərinin 9 ballı sistemlə qiymətləndirilməsi üzrə eksperimentin genişləndirilməsi ilə əlaqədar Azərbaycan Respublikası Təhsil nazirinin 03.08.2000-ci il tarixli əmrinə əsasən 2000/2001-ci tədris ilindən respublikanın Gəncə şəhəri, Lənkəran, Şəki, Quba rayonlarının ümumtəhsil məktəblərində eksperimentin tətbiqinə başlanmışdır. Eksperimentin tətbiqi müəllim və şagirdlər tərəfindən müsbət qəbul edilmiş, heç bir pedaqoji və psixoloji fəsadlar yaratmamışdır.

2000/2001-ci tədris ilində şagirdlər fənn olimpiadalarına maraq göstərmişlər. Olimpiadaların məktəb turunda 3.147 nəfər iştirak etmişdir. Olimpiadanın məktəb turu Şəki fizika-riyaziyyat və humanitar təmayüllü liseydə, şəhər 5,7,8,10,18 nömrəli, Oxut, Baş Zəyzid, Baş Künküt orta məktəblərində daha yaxşı təşkil olunmuşdur. Olimpiadaların respublika turunda Şəki məktəblərini fizika-riyaziyyat və humanitar təmayüllü lisey, Özəl Türk liseyi, 7, 8,10,18 nömrəli məktəblərin şagirdləri təmsil etmişlər. Şəki fizika-riyaziyyat və humanitar təmayüllü liseyin XI sinif şagirdi Zaur Qurbanov Azərbaycan tarixi fənni üzrə, Özəl Türk liseyinin IX sinif şagirdi Turan Abdullayev riyaziyyat fənni üzrə II yer tutmuşlar.

Şəki Şəhər Təhsil Şöbəsi nəzdindəki ümumtəhsil məktəbləri üzrə məktəblilərin fənn olimpiadalarının ***2000-2001-ci tədris ili üçün*** respublika turunun nəticələri aşağıdakı cədvəldəki kimi olmuşdur.

**Cədvəl 3.3. 3**

| № | Fənlər | İştirakçıların sayı | Qaliblərin sayı | | | | Cəmi |
|---|---|---|---|---|---|---|---|
| | | | I yer | II yer | III yer | IV Yer | |
| 1 | Azərbaycan dili və ədəbiyyatı | 3 | - | - | - | - | - |
| 2 | Azərbaycan tarixi | 5 | - | 1 | - | 1 | 2 |
| 3 | Riyaziyyat | 6 | - | 1 | - | - | 1 |
| 4 | Fizika | 5 | - | - | - | 3 | 3 |
| 5 | Kimya | 6 | - | - | 2 | 1 | 3 |
| 6 | Biologiya | 6 | - | - | 1 | - | 1 |
| 7 | İnformatika | 2 | - | - | - | 1 | 1 |
| | Cəmi | **33** | - | 2 | 3 | 6 | **11**[415] |

Şəkinin ümumtəhsil məktəblərinin məzunları 2001-2002-ci tədris ili üçün qəbul imtahanlarında uğur qazanmış, **315 nəfər** məzun ali məktəblərə qəbul olunmuşdur. Onlardan 228 nəfəri ödənişsiz, 87 nəfəri ödənişli əsaslarla təhsil

almaq hüququ əldə etmişlər. *Şəhər* fizika-riyaziyyat və humanitar təmayüllü liseyin ***42**, Özəl Türk liseyinin **29**, şəhər 10* nömrəli *məktəbin **25**, 7* nömrəli *məktəbin **18** məzunu ali məktəb tələbəsi olmuşdur.* Şəhər 5, 9, 14, 17, Oxut, Orta Zəyzid 1 nömrəli, Turan qəsəbə, Kiçik Dəhnə 1 və 2 nömrəli məktəblərinin şagirdləri yüksək bilik nümayiş etdirmişlər.

Aşağı Layıskı kənd orta məktəbinin məzunu ***Asif Mustafayev 678 bal*** *toplayaraq BDU-nun hüquqşünaslıq fakültəsinə, 6* nömrəli *orta məktəbin məzunu* ***Sərxan Ağakişiyev 671 bal*** *toplayaraq BDU-nun beynəlxalq münasibətlər fakültəsinə, Kiçik Dəhnə 2* nömrəli *orta məktəbin məzunu* ***Rövzət Zəkəryəyev 647 bal*** *toplayaraq BDU-nun hüquqşünaslıq fakültəsinə, şəhər liseyinin məzunu* ***Ağamalı Qurbanov 633 bal*** *toplayaraq Azərbaycan Kooperasiya İnstitutunun beynəlxalq iqtisadi münasibətlər fakültəsinə, Şəki Özəl Türk liseyinin məzunu* ***Emin Məmmədov 677 bal*** *toplayaraq Azərbaycan İqtisad Universitetinin beynəlxalq iqtisadi münasibətlər fakültəsinə, həmin məktəbin digər məzunu* ***Elxan Şərifov 628 bal*** *toplayaraq Azərbaycan Tibb Universitetinin müalicə işi fakültəsinə, Orta Zəyzid 2* nömrəli *məktəbin məzunu* ***Emil Əbdürrəhimov 640 bal*** *toplayaraq Azərbaycan Respublikası Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasına* daxil olmuşlar[416] . Müqayisə üçün bildirək ki, əgər keçən tədris ilində Şəkinin 65 orta məktəbindən 40 məktəbin məzunu ali məktəbin tələbəsi adını qazanmışdırsa, göstərilən həmin məktəblərin sayı 50-yə çatmışdır.

Tədris ili prosesində məktəblərin maddi-texniki bazasının yaxşılaşdırılması məqsədilə müxtəlif vasitələrdən istifadə olunmuşdur. Şəhər 11 nömrəli, Vərəzət kənd məktəblərində, şəhər 28 nömrəli uşaq bağçasında təmir-tikinti işləri görülmüş, Aydınbulaq kənd orta məktəbində 4 əlavə sinif otağı inşa olunmuş, Turan qəsəbə məktəbində Yaponiya dövlətinin köməyi ilə tikinti-yenidənqurma işləri aparılmışdır.

**2001-2002-ci tədris ilində** Şəkinin 97 ümumtəhsil məktəbində 32.093 nəfər şagird təhsil almışdır. 1.928 sinifdə 33.180 nəfər şagird təhsilə cəlb edilmişdir ki, onlardan 3.094 nəfəri I siniflərə, 1.909 nəfəri X siniflərə qəbul olunanlardır. 3.144 nəfər IX sinfi,1.353 nəfər XI sinfi bitirmişdir. Şəhər internat məktəbi nəzdində əqli və fiziki cəhətdən qüsurlu uşaqlar üçün 9 sinif təşkil olunmuş və 54 nəfər təhsillə əhatə olunmuşdur. 34 gündüz ümumtəhsil məktəbində 973 nəfər şagird axşam əyani və qiyabi təhsil sinifləri və qruplarında təhsilə cəlb edilmişdir. Azərbaycan Respublikası Təhsil Nazirliyinin Şəki Şəhər İcra Hakimiyyətinə ünvanladığı 27.11.2000-ci il tarixli 48-17-5195/16 saylı məktuba əsasən Azərbaycan Dəmiryol İdarəsinin Şəki dəmiryol stansiyası 11 nömrəli orta məktəbi 01.01.2001-ci il tarixdən Şəki ŞTŞ-nin tabeliyinə verilmişdir. Bu səbəbdən də, yuxarıda qeyd olunduğu kimi, məktəblərin sayı 97-ə çatmışdır.

Şəki ŞTŞ üzrə 2001-2002-ci tədris ili üçün məktəb şəbəkəsi aşağıdakı kimi olmuşdur.[417]

**Cədvəl 3.3.4.**

| Sıra №si | Göstəricilər | şəhər | kənd | cəmi |
|---|---|---|---|---|
| 1 | Gündüz ümumtəhsil məktəb lərinin sayı<br>o cümlədən:<br>ibtidai<br>əsas<br>orta | 23<br><br>1<br>-<br>22 | 74<br><br>5<br>24<br>45 | 97<br><br>6<br>24<br>67 |
| 2 | Məktəblərin ümumi sayından internat | 1 | - | 1 |
| 3 | Cəmi sinif komplektləri<br>o cümlədən:<br>hazırlıq | 677<br><br>- | 1.251<br><br>8 | 1.928<br><br>8 |
| | I-IV siniflər | 260 | 496 | 756 |
| | V-X siniflər | 336 | 614 | 950 |
| | X-XI siniflər | 81 | 133 | 214 |
| 4 | Gündüz məktəblərində şagirdlərin sayı-<br>cəmi<br>o cümlədən:<br>hazırlıq siniflərində<br>I-IV siniflərdə<br>V-X siniflərdə<br>X-XI siniflərdə | <br>12.349<br><br>-<br>470<br>6.392<br>1217 | <br>20.831<br><br>117<br>8.235<br>10.402<br>2.077 | <br>33.180<br><br>117<br>12.975<br>16.794<br>3.294 |
| 5 | Şagirdlərin ümumi sayından internat məktəblərində oxu-yanlar<br>cəmi | 102 | - | 102 |
| 6 | Birsinifli komplektin orta sıxlığı | 18,24 | 16,6 | 17,21 |
| 7 | Xüsusi məktəblərin sayı | - | - | - |
| 8 | Məktəbyanı internatların sayı<br>Onlarda şagirdlərin sayı<br>Bunlardan tam dövlət təminatında olan uşaqların sayı | 1<br><br>35<br>35 | --<br><br>-<br>- | 1<br><br>35<br>35 |
| 9 | Günüuzadılmış məktəblərin sayı | - | - | - |
| 10 | Məktəblərin nəzdində günüuzadılmış qrupların sayı<br>Onlarda şagirdlərin sayı | 15<br>308 | 37<br>749 | 52<br>1057 |
| 11 | Axşam (növbəli) ümumtəhsil | | | |

| | | | | |
|---|---|---|---|---|
| | məktəblərinin sayı | - | - | - |
| 12 | Gündüz ümumtəhsil məktəb ləri nəzdində axşam (əyani-qiyabi) siniflərin sayı<br>Onlarda şagirdlərin sayı | 19<br>295 | 55<br>678 | 74<br>973 |
| 13 | Gündüz məktəblərinin və ya internat məktəblərin nəzdində əqli və fiziki cəhətdən qüsurlu uşaqlar üçün açılmış sinif komplektlərinin sayı<br>Onlarda uşaqların sayı | 9<br>54 | -<br>- | 9<br>54 |

Cədvəldən göründüyü kimi, 2001/2002-ci tədris ilində ümumtəhsil məktəblərində 52 günüuzadılmış qrup təşkil edilmiş, onlara 1.057 nəfər şagird cəlb olunmuşdur.

2001-2002-ci tədris ilində Şəki ŞTŞ-nin tabeliyində şəhər üzrə 29, kənd üzrə 32, ümumilikdə 61 uşaq bağçası fəaliyyət göstərmişdir. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 17 yanvar 1995-ci il tarixli 12 № li qərarı ilə təsdiq edilmiş «Məktəbəqədər müəssisələrin nümunəvi Əsasnaməsi» və Təhsil nazirliyinin digər normativ sənədləri əsasında kontingent planı yerinə yetirilmədiyindən eyni binada yerləşən şəhər 10 və 12 nömrəli uşaq bağçaları birləşdirilmiş, uşaqların davamiyyəti zəif olduğu üçün şəhər və kənd tərbiyə müəssisələri üzrə 32 qrupun fəaliyyəti dayandırılmışdır.

XI (XII) siniflərdə buraxılış imtahanlarının nəticələrinin təhlili göstərir ki, test üsulu ilə imtahan götürülən fənlər üzrə Azərbaycan dili və ədəbiyyatından imtahan verən şagirdlərdən 29 %-i, coğrafiyadan 23 %-i, cəbr və analizin başlanğıcından 17 %-i, Azərbaycan tarixi fənnindən isə 15 % -i «8» və «9» qiymət almışlar. Azərbaycan dili və ədəbiyyatı fənni üzrə 8 nəfər, cəbr və analzin başlanğıcı fənni üzrə 66 nəfər, Azərbaycan tarixi üzrə 37 nəfər, coğrafiya fənni üzrə 98 nəfər «9» qiymət almışdır.[418]

Sinifdən-sinfə keçirmə və buraxılış imtahanlarının təhlili göstərir ki, ümumtəhsil məktəblərində təlimin keyfiyyətinin yüksəldilməsi sahəsində nöqsanlar və çatışmazlıqlar vardır. Belə ki, Şəki şəhər təhsil şöbəsi üzrə 32.180 nəfər şagirddən 239 nəfər payız imtahanlarına qalmış, 102 nəfər şagirdin biliyi qiymətləndirilməmiş, 273 nəfər şagird təkrar sinifdə saxlanmışdır. XI (XII) siniflər üzrə 11 nəfər imtahana gəlməmiş, imtahana buraxılan 1.664 nəfərdən 652 nəfəri cəbr və analizin başlanğıcı fənnini, 351 nəfəri Azərbaycan tarixi fənnini, 284 nəfər coğrafiya fənnini seçməmişlər. Fizika fənni üzrə imtahan verən 639 nəfər şagirddən cəmi 13 nəfər, həndəsə fənni üzrə imtahan verən 586 şagirdən 13 nəfər, kimya fənni üzrə imtahan verən 550 şagirddən 9 nəfər, biologiya fənni üzrə imtahan verən 318 nəfər şagirddən 7 nəfər «9» qiymət almışdır.

Bir sıra məktəblər üzrə göstəricilər qeyri-qənaətbəxş olmuşdur. *Şəki kənd orta məktəbi* üzrə kimya, *Suçma kənd orta məktəbində* fizika, *Aşağı Künküt kənd orta məktəbində* Azərbaycan dili və ədəbiyyatı, Azərbaycan tarixi fənnindən, *Şin kənd*

*orta məktəbində* Azərbaycan dili və ədəbiyyatı, Azərbaycan tarixi, cəbr və analizin başlanğıcı, coğrafiya, Azərbaycan dili, tarix, həndəsə, *Dəmiryol köçkünlər qəsəbə orta məktəbində* Azərbaycan tarixi, coğrafiya, həndəsə, xarici dil, fizika, *Cunud kənd məktəbində* tarix fənnindən «7», «8», «9» qiymət alan olmamışdır. Bütün bunlar əslində qeyd olunan fənlərin tədrisinin səviyyəsinin aşağı olduğunu göstərir.

2001/2002-ci tədris ilində təhsil şöbəsi əvvəlki illərdə olduğu kimi, fənn olimpiadalarına hazırlığı diqqət mərkəzində saxlanmışdır. Şəkini Respublika turunda təmsil edən şagirdlərdən 3 nəfəri I, 4 nəfəri II, 3 nəfəri III, 11 nəfəri IV yeri tutmuşlar.

Şəhər 8 nömrəli məktəbin IX sinif şagirdi *Turab Ramazanov* fizika fənni üzrə, Şəki Özəl Türk liseyinin X sinif şagirdi *Turan Abdullayev* riyaziyyat fənni üzrə, həmin liseyin XI sinif şagirdi *Elnur Məmmədov* kimya fənni üzrə **I yer**, 11 nömrəli orta məktəbin IX sinif şagirdi *Şəfəq Abdullayeva* Azərbaycan dili və ədəbiyyatı fənni üzrə, Özəl Türk liseyinin XI sinif şagirdi *Fəryaz Rüstəmov* kimya fənni üzrə, həmin liseyin IX sinif şagirdi *Yusif Yusifov* biologiya fənni üzrə, şəhər fizika-riyaziyyat və humanitar təmayüllü liseyin X sinif şagirdi *Kəmalə Məmmədova* biologiya fənni üzrə **II yer**, 7 nömrəli orta məktəbin X sinif şagirdi *Sevinc Hacıhəsənzadə* Azərbaycan dili və ədəbiyyatı fənni üzrə, fizika-riyaziyyat və humanitar təmayüllü liseyin XI sinif şagirdi *Nicat Əkbərov* Azərbaycan tarixi fənni üzrə **III yer** tutmuşlar. Olimpiadaların fənlər üzrə ***2001-2002-ci tədris ili üçün*** nəticələri aşağıdakı cədvəldəki kimi olmuşdur.

**Cədvəl 3.3.5**

| № | F ə n l ə r | İştirakçıların sayı | Qaliblərin sayı | | | | Cəmi |
|---|---|---|---|---|---|---|---|
| | | | I yer | II yer | III yer | IV yer | |
| 1 | Azərbaycan dili və ədəbiyyatı | 4 | - | 1 | 2 | - | 3 |
| 2 | Azərbaycan tarixi | 6 | - | - | 1 | 2 | 3 |
| 3 | Riyaziyyat | 5 | 1 | - | - | 2 | 3 |
| 4 | Fizika | 5 | 1 | - | - | 2 | 3 |
| 5 | Kimya | 6 | 1 | 1 | - | 2 | 4 |
| 6 | Biologiya | 6 | - | 2 | - | 2 | 4 |
| 7 | İnformatika | 2 | - | - | - | 1 | 1 |
| | Cəmi | **34** | 3 | 4 | 3 | 11 | **21** |

Şəki məktəbliləri ənənəyə sadiq qalaraq 2002/2003-cü tədris ili üçün qəbul imtahanlarında yenə də yüksək nəticələr göstərmişlər. 8 nömrəli məktəbin məzunu **Məmmədov Vüqar Əhməd oğlu** *666 bal* toplayaraq *Moskva Dövlət Universitetinin* hüquq fakültəsinə qəbul olunmuşdur. Şəki Özəl Türk liseyinin məzunları **Məmmədov Murad Elşad oğlu** *Ankara Universitetinə*, **Zamanov**

**Zakir Adil oğlu** *Ege Universitetinin*, **Məmmədov Elnur Nizami oğlu** *Qazi Universitetinin*, **Məmmədov Toğrul Cahangir oğlu** *Yulduz Texnik Universitetinin* tələbəsi olmuşlar. Ümumiyyətlə, 2002-ci ildə orta məktəbi bitirmiş 1353 məzundan **487** nəfəri ali məktəb tələbəsi adını qazanmışdır.

Məzunlardan 12 nəfəri 600 baldan yuxarı nəticə göstərmişdir. Şəki şəhər 5 nömrəli məktəbin məzunu ***Salamova Xatın Ümüd qızı*** **652 bal** toplayaraq Tibb Universitetinə, 19 nömrəli məktəbin məzunu ***Nəsrullayev Elçin Mahir oğlu*** **639 bal** toplayaraq Azərbaycan Respublikası Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasına, 10 nömrəli məktəbin məzunu ***Əsədov İsmayıl Nütvəli oğlu*** **627 bal** toplayaraq Tibb Universitetinə, 7 nömrəli məktəbin məzunu ***Lütfəliyeva Fəridə Əli qızı*** **623 bal** toplayaraq BDU-ya qəbul olunmuşlar. Ümumilikdə, məzunlardan **78 nəfəri** *BDU-nun,* **25 nəfəri** *Azərbaycan Tibb Universitetinin* tələbəsi olmuşlar. Təhlil göstərir ki, ali məktəblərə qəbul olunanların və ali məktəblərə qəbulda iştirak edən məktəblərin sayı ildən-ilə artmışdır. Belə ki, əgər 2000-ci ildə Şəkinin 65 orta məktəbindən 40-nın, 2001-ci ildə 67 orta məktəbindən 50-sinin məzunu ali məktəbin tələbəsi olmuşdursa, 2002-ci ildə 67 orta məktəbdən 64 -nün məzunu tələbə adını qazanmışdır.[419]

Tədris ili ərzində müəllimlərin ixtisasartırma kurslarından keçməsi diqqətdə olmuşdur. 2001-2002-ci tədris ilində 233 nəfər müəllim ixtisasartırma kurslarından keçmiş, 55 nəfər yenidənhazırlanma kurslarında oxumuş, 355 nəfər riyaziyyat, 305 nəfər Azərbaycan dili və ədəbiyyatı müəlliminin siyahısı hazırlanmış, onlarla «Öyrədənləri öyrədən» proqramı üzrə qısa müddətli kurslarının təşkili üçün hazırlıq işləri aparılmışdır.[420]

Tədris ilində məktəblərin maddi-texniki bazasının möhkəmlən dirilməsi, şagirdlərin dərsliklərlə təchizi davam etdirilmişdir.

**2002-2003-cü tədris ilində** Şəkidə 1.983 sinifdə 33.361 şagird, 2004-2005-ci tədris ilində 100 məktəbin 1.971 sinfində 31.971 şagird təhsilə cəlb edilmişdir. Fəaliyyət göstərən 100 ümumtəhsil məktəbindən 68-i orta, 26-ı əsas, 6-ı ibtidai məktəb olmuş, 96 məktəbdə dərslər Azərbaycan dilində, 4 məktəbdə isə Azərbaycan və rus dillərində tədris olunmuşdur. Əvvəlki illərlə müqayisədə orta məktəblərin sayı 65-dən 68-ə yüksəlmişdir. Sağlamlıq imkanları məhdud olan şagirdlərin təhsilə cəlbi məqsədilə qarışıq tipli internat məktəbində 81 nəfər, 12 şəhər və 21 kənd məktəbində 104 nəfər evdə fərdi qaydada təhsilə cəlb olunmuşdur.

Şəki ŞTŞ üzrə 2002/2003-cü tədris ilinə aid məktəb şəbəkəsi[421]

**Cədvəl 3.3.6**

| Sıra №si | Göstəricilər | şəhər | kənd | cəmi |
|---|---|---|---|---|
| 1 | Gündüz ümumtəhsil məktəb lərinin sayı | 20 | 80 | 100 |

| | | | | |
|---|---|---|---|---|
| | o cümlədən:<br>ibtidai<br>əsas<br>orta | <br>-<br>-<br>20 | <br>6<br>26<br>48 | <br>6<br>26<br>68 |
| 2 | Məktəblərin ümumi sayından internat | 1 | - | 1 |
| 3 | Cəmi sinif komplektləri<br>o cümlədən:<br>hazırlıq | 629<br><br>- | 1.354<br><br>7 | 1.983<br><br>7 |
| | I-IV siniflər | 233 | 526 | 759 |
| | V-X siniflər | 299 | 654 | 953 |
| | X-XI siniflər | 97 | 167 | 264 |
| 4 | Gündüz məktəblərində şagirdlərin sayı-<br>cəmi<br>o cümlədən:<br>hazırlıq siniflərində<br>I-IV siniflərdə<br>V-X siniflərdə<br>X-XI siniflərdə | <br>11.380<br><br>-<br>4.201<br>5.624<br>1.555 | <br>21.981<br><br>105<br>8.383<br>10.849<br>2.644 | <br>33.361<br><br>105<br>12.584<br>16.473<br>4.149 |
| 5 | Şagirdlərin ümumi sayından internat məktəblərində oxu yanların sayı-<br>cəmi | 104 | - | 104 |
| 6 | Birsinifli komplektin orta sıxlığı | 18,09 | 16,23 | 16,82 |
| 7 | Xüsusi məktəblərin sayı | - | - | - |
| 8 | Məktəbyanı internatların sayı<br>Onlarda şagirdlərin sayı<br>Bunlardan tam dövlət təminatında olan uşaqların sayı | <br>1<br>35<br><br>35 | <br>-<br>-<br><br>- | <br>1<br>35<br><br>35 |
| 9 | Günüuzadılmış məktəblərin sayı | - | - | - |
| 10 | Məktəblərin nəzdində günüuzadılmış qrupların sayı<br>Onlarda şagirdlərin sayı | 21<br>444 | 39<br>785 | 60<br>1.229 |
| 11 | Axşam (növbəli) ümumtəhsil məktəblərinin sayı | - | - | - |
| 12 | Gündüz ümumtəhsil mək | | | |

| | | | | |
|---|---|---|---|---|
| | təbləri nəzdində axşam (əyani-qiyabi) siniflərin sayı<br>Onlarda şagirdlərin sayı | 9<br>137 | 35<br>411 | 44<br>548 |
| 13 | Gündüz məktəblərinin və ya internat məktəblərinin nəzdində əqli və fiziki cəhətdən qüsurlu uşaqlar üçün açılmış sinif komplektlərinin sayı<br>Onlarda uşaqların sayı | 9<br>55 | -<br>- | 9<br>55 |
| 14 | Məktəbdənkənar tərbiyə müəssisələrində qrupların sayı<br>1. Ekoloji Tərbiyə və Təcrübəçilik Mərkəzi<br>2. Texniki yaradıcılıq Mərkəzi<br>3.Uşaq yaradıcılıq Mərkəzi<br>4.Uşaq Gənclər İdman Məktəbi<br>5.Uşaq Gənclər Şahmat Məktəbi<br>6.Uşaq Gənclər Fiziki Hazırlıq Klubu | 432<br>72<br>152<br>128<br>34<br>46<br>- | 30<br>-<br>-<br>-<br>-<br>-<br>30 | 462<br>72<br>152<br>128<br>34<br>46<br>30 |

2003-cü ildə rayonun orta ümumtəhsil məktəblərini 2.067 şagird bitirmişdir. Onlardan 42,57 %-i (880 nəfəri) ali məktəblərə sənəd vermişdir. Qəbul imtahanlarının nəticələrinə əsasən rayonun 340 məzunu ali məktəblərə qəbul olunmuşdur. Onlardan 54,71 %-i (186 nəfəri) dövlət ali məktəblərinin ödənişsiz, 34,71 %-i (118 nəfəri) ödənişli ixtisaslarına, 10,59 % (36 nəfər) isə özəl ali məktəblərə qəbul olunmuşdur. Qəbul imtahanlarında rayonun 67 məktəbinin məzunu iştirak etmişdir. Onlardan *1* nömrəli *şəhər, İnçə Zunud, Şorsu, Daşüz, Köbər Zəyzid, II Biləcik, Qudula, Dərəcənnət, Bolludərə, İbrahimkənd, Kiçik Dəhnə 1*nömrəli *kənd, Çələbixan qəsəbəsi köçkün məktəblərinin heç* ***bir məzunu tələbə adını qazana bilməmişdir***. *Daşüz, Köbər Zəyzid, II Biləcik, Dərəcənnət, Bolludərə, Aşağı Küngüt, Qudula, Kiçik Dəhnə 1* nömrəli*, Böyük Dəhnə 2* nömrəli *kənd məktəbləri abituriyentlərinin topladığı* ***orta bal 100-dən aşağı olmuşdur.***[422]

2003/2004-cü dərs ilində 100 gündüz ümumtəhsil məktəbi fəaliyyət göstərmişdir. ki, onlardan 69-u orta, 25-i əsas, 6-sı ibtidai məktəb olmuşdur. 2003-cü ildə 32. 993 nəfər təhsilə cəlb edilmişdir. 17 gündüz ümumtəhsil məktəbi nəzdində 242 nəfər şagird 18 axşam əyani və qiyabi təhsil sinifləri və qruplarında təhsillərini davam etdirmişlər.[423]

**2004/2005-ci tədris ilində** Şəki ŞTŞ-nin tabeliyində 100 gündüz ümumtəhsil məktəbi fəaliyyət göstərmişdir. Onlardan 71-i orta, 24-ü əsas, 5-i ibtidai

məktəb olmuşdur. 1.971 sinif komplektində 31.971 nəfər təhsilə cəlb edilmişdir ki, onlardan 2.411 nəfəri I siniflərə, 2.401 nəfəri X siniflərə qəbul olunmuşdur. Tədris ilində Kiş kəndində yaşayan əhalinin sayının 6.242 nəfərə çatması, məktəbyaşlı uşaqların sayının 1.322 nəfər olması nəzərə alınaraq Kiş 1 nömrəli məktəb ərazi məktəbi kimi saxlanılmaqla bəhs olunan tədris ilində yeni tikilmiş məktəb binasında 31 sinif komplekti və 610 şagird kontingenti ilə yeni Kiş kənd orta məktəbi təşkil edilmişdir.

Eyni proses rayonun Çayqaraqoyunlu kəndində də baş vermişdir. Tədris ilində kəndin əhalisinin sayı 1.600 nəfərə yüksəlmişdir ki, onların 319 nəfəri məktəbyaşlı uşaqlar olmuşdur. Bu səbəbdən, məktəb orta məktəbə çevrilmişdir.[424]

Şəki ŞTŞ üzrə **2004/2005-ci tədris ilinə** aid məktəb şəbəkəsi[425]

**Cədvəl 3.3.7**

| Sıra № si | Göstəricilər | şəhər | kənd | cəmi |
|---|---|---|---|---|
| 1 | Gündüz ümumtəhsil məktəblərinin sayı<br>o cümlədən:<br>ibtidai<br>əsas<br>orta | 20<br><br>-<br>-<br>20 | 80<br><br>5<br>24<br>51 | 100<br><br>5<br>24<br>71 |
| 2 | Məktəblərin ümumi sayından internat | 1 | - | 1 |
| 3 | Cəmi sinif komplektləri<br>o cümlədən:<br>hazırlıq | 637<br><br>- | 1.334<br><br>- | 1.971<br><br>9 |
| | I-IV siniflər | 223 | 488 | 711 |
| | V-X siniflər | 302 | 655 | 957 |
| | X-XI siniflər | 112 | 182 | 294 |
| 4 | Gündüz məktəblərində şagirdlərin sayı-cəmi<br>O cümlədən:<br>hazırlıq siniflərində<br>I-IV siniflərdə<br>V-X siniflərdə<br>X-XI siniflərdə | 11.051<br><br>-<br>3762<br>5.577<br>1.555 | 20.920<br><br>127<br>7.206<br>10.674<br>2.644 | 31.971<br><br>127<br>10.251<br>16.251<br>4.149 |

| | | | | |
|---|---|---|---|---|
| 5 | Şagirdlərin ümumi sayından internat məktəblərində oxu-yanlar<br>cəmi | 95 | - | 95 |
| 6 | Birsinifli komplektin orta sıxlığı | 17,34 | 15,68 | 16,22 |
| 7 | Xüsusi məktəblərin sayı | - | - | - |
| 8 | Məktəbyanı internatların sayı<br>Onlarda şagirdlərin sayı<br>Bunlardan tam dövlət təmina-tında olan uşaqların sayı | -<br><br>-<br>- | -<br><br>-<br>- | -<br><br>-<br>- |
| 9 | Günüuzadılmış məktəblərin sayı | - | - | - |
| 10 | Məktəblərin nəzdində günüuzadılmış qrupların sayı<br>Onlarda şagirdlərin sayı | 23<br>466 | 29<br>580 | 52<br>1.046 |
| 11 | Axşam (növbəli) ümum təhsil məktəblərinin sayı | - | - | - |
| 12 | Gündüz ümumtəhsil məktəb ləri nəzdində axşam (əyani-qiyabi) siniflərin sayı<br>Onlarda şagirdlərin sayı | -<br><br>- | -<br><br>- | -<br><br>- |
| 13 | Gündüz məktəblərinin və ya internat məktəblərin nəz-din-də əqli və fiziki cəhətdən qü-surlu uşaqlar üçün açılmış sinif komplektlərinin sayı<br>Onlarda uşaqların sayı | 9<br>81 | -<br>- | 9<br>81 |
| 14 | Məktəbdənkənar tərbiyə müəssisələrində qrupların sayı<br>1. Ekoloji Tərbiyə və Təcrübəçilik Mərkəzi<br>2. Texniki Yaradıcılıq Mərkəzi<br>3.Uşaq Yaradıcılıq Mərkəzi<br>4.Uşaq Gənclər İdman Məktəbi<br>5.Uşaq Gənclər Şahmat Məktəbi<br>6.Uşaq Gəncər Fiziki Hazırlıq | 438<br>72<br>152<br>128<br>40<br>46 | 30<br>-<br>-<br>-<br>-<br>- | 468<br>72<br>152<br>128<br>40<br>46 |

| | | | | |
|---|---|---|---|---|
| | Klubu | - | 30 | 30 |

2004/2005-ci tədris ilinin yekunlarına görə ilin sonuna qalmış 31.589 nəfər şagirddən 29.020 nəfəri sinifdən-sinfə keçirilmiş, 71 nəfər yay tapşırığı almış, 288 nəfər şagird təkrar sinifdə saxlanılmışdır. Əsas və orta məktəb kursu üzrə buraxılış imtahanlarının nəticələrinə görə 3.153 nəfər əsas təhsil haqqında şəhadətnamə, 2.172 nəfər orta təhsil haqqında attestat almışlar.[426]

2004-2005-ci tədris ili ərzində icbari təhsilin yerinə yetirilməsi, I və X siniflərə qəbulun mövcud qaydalar əsasında aparılması, şagirdlərin hərəkətinin uçotunun təşkili və izlənilməsi, ayrı-ayrı fənlərin tədrisi vəziyyəti öyrənilmiş və işdə yol verdikləri ciddi nöqsanlara görə şəhər 11 və 18 nömrəli, Baş Göynük 2 nömrəli orta məktəbin, Şəki fizika-riyaziyyat və humanitar təmayüllü liseyin direktorları *M.Mahmudov, Ə.Məmmədli, A.Məmmədov və A.Əzimli* tutduqları vəzifələrindən azad edilmiş, şəhər 10 nömrəli, Baş Göynük kənd 1 nömrəli orta və qarışıq tipli internat məktəblərin direktorları yeni kadrlarla əvəz olunmuşdur.

2004-2005-ci tədris ili Təhsil nazirliyi tərəfindən *«Təhsil sistemində müasir yanaşmaların təşəkkülü ilə bağlı qarşıya qoyulmuş vəzifələrin yerinə yetirilməsinin davamı ili»* elan olunmuşdur. Bu məqsədlə şəhər təhsil şöbəsi Azərbaycan Respublikası Təhsil Şurası, Qafqaz Universiteti, Azərbaycan Müəllimər İnstitutunun Şəki filialı ilə birlikdə konfranslar, «Dəyirmi masa»lar keçirmiş, təhsil sahəsində aparılan islahatların yerlərdə icrası məqsədilə tədbirlər müəyyənləşdirmişdir. Bəhs olunan tədris ilində 161 nəfər müəllim ixtisasartırma kurslarından keçmiş, 40 nəfər müəllim tənqidi təfəkkürün inkişafı üçün «Mütaliə və Yazı» alternativ proqramı üzrə, 40 nəfər ibtidai sinif müəllimi, 40 nəfər bağça tərbiyəçisi «*Addım-addım*» alternativ proqramı üzrə kurslarda olmuşlar. Rayon miqyasında keçirilən «İlin ən yaxşı məktəbi», «İlin ən yaxşı şagirdi», «İlin ən yaxşı direktoru» müsabiqələrinin yekunlarına görə Köndələn kənd məktəbinin direktoru **Abdulla Mahmudov** «İlin ən yaxşı direktoru», **28** nömrəli **uşaq bağçası** «*İlin ən yaxşı uşaq bağçası*», şəhər **5 nömrəli məktəb** «*İlin ən yaxşı məktəbi*» , 17 nömrəli uşaq bağçasının müdiri **Həqiqət Məmmədova** «*İlin ən yaxşı müəssisə rəhbəri»*, 9 nömrəli körpələr evinin tərbiyəçisi **Almaz Qafarova** «*İlin ən yaxşı tərbiyəçisi*» adına layiq görülmüşlər.

Amerika Beynəlxalq Təhsil Şurası və ABŞ Dövlət Departamentinin Təhsil və Mədəniyyət üzrə Bürosunun təqdim etdiyi *«Tədris üzrə yüksək mükafat»* proqramına əsasən ingilis dilini tədris edən və peşəkarlıq qabiliyyətinə malik müəllimlərin müsabiqəsində şəhər 10 nömrəli məktəbin müəllimi Ədalət Musayeva 3 mərhələdən keçərək xüsusi sertifikat almışdır. Ə.Musayeva 125 ABŞ dolları məbləğində ədəbiyyat, 100 ABŞ dolları məbləğində texniki vəsait və ABŞ-da ixtisasartırma kurslarına getmək üçün 7 həftəlik səfərə vəsiqə ilə mükafatlandırılmışdır.

2002-2006-cı illərdə 7 fənn üzrə respublika olimpiadalarında Şəkini 75 məktəbli təmsil etmiş, onlardan 7 nəfəri **I**, 7 nəfəri **II**, 2 nəfəri **III**, 11 nəfəri **IV** yerləri tutmuşlar.

*2002-2006-cı illərdə* olimpiadaların respublika turunun nəticələri aşağıdakı cədvəllərdəki kimi olmuşdur.

**Cədvəl 3.3.8**

**2002/2003-cü tədris ili**

| № | F ə n l ə r | İştirak çıların sayı | Qaliblərin sayı | | | | Cəmi |
|---|---|---|---|---|---|---|---|
| | | | I yer | II yer | III yer | IV yer | |
| 1 | Azərbaycan dili və ədəbiyyatı | 2 | - | - | - | 2 | 2 |
| 2 | Azərbaycan tarixi | 3 | - | 1 | 2 | - | 3 |
| 3 | Riyaziyyat | 3 | - | - | 1 | - | 1 |
| 4 | Fizika | 3 | - | - | - | 2 | 2 |
| 5 | Kimya | 3 | - | 1 | - | 2 | 3 |
| 6 | Biologiya | 2 | 1 | 1 | - | - | 2 |
| 7 | İnformatika | 2 | - | 1 | - | - | 1 |
| | Cəmi | **18** | 1 | 4 | 3 | 6 | **14** |

**Cədvəl 3.3.9**

**2003/2004-cü tədris ili**

| № | F ə n l ə r | İştirak çıların sayı | Qaliblərin sayı | | | | Cəmi |
|---|---|---|---|---|---|---|---|
| | | | I yer | II yer | III yer | IV yer | |
| 1 | Azərbaycan dili və ədəbiyyatı | 4 | - | - | - | - | - |
| 2 | Azərbaycan tarixi | 6 | - | - | - | - | - |
| 3 | Riyaziyyat | 2 | - | - | 1 | - | 1 |
| 4 | Fizika | 1 | 1 | - | - | - | 1 |
| 5 | Kimya | 2 | - | - | 1 | - | 1 |
| 6 | Biologiya | 4 | - | 1 | - | - | 1 |
| 7 | İnformatika | 1 | - | - | - | 1 | 1 |
| | Cəmi | **20** | 1 | 1 | 2 | 1 | **5** |

**Cədvəl 3.3.10**

**2004/2005-ci tədris ili**

| № | F ə n l ə r | İştirak çıların sayı | Qaliblərin sayı | | | | Cəmi |
|---|---|---|---|---|---|---|---|
| | | | I yer | II yer | III yer | IV yer | |
| 1 | Azərbaycan dili və ədəbiyyatı | 4 | - | - | - | - | - |
| 2 | Azərbaycan tarixi | 1 | - | - | - | - | - |
| 3 | Riyaziyyat | 4 | - | - | - | - | - |
| 4 | Fizika | 3 | - | 1 | - | 1 | 2 |
| 5 | Kimya | 3 | - | - | - | 2 | 2 |
| 6 | Biologiya | 2 | - | - | - | - | - |
| 7 | İnformatika | 1 | 1 | - | - | - | 1 |
| | Cəmi | **18** | 1 | 1 | - | 3 | **5** |

**Cədvəl 3.3.11**

**2005/2006-cı tədris ili**

| № | F ə n l ə r | İştirak çıların sayı | Qaliblərin sayı | | | | Cəmi |
|---|---|---|---|---|---|---|---|
| | | | I yer | II yer | III yer | IV yer | |
| 1 | Azərbaycan dili və ədəbiyyatı | 5 | - | - | - | - | - |
| 2 | Azərbaycan tarixi | 4 | - | - | - | - | - |
| 3 | Riyaziyyat | 2 | - | - | - | - | - |
| 4 | Fizika | 2 | 1 | - | - | 1 | 2 |
| 5 | Kimya | 2 | - | - | - | 1 | 1 |
| 6 | Biologiya | 3 | - | - | - | - | - |
| 7 | İnformatika | 2 | 1 | - | - | - | 1 |
| | Cəmi | **20** | 2 | - | - | 2 | **4** |

Ali məktəblərə test üsulu ilə qəbul imtahanları zamanı keçid ballarının ildən-ilə artmasına baxmayaraq 2005-ci ildə Şəkinin orta məktəb məzunları qəbul imtahanlarında yüksək nəticə göstərmişlər. Şəki Şəhər Təhsil Şöbəsinin Sənəd Qəbulu Komissiyasına sənəd vermiş 1.655 nəfər məzundan 468 nəfəri ali məktəblərə qəbul olunmuşdur. Qəbul olunmuş məzunların 212 nəfəri ödənişli, 256 nəfəri ödənişsiz əsaslarla təhsil almaq hüququ qazanmışlar. Məzunlardan 67

nəfəri 500 baldan, 19 nəfər 600 baldan yuxarı bal toplayaraq respublikanın ən nüfuzlu ali məktəblərinə qəbul olumuşlar.[427]

Kiş kənd 4 nömrəli orta məktəbin məzunu *İsmayılova Sevinc İzzət qızı* **680 bal**, şəhər 7 nömrəli məktəbin məzunu *Azaqov Azad Tahir oğlu* və *İsayev Elmir Mahmudəli oğlu* **664 bal**, Bideyiz kənd məktəbinin məzunu *Dadaşov Cəlal Nurəddin oğlu* **655 bal** toplayaraq Azərbaycan İqtisad Univrsitetinin tələbəsi adını qazanmış, şəhər 3 nömrəli məktəbin məzunu *Səmədov Elvin Rahim oğlu* **650 bal** toplayaraq Rusiya Federasiyası hökuməti yanında Maliyyə Akademiyasının Maliyyə və Kredit fakültəsinə, həmin məktəbin digər məzunu *Əhmədov Şükür Mahir oğlu* **630 bal** toplayaraq Azərbaycan İqtisad Universitetinin Vergi işinin təşkili və idarə olunması fakültəsinə daxil olmuşlar. Şəhər 18 nömrəli məktəbin məzunları *Salamlı Mahir Nemət oğlu* **642 bal**, *Mürşüdov Vüqar Eyvaz oğlu* **636 bal**, *Salamova Xumar Mehman qızı* **616 bal,** *Rəfiyev Taleh İlqar oğlu* **605 bal** toplayaraq ali məktəblərə qəbul olunmuşlar.

Ali məktəblərə qəbul imtahanlarında şəhər 4 və 7 nömrəli məktəblərin məzunları daha çox fərqlənmişlər. 4 nömrəli məktəbin məzunları *Qarayev Nizam Elman oğlu* **648 bal**, *Səlimov Renad Elman oğlu* **620 bal**, 7 nömrəli məktəbin məzunları *Kərimov Səbuhi Tahir oğlu* **636 bal,** *Cəfərov Zaur Əşrəf oğlu* **630 bal** toplamışlar.

Şəki şəhər 4 nömrəli məktəbin 15 yaşlı məzunu **Balayev Ehtiram Nütvəli oğlu 628 bal** toplayaraq Azərbaycan Respublikası Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasına daxil olaraq *«Respublika üzrə ən gənc tələbə»*, şəhər 5 nömrəli məktəbin məzunu **Əliyeva Gülşən Ələsgər qızı 618 bal** toplayaraq BDU-ya daxil olmuş və respublika üzrə «*V qrupda ən yüksək bal toplayan tələbə»* adını qazanmışlar. Ümumilikdə, ali məktəblərə qəbulun yekunlarının təhlili göstərir ki, qəbul imtahanı zamanı şəhər 3*, 4, 5, 7, 8, 10,11,17,18,19 nömrəli, şəhər fizika-riyaziyyat və humanitar təmayüllü liseyin, Orta Zəyzid 2 nömrəli, Baş Zəyzid, Vərəzət, Oxut, Baş Göynük 2 nömrəli, Aşağı Göynük kənd orta məktəbləri*nin məzunları daha sanballı bilik nümayiş etdirmişlər.[428]

Əlbəttə, uğurlarla yanaşı, uğursuzluqlar da olmuşdur. Şəkinin 76 orta məktəbindən yalnız 56 məktəbin məzunlarının ali məktəb tələbəsi olması, 20 məktəbin kənarda qalması xoşagələn hal deyildir.

2004/2005-ci tədris ilində ümumtəhsil məktəblərinin I-VIII sinif şagirdləri pulsuz dərsliklərlə təmin edilmişlər. 2005-2006-cı tədris ili üçün Azərbaycan bölməsində 9-11-ci siniflər üzrə 35 adda 74.580 ədəd, rus bölməsində 19 adda 1.648 ədəd pulsuz dərslik gətirilmiş və məktəblərə paylanmışdır.

2005/2006-cı tədris ilində Şəki ŞTŞ-nin tabeliyndə 72 orta, 23 əsas və 5 ibtidai məktəb fəaliyyət göstərmişdir. Yuxarıda qeyd olunduğu kimi, Çayqaraqoyunlu kəndində əhalinin və məktəbyaşlı uşaqların sayının artması ilə əlaqədar kənd məktəbinin orta məktəbə çevrilməsi məqsədəuyğun hesab edilmişdir. Lakin qaldırılan məsələyə Maliyyə nazirliyinin razılıq verməməsi kənd əhalisinin narazılına səbəb olmuşdur. Valideynlər haqlı olaraq 4-5 km. uzaqda yerləşən məktəbə

şagirdlərin getməsinə etiraz etmiş, məktəbin müəllimləri 2004/2005-ci tədris ilinin sonunadək X-XI siniflərdə əmək haqqı almadan dərs demişlər.

Çayqaraqoyunlu kəndində məktəb üçün 1997-ci ildə 6 yeni sinif otağı, 2003-cü ildə 4 sinif otağı, 2004-cü ildə isə Asiya Müsəlmanları Komitəsinin köməyi ilə 12 otaqdan ibarət yeni məktəb binası tikilib istifadəyə verilmişdir. Bəhs olunan tədris ilində məktəbin 22 sinif otağı olmuşdur.

Tədris ilində Azərbaycan Respublikası Prezidentinin «*Azərbaycan Respublikasında Bilik Gününün təsis edilməsi və təhsil müəssisələrində iş rejiminin tənzimlənməsi haqqında*» 21 avqust 2004-cü il tarixli Fərmanına dəyişiklik edilməsi barədə 2005-ci il 28 may tarixli Fərmanının və Azərbaycan Respublikası Təhsil Nazirliyinin 03 avqust 2005-ci il tarixli 611 nömrəli əmrinin icrası ilə əlaqədar Şəkinin 4 məktəbinin I-XI siniflərinin, 51 məktəbinin I-V siniflərinin şagirdləri 5 günlük iş həftəsində oxumuşlar.

**2006-2007-ci dərs ilində** Şəki ŞTŞ tabeliyində 100 ümumtəhsil məktəbi fəaliyyət göstərmişdir. Onlardan 72-si orta, 3-ü əsas, 5-i ibtidai məktəb olmuşdur. Tədris ilində 1.891 sinif komplektində 29.524 şagird təhsilə cəlb olunmuşdur. Təhsilə cəlb olunanların 2.197 nəfəri **I** siniflərə, 2.552 nəfəri **X** siniflərə qəbul olunanlar idi. Orta ümumtəhsil internat məktəbində əqli və fiziki cəhətdən qüsurlu uşaqlar üçün 10 sinif təşkil olunmuş və 68 nəfər uşaq həmin siniflərə qəbul olunmuşdur. 101 nəfərin evdə təhsili təşkil edilmişdir. 2006/2007-ci dərs ilində ümumtəhsil məktəblərində 49 azkomplektli I-IV siniflər təşkil edilmiş, 1.940 sinifdə 1.891 sinif komplekti fəaliyyət göstərmişdir. 43 günüuzadılmış qrup, 61 məktəbəqədər tərbiyə müəssisəsi fəaliyyətdə olmuşdur. Məktəbəqədər tərbiyə müəssisələrinə 2.965 nəfər uşaq cəlb olunmuşdur.[429]

Şəki ŞTŞ üzrə 2006-2007-ci tədris ilinə aid məktəb şəbəkəsi[430]

**Cədvəl 3.3.12**

| Sıra № si | Göstəricilər | şəhər | kənd | cəmi |
|---|---|---|---|---|
| 1 | Gündüz ümumtəhsil məktəblərinin sayı<br>o cümlədən:<br>ibtidai<br>əsas<br>orta | 20<br><br>-<br>-<br>20 | 80<br><br>5<br>23<br>52 | 100<br><br>5<br>23<br>52 |
| 2 | Məktəblərin ümumi sayın dan internat | 1 | - | 1 |
| 3 | Cəmi sinif komplektləri<br>o cümlədən:<br>hazırlıq | 601<br><br>- | 1290<br><br>8 | 1891<br><br>8 |

| | | | | |
|---|---|---|---|---|
| | I-IV siniflər | 196 | 439 | 635 |
| | V-X siniflər | 294 | 635 | 929 |
| | X-XI siniflər | 111 | 208 | 319 |
| 4 | Gündüz məktəblərində şagirdlərin sayı-<br>o cümlədən:<br>hazırlıq siniflərində<br>I-IV siniflərdə<br>V-X siniflərdə<br>X-XI siniflərdə | 10.175<br><br>-<br>3101<br>5.48<br>1726 | 19.349<br><br>116<br>6189<br>9837<br>3207 | 29.524<br><br>116<br>9290<br>15.185<br>4933 |
| 5 | Şagirdlərin ümumi sayından internat məktəblərində oxu yanlar | 98 | - | 98 |
| 6 | Birsinifli komplektin orta sıxlığı | 16,93 | 14,99 | 15,61 |
| 7 | Xüsusi məktəblərin sayı | - | - | - |
| 8 | Məktəbyanı internatların sayı<br>Onlarda şagirdlərin sayı<br>Bunlardan tam dövlət təminatında olan uşaqların sayı | -<br>-<br>- | -<br>-<br>- | -<br>-<br>- |
| 9 | Günüuzadılmış məktəblərin sayı | - | - | - |
| 10 | Məktəblərin nəzdində günüuzadılmış qrupların sayı<br>Onlarda şagirdlərin sayı | 25<br>501 | 18<br>360 | 43<br>861 |
| 11 | Axşam (növbəli) ümum təhsil məktəblərinin sayı | - | - | - |
| 12 | Gündüz ümumtəhsil mək təbləri nəzdində axşam (əyani-qiyabi) siniflərin sayı<br>Onlarda şagirdlərin sayı | -<br>- | -<br>- | -<br>- |
| 13 | Gündüz məktəblərinin və ya internat məktəblərin nəzdində əqli və fiziki cəhətdən qüsurlu uşaqlar üçün açılmış sinif komplekt lərinin sayı<br>Onlarda uşaqların sayı | 10<br>68 | -<br>- | 10<br>68 |
| 14 | Məktəbdənkənar tərbiyə müəssisələrində qrupların sayı<br>1.Ekoloji Tərbiyə və Təcrübəçilik Mərkəzi<br>2.Texniki Yaradıcılıq Mərkəzi | 416<br>64<br>142 | 30<br>-<br>- | 446<br>64<br>142 |

| | | | | |
|---|---|---|---|---|
| | 3.Uşaq Yaradıcılıq Mərkəzi | 128 | - | 128 |
| | 4.Uşaq Gənclər İdman Məktəbi | 38 | - | 38 |
| | 5.Uşaq Gənclər Şahmat Məktəbi | 44 | - | 44 |
| | 6.Uşaq Gənclər Fiziki Hazırlıq Klubu | - | 30 | 30 |

2006-2007-ci tədris ilində Şəki ŞTŞ-nin tabeliyində 61 məktəbəqədər tərbiyə müəssisəsi fəaliyyət göstərmişdir. Onlardan 29-u şəhər, 32-si kənd ərazisində yerləşmişdir. Məktəbəqədər tərbiyə müəssisələrində işləyən 403 nəfər pedaqoji işçidən 43 nəfəri ali, 282 nəfəri orta ixtisas, 78 nəfəri ümumi orta təhsilli olmuşdur.



***Təhsil şöbəsinin inspektoru Ulduz Paşayeva yeni təlim texnologiyalarına dair seminar apararkən***

Azərbaycan Respublikası Pezidentinin 2007-ci il 12 aprel tarixli sərəncamı ilə təsdiq edilmiş *«Azərbaycan Respublikasında məktəbəqədər təhsilin yeniləşdirilməsi proqramı (2007-2010-cu illər)»* məktəbəqədər təhsildə nöqsanların aradan qaldırılması və problemlərin həlli üçün daha yaxşı işləməyi, kiçik yaşlı uşaqların təhsilinin və tərbiyəsinin müasir qaydada qurulmasını tələb edir. Bu baxımdan Şəkinin məktəbəqədər tərbiyə müəssisələrinin işində bir sıra nöqsanlar hələ də mövcuddur. Məktəbəqədər müəssisələrin əksəriyyəti uyğunlaşdırılmış binalarda yerləşdiyindən və darısqal olduğundan təlim-tərbiyə

işlərinin lazımi səviyyədə qurulmasına imkan vermir. Kiçik yaşlı uşaqların bağçalara cəlbi, ərzaq məhsullarından təyinatı üzrə istifadədə xoşagəlməz hallar davam etməkdədir. Məktəbəqədər tərbiyə müəssisələrinin bərk və yumşaq inventarlara ehtiyacı vardır.

2006-2007-ci dərs ilində Şəkinin ümumtəhsil məktəblərində 4.495 pedaqoji işçi çalışmışdır ki, onlardan 2.713 nəfəri ali təhsilli olmuşdur. Pedaqoji işçilərin 3.144 nəfərini qadınlar təşkil etmişdir.[431]

Dərs ilinin nəticələrinə görə tədris ilinin sonuna qalmış 29.221 nəfər şagirddən 26.492 nəfəri yuxarı siniflərə keçirilmiş, yaxud məktəbi bitirmiş, 79 nəfər yay tapşırığı almış, 61 nəfər payız imtahanlarına, 274 nəfər təkrar sinifdə saxlanılmışdır.

2006-2007-ci dərs ilində pedaqoji kadrların fasiləsiz təhsilinin təmin edilməsi, ixtisasartırma təhsilinin onların tələbat və maraqları əsasında qurulması istiqamətində bir sıra tədbirlər həyata keçirilmiş və uğurlu nəticələr əldə edilmişdir. Müddət ərzində 12 kateqoriya üzrə 284 nəfər, o cümlədən Azərbaycan dili və ədəbiyyatı fənni üzrə 34 nəfər, riyaziyyat fənni üzrə 28 nəfər, tarix fənni üzrə 19 nəfər, kimya-biologiya fənni üzrə 19 nəfər, fiziki tərbiyə üzrə 17 nəfər, əmək təlimi üzrə 19 nəfər, 21 nəfər uşaq birliyi rəhbəri, 32 nəfər bağça tərbiyəçisi ixisasartırma kursundan keçmişdir.[432]

İstedadlı uşaq və gənclər hər bir xalqın milli sərvətidir. Bunu nəzərə alan Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev «*Xüsusi istedada malik uşaqların (gənclərin) yaradıcılıq potensialının inkişafı üzrə Dövlət Proqramının (2006-2010-cu illər) təsdiq edilməsi haqqında*» Fərman imzalamışdır. Həmin Fərmana uyğun olaraq Şəki ŞTŞ-də tədbirlər planı hazırlanmış və icra üçün yerlərə göndərilmişdir.

İstedadlı uşaqların (gənclərin) üzə çıxarılmasında fənn olimpiadaları mühüm əhəmiyyət kəsb edir. 2006/2007-ci tədris ilində Şəkidə fənn olimpiadalarının I şəhər turunda 1.360 nəfər, II şəhər turunda 367 nəfər VIII-XI sinif şagirdləri iştirak etmişdir. Respublika turunda Şəkini 7 fənn üzrə Şəki Özəl Türk liseyindən 7, şəhər fizika-riyaziyyat və humanitar təmayüllü liseydən 4 nəfər, 3, 7, 8, 9, 11, 20 nömrəli şəhər, Baltalı, Baş Göynük və Köndələn kənd məktəblərinin hər birindən 1 nəfər təmsil etmişlər.

2006-2007-ci tədris ilində respublika olimpiadalarının Şəki ŞTŞ üzrə nəticələri aşağıdakı kimi olmuşdur.

**Cədvəl 3.3.13**

| № | F ə n l ə r | İştirakçıların sayı | Qaliblərin sayı | | | | Cəmi |
|---|---|---|---|---|---|---|---|
| | | | I yer | II yer | III yer | IV yer | |
| 1 | Azərbaycan dili və ədəbiyyatı | 3 | - | - | - | 1 | 1 |
| 2 | Azərbaycan tarixi | 4 | - | - | - | - | - |

| | | | | | | | |
|---|---|---|---|---|---|---|---|
| 3 | Riyaziyyat | 4 | - | - | - | - | - |
| 4 | Fizika | 2 | - | - | - | 1 | 1 |
| 5 | Kimya | 2 | - | 1 | 1 | - | 2 |
| 6 | Biologiya | 3 | - | - | - | - | - |
| 7 | İnformatika | 2 | - | - | - | - | - |
| | Cəmi | **20** | - | 1 | 1 | 2 | **4** |

Respublika fənn olimpiadalarının nəticələrinə görə 20 nömrəli məktəbin XI sinif şagirdi Günay Vahabova Azərbaycan dili və ədəbiyyatı fənni üzrə, şəhər fizika-riyaziyyat və humanitar təmayüllü liseyin XI sinif şagirdi Əlipaşa Camallı fizika fənni üzrə həvəsləndirici mükafatla, Özəl Türk liseyinin XI sinif şagirdi Ramil Abdullayev kimya fənni üzrə II dərəcəli, həmin liseyin X sinif şagirdi Samir Qiyaslı kimya fənni üzrə III dərəcəli diplomla təltif olunmuşlar.

Məktəblilər müxtəlif müsabiqə və yarışlarda iştirak etmişlər. Cunud kənd məktəbinin şagirdi Kəmalə İsmayılova *«Ekologiya uşaqların gözü ilə»* Respublika rəsm müsabiqəsinin qalibi olmuş, şəhər 10 nömrəli məktəbin X sinif şagirdi Gülgəz Salamova *«Heydər Əliyev və Müstəqil Azərbaycan»* mövzusunda Respublika turunun mükafatçısı olmuş və onun inşa yazısı «*Heydər Əliyev məktəblilərin gözü ilə*» kitabına daxil edilmişdir.

ABŞ Dövlət Departamenti tərəfindən keçirilən orta məktəb şagirdləri üçün *«Gənc liderlər Mübadiləsi»* (FLEX) proqramının qalibləri olan şəhər 18 nömrəli orta məktəbin XI sinif şagirdi Kənan Heybətli, 10 nömrəli orta məktəbin XI sinif şagirdi Kamran Vahabzadə bir il müddətinə ABŞ-da ailədə yaşayaraq pulsuz təhsil almaq hüququ qazanmışlar. 10 nömrəli məktəbin digər bir nümayəndəsi, X sinif şagirdi Könül Kərimova Sülh korpusu xətti ilə keçirilən ingilis dilində yazı müsabiqəsinin Respublika turunda I yeri tutmuşdur.[433]

Orta ümumtəhsil məktəbinin ən mühüm göstəricilərindən biri ali məktəblərə qəbulun nəticələridir. 2006/2007-ci tədris ilində məktəbi bitirmiş 2.279 nəfər məzundan 1.152 nəfəri, əvvəlki illərdə məktəbi bitirmiş məzunlardan isə 508 nəfəri ali məktəbə daxil olmaq üçün ərizə vermişdir. Qəbul imtahanlarının nəticələrinə görə 2007-ci ildə məktəbi bitirənlərdən 268 nəfəri, əvvəlki illərdə məktəbi bitirənlərdən isə 99 nəfəri tələbə adını qazanmışdır.[434] Məzunlardan **21 nəfəri 600 baldan , 44 nəfəri 550 baldan, 90 nəfəri 500 baldan yuxarı nəticə göstərmişlər.** [435]

Sözün həqiqi mənasında uğurları ilə sevinməyə haqları olan məzunlardan bir qrupunun göstəriciləri ilə oxucuları tanış edirik:

***İbrahimov Emil Abdurəşid oğlu –***
*680 bal, şəhər* fizika-riyaziyyat və humanitar təmayüllü lisey
***Əhmədzadə Xəyal Mahmud oğlu-***
*667 bal- 5* nömrəli *məktəb*
***Əhmədov Niymət Mövlüd oğlü-***
*662 bal-Aşağı Göynük orta məktəbi*

***İbrahimova Arzu Telman qızı-***
*652 bal-Baş Künküt orta məktəbi*
***Abdurrahmanova Samirə Akif qızı**-*
*632 bal- 12* nömrəli *məktəb*
***Çələbiyev Elvin Mahir oğlu-***
*630 bal-şəhər* fizika-riyaziyyat və humanitar təmayüllü lisey
***Haqverdiyev Fərhad Elşad oğlu**-*
*627 bal- 5* nömrəli *orta məktəb*
***Abbasov Aysel Bakıxan qızı***
*625 bal- 10* nömrəli *məktəb*
***Əfəndizadə Şamil Fazil oğlu-***
*624 bal-10* nömrəli *məktəb*
***Səlimov Anar Yaşar oğlu-***
*621 bal- şəhəri* fizika-riyaziyyat və humanitar təmayüllü lisey
***Həmzətov Xəyal Nurəhməd oğlu-***
*620 bal-7* nömrəli *məktəb*
***Allahverdiyev Tehran Əmiraslan oğlu-***
*619 bal- 19* nömrəli *məktəb*
***Məmmədova Günel Müsabir qızı-***
*619 bal- 12* nömrəli *məktəb*
***Rəsulov Anar Abdurahim oğlu-***
*616 bal- Baş Zəyzid orta məktəbi*
***Abdurahmanov Mətin Famil oğlu-***
*613 bal-Baş Göynük kənd 1 nömrəli tam orta məktəb*
***Müstafayeva Nübar Azər qızı-***
*613 bal- şəhər* fizika-riyaziyyat və humanitar təmayüllü lisey
***Ramazanova Təranə Nüsrət qızı-***
*604 bal- 7* nömrəli *məktəb*
***Səmədova Turan Səbuhi qızı-***
*602 bal- 18* nömrəli *məktəb* və s.

Qəbul imtahanlarında şəhər 5, 7, 9, 10, 11,18, 19, 20 nömrəli, Baş Zəyzid, Baş Künküt kənd məktəblərinin şagirdləri daha yüksək bal toplamışlar.

Respublikamızın iqtisadi qüdrətinin artması təhsil sistemində davamlı inkişaf üçün əsaslı infrastruktur dəyişikliklərinə yol açmışdır. Baş verən dəyişiklikləri bütün sahələrdə, o cümlədən təhsil sistemində də müşahidə etmək mümkündür. Xüsusi ilə regionların inkişafına dair Dövlət proqramının həyata keçirilməsi nəticəsində təhsil sisteminin maddi-texniki bazasının yaxşılaşdırılmasına yönələn tədbirlər pedaqoji ictimaiyyət tərəfindən rəğbətlə qarşılanmışdır. Baş verən dəyişiklikləri Şəki təhsilində də görmək olar.

2007-2008-ci tədris ilində Şəkidə 101 ümumtəhsil məktəbi üzrə 1.864 sinif komplektində 28.419 nəfər təhsilə cəlb edilmişdir. Şəhər qarışıq tipli inter-

nat məktəbində əqli və fiziki cəhətdən qüsurlu uşaqlar üçün təşkil olunmuş 10 sinifdə 45 nəfər təhsillə əhatə olunmuşdur.

Şəki ŞTŞ üzrə 2007/2008-ci tədris ilinə aid məktəb şəbəkəsi[436]

**Cədvəl 3.3.14**

| Sıra № si | Göstəricilər | şəhər | kənd | cəmi |
|---|---|---|---|---|
| 1 | Gündüz ümumtəhsil məktəblərinin sayı<br>o cümlədən:<br>ibtidai<br>əsas<br>orta | 21<br><br>-<br>-<br>21 | 80<br><br>5<br>23<br>52 | 101<br><br>65<br>23<br>73 |
| 2 | Məktəblərin ümumi sayından internat | 1 | - | 1 |
| 3 | Cəmi sinif komplektləri<br>O cümlədən:<br>hazırlıq | 601<br><br>- | 1263<br><br>7 | 1864<br><br>7 |
| | I-IV siniflər | 190 | 436 | 626 |
| | V-X siniflər | 296 | 619 | 915 |
| | X-XI siniflər | 115 | 201 | 316 |
| 4 | Gündüz məktəblərində şagirdlərin sayı-<br>cəmi<br>O cümlədən:<br>hazırlıq siniflərində<br>I-IV siniflərdə<br>V-IX siniflərdə<br>X-XI siniflərdə | 9.871<br><br>-<br>2903<br>5.234<br>1734 | 18.548<br><br>102<br>6003<br>9.410<br>3033 | 28.419<br><br>102<br>8.906<br>14.644<br>4767 |
| 5 | Şagirdlərin ümumi sayından internat məktəblərində oxuyanlar | 103 | - | 103 |
| 6 | Birsinifli komplektin orta sıxlığı | 16,42 | 14,269 | 15,25 |
| 7 | Xüsusi məktəblərin sayı | - | - | - |
| 8 | Məktəbyanı internatların sayı<br>Onlarda şagirdlərin sayı<br>Bunlardan tam dövlət təminatında olan uşaqların sayı | -<br>-<br>- | -<br>-<br>- | -<br>-<br>- |

| | | | | |
|---|---|---|---|---|
| 9 | Günüuzadılmış məktəblərin sayı | - | - | - |
| 10 | Məktəblərin nəzdində günüuzadılmış qrupların sayı<br>Onlarda şagirdlərin sayı | 1<br>20 | -<br>- | 1<br>20 |
| 11 | Axşam (növbəli) ümum təhsil məktəblərinin sayı | - | - | - |
| 12 | Gündüz ümumtəhsil mək təbləri nəzdində axşam (əyani-qiyabi) siniflərinin sayı<br>Onlarda şagirdlərin sayı | -<br>- | -<br>- | -<br>- |
| 13 | Gündüz məktəblərinin və ya internat məktəblərin nəz-dində əqli və fiziki cəhətdən qüsurlu uşaqlar üçün açılmış sinif komplektlərinin sayı<br>Onlarda uşaqların sayı | 10<br>45 | -<br>- | 10<br>45 |
| 14 | Məktəbdənkənar tərbiyə müəssisələrində qrupların sayı | 419 | 30 | 449 |
| | 1. Ekoloji Tərbiyə və Təcrü-bəçilik Mərkəzi | 64 | - | 64 |
| | 2.Texniki Yaradıcılıq Mərkəzi | 142 | - | 142 |
| | 3. Uşaq Yaradıcılıq Mərkəzi | 128 | - | 128 |
| | 4. Uşaq Gənclər İdman Mək-təbi | 41 | - | 41 |
| | 5. Uşaq Gənclər Şahmat Məktəbi | 44 | - | 44 |
| | 6. Uşaq Gənclər Fiziki Hazırlıq klubu | - | 30 | 30 |

Tədris ilində Dünya Bankının maliyyə dəstəyi ilə həyata keçirilən Təhsil Sektorunun İnkişafı Layihəsi çərçivəsində respublikamızda təhsilin məzmununda islahatlar aparılmağa başlanmışdır. İslahatların əhəmiyyətli istiqamətlərindən biri yeni qiymətləndirmə sisteminin yaradılmasıdır. Bu istiqamətdə orta təhsil kursu üzrə buraxılış imtahanlarının mərkəzləşdirilmiş qaydada keçirilməsi sahəsində atılmış addımlar təhsilin keyfiyyətinin yaxşılaşdırılmasına, təhsilə münasibətdə şagird və müəllimlərin, məktəb rəhbərlərinin, eləcə də valideynlərin məsuliyyətinin artırılmasına xidmət edir. Respublika Təhsil nazirinin əmri ilə bir sıra rayonlarda, o cümlədən Şəki şəhərində XI siniflərdə buraxılış imtahanları cavab kartı tətbiq edilmədən test üsulu ilə mərkəzləşdirilmiş qaydada

aparılmışdır. Belə imtahanlarda iştirak etmiş 2.307 nəfər şagirddən 2.159 nəfər müvəffəq qiymət alaraq orta təhsilini başa vurmuşdur. XI siniflərin buraxılış imtahanlarında iştirak etmiş şagirdlərdən 148 nəfəri test çalışmalarının öhdəsindən gələ bilmədiyindən attestat ala bilməmişlər.[437]

Təlimin məzmununa müasir yanaşmaları özündə əks etdirən yeni fənn kurikulumlarının tətbiqi təhsilin keyfiyyətində müsbət irəliləyişlərin olması ilk növbədə bu sahədə işləyəcək müəllimlərin hazırlığından asılıdır. Bu məqsədlə I siniflər üzrə kurikulumun tətbiqi ilə əlaqədar müəllimlər Azərbaycan Müəllimlər İnstitutuna göndərilmiş, orada müvafiq təlim keçmişlər. Tədris ili ərzində 17 kateqoriya üzrə 311 nəfər müəllim ixtisasartırma kurslarına göndərilmişdir.

Tədris ilinin yaddaqalan hadisələrindən biri Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin ***«Ən yaxşı ümumi təhsil müəssisəsi* və *ən yaxşı müəllim mükafatlarının təsis edilməsi haqqında»*** 04 sentyabr 2007-ci il tarixli, 2373 nömrəli sərəncamı olmuşdur. Bu sərəncamın icrası ilə əlaqədar Təhsil Nazirliyinin 2 noyabr 2007-ci il tarixli, 46-25-7100/16 nömrəli məktubuna əsasən şəhər 10 nömrəli məktəbin müəllimləri Ədalət Musayeva və Fikrət Əsgərov, 11 nömrəli məktəbin müəllimləri Ruhangiz Abdullayeva və Xatirə Abdullayeva, 20 nömrəli məktəbin müəllimi Mahir Əyyubov «Ən yaxşı müəllim» müsabiqəsində, şəhər 5 nömrəli və H.Əliyev adına Kiş kənd 1 nömrəli orta məktəbləri «Ən yaxşı ümumi təhsil müəssisəsi» müsabiqəsində iştirak etmişlər. Qeyd edək ki, az sonra **F.Əsgərov və R.Abdullayeva «Azərbaycan Respublikasının əməkdar müəllimi»** fəxri adına layiq görülmüşlər.

Biliklərə əsaslanmış iqtisadiyyatın təşəkkül tapdığı şəraitdə informasiya və kommunikasiya texnologiyalarının (İKT) inkişafı ölkənin intellektual və elmi potensialının vacib göstəricilərindən biridir. Ölkə Prezidentinin sərəncamı ilə təsdiq edilmiş *«Ümumtəhsil məktəblərinin İKT ilə təminatı»* Proqramı bu istiqamətdə atılmış ən mühüm addım olmuşdur. Proqrama uyğun olaraq Şəki ŞTŞ üzrə 83 ümumtəhsil məktəbində 666 ədəd kompüter və digər İKT avadanlığı, 17 ədəd netbuk və proyektor quraşdırılmışdır.

Tədris ili müddətində gənclərin çağırışaqədər hazırlığı sahəsində də bir sıra tədbirlər həyata keçirilmişdir.

Əvvəlki tədris illərində olduğu kimi, 2007-2008-ci tədris ilində Şəki məktəbliləri fənn olimpiadalarında və ali məktəblərə qəbul imtahanlarında yüksək nəticələr göstərmişlər. 2007-2008-ci tədris ilində Respublika fənn olimpiadalarında Şəki məktəblilərinin iştirakı aşağıdakı cədvəldəki kimi olmuşdur.

**Cədvəl 3.3.15**

| № | F ə n l ə r | İştirakçıların sayı | Qaliblərin sayı | | | | Cəmi |
|---|---|---|---|---|---|---|---|
| | | | I yer | II yer | III yer | IV yer | |
| 1 | Azərbaycan dili | 3 | - | - | - | - | - |

| | | | | | | | |
|---|---|---|---|---|---|---|---|
| | və ədəbiyyatı | | | | | | |
| 2 | Azərbaycan tarixi | 5 | - | - | - | - | - |
| 3 | Riyaziyyat | 5 | - | - | - | - | - |
| 4 | Fizika | 2 | - | - | - | 1 | - |
| 5 | Kimya | 2 | - | - | - | 1 | - |
| 6 | Biologiya | 3 | - | - | - | - | - |
| 7 | İnformatika | 1 | - | - | - | - | - |
| | Cəmi | **21** | - | - | - | 2 | **2** |

Cədvəldən göründüyü kimi, olimpiadaların nəticələri o qədər də sevindirici olmamış, 21 iştirakçıdan cəmi iki şagird IV yeri tutmuşdur

Şəki məktəbliləri olimpiadalarda uğursuz çıxış etsələr də, ali məktəblərə qəbul imtahanlarında yüksək nəticələr əldə etmişlər. 2008-ci ildə məktəbi bitirmiş 2.158 nəfər məzundan 1.250 nəfəri ali məktəblərə qəbul üçün sənəd vermiş, onlardan 479 nəfəri ali məktəbə qəbul olunmuşdur.[438] Məzunlardan **50 nəfəri 600 baldan** yuxarı nəticə göstərmişdir. *Şəhər 5* nömrəli *məktəbdən 6 nəfər, 7 nömrəli məktəbdən 5 nəfər, 10 və 11* nömrəli *məktəblərin hər birindən 4 nəfər, şəhər fizika-riyaziyyat və humanitar təmayüllü liseydən 3 nəfər, 1,18, 19* nömrəli *şəhər, Böyük Dəhnə 1* nömrəli, *Orta Zəyzid 1* nömrəli, *Vərəzət kənd məktəblərinin hər birindən 2 nəfər, 3 və 14* nömrəli *şəhər, Baltalı, Cunud, Qaratorpaq, Bideyiz, Aşağı Göynük, Baş Layıskı, Köndələn, II Biləcik, Qoxmuq kənd orta məktəblərinin hər birindən 1 nəfər 600 baldan yuxarı nəticə göstərmişlər.*

Ümumilikdə, *şəhər* ***10 nömrəli*** *məktəbdən* ***35 nəfər***, **5** nömrəli *məktəbdən* ***34 nəfər***, *7* nömrəli *məktəbdən* ***32 nəfər***, *şəhər fizika-riyaziyyat və humanitar təmayüllü liseydən* ***27 nəfər***, ***11*** nömrəli *məktəbdən* ***26 nəfər***, ***18*** *və* ***19*** nömrəli *məktəblər və* ***Oxut*** *kənd orta məktəbinin hər birindən* ***18 nəfər***, ***Turan*** *qəsəbə orta məktəbindən* ***14 nəfər*** *ali məktəblərə qəbul olunmuşlar*.[439]

2008-2009-cu tədris ili üçün qəbul imtahanlarında 600 baldan yuxarı nəticə göstərmiş bir qrup məzunun məktəblər üzrə siyahısı[440]

**Cədvəl 3.3.16**

| № | Məzunun soyadı, adı və atasının adı | Bitirdiyi məktəb | Topladığı bal |
|---|---|---|---|
| 1 | Əhmədli Nərmin İsa qızı | şəhər fizika-riyaziyyat və humanitar təmayüllü lisey | 695 |
| 2 | Həsənov Şahin İlham oğlu | Vərəzət kənd məktəbi | 681 |
| 3 | Şərifli Nigar Rövşən qızı | 18 nömrəli məktəb | 680 |
| 4 | Məmmədov Bəhruz Vidadi oğlu | Baltalı kənd orta məktəbi | 675 |
| 5 | Şükürzadə Azər Məclum oğlu | Özəl Türk liseyi | 675 |
| 6 | Məsimova Aytac Eynulla qızı | Böyük Dəhnə 1 nömrəli | 671 |

| | | | |
|---|---|---|---|
| | | kənd məktəbi | |
| 7 | Həsənov Cəsur Mülkədar oğlu | 3 nömrəli orta məktəb | 670 |
| 8 | Əzizzadə Sevinc Neymət qızı | Cunud kənd orta məktəbi | 670 |
| 9 | Süleymanzadə Mətin Qalib oğlu | 10 nömrəli orta məktəb | 665 |
| 10 | Kərimova Könül Telman qızı | 10 nömrəli orta məktəb | 661 |
| 11 | Şərifova Səbinə Rüstəm qızı | 18 nömrəli orta məktəb | 660 |
| 12 | Cabbarova Simuzər İmran qızı | 11 nömrəli orta məktəb | 658 |
| 13 | Məmmədova Çinarə İmran qızı | Qaratorpaq kənd orta məktəbi | 655 |
| 14 | Yusifzadə Nəcibə Nazim qızı | 7 nömrəli orta məktəb | 651 |
| 15 | Abdurəhimli Cəlil Seyran oğlu | 5 nömrəli orta məktəb | 650 |

Şəki ŞTŞ 2008-2009-cu tədris ilinə ciddi hazırlıq işləri aparmışdır. Müəllimlərin 2008-ci il sentyabr konfransında məlumat verilmişdir ki, yeni dərs ilinə hazırlıq artıq başa çatmaq üzrədir. Yeni dərs ilinə hazırlıqla əlaqədar olaraq *«Ümumtəhsil məktəblərinin əsaslı təmiri və yeni məktəb binalarının tikintisi üzrə»* Dövlət Proqramı çərçivəsində 17 nömrəli məktəbdə 160 şagird yeri olan əlavə tədris korpusu tikilmiş, şəhər 3, 10, 9,14,17,19 nömrəli, Cunud, Biləcik, Baş Göynük kənd orta məktəblərində əsaslı təmir işləri aparılmış, 4 və 20 nömrəli şəhər, Şin kənd və Çələbixan qəsəbə məktəblərində cari təmir işləri görülmüşdür.

Yeni dərs ilinə hazırlıqla əlaqədar 2008/2009-cu tədris ili üçün təhsil nazirliyinə 42 gənc mütəxəssis üçün sifariş verilmiş, dərsliklər gətirilərək məktəblərə paylanmışdır. Azərbaycan Respublikası Prezidenti İ.Əliyevin «*Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında»* 12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunan 548 adda 11.030 nüsxə Azərbaycan, dünya klassik və müasir ədəbiyyat nümunələri bölgü əsasında məktəblərə verilmişdir. 2008-ci ildə 122 adda 28.172 ədəd bədii ədəbiyyat gətirilərək məktəb kitabxanaları zənginləşdirilmişdir.[441]

**2008/2009-cu tədris ilində** Şəkinin 100 ümumtəhsil məktəbində 1.759 sinifdə 27.082 nəfər təhsil almışdır. Şəhər qarışıq tipli internat məktəbində 10 sinifdə 38 nəfər əqli və fiziki cəhətdən qüsurlu uşaq təhsillə əhatə olunmuş, 135 nəfər uşağın evdə təhsili təşkil edilmişdir. Dərs ilinin yekununa görə, 27.082 nəfər tədris ilinin sonuna qalmışdır ki, onlardan da 26.408 nəfər məktəbi bitirmiş və ya yuxarı siniflərə keçirilmişlər. Tədris ilində 3.051 nəfər əsas məktəbi, 1.686 nəfər orta məktəbi müvəffəqiyyətlə başa vurmuşlar. Əsas məktəbi bitirənlərdən 112 nəfər fərqlənmə şəhadətnaməsi, orta məktəbi bitirənlərdən 6 nəfər fərqlənmə attestatı almışdır.[442]

Şəki ŞTŞ üzrə 2008/2009-cu tədris ilinə aid məktəb şəbəkəsi[443]

**Cədvəl 3.3.17**

| Sıra № si | Göstəricilər | şəhər | kənd | cəmi |
|---|---|---|---|---|
| 1 | Gündüz ümumtəhsil məktəblərinin sayı<br>o cümlədən:<br>ibtidai<br>əsas<br>orta | 21<br><br>-<br>-<br>21 | 79<br><br>4<br>23<br>52 | 100<br><br>4<br>23<br>73 |
| 2 | Məktəblərin ümumi sayından internat | 1 | - | 1 |
| 3 | Cəmi sinif komplektləri<br>o cümlədən:<br>hazırlıq | 556<br><br>- | 1203<br><br>8 | 1759<br><br>8 |
| | I-IV siniflər | 173 | 418 | 591 |
| | V-IX siniflər | 284 | 588 | 872 |
| | X-XI siniflər | 99 | 189 | 288 |
| 4 | Gündüz məktəblərində şagirdlərin sayı-<br>cəmi<br>o cümlədən:<br>hazırlıq siniflərində<br>I-IV siniflərdə<br>V-IX siniflərdə<br>X-XI siniflərdə | 9.368<br><br>-<br>2.832<br>4.976<br>1.560 | 17.714<br><br>114<br>5.932<br>8.818<br>2.850 | 27.082<br><br>114<br>8.764<br>13.794<br>4.410 |
| 5 | Şagirdlərin ümumi sayından internat məktəblərində oxu yanların sayı-<br>cəmi | 73 | - | 73 |
| 6 | Birsinifli komplektin orta sıxlığı | 16,85 | 14,72 | 15,840 |
| 7 | Gündüz məktəblərinin və ya internat məktəblərin nəzdində əqli və fiziki cəhətdən qüsur lu uşaqlar üçün açılmış sinif komplektlərinin sayı<br>Onlarda uşaqların sayı | 10<br>38 | -<br>- | 10<br>38 |
| 8 | Məktəbdənkənar tərbiyə müəssisələrində qrupların | | | |

| | | | | |
|---|---|---|---|---|
| | sayı | 419 | 30 | 449 |
| | 1. Ekoloji Tərbiyə və Təcrübəçilik Mərkəzi | 64 | - | 64 |
| | 2.Texniki Yaradıcılıq Mərkəzi | 142 | - | 142 |
| | 3. Uşaq Yaradıcılıq Mərkəzi | 128 | - | 128 |
| | 4. Uşaq Gənclər İdman Məktəbi | 41 | - | 41 |
| | 5. Uşaq Gənclər Şahmat Məktəbi | 44 | - | 44 |
| | 6. Uşaq Gənclər Fiziki Hazırlıq Klubu | - | 30 | 30 |
| 9 | Məktəbəqədər tərbiyə müəssisələrinin sayı | 28 | 32 | 60 |
| | Onlarda qrupların sayı | 76 | 65 | 141 |
| | Uşaqların sayı | 1.510 | 1.260 | 2.770 |

2008-2009-cu tədris ilində Şəki ŞTŞ-nin tabeliyində olan məktəbəqədər tərbiyə müəssisələrinin işində uğurlar olmuşdur. Tədris ili müddətində 60 məktəbəqədər tərbiyə müəssisəsi fəaliyyət göstərmişdir. Onların 28-i şəhərdə, 32-si kənd yerlərində olmuşdur. Həmin tərbiyə müəssisələrinə 141 qrupda 2.770 məktəbəqədər yaşlı uşaq cəlb edilmişdir. Uşaq bağçalarının 10-u birtipli layihə üzrə tikilmiş binalarda, qalanları isə uyğunlaşdırılmış binalarda yerləşmişdir. 60 uşaq bağçasından 10-u körpələr evi uşaq bağçası, 50-si isə uşaq bağçası kimi fəaliyyət göstərmişdir.[444]

2009-cu ilin may ayında Şəki «Uluçay» xeyriyyə cəmiyyəti Yaponiyanın maliyyə dəstəyi ilə 40 yerlik yeni tipli uşaq bağçası tikərək Zəyzid kənd əhalisinin istifadəsinə vermişdir.



*Uşaq bağçasında açıq məşğələ*

Bütün bunlarla bərabər, təhlillər göstərir ki, məktəbəqədər tərbiyə müəssisələrinin işində nöqsanlar qalmaqdadır. Bu nöqsanların bir hissəsi rayonun əlaqədar təşkilatlarının, əsas hissəsi rayon təhsil şöbəsinin fəaliyyəti ilə bağlı olmuşdur. Faktlara diqqət yetirək: Şəki üzrə məktəbəqədər təhsillə əhatə səviyyəsi 23,55%-dir. Kənd uşaq bağçalarında çalışan tərbiyəçilərin 71 nəfəri ümumi orta təhsillidir. Bağçaların xeyli hisəsinin təmirə ehtiyacı vardır. Bu bağçaların təmiri isə yerli hakimiyyət və idarəetmə təşkilatlarından asılıdır. Uşaq bağçalarının ərzaq, bərk və yumşaq inventarlarla təminatında, qida rejiminin təşkilində nöqsanlar qalmaqdadır.

Bütün respublikada olduğu kimi, Şəkidə də buraxılış imtahanları mərkəzləşdirilmiş qaydada keçirilmiş və əvvəlki illərlə müqayisədə uğurlar əldə edilmişdir. İmtahanda iştirak edən 2.073 nəfər şagirddən 1.685 nəfəri müvəffəq qiymət, o cümlədən 8 nəfəri bütün fənlərdən «5» qiymət almışdır. Şəki şəhəri üzrə orta göstərici 81,3 % olmuşdur ki, bu da Respublika üzrə orta göstəricidən (77,5%) yüksəkdir.

Şəki məktəbliləri əvvəlki illərdə olduğu kimi, bu tədris ilində də fənn olimpiadalarında iştirak etmişlər. Özəl Türk liseyinin şagirdi **Rəşad Bayramov** fizika fənni üzrə **II yer**, 18 nömrəli məktəbin şagirdi **Nərmin İsgəndərova** Azərbaycan tarixi fənni üzrə **III yer** tutmuş, 10 nömrəli məktəbin şagirdi **Dərya Vəliyeva**, şəhər fizika-riyaziyyat və humanitar təmayüllü liseyin şagirdi **Ayxan**

**Salamov** riyaziyyat fənni üzrə, 7 nömrəli məktəbin şagirdi **Aygün İsmayılova** biologiya fənni üzrə, Şəki Özəl Türk liseyinin şagirdləri **Şirinli Şirin** Azərbaycan dili və ədəbiyyat fənni üzrə, **Samir Poladov f**izika fənni üzrə**, Cəlil Yusifzadə** informatika fənni üzrə **IV yerə** çıxaraq həvəsləndirici mükafata layiq görülmüşlər.

2008/2009-cu tədris ilində respublika fənn olimpiadalarında Şəki məktəblilərinin göstəriciləri aşağıdakı cədvəldəki kimi olmuşdur:

**Cədvəl 3.3.18**

| № | F ə n l ə r | İştirak çıların sayı | Qaliblərin sayı | | | | Cəmi |
|---|---|---|---|---|---|---|---|
| | | | I yer | II yer | III yer | IV yer | |
| 1 | Azərbaycan dili və ədəbiyyatı | 3 | - | - | 1 | 1 | 2 |
| 2 | Azərbaycan tarixi | 2 | - | - | 1 | - | 1 |
| 3 | Riyaziyyat | 4 | - | - | - | 2 | 2 |
| 4 | Fizika | 3 | - | 1 | - | 1 | 2 |
| 5 | Kimya | - | - | - | - | - | - |
| 6 | Biologiya | 3 | - | - | - | 1 | 1 |
| 7 | İnformatika | 1 | - | - | - | 1 | 1 |
| | Cəmi | **16** | - | 1 | 2 | 6 | **9** |

Respublika Təhsil Nazirliyi riyaziyyat, fizika və kimya-biologiya fənləri üzrə aşkara çıxarılmış istedadlı şagirdlər arasından ən istedadlılarını müəyyənləşdirmək məqsədi ilə 2009-cu ilin may ayında Bakıda alim və mütəxəssislərin iştirakı ilə keçirilən təkrar seçimdə 11 nömrəli məktəbin şagirdi **Abdüləli Hadızadə** iştirak etmiş, 100 ballıq sistem üzrə **84 bal** toplayaraq **Respublika birincisi** olmuş, 7 nömrəli məktəbin şagirdi **Aygün İsmayılova** biologiya fənni üzrə **56 balla** ən yüksək nəticə göstərmişdir.[445]

Respublika Təhsil Nazirliyi və «Çağ» Öyrətim İşlətmələrinin birgə təşkil etdiyi riyaziyyat-məntiq olimpiadasında şəhər 8 nömrəli orta məktəbin VI sinif şagirdi **Elsevər İsmayılov I dərəcəli diplom və 500 manat pul ilə mükafatlandırılmışdır**.

Şəki ŞTŞ-də «*2008-2012-ci illərdə Azərbaycan Respublikasında Təhsil sisteminin informasiyalaşdırılması üzrə Dövlət Proqramı»*nın həyata keçirilməsi sahəsində müəyyən işlər görülmüşdür. Lakin aparılan təhlillər göstərir ki, ümumitəhsil məktəblərində müasir informasiya və kommunikasiya texnologiyalarının tətbiqi vəziyyəti qeyri-qənaətbəxşdir. *Belə ki, Şəkinin 17 məktəbinə kompüter texnikası verilməmişdir. 73 orta məktəbdən cəmi 3 məktəbin internetə çıxışı vardır.*

2008/2009-cü tədris ilinin yekununda ümumtəhsil məktəblərinin məzunları ali məktəblərə qəbul imtahanlarında iştirak etmiş, 2009-cu ildə məktəbi bitirmiş 1.686 məzundan 931 nəfəri ali məktəblərə daxil olmaq üçün sənəd vermiş, onlardan **406 nəfəri** tələbə adını qazanmışdır. **22 nəfər şəkili məzun 600 baldan, 73 nəfər məzun 500 baldan yuxarı nəticə göstərmişdir.**[446]

Şəki şəhər 10 nömrəli məktəbin məzunu *Musazadə Xəyyam Həsrət oğlu* **670 bal,** 5 nömrəli məktəbin məzunu *Rəsulzadə Nailə Şahid qızı* **670 bal**, Kiş kənd 1 nömrəli məktəbin məzunu *Bayramova Aydan İlqar qızı* **660 bal**, Bideyiz kənd məktəbinin məzunu *İsmayılov Orxan Rəhman oğlu* **650 bal,** 2 nömrəli məktəbin məzunu *Kərimli Kamran Rasim oğlu* **642 bal,** 10 nömrəli məktəbin məzunu *İsmayılov Rəşad Mahmud oğlu* **641 bal**, 5 nömrəli məktəbin məzunu *Rəhimli Aytən Miroğlan* qızı **632 bal,** 10 nömrəli məktəbin məzunu *Əsədullyeva Firəngiz Kamran* qızı **629 bal** toplamışlar. Ümumilikdə, ali məktəblərə qəbul imtahanlarında şəhər 2, 3, 4, 5, 7, 10, 12, 14, 17,18 nömrəli, şəhər fizika-riyaziyyat və humanitar təmayüllü lisey, Turan qəsəbə, Baş Zəyzid və Orta Zəyzid 1 nömrəli, Oxut, Baş Layskı, Bideyiz, Oraban kənd məktəbləri fərqlənmişlər. ***5*** nömrəli ***məktəbdən sənəd vermiş 35 məzundan 21 nəfər, 7*** nömrəli ***məktəb üzrə 43 məzundan 24 nəfər, 10*** nömrəli ***məktəb üzrə 53 nəfərdən 30 nəfər, 17*** nömrəli ***məktəb üzrə 17 nəfərdən 8 nəfər, şəhər fizika-riyaziyyat və humanitar təmayüllü lisey üzrə 64 nəfərdən 40 nəfər, «Turan» qəsəbə orta məktəbi üzrə 21 nəfərdən 14 nəfər ali məktəb tələbəsi olmuşdur.***[447]

Tədrisin keyfiyyətinin yüksəldilməsində məktəb kitabxanaları mühüm rola malikdir. 2008/2009-cu tədris ilində Şəki ŞTŞ-nin tabeliyində olan 100 ümumtəhsil məktəbinin 96-da kitabxana fəaliyyət göstərmişdir. Bu kitabxanalarda 514.335 nüsxədə dərslik, 347.612 nüsxə bədii ədəbiyyat olmuşdur. Milli kurikuluma keçidlə əlaqədar olaraq ötən tədris ilində I siniflərdə oxumuş şagirdlər üçün 11.720 ədəd dərslik, müəllimlər üçün isə 1.040 ədəd vəsait kitabxanalara paylanmışdır. Tədris ilində Azərbaycan Respublikası Təhsil Nazirliyindən 40 adda 56.339 nüsxə dərslik gətirilərək məktəblərə verilmişdir. [448]

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin *«...qara qızıldan, maddi dəyərlərdən əldə edilən kapital ölkədə insan kapitalının inkişafına yönəldilməlidir»* konsepsiyası cəmiyyətin inkişafında yeni mərhələnin başlanğıcını qoymuşdur. Həmin konsepsiyanı əldə rəhbər tutan təhsil işçiləri «Təhsili Azərbaycanın davamlı inkişaf strategiyasının ən öncül istiqamətlərindən biri» hesab etmiş, «Təhsil haqqında» Azərbaycan Respublikası Qanununun qəbul olunması və Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin həmin qanunun tətbiq edilməsi barədə 5 sentyabr 2009-cu il tarixli Fərmanından[449] irəli gələn vəzifələrin yerinə yetirilməsi üçün bütün qüvvələri səfərbər etmişlər.

2009-2010-cu tədris ilində Şəkidə 100 ümumtəhsil məktəbi fəaliyyət göstərmiş, həmin məktəblərə 25.867 nəfər şagird cəlb olunmuşdur. Məktəblərdən 4-u ibtidai, 23-ü ümumi orta, 73-ü tam orta məktəblər olmuşdur. Dərs ilinin yekununa görə, 25.867 nəfər şagirddən 25.346 nəfəri tədris ilinin sonuna qalmış, onlardan 24.489 nəfəri yuxarı siniflərə keçirilmiş və ya məktəbi bitirmişlər.

Tədris ilinin yekununa görə, 1.656 nəfər məzun orta təhsil haqqında attestat, 2.263 nəfər isə əsas təhsil haqqında şəhadətnamə almışlar . Orta məktəbi bitirənlərdən 4 nəfəri fərqlənmə attestatına layiq görülmüşdür.[450]

Şəki ŞTŞ üzrə 2009/2010-cu tədris ilinə aid məktəb şəbəkəsi[451]

**Cədvəl 3.3.19**

| Sıra № si | Göstəricilər | şəhər | kənd | cəmi |
|---|---|---|---|---|
| 1 | Gündüz ümumtəhsil məktəblərinin sayı<br>o cümlədən:<br>ibtidai<br>əsas<br>orta | 21<br><br>-<br>-<br>21 | 79<br><br>4<br>23<br>52 | 100<br><br>4<br>23<br>73 |
| 2 | Məktəblərin ümumi sayından internat | 1 | - | 1 |
| 3 | Cəmi sinif komplektləri<br>o cümlədən:<br>hazırlıq | 534<br><br>- | 1182<br><br>9 | 1716<br><br>9 |
| | I-IV siniflər | 170 | 412 | 582 |
| | V-IX siniflər | 259 | 569 | 28 |
| | X-XI siniflər | 105 | 192 | 297 |
| 4 | Gündüz məktəblərində şagirdlərin sayı-<br>cəmi<br>o cümlədən:<br>hazırlıq siniflərində<br>I-IV siniflərdə<br>V-X siniflərdə<br>X-XI siniflərdə | 8.897<br><br>-<br>2.789<br>4.566<br>1.542 | 16.970<br><br>125<br>5.783<br>8.214<br>2.848 | 25.867<br><br>125<br>8.572<br>12.780<br>4.390 |
| 5 | Şagirdlərin ümumi sayından internat məktəblərində oxu yanlar | 66 | - | 66 |
| 6 | Birsinifli komplektin orta sıxlığı | 16,66 | 14,36 | 15,08 |
| 7 | Gündüz məktəblərinin və ya internat məktəblərin nəz-dində əqli və fiziki cəhətdən qüsurlu uşaqlar üçün açılmış | | | |

| | | | | |
|---|---|---|---|---|
| | sinif komplektlərinin sayı<br>Onlarda uşaqların sayı | 10<br>33 | -<br>- | 10<br>33 |
| 8 | Məktəbdənkənar tərbiyə müəssisələrində qrupların sayı<br>1. Ekoloji Tərbiyə və Təcrübəçilik Mərkəzi<br>2.Texniki Yaradıcılıq Mərkəzi<br>3.Uşaq Yaradıcılıq Mərkəzi<br>4.Uşaq Gənclər İdman Mək təbi<br>5.Uşaq Gənclər Şahmat Məktəbi<br>6.Uşaq Gənclər Fiziki Hazırlıq Klubu | <br>428<br>64<br>142<br>128<br>50<br>44<br>- | <br>-<br>-<br>-<br>-<br>-<br>-<br>30 | <br>428<br>64<br>142<br>128<br>50<br>44<br>30 |
| 9 | Məktəbəqədər müəssisələrin sayı<br>Onlarda qrupların sayı<br>Uşaqların sayı | 28<br>76<br>1.322 | 32<br>65<br>1.105 | 60<br>141<br>2.427 |

2009-2010-cu tədris ilində Şəkidə 60 məktəbəqədər uşaq tərbiyə, 5 məktəbdənkənar müəssisə fəaliyyət göstərmişdir. Məktəbəqədər müəssisələrdə 141 qrupa 2.427 uşaq, məktəbdənkənar müəssisələrdə isə 428 qrupa 6.072 uşaq cəlb olunmuşdur.

Aparılan müşahidələr və təhlillər göstərir ki, uşaqların təlim-tərbiyəsində əvəzsiz rola malik məktəbəqədər və məktəbdənkənar müəssisələrin fəaliyyətində çatışmazlıqlar hələ də qalmaqdadır. Doğrudur, sadalanan müəssisələrin təmirə ehtiyacı vardır, onların maddi-texniki bazası günün tələblərinə cavab vermir. Lakin etiraf etmək lazımdır ki, bu müəssisələrin çoxu öz fəaliyyətini müasir standartlara uyğun qurmaq üçün yollar axtarmırlar. Başqa sözlə, sadalanan müəssisələr sadəcə iş yerləri kimi mövcuddur.

Məktəblilər respublika fənn olimpiadaları ilə yanaşı ayrı-ayrı nazirliklərin və şirkətlərin keçirdikləri olimpiada və müsabiqələrdə iştirak edərək mükafatlara layiq görülmüşlər. Azərbaycan Respublikası Təhsil Nazirliyinin Dövlət Neft Şirkətinin, Azərbaycan Respublikası Ekologiya və Təbii Sərvətlər Nazirliyinin dəstəyi ilə «Çağ» Öyrətim İşlətmələri Məhdud Məsuliyyətli Müəssisəsinin keçirdiyi «İNEPO-Avrasiya» IV Beynəlxalq Ətraf Mühitin Mühafizəsi Layihə Olimpiadasında şəhər 20 nömrəli orta məktəbin IX sinif şagirdi **Abbasov Nail Natiq oğlu**, Özəl Türk liseyinin X sinif şagirdi **Süleymanov Vüsal Ramiz oğlu** və müəllimi **Fatih Türk** ***II yer*** tutaraq gümüş medala, şəhər 11 nömrəli orta məktəbin X sinif şagirdləri **Aslanlı Aytən Məmmədiyyə qızı, Əhmədli İlahə Nurməmməd qızı** və həmin məktəbin müəllimi **Şabəddinova Xatirə Nəzir qızı** ADNŞ-nin ən yaxşı layihə üçün təsis etdiyi xüsusi mükafata layiq görülmüşlər.

ABŞ Dövlət Departamentinin keçirdiyi Gənc Liderlərin Mübadiləsi Proqramı müsabiqəsində şəhər 10 nömrəli məktəbin şagirdi **Rəsulzadə Əlövsət Anar oğlu** və Baş Zəyzid kənd orta məktəbinin şagirdi **Nəsibov Tural Etibar oğlu** qalib gələrək növbəti dərs ilində ABŞ-da yaşamaq və təhsil almaq hüququ qazanmışlar.[452]

Təhlil etdiyimiz tədris illərində Şəki məktəbliləri fənn olimpiadalarında fəal iştirak etmiş, mükafat yerlərini tutmuşlar. 2009-2010-cu tədris ilində fənn olimpiadalarında iştirak aşağıdakı cədvəldəki kimi olmuşdur:

**Cədvəl 3.3.20**

| № | F ə n l ə r | İştirakçıların sayı | Qaliblərin sayı | | | | Cəmi |
|---|---|---|---|---|---|---|---|
| | | | I yer | II yer | III yer | IV yer | |
| 1 | Azərbaycan dili və ədəbiyyatı | 3 | - | - | - | - | - |
| 2 | Azərbaycan tarixi | 2 | - | - | - | - | - |
| 3 | Riyaziyyat | 5 | - | - | - | 3 | 3 |
| 4 | Fizika | 5 | - | - | - | 2 | 2 |
| 5 | Kimya | 2 | - | - | - | - | - |
| 6 | Biologiya | 5 | - | - | - | 3 | 3 |
| 7 | İnformatika | 1 | - | - | - | - | - |
| | Cəmi | **23** | - | - | - | 8 | **8** |

Fənn olimpiadalarının qaliblərinin bir qrupu ilə oxucuları tanış edək.

***Rəcəbli Ağaməcid Rəfael oğlu-***
*10* nömrəli *məktəbin IX sinif şagirdi*
***Rəhimzadə Ramin Rauf oğlu-***
*12* nömrəli *məktəbin X sinif şagirdi*
***Hadızadə Abduləli Etibar oğlu-***
*11* nömrəli *məktəbin X sinif şagirdi*
***Ramazanov Ramazan Rizvan oğlu-***
*Özəl Türk liseyinin IX sinif şagirdi*
***Padarov Samir Elşad oğlu-***
*Özəl Türk liseyinin IX sinif şagirdi*
***Rəsulzadə Rübabə Eldar qızı-***
*1* nömrəli *məktəbin IX sinif şagirdi*
***Süleymanov Vüsal Ramiz oğlu-***
*Özəl Türk liseyinin X sinif şagirdi*
***Rəsulzadə Nərmin Şahid qızı-***
*5* nömrəli *məktəbin XI sinif şagirdi və s.*[453]

Tədris ilinin sonunda Şəkidə IX və XI siniflərdə buraxılış imtahanları Respublika Təhsil Nazirliyi tərəfindən mərkəzləşdirilmiş qaydada aparılmışdır. Orta məktəb məzunlarından 1.958 nəfəri imtahanlarda iştirak etmiş, onlardan 1.654 nəfəri (84,47%) müvəffəqiyyət qazanmışdır. IX siniflər üzrə imtahanda iştirak etmiş 2.788 nəfərdən 2.552 nəfəri və ya 91,54 %-i müvəffəq qiymət almışlar. Göstərilən faizlər bəzi təhlilləri aparmağa imkan verir. Belə ki, mərkəzləşdirilmiş qaydada aparılan imtahanların yekunlarına görə Respublika üzrə bu göstərici kənd rayonlarında 79,47%, Gəncə, Mingəçevir, Naftalan, Şirvan və Sumqayıt şəhərləri üzrə 92,2 %, Bakı şəhəri üzrə 92,74 % olmuşdursa, Şəkinin məktəbləri üzrə 94,7 % olmuşdur. **Şəkinin 12 məktəbində XI siniflər üzrə, 17 məktəbində IX siniflər üzrə buraxılış imtahanlarından «2» qiymət alan olmamışdır.** Bu göstəricilər əvvəlki illərdən yüksək olsa da, ümumilikdə qənaətbəxş hesab edilə bilməz.

Ənənəmizə sadiq qalaraq ali məktəblərə qəbulun yekunlarına nəzər salaq.

2010-cu ildə Şəkinin ümumtəhsil məktəblərini bitirmş **1.656 nəfər** məzundan **1.165 nəfəri** ali məktəblərə daxil olmaq üçün sənəd vermiş, onlardan **408** nəfər, o cümlədən 2009-cu ilin məzunlarından **138** nəfər tələbə adını qazanmışdır.[454] **Şəkinin təhsil tarixində *ilk dəfə olaraq Kiçik Dəhnə 2*** nömrəli ***kənd orta məktəbinin məzunu Abdullayeva Günay Eldar qızı ən yüksək nəticə-700 bal toplayaraq respublika üzrə 7 abituriyentdən biri olmuşdur.*** *29 məzun* ***600 baldan*** *yuxarı, 85 məzun* ***500-dən*** yuxarı bal toplamışdır. Onlardan *şəhər 3* nömrəli *məktəbin məzunu Hacızadə Fədan Bağır oğlu* ***və*** *Cumakənd orta məktəbdən İsmayılov Toğrul İsmayıl oğlu* ***680 bal*** *toplayaraq ATU-nə, 9* nömrəli *məktəbdən Azayev Fərid Vazeh oğlu* ***670 bal*** *toplayaraq Lomonosov adına Moskva Dövlət Universitetinin Bakı filialına, Köndələn orta məktəbindən Rəsullu Elbəy Məmməd oğlu* ***670 bal*** *toplayaraq ATU-nə, Özəl Türk liseyindən Şükürov Asim Məclum oğlu* ***670 bal*** *toplayraq Qafqaz Universitetinə, Bicilov Əhməd Məmməd oğlu* ***670 bal*** *toplayaraq ATU-nə, Dadayev Rəsul Abdulla oğlu* ***670*** *bal toplayaraq ATU-nə, 5* nömrəli *məktəbdən Rəsulzadə Nərmin Şahid qızı* ***662 bal*** *toplayaraq ATU-nə, Baş Göynük kənd 1* nömrəli *orta məktəbdən Salmanov Zakir Nadir oğlu* ***662 bal*** *toplayaraq Qafqaz Universitetinə, 1* nömrəli *məktəbdən Həsənli Elburus Ehtibar oğlu* ***660*** *bal toplayaraq Azərbaycan Respublikası Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasına, 8* nömrəli *məktəbdən Aslanlı Leyla Şahid qızı* ***655*** *bal toplayaraq BDU-ya, 18* nömrəli *məktəbdən Şərifli Samirə Rövşən qızı* ***650*** *toplayaraq Qafqaz Universitetinə daxil olmuşlar.*

Təbii ki, sadalanan nailiyyətlərin qazanılmasında **müəllimlərin** əməyi böyük olmuşdur. Əslində bu uğurlar üç komponentin - ***məktəb pedaqoji kollektivinin, fərdi qaydada dərs keçən repetitorların və müxtəlif hazırlıq kurslarının*** birgə əməyi nəticəsində qazanılmışdır. Bəllidir ki, ictimaiyyət arasında bu üç komponentə münasibət birmənalı deyildir. Bir qrup valideyn məktəbin işindən narazıdır, digər qrup maddi imkanları olmadığından fərdi hazırlığın əleyhinə çıxır, başqa qrup isə hazrlıq kurslarının fəaliyyətindən gileylənirlər. Əslində isə, hər

üçündə baş rolu **müəllim** oynayır. Qeyd edək ki, bunlardan məktəbdən başqa digər ikisi çox keçməz ki, öz fəaliyyətini dayandıracaq, hegemonluğu yenə də məktəb ələ alacaqdır. Bunun üçün tələsmək, müxtəlif təşkilatları, rəhbər işçiləri günahlandırmaq yox, islahatların icrasına kömək etmək daha məqsədyönlü olardı. Məhz elə bu məqsədlə də, Şəki ŞTŞ-də 2009-2010-cu tədris ilində müəllimlərin hazırlığını diqqət mərkəzində saxlanılmış, 13 kateqoriya üzrə 408 nəfər müəllimin ixtisasartırma kurslarında iştirakı təmin olunmuşdur. I siniflərdə işləyəcək ibtidai sinif müəllimlərinin fənn kurikulumlarının tətbiqi sahəsində nəzəri və praktiki hazırlıqlarını təmin etmək məqsədilə Azərbaycan Respublikası Təhsil Nazirliyi tərəfindən 6 günlük təlim kursları təşkil edilmiş, kurslarda 4 həftə davam edən kurslarda 9 qrupda 198 müəllim iştirak etmişdir.[455]

Böyük Britaniya konsulluğunun maliyyə dəstəyi və təhsil nazirliyinin əməkdaşlığı ilə həyata keçirilən *«Gənc ingilis dili müəllimlərinin təkmilləş-dirilməsi»* layihəsinin davamı kimi keçirilən seminarda Şəkinin 20 müəllimi iştirak etmiş və sertifikat almışdır.

*«2008-2012-ci illərdə Azərbaycan Respublikası təhsil sisteminin informasi-yalaşdırılması üzrə Dövlət Proqramı»* nın həyata keçirilməsi sahəsində işlər davam etdirilmişdir. Belə ki, 957 nəfər təhsil işçisi, o cümlədən 2009-2010-cu dərs ilində 287 nəfər inzibati idarəetmə işçisi (direktor, direktor müavini, təşkilatçı və s.) İKT üzrə treninqlərdən keçmişlər.

Yuxarıda qeyd etmişdik ki, internetə qoşulan məktəblərin sayı cəmi 3 olmuşdur. Bəhs olunan tədris ilində *şəhərin 20 ümumtəhsil məktəbinin hamısı, Kiş 1 və 4* nömrəli*, Oxut, Qoxmuq və İnçə-Zunud kənd məktəbləri internet xəttinə qoşulmuşlar*. Şəki ŞTŞ-nin internetə qoşulması üçün 12 nöqtə ayrılmışdır. Əlbəttə, bütün bunlar həm müəllimlərin, həm də şagirdlərin təhsil səviyyəsinə müsbət təsir göstərmişdir.

Bütün respublikada oduğu kimi, Şəkidə də 2010/2011-ci tədris ili müvəffəqiyyətlə başa vurulmuşdur.

Şəki ŞTŞ üzrə 2010/2011-ci tədris ilinə aid məktəb şəbəkəsi[456]

**Cədvəl 3.3.21**

| Sıra № si | Göstəricilər | şəhər | kənd | cəmi |
|---|---|---|---|---|
| 1 | Gündüz ümumtəhsil məktəblərinin sayı<br>o cümlədən:<br>ibtidai<br>əsas<br>orta | 21<br><br>-<br>-<br>21 | 78<br><br>4<br>22<br>52 | 99<br><br>4<br>22<br>73 |
| 2 | Məktəblərin ümumi sayından internat | 1 | - | 1 |

| | | | | |
|---|---|---|---|---|
| 3 | Cəmi sinif komplektləri<br>o cümlədən:<br>hazırlıq | 517<br><br>- | 1147<br><br>9 | 1664<br><br>9 |
| | I-IV siniflər | 168 | 403 | 571 |
| | V-IX siniflər | 239 | 551 | 790 |
| | X-XI siniflər | 110 | 184 | 294 |
| 4 | Gündüz məktəblərində<br>şagirdlərin sayı-<br>cəmi<br>O cümlədən:<br>hazırlıq siniflərində<br>I-IV siniflərdə<br>V-IX siniflərdə<br>X-XI siniflərdə | <br><br>8.609<br><br>-<br>2.810<br>4.192<br>1.607 | <br><br>16.288<br><br>134<br>5.700<br>7.771<br>2.683 | <br><br>24.897<br><br>134<br>8.510<br>11.963<br>4.290 |
| 5 | Şagirdlərin ümumi sayından<br>internat məktəblərində oxu-<br>yanların sayı-<br>cəmi | <br><br><br>55 | <br><br><br>- | <br><br><br>55 |
| 6 | Birsinifli komplektin orta<br>sıxlığı | <br>16,65 | <br>14,20 | <br>14,96 |
| 7 | Gündüz məktəblərinin və ya<br>internat məktəblərin nəz-<br>dində əqli və fiziki cəhətdən<br>qüsurlu uşaqlar üçün açılmış<br>sinif komplektlərinin sayı<br>Onlarda uşaqların sayı | <br><br><br><br>8<br>31 | <br><br><br><br>-<br>- | <br><br><br><br>8<br>31 |
| 8 | Məktəbdənkənar tərbiyə<br>müəssisələrində qrupların<br>sayı<br>1. Ekoloji Tərbiyə və<br>Təcrübəçilik Mərkəzi<br>2. Texniki Yaradıcılıq<br>Mərkəzi<br>3.Uşaq Yaradıcılıq Mərkəzi<br>4.Uşaq Gənclər İdman<br>Məktəbi<br>5.Uşaq Gənclər Şahmat<br>Məktəbi | <br><br>428<br><br>64<br><br>142<br>128<br><br>50<br><br>44 | <br><br>-<br><br>-<br><br>-<br>-<br><br>-<br><br>- | <br><br>428<br><br>64<br><br>142<br>128<br><br>350<br><br>44 |
| 9 | Məktəbəqədər tərbiyə<br>müəssisələri<br>Onlarda qrupların sayı<br>Uşaqların sayı | <br>28<br>76<br>1240 | <br>32<br>65<br>1097 | <br>60<br>141<br>2337 |

Məktəbəqədər təhsil müəssisələri fasiləsiz təhsilin həyata keçirilməsində mühüm halqanı təşkil edir. Şəkidə fəaliyyət göstərən 60 məktəbəqədər təhsil müəssisəsində 141 qrupa 2.337 nəfər məktəbyaşlı uşaq cəlb olunmuşdur. Uşaq bağçalarında aparılan monitorinqlər göstərir ki, əvvəlki illərlə müqayisədə uşaqların sağlamlığının mühafizəsi, ilkin təhsilə hazırlığı sahəsində müəyyən işlər görülmüşdür. Şəhərin bir sıra məktəbəqədər müəssisələri **«Addım-addım»** təlim texnologiyası ilə işdə uğurlu nəticələr əldə etmişlər.



***«Addım-addım» təlim texnologiyaları ilə işləyən tərbiyəçi Almaz Qaffarova məşğələ zamanı***

Tədris ilində fəaliyyət göstərən 53 tam orta, 22 ümumi orta və 4 ibtidai məktəbdə 24.897 nəfər, qarışıq tipli internat məktəbdə əqli və fiziki cəhətdən qüsuru olan 33 şagird təhsilə cəlb edilmişdir. Dərs ilinin yekunlarına görə 24.897 nəfər şagirddən 24.530 nəfəri dərs ilinin sonuna qalmış, onlardan 23.625 nəfəri yuxarı sinfə keçmiş və ya məktəbi bitirmişdir. 2010-2011-ci tədris ilinin sonunda

1.725 nəfər məzuna tam orta məktəbi bitirmək haqqında attestat, 2.454 nəfərə isə ümumi orta təhsil haqqında şəhadətnamə verilmişdir.[457]

Dərs ili ərzində 129 nəfər təhsildən yayınmış, təkrar sinifdə saxlanılan 223 nəfər şagirddən uzun müddət dərsə davam etmədiyinə görə 194 nəfərin biliyi qiymətləndirilməmişdir. XI siniflər üzrə imtahana buraxılmış 2.075 nəfərdən 350 nəfəri attestat ala bilməmişdir.[458]

***Şəhər 11*** nömrəli ***məktəbin məzunu Abduləli Hadızadə qızıl medala layiq görülmüşdür. 11 məktəbdə – şəhər 9,11,14, 20*** nömrəli***, Orta Zəyzid 2*** nömrəli***, Daşüz, Çeşməli, Qozlubulaq, Bolludərə, Kiş 4*** nömrəli ***kənd tam orta məktəblərində XI siniflər üzrə buraxılış imtahanlarından «2» qiymət alan olmamışdır***.

Dərs ilində «Xüsusi istedada malik uşaqların yaradıcılıq potensialının inkişafı üzrə Dövlət Proqramı»ndan irəli gələn vəzifələrin yerinə yetirilməsi ilə əlaqədar «Kiçik Akademiyalar» olimpiada mərkəzləri yaradılmışdır. Olimpiadaların Respublika mərhələsində Şəkinin 24 məktəblisi iştirak etmiş, 10 nəfər müxtəlif fənlər üzrə yer tutmuşlar.

2010/2011-ci tədris ilində fənn olimpiadaların nəticələri aşağıdakı cədvəldəki kimi olmuşdur:

**Cədvəl 3.3.22**

| № | F ə n l ə r | İştirak çıların sayı | Qaliblərin sayı | | | | Cəmi |
|---|---|---|---|---|---|---|---|
| | | | I | II yer | III yer | IV yer | |
| 1 | Azərbaycan dili və ədəbiyyatı | 3 | - | - | - | 1 | 1 |
| 2 | Azərbaycan tarixi | 4 | - | - | - | 1 | 1 |
| 3 | Riyaziyyat | 6 | - | - | 1 | 1 | 2 |
| 4 | Fizika | 3 | - | 1 | - | 1 | 2 |
| 5 | Kimya | 4 | - | - | - | - | - |
| 6 | Biologiya | 3 | - | - | - | 3 | 3 |
| 7 | İnformatika | 1 | - | - | - | 1 | 1 |
| | Cəmi | **24** | - | 1 | 1 | 8 | **10** |

«İNEPO - AVRASİYA» ətraf mühitin mühafizəsi V Beynəxalq layihə olimpiadasında Azərbaycandan seçilmiş 58 işdən 6-sı Şəki məktəblilərinin layihəsi olmuşdur. Şəki şəhər 18 nömrəli tam orta məktəbin IX sinif şagirdi **Məmmədov Ayaz Məmmədrahim oğlu** olimpiadada I yeri tutaraq qızıl medalla təltif olunmuşdur. 2 nəfər məktəbli ABŞ-ın Dövlət Departamenti tərəfindən maliyyələşdirilən orta məktəb şagirdləri üçün təşkil olunmuş FLEX proqramının qalibi olmuşdur. 8 nömrəli beynəlmiləl məktəbin rus bölməsinin XI sinif şagirdi **Hüseynli Səyyarə Səbuhi qızı** və 10 nömrəli məktəbin X sinif şagirdi

**Abdullayeva Səadət Mahir qızı** 2011-2012-ci tədris ilində ABŞ-da pulsuz təhsil almışlar.

Şəki məktəbliləri 2011-ci ildə qəbul imtahanlarında uğurlu nəticələr əldə etmişlər. Tam orta məktəbi bitirmiş 1.275 məzundan 1.265 nəfəri ali məktəblərə daxil olmaq üçün sənəd vermiş, 513 nəfər tələbə adını qazanmışdır. Qəbul imtahanları zamanı **11 nəfər 500 baldan yuxarı, 4 nəfər 550 baldan yuxarı, 33 nəfər 600 baldan yuxarı** nəticə göstərmişlər. 5 nömrəli məktəbin məzunu **Alxasova Leyla Vasif qızı** və 11 nömrəli məktəbin məzunu **Səlimzadə Xəzər Hümbət oğlu** ***Prezident təqaüdünə*** layiq görülmüşlər.

Əldə edilmiş uğurlarda şəhər 5,11, şəhər liseyi, Bideyiz, Çeşməli, Çayqaraqoyunlu, Qayabaşı kənd məktəblərinin xüsusi payı vardır. *5* nömrəli *məktəbin **55 məzunundan 28**, 11* nömrəli *məktəbin **62 məzunundan 35**, şəhər liseyinin **36 məzunundan 20**, Bideyiz məktəbinin **12 məzunundan** 7, Çeşməli məktəbinin **10 məzunundan** 7, Çayqaraqoyunlu məktəbinin **17 məzunundan 10**, Qayabaşı məktəbinin **19 məzunundan 10** nəfəri ali məktəblərə qəbul olunmuşlar.*

«2008-2012-ci illərdə Azərbaycan Respublkası Təhsil sisteminin informasiyalaşdırılması üzrə Dövlət Proqramı»nın həyata keçirilməsi sahəsində işlər davam etdirilmişdir. İlk növbədə müəllimlərin İKT-na yiyələnməsi üçün treninqlər keçirilmiş, 421 nəfər müəllim müvafiq bacarıqlara yiyələnmişlər. 35 məktəb internet xəttinə qoşulmuşdur. Həyata keçirilmiş məqsədyönlü işlərin nəticəsidir ki, ***şəhər 11*** nömrəli ***məktəb «Ən yaxşı ümumi təhsil məktəbi»*** adını almışdır.

2010/2011-ci tədris ilində Şəkinin 5 məktəbdənkənar müəssisəsi məktəb-yaşlı uşaqların asudə vaxtının səmərəli təşkili məqsədilə 427 qrup təşkil etmiş və bu qruplara 6.057 şagird cəlb olunmuşdur. Məktəbdənkənar müəssisələr Respublika və rayon müsabiqələrində iştrak etmişlər. Uşaq Yaradıcılıq Mərkəzinin dərnək üzvü Əfsanə Məmmədova 2011-ci il yanvar ayının 25-də Bakı şəhərində Təhsil Nazirliyi xəttilə keçirilən əl işlərindən ibarət sərgidə I yeri, Ekoloji Tərbiyə və Təcrübəçilik Mərkəzinin dərnək üzvü Xanım Rəsulova 2011-ci il mart ayının 11-də keçirilən «Təbiəti qoruyaq» mövzusunda foto müsabiqədə II yeri, Uşaq Şahmat Məktəbinin yetirmələri Elmar Səlimov 16 yaşadək oğlanlar arasında II yeri, Aytac Rəhimova 16 yaşadək qızlar arasında I yeri, Əfsanə Mehtiyeva II yeri tutmuşlar.

Əlbəttə, qeyd edilənlərlə yanaşı təhsil müəssisələrinin işində nöqsan və çatışmazlıqlar da olmuşdur. Məktəblərin böyük əksəriyyətinin əsaslı təmirə ehtiyacı vardır. Şəki ŞTŞ-nin tabeliyində olan 99 məktəbdən 20-si, 60 uşaq bağçasından bir uşaq bağçası və Uşaq evi qazanxana sistemi ilə qızdırılır. Uşaq bağçalarında kontingent planının yerinə yetirilməməsi, ərzaqla təchizatda yol verilən neqativ hallar narahatlıq doğurur.

**2011-2012-ci dərs ilində** Şəkidə 99 ümumtəhsil məktəbi fəaliyyət göstərmişdir. Bunlardan 73-ü tam orta, 22-si ümumi orta, 4-ü ibtidai məktəbdir. Bu məktəblərdə 24.088 nəfər şagird təhsilə cəlb edilmiş və təhsil sahəsində aparılan işlərin son nəticəsi üç meyar üzrə qiymətləndirilmişdir.

1.İstedadlı şagirdlərin üzə çıxarılması, onların yaradıcılıq potensialının inkişaf etdirilməsinə stimul verən fənn olimpiadalarının yekunu;

2.Şagirdlərin baza təhsili üzrə yekun attestasiyalarının, buraxılış imtahanlarının nəticələri;

3.Məzunların sonrakı təhsili, ali məktəblərə qəbul;

Hər üç sahə üzrə nəticələri ürəkaçan olmuşdur. Belə ki, fənn olimpiadalarının və müsabiqələrin rayon turunun nəticələrinə görə 7 fənn və müxtəlif nominasiyalar üzrə birinci yer tutmuş 34 nəfər şagird respublika və beynəlxalq olimpiada və müsabiqələrdə iştirak etmiş, onlardan 24 nəfəri qalib olmuşdur. Bu isə yaxın 3 il bundan qabaqkı nəticədən 4 dəfə çoxdur. «İNEPO-Avrasiya» ətraf mühitin mühafizəsi VI Beynəlxalq Layihə olimpiadasında şəhər 20 №-li tam orta məktəbin IX sinif şagirdi Xəlilov Əli və XI sinif şagirdi Mustafayev Yusif gümüş medal, 18 №-li tam orta məktəbin IX sinif şagirdi Muradzadə Murad və Abdurəhimova Gülnarə bürünc medala layiq görülmüşdür. 18 №-li tam orta məktəbin X sinif şagirdi Salamova Şəlalə «Ana dilimizi sevək-sevdirək» respublika inşa müsabiqəsində I yeri tuturaq qızıl medalla təltif edilmişdir.

11 №-li tam orta məktəbin XI sinif şagirdi Rəhimli Məryəm «H.Əliyev və Müstəqil Azərbaycan» mövzusunda keçirilən respublika rəsm müsabiqəsində II yer, 5 №-li tam orta məktəbin X sinif şagirdi Zəkəryəzadə Şəlalə M.Ə.Sabirin 150 illik yubileyinə həsr edilmiş respublika inşa yazı müsabiqəsində, Bideyiz kənd tam orta məktəbin VII sinif şagirdi Hümmətzadə Gülyaz «Sevdiyim idmançıya məktub» mövzusunda inşa yazı müsabiqəsində III yeri tutmuşlar. 11 №-li tam orta məktəbin şagirdi Qarayev Murad M.İbrahimovun yubileyinə həsr edilmiş inşa yazı müsabiqəsində respublika ikincisi olmuşdur. Təhsil Nazirliyinin fənn olimpiadalarının yekunlarına həsr olunmuş kollegiya yığıncağında 2012-ci ildə fənn olimpiadalarının təşkili və yekunlarına görə Şəki Şəhər Təhsil Şöbəsinin yaxşı işi qeyd edilmişdir. Olimpiada qalibləri ilə 2012-ci il iyunun 27-də Şəki Şəhər İcra Hakimiyyətind görüş keçirilmiş və qaliblər İcra başçısı cənab Elxan Usubov tərəfindən qiymətli hədiyyələrlə mükafatlandırılmışdır.

Məlum olduğu kimi, Təhsil Nazirliyinin əmri ilə respublikanın bir sıra ümumtəhsil məktəblərində, o cümlədən Şəki Şəhər 19 №-li tam orta məktəbdə xüsusi istedadı olan şagirdlər müsabiqə yolu ilə seçilmiş və onlar üçün xüsusi sinif açılmışdır. Bu dərs ilində Respublika Təhsil Nazirliyi tərəfindən həmin məktəbdə fəaliyyət göstərən VI «İstedad» sinfində Azərbaycan dili və riyaziyyatdan şagirdlərin bilikləri müxtəlif kriteriyalar üzrə yoxlanılmış və nəticələr sevindirici olmuşdur. İmtahanların nəticələrinə görə həmin sinif riyaziyyat üzrə respublika ikincisi, Azərbaycan dili üzrə üçüncü olmuşdur.

Lakin sevindirici nəticələri söyləməklə bərabər gənc istedadlarla aparılan işlərin tam qaydasında olduğunu iddia etmək olmaz. Məktəb rəhbərləri, fənn müəllimləri, istedadlı şagirdlərlə işi elə qurmalıdırlar ki, Şəkili məktəblilərin

uğurları daha çox olsun. Məktəblərdə yaradılmış olimpiadalara hazırlıq mərkəzi - «Kiçik Akademiyalar» ın işi gücləndiril məlidir.

Dərs ilinin yekunlarına görə 24.088 nəfər şagirddən 23.010 nəfəri yuxarı siniflərə keçmiş və ya məktəbi bitirmişdir. 2012-ci ildə TQDK tərəfindən mərkəzləşmiş qaydada keçirilən və ictimaiyyətin maraq dairəsində olan buraxılış imtahanlarının nəticələri sevindirici olmuşdur. İmtahanlarda iştirak edən 1.925 nəfər XI sinif şagirdlərinin 90%-dən çoxu attestat, 1910 nəfər ümumi orta təhsil haqqında şəhadətnamə almışdır.

Attestatlarda 11 fənn üzrə yekun qiymətləndirmənin TQDK tərəfindən aparıldığını nəzərə alsaq məzunlardan 70 nəfərinin attestat qiymətlərinin tam 5 olması yaxşı hal hesab olunmalıdır. 70 nəfər məzuna attestatlar H.Əliyev muzeyində təntənəli şəkildə təqdim olunmuş, məzunlar mükafatlandırılmışlar. 148 nəfərin attestatında yalnız bir və ya iki fəndən «4» qiymət olmuşdur. 343 nəfərin attestat qiymətləri «4» olmuşdur. 1731 nəfər attestat alan məzundan yalnız 125 nəfəri tam «3» qiymətlə attestat almışdır. 7 №-li tam orta məktəbin məzunu Nəsibli Yaşar, 11№-li tam orta məktəbin məzunu Rəhimli Məryəm fərqlənmə attestatı ilə birgə qızıl medalla, 11№-li tam orta məktəbin məzunu Hacıqədirli Məmmədsadıq gümüş medalla təltif olunmuşdur.

Şəkinin təhsil tarixində ilk dəfə rayonun 21 nəfər IX sinif məzunu illik qiymətlər və buraxılış imtahanlarının nəticələrinə görə fərqlənmə şəhadət naməsi almışdır. 8 №-li tam orta məktəbin şagirdi Hüseyinli Fatimə və 20 №-li tam orta məktəbin şagirdi Mustafayev Yusif Amerika Beynəlxalq Təhsil Şurasının FLEX proqramı çərçivəsində keçirdiyi müsabiqədə qalib gələrək bir il müddətində ABŞ-da yaşamaq və təhsil almaq hüququ qazanmışlar. Əla qiymətlə attestat alan şagirdlərin hamısı yüksək balla ali məktəblərə qəbul olunmuşlar.

Lakin uğurlarla yanaşı çatışmazlıqlar da olmuşdur. Dərs ilinin yekunlarına görə 205 nəfər müxtəlif səbəblərdən təhsildən yayınmış, təkrar sinifdə saxlanılan 136 nəfər şagirddən 125 nəfəri uzun müddət dərsə davam etmədiyi üçün biliyi qiymətləndirilməyənlərdir. 226 nəfər attestat əvəzinə arayış almışdır.

Orta məktəblərin fəaliyyətinin qiymətləndirilməsinin əsas göstəri cilərdən biri də ali məktəblərə qəbulda məzunların əldə etdiyi nəticələrdir. 2012-ci ildə Şəkinin ümumtəhsil məktəblərini bitirmiş 1731 məzundan 1166 nəfəri ali məktəbə daxil olmaq üçün sənəd vermiş, onlardan 587 nəfəri tələbə adını qazanmışdır. Bu məzunlardan 112 nəfəri 500 baldan yuxarı bal toplamışdır ki, bunların içərisində 35 nəfəri 600 baldan yuxarı nəticə göstərənlərdir. Bu Şəkinin təhsil tarixində rekord nəticədir. 600 baldan yuxarı toplayanlar Şəkinin 19 məktəbinin, 500 baldan yuxarı nəticə göstərənlər 43 məktəbin məzunlarıdır. 73 tam orta məktəbdən yalnız 2 məktəbin məzunlarından ali məktəblərə qəbul olmayıb. Bu rəqəm 2010-cu ildə 14, 2011-ci ildə 7 idi.

Məzunların ali məktəblərə qəbuluna görə reytinq cədvəlində şəhər 3, 5, 7 ,9, 10, 12, 14, 17, 18, 20, 21№-li, məktəblər və şəhər liseyi, kəndlər üzrə Bideyiz,

I Biləcik, Baş Zəyzid, Orta Zəyzid kənd 1 №-li, Orta Zəyzid kənd 2 №-li, Çayqaraqoyunlu, İbrahimkənd, Qayabaşı kənd tam orta məktəbləri özünəməxsus yer tutur. Şəhər 3 №-li tam orta məktəbdən sənəd verənlərin 93%, yaxud 16 nəfərdən, 15 nəfəri, 5 №-li tam orta məktəbdən 66%, yaxud 51 nəfərdən 34 nəfəri, 9 №-li tam orta məktəbdən sənəd verənlərin 86%, yaxud 15 nəfərdən 13 nəfəri, 14 №-li tam orta məktəbdən 11 nəfərdən 8 nəfəri, 12 №-li tam orta məktəbdən 15 nəfərdən 9 nəfər, 17 №-li tam orta məktəbdən 20 nəfərdən 13 nəfəri, Bideyiz kənd tam orta məktəbindən sənəd verən 10 nəfərdən 10 nəfəri, I Biləcik kənd tam orta məktəbindən sənəd verən 10 nəfərdən hamısı ali məktəblərə qəbul olunmuşlar.

600 baldan yuxarı bal toplayan məzunları olan məktəblərin 6-sı kənd məktəbidir. Vərəzət kənd tam orta məktəbinin şagirdi Nizamov İlham IV qrup üzrə 696 bal toplayaraq respublika üzrə II yeri tutmuş, Şəki kənd tam orta məktəbinin məzunu Novruzova Nuranə 681 bal toplamışdır.

«İstedadlı gənc müəllimlərin fəaliyyətinin təkmilləşdirilməsi və stimullaşdırılması tədbirləri haqqında» Təhsil Nazirliyinin 15.07.2011-ci il tarixli 1436 №-li əmrinin icrası təhsil şöbəsinin diqqət mərkəzində olmuşdur. Ümumtəhsil məktəbləri üzrə yaşı 35-dək olan gənc müəllimlərin müəyyən olunmuş forma üzrə «Məlumat bankı» yaradılmış, həmin gənc müəllimlər içərisindən seçilmiş 155 nəfər istedadlı gənc müəllim haqqında məlumat elektron variantı ilə birlikdə Nazirliyə göndərilmişdir. 2012-13-cü dərs ilində V sinifdə dərs deyəcək 918 nəfər müəllimin 10 fənn kurikulumlarının tətbiqi sahəsində nəzəri və praktik hazırlığını təmin etmək məqsədilə Təhsil Nazirliyi tərəfindən Təhsil Sektorunun inkişafı üzrə ikinci layihə çərçivəsində təlim kurslarında iştirakı təmin edilmiş və həmin müəllimlər müvafiq serfikatlar verilmişdir.

Müasir həyatımızın getdikçə informasiyalaşması elə bir vəziyyət yaratmışdır ki, informasiyaları yaradanlar deyil, bu informasiyalardan çzevik istifadə edənlər daha çox inkişaf edirlər. İKT sahəsində savadlılığın dövlətə verdiyi fayda istənilən sənaye yeniliyinin səmərəsindən bir neçə dəfə çoxdur. 2012-ci ildə Şəkinin məktəblərində V-XI siniflərdə 29 şagirdə 1 kompüter nisbəti təmin edilmişdir. Aparıcı fənlər üzrə elektron təlim materialları məktəblərə çatdırılmışdır. Rayonda 35 məktəb internet xəttinə qoşulmuş, 22 məktəbə internet xətləri çəkilmişdir. Əlbəttə məktəblərdə kompüterlərin sayının artırılmasına , netbuk və proyektorlara ehtiyac var.

2012-ci il Şəkinin elmi ictimaiyyəti və ədəbi mühiti üçün önəmli il olmuşdur. Azərbaycan dramaturgiyasının banisi M.F Axundzadənin 200 illik yubileyi təntənə ilə qeyd olunmuş, tədbirlərdə Şəkinin ümumtəhsil məktəbləri fəal iştirak etmişlər.

Tədris ilində Şəkidə *5 məktəbdənkənar müəssisə* fəaliyyət göstərmişdir. Onların hər birinin özünəməxsus uğurları olsa da, məktəbdənkənar müəssisələri işi müasir tələblərə cavab vermir, maddi baza zəifdir, məktəblərlə əlaqələr zəif təşkil edilmişdir. Kadrların ixtisas və peşəkarlıq səviyyəsi əksər hallarda

müəssisələrin profilləri ilə uzlaşmır, metodiki təminat, dərnəklərə uşaqların cəlbi formal xarakter daşıyır.

Təhsil müəssisələrinin tikintisi və maddi-texniki bazanın inkişaf etdirilməsi prioritet məsələ kimi daim qarşıda durmuş, tədris ilində rayonun kəndlərində dövlət vəsaiti hesabına dörd yeni məktəb binasının tikintisi davam etdirilmiş, şəhər məktəblərinin bir neçəsinində binasında əsaslı təmir işləri aparılmış, yeni tədris korpusları tikilmişdir.

Şorsu kəndində inşa edələn 360 yerlik yeni məktəb binasının tikintisi başa çatmış, Çələbixan qəsəbəsində 180 yerlik yeni məktəb binasında son tamamlama işləri görülmüşdür. Aşağı Layısqı kəndində inşa olunan 360 yerlik yeni məktəb binasının bu ilin sonunadək istifadəyə verilməsi nəzərdə tutulmuş, Əlyar kəndində ümumi orta məktəb üçün 80 yerlik binanın tikintisinə başlanılmışdır. Şəhər 8 №-li, fizika-riyaziyyat və humanitar təmayüllü lisey, Baş Küngüt tam orta məktəblərində əsaslı təmin işləri aparılmışdır. Şəhər 5 №-li tam orta məktəbin binası əsaslı təmir olunmuş, həyətində 320 şagird yerlik yeni tədris korpusu tikilmişdir.

Şəkinin təhsil işçiləri **2012-2013-cü dərs ilində** bir sıra uğurlara imza atmışlar. Dərs ilində Şəkidə 98 ümumtəhsil məktəbi, o cümlədən 72 tam orta, 22 ümumi orta, 4 ibtidai mətəb fəaliyyət göstərmişdir. Bu məktəblərdə 23.257 nəfər şagird təhsilə cəlb edilmişdir. Fənn olimpiadalarının və müsabiqələrin rayon turunun nəticələrinə görə 7 fənn və müxtəlif nominasiyalar üzrə birinci yer turmuş 52 nəfər şagird respublika, beynəlxalq olimpiada və müsabiqələrdə iştirak etmiş, onlardan 33 nəfəri qalib olmuşdur. Bu isə yaxın 3 il bundan əvvəlki nəticədən 4 dəfə çoxdur.

«İNEPO-Avrasiya» ətraf mühitin mühafizəsi VII Beynəlxalq layihə olimpiadasında 45 ölkədən təqdim olunmuş 625 layihədən yalnız 78-i finala vəsiqə qazanmışdır ki, onlardan 4-ü Şəki məktəblilərinin layihəsi olmuşdur. Təqdimat mərasimində 4 layihənin hamısının münsiflər heyəti tərəfindən yüksək qiymətləndirilməsi, 45 ölkə arasında gümüş medalı və 3 sertifikatı Şəki məktəbliləri almışlar. Qaliblər sırasında şəhər 20 №-li tam orta məktəbin şagirdləri Elnur Mustafayev və Əli Xəlilov, 11 №-li tam orta məktəbin şagirdləri Aygün Abdurahmanova və Pərvin İmamverdiyeva, Orta Zəyzid kənd 2 №-li tam orta məktəbin şagirdləri Dilək Məmmədova və Nazpəri İsfəndiyarzadə, Şorsu kənd tam orta məktəbin şagirdləri Tofiq Heydərov və Elvin İskəndərov, fənn olimpiadalarının respublika turunun qalibləri 6 №-li tam orta məktəbin şagirdi Vüsal Qurbanov, 7 №-li tam orta məktəbin şagirdi Elvin Qurtuluşzadə, 12 №-li tam orta məktəbin şagirdi Eşqin Əhmədov, 18 №-li tam orta məktəbin şagirdi Aişə Usubova, fizika-riyaziyyat və humanitar təmayüllü liseyin şagirdi Türkan Rəsulova olmuşdur.

«Beynəlxalq Ana dili günü» nə həsr edilmiş «Ana dilimizi sevək-sevdirək» ümumrespublika müsabiqəsinin qalibləri 11 №-li tam orta məktəbin şagirdi

Rəhimə Əzimova, Gülər Orucova, 18 №-li tam orta məktəbin şagirdi Nicat Səttarov, ümumrespublika inşa yazı müsabiqələrinin qalibləri 11 №-li tam orta məktəbin şagirdi Fəridə Yusifova, 20 №-li tam orta məktəbin şagirdi Xatın Hacıbalayeva, Bideyiz kənd tam orta məktəbin şagirdi Gülyaz Hümmətzadə, «Xəmsə» milli intellektual oyunu üzrə respublika çempionları – 14 №-li tam orta məktəbin şagirdləri Rövşən Məhərrəmli, Murad Məmmədov, Emin Əhmədov, Vasif Yusifli, İdman sahəsində respublika miqyaslı yarışlardan qızıl medalla qayıdan 7 №-li tam orta məktəbin şagirdi Coşqun Camallı, 9 №-li tam orta məktəbin şagirdi Fərid Abduləzizov, 6 №-li tam orta məktəbin şagirdi Faiq İmamverdiyev, Səmərələşdiricilik və ixtiraçılıq işləri üzrə respublika müsabiqəsinin qalibləri 20 №-li tam orta məktəbin şagirdi Əli Xəlilov, 10 №-li tam orta məktəbin şagirdi Ruslan Kərimov, 8 №-li tam orta məktəbin şagirdi Günel Mərdanlı, eləcə də Amerika Beynəlxalq Təhsil Şurasının FLEX proqramı çərçivəsində keçirdiyi müsabiqədə qalib gəlib 2013-2014-cü dərs ilində 1 il müddətində ABŞ-da yaşamaq və təhsil almaq hüququ qazanmış şəhər 10 №-li tam orta məktəbin şagirdləri Cavid Abdurahmanov və Aytac Mürşüdzadə Şəki şagirdlərinin istedad bankına daxil edilmişlər.

Dərs ilinin yekunlarına görə 1.917 nəfər attestat, 2.228 nəfər əsas təhsil haqqında şəhadətnamə almışdır. Şəki təhsilinin tarixində ilk dəfə olaraq 11 nəfər XI sinif məzunu qızıl medalla təltif olunmuşdur.

Buraxılış imtahanlarının yekunlarına görə 36 məktəbin nəticələri 70%-dən, 23 məktəbin nəticələri 80%-də yuxarıdır. Yaxşı haldır ki, əla qiymətlə attestat alan şagidlərin hamısı yüksək balla ali məktəblərə qəbul olunmuşlar.

Dərs ilinin yekunlarına görə 313 nəfər təkrar sinifdə qalmış və ya təhsili yarımçıq tərk etmişdir. IX sinfi qurtaran şagirdin X sinfə qeyri-şərtsiz qəbul edilməsi, valideynlərin öz uşaqlarının bacarıq və qabiliyyətlərini qiymətləndirmədən X sinifdə oxuması üçün israrlı olmaları, məktəb direktorlarının mövcud müəllim sıxlığına görə təminat xatirinə bu işə maraqlı olmaları uğursuzluğun səbəbləri sırasındadır. Buna görə də məktəblərdə hər bir uşağın maraq, meyl, bacarıq və biliyinə istinad edərək peşə yönümü işinə diqqətlə yanaşılmalı və bu barədə valideynlərlə ardıcıl iş aparılmalıdır.

2013-cü ildə Şəkinin ümumtəhsil məktəblərini bitirmiş 1.917 məzundan 1.197 nəfəri ali məktəbə daxil olmaq üçün sənəd vermiş, onlardan 680 nəfəri tələbə adını qazanmışdır. Məzunlardan 145 nəfəri 500 baldan yuxarı, o cümlədən 55 nəfəri 600 baldan yuxarı nəticə göstərmişdir. Şəkinin 29 məktəbinin şagirdləri 600 baldan yuxarı, 42 məktəbin məzunu 500 baldan yuxarı nəticə əldə etmişdir. Şəhər 10, 18,11,5, 20, 14, Kiçik Dəhnə kənd 1 №-li, Baş Zəyzid, Baş Göynük kənd 1 №-li, , Köndələn, Bideyiz, Orta Zəyzid kənd 1 və 2 №-li, Oxud, İnçə-Zunud tam orta məktəblərin uğurları sevindiricidir. 10 №-li tam orta məktəbin məzunlarından 50 nəfər, 18 №-li tam orta məktəbin məzunlarından 36 nəfər, 11 №-li tam orta məktəbin məzunlarından 31 nəfər, 5 №-li tam orta məktəbin

məzunlarından 18 nəfər, 20 №-li tam orta məktəbin məzunlarından 21 nəfər, 14 №-li tam orta məktəbin məzunlarından 14 nəfər, Kiçik Dəhnə kənd 1 №-li tam orta məktəbin məzunlarından 21 nəfər, Baş Zəyzid kənd tam orta məktəbin məzunlarından 16 nəfər, Baş Göynük kənd 1 №-li tam orta məktəbin məzunlarından 12 nəfər, Bideyiz kənd tam orta məktəbin məzunlarından 11 nəfər, Orta Zəyzid kənd 1 №-li tam orta məktəbin məzunlarından 16, Orta Zəyzid kənd 2 №-li tam orta məktəbin məzunlarından 11 nəfər nüfuzlu ali məktəblərə yüksək balla qəbul olunmuşlar ki, bu da həmin məktəbin məzunlarının 60%-dən çoxunu təşkil edir.

Oxud kənd tam orta məktəbinin məzunu Hacıhəsənli Fəridə 696 bal, İnçə-Zunud kənd tam orta məkəbinin məzunu Abdurahmanov Pərvin 691 bal toplamışlar

2013-2014 -cü dərs ilində VI sinifdə dərs deyəcək 798 nəfər müəllimin 10 fənn üzrə kurikulumlarının tətbiqi sahəsində nəzəri və praktik hazırlığını təmin etmək məqsədilə Təhsil Nazirliyi tərəfindən Təhsil Sektorunun inkişafı üzrə ikinci layihə çərçivəsində təlim kurslarında iştirakı təmin edilmiş və həmin müəllimlərə müvafiq serfikatlar verilmişdir.

2013-cü il Respublika Prezidenti tərəfindən İKT ili elan edilmişdir. İl çərçivəsində xeyli iş görülmüşdür. Şəhər 5 və 10 №-li tam orta məktəblərin müəлlimləri bir şagird bir kompyüter layihəsində fəal iştirak etmiş və respublika üzrə iştirakçı olmuş 278 məktəbdən finala qalmış 15 məktəb sırasında olmuşlar. 5 №-li tam orta məktəbin müəllimi Aysun Qasımova respublika üzrə keçirilən elektron-məktəb layihəsində qalib gələrək II yerə layiq görülmüşdür.

2013-cü ildə Şəkinin məktəblərində V-XI siniflərdə 20 şagirdə 1 kompyüter nisbəti təmin edilmişdir.

Müasir probemləri vaxtında dərk etməyən, yenilikləri qəbul etmək iqtidarında olmayan, vəzifə məsuliyyəti təşkilatçılıq qabiliyyəti, kollektivi vahid məqsəd ətrafında səfərbər etmək bacarığı olmayan direktorlar da vardır.

Azərbaycan Respublikası Prezidentinin sərəncamına əsasaən 2008-ci ildən keçirilən «İlin ən yaxşı müəllimi» və «İlin ən yaxşı məktəbi» müsabiqəsində 5, 10 və 11 №-li tam orta məktəblər «Ən yaxşı ümumi təhsil məktəbi»nin müsabiqəsinin qalibləri, 10 №-li tam orta məktəbin müəllimi Ədalət Musayeva və 20 №-li tam orta məktəbin müəllimi Rahim Həsənov «İlin ən yaxşı müəllimi» müsabiqəsinin qalibləri olmuşlar.

2012-2013-cü dərs ilində rayonda 6 yeni məktəb tikilmiş, (şəhər 12,14 №li, Şorsu, Çələbixan, Aşağı Layısqı kənd tam orta, Əliyar kənd ümumi orta), 2 məktəb əsaslı təmir edilmiş (8 №-li və fizika-riyaziyyat və humanitar təmayüllü lisey) şagirdlərin istifadəsinə verulmişdir. Şəhər 5№-li tam orta məktəb əsaslı təmir edilmiş 360 yerlik yeni korpus, 10 №-li tam orta məktəbdə idman, akt zalı və bufetdən ibarət əlavə korpus inşa edilmişdir. Şin, Baş Şabalıd, Baş Göynük, Göybulaq kəndlərində yeni məktəb tikintisinə başlanılmışdır.

***2012-2014-cü illərdə məktəblilərin fənn olimpiadasının Respublika turunun qaliblərinin SİYAHISI***

| *№* | *İl* | *Soyadı, adı, atasını adı* | *Məktəbin adı* | *Sinif* | *Fənnin adı* | *Yer* | *Qeyd* |
|---|---|---|---|---|---|---|---|
| 1 | 2012 | Sədrəddinli Maqsud Sahib | 20№-li tam o/m | IX | Azərbaycan tarixi | II | |
| 2 | 2012 | İmamverdiyeva Pərvin Arif | 11№-li tam o/m | IX | Azərbaycan tarixi | IV | |
| 3 | 2012 | İsmayılov Elsəvər Elçin | Türk liseyi | IX | Riyaziyyat | II | |
| 4 | 2012 | Səlimli Gündüz Yamən | Türk liseyi | XI | Riyaziyyat | III | |
| 5 | 2012 | Əzizli İqrar İlqar | 8№-li tam o/m | X | Riyaziyyat | IV | |
| 6 | 2012 | Nəsibov Yaşar Mansur | 7№-li tam o/m | XI | Riyaziyyat | IV | |
| 7 | 2012 | Ramazanov Ramazan Rizvan | Türk liseyi | XI | Fizika | II | |
| 8 | 2012 | Fəttahova Günel Vasif | 5№-li tam o/m | IX | Fizika | IV | |
| 9 | 2012 | Abdullayeva Ülviyyə Əyyub | 8№-li tam o/m | XI | Fizika | IV | |
| 10 | 2012 | İsgəndərli Aytac Elşad | Lisey | XI | Fizika | IV | |
| 11 | 2012 | Usubova Ayşə Sahib | 18№-li tam o/m | X | Kimya | IV | |
| 12 | 2012 | Yusifova Günel İlqar | 12№-li tam o/m | X | Biologiya | IV | |
| 13 | 2012 | Qurbanov Vüsal Asəf | 6№-li tam o/m | X | Biologiya | IV | |
| 14 | 2012 | Balakişiyeva Aytac Elman | 11№-li tam o/m | XI | Biologiya | IV | |
| 15 | 2013 | Qurtuuşzadə Elvin Yaşar | 7№-li tam o/m | IX | Azərb.dili və ədəb. | IV | |
| 16 | 2013 | Əhmədov Eşqin Seymur | 12№-li tam o/m | IX | Azərbaycan tarixi | IV | |
| 17 | 2013 | Bazarov Abdullah Həmid | Türk liseyi | X | Fizika | IV | |
| 18 | 2013 | Usubova Ayşə Sahib | 18№-li tam o/m | XI | Kimya | IV | |
| 19 | 2013 | Qurbanov Vüsal Asəf | 12№-li tam o/m | XI | Biologiya | III | |
| 20 | 2013 | Rəsulova Türkan Eldar | Lisey | X | Bilogiya | IV | |
| 21 | 2014 | Əzizli Sevinc İlqar | 8№-li tam o/m | XI | Azərb.dili və ədəb. | I | |
| 22 | 2014 | Hacırəsulzadə Aydan İlqar | 7№-li tam o/m | XI | Azərbaycan tarixi | IV | |
| 23 | 2014 | Bazarov Abdullah Həmid | Türk liseyi | XI | Fizika | III | |

| | | | | | | | |
|---|---|---|---|---|---|---|---|
| 24 | 2014 | Həsənova Aygün Əhməd | 11№-li tam o/m | XI | Biologiya | III | |
| 25 | 2014 | Süeymanlı Samir Azər | Türk liseyi | IX | İnformatika | III | |

Tədris ilində məktəblərin işində nöqsanlar da olmuşdur. Tarifləşmə siyahısında olan 4.054 müəllimin 35%-dən çoxu okladdan aşağı işləmişdir. Məktəblərdə peşəkarlığı ilə fərqlənən müəllimlərlə yanaşı, pedaqoji aləmə təsadüfü düşən, yalnız diplomuna görə müəllim sayılanlar da var. Təəssüf ki, hələ də səriştəsiz, məktəbdə və valideynlər arasında nüfuz qazana bilməyən müəllimlərin pedaqoji sahədən uzaqlaşdırılmasını tənzimləyən normativ hüquqi baza yoxdur.

Tədris ilinin yekunları deməyə əsas verir ki, Şəkinin ümumtəhsil məktəblərinin hamısı qəbul etdiyi nizamnamədən irəli gələn vəzifələri tam yerinə yetirməmişlər. Valideyn-məktəb assosasiyalarının işi canlandırılmalıdır. Problemlərin aradan qaldırılması istiqamətində təsirli tədbirlərin görülməsi, məzmun islahatları sahəsində yeni kurikulumların tətbiqi prosesinin müntəzəm nəzarətdə saxlanılması qarşıda duran vəzifələr sırasındadır.

**2013-2014-cü dərs ilində** Şəkidə 98 ümumtəhsil məktəbi fəaliyyət göstərmişdir. Bunlardan 72-si tam orta, 22-si ümumi orta, 4-ü ibtidai məktəbdir. Bu məktəblərdə 22.911 nəfər şagird təhsilə cəlb edilmişdir. Müəllimlərdən Bəşarət Yusifov, Anar Məmmədov, Cəsarət Abdullayev, Nəzakət Hüseynova, Rəhman Yusifov, Pənah Alxasov tədrisdə yüksək nəticələr əldə etmişlər.

Dərs ilinin yekunlarına görə 1.682 nəfər attestat, 2.109 nəfər əsas təhsil haqqında şəhadətnamə almışdır. Məzunlardan 145 nəfərinin attestat qiymətləri tam 5 olmuşdur. 19 nəfər XI sinif məzunu qızıl medalla təltif olunmuşdur ki, bu 2012-2013-cü tədris ilindəkindən 8 nəfər çoxdur. İlk dəfə olaraq 196 nəfər IX sinif şagirdi fərqlənmə şəhadətnaməsi almışdır ki, bu da respublika üzrə rekord nəticə sayılır. Buraxılış imtahanlarının yekunlarına görə 42 məktəbin nəticələri 70%-dən, 25 məktəbin nəticələri 80%-dən yuxarıdır.

Tədris ilinin yekunlarına görə 252 nəfər təkrar sinifdə qalmış və ya təhsili yarımçıq tərk etmişdir. Bu rəqəmlər əvvəlki illərdən xeyli az olsa, bir sıra məktəblərin nöqsanlı işinin nəticəsi kimi qiymətləndirilməlidir.

2014-cü ildə Şəkinin ümumtəhsil məktəblərini bitirmiş 1.682 məzundan 1.130 nəfəri ali məktəbə daxil olmaq üçün sənəd vermiş, onlardan 612 nəfəri tələbə adını qazanmışdır. Bu məzunlardan 135 nəfəri 500 baldan yuxarı, 40 nəfəri 600 baldan yuxarı nəticə göstərmişlər. Şəkinin 16 məktəbinin məzunu 600-dən yuxarı, 33 məktəbin məzunları 500 baldan yuxarı nəticə əldə etmişlər. Şəhər 5, 18, 11, 10, fizika-riyaziyyat və humanitar təmayüllü lisey, 7, 20,8, Kiçik Dəhnə kənd 1 №-li, Baş Zəyzid kənd tam orta, Baş Göynük kənd 1 №-li, Köndələn, Oxud kənd tam orta məktəblərinin uğurları təqdirəlayiqdir. Ali məktəblərə qəbulun nəticələrinə görə şəhər 5№-li məktəbin 36 məzunu, 18№-li məktəbin 27

məzunu, 11№-li məktəbin 36 məzunu, 10 №-li məktəbin 40 məzunu, fizika-riyaziyyat və humanitar təmayüllü liseyin 18 məzunu, 7 №-li məktəbin 30 məzunu, 8 №-li məktəbin 25 məzunu, Baş Zəyzid kənd tam orta məktəbi 27 məzunu, Baş Göynük kənd 1 №-li tam orta məktəbi 13 məzunu, Kündələn kənd tam orta məktəbin 10 məzunu, Oxud kənd tam orta məktəbi 18 məzunu, Kiçik Dəhnə kənd 2 №-li tam orta məktəbi 16 məzunu, Orta Zəyzid kənd 1№-li tam orta məktəbin 15 məzunu nüfuzlu ali məktəblərə yüksək balla qəbul olunmuşlar.

2013-2014-cü dərs ili şagirdlərin həyatında daha bir yadda qalan hadisə ilə zəngin olmuşdur. Gəncliyə daim qayğı ilə yanaşan ölkə Prezidenti İ.Əliyevin tövsiyyəsi ilə «Ölkəmizi tanıyaq» layihəsi çərçivəsində VIII-X sinif şagirdləri respublikamızın müxtəlif guşələri ilə tanış olmaq üçün ekskursiyalara çıxmışlar. Uşaqların həyatında yadda qalan bu gəzintiyə Şəkidən də 40 nəfər məktəbli qoşulmuş, Quba-Qusar və Xazmazda 3 günlük gəzinti ilə yanaşı mənalı istirahət etmişlər. Bakıdakı 190 №-li məktəblə şəhər 7 №-li məktəb qardaşlıq və dostluq əlaqələri yaratmışlar.

«İstedadlı gənc müəllimlərin fəaliyyətinin təkmilləşdirilməsi və stimullaşdırılması tədbirləri haqqında» Təhsil Nazirliyinin 15.07.2011-ci il tarixli 1436 №-li əmrinin icrası ilə gənc müəllimlərin ixtisasının artırılması və təkmilləşdirilməsi istiqamətində açıq dərslər, seminarlar keçirilmiş, təcrübə mübadilələri aparılmışdır. Rayonun nəfər müəllimi Respublika və Beynəlxalq səviyyəli treninq və yığıncaqlarda iştirak edərək tədris ilində Elektron məktəb layihəsində müxtəlif nominasiyalar üzrə 1-III yerləri tutmuşlar. SMART Texnologiyalar şirkətinin Təhsil Problemləri İnstitutu ilə birgə layihəsində iştirak edən 40 nəfər müəllim sertifikat almışdır ki, bu da iştirakçıların sayına görə I yer hesab edilmişdir.

2014-2015-cü dərs ilində V-VII sinifdə dərs deyəcək 828 nəfər müəllimin 10 fənn üzrə kurikulumların tətbiqi sahəsində nəzəri və praktik hazırlığını təmin etmək məqsədilə Təhsil Nazirliyi tərəfindən Təhsil Sektorunun inkişafı üzrə ikinci layihə çərçivəsində təlim kurslarında iştirakı təmin edilmiş və həmin müəllimlərə müvafiq serfikatlar verilmişdir.

2013-2014-cü dərs ilində rayonda 5 yeni məktəbin tikintisi davam etdirilmiş, bir məktəb əsaslı təmir edilmişdir. Məktəblərdən 3-nün yeni tədris ilində (Şin tam orta, Baş Şabalıd tam orta, Baş Göynük kənd 1 tam orta, Göybulaq kənd ümumi orta) məktəbinin istifadəyə verilməsi planlaşdırılmışdır. Şəki Şəhər Təhsil Şöbəsi üçün inzibati bina inşa olunmuşdur. Baş Zəyzid kənd tam orta məktəbində əsaslı təmir işləri başlanılmış, Qaratorpaq tam orta məktəbi və Qırxbulaq ümumi orta məktəbi üçün yeni binaların layihə-smeta sənədləri hazırlanmışdır. Bir sözlə, 2013-2014-cü tədris ilində əldə edilmiş müvəffəqiyyətlər yeni tədris ili üçün əsaslı baza rolunu oynaya bilər.

## 3.4. Milli qürur hissinin tərbiyəsi

Azərbaycan Respublikası 20 ildən artıqdır ki, Ermənistanla müharibə şəraitində yaşayır. Respublikanın ərazisinin 20 %-nin işğalı, milyondan artıq soydaşımızın doğma yurdlarından qovulması və erməni separatçılarının işğal etdikləri ərazləri azad etmək istəməmələri böyüməkdə olan gənclərimizin hərbi vətənpərvərlik tərbiyəsini gücləndirməyi, onların ordu sıralarına hazılanmasına diqqət yetirməyi tələb edir. Bu baxımdan Şəki ŞTŞ şagirdlərin zabit və əsgərlərlə görüşünü təşkil etmiş, onların həyat şəraiti, məişəti, vəzifələrini necə icra etmələri ilə tanış olmuşar. Hərbi hissələrlə sıx əlaqənin nəticəsidir ki, «Şahin» hərbi idman oyunlarının şəhər birinciliyi 2006-cı ildə Şəki sərhəd dəstəsində keçirilmişdir.

Azərbaycan Respublikası Sərhəd Qoşunlarının 91-ci və Dövlət Sərhəd Xidmətinin yaradılmasının 8-ci ildönümü ilə əlaqədar məktəblilər arasında Sərhəd xidməti ilə əlaqədar təsviri sənət, foto sənəti və inşa müsabiqələri təşkil olunmuşdur. *«Vətən sərhəddən başlanır»* devizi altında keçirilən müsabiqənin şəhər turunun qalibi olmuş 3 inşa işi qiymətləndirilmək üçün Sərhəd Qoşunlarının Respublika Qərargahına göndərilmişdir. Müsabiqənin nəticələrinə görə, şəhər 10 nömrəli məktəbin şagirdi Lalə Mikayılzadənin inşası **II yerə** layiq görülmüş, 150 manat pul və fəxri fərmanla mükafatlandırılmışdır.

Könüllü Hərbi Vətənpərvərlik Texniki İdman Cəmiyyətinin Şəki Avtomobil Məktəbində keçirilən «*Mahir nişançı»* devizi altında atıçılıq yarışında 7 rayonun komandası iştirak etmiş, Şəkinin gənc atıcıları Respublika birinciliyinə vəsiqə almış və 22 komanda arasında 5-ci olmuşlar.

Şagirdlər arasında «Cəsurlar», «Vətənin müdafiəsinə hazıram», «Şahin» hərbi idman oyunları, sərhəd kəndlərinin X sinif şagirdləri arasında «Sərhəd» hərbi idman» oyunları keçirilmişdir. «Cəsurlar» yarışında şəhər fizika-riyaziyyat və humanitar təmayüllü liseyin, «Vətənin müdafiəsinə hazıram» və «Şahin» hərbi idman oyunlarında 19 nömrəli məktəbin, «Sərhəd» hərbi idman oyununda Baş Göynük 1 nömrəli orta məktəbin komandası **I yeri** tutmuşdur. Aparılmış məqsədyönlü işin nəticəsidir ki, orta məktəb məzunlarından 14 nəfəri ali hərbi məktəblərə, əsas məktəb məzunlarından 16 nəfəri C.Naxçıvanski adına hərbi liseyə daxil olmuşlar.[459]

Uşaq Gənclər İdman Məktəbinin idmançıları 24 qızıl, 24 gümüş, 12 bürünc, ümumilikdə 60 medal qazanmışlar. Məktəbin idmançılarından 3 nəfər basketbol, 8 nəfər voleybol üzrə respublika yığmasına namizəd göstərilmişdir.

Uşaq Gənclər Şahmat Məktəbinin şagirdi Aytac Abdurahmanlı 15-16 yaşlılar arasında Respublika çempionu olmuş, Türkiyədə keçiriləcək dünya birinciliyi yarışında iştirak etmək hüququ qazanmışdır.

2004-2005-ci tədris ilində Şəki ŞTŞ-də gənclərin çağırışaqədər hazırlığı, fiziki tərbiyəsi və kütləvi idman işləri sahəsində bir sıra tədbirlər həyata keçrilmişdir. Hərbi hissələrlə birgə iş planlarının tərtibi, hərbçilərlə birgə **«Sərhəddə şəhər»** mövzusunda müsabiqələr keçirilməsi, məktəblilərlə zabit və əsgər

heyətinin görüşləri, hazırlanan ədəbi-bədii kompozisiyalar, şeir və mahnı müsabiqələri öz səmərəsini vermişdir.

Məktəblərdə «**Şəhidlər»** guşəsi yaradılmışdır. Şəhidlərin qəbirləri ziyarət edilmiş, *«H.Əliyevin gənclərin birinci forumunda çıxışı- çağırışını* mən necə başa düşürəm», «*Vətənin müdafiəsi uğrunda şəxsi məsuliyyətimi necə hiss edirəm», «Ataların yolu ilə»* mövzusunda hünər dərsləri keçirilmişdir.[460]

Fiziki tərbiyə və kütləvi idman işlərinin təşkili istiqamətində bir sıra tədbirlər müəyyənləşdirilmişdir. 2005-ci il mayın 25-də Dövlət Sərhəd Xidmətinin, Təhsil, Gənclər və İdman, Mədəniyyət və Turizm Nazirliklərinin birgə qərarına əsasən «Sərhəd» hərbi-idman oyunlarının şəhər birinciliyi keçirilmişdir.



***Məktəblərdəki hərbi hazırlıq guşələrindən biri***

Gənclərin Çağırışaqədər Hazırlığı diqqət mərkəzində saxlanılmışdır. İdmanın şahmat, voleybol, basketbol, stolüstü tennis növləri üzrə məktəb və şəhər birincilikləri keçirilmiş, yarışların yekunlarına görə 7, 20 və 8 nömrəli məktəblərin oğlanlardan ibarət voleybol, 20, 8 və 11 nömrəli məktəblərin qızlardan ibarət volebol, 17,11 və 8 nömrəli məktəblərin qızlardan ibarət basketbol komandaları müvafiq olaraq I, II, III yerləri tutmuşlar.




***Gənclərin Çağırışaqədərki Hazırlığı kabinetinin məktəb stendlərindən birinin görünüşü***



***«Cəsurlar» hərbi idman oyununun iştirakçıları***

«Sərhəd» hərbi idman oyunları» və «Vətənin keşiyindəyik» yarışlarında, «Heydər Əliyev Dövlət Sərhəd Xidmətinin yaradıcısıdır» mövzusunda elmi-praktik konfransda məktəblilər fəal iştirak etmişlər. 20 Yanvar faciəsi ilə bağlı tədbirlər də məktəblilərin hərbi-vətənpərvərlik tərbiyəsində mühüm rol oynamışdır.

Şəhər və kənd məktəblərində payız və qış çağırışına həsr olunmuş «Vətənin müdafiəsinə hazıram» hərbi idman yarışlarının məktəb və şəhər birincilikləri keçirilmişdir. Payız çağırışına həsr edilmiş şəhər birinciliyində 24 komanda iştirak etmiş, şəhər liseyinin komandası **I**, 17 nömrəli məktəbin komandası **II**, 8 nömrəli məktəbin komandası **III** yeri tutmuşdur.

**«Cəsurlar» və «Şahin»** hərbi-idman oyunları mütəşəkkil keçirilmişdir. «Cəsurlar» hərbi-idman oyunlarında 23 komanda, «Şahin» hərbi-idman oyununda 22 komanda iştirak etmişdir.

2006/2007-ci tədris ilində Şəkinin 72 ümumtəhsil məktəbinin X-XI siniflərində təhsil alan 4.939 nəfər şagird gənclərin çağırışaqədər hazırlığına cəlb edilmişdir.

Tədris ilinin yekununa görə, XI siniflərdə yoxlamalar keçirilmişdir. Nəticələrə görə, 399 şagird «əla», 1.246 şagird «yaxşı», 648 şagird «kafi» qiymət almışdır.[461] Məktəblilər Respublika Təhsil Nazirliyinin ümumtəhsil, lisey, peşə liseyləri şagirdləri arasında IV Respublika Spartakiadasının zona mərhələsində iştirak etmiş, Şəki ŞTŞ-nin oğlanlardan ibarət yığma komandası basketbol




***Məktəblərdə təşkil olunmuş sərgilərdən biri***

və voleybol idman növü üzrə I yeri tutmuş, 2007-ci il may ayının 14-24-də keçirilən Respublika mərhələsində basketbolçular I yerə, voleybolçular isə III yerə layiq görülmüşlər.

2006/2007-ci tədris ilində Uşaq Gənclər İdman Məktəbi (UGİM) səmərəli fəaliyyət göstərmişdir. UGİM dərs ilində basketbol və voleybol idman növləri üzrə 8 qrupla fəaliyyətə başlamış, qruplara 496 nəfər şagird cəlb olunmuşdur. Aparılan səmərəli işlərin nəticəsi olaraq məktəbin basketbolçuları 2007-ci ilin mart ayının 17-18-də Bakı şəhərində Respublika Təhsil İdman Mərkəzinin birinciliyində II yeri tutmuşlar.[462]

Şahmatçılar yüksək nəticələr əldə etmişlər. Məktəbdə təşkil olunmuş 44 qrupda 508 şahmatçı məşğul olmuşdur. Məktəbin şahmatçısı Aytac Abdurahmanlı 2006-cı il dekabr ayının 15-25-də Mingəçevir şəhərində keçirilən Respublika şahmat turnirində I yer tutmuş, Abdurahmanlı Aytac və Ulduz Nəsrullayeva 2007-ci il yanvar ayının 03-13-də Gəncə şəhərində yaş qrupları üzrə respublika

birinciliyində finala vəsiqə qazanmış, Adurahmanlı Aytac 2007-ci il mart ayının 15-27-də Bakı şəhərində keçirilən final yarışında ən güclü 12 qız arasında IV yeri tutmuşdur.

Hərbi hissələrlə sıx əlaqənin nəticəsi olaraq 2006 nömrəli hərbi hissənin köməyi ilə H.Əliyev adına Kiş kənd 1 nömrəli orta məktəbdə GÇQH üzrə kabinet yaradılmış və hər cür avadanlıqla təmin olunmuşdur.

2007-2008-ci tədris ili bir sıra yaddaqalan hadisələrlə zəngin olmuşdur. Ümummilli lider Heydər Əliyevin anadan olmasının 85 illiyi münasibətilə keçirilən tədbirlərin ana xəttini məktəblilərin hərbi vətənpərvərlik tərbiyəsi təşkil etmişdir. XI siniflərdə «Heydər Əliyevin vətənpərvərliyi bizim üçün örnəkdir», Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 90 illiyinə həsr edilimiş «Şərqdə ilk demokratik dövlət» mövzularında inşa yazı müsabiqələri keçirilmiş, sərgilər təşkil edilmişdir.

Azərbaycan Respublikası Sərhəd Qoşunlarının 89-cu və Dövlət Sərhəd Xidmətinin yaranmasının 6-cı ildönümü ilə əlaqədar ümumtəhsil məktəblərinin X-XI sinif şagirdləri arasında sərhəd xidməti ilə bağlı fotomüsabiqə keçirilmişdir. Tədris ilində proqrama müvafiq olaraq 4.767 nəfər şagird GÇQH-na cəlb olunmuşdur. Bu dərsləri 73 ümumtəhsil məktəbində işləyən 1 polkovnik, 1 kapitan, 24 baş leytenant, 4 gizir, 17 çavuş və b. aparmışlar.[463]

**2008/2009-cu tədris** ilində gənclərin çağırışaqədər hazırlığı Azərbaycan Respublikasının Hərbi Xidmət haqqında qanunu, Azərbaycan Respublikası Nazirlər Kabinetinin qərarı və Respublika Təhsil Nazirliyinin tədris planı əsasında təşkil edilmişdir.

Tədris ilində 73 ümumtəhsil məktəbində gənclərin çağırışaqədər hazılığı təşkil olunmuş, 4.410 nəfər şagird GÇQH-na cəlb edilmişdir. Məktəblərdə fiziki hazılıq dərslərinə 27.082 şagird cəlb olunmuşdur. Onların 13.024 nəfəri qızlar olmuşdur. Ümumilikdə, məktəblərdəki idman dərnəklərində 8 növ üzrə 2.982 şagird məşğul olumuşdur.[464]

Azərbaycan Respublikası Təhsil Nazirliyi ilə Gənclər və İdman Nazirliyinin birgə keçirdiyi «Uşaq ili» nə həsr olunmuş Respublika ümumtəhsil və texniki peşə məktəbləri şagirdlərinin V Spartakiadasında iştirak edən Şəki ŞTŞ-nin voleybol və basketbol komandaları Qax şəhərində keçirilən zona mərhələsində qalib olmuş, respublika turuna vəsiqə qazanılmışdır.

**2009/2010-cu tədris ili** bir sıra hadisələrlə zəngin olmuşdur. Tariximizin qan yaddaşı olan 20 Yanvar faciəsi, Xocalı soyqırımı, Füzulinin, Kəlbəcərin, Ağdamın, Zəngilanın və Şuşanın işğalının ildönümü günləri keçirilmiş, məktəblərdə ədəbi-bədii kompozisiyalar təşkil edilmişdir. Sərhədyanı kəndlərin ümumtəhsil məktəblərinin X sinif şagirdləri arasında keçirilən «Sərhəd» hərbi idman oyunlarının şəhər turunda Kiş 1 və 4 nömrəli, Baş Göynük 1 və 2 nömrəli, şəhər 6 və 11 nömrəli məktəblərin komandaları iştirak etmiş, 6 nömrəli məktəbin komandası I yeri tutaraq zona turuna vəsiqə qazanmış və zona turunda II yerə layiq görülmüşdür.



***Şəki məktəbliləri  Spartakiadada.    2008-ci il***

Könüllü Hərbi Vətənpərvərlik Texniki İdman Cəmiyyətinin Şəki Avtomobil Məktəbində «Sərrast atıcı» devizi altında keçirilən şəhər birinciliyində 20 məktəbin komandası iştirak etmiş, 20 nömrəli məktəbin şagirdi, 1993-cü il təvəllüdlü **Mustafayev Ramin Nağı oğlu**, şəhər 11 № li məktəbin şagirdi, 1994-cü il təvəllüdlü **Ramazanlı Ruslan Rizvan oğlu** zona birinciliyinə vəsiqə qazanmışlar. Aparılmış məqsədyönlü işin nəticəsi olaraq **29 şagird** Naxçıvanski adına hərbi liseyə, **36 nəfər** ali hərbi məktəblərə sənəd vermiş, qəbulun yekunlarına görə **14 nəfər ali hərbi məktəblərə, 17 nəfər hərbi liseyə** daxil olmuşdur.[465]

Gənclərin sağlam böyüməsində və çağırışaqədərki hazırlığında Fiziki hazırlıq fənninin xüsusi yeri vardır. 2009-2010-cu tədris ilində təhsil şöbəsinin 99 ümumtəhsil məktəbində 25.867 şagird təhsil almışdır. Onların 12.422 nəfəri qızlar olmuşdur. Məktəblərdə 28 idman zalı, 172 idman qurğusu, 2 atıcılıq tiri şagirdlərin istifadəsində olmuşdur.



*Məktəblilər yarışa hazırlaşırlar*

Məktəblərdə şagirdlərin fiziki hazırlığı ilə 279 müəllim məşğul olmuşdur. Onların 110 nəfəri ali, 169 nəfəri orta ixtisas təhsillidir. Fiziki hazırlıq müəllimlərinin 65 nəfəri qadınlardır. 2.559 şagird 11 idman növü ilə məşğul olmuşdur.

Gənclərin hərbi-vətənpərvərlik tərbiyəsi sahəsində bir sıra işlər görülmüşdür. Şəkinin tam orta məktəblərində Gənclərin Çağırışaqədər Hazırlığı üzrə 128 saatlıq proqram yerinə yetirilmişdir. GÇQH rəhbərləri vəzifəsində 1 polkovnik, 1 kapitan, 24 baş leytenant, 23 leytenant, 3 gizir, 19 çavuş, 2 əsgər çalışmışdır.[466] «Şahin», «Cəsurlar» hərbi-idman oyunlarının şəhər turları, «Vətənin müdafiəsinə hazıram» devizi altında çoxnövçülük yarışlarının payız və yaz çağırışlarına həsr olunmuş şəhər birinciliyi keçirilmişdir.

«Şahin» hərbi-idman oyununda 15 komanda, «Cəsurlar» hərbi-idman oyununda 21 komanda, «Vətənin müdafiəsinə hazıram» çoxnövçülük yarışlarının payız çağırışında 10 komanda, yaz çağırışında 21 komanda iştirak etmişdir. Bu yarışlarda şəhər liseyinin, 5, 8, 11 və 19 nömrəli məktəblərin komandaları fərqlənmişlər.[467]

Sərhəd hərbi-idman oyunlarında sərhədyanı Şin, Baş Göynük 2 nömrəli, Kiş 1, 2, 4 nömrəli tam orta məktəblərin,18 və 20 nömrəli məktəblərin komandaları iştirak etmişlər. Kiş 4 nömrəli məktəbin komandası I yerə layiq

görülərək zona turuna vəsiqə qazanmış, şəhər 20 nömrəli məktəbin komandası II yerə, Kiş 2 nömrəli tam orta məktəbin komandası III yerə çıxmışdır.

Könüllü Hərbi Vətənpərvərlik Texniki İdman Cəmiyyətinin Avtomobil məktəbində «Qarabağ uğrunda irəli!» devizi altında keçirilən atıcılıq yarışlarının şəhər birinciliyində 18 məktəbdən hər birində 3 atıcıdan ibarət komanda iştirak etmiş, 7 № li məktəbin komandası I, 18 nömrəli məktəbin komandası II, 6 nömrəli məktəbin komandası III yerə çıxmışlar.

Məktəblilərin fiziki tərbiyəsi də yaddan çıxmamışdır. Fiziki hazırlıq dərslərinə 24.897 şagird cəlb olunmuş, 2.903 nəfər şagird 214 qrupda idmanın 12 növündə məşğul olmuşlar ki, onların 384 nəfəri qızlardır. 2010-2011-ci tədris ilində şagirdlərin fiziki hazırlığı ilə 284 nəfər idman müəllimi məşğul olmuşdur ki, onlardan 112 nəfəri ali, 172 nəfəri orta ixtisas təhsilli olmuşdur. İdman müəllimlərinin 67 nəfəri qadındır.[468]

Aparılan peşə yönümlü söhbətlərin nəticəsi olaraq 26 nəfər ali hərbi məktəblərə, 28 nəfər hərbi liseylərə sənəd vermiş, onlardan 13 nəfəri ali hərbi məktəblərə, 9 nəfər liseylərə qəbul olunmuşdur.[469]

***2012-2013- cü il dərs ilində*** Şəki Şəhər Təhsil Şöbəsinin ümumtəhsil məktəblərində hərbi vətənpərvərlik tərbiyəsi, Gənclərin Çağırışaqədərki Hazırlığı, fiziki tərbiyə və kütləvi idman işləri sahələrində əməli işlər həyata keçirilmişdir. Bütün ümumtəhsil məktəblərinin GÇQH rəhbərlərinə və təşkilatçılarına hərbi-vətənpərvərlik tərbiyəsi işinin daha səmərəli təşkilinin forma və metodlarının təkmilləşdirilməsi, məzmununun zənginləşdirilməsi tapşırılmışdır. Şəki Şəhər Müharibə, Əmək, Silahlı Qüvvələr və Hüquq Mühafizə Orqanları Veteranları Şurası ilə birgə ümumtəhsil məktəblərində IX-XI sinif şagirdəri ilə faşizm üzərində Qələbənin 68-ci ildönümü münasibətilə söhbətlər aparılmışdır. 20 yanvar və Xocalı faciələri ilə əlaqədar məktəblərdə ədəbi bədii kompozisiyalar keçirilmiş, divar qəzetləri buraxılmış, şəhərdəki «Şəhidlər xiyabanı» ziyarət edilmiş, sovet imperiyasının xalqımıza qarşı törətdiyi qanlı hadisələr təhlil olunaraq faciənin milli -azadlıq tarixində rolu haqqında məlumat verilmişdir.

Şəhərin ümumtəhsil məktəblərinin IX-XI sinif şagirdlərinin hərbi hissəyə səfərləri təşkil edilmiş, onlara əsgərlərimizin ən müqəddəs vətəndaşlıq borclarının necə yerinə yetirmələri, Vətənə xidmətin şərəfli olduğu aşılanmışdır. Şagirdlər hərbi hissədə əsgərlərin məişəti və qidalanmalarının əyani şahidi olmuşlar. «Şahin» və «Sərhəd» hərbi idman oyunları həmin hərbi hissələrdə keçirilmişdir.

«Sərhəd» hərbi idman oyunlarında Kiş kənd 1 və 2 №-li, Baş Göynük 1 və 2 №-li, Şin kənd komandaları iştirak etmiş, Şin kənd tam orta məktəbinin «Salavat» komandası I yerə layiq görülərək zona turuna vəsiqə qazanmışdır.

Aparılmış məqsədyönlü tədirlərin nəticəsidir ki, C.Naxzıvanski adına Hərbi liseyə 32 nəfər, Ali Hərbi məktəbə 27 nəfər sənəd vermişdir.



***Məktəblilər Şəkidəki N hərbi hissəsində bacarıqlarını nümayiş etdirirlər. 2010-cu il***

Gənclərin Çağırışa Qədərki Hazırlığı Azərbaycan Respublikasının Hərbi Xidmət Haqqında Qanunu və Azərbaycan Respublikası Nazirlər Kabinetinin qərarı və Təhsil Nazirliyinin tədris planına uyğun həyata keçirilir. Proqramın tələblərinə əsasən 72 tam orta məktəbdə 3.829 nəfər X-XI sinif şagirdləri GÇQH-na cəlb olunmuşlar. Onlardan 1.854 nəfəri qızlardır.

Tam orta məktəblərdə GÇQH üzrə 128 saatlıq proqram yerinə yetirilmişdir. GÇQH rəhbərləri vəzifəsində 1 palkovnik, 1 mayor, 1 kapitan, 24 baş leytenant, 21 leytenant, 3 gizir, 21 nəfər əsgər və çavuşlar çalışırlar.

Şəhər Gənclər idman idarəsi ilə birgə tədbirlər planına uyğun olaraq «Şahin»-lər, «Cəsurlar» payız və yaz çağırışına həsr olunmuş «Vətənin müdafiəsinə hazıram» devizi altında çoxnövçülük yarışları keçirilmişdir. 28 fevral 2013-cü il tarixdə Sərhəd dəstəsində keçirilmiş «Şahin» Hərbi idman oyununda 15 komanda iştirak, 11 № - li tam orta məktəb I yer, – 19 № - li tam orta məktəb II yer, Şəhər liseyi III yer tutmuşdur. Zona turunda İsmayıllı şəhərində 11 № - li tam orta məktəbin komandası IV yerə layiq görümüşdür.

«Cəsurlar» Hərbi idman oyununda 17 komanda iştirak etmiş, 11 № - li tam orta məktəb I yer, 19 № - li tam orta məktəb II yer, 10 № - li tam orta məktəb III

yer tutmuşlar. «Vətənin müdafiəsinə hazıram» devizi altında payız və yaz çağırışına həsr olunmuş çoxnövçülük yarışlarının nəticələri daha sevindirici olmuşdur.

Payız çağırışında 21, yaz çağırışında 19 komanda iştirak etmiş və nəticələr aşağdakı kimi olmuşdur.

**Payız çağırışı üzrə:**

I yer - 8 № - li tam orta məktəb
II yer – Oxud kənd tam orta məktəb
III yer – 11 № - li tam orta məktəb

**Yaz çağırışı üzrə**

I yer – Oxud kənd tam orta məktəb
II yer - 8 № - li tam orta məktəb
III yer – Qoxmuq kənd tam orta məktəb

Ümumtəhsil məktəblərində Fiziki tərbiyə fənninin tələblərinə uyğun olaraq tematik, təqvim planları, idman tədbirlərinin illik planları, məktəbdaxili yarışların qrafikləri, idman zalları və qurğularının iş qrafikləri, məktəb idman kollektivlərinin iş planları, Əməyə Müdafiəyə Hazıram (Ə.M.H) normalarının qeydiyyat jurnalları tərtib edilmiş, sinif jurnallarında şagirdlərin fiziki hazırlıqlarının göstəriciləri qeyd edilmişdir. V siniflərdə yeni təlim metodları olan kurikulum islahatlarına uyğun olaraq dərslərin keçirilməsinə başlanılmışdır. Bununla əlaqədar 98 müəllim təlim kurslarına cəlb edilmişdir.

Məktəblərdə fiziki hazırlıq dərslərinə 23.257 şagird cəlb olunmuşdur. 2.779 nəfər şagird 227 qrupda 11 idman növündə məşğul olur ki, onlardan 567 nəfəri qızlardır. Məktəblərdə fiziki hazırlıq fənni üzrə 276 nəfər idman müəllimi çalışır ki, onlardan 116 nəfəri ali, 160 nəfəri orta ixtisas müəllimidir. Qadın müəllimlərinin sayı 82 nəfərdir. İdman zallarının sayı 38-ə çatmışdır.

Şəkinin məktəbliləri Azərbaycan Respublikası Təhsil Nazirliyi Bədən Tərbiyəsi Mərkəzinin 2013-cü il aprel ayının 3-11 arasında keçirdiyi ümumtəhsil və ilk peşə liseyləri şagirdlərinin VII Spartakiadasının zona mərhələsində V idman növündə voleybol və basketbol üzrə oğlanlar I yeri, voleybol və basketbol üzrə qızlar II yeri tutmuşlar. Oğlanlardan ibarət həndbol komandası II yerin sahibi olmuşlar. May ayının 14-31 arasında keçirilən stolüstü tennis üzrə də yüksək nəticələr qazanılmışdır. Şəkinin məktəbli oğlanları yarışlarda II, qızları IV yeri tutmuşlar.

Aparılmış işlərin təhlili göstərir ki, uğurlarla yanaşı nöqsan və çatışmazlıqlar da vardır.

**2013-2014-cü dərs ilində** Şəki Şəhər Təhsil Şöbəsinin ümumtəhsil məktəblərində hərbi-vətənpərvərlik tərbiyəsi Gənclərin Çağırışaqədərki Hazırlığı, fiziki tərbiyə və kütləvi idman işləri sahəsində sevindirici nəticələr qazanılmışdır.

Şəki Şəhər Müharibə, Əmək, Silahlı Qüvvələr və Hüquq Mühafizə Orqanları Veteranları Şurası, Qarabağ Əlilləri, Şəhid ailələrinin Şəki təşkilatı məktəblərdə şagirdlərin qonağı olmuş, qarşıda duran vəzifələr haqqında söhbətlər aparmışlar.

**Şagirdlərin hərbi hissələrlə əlaqələri yaxşılaşdırılmışdır.**





**Hərbi hissələrdə**

«Sərhəd» hərbi idman oyunlarının şəhər birinciliyində sərhədyanı kənd tam orta məktəblərdən Şin, Baş Göynük 1№-li, Kiş 4 №-li, Baş Zəyzid, Vərəzət komandaları iştirak etmişlər. Şagirdlər  əsgər və zabitlərlə görüşmüş, onlarla söhbətlər eçirilmiş, ərazidə abadlıq işlərində hərbçilərəköməklik göstərmişlər.





**Sərhəd məntəqələrində bir gün**








**Milli idman növləri  üzrə yarışlar**

Yarışlar Baş Zəyzid kəndində yerləşən sərhəd qaravulxanasında keçirilmişdir. Gərgin şəraitdə keçən yarışlarda Şin kənd tam orta məktəbinin komandası I yerə layiq görülərək zona yarışlarına vəsiqə qazanmışdır. Müvafiq olaraq Baş Zəyzid kənd tam orta məktəbinin komandası II yerə, Kiş kənd 1 №-li tam orta məktəbinin komandası III yerə layiq görülmüşlər. Qalib komanda, həmçinin II və III yerin sahibləri 2006 № li hərbi hissənin fəxri fərmanı və

Gənclər İdman idarəsinin diplom və qiymətli hədiyyələri ilə mükafatlandırılmışlar.

Şin kənd tam orta məktəbinin «Salavat» komandası I yerə layiq görülərək Respublika turuna vəsiqə qazanmışdır.

Şəhər 1, 3 və 9 №-li, Oxud kənd tam orta məktəblərində Fövqəladə Hallar Nazirliyi Qəbələ Regional Mərkəzinin təşkilatçılığı ilə «Fövqəladə Hallarda şagirdlərin davranış qaydaları» ndan bəhs olunan slayd göstərilmiş, məlumatlar dinlənilmiş, təxliyyə məşqi keçirilmişdir.

2014-cü il iyun ayının 3-də Qəbələ şəhərində keçirilən «Yanğınsöndürən və xilasedicilərin zona yarışları»na vəsiqə qazanmış şəhər 11 №-li tam orta məktəbin komandası IV yerə layiq görülmüşdür.



**Şagirdlər fövqəladə hallarda özlərini sınayırlar**

 

**Cəsurlar öz  məharətlərini göstərirlər**

Şəhər Gənclər idman idarəsi ilə birgə tədbirlər planına uyğun olaraq «Şahin», «Cəsurlar, Payız və yaz çağırışına həsr olunmuş çoxnövçülük yarışlarının məktəb və şəhər birinciliklərinin nəticələr aşağıdakı kimi olmuşdur.

***Şahinlər-27 fevral 2014-cü il***

I yer – 11 №-li tam orta məktəb
II yer – Şəhər fizika-riyaziyyat və humanitar təmayüllü  lisey
III yer – 10 №-li tam orta məktəb

***Cəsurlar -11 fevral 2014-cü il***

I yer    – 11 №-li tam orta məktəb
I  yer – 19  №-li tam orta məktəb
III yer - 10 №-li tam orta məktəb

**Vətənin müdafiəsinə hazıram çoxnövçülük yarışı**
**Payız çağırışı -22 oktyabr 2013-cü il**

I yer – Çeşməli kənd tam orta məktəbi
II yer - 11 №-li tam orta məktəb
III yer - 10 №-li tam orta məktəb

**Yaz çağırışı 08 aprel 2014-cü il**

I yer - Çeşməli kənd tam orta məktəbi
II yer – Qoxmuq kənd tam orta məktəbi
III yer – 11  №-li tam orta məktəb

**Yanğınsöndürən və Xilasedicilərin yarışı**
24 aprel 2014-cü il

I yer – 11 №-li tam orta məktəb
II yer – Şəhər fizika-riyaziyyat və humanitar təmayüllü lisey
III yer - 6 №-li tam orta məktəb

Azərbaycan Respublikası Təhsil Nazirliyi Respublika Bədən Tərbiyəsi Mərkəzi və Şəki Şəhər Təhsil Şöbəsi birgə Şəki şəhərindəki ümumtəhsil məktəbləri şagirdləri arasında «Narkomaniyaya qarşı mübarizə» yə həsr olunmuş oğlan və qızlar arasında voleybol, 9 noyabr «Bayraq günü» nə həsr olunmuş oğlan və qızlar arasında basketbol, 12 noyabr «Konstitusiya günü» nə həsr olunmuş stolüstü tennis üzrə qız və oğlan komandalarının yarışları məktəblilər arasında maraq yaratmışdır. Yarışlara 58 komanda qatılmışdır. Ümumtəhsil məktəb şagirdlərinin voleybol idman növü üzrə Respublika birinciliyində Şəki Şəhər Təhsil Şöbəsinin komandası III yerə layiq görülmüş, qalib komandalar Bədən Tərbiyəsi Mərkəzinin təsis etdiyi kubok, medal və Fəxri fərmanlarla mükafatlandırılmışdır.

Ümummilli lider Heydər Əliyevin anadan olmasının 91-ci ildönümü münasibəti ilə Azərbaycan Respublikası Təhsil Nazirliyi, Respublika Bədən Tərbiyəsi və İdman Mərkəzinin Şəki şəhərində keçirdiyi voleybol (oğlan, qız), basketbol (oğlan, qız), stolüstü tennis (oğlan, qız) və mini futbol idman növləri üzrə yarışlar əhatə dairəsinə və iştirakçıların sayına görə əvvəlkilərdən xeyli fərqlənmişdir. Ümumilikdə yarışlarda 77 komanda iştirak etmiş, nəticələr aşağıdakı kimi olmuşdur.




**Voleybol yarışlarından epizod**






**Stolüstü tennis yarışlarından fraqment**







**Qaliblər mükafatlandırılmışdır**

Mini futbol yarışları məktəblilərin böyük marağına səbəb olmuşdur. Yarışlar şəhər stadionunda keçirilmiş və nəticələrə görə 18 №-li tam orta məktəb I, Çeşməli kənd tam orta məktəbi II, 17 №-li tam orta məktəbin futbol komandası III yerə layiq görülmüşdür.

AFFA, Coca – Cola şirkətləri və Təhsil Nazirliyinin birgə keçirdiyi Coca – Cola məktəbli kuboku layihəsi üzrə VII siniflər arasında «Mini futbol» birinciliyində 23 komanda iştirak etmişdir. Qalib olan Şorsu kənd tam orta məktəbinin komandası zona turuna vəsiqə qazanmışdır. IX sinif şagirdləri



arasında Coca – Cola məktəbli kuboku yarışları şəhər stadionunda keçirilmiş və 18 komanda mübarizəyə qatılmışdır. H.Əliyev adına Kiş kənd 1 №-li tam orta məktəbinin komandası qalib gələrək respublika turuna vəsiqə qazanmışdır. Ümumilikdə 2013-2014-cü dərs



ilində İdman Gənclər İdarəsi ilə birgə tədbirlər planına uyğun olaraq 14 idman növü üzrə şəhər birinciliyi, Azərbaycan Respublikası Təhsil Nazirliyi Respublika Bədən Tərbiyəsi İdman Mərkəzinin Şəkidə keçirdiyi 13 növ üzrə idman yarışı, Coca–Cola və AFFA-nın təşkilatçılığı ilə 4 öv üzrə idman yarışı «Sərhəd» Hərbi idman oyunlarının şəhər və zona turu, xilasedici və yanğınsöndürənlərin 2 yarışı, «Şahin», «Cəsurlar», «Vətənin müdafiəsinə hazıram» devizi altında payız və yaz çağırışı üzrə 4 zona yarışı, Fövqəladə Hallar Nazirliyi ilə birgə 6 təxliyyə məşqi, 7 respublika səviyyəli yarışlar -cəmi 60 yarış və tədbirlər keçirilmişdir.

Təbii ki, əsas məqsəd gəncləri vətənə layiq vətəndaş, sağlam iradəli insan, dövlətə sadiq, azərbaycançılıq ideyalarını özündə birləşdirən savadlı və intellektual gənclər yetişdirmək olmuşdur.

Şəkidə gənclərin çağırışaqədərki hazırlığı, onların vətənpərvərlik tərbiyəsinin gücləndirilməsi sahəsində əldə olunan nailiyyətlərin qazanılmasında təhsil şöbəsində bu sahəyə rəhbərlik edən **Abdurahman Allahyar oğlu Məmmədovun** xüsusi əməyi vardır.



*Məmmədov Abdurahman Allahyar oğlu* 1961-ci ildə Şəki şəhərində fəhlə ailəsində anadan olmuşdur. 1978-ci ildə şəhər 10 nömrəli məktəbi bitirmiş, 1978-1980-ci illərdə Bakı Baş Tikinti İdarəsində çilingər işləmiş, 1980-1982-ci illərədə hərbi xidmətdə olmuş, 1982-1983-cü illərdə Şəki rayonlararası Avtoservis müəssisə sində mühasib işləmişdir.

A.Məmmədov 1988-ci ildə ADPİ-nin (indiki ADPU) hərbi və bədən tərbiyəsi fakültəsini bitirmiş, 1988-2005-ci illərdə Şəkinin şəhər məktəblərinin hərbi rəhbəri vəzifəsində çalışmışdır. 2005-ci ildən Şəki ŞTŞ-də metodist vəzifəsində işləyir. Ehtiyatda olan mayordur.

A.Məmmədov işlədiyi müddətdə gənclərin hərbi vətənpərvərlik tərbiyəsi və çağırışaqədərki hazırlığı sahəsində müxtəlif tədbirlər həyata keçirmişdir.

## 3.5. Təhsilin təşkilatçıları - Şəki Şəhər İcra Hakimiyyəti və Şəki Şəhər Təhsil Şöbəsi

***Hörmətli oxucu, yuxarıda 2000-2014-cü illərdə Şəkidə təhsil sahəsində əldə olunan müvəffəqiyyətlərdən söz açıldı, uğurlar və çatışmazlıqlar faktlarla göstərildi. Sadalanan uğurların əldə olunmasında xüsusi xidmətləri olan rayonun rəhbər təşkilatları, məktəbləri və onların pedaqoji kollektivləri barəsində məlumatlarla tanış olaq.***

### *3.5.1. Şəki şəhər İcra hakimiyyəti*



**İcra hakimiyyəti başçısının təhsil, səhiyyə və mədəniyyət üzrə müavini Cavadova Zərinə Ələkbər qızıdır.** *Birinci dərəcə dövlət qulluqçusu* Z.Cavadova 1960-cı il sentyabr ayının 15-də Şəki şəhərində anadan olmuşdur. Azərbaycan Dövlət Universitetinin tarix fakültəsini bitirib. 1986-1994-cü illərdə Kiş kəndindəki 6 nömrəli məktəbdə müəllim işləmişdir. 1994-2001-ci illərdə Bakı Dövlət Universitetinin Şəki filialında müəllim, baş müəllim, dekan, 2001-2006-cı illərdə Azərbaycan Müəllimlər İnstitutunun Şəki filialında baş müəllim, dekan, təlim-tərbiyə işləri üzrə direktor müavini vəzifələrində çalışmışdır.

«Şimal-Qərbi Azərbaycan: tarixi demoqrafik tədqiqat» mövzusunda dissertasiya müdafiə edərək tarix üzrə fəlsəfə doktoru elmi dərəcəsi almışdır. 2 monoqrafiyanın, onlarla elmi əsərin müəllifidir. 2006-cı il aprel ayının 17-də Şəki şəhər İHB-nın təhsil, səhiyyə və mədəniyyət üzrə müavini vəzifəsinə təyin edilmişdir.

Z.Cavadova harada işləməsindən asılı olmayaraq vəzifəsinin öhdəsindən ləyaqətlə gəlmişdir. Kiş kəndindəki 6 nömrəli məktəbdə işlədiyi dövrdə özünü savadlı, peşəsini sevən pedaqoq kimi göstərməklə yanaşı kəndin ictimai həyatında fəal iştirak etmiş, gənc olmasına baxmayaraq kənd əhalisinin yaxın məsləhətçisinə çevrilmişdir.

Z.Cavadovanın 1994-2001-ci illərdə BDU-nun Şəki filialındakı fəaliyyəti bu gün də xoş xatirələrlə yad olunur. Filialın məzunları onu təkcə tarix müəllimi kimi deyil, həm də tələbələrin yaxın dostu, məsləhətçisi və çətin anlarda köməkçisi kimi xatırlayırlar.

Azərbaycan Müəllimlər İnstitutunun Şəki filialı yaradılarkən Z.Cavadova səy və bacarığını əsirgəməmiş, filialın təşkilatlanmasında, tədris prosesinin təşkilində, kadr potensialının yaradılmasında yaxından iştirak etmiş, onun səyi ilə kitabxana zənginləşdirilmiş, akt zalı yenidən qurulmuş, TEC-nin işi canlandırılmışdır.

Z.Cavadovanın şəhər icra hakimiyəti başçısının müavini təyin olunmasından sonra nəinki şəhərdə (rayonda), həmçinin regionda ideoloji iş canlanmış, bir sıra respublika və Avropa miqyaslı tədbirlər Şəkidə keçirilmişdir. Rayonun ayrı-ayrı problemlərinə, tarixi abidələrin öyrənilməsi və təbliğinə həsr olunmuş elmi-nəzəri və praktiki konfranslar, festivallar, müsabiqələr Z.Cavadovanın təşəbbüsü və rəhbərliyi ilə təşkil olunmuş və respublikada əks-səda doğurmuşdur. Şəki xanlarının sarayının 250 illiyi, M.F.Axundovun anadan olmasının 200 illiyi və qəza məktəbinin 180 illiyinin qeyd olunmasının təşəbbüskarlarından biri Z.Cavadova olmuşdur.

*«Xüsusi istedada malik uşaqların (gənclərin) yaradıcılıq potensialının inkişafı üzrə Dövlət Proqramı (2006-2010-cu illər)»*nın icrası və bu proqramla əlaqədar Təhsil Nazirliyinin 22 iyun 2010-cu il tarixli əmrinin icrası şəhər icra hakimiyyətinin diqqət mərkəzində saxlanılmışdır. Qərarın icrası ilə əlaqədar şəhər 19 nömrəli məktəbdə xüsusi istedadı ilə fərqlənən 15 nəfərdən ibarət V sinif açılmış, xüsusi istedada malik uşaqlarla iş təcrübəsinə malik olan 60 nəfər müəllim seçilmiş və onlar Azərbaycan Müəllimlər İnstitutunda «*Xüsusi istedadlı uşaq və gənclərlə fəaliyyətin xarakterik xüsusiyyətləri»* mövzusunda keçirilən müxtəlif seminarlarda iştirak etmişlər.

Azərbaycan Respublikası Prezidentinin 10 iyun 2008-ci il tarixli sərəncamı ilə təsdiq olunmuş *«2008-2012-ci illərdə Azərbaycan Respublikasında təhsil sisteminin informasiyalaşdırılması üzrə Dövlət Proqramı»* nın icrası ilə əlaqədar tədbirlər həyata keçirilmişdir. Proqram çərçivəsində pedaqoji kadrların İKT üzrə savadlılığının artırılmasına yönəldilmiş təlimlərdə 2008-2014-cü illərdə 1500 nəfər müəllim iştirak etmişdir. Dövlət Proqramı çərçivəsində rayon və şəhərin

bütün ümumtəhsil məktəblərinin direktor, direktor müavini, kargüzar və tədris köməkçi heyəti işçiləri üçün İKT-nin tədrisə tətbiqi sahəsində biliklərin əldə edilməsi məqsədilə «İnzibati idarəetmə heyəti» təlim kurslarında 525 nəfər iştirak etmişdir.

## 3.5.2. Şəki Şəhər Təhsil Şöbəsi



**M.Yusifov**

Şəki Şəhər Təhsil Şöbəsində hazırda 53 nəfər çalışır. Onlardan 17 nəfəri metodist, 6 nəfəri inspektordur. Təhsil şöbəsinin rəhbərlik etdiyi 99 məktəbdə və 62 məktəbəqədər tərbiyə müəssisəsində 4 mindən yuxarı müəllim və tərbiyəçi yetişməkdə olan nəslin təlim və tərbiyəsi ilə məşğul olur.

Şəki Şəhər Təhsil Şöbəsinin son 20 ildə əldə etdiyi uğurlarda gözəl pedaqoq, sözün həqiqi mənasında insan, hamının sevimlisinə çevrilmiş, səmimiyyəti ilə ictimaiyyətin hörmətini qazanmış **Məmmədnuru Yusifovun** xüsusi payı vardır.

M.Yusifov haqqında danışarkən böyük şəxsiyyət Ə.Caminin sözləri yerinə düşür. Ə.Cami yazırdı: *«Adamı vəzifə böyüdüb şərəfli edə bilməz, bəlkə adamına görə vəzifə böyük və şərəflidir».*

Məmmədnuru müəllim təhsil şöbəsi müdiri vəzifəsinin böyük vəzifə olduğunu, həm də özünün vəzifəyə layiq olduğunu 20 ildən artıq təhsil şöbəsinə rəhbərlik etdiyi illərdə sübut etmiş, müstəqillik illərində təhsil işçisinin şərəfli və fədakar bir peşə olduğu onun rəhbərliyi dövründə özünün bir daha təsdiqini tapmışdır.



Şöbəyə hazırda ***Südabər İsmayılova*** rəhbərlik edir.

S.İsmayılova 1956-cı ildə Şəkinin Bideyiz kəndində anadan olmuşdur. 1963-1971-ci illərdə Bideyiz kənd orta məktəbində, 1971-1975-ci illərdə Şəki Pedaqoji texnikumunda təhsil almışdır. Texni kumu bitirdikdən sonra 10 il Bideyiz kənd orta məktəbində müəllim işləmişdir.

Südabər xanım 1985-90-cı illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun ümumi texniki fənlər və fizika fakültəsində təhsilini davam etdirmiş və ali təhsilli müəllim kimi doğma kəndinə qayıtmışdır. 1995-ci ildə işlədiyi Bideyiz kənd orta məktəbinə direktor təyin olunmuş və 2011-ciilədək həmin vəzifənin öhdəsindən bacarıqla gəlmişdir.

Öz işinə məsuliyyətlə yanaşan, öhdəsinə düşən vəzifəni həmişə layiqincə yerinə yetirən Südabər İsmayılova 2011-ci ilin yanvar ayında Şəki Şəhər Təhsil Şöbəsinin müdiri vəzifəsinə təyin edilmişdir.

Son üç ildə təhsil şöbəsinin işində canlanma, yeniliyə meyl hiss olunmaqdadır. S.İsmayılova təhsil müəssisələrinin maddi-texniki bazasının möhkəmləndirilməsi sahəsində əməli işlər həyata keçirir. Şəhər 5, 12, 14, 17 nömrəli, Şorsu, Aşağı Layısqı kənd və Çələbixan qəsəbə tam orta məktəbləri üçün yeni məktəb binaları inşa olunmuş, şəhər fizika-riyaziyyat və humanitar təmayüllü lisey və 8 nömrəli məktəb əsaslı təmir edilmiş, digər tədris müəssisələrində təmir-tikinti işləri hazırda davam etdirilir. Bütün bunlarla yanaşı, rayonda orta məktəb binalarının 19 faizi, əsas məktəb binalarının 18 faizi qəza vəziyyətindədir, orta məktəb binalarının 70 %-nin, əsas məktəb binalaının 64 %-nin əsaslı təmirə ehtiyacı vardır. Rayonda məktəb binalarının əksəriyyətinin qızdırıcı sistemi və kanalizasiya xətləri yoxdur.

1995-ci ildən YAP-ın üzvü olan S.İsmayılova YAP-ın I, II və III, Azərbaycan müəllimlərinin VIII, IX və X və XIV qurultaylarına nümayəndə seçilmişdir.

Şöbə müdirinin müavini vəzifəsində təcrübəli təhsil işçisi, uzun illər şəhər təhsil şöbəsində müxtəlif vəzifələrdə işləmiş, pedaqoji ictimaiyyət və valideynlər arasında nüfuz qazanmış, ixtisasca riyaziyyat müəllimi ***Elxan Soltan oğlu Abdullayev*** işləyir. E.Abdullayev bu vəzifəyə dövlət qulluğu xətti ilə müsabiqə yolu ilə seçilmişdir.



*Abdullayev Exlan Soltan oğlu* 1961-ci ildə Şəki şəhərində ziyalı ailəsində anadan olmuşdur. 1977-ci ildə orta məktəbi, 1982-ci ildə Bakı Dövlət Universitetinin mexanika-riyaziyyat fakültəsini bitirmişdir.

E.Abdullayev əmək fəaliyyətinə Şəki şəhər 10 nömrəli məktəbdə başlamış, 1987-ci ildə Şəki ŞTŞ-nə məktəblər üzrə inspektor vəzifəsinə irəli çəkilmiş, son iki ildə şəhər 10 nömrəli məktəbdə direktor vəzifəsində işləmişdir. 2003-cü ildə keçirilən Azərbaycan müəllimlərinin XII qurul tayının iştirakçısı olmuşdur.

Təhsil şöbəsi yanında **Metodiki kabinet** fəaliyyət göstərir. Metodik kabinetdə 17 nəfər metodist təhsil müəssisələrinə metodiki xidmət göstərir. Metodistlərin 14 nəfəri tam, 3 nəfəri 0,5 ştat vahidi üzrə işləyirlər.

Metodik kabinetdə Azərbaycan dili və ədəbiyyat (G.Salamova), tarix (E.Məhərrəmova), riyaziyyat (X.İsmayılova), informatika (A.İslamova), rus dili və ədəbiyyatı (İ.Mustafayeva), ingilis dili (A.Məmmədova), coğrafiya (M.Qədirov), biologiya (N.Səfərova), tərbiyə işinin istiqamətləndirilməsi (R.Rəşidov), GÇQH və bədən tərbiyəsi (A.Məmmədov), ibtidai sinif (Ç.Mustafayeva, A.Yüsiıfova), məktəbəqədər müəssisələr, (G.İsmayılova, Z.İmamova)

məktəb kitabxanaları (T.Əsgərova), psixoloq (Ə.Mustafayeva) ixtisasları, TİMS (T.Səfərov) üzrə metodistlər fəaliyyət göstərirlər.

Metodik kabinetə ixtisasca fizika müəllimi, maarif işinin təşkilatçılarından olan **Firəngiz Boris qızı İbrahimova** rəhbərlik edir.

***F.B.İbrahimova*** 1952-ci ildə Şəki şəhərində anadan olmuşdur. 1969-cu ildə Şəki şəhər 2 nömrəli məktəbi, 1975-ci ildə Bakı Dövlət Universitetinin fizika fakültəsini bitirmişdir. O, 1975-2001-ci illərdə şəhər 7 nömrəli məktəbdə müəllim işləmiş, məktəb komsomol təşkilatına rəhbərlik etmişdir. F.İbrahimova 1980-ci ildə ÜİLKGİ MK-nin Fəxri Fərmanı ilə təltif olunmuş, 1981-ci ildə komsomolçu və gənclərin Ümumittifaq sosializm yarışının qalibi olmuşdur.



F.İbrahimovanın tədrisdə əldə etdiyi nailiyyətlər, təşkilatçılıq qabiliyyəti diqqətdən yayınmamış, 1985-ci ildə Şəki şəhər təhsil şöbəsinə metodist vəzifəsinə irəli çəkilmiş, 1987-ci ildə yeni yaradılmış metodkabinetə müdir təyin olunmuşdur. 1987-ci ildə şəhər və rayon təhsil şöbələri birləşdirildikdən sonra metodkabinetin müdir müavini olmuş, 2004-cü ildən metodkabinetin direktoru vəzifəsində çalışır.

F.İbrahimova 1989-cu ildə Azərbaycan Respublikası Pedaqoji Cəmiyyətinin IV qurultayının, 1998-ci ildə Azərbaycan müəllimlərinin XI, 2003-cü ildə XII qurultayının nümayəndəsi olmuşdur. Firəngiz müəllimə 2003-cü idə «Vektor» Beynəlxalq Elm Mərkəzi Mükafat Komissiyasının qərarı ilə *«Azərbaycanın Tanınmış Maarifçiləri»* Beynəlxalq layihəsinin qalibi olmuş, «XXI əsrin Tanınmış Maarifçisi» Beynəlxalq diplomu ilə təltif olunmuş, «Vektor» Beynəlxalq Elm Mərkəzinin «Azərbaycanın Tanınmış Maarifçiləri» ensiklopediyasına daxil edilmişdir.

Metodik kabinet öz fəaliyyətində «Azərbaycan Respublikasının Təhsil Qanunu» nu, Azərbaycan Respublikası Prezidentinin və Nazirlər Kabinetinin direktiv sənədlərini, «Ümumtəhsil məktəblərinin nümunəvi Əsasnaməsi»ni, Azərbaycan Respublikası Təhsil Nazirliyinin «Rayon (şəhər) təhsil şöbəsinin metodik kabineti haqqında Əsasnaməsi» ni, Təhsil nazirliyinin əmr, sərəncam və təlimatlarını əsas tutur. Metodik kabinet təlim-tərbiyə müəssisələrini normativ sənədlər, tədris proqramları və planları, metodiki və pedaqoji materiallarla təmin etmiş, vaxtaşırı olaraq işin gedişini yoxlamış, bölmə iclaslarında tədris planı və proqramları, dərsliklərlə bağlı məsələlər geniş müzakirə olunmuş, qarşıda duran vəzifələr müəyyənləşdirilmişdir.

2010/2014-cü tədris ilində Şəki ŞTŞ-nin tabeliyində 98 ümumtəhsil məktəbi fəaliyyət göstərmişdir. Onlardan 72-si tam orta, 22-si ümumi orta, 4 –ü ibtidai məktəb olmuşdur. 96 məktəbdə dərslər Azərbaycan dilində, 2 məktəbdə Azər-

baycan və rus dillərində tədris olunmuşdur. Ümumtəhsil məktəblərinə 22.911 nəfər şagird təhsilə cəlb olunmuşdur.



***Metodik kabinetin direktoru F.İbrahimova inşa yazıları və rəsm müsabiqəsinin yekunlarını müzakirə edir***

Şəki ŞTŞ nəzdində şəhər üzrə 28, rayon üzrə 34 məktəbəqədər təhsil müəssisəsinə metodiki yardım göstərir. Bu müəssisələrdə ***2.500-dən artıq uşağın*** təlim-tərbiyəsi ilə **400 nəfərə yaxın** işçi məşğul olur. Təhsil şöbəsi nəzdində həmçinin 5 məktəbdənkənar müəssisə-Uşaq Yaradıcılıq Mərkəzi, Texniki Yaradıcılıq Mərkəzi, Ekoloji Tərbiyə və Təcrübəçilik Mərkəzi, Uşaq Gənclər İdman Məktəbi, Uşaq Gənclər Şahmat Məktəbi fəaliyyət göstərir və həmin müəssisələrdə ***200 nəfərdən artıq*** pedaqoji işçi çalışır.

Metodiki kabinet məktəbəqədər və məktəbdənkənar müəssisələrin fəaliyyətini daim izləyir, işin təşkilini öyrənmək üçün monitorinqlər keçirilir, həmin müəssisələrin rəhbərlərinin iştirakı ilə görülmüş işlər və yol verilmiş nöqsanlar müzakirə olunur.

Təhsilin məzmununa dair yeniliklər, tədris plan və proqramların təkmilləşdirilməsi istiqamətində aparılan işlər metodik kabinetin diqqət mərkəzindədir. Bu məqsədlə müntəzəm olaraq monitorinqlər keçirilir, nəticələr

ümumiləşdirilərək təhsil şuralarında müzakirə olunur, nöqsanların aradan qaldırılması üçün tədbirlər müəyyənləşdirilir.

2008/2009-cu dərs ilindən ümumtəhsil məktəblərinin **birinci siniflərində kurikulumların** tətbiqinə başlanılmış və bu proses indi də davam edir. Bununla əlaqədar olaraq ibtidai sinif müəllimlərinin fənn kurikulumlarının tətbiqi sahəsində nəzəri və praktik hazırlığını təmin etmək məqsədilə 2011/2012-ci tədris ilində I siniflərdə dərs deyəcək, həmçinin son 3 ildə fənn kurikulumlarının tətbiqi üzrə kursdan keçməyən ibtidai sinif müəllimləri üçün Təhsil Nazirliyinin 29 aprel 2011-ci il tarixli əmri əsasında 8 nömrəli tam orta məktəbdə 10 günlük təlim kursu təşkil olunmuşdur. Mərhələlərlə 6 həftə davam edən kurslardan 200 nəfər müəllim keçmişdir. Təlim kurslarının dərsləri Təhsil nazirliyinin Təhsil Sektorunun İnkişafı üzrə İkinci Layihə çərçivəsində keçirdiyi tenderin qaliblərindən olan «*Yaşlıların təhsili Assosiasiyası*» İctimai Birliyinin əməkdaşları tərəfindən aparılmışdır. 27 iyundan 05 avqusta qədər olan müddətdə təşkil edilən təlim kursu 3 mərhələdə aparılmışdır.

Fənn olimpiadalarına hazırlıq, onların yüksək səviyyədə keçirilməsi metodik kabinetin fəaliyyət istiqamətlərindən biridir. Aparılmış məqsədyönlü işlər təhsil nazirliyinin daim diqqət mərkəzində olmuş, 2009-2010-cu tədris ilində məktəblilərin fənn olimpiadalarına hazırlığı sahəsində Şəki ŞTŞ-də görülmüş işlər nazirliyin Kollegiya iclasında müsbət qiymətləndirilmişdir.

Metodik kabinet Respublika təhsil nazirliyinin *«İxtisasartırma sistemində yeni mexanizmlərə keçid və müəllimlərin təkmilləşdirilməsi işinin təşkili barədə»* 21 fevral 2002-ci il tarixli 164 nömrəli əmr və 1 iyul 2003-cü il tarixli 81 nömrəli kollegiya qərarına istinadən yaradılan dayaq məntəqələrinin fəaliyyətini daim diqqət mərkəzində saxlamış, dayaq məntəqələrinin daxil olduğu baza məktəblərində təşkil edilmiş metodiki guşələr zənginləşdirilmiş, müasir təlim üsullarının tətbiqi ilə keçirilən açıq dərslərin keyfiyyətinin yüksəldilməsi üçün əməli işlər görülmüşdür.

Azərbaycan Respublikası Prezidentinin *«Ən yaxşı ümumi təhsil müəssisəsi» və «Ən yaxşı müəllim»* mükafatlarının təsis edilməsi haqqında 04 sentyabr 2007-ci il tarixli 2373 nömrəli sərəncamı əsasında Təhsil Nazirliyinin 2008-2009-cu tədris ilində keçirdiyi *«Ən yaxşı müəllim»* müsabiqəsində 6 nəfər müəllim *(şəhər 8* nömrəli *tam orta məktəbin riyaziyyat müəllimi Aydın Məmmədov, şəhər 10* nömrəli *tam orta məktəbin ingilis dili müəllimi Ədalət Musayeva və Azərbaycan dili və ədəbiyyatı müəllimi Adilə Məmmədova, şəhər 20* nömrəli *məktəbin tarix müəllimi Rahim Həsənov, H.Əliyev adına Kiş 1* nömrəli *tam orta məktəbin ibtidai sinif müəllimi Dursun Cavadova və Sümayə Abuzərova*) «Ən yaxşı müəllim» müsabiqəsində, şəhər 11 nömrəli məktəb isə «Ən yaxşı ümumtəhsil müəssisəsi» müsabiqəsində iştirak etmişdir. Şəki Şəhər **11** nömrəli **tam orta məktəb** müsabiqənin **qalibi** olmuşdur.

Ekoloji problem müasir dövrün qlobal problemlərindən biridir. Ona görə də, hamının ekoloji biliklərə yiyələnməsi, xüsusən məktəblilərin bu sahədəki biliklərinin zənginləşdirilməsi metodik kabinetin fəaliyyət istiqamətlərindən biri

olmuşdur. Bu məqsədlə şəhər 8 nömrəli məktəbin şagirdlərindən ibarət ***«Təbiət», «Torpaq», «Flora», «Fauna»*** adlı 4 qrupun iştirakı ilə şəhər 10 nömrəli tam orta məktəbdə «Davamlı inkişaf uğrunda» cəmiyyətin «Yaşıl paket» üzrə təmsilçisi, şəhər təhsil şöbəsi metodik kabinetinin direktoru F.İbrahimova ekologiyaya dair açıq dərs təşkil etmişdir.

Qeyd olunanlardan aydın olur ki, metodik kabinet Şəkidə təhsilin səviyyəsinin yüksəldilməsi üçün məqsədyönlü iş aparır və bu işlər bu gün də davam edir.

Təhsil şöbəsində öz işinin ustası olan, pedaqoji ictimaiyyət arasında nüfuz qazanmış inspektorlardan ***Mais Müslümov, Qalib Məmmədov, Bəhyəddin Qüvvətov, Cumay Kərimov, metodistlərdən Məmməd Qədirov, Afər Məmmədova, Gülxar Salamova, Abdurahman Məmmədov, Rəşad Rəşidov*** kimi təhsil işçiləri çalışırlar. **Onlardan bir neçəsinin əmək və pedaqoji fəaliyyəti ilə tanış olaq.**



Şəki ŞTŞ-nin əməkdaşları arasında çoxillik məktəb təcrübəsinə malik Mais Müslümovun öz dəsti-xətti vardır.

***Müslümov Mais Rəcəb oğlu*** 1952-ci ildə Şəki şəhərində anadan olmuşdur. O, 1969-cu ildə şəhər 11 nömrəli məktəbi, 1973-cü ildə Azərbaycan Dövlət Pedaqoji Universitetinin riyaziyyat fakültəsini bitirmişdir. 1973-cü ildə təyinatla Şəki rayonunun Bideyiz kəndində əmək fəaliyyətinə başlayan Mais müəllim 1980-ci ildə irəli çəkilərək Şəki ŞTŞ-nə inspektor təyin olunmuş, 1982-1992-ci illərdə təhsil şöbəsi müdirinin müavini vəzifəsində işləmişdir. Hazırda Şəki ŞTŞ-də inspektor vəzifəsində işləyən Mais Müslümov həm də yaxşı riyaziyyat müəllimi kimi pedaqoji ictimaiyyət arasında böyük nüfuza malikdir. Onun dərs dediyi şagirdlər dəfələrlə Respublika fənn olimpiada larında fəxri yerləri tutmuşlar.

Şəki padaqoji ictimaiyyəti Şəkinin təhsil sütunlarından söz düşəndə öncə Qalib Məmmədovun adını çəkirlər.



***Məmmədov Qalib Məmmədarif oğlu*** 1957-ci ildə Şəki rayonunun Oxut kəndində dünyaya göz açmışdır. 1974-ci ildə Oxut kənd orta məktəbini, 1978-ci ildə Bakı Dövlət Universitetinin riyaziyyat fakültəsini bitirmişdir. 1978-ci ildə Şəkinin Baltalı kənd məktəbində əmək fəaliyyətinə başlayan Qalib müəllim savadına, təşkilatçılıq bacarığına, ən vacibi insanlarla işləmək qabiliyyətinə görə məktəbdə direktor müavini təyin edilmiş, 1982-1985-ci illərdə həmin vəzifədə işləyərkən rayon rəhbərliyinin diqqətini cəlb etmiş, 1985-ci ildə Şəki ŞTŞ-ə inspektor təyin olunmuşdur.

Qalib Məmmədov məktəb müəllimlərin yaxın məsləhətçisi olmaqla yanaşı, həm də fənn olimpiadalarının təşkilatçısıdır. Şəki Şəhər İcra Hakimiyyəti tərəfindən dəfələrlə fəxri fərmanlar və pul mükafatları ilə təltif olunmuşdur.

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 19 yanvar 2004-cü il tarixli 63 № li «Yerli idarəetmə orqanlarında çalışan əməkdaşlara vəzifə adlarının və ixtisas dərəcələrinin verilməsi barədə» əmrinə əsasən Qalib Məmmədova məsləhətçi vəzifəsi və üçüncü dərəcəli dövlət qulluqçusu ixtisas dərəcəsi verilmişdir.



Təhsil şöbəsində məktəb inspektoru işləyən ***Bəhyəddin Şəfayət oğlu Qüvvətov*** 1958-ci ildə Şəki rayonundakı Oxut kəndində anadan olmuşdur. 1965 - 1975-ci illərdə kənd orta məktəbində təhsil aldıqdan sonra, 1975-ci ildə Bakı Dövlət Universitetinin mexanika-riyaziyyat fakültəsinə daxil olmuş, 1980-ci ildə ali məktəbi bitirərək Şəki rayonundakı Cəyirli kənd məktəbində riyaziyyat müəllimi kimi əmək fəaliyyətinə başlamışdır. 1980-ci ilin noyabr ayından rayonun Daşüz kənd məktəbində fəaliyyətini davam etdirən B. Qüvvətov az müddətdə özünü yaxşı müəllim kimi göstərmiş, 1982-ci ildə həmin məktəbdə təlim-tərbiyə işləri üzrə direktor müavini təyin olunmuşdur. On il direktor müavini vəzifəsində işləyən Bəhyəddin müəllim özünü həm yaxşı təşkilatçı, həm də müəllim kimi göstərmiş, onun fəaliyyəti rayonun rəhbər orqanlarının diqqətini cəlb etmiş və 1992-ci ildə Şəki Şəhər Təhsil şöbəsinə metodist vəzifəsinə irəli çəkilmişdir. Təhsil şöbəsində əvvəlcə dərslik fondu və riyaziyyat fənni üzrə, sonra isə «Gənclərin çağırışaqədərki hazırlığı» üzrə metodist vəzifələrində çalışmış, 2005-ci ildən hal-hazıradək məktəb inspektoru vəzifəsində işləyir.

B.Qüvvətov fənninin ustasıdır. Onun şagirdləri ənənəvi olaraq olimpiadaların qalib olmuşlar. Öz üzərində müntəzəm işləyir, xidmət etdiyi məktəblərin fəaliyyətinin təkmilləşdirilməsində fəal iştirak edir.



Şəki müəllimləri ŞTŞ-də metodist işləyən *Məmməd Qədirovu* fəal ictimaiyyətçi, yaxşı biologiya-coğrafiya müəllimi kimi tanıyırlar.

**Qədirov Məmməd Cabbar oğlu** 1955-ci ildə Şəki şəhərində anadan olmuşdur. 1971-ci ildə Şəkidəki 12 nömrəli məktəbi bitirmiş, Şəki İpək kombinatında fəhləlik etmiş, 1977-ci ildə Azər baycan Dövlət Pedaqoji Universitetinin biologiya-coğrafiya fakültəsini bitirmişdir. 1985-ci ildən Şəki ŞTŞ-də metodist kimi fəaliyyətini davam etdirən Məmməd müəllim 1988-ci ildən şöbə həmkarlar

təşkilatının sədri kimi ictimai işin öhdəsindən ləyaqətlə gəlir.

M.Qədirov məktəblilərin yaxın dostudur. TQDK-nın Şəki şəhəri üzrə məhsul katibi olan Məmməd Qədirov ali məktəblərə ixtisas seçimində şagirdlərə məsləhətlər verir, onların peşələrə istiqamətləndirilməsində fəal iştirak edir.

Şəkinin maarif işçiləri içərisində şairlik təbii ilə seçilən, öz işinin bilicisi, sözü ilə işi bir olan Cumay Kərimov xüsusi hörmətə malikdir.



***Kərimov Cumay Zahid oğlu*** 1949-cu ildə Şəkinin qədim Kiş kəndində anadan olmuşdur. 1966-cı ildə orta məktəbi, 1974-cü ildə ADPİ-nin (indiki ADPU) riyaziyyat fakültəsini bitirmişdir. Təyinatla Zaqatala rayonunun Maqov kəndində əmək fəaliyyətinə başlayan Cumay Kərimov 1974-1977-ci illərdə həmin kənddə riyaziyyat müəllimi işləmiş, 1977-ci ildə Şəki rayonuna qayıtmış, 1986-cı ilə kimi rayon TŞ-də riyaziyyat fənni üzrə metodist, 1986-2004-ci illərdə inspektor, 2004-cü ildən hal-hazıra kimi 3-cü dərəcəli dövlət qulluqçusu, aparıcı məsləhətçi vəzifəsində işləyir.

C.Kərimov davranışı, biliyi, insanlarla ünsiyyət qurmaq bacarığı ilə seçilən pedaqoqlardandır. Yaxşı ailə başçısı olan Cumay müəllim Kiş kəndinin ictimai həyatında fəal iştirak edir.

Şəki ŞTŞ-də işləyən metodistlər arasında işgüzarlığı, fənnini mükəmməl bilməsi, davranışı ilə seçilənlərdən biri də ingilis dili üzrə metodist ***Afər Məmmədovadır.***



*Məmmədova Afər Temurçin qız**ı*** 1960-cı ildə anadan olmuşdur. 1977-ci ildə Şəki şəhər 19 nömrəli məktəbi, 1982-ci ildə Azərbaycan Xarici Dillər İnstitutunu bitirmişdir.

A.T.Məmmədova 1982-1986-cı illərdə 43 nömrəli Şəki Şəhər Texniki Peşə Məktəbində və 11 nömrəli məktəbdə müəllim işləmiş, 1986-cı ildən Şəki ŞTŞ-də metodist vəzifəsində çalışır.

A.Məmmədova Böyük Britaniyanın Kent Universitetinin təşkil etdiyi «Priqim» proqramı üzrə *«Sinif üçün yaradıcı metodologiya»* mövzusunda keçirdiyi 2 həftəlik müəllimləri təkmilləşdirmə kursunun, Azərbaycan İDMB-nin (İngilis Dili Müəllimləri Birliyi (Az ETA) təşkil etdiyi Beynəlxalq və regional konfransların, Sülh Korpusunun təşkil etdiyi «İngilis dilinin tədrisində interaktiv metoddan istifadə», «İngilis dilinin tədrisində incəsənətin rolu», «İngilis dilinin tədrisində dil bacarıqlarının inkişafı» mövzularında keçirilən seminar, treninq və kursların iştirakçısı olmuşdur.

### *3.5.2.1. Nuxanın ilk «rus-tatar» məktəbi – Qoxmuq şkola*

Gürcüstanın Qori şəhərində Müəllimlər Seminariyasının açılması, xüsusi ilə Azərbaycan şöbəsinin təsisi Azərbaycan qəzalarında açılan yeni məktəblərin pedaqoji kadrlarla təmin edilməsində əhəmiyyətli rol oynamışdır. Qori Müəllimlər Seminariyasında oxuyan gənclərin sayının artması səbəbli XIX əsrin 80-ci illərində Zəngəzur qəzasının Qubadlı, Naxçıvan qəzasının Böyük Vedi, Nuxa qəzasının Baş Göynük və Qoxmuq, Gəncə qəzasının Goran, Qara Çinar, Zəyəm, Qazax qəzasının Yuxarı Salahlı və s. yerlərdə çar Rusiyası tərəfindən qəza məktəbləri açılmışdır. Bu məktəblərin üstünlüyü ondan ibarətdir ki, burada ana dili tədrisi məcburi idi, məktəblərdə ***rus dili, riyaziyyat, coğrafiya, şəriət*** və s. dərslər tədris olunurdu.

1882-1884-cü illərdə 6 nəfər şəkili gənc Qori Müəllimlər Seminariyasının Azərbaycan şöbəsini bitirərək Nuxa qəzasına işə göndərilir ki, bunlardan biri də Qoxmuq kəndində açılmış məktəbdə işə başlayır. Sonralar Qori seminariyasını bitirmiş bir çox gənc məzunlar Qoxmuq məktəbində işləmiş, yerli əhalinin savadlanmasında iştirak etmişlər.

Şəki rayonundakı ***Qoxmuq kənd tam orta məktəbi*** tarixə «rus-tatar» məktəbi kimi düşmüşdür. Əhali arasında «**Qoxmuq şkola**» kimi məşhur olan məktəbin əsasının bəzi mənbələrdə 1884-cü ildə, bəzi mənbələrdə, o cümlədən Azərbaycan Respublikası Təhsil Nazirliyinin internet saytında 1889-cu il kimi göstərilmişdir.




М. Н. П.
КАВКАЗ. УЧЕБ. ОКР.
ДИРЕКЦІЯ
НАРОДНЫХЪ ШКОЛЪ
Елисаветп. и Эриван. губ.
СМОТРИТЕЛЬ
КОХМУХСКАГО
УЧИЛИЩА
2 января 910
№ 2

Господину Мировому посреднику 1го отдела Нухинскаго уезда

Имею честь покорнейше просить Ваше Высокородие понудить Кишскаго и Кохмухскаго старшинъ собрать съ жителей вверенныхъ имъ селений деньги въ размере 105 руб. для уплаты за школьное помещение домовладельцу моллъ Ивашину Эфендиеву за истекший 1909 годъ.

Смотритель училища [signature]

***Qoxmuq «rus-tatar» məktəbinin 1910-cu ilə aid ştampının əksi olan məktub***[470]

*Bu məktəb Qafqaz məktəblərinin 1853-cü il Nizamnaməsi ilə təşkil olunmuşdur. Məktəbə birinci dəfə 39 şagird qəbul edilmişdir ki, onların 31 nəfəri azərbaycanlı, 6 nəfəri ləzgi, 2 nəfəri rus olmuşdur. Məktəbə direktor* ***Oruc Hüseynov*** *təyin edilmişdir. Məktəbdə cəmi üç müəllim işləmişdir.*

Qoxmuq məktəbi haqqında arxiv sənədləri çar Rusiyasının Qafqaz canişinliyinin Tbilisi şəhərindəki arxivində saxlanılırdı. Lakin 1992-ci ildə xalq cəbhəsi ilə Gürcüstanın keçmiş prezidenti Qamsaxurdiya tərəfdarları arasında gedən mübarizə zamanı bu sənədlərin yandığı göstərilir.

Əldə olunmuş məlumatlara əsasən Qoxmuq məktəbi Molla İbrahim Məhəmməd oğlu Əfəndiyevin evində yerləşmişdir. Bunu Nuxa qəzasına yazılan 2 yanvar 1910-cu il tarixli məktub təsdiqləyir. Məktubda məktəbin yerləşdiyi binanın sahibinin molla İbrahim Əfəndiyev və icarə haqqının 1909-cu ildə 105 rubl olduğu bildirilirdi.

1912-ci ildə Tiflis quberniyasından **Molla İbrahim Məhəmməd oğlu**nun məktəbdə işləməsi üçün əmr verilmişdir.

Təhsilin inkişafında müstəsna rolu olan pedaqoqlardan biri də, bu gün də yaşlı qoxmuqluların hafizəsində işıqlı şəxsiyyət kimi qalmış, nəinki Qoxmuq kəndinin əhalisinin, həmçinin ətraf kəndlərin də əhalisinin savadlanmasında mühüm rol oynayan və XX əsrin 30-cu illərində məktəbə rəhbərlik etmiş ***Əyyub Abdureyim oğlu Abdureyimov*** olmuşdur.

***Qoxmuq kənd məktəbi 1941-ci ilədək ibtidai, 1958-ci ilədək 7 illik məktəb,*** **1970-1971-ci tədris ilinə qədər 8 illik** məktəb ***kimi fəaliyyət göstərmiş****, 1972-ci ildə orta məktəbə çevrilmişdir*.[471]

Son 15 ildə Qoxmuq kənd məktəbini 477 nəfər bitirmiş, onlardan 74 nəfəri ali təhsil, 70 nəfəri orta ixtisas məktəblərinə qəbul olunmuşlar.

Orta məktəb kimi fəaliyyəti illərində məktəbi bitirmiş məzunların sorağı nəinki respublikamızdan, o cümlədən xarici ölkələrdən gəlir. Məktəbin müəllimlərindən Kamil Eldarov, Həsən Şıxəliyev, Elşad Hacıyeva təlimdə müvəffəqiyyətlər əldə etmişlər.



Hazırda məktəbə təcrübəli pedaqoq ***Umudvar Mürsəl oğlu Daşdəmirov*** rəhbərlik edir.

U.Daşdəmirov 1955-ci ildə Qoxmuq kəndində anadan olmuşdur. 1969-cu ildə kənd məktəbinin VIII sinfini bitirmiş, tam orta təhsilini şəhər 10 nömrəli məktəbdə almışdır. O, 1978-ci ildə Bakı Dövlət Univer sitetinin geoloji coğrafiya fakültəsini bitirmiş, 1978-1982-ci illərdə Qoxmuq kənd məktəbində müəllim, 1982-1990-cı illərdə tərbiyə işləri üzrə direktor müavini, 1990-1991-ci illərdə tədris işləri üzrə direktor müavini, 1991-ci ildən direktor vəzifəsində işləyir.

U.Daşdəmirov kəndin ictimai həyatında fəal iştirak edir, 2 çağırış kənd bələdiyyəsinin üzvü seçilmişdir.



Məktəbin müəllimlərindən söz düşəndə öncə **Elşad İsaq qızı Hacıyevanın adı çəkilir.** E.Hacıyeva 1948-ci ildə Nuxa rayonunun Baş Göynük kəndində anadan olmuşdur. 1966-cı ildə kənd məktəbini bitirən E.Hacıyeva həmin il Nuxa Pedaqoji Məktəbinin ibtidai sinif müəllimi şöbəsinə daxil olmuş, 1968-ci ildə məktəbi bitirərək Qoxmuq kənd məktəbində sinif müəllimi kimi əmək fəaliyyətinə başlamışdır**.** 40 illik pedaqoji fəaliyyəti dövründə Elşad müəllimə şagirdlərin və valideynlərin sevimlisinə çevrilə bilmiş, 1983-cü ildə Azərbaycan SSR Maarif Nazirliyinin Fəxri fərmanı, 1986-cı ildə **«Şərəf nişanı» ordeni** ilə təltif olunmuşdur.

2013-2014-cü tədris ilində məktəbdə 600 nəfərdən artıq şagird təhsil almış, onların təlim-tərbiyəsi ilə 110 nəfər müəllim məşğul olmuşdur ki, onların 60 nəfəri həmin məktəbin məzunlarıdır.

### *3.5.2.2. Şəkinin ikinci «rus-tatar» məktəbi – Baş Göynük kənd 1 nömrəli tam orta məktəbi*

1884-cü ildə Nuxa qəzasının Baş Göynük kəndində «rus-tatar» məktəbi fəaliyyətə başlamışdır. Məktəb sonralar ibtidai, daha sonra yeddiillik məktəbə çevrilmiş, 1939-cu ildə orta məktəb statusu almışdır. Fəaliyyətə başladığı gündən şagirdlərinə əsaslı bilik vermək uğrunda çalışan məktəbin pedaqoji heyəti öz vəzifəsinin öhdəsindən ləyaqətlə gəlmişdir. Sovet hakimiyyəti illərində böyümüş və qabaqcıl məktəblər sırasına daxil olmuşdur. Məktəb fəaliyyəti illərində minlərlə məzuna həyat vəsiqəsi vermiş, onlar Azərbaycanın ictimai-siyasi və mədəni həyatında fəal iştirak etmişlər. Məktəbin yetirmələri-Azərbaycan Respublikası Nazirlər Kabinetinin əməkdaşı Nəsir Məmmədov, Azərbaycan Respublikası Prezidenti Administrasiyasının əməkdaşı Dəyanət Abdullayev, Meliorasiya və Su Təsərrüfatı Komitəsinin sədri Əhməd Əhmədzadə, Azərbaycan MEA Nəsimi adına Dilçilik İnstitutunun əməkdaşı, professor Musa İslamov, AMEA-nın Fizika İnstitutunun əməkdaşı Qərib Camalov, fizika-riyaziyyat üzrə fəlsəfə doktoru İdris Əliyev, Ankara Universitetinin professoru Rafiq Səmədov, BDU-nun əməkdaşı, fəlsəfə üzrə elmlər doktoru, professor Fərman İsmayılov, Azərbaycan Dillər Universitetinin əməkdaşı Vahid Ərəbov tez-tez məktəbin qonağı olur, şagirdlərlə görüşür, kəndin sosial həyatında fəal iştirak edirlər. Məktəbdə öz işinin ustası olan, şagird kollektivinin və valideynlərin hörmətini qazanmış *Mustafa Əhmədiyyə oğlu Məmmədov, Zümrüd Məmməd qızı Zeynalova, Səadət Zahid qızı Rəhimova, Şəkurə Camal qızı Salamova, Sovqat Fərrux qızı Musayeva, Qurban Abakər oğlu Rəhimov,*

*Nəsrullah Süleyman oğlu Kərimov* kimi müəllimlər şagirdlərin təlim-tərbiyəsi ilə məşğul olurlar.



Göynük mahalında riyaziyyatçı kadrların yetişmə sində xüsusi əməyi olan müəllimlərdən biri ***Mustafa Əhmədiyyə oğlu Məmmədovdur. O, 1924-cü ildə Baş Göynük kəndində anadan olmuşdur. 1941-1945-ci illər sovet-alman müharibəsi cəbhələrində göstərdiyi igidliyə görə orden və medallarla təltif olunan M.Məmmədov cəbhədən qayıtdıqdan sonra təhsilini artırmağı unutmamış, 1950-ci ildə ADPU-nun riyaziyyat fakültəsini bitirmişdir. Məktəblilərin təlim-tərbiyəsi sahəsində qazandığı nailiyyətlərə görə Mustafa müəllim 1982-ci ildə «Qırmızı Əmək bayrağı» ordeni ilə təltif olunub.***

Baş Göynük kənd 1 № li tam orta məktəbinin 2004-cü ildə 120 yaşı tamam olmuşdur. Azərbaycan Respublikası Təhsil Nazirinin 08.12. 2004-cü il tarixli əmri ilə məktəbin 120 illik yubileyi qeyd olunmuş, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev 28 may 2005-ci tarixli 1/277 №li məktubla məktəbin şagird və müəllim kollektivini təbrik etmişdir. 120 illik yubiley münasibəti ilə Azərbaycan Respublikasının Təhsil naziri M.Mərdanovun əmri ilə *Qurban Rəhimov «Qabaqcıl təhsil işçisi»* döş nişanı, *M.Məmmədov, S.Kərimov, G.Musayeva, Ş.İmamov, S.Məmmədova nazirliyin Fəxri fərmanı* ilə təltif olunmuşlar.

2000-2014-cu illərdə Baş Göynük kənd 1 № li tam orta məktəbini bitirmiş məzunlardan 65 nəfəri ali məktəblərə, 70 nəfəri orta ixtisas məktəblərinə qəbul olunmuş, 3 nəfər məzun 600-dən yuxarı bal toplamışdır.



Qocaman təhsil ocağına uzun müddət həmin məktəbin məzunu ***Mahmudov Cuma Muxtar* oğlu** rəhbərlik etmişdir.

C.Mahmudov 1969-cu ildə Baş Göynük kəndində müəllim ailəsində dünyaya göz açmışdır. 1972-ci ildə ADPU-nun filologiya fakültəsini bitirən Cuma müəllim əmək fəaliyyətinə doğma məktəbində başlamış, müəl limlik peşəsinin sirlərini səbrlə öyrənmişdir. Onun peşəsinə vurğunluğu, ixtisasını təkmilləşdirmək məqsə dilə daim öz üzərində çalışması, təşkilatçılıq qabiliyyəti rayon rəhbərliyinin diqqətindən yayınmamış, 2004-cü ildə məktəbə direktor təyin olunmuşdur. Onun rəhbərliyi dövründə məktəbdə təlimin keyfiyyətinin yaxşılaşdırılması, qabaqcıl təcrübənin öyrənilməsi və tətbiqi sahəsində əməli işlər həyata keçirilmiş, məktəb məzunlarının ali və orta ixtisas məktəblərinə qəbulunda əsaslı dönüş yaranmışdı.

C.Mahmudov 2004-cü ildə *«Qabaqcıl təhsil işçisi»* döş nişanı ilə təltif olunmuşdur.

Hazırda məktəbə İbrahimov Sadəddin Salam oğlu rəhbərlik edir.

### *3.5.2.3. Nurpaşa müəllimin məktəbi – Oxut kənd tam orta məktəbi*

***Oxut kəndi*** **Şəkinin qədim kəndlərindən biridir.** Əvvəllər kənddə molla məktəbi fəaliyyət göstərmişdir. Həmin zamanlarda uşaqlara dərs deyən müəllim-lər-ruhanilər tam savadlı olmaqla yanaşı, həm də ərəb və fars dillərini mükəmməl bilirdilər. Onların əksəriyyəti «Qurani-Kərim» in surələrindəki ayələrin hamısını Azərbaycan dilində sərbəst olaraq şərh etməyi bacarırdılar. Sonralar, yəni Azərbaycanda sovet hakimiyyəti qurulandan sonra kənddə fəaliyyət göstərən molla məktəbi yeni üsulla tədrisə başlayan məktəblə əvəz olunur. Bu məktəbin sinifləri məsciddə yerləşdirilir. Kəndin əhalisinin sayı çoxaldıqca, onların övladlarının oxuduğu ibtidai məktəb darısqallıq edir. Bu vəziyyət 1926-cı ilə qədər davam edir. Ayrı-ayrı evlərdə və kiçik məsciddə dərs deyilmə hallarına son qoymaq üçün kənd camaatı yeni məktəb binası inşa etdirmək qərarına gəlir. Kəndin sözükeçən adamlarının məsləhəti və köməyi ilə kəndin «Duluzlar» deyilən məhəlləsində məktəb binasının tikilməsi işinə başlanılır və kənd sakinləri bir nəfər kimi məktəb binasının tikintisində iştirak edirlər. Ehtimala görə, məktəb binasının tikintisinə səbəb olan şəxslərin adı və soyadları yazılmış siyahı şüşə butulkada binanın bir küncünə qoyulmuş, çaydaşı və bişmiş qırmızı kərpiclə hörülmüşdür. Bina tikintisi tezliklə başa çatsa da, onun örtük hissəsi yarımçıq qalır. Elə həmin ildə Səmədağa Ağamalıoğlu Nuxaya gəlir. Kəndin ziyalıları S.Ağamalıoğlu ilə görüşdə məktəb binasının üstünü örtmək üçün ondan kömək istəyirlər. Az sonra məktəb binası hazır olur və 1926-cı il sentyabr ayının 1-dən 7 illik məktəb, sonralar orta məktəb kimi fəaliyyət göstərir.

Kənddə şəraitin yaxşılaşması, əhali sayının artması səbəbli yeni məktəb binasına ehtiyac yaranır və yeni ikimərtəbəli məktəb binası tikilir. 1967-ci ildə yeni binaya köçürülmüş orta məktəb bu gün də həmin binada öz fəaliyyətini davam etdirir.

Məktəbə müxtəlif illərdə Mustafa Mustafayev, Lütvəli (soyadı məlum deyil), Əhmədiyyə Hidayətzadə, Fətixə İsmayılzadə, Yusif İsmayılov, Əyyub Yusifov, Vahid Əzimov, Nuru Məmmədov, Nurpaşa Hümmətov, Rafiq Məmmədov, Nazim Hacıhəsənov, Rəsul Rəsulov rəhbərlik etmişlər. Hazırda məktəbin direktoru kəndin tanınmış qocaman müəllimlərindən olan Qəni Abdullayevin oğlu Ülfət Abdullayevdir.



***Oxut kənd tam orta məktəbinin hazırkı binası***

Oxud kənd orta məktəbinin məzunları nəinki Şəkidə, həm də respublikada yüksək vəzifələrdə çalışmışlar. *Bunlardan türkoloq, tənqidçi alim* ***Aydın Məmmədov****, kimya üzrə elmlər doktoru* ***Ələfsər Məmmədov****, Azərbaycan Yazıçılar Birliyi Şəki bölməsinin sədri,* ***şair Vaqif Aslan****, riyaziyyat üzrə fəlsəfə doktorları* ***Nüyvər Nəsrullayev, Rəşad Məmmədov****, tarix üzrə fəlsəfə doktoru* ***Səmayə Mustafayeva,*** *psixologiya üzrə fəlsəfə doktoru* ***Məmmədhənifə Musayev****, pedaqogka üzrə fəlsəfə doktorları* ***Nurpaşa Hümmətov və Əsabəli Quliyev****, iqtisadiyyat üzrə fəlsəfə doktoru* ***Müşfiq Feyzullayev****, kənd təsərrüfatı üzrə fəlsəfə doktorları* ***Nəcvəddin Əhmədov və Şəmsəddin Mustafayev****, texnika üzrə fəlsəfə doktorları* ***Məzahir Qədirov, Solmaz Soltanova, Saleh Məmmədov, Çərkəz Yusifov və Niyazi Soltanov****, baytarlıq üzrə fəlsəfə doktoru* ***Əsabəli Hacıyev****, əməkdar müəllimlər* ***Musa Rəcəbov*** *və* ***Aydın Adışirinov****, əməkdar kənd təsərrüfatı işçisi* ***Niyazi Alıyev****, əməkdar mühəndis* ***Məmmədsaleh Əliyev****, əməkdar zootexnik* ***Məmmədəli Salamov,*** *respublika dəmiryol prokuroru olmuş* ***İsmayıl İsmayılov,*** Kür suyunun Bakıya gətirilməsi işinə rəhbərlik etmiş **Əsgər İsmayılov**, Fransa müqavimət hərəkatının iştirakçısı **Əhmədiyyə Cəbrayılov**, onun oğlu, Azərbaycan Respublikasının Milli Qəhrəmanı **Mikayıl Cəbrayılov**,

polkovnik **Araz Salamov, hazırda** Azərbaycan Respublikası Ədliyyə Nazirliyində qrup rəhbəri işləyən **Rəsul Yusifov** və başqaları Oxut kənd orta məktəbinin yetirmələridir.

Oxud kənd məktəbinin şagirdləri təhsil sahəsində uğurlarını davam etdirir, yüksək balla respublikanın, həmçininTürkiyənin ali məktəblərinə qəbul olunurlar. 2009-2010-cu tədris ilində məktəbin məzunlarından N. Süleymanlı (610 bal), N.Cəbrayılova (607 bal), P.Səlimov (604 bal), X. Yusifli, S.Yusifov (601 bal) yüksək bal toplamışlar. Sözsüz ki, bu uğurların əldə olunmasında məktəbin müəllimlərinin əməyi az olmamışdır.



***Hümmətov Nurpaşa Ömər oğlunun*** adı Şəkinin təhsil işçilərinə, o cümlədən respublika pedaqoji ictimaiyyətinə yaxşı tanışdır. Əslində Oxut məktəbindən söz düşəndə «Nurpaşa müəllimin məktəbi» deyimi yada düşür.

1923-cü ildə dünyaya göz açan Nurpaşa müəllim Oxut kənd orta məktəbini və Nuxa Pedaqoji Texnikumunu bitimişdir.

1941-ci ildə hərbi xidmətə çağırılan N.Hümmətov 1943-cü ildə ağır yaralandığına görə ordu sıralarından tərxis olunmuş və pedaqoji fəaliyyətə başlamış, istehsalatdan ayrılmadan Azərbaycan Dövlət Pedaqoji İnstitutuna (indiki ADPU) daxil olmuş, 1954-cü ildə həmin institutun Azərbaycan dili və ədəbiyyatı fakültəsini bitirmiş, müəllim kimi fəaliyyət göstərmişdir.

N.Hümmətov 1969-cu ildən 1985-ci ilədək məktəbin pedaqoji kollektivinə rəhbərlik etmişdir. O,1971-ci ildə «V-VIII siniflərdə Azərbaycan dili dərslərində şagirdlərin rabitəli nitq vərdişlərini inkişaf etdirmək yolları» mövzusunda dissertasiya müdafiə edərək **pedaqogika üzrə fəlsəfə doktoru** elmi dərəcəsi almışdır.

N.Hümmətov 1967-ci ildə Azərbaycan müəllimlərinin I, 1977-ci ildəki II qurultayının nümayəndəsi, gənc yazıçıların III respublika müşavirəsinin iştirakçısı olmuşdur.

O, 250 şer, 150 məqalə, bir çox oçerk və monoqrafiyaların müəllifidir. Oxut kəndinin alim və ziyalılarının yetişməsində onun müəllim kimi böyük əməyi olmuşdur.

**Nurpaşa Hümmətov 1989-cu ildə dünyasını dəyişmişdir.**

Məktəbin qabaqcıl müəllimlərindən biri ***Məmmədov Nuru Abducəlil*** oğludur. 1923-cü ilin yanvar ayında Yelizavetpol quberniyasının Nuxa qəzasının Oxut kəndində yoxsul kəndli ailəsində anadan olmuşdur.

1937-ci ildə VII sinfi bitirərək Nuxa Pedaqoji Texnikumuna daxil olan gənc Nuru 1940-cı ildə texnikumun məktəb şöbəsini bitirərək Balakən rayonunun Meşə-Şanbul kənd ibtidai məktəbinə müəllim göndərilmişdir.

O,1942-ci il yanvarın 30-dan 1945-ci ilin noyabrına qədər hərbi xidmətdə olmuş, Böyük Vətən müharibəsində iştirak etmişdir. Müharibə illərində əvvəlcə

sıravi əsgər, sonra isə zabitlər məktəbində hərbi təhsil alaraq kiçik leytenant



rütbəsi ilə komandir heyətində fəaliyyət göstərmişdir. Müxtəlif cəbhələrdə aparılan döyüşlərdə 3 dəfə yaralanmış, Leninqrad (indiki Sankt-Peterburq) şəhərinin azad edilməsində yaxından iştirak etmişdir. Narva yaxınlığında şiddətli döyüşlərdə fəal iştirakına görə SSRİ Ali Soveti Rəyasət Heyətinin qərarı ilə **«Qırmızı ulduz» ordeninə** layiq görülmüş, «**Qələbə» medalı** və bir sıra yubiley medalları ilə təltif edilmişdir.

Nuru müəllim 1946-1949-cu illərdə Anri Barbus adına Nuxa şəhər 11 №li qızlar məktəbində və toxuculuq texnikumunda hərbi rəhbər vəzifəsində işləmiş, 1949-cu ildə ucqar Əlyar kəndinə ibtidai məktəbə müəllim-müdir vəzifəsinə göndərilmiş, 1951-1966-cı illərdə rayonun müxtəlif kəndlərində müəllim və direktor vəzifələrində fəaliyyət göstərmişdir.

1966-cı ildə Oxut kənd orta məktəbinə direktor təyin edilmiş N.Məmmədov ömrünün sonunadək məktəbdə bir müddət direktor, sonra isə müəllim kimi fəaliyyətini davam etdirmişdir.

**Məmmədov Nuru Abducəlil oğlu 1997-ci il avqust ayının 27-də Oxut kəndində vəfat etmişdir.**



***Qaffarov Əsabəli Məmmədəli oğlu*** Şəkinin say-seçmə müəllimlərindəndir.1921-ci ildə Nuxa rayonu nun Oxut kəndində fəhlə ailəsində anadan olmuş Əsabəli Məmmədəli oğlu kənddə orta məktəbi bitirdikdən sonra Nuxa şəhərindəki Pedaqoji Texnikuma daxil olmuş, 1939-cu ildə Texnikumu bitirərək Oxut kəndindəki orta məktəbdə sinif müəllimi kimi əmək fəaliyyətinə başlamışdır.

1942-ci ildə hərbi xidmətə çağırılan Əsabəli müəllim Qərb cəbhəsində 158-ci xüsusi atıcılıq diviziyasında Berlinə qədər döyüş yolu keçmişdir. Ə.Qaffarov 1944-cü ilin dekabr ayında Vitevsk şəhərinin alınmasında göstərdiyi igidliyə görə **«Qırmızı ulduz» ordeni** ilə təltif olunmuşdur.

Müharibədən sonra Oxut kənd orta məktəbində pedaqoji fəaliyyətini davam etdirən Əsabəli müəllim 1953-cü ildə Nuxa İkiillik Müəllimlər İnstitutunu, sonra isə M.F.Axundov adına Azərbaycan Dillər İnstitutunun rus dili və ədəbiyyatı fakültəsini bitirmişdir. Gənc nəslin təlim-tərbiyəsi sahəsində qazandığı nailiyyətlərə görə 28 iyun 1978-ci ildə «**Lenin» ordeni** ilə təltif olunmuşdur.



Məktəbin adlı-sanlı müəllimlərindən olan *Məmmədov Bəlyar Camal oğlu* 1923-cü ilin may ayında Nuxa rayonunun Oxut kəndində anadan olmuşdur. Kənd 7 illik məktəbində təhsil alan Bəlyar müəllim 1938-ci ildə Nuxa Pedaqoji Texnikumuna daxil olmuş, 1941-ci texnikumu müvəffəqiyyətlə bitirmiş, ordu sıralarına çağırılmış, «Qırmızı bayraq» və «Suvorov» ordenli Zernikovski adına 211-ci atıcı diviziyanın tərkibində I Ukrayna cəbhəsində döyüşlərdə iştirak etmiş, göstərdiyi şücaətə görə orden və medallarla təltif edilmişdir.

1946-cı ildə ordu sıralarından tərxis olunan Bəlyar müəllim 2006-cı ilə qədər - 60 il Oxut kənd orta məktəbində gənc nəslin təlim-tərbiyəsi ilə məşğul olmuşdur. Əmək fəaliyyəti dövründə təhsilini artırmağı yaddan çıxarmayan B.Məmmədov 1951-ci ildə Nuxa İkiillik Müəllimlər İnstitutunun təbiət-coğrafiya, 1961-ci ildə APİ-nin (indiki ADPU) təbiət şöbəsini qurtarmışdır.

1958-ci ildən 1985-ci ilə qədər Oxut kənd orta məktəbində təlim-tərbiyə işləri üzrə direktor müavini işləmiş II qrup müharibə əlili B.Məmmədov 2006-cı ildən təqaüdə çıxmışdır. hazırda ***Prezident təqaüdçüsüdür.***

*Oxut tam orta məktəbi bu gün də fəaliyyəti ilə Şəkinin məktəblərinə nümunədir.*

### *3.5.2.4. Yaşı minilliklərə çatan Kişin şöhrətli məktəbi*

Azərbaycan Respublikasının Prezidenti, ümummilli lider H.Əliyev 2002-ci ildə Şəkiyə səfər edərkən Kiş kənd 1 nömrəli orta məktəbinin direktoru M.Qarayev Prezidentin ziyalılarla görüşündə kənddə məktəb tikintisi məsələsini qaldırmış, ümummilli lider onun təşəbbüsünü bəyənmiş və məktəb tikintisi haqqında göstəriş vermişdir. Kiş kəndində 640 yerlik məktəb binası 10 may 2005-ci ildə istifadəyə verilmişdir. Kiş kənd sakinlərinin çoxsaylı müraciətinə əsasən məktəbə H.Əliyevin adı verilmişdir. 2006-cı ilin aprel ayının 13-də Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev və H.Əliyev Fondunun Prezidenti, YUNESKO-nun xoşməramlı səfiri, «Yeniləşən Azərbaycana yeni məktəb» layihəsinin təşəbbüsçüsü Mehriban xanım Əliyeva Kiş kənd 1 nömrəli orta məktəbdə olmuş, H.Əliyevin məktəbdəki abidəsi önünə əklil qoymuş, məktəbdən xoş təəssüratla ayrılmışlar.



Kişlilər məktəb tikintisinin təşəbbüsçüsü Müzəkkir Qarayevi hörmətlə xatırlayırlar.

***Qarayev Müzəkkir Seydi oğlu*** 1944-cü ildə anadan olmuşdur. Əsas təhsilini Kiş əsas məktəbində, orta təhsi-

lini Oxut kənd orta məktəbində almış, 1962-cı ildə Nuxa Pedaqoji texnikumunu bitirmiş, təyinatla Bərdə rayonunun Xanərəb kənd məktəbində əmək fəaliyyətinə başlamış, 1964-cü ildən Nuxa rayonundakı Çay Qaraqoyunlu kənd məktəbində pedaqoji fəaliyyətini davam etdirmişdir.

M.Qarayev 1970-ci ildə ADPİ-nin (indiki ADPU) kimya fakültəsini bitirmişdir. Ömrünü Kiş kənd məktəbi ilə bağlayan Müzəkkir müəllim 1988-ci ildə həmin məktəbə direktor təyin olumuşdur.

Şəkidə Qarayevlər nəslini tanımayan yoxdur. Bu nəsli müəllimlər sülaləsi də adlandıranlar vardır. Almaz Qeysər qızının ürək yanğısı ilə qələmə aldığı *«Mənəviyyatımızın memarları»* adlı kitabında sülalənin pedaqoji stajının 873 il olduğu qeyd edilmişdir. İstedadlı jurnalistin kitabında qeyd edilir ki, nəslin ağsaqalı Hacı İsaq Əfəndi Qarayev din xadimi olmuşdur. Dövrünün savadlı və işıqlı insanlarından olan H. Qarayev Türkiyədə təhsil almış, Kiş kəndinə qayıtdıqdan sonra əhalinin gücü ilə məktəb inşa etdirmiş, əhalinin savadlanmasına səy göstərmişdir. İsaq əfəndinin qardaşı Hüseyn Qarayev Kişdə tikilmiş məktəbə uzun müddət rəhbərlik etmişdir. Qardaşı Məmməd də dövrünün işıqlı ziyalılarından olmuşdur. Əmək fəaliyyətinə Göyçayda başlayan M.Qarayev və həyat yoldaşı Xədicə xanımı göyçaylılar xoş xatirələrlə yad edirlər. Onların övladları Fatma Oxut, Zivər isə Kiş kəndində valideynlərinin yolunu davam etdirmişlər.

Fatma Qarayevanın həyat yoldaşı Əyyub Yusifov «Azərbaycan SSR əməkdar müəllimi» fəxri adına layiq görülmüşdür.

Müzəkkir Qarayev fəal ictimaiyyətçi olmaqla yanaşı, həm də təcrübəli və yaradıcı pedaqoq olmuşdur. Onun respublikanın nüfuzlu jurnallarında məqalələri dərc olunmuş, iş təcrübəsi rayonda və respublikada yayılmışdır. «Qabaqcıl maarif xadimi», «SSRİ maarif əlaçısı» döş nişanları ilə təltif olunan M.Qarayev 2003-cü ildə Respublika müəllimlərinin XI qurultayının iştirakçısı olmuşdur.

Kiş kənd 1 nömrəli tam orta məktəb 2013-2014-cü tədris ilini müvəffəqiyyətlə başa vurmuşdur. Məktəbin XI sinfini bitirən məzunlardan **yarısı** ali və orta ixtisas məktəblərinə daxil olmuşlar**. Ümumiyyətlə,** 2001-2014-ci illərdə məktəbin məzunu olmuş **800 nəfərə yaxın şagirddən 300** nəfərə yaxını ali və orta ixtisas təhsili alaraq respublikamızın sosial-iqtisadi və mədəni həyatında səmərəli fəaliyyət göstərirlər**.**

XXI əsrin sayılıb-seçilən şairlərindən olan Vaqif Aslan Kiş kəndində dünyaya gəlmiş və hazırda orada yaşayır.

### *3.5.2.5. Böyük Dəhnə kənd 1 nömrəli tam orta məktəbi*

XX əsrin əvvəllərində Şəkinin bir çox kəndlərində rəsmi məktəblər olmamışdır. Belə kəndlərdən biri də ***Böyük Dəhnə kəndidir***. Yerli sakin İsmayıl Qədirli öz evində məktəb açmış, yeni üsulla dərs vermişdir. 3 il fəaliyyət göstərdikdən sonra kənd əhalisinin köməyilə məktəb üçün bina tikilmiş və 1914-cü ildə tədrisə başlanmışdır. Məktəbdə ana dili, hesab, tarix, coğrafiya, təbiət fənləri tədris olunmuşdur. Bu məktəb 4 il qeyri-rəsmi fəaliyyət göstərdikdən

sonra Nuxa şəhər maarif işçilərinin köməyi ilə rəsmi məktəbə çevrilmiş və məktəbə ***İsmayıl Qədirli*** direktor təyin olunmuşdur.



***Şəkildə: oturanlardan solda birinci İsmayıl Qədirli***

İsmayıl Qədirli dövrünün işıqlı şəxsiyyətlərindən olmuşdur. O, ilk ibtidai təhsilini 1894-cü ildə mollaxanada almış, 5 il oxuduqdan sonra Nuxada təhsilini davam etdirmiş, ərəb və fars dillərini mükəmməl öyrənmişdir. 1907-ci ildə Türkiyəyə gedən İsmayıl Qədirli İstanbul Darülfununa daxil olmuş, 1911-ci ildə doğma kəndinə qayıtmışdır. İsmayıl Qədirli 1911-ci ildən ömrünün sonunadək-1948-ci ilədək Böyük Dəhnə, Kiçik Dəhnə, Suçma kəndlərində müəllimlik etmişdir.



İsmayıl Qədirlinin məktəbində təhsil alan məzunlardan biri də ***Kərəm Əbdürrəhimov*** olmuşdur. İlk təhsilini kənd məktəbində alan K.Əbdürrəhimov 1936-cı ildə ADPİ-nin (indiki ADPU) tarix fakültəsini bitirmiş və orada elmi-pedaqoji fəaliyyətini davam etdirmişdir. «Azərbaycan xalqının Roma işğalçılarına qarşı mübarizəsi» mövzusunda dissertasiya müdafiə edən Kərəm Əbdürrəhimov 1950-ci ildə qəflətən vəfat etmişdir.

Hazırda Böyük Dəhnə kəndində iki məktəb fəaliyyət göstərir. Kənd məktəbinin məzunlarından biri, fəlsəfə üzrə fəlsəfə doktoru, hazırda millət vəkili olan Cavanşir Feyziyev 2 nömrəli məktəb üçün yeni məktəb binası inşa etdirmişdir.

### *3.5.2.6. Orta Zəyzid kənd 1 nömrəli tam orta məktəbi*

Məlumatlara görə, 1920-ci ildə Orta Zəyzid kəndində «Aşağı məhəllə» adlanan hissədə kiçik bir binada mollaxana açılmışdır. 1926-cı ildə həmin binada ibtidai siniflər, kəndin yuxarı hissəsində isə I və II siniflər fəaliyyət göstərmişdir. Bir neçə il davam edən tədrisdən sonra kənddə natamam orta məktəbin yaradılmasına ehtiyac duyulmuşdur. Beləliklə, 1930-cu ildə məktəb natamam orta məktəbə çevrilmiş və Kərəm Əsgərov məktəbə direktor, Nurməmməd Məmmədov müavin təyin edilmişlər. Yeni məktəbin cəmi 5 sinifi və bir müəllimlər otağı olmuşdur. Həmin ildə kənddə uşaq bağçası da fəaliyyətə başlamışdır.

Məktəb haqqında materiallarla tanışlıq göstərir ki, hər sinifdə 12-16 uşaq olmuş, 7-ci sinfi bitirən uşaqlar Nuxa şəhərindəki pedaqoji, tibb və kənd təsərrüfatı texni -kumlarında təhsillərini davam etdirmişlər.



***Zəyzid kənd 1 № li tam orta məktəbin binası***

1940-1941-ci dərs ilində Orta Zəyzid məktəbində 8-ci sinif, 1941-1942-ci tədris ilində IX sinif açılmışdır. Lakin müharibənin başlanması ilə əlaqədar olaraq məktəb yenidən 7 illik məktəbə çevrilmişdir.

Hazırkı məktəb binasının təməli 1932-ci ildə qoyulmuşdur. 10 il ərzində tikilən məktəb 1942-ci ildə 7 illik məktəb kimi istifadəyə verilmişdir. Məktəbin direktoru Hüseyn Ağayev, müavini Yaqub Əzimov, müəllimlər Əliqulu Quliyev, Əsgər Məmmədov, Həbibə Səttarova, Məmməd Teymurov və başqaları olmuşlar. 1945-ci ildə məktəbə Yaqub Əzimov rəhbərlik etmişdir. 1951-ci ildə məktəb orta məktəbə çevrilmiş və VIII sinif açılmışdır.



***Əzimov Yaqub Əhməd oğlu** **1915-ci ildə Nuxa rayonunun Zəyzid kəndində anadan olmuşdur. Çox çətinliklə kənddə ibtidai təhsil alan Y.Əzimov Nuxa Pedaqoji məktəbinə daxil olmuş, 1932-ci ildə ibtidai sinif müəllimi kimi kənddə əmək fəaliyyətinə başlamışdır. Bir müddət Orta Zəyzid və Vərəzət kəndlərində müəllim işlədikdən sonra Y. Əzimov 1936-1940-cı illərdə Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU) Dil-ədəbiyyat fakültəsində təhsilini davam etdirmiş, 1940-cı ildə təyinatla Masallı rayonuna göndərilmişdir.***

***Y.Əzimov 1941-1943-cü illərdə alman faşistlərinə qarşı mübarizədə iştirak etmiş, döyüşlərin birində ağır yaralandığı üçün arxa cəbhəyə göndərilmişdir. O, 1943-cü ildə Orta Zəyzid kənd orta məktəbində dərs hissə müdiri, müəllim, sonra isə direktor işləmişdir. Ömrünün 45 ilini gənc nəslin tərbiyəsinə həsr etmiş Yaqub Əzimov 1988-ci ildə dünyasını dəyişmişdir.***

Məktəbin birinci buraxılışı 1954-cü ildə olmuş və məktəbi 15 nəfər - *Məmmədova Mədimə, Mustafayev Məsud, Ramazanov Mürsəl, Məmmədov Ziyəddin, Kərimov Qurban, Əbdürrəhimov Əvvəl, Yusifov Əyyub, Əsədov Qurban, İbrahimxəlilov Əyyub, Məmmədova Zümrüd, Xasməmmədov Məhyəddin, Məcidov Abdulbər, Həsənov Yamən, Əhmədov Məmməd, Məmmədov Qüdrət* bitirmişlər.

**1962-1964-ci illərdə** *Abdurrahmanov İzzət*, **1964-1980-ci illərdə** *Abdulsəmədov Əhməd*, **1980-1983-cü illərdə** *Abdulhəmidov Abdulhəmid*, **1983-1987-ci illərdə** *Əzimov Arif* **məktəbdə direktor olmuşlar**.

Orta Zəyzid kənd tam orta məktəbinin müəllimlərindən söz düşəndə kənd əhalisinin və şagirdlərin nəzərində Əhməd Yusifovun portreti canlanır.



***Yusifov Əhməd Məmməd oğlu 1924-cü ildə Orta Zəyzid kəndində anadan olmuşdur. 1930-cu ildə kənddə məktəbin birinci sinfinə daxil olan balaca Əhməd istedadlı şagird olduğundan II sinifdən IV sinfə keçirilmişdir. Kənd məktəbini bitirən Ə.Yusifov Nuxa Pedaqoji məktəbinə daxil olmuş, 1940-cı ildə məktəbi bitirərək qonşu Vərəzət kənd məktəbində müəllimlik fəaliyyətinə başlamışdır. Lakin müharibənin başlanması ilə bütün sahələrdə olduğu kimi, təhsil sahəsində də çətinliklər yaranmış, öz həmkarları kimi Əhməd müəllim də 1942-ci ildə 18 yaşında orduya səfərbərliyə alınmışdır. 1946-cı ilə kimi Baltik donanmasında xidmət keçən Ə.Yusifov Leninqradın (indiki Sankt-Peterburq şəhəri) müdafiəsində ağır döyüşlərdə iştirak etmişdir. II dərəcəli «Vətən müharibəsi», «1941-1945-ci illər Böyük Vətən müharibəsində Almaniya üzərində qələbəyə görə», «Leninqradın müdafiəsinə görə», «1941-1945-ci illər Vətən müharibəsinin 50 illiyi» medalları ilə təltif olunmuşdur.***

***1946-cı ildə ordudan tərxis olunan Ə.Yusifov doğma kəndinə qayıtmış və 40 il Orta Zəyzid kənd orta məktəbində tədris işləri üzrə direktor müavini işləmişdir.***

***Ə.Yusifov işlədiyi müddətdə təhsilini artırmağı yaddan çıxarmamışdır. O, 1953-cü ildə Nuxa İkiillik Müəllimlər İnstitutunu, 1957-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU) tarix fakultəsini qiyabi yolla bitirmişdir.***

***Əhməd Yusifovun əmək cəbhəsindəki fəaliyyəti yüksək qiymətləndirilmişdir. O, «Qabaqcıl maarif xadimi» döş nişanı, Azərbaycan Respublikası Təhsil Nazirliyinin Fəxri Fərmanları və «Qırmızı Əmək Bayrağı» ordeni ilə***

***təltif olunmuşdur. Azərbaycan müəllimlərinin IV, V və VII qurultayının nümayəndəsi olan qocaman maarif işçisi Ə.Yusifov 2004-cü ildə vəfat etmişdir*.

Orta Zəyzid kənd 1 nömrəli tam orta məktəbinə 1987-ci ildən **Əli Rəsulov** rəhbərlik edir.



***Rəsulov Əli Allahverdi oğlu*** *Orta Zəyzid kənd orta məktəbinin məzunudur. 1954-cü ildə həmin kənddə anadan olan Əli müəllim 1971-ci ildə kənd məktəbini, 1980-ci ildə M.F.Axundov adına Rus dili və Ədəbiyyatı İnstitutunu bitirmişdir. Təyinatla Daşkəsən rayonunda pedaqoji fəaliyyətə başlayan Ə.Rəsulov Təzəkənd orta məktəbində bir il müəllim, 1981-ci ildən Daşkəsən şəhər maarif şöbəsində inspektor işləmişdir. 1985-ci ildə Şəkiyə qayıdan Ə.Rəsulov Mərkəzi Müəllimləri Təkmilləşdirmə İnstitutunun Şəki filialında kabinet müdiri işləmiş, 1987-ci ildə Orta Zəyzid kənd orta məktəbinə direktor təyin olunmuşdur. Ə.Rəsulov kənd ictimaiyyətinin nüfuzunu qazana bilmişdir. Kənd bələdiyyəsinin üzvü olan Əli müəllim bir sıra qəzetlərin redaksiya heyətinin üzvüdür.*

Orta Zəyzid kənd orta məktəbi müstəqillik illərində yüksək nailiyyətlər qazanmışdır. Məktəbin məzunları respublikanın siyasi, elmi və mədəni həyatında fəal iştirak edirlər.

### *3.5.2.7. 2010/2011-ci tədris ilinin «Ən yaxşı ümumi təhsil müəssisəsi»*

Şəkinin Qışlaq adlanan hissəsində əsası 1923-cü ildə qoyulmuş ***11 nömrəli məktəb*** yerləşir. Məktəbin tikintisinin başlanması haqqında şəhər əhalisi arasında müxtəlif rəvayətlər vardır. Nəql edirlər ki, şəhərin imkanlı şəxslərindən İsmayıl Hacıkərim oğlu, Həsən Cabbar oğlu və Rəsul Hacıabdulla oğlu şəhər rəhbərliyi qarşısında məktəb tikintisi haqqında məsələ qaldırırlar. Hətta məsələ şəhərin Qışlaq adlanan hissəsində yerləşən 2 ***nömrəli*** baramaaçan fabrikin ümumi yığıncağında da müzakirə olunur. Əslində məsələnin burada müzakirəsi təbii sayılmalıdır. Çünki fabrik indiki 11 nömrəli məktəbin ərazisində yerləşirdi və fabrikin fəhlələrinin əsas hissəsini bu ərazinin insanları təşkil edirdi. Fabrikin fəhlələri müzakirənin gedişində əmək haqqlarının 2%-nin məktəbin tikintisi üçün ayrılması təşəbbüsünü irəli sürürlər. Tezliklə ərazi müəyyənləşdirilir, məktəbin tikinti planı hazırlanır və tikintiyə rəhbərlik «Çopur» ləqəbli Rizvan Lətif oğluna həvalə olunur. Tikintinin aparılması usta Adışirinə tapşırılır. Beləliklə, 1923-cü ildə məktəbin tikintisinə başlanılır. Təsadüfən həmin gün Şəkidə olan Nəriman Nərimanov da təməlqoyma mərasimində iştirak edir. Məktəbin yuxarı hissəsində, orta pəncərənin üstündə yerləşdirilən xüsusi ornamentli «lövhə» bu iştirakın göstəricisidir.

Məktəb 1925/26-cı dərs ilində istifadəyə verilmişdir. Birinci il təqibən 15-16 şagirdlə fəaliyyətə başlayan 11 nömrəli məktəb əvvəllər 7 illik təhsil vermiş, 1937-1938-ci dərs ilində məktəbin birinci buraxılışı olmuşdur. Əvvəllər 7 illik məktəb , 1937-1938-ci dərs ilində tam orta məktəb, **1946-1954-cü illərdə qız məktəbi,** 1955-ci ildən bu günə kimi orta ümumtəhsil məktəbi kimi fəaliyyət göstərir. Məktəbə **Simuzər Hacıyeva, Qurban Abbasov, Məmmədsadıq Naibov, Zahid İbrahimov, Oktay Əhmədov, Asim Həmidov** kimi bacarıqlı pedaqoqlar rəhbərlik etmişlər. İllər keçdikcə şagirdlərin sayı artmış, məzunlar respublikanın bütün bölgələrində işləməyə başlamışlar.

*Fizika-riyaziyyat üzrə elmlər doktoru, professor Qurban Nizaməddin oğlu Cəlilov, kimya üzrə fəlsəfə doktoru, dosent Siracəddin Nizaməddin oğlu Cəlilov, fizika-riyaziyyat üzrə fəlsəfə doktoru Həsən Bəkir oğlu Mustafayev, filologiya üzrə elmlər doktoru, professor, şair, nasir Arif Abdurrəhman oğlu Abdullazadə məktəbin yetirmələridir. Soltan Hümmət oğlu Əzizov, Elxan Məmmədsadıq oğlu İmanov, Bahar Cumay qızı Mustafayeva, Rüfət Yunis oğlu Əhmədov, Rəşad Nurməmməd oğlu Əhmədov,* Şəki Bələdiyyəsinin sabiq sədri *Fikrəm Məmmədov,* Şəki Avtobazasının direktoru *Arzu Əbdürrəhmanov*, Bakı şəhər 5 nömrəli xəstəxananın baş həkimi *Ziya Rəhimov və başqaları məktəbin fəxri məzunlarıdır.*

*Məktəbin məzunları olmuş Hikmət Salmanov, Bilal Məmmədov, Qurban Nəsibov və digərləri hərbiçi kimi şöhrət qazanmış, polkovnik-leytenant rütbəsinədək yüksəlmiş, orden və medallarla təltif olunmuşlar.*

Pedaqoji fəaliyyətə 11 nömrəli məktəbdə başlamış pedaqoqlar – Hüseyn Salehli, Bəxtiyar Məmmədov, Mədinə İsmayılova, İqlimə Əhmədova, Tofiq Qafarov, İdris Surxayev, Mustafakamal Allahverdiyev və b. sonralar rəhbər vəzifələrə irəli çəkilmişlər.

Məktəbin məzunlarından 6 nəfəri Qarabağ döyüşlərində şəhid olub, 2 nəfəri itkin düşmüşdür.

Azərbaycan Respublikası Prezidentinin təhsilin davamlı inkişafını təmin etmək üçün təsdiq etdiyi Dövlət Proqramlarına əsasən məktəbin əsas binasının istilik sistemi yenidən qurulmuş, İKT ilə təminat proqramına əsasən məktəbə 24 kompüter, 1 proyektor, 1 netbuk, 2 çap aparatı verilmişdir. Təhsil sisteminin informasiyalaşdırılması proqramına əsasən məktəb sürətli internetə (ADSL) qoşulmuş, elektron dərs vəsaitləri ilə təmin olunmuşdur.

Şagirdlər həm məzmun, həm poliqrafik cəhətdən müasir tələblərə cavab verən pulsuz dərsliklərlə təmin olunmuş, məktəb kitabxanası dünya və Azərbaycan ədəbiyyatından 229 adda nümunələrlə, 6 adda antologiyalarla, 10 adda lüğət, 18 adda «Ayna» uşaq ensiklopediyası və Azərbaycan ensiklopediyası ilə zənginləşdirilmişdir.

Məktəbin şagirdləri respublika olimpiadalarında və müsabiqələrdə iştirak etmiş, mükafata layiq yerlər tutmuşlar***. Bunlar aşağıdakılardır.***

1.**Hadizadə Abduləli**- «Xüsusi istedada malik uşaqların yaradıcılıq potensialının inkişafı üzrə Dövlət Proqramı» - riyaziyyat fənni – I yer – 2008 – ci il

2.**Pərvin İmanverdiyeva** -«Ana dilimizi sevək, sevdirək» şeir kateqoriyası – I yer – qızıl medal – 2009– cu il

3.**Lətifli Musa** -«Gənc kompüter istedadları» III yer – 2009– cu il

4.**Hadizadə Abduləli**-«Xüsusi istedada malik uşaqların yaradıcılıq potensialının inkişafı üzrə Dövlət Proqramı» - riyaziyyat fənni – I yer – 2009– cu il



***11 №li məktəbin həyətindən görünüş***

5..**İsgəndərli Nərmin**-Fənn olimpiadası – tarix fənni – III yer –2009– cu il

6.**Cəfərova Esmira** - «Xüsusi istedada malik uşaqların yaradıcılıq potensialının inkişafı üzrə Dövlət Proqramı» - riyaziyyat fənni – II yer – 2010– cu il; «Xüsusi istedada malik uşaqların yaradıcılıq potensialının inkişafı üzrə Dövlət Proqramı»- biologiya fənni – III yer – 2010– cu il

7.**Aslanlı Aytən** - İNEPO-EUROASİA Beynəlxalq Layihə Olimpiadası-Neft Şirkətinin xüsusi mükafatı

8.**Əhmədli İlahə** -İNEPO-EUROASİA Beynəlxalq Layihə Olimpiadası – Neft Şirkətinin xüsusi mükafatı



***Şagirdlər informatika kabinetində***

Məktəbdə şagirdlərin hərbi-vətənpərvərlik tərbiyəsi diqqət mərkəzindədir. Məktəbin şahinləri zona turunda II yerə çıxmışlar.




*«Şahin» hərbi idman oyunları -zona turu – II yer – 2010*

İlin «Ən yaxşı ümumi təhsil müəsisəsi» olmuş 11 nömrəli məktəbdə 2010-2011-ci tədris ilində 54 sinif komplektində 1.010 nəfər şagird təhsil almışdır. Onların təlim-tərbiyəsi ilə 147 nəfər müəllim məşğul olmuşdur. Müəllimlərin 60 % ali, 40 % orta ixtisas təhsillidir. Müəllimlərin 92 %-ni qadınlar təşkil edir.

Məktəbin məzunları son üç ldə yüksək balla respblikanın nüfuzlu ali məktəblərinə qəbul olunmuşlar. Uğurların qazanılmasında məktəbin direktoru ***Ədalət Sədiyevanın*** **əməyi böyükdür.**

## *3.5.2.8. Qocaman təhsil ocağı - Şəki şəhər 10 nömrəli tam orta məktəb*

Şəkinin qocaman tədris ocaqlarından biri **10** nömrəli **şəhər məktəbidir.** Məktəbin adı ilk dəfə1920-ci ilə aid arxiv sənədlərində çəkilir.1937-ci ildən məktəb hazırkı ünvanda fəaliyyət göstərir. Məktəbin əsas korpusu 1936-1937-ci illərdə inşa edilmiş və həmin ildə məktəbə yazıçı Maksim Qorkinin adı verilmişdir. Məktəb 1991-ci ildən görkəmli Azərbaycan pedaqoqu Rəşid bəy Əfəndiyevin adını daşıyır. 2006-cı ildə Heydər Əliyev Fondunun təşəbbüsü ilə 3 mərtəbəli, 240 şagird yerlik əlavə tədris binası tikilmiş, Azərbaycan

Respublikasının Prezidenti İlham Əliyevin 16 avqust 2007-ci il tarixli sərəncamına əsasən məktəbin 1937 və 1974-cü ildə tikilmiş daha iki binası əsaslı təmir olunaraq yeni avadanlıqlarla təchiz edilmiş və şagirdlərin istifadəsinə verilmişdir.



***10*** nömrəli ***məktəbin hazırkı binası***

Şəki şəhər 10 nömrəli məktəbin məzunları arasında yüksək dövlət vəzifələrində çalışan, elm, təhsil, incəsənət və iqtisadiyyat sahələrində tanınmış insanlar vardır. *Azərbaycan Respublikası Baş nazirinin müavini **Abid Şərifov**, sabiq rabitə naziri **Nadir Əhmədov**, Azərbaycan MEA-nın Əlyazmalar İnstutunun sabiq direktoru, professor **Məmməd Adilov**, tanınmış neftçi alim, professor **Aydın Əhmədov**, Şəki Regional Elm Mərkəzinin sabiq direktoru, professor **Zəkəriyyə Əlizadə**, iqtisadiyyat üzrə elmlər doktoru, professor **Qüdrət Əbdülsəlimzadə**, tanınmış musiqişünas alim, sənətşünaslıq doktoru **Faiq Çələbi**, BDU-nun dosentləri **Cabbar Cabbarov**, **Rəfael Həmidov**, istefada olan polkovniklər **Raqib Bəşirov, Xanlar Cəfərov**, respublikanın əməkdar müəllimi **Ceyran Quliyeva**, tibb üzrə fəlsəfə doktoru **Ənvər Həmidov*** və başqaları bu məktəbin məzunlarıdır.

Məktəbin məzunları bir qayda olaraq ali məktəblərə qəbul imtahanlarında diqqətəlayiq uğurlar qazanırlar. Ali məktəblərə qəbulla əlaqədar 10 nömrəli məktəbin 2008-2010-cu illərdəki göstəriciləri aşağıdakı cədvəldəki kimi olmuşdur.

**Cədvvəl 3.5.2.8.1.**

| G ö s t ə r i c i l ər | 2008 | 2009 | 2010 |
|---|---|---|---|
| Ali məktəblərə qəbul üçün sənəd vermişdir | 61 | 54 | 69 |
| Ali məktəblərə qəbul olunmuşdur | 28 | 27 | 36 |
| 600 baldan yuxarı toplamışdır. | 4 | 3 | 4 |

2008-ci ildə 675 bal toplayaraq Azərbaycan Tibb Universitetinin Müalicə işi fakültəsinə qəbul olunmuş Mətin Süleymanzadə elə həmin ildə keçirilən əlavə müsabiqədə qalib gələrək Türkiyənin Gülhanə Hərbi Tibb Akademiyasında oxumaq hüququ qazanmışdır.

2009-cu ildə məktəbin məzunu Xəyyam Musazadə 670 bal toplayaraq Qafqaz Universitetinə daxil olmuş və Prezident təqaüdünə layiq görülmüşdür.

Məktəbin yetirməsi *Ülvi Həsənli, Kamran Vahabzadə, Anar Abbasov, Asiman Əhədzadə* 2009-cu ildə, X sinif şagirdi *Ələfsər Rəsulzadə* 2010-cu ildə ABŞ Dövlət Departamentinin FLEX proqramı çərçivəsində keçirdiyi müsabiqənin qalibi olmuş, bir il ərzində ABŞ-da yaşamaq və təhsil almaq hüququ qazanmışlar.

2013-2014-cü dərs ilində məktəbdə 900-dən artıq şagird təhsil almışdır. Məktəbdə 180 nəfərə yaxın müəllim və tərbiyəçi çalışır. Onların arasında pedaqoji kollektivin, şagirdlərin və valideynlərin hörmətini qazanmış respub likanınə *əməkdar müəllimi Fikrət Əsgərov*[472]*, Azərbaycan dili və ədəbiyyatı müəllimləri Adilə Məmmədova, Möhübbət İbrahimova, Nəzakət Mustafayeva, ingilis dili müəllimləri Ədalət Musayeva, Həqiqət Babayeva, ibtidai sinif müəllimləri Qəribə Məmmədova, Svetlana Bəkirova, Ziyafət Mehdiyeva, Rövşanə Hüseynova, əmək və rəsmxət müəllimi Sevil İbrahimova da vardır.*

Onlardan bir neçəsi haqqında məlumatlara nəzər salaq.



***İbrahimova Möhübbət Zahid qızı*** *1954-cü ildə Nuxa şəhərində anadan olmuşdur. 1970-ci ildə Şəki şəhərindəki 10 nömrəli orta məktəbi, 1975-ci ildə ADPİ-nin (indiki ADPU) Azərbaycan dili və ədəbiyyatı fakültəsini bitirmişdir.*

*M.İbrahimova əmək fəaliyyətinə Şəki şəhərindəki 11 nömrəli məktəbdə başlamış, 1975-1991-ci illərdə həmin məktəbdə, 1991-ci ildən isə 10 nömrəli məktəbdə müəllim işləyir.*

M.İbrahimova Şəkinin sayılıb-seçilən Azərbaycan dili və ədəbiyyatı müəllimlərindəndir.

Onun dərs dediyi şagirdlərin böyük əksəriyyəti respublikanın ali məktəblərinin Azərbaycan dili və ədəbiyyatı fakültəsinə yüksək balla qəbul olunmuşlar. Onun müəllimlik peşəsinə olan marağı, işinə məsuliyyətlə yanaşması və təlim-tərbiyə sahəsindəki fəaliyyəti yüksək qiymətləndirilmiş, dəfələrlə fəxri fərmanlar, pul mükafatları, 2005-ci ildə isə Azərbaycan Respublikası «Təhsil» Mərkəzinin «Xan qızı Natəvan» mükafatı ilə təltif olunmuşdur.



***Musayeva Ədalət Ələkbər qızı*** *– 1957-ci ildə ziyalı ailəsində anadan olmuşdur. 1974-cü ildə Şəki şəhərindəki 10* nömrəli *məktəbi bitirərək həmin ildə Azərbaycan Dövlət Dillər İnstitutunun ingilis-alman dili fakültəsinə daxil olmuş, 1978-ci ildə təyinatla Şəki rayonunun Aşağı Küngüt və İbrahimkənd kənd məktəblərində müəllim işləmişdir. 1984-cü ildən bu günədək 10* nömrəli *məktəbdə işləyir.*

*Ə.Musayeva 2000-ci ildən «Addım - addım» və «Öyrədənləri öyrədən» proqramlarının iştirakçısı olmuş, 2003-cü ilin aprelində Cənubi Qafqaz ölkələri ingilis dili müəllimlərinin Gürcüstanda təşkil edilmiş birinci qurultayına nümayəndə seçilmişdir. 2005-2007-ci illərdə Amerika Beynəlxalq Təhsil Şurası və ABŞ–ın «İngilis dili və Amerika ölkəşünaslıq» fənlərinin tədrisi üzrə yüksək mükafatlar proqramları əsasında həyata keçirilən müsabiqələrin qalibi olaraq kompüter və 125 dollar həcmində kitablarla mükafatlandırılmış və ABŞ-a 7 həftəlik səyahət hüququ qazanmışdır. Britaniya səfirliyinin, AMİ və Təhsil Nazirliyinin «Müəllimlərin təkmilləşdirilməsi» layihəsinin III mərhələsi üzrə qarşılıqlı anlama memorandumuna əsasən «müəllim-reyne» statusu almışdır. 2003-cü ildə Prezident seçkilərində ATƏT-in tərcüməçisi kimi iştirak etmişdir.*



***Babayeva Həqiqət Məmmədemin qızı****- 1955-ci ildə Nuxa şəhərində anadan olmuşdur. 1972-ci ildə orta məktəbi, 1980-ci ildə ali məktəbi bitirərək təyinatla 3 nömrəli məktəbdə əmək fəaliyyətinə başlamışdır. 1983-cü ildən 10 nömrəli məktəbdə ingilis dili müəllimi işləyir.*

H.Babayeva tədris etdiyi fənninin incəliklərini şagirdlərə öyrətməyə səy göstərir. Onun şagirdləri ingilis dili fənni üzrə keçirilən olimpiadalarda fəal iştirak edirlər. Şagirdlərindən R.Həsənli 2003-cü ildə, Ü.Həsənli 2005-ci ildə, K.Vahabzadə 2007-ci ildə, A.Əhmədzadə 2008-ci ildə müsabiqə qalibi olmuşlar.

H.Babayeva məktəbin və şəhərin ictimai həyatında fəal iştirak edir. Məktəb metodbirləşməsinin sədridir. Dəfələrlə müxtəlif təşkilatlar tərəfindən fəxri fərmanlarla təltif olunmuşdur.

2011-2012-ci tədris ili 10 nömrəli məktəb üçün yaddaqalan olmuşdur. Azərbaycan Respublikası Prezidenti İ.Əliyevin 20 iyun 2012-ci il tarixli «20011/2012-ci il tədris ilində keçirilmiş «Ən yaxşı ümumi təhsil müəssisəsi» qaliblərinin mükafatlandırılması haqqında» Sərəncamına əsasən 10 nömrəli məktəb «***Ən yaxşı ümumi təhsil müəssisəsi***» hesab olunmuşdur.

### *3.5.2.9. Milli Qəhrəmanın oxuduğu məktəb – 12 nömrəli tam orta məktəb*

Şəkinin qocaman təhsil ocaqlarından biri də 1924-cü ildə tikilmiş və həmin ildən uşaqları qoynuna almış **12 nömrəli tam orta** məktəbdir. İbtidai məktəb kimi fəaliyyətə başlayan 12 nömrəli məktəb 1932-ci ildə 7 illik, 1955-ci ildə isə qız-oğlan məktəbinə çevrilmişdir. 1941-ci ilədək məktəbə rəhbərlik etmiş direktorlar haqqında əlimizdə məlumat yoxdur. Məktəbə 1941-1946-cı illərdə *Əbdürəhman Məmməd oğlu Abdullayev*, 1946-cı ildən 1960-cı ilədək *Abdulbər Abdullayev, Niyazi Məmmədov, Novruz Rəsulov, 1960-1968-ci illərdə Ayaz İsmayılov,* 1968-1987-ci illərdə *Səadət Rəhimova*, 1987-ci ildən hal-hazıradək *Türabə Hümmətova* rəhbərlik edir.

12 nömrəli məktəbdə oxumuş E.M.Yəhyayev Azərbaycan Respublikasının Milli Qəhrəmanı adına layiq görülmüşdür.



**Yəhyayev Elşad Məmmədhənifə oğlu**
***1966-cı il may ayının 5-də Nuxada anadan olmuşdur. 1973-cü ildə Şəki şəhər 12 nömrəli məktəbin birinci sinfinə daxil olmuşdur.***

***E.Yəhyayev 1977-ci ildə ailəsi ilə Bakı şəhərinə köçdüyündən təhsilini Xətai rayonundakı 56*** **nömrəli** ***orta məktəbdə başa vurmuşdur. 1991-ci ildə Saratov şəhərində DİN Ali Hərbi Komandirlər Məktəbini bitirib. 1992-ci ilin iyun ayının 19-da Ağdam rayonu ətrafında gedən döyüşlərdə qəhrəmancasına həlak olub. Daxili xidmət baş leytenantı idi. Azərbaycan Respublikası Prezidentinin 8 oktyabr 1992-ci il tarixli Fərmanı ilə E.Yəhyayevə «Azərbaycan Respublikasının Milli Qəhrəmanı» fəxri adı verilmişdir.***

***Elşad Yəhyayevin adı Şəkidə və Bakıda əbədiləşdirilmişdir. Şəkidəki 12*** **nömrəli** ***orta məktəb E.Yəhyayevin adını daşıyır. Bakının Xətai rayonundakı 56 nömrəli orta məktəbin qarşısında E.Yəhyayevin büstü qoyulmuşdur.***

12 nömrəli məktəbin məzunla rından danışarkən bəstəkar, xor drijoru, aktyor, müğənni, həyatını musiqinin və mədəniyyətin inkişafına həsr etmiş Şahid Əbdülkərimovu xatırlamamaq ən azı insafsızlıqdır.

***Əbdülkərimov Şahid Qədir oğlu*** 1938-ci ildə Nuxada anadan olmuşdur. 1957-ci ildə 12 nömrəli orta məktəbi bitirmiş, 1958-1960-cı illərdə Bakı Mədəni-



Maarif Texnikumunun xor drijorluğu şöbəsində təhsil almış, təhsil illərində görkəmli sənətkar Qulu Əsgərov onun müəllimi olmuşdur.

Ş.Əbdülkərimov 1961-1966-cı illərdə M.Əliyev adına Dövlət Teatr İnstitutunda oxumuş, təyinatla Xırdalan 1 nömrəli məktəbdə əmək fəaliyyətinə başlamışdır. Təhsilini Konservatoriyada davam etdirən Şahid Əbdülkərimovun bəstələdiyi mahnıları Baloğlan Abbasov, Könül Kərimova, Kifayət Gəncəli və b. ifa etmişlər. Ş.Əbdülkərimovun «Təki sən səslə məni» mahnısı zamanında dillər əzbəri olmuş, ümummilli lider H.Əliyev tərəfindən yüksək qiymətləndirilmişdir. 1986-cı ildə bəstəkarın 50 illik yubileyi Şəkidə və Abşeron rayonunda təntənəli surətdə qeyd olunmuşdur. Bəstəkarın «Sevgilimə könül açdım», «Naxçıvanım», «Qocalmışam demə ana», «Biləydin kaş», «Gözəlim», «Sarı sim», «Nişan üzüyü», «Azərbaycan» və s. mahnıları bu gün də müğənnilərin repertuarını bəzəyir.

Məktəbin məzunlarından Faiq Əhmədov və Namiq Əhmədov fizika-riyaziyyat üzrə fəlsəfə doktoru, Mürsəl İmamverdiyev kənd təsərrüfatı üzə fəlsəfə doktoru, Səadət Qasımova filollogiya üzrə fəlsəfə doktorudur.

Məktəb məzunlarının həyatından sətirlər:

***Abdullayev Abdurrahman Məmməd oğlu*** *-1914-cü ildə anadan olmuşdur. 1933-cü ildə Nuxa Pedaqoji texnikumunu, 1941-ci ildə Azərbaycan Pedaqoji İnstitutunu (indiki ADPU) qiyabi bitirmişdir. 1941-ci ilədək müəllim, dərs hissə müdiri, 1946-cı ildən Xalq Maarif şöbəsində pedaqoji kabinetin müdiri, məktəblər müfəttişi, maarif şöbəsinin müdiri işləmişdir. A.Abdullayev 1950-60-cı illərdə partiya işində çalışmış, 1969-cı ildən EA sistemində işləmişdir. 1990-cı ildə «Əməkdar mədəniyyət işçisi» fəxri adına layiq görülmüş, orden və medallarla təltif olunmuşdur. 1998-ci ildə Şəkidə vəfat etmişdir.*

***Zülfüqarova Laləndar*** *– 1922-ci ildə anadan olmuşdur. BDU-nun kimya fakültəsinə qəbul olunmuş, 1942-ci ildə tələbə ikən Nuxa şəhərinə müəllim göndərilmiş, 12* nömrəli *məktəbdə əmək fəaliyyətinə başlamışdır. 1943-cü ildə təhsilini davam etdirmək üçün Bakıya qayıtmış, 1945-ci ildə kiçik elmi işçi kimi işini davam etdirmişdir. 1954-cü ildə kimya elmləri namizədi elmi dərəcəsi almışdır.*

***Hacıyev Nazim Məmmədiyyə oğlu -*** *1924-cü ildə anadan olmuş, Nuxa Pedaqoji məktəbini və Azərbaycan Dövlət Universitetinin filologiya fakültəsini bitirmişdir. Bakı küçələrindən biri, Şəkidəki istirahət klubu və Baş Küngüt kənd məktəbi onun adını daşıyır.*

***Cəlilov Səttar Mustafa oğlu*** *- 1937-ci ildə anadan olmuşdur. 12* nömrəli *məktəbi, sonra Dövlət Neft Akademiyasını bitirmişdir. 1974-1986-cı illərdə Azərbaycan Neft və Kimya İnstitutunun «Neft və qaz qurğularının qazılması»*

*kafedrasında, elmi-tədqiqat laboratoriyasında mühəndis, baş elmi işçi və aparıcı elmi işçi vəzifələrində çalışmışdır. 16 məqalənin, 4 metodiki vəsaitin müəllifidir.*

***Əhmədov Faiq Əbdüləvvəl oğlu** -1940-cı ildə anadan olmuşdur. 12 nömrəli məktəbi və BDU-nun fizika fakültəsini bitirmişdir.1962-ci ildə Moskva Dövlət Universitetinin aspiranturasına daxil olmuş, 1966-cı ildə namizədlik, 1992-ci ildə doktorluq dissertasiyası müdafiə etmişdir. 80 elmi məqalənin, 7 dərs və metodiki vəsaitin müəllifidir.*

***Əhmədov Namiq*** **Abduləvvəl oğlu** – *1949-cu ildə anadan olmuşdur. 12* nömrəli *məktəbi, sonra da BDU-nun fizika fakültəsini bitirmişdir. 1972-ci ildə aspiranturaya daxil olmuş, SSRİ EA Bioüzvü Kimya İnstitutuna ezam olunmuş, professor Y. M. Popovun rəhbərliyi altında namizədlik dissertasiyası üzərində işləmişdir. 1976-cı ildə BDU-da namizədlik dissertasiyası müdafiə etmişdir. Hazırda BDU-nun «Molekulyar fizika» laboratoriyasında işləyir. 130-dan artıq məqalənin müəllifidir. Məqalələri Rusiya, ABŞ, Fransa və Türkiyədə çap olunmuşdur.*

***İmamverdiyev Mürsəl Həbibullah oğlu** - 1926-cı ildə anadan olmuşdur. 12* nömrəli *məktəbi, 1944-cü ildə Nuxa Kənd Təsərrüfatı texnikumunu, 1956-cı ildə Azərbaycan Kənd Təsərrüfatı İnstitutunu bitirmişdir. 1972-ci ildə «Şəki-Zaqatala zonası şəraitində kübrələrin payızlıq arpanın boyuna, inkişafına və məhsuldarlığına təsiri» mövzusunda dissertasiya müdafiə edərək kənd təsərrüfatı elmləri namizədi elmi dərəcəsi almışdır.*

2013/2014-cü tədris ilində 12 nömrəli məktəbdə 300-dən artıq şagird təhsil almış, onların təlim-tərbiyəsi ilə 50 **nəfər** müəllim məşğul olmuşdur. Məktəbin məzunları ali və orta ixtisas məktəblərinə qəbul olunmuşdur. 2 nəfər məzun 500-dən yuxarı bal toplamışdır. Hazırda 12 nömrəli məktəb yeni binada tədrisi davam etdirir.

## *3.5.2.10. Şəkinin ilk rus məktəbi - 8 nömrəli beynəlmiləl məktəb*

Şəkinin ictimaiyyəti tərəfindən sevilən və pedaqoji kollektivinə hörmət göstərilən məktəblərdən biri də **8** nömrəli ***beynəlmiləl məktəbdir***.

Məktəb 1929-cu ildə rus məktəbi kimi fəaliyyətə başlamışdır. *Məktəbə 1952-1956-cı illərdə **Nəbiyev Məmmədsadıq Yaqub oğlu**, 1956-1973-cü illərdə **Kolodin Timofey İvanoviç**, 1973-1980-cı illərdə **Hüseynbəyov Tərlan Məmməd oğlu**, 1980-1986-cı illərdə **Əhmədov Rüfət Yunus oğlu**, 1986-1989-cu illərdə **Abbasova Mina Nadir qızı**, 1889-1992-ci illərdə **Əmrahova Minayə Ələddin qızı** rəhbərlik etmişlər.* 1992-ci ildən məktəbin direktoru ***Ələsgərli Səttar Sabir oğludur***.



**Ələsgərli Səttar Sabir oğlu** *1955-ci ildə Zaqatala şəhərində anadan olmuşdur. 1972-ci ildə Şəki şəhər 8* nömrəli *rus məktəbini, 1982-ci ildə M.F. Axundov adına*

*Azərbaycan Pedaqoji Rus dili və Ədəbiyyatı İnstitutunu bitirmişdir. Tələbəlik illərində ictimai fəaliyyətinə görə Azərbaycan LKGİ MK-nin Fəxri fərmanı ilə təltif olunmuşdur.*

*S.Ələsgərli əmək fəaliyyətinə 1983-cü ildə Böyük Dəhnə kənd məktəbində rus dili müəllimi kimi başlamış, sonra şəhər 9* nömrəli *məktəbdə fəaliyyətini davam etdirmişdir. 1985-1992-ci illərdə həmin məktəbdə təlim-tərbiyə işləri üzrə direktor müavini, 1992-ci ildən 8* nömrəli *məktəbdə direktor vəzifəsində çalışır.*

*S.Ələsgərli şəhərin və məktəbin ictimai həyatında fəal iştirak edir. Yaxşı ailə başçısıdır. Oğlu Faiq Ələsgərli Azərbaycan Dillər Universitetini bitirmiş və hazırda ABŞ-da təhsilini davam etdirir.*

8 nömrəli məktəbin gənc müəllimlərindən söz düşəndə öncə Ülkər Əliyevanın adını çəkirlər. Ü. Əliyevanın pedaqoji təcrübəsi az olsa da, onun çalışqanlığı, əməksevərliyi və istedadı göstərir ki, o tezliklə respublikamızın sevilib-seçilən müəllimlərindən biri olacaqdır.



**Tanıtma:**

***Ülkər Akif qızı Əliyeva*** *1984-cü ildə Şəki şəhərində anadan olmuşdur. 2006-cı ildə Azərbaycan Müəllimlər İnstitutunun Şəki filialını bitirmişdir. İngilis dili müəllimidir. 2007-2011-ci illərdə AzETA-nın beynəlxalq və regional konfranslarında iştirak etmiş və yeni təlim texnologiyalarına yiyələnmişdir. 2009-cu ilin yanvar ayında AzETA və Britaniya şurası tərfindən təşkil olunmuş «İdarəetmə» kursunu bitirmiş və «Öyrədənləri öyrədən» sertifikatını almışdır. 2007-ci ildə ABŞ səfirliyi tərəfindən təşkil olunan «Aztəminatlı ailələrin uşaqlarına xarici dilin öyrədilməsi» layihəsində iştirak etmiş,* ***online*** *kursa qoşularaq Amerikanın Maryland Balmitor Universitetini bitirmiş, TEA (Müəllimlərin təkmilləşdirilməsi) proqramının qalibi olmuş və ABŞ-da 6 həftəlik təlim keçmək hüququ qazanmışdır.*

*Ü.Əliyeva beynəlxalq konfransların iştirakçısı olmuş, Ukrayna, Tükiyə və Gürcüstanın təhsil sistemi ilə tanış olmuş və qazandığı bilikləri məktəbdə tətbiq etməyə başlamışdır. World, Excel, Power, Point, Preziclide proqramlarına yiyələnmiş və onlardan dərslərində istifadə edir.*

*Ü.Əliyevanın dərs dediyi şagirdlər ingilis dili üzrə olimpiadalarda, inşa yazı müsabiqələrində iştirak etmiş, Siyahbərli Elvin Asif oğlu 2009-cu ildə ingilis dili üzrə, Aytən Yusifova İREX inşa yarışında region üzrə I yer tutmuşlar.*

Ü.Əliyeva 2013/2014-cü tədris ilində «İlin müəllimi» müsabiqəsinin qalibi olmuşdur.

**8** nömrəli məktəb son on ildə təlim-tərbiyə sahəsində nəzərəçarpacaq nailiyyətlər əldə etmişdir. Məktəbdə öz işinə məsuliyyətlə yanaşan, təlim-tərbiyə sahəsində uğurlu nəticələr əldə edən müəllimlər ordusu çalışır. Qazanılmış

uğurlarda tədris işləri üzrə direktor müavini **Yaqub İslamovun** xüsusi əməyi vardır.

### *3.5.2.11. «Kamal müəllimin məktəbi» – 20 № li tam orta məktəb*



*20 nömrəli məktəbin tədris korpusu*

Şəhər **20 nömrəli** tam orta məktəb **1974-cü** ildən fəaliyyətə başlayıb. Məktəb üçmərtəbəli bina ilə yanaşı, geniş idman zalı, işıqlı, zəngin sinif otaqları, fənn kabinetləri, kitabxana və geniş həyətyanı sahəyə, idman meydançasına malikdir.

Məktəbin fəaliyyət göstərdiyi 36 ildə cəmi 3 dəfə direktor dəyişdirilmişdir. Məktəbin ilk direktoru sonralar uzun müddət Şəki təhsilinə rəhbərlik etmiş maarifpərvər riyaziyyatçı *Mustafakamal Allahverdiyev* olmuşdur. Onun rəhbərliyi



dövründə məktəb nəinki rayonda, həm də respublikadan kənarda şöhrət qazanmışdır. 20 nömrəli məktəbdən söz düşəndə onu **«Kamal müəllimin məktəbi»** deyə xatırlayırlar.

2006-cı ildə məktəbə peşəsini ürəkdən sevən, müəllimlik ləyaqətini hər yerdə, həmişə qoruyub

saxlayan, sayılıb-seçilən ziyalı-**Mais Səlimov** rəhbər təyin olunmuşdur.

***Mais Davud oğlu Səlimov*** *1962-ci il fevral ayının 22-də Şəki şəhərində anadan olmuşdur. 1979-cu ildə orta məktəbi bitirərək APİ-nin filologiya fakültəsinə daxil olmuş, 1984-cü ildə həmin fakültəni fərqlənmə diplomu ilə bitirmişdir. O, müxtəlif məktəblərdə ədəbiyyat müəllimi işləmiş, dəfələrlə Şəki Təhsil Şöbəsinin fəxri fərmanlarına layiq görülmüşdür. 2002-ci ildə Respublika Təhsil Nazirliyinin I dərəcəli diplomu, 2010-cu ildə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin fərmanı ilə «Tərəqqi» medalı ilə təltib olunmuşdur. Üç şeir kitabının müəllifidir.*

M.Səlimov məktəbə direktor təyin olunan gündən məktəbdə yeni ruh, işgüzar ab-hava yaranmışdır. Kollektivdə müsbət psixoloji iqlim, yaradıcılıq mühiti bərqərar olmuş, müəllimlərdə özünə inam, məsuliyyət hissi, yeniliyə həvəs artmışdır. Kollektivdə sağlam psixoloji iqlim hökm sürmüşdür. Kollektivin üzvləri arasında qarşılıqlı hörmət, tələbkarlıq, səmimiyyət, etimad durur. Münasibətlərin pedaqoji əməkdaşlıq zəminində qurulması, şagirdlərə təlim-tərbiyə prosesinin bərabərhüquqlu üzvü kimi yanaşılması məktəbdə sürətli dönüş yaratmışdır.

M.Səlimovun rəhbərliyi dövründə 20 nömrəli məktəbdə əsil demokratizm hökm sürmüş, prolemlər kollegiallıqla həll olunmuş, məktəb həyatı ilə bağlı məsələlərin həllində pedaqoji kollektivin, valideyn komitəsinin və şagirdlərin fikir, rəy və mülahizələri nəzərə alınır. Bu səbəbdən də, məktəbdə əsaslı kəmiyyət və keyfiyyət dəyişikliyi baş vermişdir. Məktəbdə təhsilin, təlim-tərbiyə işlərinin keyfiyyətini yüksəltmək üçün təlimin yeni metodları və texnologiyalari tətbiq olunmuş, qabaqcıl pedaqoji təcrübə öyrənilmişdir.

Mais Səlimov məktəbin müəllimlərinin işini daim diqqət mərkəzində saxlamış, onların iş təcrübəsinin öyrənilməsi qayğısına qalmışdır. Təsadüfi deyildir ki, M.Səlimovun fəaliyyəti şəhər rəhbərliyinin diqqətindən yayınmadı, o irəli çəkilərək şəhər icra hakimiyyətinə işə dəvət olundu.

Hazırda məktəbə **Səbuhi Qurbanov** rəhbərlik edir.

Məktəbdə işinin öhdəsindən layiqincə gələn müəllimlər ordusu çalışır. *əməkdar müəllim Mahir Əyyubov, «Tərəqqi» medalı ilə təltif olunmuş Rahim Həsənov, qabaqcıl müəllimlərdən Əntiqə Əhmədova, İntizar Hümmətova, Təranə Rəsulova, Xədicə Qəhrəmanova* və başqaları şagirdlərin, pedaqoji kollektivin və valideynlərin hörmətini qazanmışlar. Son illərdə təhsilin beynəlxalq standartlara uyğunlaşdırılması və dünya təhsil sisteminə inteqrasiyası, təlim-tərbiyənin şagirdlərin meyil və maraqları əsasında qurulması, ümumi təhsilin məzmununda köklü dəyişikliyin aparılması bu təhsil ocağının fəaliyyətinə öz müsbət təsirini göstərməkdədir. Bu baxımdan məktəbin əməkdar fizika müəllimi Mahir Əyyubovun işi xüsusilə təqdirəlayiqdir.[473]



Məktəb müəllimləri arasında xüsusi hörmət qazanmış ibtidai sinif müəllimi Əntiqə Nemət qızı Əhmədovanın işi diqqətəlayiqdir.

***Əntiqə Nemət qızı Əhmədova*** 1960-cı ildə sadə əməkçi ailəsində anadan olmuşdur. O, daima elmi-metodiki hazırlığını artırmaqla yanaşı, 1999-cu ildən bu günə qədər interaktiv təlim metodlarının sirlərini öyrənir, «Addım-addım» proqramını izləyir, mətbuatda gedən metodiki məqalələri diqqət mərkəzində saxlayır. Onun müasir təlim metodları ilə qurulmuş dərs kurikulumları, əyani vəsaitlər, pedaqoji mühazirələr və mətbuatdan əldə etdiyi materiallardan ibarət zəngin arxivi vardır. Buraya valideynlərlə keçirdiyi görüşlərin və tədbirlərin materialları, açıq dərslərin icmalları, video yazılar daxildir. Onun dərsləri biri-birindən fərqli və rəngarəng olur.

Ə.Əhmədova nümunəvi ibtidai sinif müəllimi olmaqla bərabər, həm də dayaq məntəqəsinin ibtidai siniflər üzrə assosiasiya sədri, məktəb həmkarlar təşkilatı idarə heyətinin üzvüdür. Əntiqə müəllimə pedaqoji mətbuatdan və internet saytlarından əldə etdiyi yenilikləri assosiasiya yığıncaqlarında həmkarları ilə müzakirə edir, açıq dərslərinin təşkilində və keçirilməsində onlara yaxından köməklik göstərir.

Ə.Əhmədovanın fəaliyyəti şəhər təhsil şöbəsi tərəfindən diqqət mərkəzində saxlanılır. Təhsil şöbəsinin ibtidai təhsil üzrə metodisti Çimnaz Mustafayeva onun dərslərində dəfələrlə iştirak etmiş, pedaqoji ustalığını yüksək dəyərləndirmiş və yerli mətbuatında onun fəaliyyətini işıqlandırmışdır. Çimnaz Mustafayevanın sözlərinə görə, onun dərsləri məzmun cəhətdən heç vaxt bir-birinə bənzəmir. Müəllim hər bir mövzunun spesifik xüsusiyyətlərini nəzərə alaraq müvafiq üsullar seçir və bacarıqla tətbiq edir. İnteraktiv təlimdən irəli gələn sinif quruluşu tətbiq edir, iş formaları və strategiyanı mövzuya uyğunlaşdırmağı bacarır. Təlim prosesi müəllimin şagirdlərlə və bir-birilə qarşılıqlı əməkdaşlığı şəraitində həyata keçirilir. Bir sözlə, Ə.Əhmədova yeniliyə meyl edən və onun təcrübədə tətbiq edən müəllimlərdəndir.

Məktəbdə Azərbaycan dili və ədəbiyyatı fənninin tədrisi sahəsində əldə olunan uğurlar **İntizar Hümmətovanın** adı ilə bağlıdır. İ.Hümmətova 35 ildir pedaqoji fəaliyyətlə məşğuldur. Fənninin incəliklərini şagirdlərinə böyük həvəslə öyrədir. 35 illik müəllimlik fəaliyyətində İntizar müəllimə özü də öyrənmiş, püxtələşmişdir. Şagirdlərinin uğurunu İntizar müəllimə öz uğuru hesab etmiş, onlarla birgə sevinmiş, onları yeni nailiyyətlərə həvəsləndirmişdir. O, Azərbaycan dili və ədəbiyyatı fənni üzrə dayaq məntəqəsinin sədri kimi də səmərəli fəaliyyət göstərir.

Məktəbin tarix müəllimi **Rahim Həsənov** Azərbaycan Müəllimlər İnstitunun Şəki filialını bitirmişdir. Magistratura təhsili almışdır. R.Həsənov yeniliyə meyilli müəllimlərdəndir. Elə bu səbəbdən də, o, təlimin müasir metodları ilə bağlı Beynəlxalq təşkilatların treninqlərinin fəal iştirakçılarından olmuşdur. Cəmi 10 illik pedaqoji staja malik olmasına baxmayaraq R.Həsənov

şəhərdə və Respublikada tanınmışdır. 2009-cu ildə «İlin müəllimi» müsabiqəsinin Respublika turunun iştirakçısı olmuşdur.

R.Həsənovun pedaqoji sahədə əldə etdiyi nailiyyətlər diqqətdən kənarda qalmamış, o, 2009-cu il oktyabrın 30-da Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin Fərmanı ilə «Tərəqqi» medalına layiq görülmüşdür.

R.Həsənov daim öz üzərində işləyir. **«Açılmamış səhifələr»** kitabının müştərək müəlliflərindən olan Rahim müəllim «Şəki XX əsrin 20-30-cu illərində» mövzusunda araşdırmalar aparır.

Məktəbdə şagirdlərin asudə vaxtının səmərəli təşkili üçün fənn dərnəkləri, idmanın müxtəlif növləri üzrə bölmələr fəaliyyət göstərir. Vaxtaşırı maraqlı müsabiqə, yarış, festival, viktorinalar keçirilir, divar qəzetləri və bülletenlər buraxılır, elm və mədəniyyət xadimləri, müharibə veteranları ilə görüşlər təşkil olunur. Zəngin fənn kabinetləri şagirdlərin istifadəsinə verilmişdir.

Məktəbin şagirdlərinin olimpiadalarda iştirakı və yer tutması artıq ənənəyə çevrilmişdir. *Paşazadə Günay «Beynəlxalq Turizm» müsabiqəsində I yeri, Vahabova Günay Azərbaycan dili və ədəbiyyatı fənnindən respublika turunda IV yeri tutmuş, Paşayev Oruc biologiya fənni üzrə respublika turunun qalibi olmuşdur. Nail Abbasov «Ətraf mühitin mühafizəsi» adlı Beynəlxalq Respublika olimpiadasında qalib gələrək gümüş medalla təltif olunmuşdur. Məktəbin folklor kollektivi Novruz şənliklərində şəhər birinciliyi qazanmışdır. Qızlardan ibarət voleybol komandası şəhər çempionu adına layiq görülmüşdür.*



***İnformatika kabinetindən görünüş***

Məktəb məzunları ilə fəxr edir. *Məktəbin məzunlarından General Mirzəli Əhmədov Hərbi Akademiyanın rəisi vəzifəsində çalışır.* Məzunlardan *Elşən Səlimov və Günel Yusifli 623 balla* Bakı Dövlət Universitetinə*, Elşən Abdullayev 600 balla* Tibb Universitetinə daxil olmuşdur. *Tahirə Hacıbalayeva, Günay Vahabova, Fəridə Paşazadə, Gülnarə Hacıbalayeva, Nərmin Hüseynova , Nəbi Məmmədov, Rəvanə Mustafayeva Azərbaycan Müəllinlər İnstitutunun Şəki filialında təhsil alırlar.*

20 nömrəli məktəb 2013-2014-cü tədris ilini uğurla başa vurmuşdur. Məktəbin məzunları ali **və** orta ixtisas məktəblərinə qəbul olunmuşlar.

## *3.5.2.12. 80 yaşlı Turan qəsəbə tam orta məktəbi*

***Turan qəsəbə tam orta məktəbi*** Şəkinin ümumtəhsil məktəbləri içərisində qabaqcıl yerlərdən birini tutur. Məktəbin təməli **1935-ci ildə** Rusiyadan Trud-Sarıca düzünə sürgün olunmuş bir qrup varlı rus ailələri tərəfindən qoyulmuşdur. Qısa müddətdə burada gözəl bir qəsəbə salınmış, illər keçdikcə məktəb böyümüşdür. Müharibə illərinə qədər qəsəbədə ibtidai məktəb kimi fəaliyyət göstərmiş, müharibədən sonra məktəb yeddiillik məktəbə çevrilmişdir. Həmin illərdə məktəbin direktoru **Səmədova Aleksandra Dmitriyevna** olmuşdur. **1957-1961-ci illərdə** məktəbə **Əsgər Muradov, 1961-1963-cü illərdə Ayaz Əzizov** rəhbərlik etmişlər. 1963-cü ildə qəsəbənin böyüməsi onun əlavə 5 şöbə ilə birləşməsi səbəbli rus və Azərbaycan bölməsindən ibarət internat məktəb açılmış, məktəb qarışıq tipli beynəlmiləl orta məktəb kimi fəaliyyət göstərməyə başlamışdır. **1963-1972-ci illərdə** məktəbin direktoru **Salehov Saleh Məmmədkərim oğlu** olmuşdur. 1972-ci ildə onun Şəki RXMŞ-nə müdir təyin olunmasından sonra məktəbin direktoru vəzifəsinə ***Cəmaləddin İbrahim oğlu Camalov*** təyin edilmişdir. O, işlədiyi müddətdə-1971-1978-ci illərdə «Qabaqcıl maarif xadimi» və «SSRİ maarif əlaçısı» döş nişanları ilə təltif olunmuşdur.



**C.Camalov**



Turan qəsəbə orta məktəbinə **1979-1980-ci** illərdə **Musa Yusif oğlu Musayev**, **1980-1992-ci illərdə Əbülfəz Hüseynov** rəhbərlik etmişdir.

***Hüseynov Əbülfəz Ərzəni oğlu*** 1942-ci ildə Qərbi Azərbaycanın Əzizli kəndində anadan olmuşdur. 1954-cu ildə Əzizli kənd məktəbini, 1964-cü ildə H.Zərdabi adına Gəncə Pedaqoji İnstitutunun (indiki

Gəncə Dövlət Universiteti) Pedaqogika və ibtidai təhsilin metodikası fakültəsini bitirmişdir.

Ə.Hüseynov rayonun ən qabaqcıl və yenilikçi direktorlarından olmuş, onun iş təcrübəsi respublikada yayılmışdır. «Qabaqcıl maarif xadimi», «SSRİ maarif əlaçısı» döş nişanları ilə təltif olunan Əbülfəz müəllim «Əmək igidliyinə görə» medalına layiq görülmüşdür.

Ə.Hyseynov direktor işlədiyi dövrdə müəllimlərin ixtisasının artırılması qayğısına qalmış, 15 nəfər müəllimin iş təcrübəsindən bəhs edən kitabçanın buraxılmasını təşkil etmişdir.

1992-1993-cü illərdə məktəbin direktoru vəzifəsində **Məmmədov Mehman Məmməd oğlu** işləmiş, 1993-cü ildə məktəbə Baba Yusifov direktor təyin olunmuşdur.

***Baba Abdulla oğlu Yusifov*** *1950-ci ildə Nuxanın Kiçik Dəhnə kəndində anadan olmuşdur. 1967-ci ildə kənd orta məktəbini, 1972-ci ildə Bakı Dövlət Universitetinin riyaziyyat fakultəsini bitirmişdir. 1972-1974-cü illərdə hərbi xidmətdə olan B.Yusifov 1974-1975-ci illərdə Şəki Üzümçülük sovxozu orta məktəbində, 1976-1984-cü illərdə isə Taxılçılıq sovxozundakı qiyabi orta məktəbdə işləmişdir.*



*B.Yusifov 80 yaşlı məktəbin ənənələrinin davamçısı kimi öz üzərində daim işləyir. O, 1983-cü ildə Azərbaycan Respublikası Təhsil Nazirliyinin və TİAHİ Respublika Komitəsinin Fəxri fərmanı ilə, 1986-cı ildə «Azərbaycan SSR Xalq Maarif əlaçısı» döş nişanı ilə təltif olunmuş, iki dəfə Respublika müəllimlərinin qurultayının iştirakçısı olmuşdur.*

Turan qəsəbə tam orta məktəbində işgüzar kollektiv formalaşmışdır. Direktor müavini Sevda Cəlilova**,** müəllimlərdən Səyyad Möylamov, Nəbi Balaşov, İsa Hüseynov, Tahirə Nəsirova, Mehman Məmmədov, Rüxsarə Quliyeva, Akif Şükürov, Arif Qurbanov, Oqtay Möylamov, Aypara Məhərrəmova, Roza Qədirova, Sevinc Adıgözəlova, Dilarə Cəlilova, Xumarə Məmmədova, Limonət Qasımova müəllim və şagird kollektivinin, həmçinin valideynlərin hörmətini qazanmışlar.

Turan qəsəbə tam orta məktəbinin mövcud olduğu 80 ildə minlərlə məzun həyata vəsiqə almışdır. Onlar texniki peşə, orta ixtisas və ali məktəblərə daxil olmuş, respublikamızın siyasi, ictimai və mədəni həyatında fəal iştirak etmişlər.

Azərbaycan Respublikası Milli Məclisinin üzvü Cavanşir Feyziyev Turan qəsəbə məktəbinin məzunudur.

# IV FƏSİL

# TEXNİKİ PEŞƏ, ORTA İXTİSAS VƏ ALİ TƏHSİL MÜƏSSİSƏLƏRİ

## 4.1. 1 nömrəli texniki peşə məktəbi

Azərbaycan xalqı ta qədimdən özünün sənətkarlıq qabiliyyəti ilə seçilmişdir. Əsrlərlə Azərbaycanda maddi mədəniyyətin mühüm sahəsi olan xalçaçılıq, toxuculuq, misgərlik, dəmirçilik, zərgərlik, ipəkçilik və s. peşələri mövcud olmuşdur. Təbriz, Ərdəbil, Gəncə, Dərbənd, Nuxa kimi ticarət şəhərləri inkişaf etdikcə peşələrin öyrənilməsinə ehtiyac artmışdır.[474]

Zaman keçdikcə sənətkarlığın inkişafı, peşələrin öyrədilməsi üçün tədris müəssisələrinin açılmasına yaranan ehtiyac səbəbli təhsilin bu növü inkişaf etməyə başladı.

Azərbaycanda manufakturanın bəzi sahələrinin inkişafı ilə əlaqədar ayrı-ayrı sahələr üzrə mütəxəssislərin kütləvi halda hazırlanmasına ehtiyac yarandı. 1843-cü ilin iyun ayında Nuxada ipəkçiliyin inkişafı ilə əlaqədar təhsil müddəti 4 il olan «Təcrübi ipəkçilik məktəbi»nin əsası qoyuldu.[475]

Göründüyü kimi, peşə müəssisələrinin açılmasının öncülü Nuxa olmuşdur.

XX əsrin əvvəllərində Azərbaycanda sənətkarlıq inkişaf etməyə başladı. Neft sahələrinin inkişafı fəhlə kadrlarının hazırlanmasını önə çıxardı. 1914-cü ildə Azərbaycanda 14 sənət məktəbi açıldı. Bu məktəblərdə 2.500-ə qədər şagird təhsil alırdı ki, onların çox cüzi bir hissəsi (5,6%) azərbaycanlılar idi. Sonrakı illərdə bir sıra müəssisələrin nəzdində texniki peşə məktəbləri yaradıldı. Azərbaycanda ixtisaslı fəhlə kadrlarının hazırlanmasına «Azərbaycan peşə-texniki təhsilinin Əsasnaməsi» təkan verdi.

Ölkənin iqtisadi həyatında baş verən dəyişikliklər fəhlə kadrlarının hazırlanmasını təkmilləşdirməyi tələb etdi. 1940-cı il oktyabr ayının 2-də peşə təhsilinə rəhbərlik edən dövlət idarəsi – Azərbaycan SSR Xalq Komissarları

Soveti nəzdində Dövlət Əmək Ehtiyatları İdarəsi yaradıldı.[476] Artıq müharibə ərəfəsində bu məktəblərdə 5 mindən artıq şagird təhsil alırdı.

1941-ci ildə sovet-alman müharibəsinin başlanması ilə əlaqədar ixtisaslı fəhlə kadrları hazırlanması günün başlıca vəzifəsinə çevrildi. 1942-ci ildə 42 sənət məktəbinə 13 min oğlan və qız qəbul edildi. Ümumiyyətlə, 1941-1945-ci illərdə Azərbaycanın əmək ehtiyyatı qüvvələri məktəblərini 43.287 nəfər bitirmişdir.[477]

Şəkidə peşə məktəblərinin yaranması XX əsrin 70-ci illərinə təsadüf edir. Keçən əsrin 70-ci illərində Şəkidə 43, 91 və 134 nömrəli texniki peşə məktəbləri fəaliyyət göstərmişdir. Onlardan ikisi - 43 və 91 nömrəli məktəblər şəhərdə, 134 nömrəli məktəb isə kənddə yerləşirdi.

43 nömrəli texniki peşə məktəbi əsasən tikinti sahəsi üçün fəhlə kadrları hazırlanması ilə, 91 nömrəli texniki peşə məktəbi xalq sənəti peşələri üzrə kadr hazırlığı ilə ixtisaslaşmışdı. 134 nömrəli məktəbdə kənd təsərrüfatı üçün kadrlar hazırlanırdı. Azərbaycan Respublikasının müstəqilliyinin bərpasından sonra texniki peşə məktəblərinin strukturunda dəyişikliklər baş vermiş, 1996-cı ildə xalq təsərrüfatının ehtiyaclarına uyğun olaraq 43 və 91 nömrəli məktəblər birləşdirilmişdir. Birləşmədən sonra 1 nömrəli texniki peşə məktəbi kimi fəaliyyət göstərən təhsil ocağında peşələr üzrə kadrlar hazırlanır.

## 4.2. Orta ixtisas məktəbləri

### *4.2.1. Şəki Pedaqoji Kolleci (Şəki Pedaqoji Texnikumu)*

Son illərdə dövlət tərəfindən təhsil sahəsində aparılan islahatlar nəticəsində orta ixtisas müəssisələrinin müstəqil fəaliyyəti və inkişafı üçün hüquqi və iqtisadi zəmin yaradılıb, orta ixtisas təhsili sahəsi genişlənib. 2013-2014-ciü tədris ilinin əvvəlinə Şəkidə 2.500 nəfərə yaxın tələbənin oxuduğu 4 orta ixtisas məktəbi fəaliyyət göstərmişdir.

1920-ci ildən ayrı-ayrılıqda oğlan və qız seminariyası (darülmüəllimin və darülmüəllimat) kimi fəaliyyətə başlayan Nuxa *Pedaqoji Texnikumu* (*Texnikum Azərbaycan Respublikası Nazirlər Kabinetinin «Orta ixtisas təhsili müəssisələrinin adlarının dəyişdirilməsi haqqında» 16 iyun 2010-cu il tarixli 112 nömrəli qərarına əsasən Şəki Pedaqoji Kolleci adlandırılmışdır)* 1925-1926-cı tədris ilindən birləşdirilərək vahid texnikum halında çalışmışdır. Dövlət Arxivləri Baş idarəsinin Şəki filialında saxlanılan Nuxa Qəza İcraiyyə Komitəsinin prezidium iclaslarının 1925-1926-cı illəri əhatə edən 1926-cı il 8 noyabr tarixli 33/23 saylı protokoldan aydın olur ki, oğlan və qız pedaqoji texnikumlarının birləşdirilməsi IV qrup texnikumlarda uşaq sayının azlığı səbəbli olmuşdur. Nuxa Qəza İcraiyyə Komitəsinin geniş plenum iclasında Azərbaycan SSR Maarif Komissarı Mustafa Quliyev və komissarlığın bir neçə şöbə müdiri iştirak etmişdir. [478]

1925-ci ildə Nuxa Pedaqoji Texnikumunun 25 nəfərlik ilk buraxılışı olmuşdur. Məzunların 17 nəfəri oğlan, 8 nəfəri qız idi. 1925-ci il iyun ayının 27-də Nuxa Qəza İcraiyyə Komitəsinin qərarı ilə qadın müəllimlərə olan ehtiyac nəzərə alınaraq Nuxa Qadınlar Seminariyası nəzdində 40 nəfər azsavadlı kəndli qızları üçün hazırlıq kursları açılmışdır.

Məktəbin ilk müəllimləri ***Rəşid bəy Əfəndiyev, Abdulmahmud Əfəndiyev, Əhmədağa Qazıyev, Veysəl Mustafayev, Əşrəf Hacıyev, Baba Qabulov, Məmmədəli Xəlfəzadə*** və başqaları olmuş və onlar məktəbin formalaşması və nüfuzunun artmasına böyük əmək sərf etmişlər.

Məktəb Azərbaycan SSR Ali Sovetinin 9 iyun 1928-ci il tarixli qərarına əsasən (prot № 25) M.F. Axundov adına Nuxa Pedaqoji Məktəbi, 1932-ci ildən İ.V.Stalin adına Nuxa Pedaqoji Məktəbi kimi fəaliyyət göstərmişdir.



***Şəki Pedaqoji Kollecinin tədris korpusu***

***Nuxa Pedaqoji Məktəbinin açılmasına Rəşid bəy Əfəndiyev böyük əmək sərf etmişdir. Məktəbə 1920-1927-ci illərdə*** *Rəşid bəy Əfəndiyev*, ***1927-1928-ci illərdə*** *Məmmədsani Məmmədov*, ***1928-1930-cu illərdə*** *Hacıbala Hacızadə*, ***1930-***



***1932-ci illərdə*** *Məhərrəm Qarayev*, ***1932-1937-ci illərdə*** *Seyfulla Hüseynov*, ***1937-1938-ci illərdə*** *Əlihüseyn Hacıkişiyev*, ***1938-1939-cu illərdə*** *Əhməd Abdurahmanlı*, ***1939-1941-ci illərdə*** *Mirzə Salehli*, ***1941-1943-cü illərdə*** *Rza Babayev*, ***1943-1945-ci illərdə*** *Yusif Həmidov*, ***1945-1952-ci illərdə*** *Mirzə Salehli*, ***1952-1957-ci illərdə*** *Qurban Abbasov*, ***1957-1967-ci illərdə*** *Aminə Babayeva*, ***1967-1971-ci illərdə*** *Zinyət Məmmədova*, ***1971-1974-cü illərdə*** *Məmmədsadıq Naibov*, ***1974-1982-ci illərdə*** *Cəmil Süleymanov*, ***1982-1987-ci illərdə*** *Mədinə İsmayılova* ***rəhbərlik etmişlər. 1993-cü ildən direktor vəzifəsini R.Şükürov icra edir.***

***İlk direktorlardan bir qrup***

1927-1928-ci illərdə texnikumda qiyabi təhsil şöbəsi yaradılmış, on il müddətində qiyabi təhsil xətti ilə 5.415 nəfər müəllim hazırlanmışdır. 1931-1932-ci tədris ilindən etibarən istehsalatdan ayrılmadan təhsil alınması məqsədilə fəhlə fakültəsi yaradılmış, 6 il ərzində rabfakı 1.151 nəfər bitirmişdir.

1933-cü il yanvar ayının 15-dən texnikum nəzdində müəllim, məktəbəqədər tərbiyəçi və pioner işçiləri hazırlamaq üçün kurslar açılmış, 8 aylıq bu kurslara VI-VII sinif həcmində savadı olan şagirdlər qəbul edilmişlər. Şagirdlərə təqaüd verilməsi onların təhsilə marağının artırılmasına təkan vermişdir.

1928-1933-cü illərdə Nuxa pedaqoji texnikumuna qəbul aşağıdakı cədvəldəki kimi olmuşdur.[479]

**Cədəvəl 4.2.1.1.**

| Tədris illəri | qəbul | buraxılış |
|---|---|---|
| 1928/1929 | 70 | 73 |
| 1929/1930 | 70 | 60 |
| 1930/1931 | 60 | 91 |
| 1931/1932 | 60 | 62 |
| 1932/1933 | 60 | 60 |

Nuxa Pedaqoji Tenikumunun 10-cu buraxılışı 1935-ci ildə olmuşdur. Yubiley məzunları içərisində sonralar Şəki təhsilinə öz töhvələrini vermiş Əhməd Rəhimli, Qurban Abbasov, Məmmədəli Rəhimov, Heydər Əfəndizadə, Ziba Muxtarova, Əminə Xəlilova, İbrahim Hacızadə və başqaları olmuşdur.

1920-1935-ci illərdə texnikumu 564 nəfər bitirmiş, onlardan 92 nəfəri təhsillərini artırmaq məqsədilə ali məktəblərə oxumağa getmişlər.[480]

Nuxa Pedaqoji Texnikumu repressiya illərinin acısını dadmış, müharibə təhsil müəssisəsinin həyatında dərin izlər buraxmışdır. Ağır müharibə şəraitinə baxmayaraq texnikumu 1940-1941-ci tədris ilində 185 nəfər, 1941-1942-ci tədris ilində 55 nəfər, 1942-1943-cü tədris ilində 36 nəfər, 1943-1944-cü tədris ilində 33 nəfər, 1944-1945-ci tədris ilində 75 nəfər, ümumilikdə 384 nəfər bitirmişdir.

Müharibədən sonra bütün təhsil müəssisələrində olduğu kimi, pedaqoji məktəbdə də təlim-tərbiyə işlərinin yenidən qurulmasına xeyli əmək sərf edilmişdir. Kitabın müəlliflərindən olan M.İ. Əmrahov 1962-1966-cı illərdə pedaqoji texnikumda təhsil almışdır. Onun təhsil illərinin ən xoş xatirələri böyük pedaqoq, əməkdar müəllim Aminə Cabbar qızı Babayevanın tələbələrə göstərdiyi qayğı və xeyirxahlıqla bağlı olmuşdur.[481]

Şəki Pedaqoji Kollecinin müəllim kollektivindən bəhs olunarkən direktor Aminə Babayeva, Azərbaycan dili və ədəbiyyatı müəllimi Mahtaban Yusifzadə haqqında kitabın «Əməkdar müəllim»lər fəslində ətraflı məlumat verilmişdir. Tələbələrin ikinci anası, gözəl insan və müəllimə Binyət Abdullayevanı xatırlamamaq ədalətsizlik olardı.



***Binyət Abdullayeva*** *1931-ci ildə Nuxada kolxozçu ailəsində dünyaya gəlmişdir. Uşaqlıq və yeniyetməlik çağları 1941-1945-ci illərin ağır müharibə dövrünə təsadüf etmişdir. İlk təhsilini şəhər 11 nömrəli məktəbdə aldıqdan sonra Nuxa Pedaqoji Məktəbinə daxil olmuş, 1950-ci ildə məktəbi fərqlənmə diplomu ilə bitirmişdir. Həmin ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutuna (indiki ADPU) qəbul olan Binyət xanım Şıxəli Qurbanov,*

*İsmayıl Şıxlı, Əbdüləzəl Dəmirçizadə kimi Azərbaycanın tanınmış pedaqoq-alimlərindən dərs almış, 1954-cü ildə ali məktəbi Azərbaycan dili, məntiq və psixologiya ixtisası üzrə başa vurmuşdur.*

*B.Abdullayeva təyinatla Yevlax rayonunun Səmədabad kənd məktəbində əmək fəaliyyətinə başlamış, sonralar Şəkidə 11 nömrəli məktəbdə pedaqoji fəaliyyətini davam etdirmişdir. Şəhər 12 nömrəli orta məktəbdə dərs hissə müdiri, Suçma kənd yeddiillik məktəbində direktor vəzifələrində işləmişdir. B.Abdullayevanın işə məsuliyyətlə yanaşması, vəzifəsinin icrasında ədalətli və xeyirxah olması rayonun rəhbər orqanlarının diqqətini çəkmiş, 1957-ci ildə Nuxa Şəhər Komsomol Komitəsinə ikinci katib vəzifəsinə irəli çəkilmişdir. 1961-ci elədək bu vəzifədə səmərəli fəaliyyət göstərən Binyət xanım, işgüzarlığı, təşəbbüskarlığı və səmimiliyi ilə rayon gənclərinin rəğbətini qazanmağa nail olmuşdur.*

*B.Abdullayeva 1963-1988-ci illərdə pedaqoji məktəbdə işləmişdir. İşlədiyi illər ərzində yüksək elmi-nəzəri hazırlığı, pedaqoji ustalığı ilə bir daha fərqlənmiş, müəllim peşəsi üçün çox vacib olan pedaqoji və psixoloji bilikləri tələbələrə mükəmməl şəkildə öyrətməyə səy göstərmişdir. Ayrı-ayrı vaxtlarda pedaqogika və psixologiya fənn birləşməsinin sədri, pedaqoji kabinetin və Tələbə Elmi Cəmiyyətinin rəhbəri kimi texnikumda aparılan təlim-tərbiyə işlərində yaxından iştirak etmişdir. O, bir müddət partiya təşkilatı katibi vəzifəsini icra etmişdir.*

*Binyət müəllimə dərs dediyi tələbələr üçün yalnız müəllim deyil, həm də ana idi. Texnikumda təhsil alan gənclərin əksəriyyətinin Şəkinin kəndlərindən və respublikanın digər rayonlarından gəldiyini, evdən, ailədən müəyyən müddətdə aralı düşdüklərini nəzərə alsaq, onda bu cür münasibətin onlar üçün nə demək olduğunu təsəvvür etmək çətin deyildir.*

*Binyət müəllimə təhsilini bitirərək pedaqoji fəaliyyətə başlayan gənclərlə əlaqə saxlayır, ailə vəziyyəti və məktəbdəki işləri ilə maraqlanardı. Bu baxımdan iki məktubdan sətirlərə diqqət yetirək. Zaqatala rayonunun Yengiyan kəndindən Aişə Şabanova Binyət müəlliməyə yazırdı: «Əziz müəlliməm, yazmış olduğunuz məktubu aldım, müəllimlər otağında oxudum, hamı sevindi. Siz arxayın olun, heç vaxt başınızı aşağı etmərəm…Sizin ana qayğınızı heç vaxt unutmarıq…». Yaxud, Şəkinin Aşağı Küngüt kəndindən Mirvari Yusifova Binyət müəlliməyə yazırdı: «… Mehriban anam, ..Sizin məktubunuzu aldım, nə qədər sevindiyimi sözlə ifadə edə bilmirəm….Sizin sözlərinizin bizə nə qədər qüvvət verdiyini təsəvvür edə bilməzsiniz. Anam mən çalışacağam ki, Sizin etimadınızı doğruldum».* [482] *Bu cür məktubların sayı onlarladır.*

*Gənc nəslin təlim-tərbiyəsi sahəsində səmərəli fəaliyyətinə, ictimai işlərdə fəallığına görə B.Abdullayeva Böyük Dəhnə kənd və Nuxa şəhər sovetinin deputatı seçilmiş, dəfələrlə texnikum rəhbərliyinin, ictimai təşkilatların, Ali və Orta İxtisas Təhsili nazirliyinin, keçmiş SSRİ və Azərbaycan SSR komsomol komitələrinin fəxri fərmanları ilə təltif olunmuş, « Əmək veteranı» medalına layiq görülmüşdür.*

XX əsrin 80-ci illərində baş verən hadisələr texnikumdan yan keçməmişdir. Texnikumun həyatındakı dəyişikliklərin sonrakı illərdə də şahidi olan

M.Əmrahov xatırlayır ki, 1987-ci ildən başlanan hərəkat, texnikumun da fəaliyyətinə mənfi təsir göstərmiş, pedaqoji ixtisaslar üzrə qəbul dayandırılmış, bir müddət məişət xidməti və texnologiya texnikumu kimi fəaliyyət göstərmiş, 1995-ci ildən texnikum fəaliyyətini əvvəlki statusda davam etdirməyə başlamışdır.

Ümumilikdə, Şəki Pedaqoji Kollecini 1924/1925 - 2009/2010-cu tədris illərində 10.511 nəfər bitirmişdir.

### *4.2.2. Şəki Dövlət Texniki Kolleci*

Şəkinin qocaman təhsil müəssisələrindən biri də, 1923-cü il martın 8-də təsis olunmuş ***Nuxa Toxuculuq Texnikumudur*** **(hazırkı Şəki Dövlət Texniki Kolleci).** Texnikumun açılışında Azərbaycan Xalq Ticarət Komissarı Həmid Sultanov iştirak etmiş, təntənəli yığıncağı Nuxa Qəza Partiya Komitəsinin katibi Tağıyev açmışdır. Uşaqlar «Beynəlmiləl» oxuduqdan sonra Həmid Sultanov çıxış edərək ipək sənayesi üçün kadr hazırlığında yeni açılan tədris müəssisəsinin rolundan bəhs etmişdir. Nuxa Qəza Xalq Maarif Şöbəsinin müdiri Mahmudov açılış mitinqində çıxış edərək məktəbə H.Sultanovun adının verilməsini təklif etmişdir.

Əsasən Nuxa ipək sənayesi üçün kadr hazırlığı ilə məşğul olan tədris müəssisəsi 1926/27-ci tədris ilində Xalq Maarif Komissarlığının 9 iyul 1926-cı il tarixli qərarı ilə Gəncə və **Nuxa** fəhlə fakültələrinin bazasında formalaşdırılmış, 1935-ci ildə Nuxa İpəkçilik texnikumuna çevrilmişdir. 30-cu illərin ortalarında bir sıra texnikumlar, o cümlədən Nuxa İpəkçilik texnikumu müvafiq nazirliklərin tabeliyinə verilmişdir.

İkinci Dünya müharibəsinin başlanması ilə xalq maarifi sistemində ciddi dəyişikliklər baş verdi. Mütəxəssislərin ordu sıralarına səfərbər edilməsi, gənclərin istehsalata getməsi səbəbli tələbə kontingenti əsaslı surətdə azaldı. Azərbaycan SSR Xalq Komissarları Sovetinin 21 avqust 1941-ci il tarixli qərarı ilə bir sıra texnikumlar birləşdirildi. Lakin müharibə illərinin çətinliklərinə baxmayaraq orta ixtisas məktəbləri kadr hazırlığını dayandırmadı. 1945/46-cı tədris ilində Nuxa İpəkçilik texnikumu bərpa olundu.

Zaman keçdikcə Şəki-Balakən bölgəsində yüngül sənaye müəssisələri ilə yanaşı digər sahələr də inkişaf etməyə başladı. Mütəxəssislərə olan ehtiyacı ödəmək məqsədilə Şəki Toxuculuq Texnikumu 1986-cı ildə Şəki Mexanika-Texnologiya Texnikumuna çevrildi. Yeni formalaşdırılan texnikumda ipəkçilik müəssisələri üçün kadr hazırlığı ilə yanaşı *«Avtomobil və traktorların elektrik avadanlıqları», «Bina və qurğuların elektromexaniki avadanlıqları», «Xalq istehlakı mallarının dəyişdirilməsi və konstruksiya edilməsi»* kimi yeni ixtisaslar üzrə orta pilləli mütəxəssislər hazırlığına başlandı. 1991-ci ildə texnikum üçün 5 mərtəbəli bina tikilib istifadəyə verildi. Yeni binanın üç mərtəbəsi tədris korpusu üçün, iki mərtəbəsi isə tələbələr üçün yataqxana kimi nəzərdə tutulmuşdur.

1988-ci ildə başlanan mərkəzdənqaçma meylləri bütün ölkədə olduğu kimi, təhsil sahəsində də bir sıra çətinliklər yaratdı. Planlaşmada yol verilən səhvlər,

kadr hazırlığı sahəsində yaranmış nizamsızlıq öz ifadəsini Şəkidə «Texnologiya texnikumu» və «Mexanika-texnologiya texnikumu» adlı iki texnikumun açılmasında biruzə verdi. Nəhayət, ümummilli lider H.Əliyevin hakimiyyətə qayıdışından sonra təhsil sahəsində yol verilmiş nöqsanlar aradan qaldırılmağa başlandı. 1994/95-ci tədris ilində Şəki Texnologiya Texnikumu əvvəlki profilinə qaytarılaraq Şəki Pedaqoji Texnikumu bərpa olundu. Həmin texnikumda olan texnoloji ixtisaslar Şəki Mexanika-Texnologiya Texnikumuna verildi və texnikum Şəki Texnologiya texnikumu adlandırıldı. 1995-ci ildə texnikuma «Konservləşmənin texnologiyası» və «Tütün məmulatlarının texnologiyası» ixtisasları üzrə kadr hazırlığına icazə verildi.

2000-ci ildə respublikada orta ixtisas təhsilinin təkmilləşdirilməsi istiqamətində aparılan işlərə uyğun olaraq Zaqatala Politexnik Texnikumu ləğv edilərək Şəki Texnologiya Texnikumuna birləşdirildi və Zaqatala Politexnik Texnikumu Şəki Texnologiya Texnikumunun şöbəsi kimi fəaliyyətini davam etdirdi.

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 26 sentyabr 2002-ci il tarixli 140 nömrəli qərarı və Azərbaycan Respublikası Təhsil Nazirliyinin 877 nömrəli əmrinə əsasən Şəkidə mövcud olan *Şəki Texnologiya texnikumu və Kənd Təsərrüfatı texnikumları birləşdirilərək Şəki Dövlət Texniki Kolleci adlandırıldı.*

*Qısa arayış:*

*Kənd təsərrüfatı texnikumunun əsası 1923-cü ildə qoyulmuşdur. Təhsil ocağının ilk direktoru İskəndər Bağbanlı olmuşdur. Texnikum müstəqillik illərində öz fəaliyyətinə son qoymuş, Şəki Texnologiya texnikumu ilə biləşdirilmişdir. Təhsil ocağının məzunlarından akademik Cəbrayıl Hüseynov, elmlər doktoru Lətif Qarayev, kənd təsərrüfatı üzrə fəlsəfə doktoru Zakir Əfəndiyev və b. göstərmək olar.*

Hazırda Şəki Dövlət Texniki Kollecinin rəhbəri **O. Sədiyevdi**r.

Şəki Dövlət Texniki Kollecində 10-a yaxın ixtisas üzrə kadrlar hazırlanır. Müstəqillik illərində orta ixtisas təhsili müəssisəsində yüzlərlə orta pilləli kadr hazırlanmış və müəssisələrə işə göndərilmişdir.

### *4.2.3. Şəki Musiqi Kolleci*

1958-ci ildə yaradılmış Şəki Musiqi Texnikumunun (*Texnikum Azərbaycan Respublikası Nazirlər Kabinetinin «Orta ixtisas təhsili müəssisələrinin adlarının dəyişdirilməsi haqqında» 16 iyun 2010-cu il tarixli 112 nömrəli qərarına əsasən Şəki Musiqi Kolleci adlandırılmışdır)* ilk direktoru Maqsud Əhmədiyyə oğlu Şirinzadə olmuşdur. Texnikum fortopiano və xalq çalğı alətləri şöbələri ilə fəaliyyətə başlamışdır. İlk qəbulda texnikuma fortopiano ixtisası üzrə 3, xalq çalğı alətləri ixtisası üzrə 7 nəfər tələbə qəbul olunmuşdur. Tələbələrlə fortopiano ixtisası üzrə Barbina Beroviç, Nemət Məmmədov, Nüsrət Hüseynov, nəzəriyyə fənləri üzrə Maqsud Şirinzadə məşğul olurdu.[483]

Şəki Musiqi Texnikumuna sonrakı illərdə tələbə qəbulu artmış, 4 fənn komissiyasında 66 müəllim fəaliyyət göstərmişdir. Təhsil müəssisəsi fortopiano,

xalq çalğı alətləri, xanəndəlik, xor drijorluğu, musiqi nəzəriyyəsi, simli alətlər, nəfəs alətləri ixtisasları üzrə kadr hazırlamağa başlamışdır.

Texnikuma əsas təhsil bazasından qəbulun aparılması ilə əlaqədar müəllim heyətinin tərkibində və tədrisin gedişində dəyişikliklər baş vermiş, ümumtəhsil fənlərinin tədrisi ilə əlaqədar fənn kabinetləri yaradılmışdır.

Ötən əsrin 60-cı illərindən Şəki orta ixtisas musiqi məktəbi adlanan tədris müəssisəsi əvvəllər darısqal bir binada, yuxarı karvansaray binasının bir hissəsində fəaliyyət göstərmiş, 60-cı illərin sonunda texnikumda yeni şöbələrin açılması və qiyabi şöbə yaradılması ilə əlaqədar olaraq tələbələrin və müəllimlərin sayı artmışdır. Həmin illərdə texnikumda 100 tələbə, 70-80-ci illərdə isə 300-dən çox tələbə təhsil almış, 100-ə qədər müəllim fəaliyyət göstərmişdir. Texnikum 1987-ci ildə köhnə həbsxana binasına köçürülmüşdür.

Keçən əsrin 80-ci illərinin hadisələri məktəbin fəaliyyətinə mənfi təsir göstərmiş, tədris prosesində durğunluq yaranmış, maddi-texniki baza zəifləmiş, tələbə qəbulu azalmışdır. Baş verən hadisələrin təsirinin nəticəsi idi ki, 1989-cu ildə məktəbə cəmi 29 tələbə qəbul olunmuşdur. Bu isə şimal-qərb bölgəsində fəaliyyət göstərən musiqi məktəblərinin və mədəniyyət ocaqlarının fəaliyyətinə mənfi təsir göstərmiş, kadrların digər sahələrdə işə qəbul olunması bölgənin mədəni səviyyəsində tənəzzül hiss olunmağa başlamışdır.

Şəki Musiqi Kollecində hazırda 5 ixtisas üzrə orta və tam orta təhsil bazasından 200 nəfərə yaxın tələbə təhsil alır. Məktəbdə ixtisas fənləri ilə yanaşı ümumtəhsil fənn müəllimləri də fəaliyyət göstərir. Müəllimlərin əksəriyyətinin ali və orta ixtisas təhsili vardır.

## 4.3. Ali təhsil müəssisələri

### *4.3.1. İkiillik Müəllimlər İnstitutu*

1939-40-cı tədris ilində Nuxada ***İkiillik Müəllimlər İnstitutu*** fəaliyyətə başlamış[484] və 1954-cü ilə kimi pedaqoji kadrlar hazırlığı ilə məşğul olmuşdur.

Nuxa İkiillik Müəllimlər İnstitutu 13 illik fəaliyyəti dövründə dörd ixtisas üzrə nəinki Nuxanın, həmçinin Nuxa-Zaqatala bölgəsinin məktəblərinin müəllim kadrları ilə təmin olunmasında əvəzsiz rol oynamışdır.




Nuxa İkiillik Müəllimlər İnstitutunun pedaqoji kollektivi R.Rəsullu başda olmaqla cəbhəyə yardım hərəkatında fəal iştirak etmiş, R.Rəsullu aylıq maaşının 10 %-nin müharibənin sonunadək cəbhəyə yardım fonduna köçürülməsi haq qında təşəbbüs irəli sürmüşdür. Nuxa İkiillik Müəllimlər İnstitutunun əmək daşları

tank dəstəsi yaratmaq fonduna 16.250 manat pul, 21.000 manatlıq istiqraz vermişlər.

***Nuxa İkiillik Müəllimlər İstitutunun***
***1941-1942-ci tədris ilinin buraxılışı***

Böyük Vətən müharibəsi dövründə cəbhəyə yardım toplanması hərəkatında fəal iştirakına görə təhsil müəssisəsinə DMK-nin sədri İ.Stalinin adından təşəkkür göndərilmişdir.

Nuxa İkiillik Müəllimlər İnstitutu 1953-cü ildə ləğv olunaraq Kirovabad (indiki Gəncə Dövlət Universiteti) Pedaqoji İnstitutuna birləşdirilmişdir. İnstitutun məzunları Nuxa-Zaqatala bölgəsində təhsilin inkişafında fəal iştirak etmişlər.

Təhsil müəssisəsinə ilk gündən Rəsul Rəsullu rəhbərlik etmişdir.

***Rəsul Yusif oğlu Rəsullu 1908-ci ildə Nuxada anadan olmuşdur. 1918-1920-ci illərdə atası ilə birlikdə fəhləlik edən balaca Rəsul 1921-ci ildən ibtidai təhsil almağa başlamış, 1924-cü ildə Nuxa Pedaqoji Texnikumuna qəbul olunmuş, 1927-ci ildə texnikumu bitirərək Qax rayonunun İlisu kəndində əmək fəaliyyətinə başlamışdır.***



***R.Rəsullunun ömür yolu çox keşməkeşli və zəngin olmuşdur. 1929-1930-cu illərdə Zaqatala – Nuxa maarif şöbəsində inspektor işləyən R.Rəsullu savadsızlığın ləğvində yaxından iştirak etmiş, 1931-1936-cı illərdə Nuxanın məktəblərində və texnikumlarda həm də müəllimlik etmiş, öz üzərində işləməyi yaddan çıxarmamış, 1936-1940-cı illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunda (indiki ADPU) təhsil almış, institutu fərqlənmə diplomu ilə bitirmişdir.***

***1953-cü ildə təhsilin yenidən qurulması ilə əlaqədar olaraq Nuxa İkiillik Müəllimlər İnstitutu ləğv olunaraq Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna birləşdirildikdən sonra R.Rəsullu 6 il orada pedaqoji fəaliyyət göstərmiş, 1858-1959-cu illərdə APİ-nin (indiki*** *ADPU) Azərbaycan ədəbiyyatı kafedrasında işləmişdir.*

R.Rəsullu yaxşı müəllim olmaqla yanaşı, həm də fədakar tədqiqatçı idi. 1945-ci ildə dissertasiya müdafiə edərək filologiya elmləri namizədi alimlik dərəcəsi alan Rəsul müəllimin N.Gəncəvinin həyat və yaradıcılığına həsr olunmuş «Ölməz sənətkar» adlı monoqrafiyası, M.S.Ordubadinin dramaturgiyasına dair məqalələri, rus yazıçıları V.M.Qoqolun, F.N.Radişşevin, L.N.Tolstoyun, A.P.Çexovun, M.Mayakovskinin, M. Qorkinin və S. Vurğunun yaradıcılığına həsr edilmiş yazıları tədqiqatçılar tərəfindən maraqla qarşılanmışdır.

R.Rəsullunun əmək və ictimai fəaliyyəti xalq və hökumət tərəfindən yüksək qiymətləndirilmişdir. O, 1931-ci ildə «Şəki fəhləsi» qəzetinin 10 illiyi münasibətilə Azərbaycan Mərkəzi İcraiyyə Komitəsinin Fəxri fərmanına, 1942-

ci ildə Azərbaycan SSR Ali Sovetinin qərarı ilə **«Azərbaycan SSR əməkdar müəllimi»** fəxri adına, 1944-cü ildə SSRİ Ali Soveti tərəfindən «**Əməkdə fərqlənməyə görə**», 1945-ci ildə «**Qafqazın müdafiəsinə görə**» medalları ilə təltif olunmuşdur. R.Rəsullu 1947-ci ildə Azərbaycan SSR Ali Sovetinə seçkilər üzrə 123 saylı Nuxa şəhər üçüncü seçki dairəsindən Azərbaycan SSR Ali Sovetinə deputat seçilmişdir.

Rəsul Rəsullu 1962-ci ildə vəfat etmiş, onunla son mənzilə vida mərasimi APİ-də (indiki ADPU) keçirilmişdir.

### *4.3.2. Azərbaycan Müəllimlər İnstitutunun Şəki filialı*

Respublikanın bölgələrində ali məktəbin filiallarının açılmasının əsası uzaq görən siyasətçi Heydər Əliyev tərəfindən qoyulmuşdur. Hazırda Şəkidə fəaliyyət göstərən ali məktəbin əsası 1991-ci ildə qoyulmuşdur. Həmin ilin sentyabr ayının 30-da Azərbaycan Respublikası Nazirlər Kabinetinin müvafiq sərəncamı ilə Şəkidə Bakı Dövlət Universitetinin filialı açılmış, filial 1992-2000-ci illərdə fəaliyyət göstərmişdir.

AMİ-nin və onun bölgə filiallarının yaradılması isə respublikamızda təhsil strukturlarının müasirləşdirilməsi və modernləşdirilməsi kontekstində həyata keçirilən mühüm islahatların ayrılmaz tərkib hissəsi olub ayrı-ayrı bölgələrinin ictimai və mədəni həyatının dirçəldilməsində, elmi-mədəni və ədəbi mühitin sağlamlaşdırılmasında çox önəmli bir hadisədir.

Azərbaycan Müəllimlər İnstitutunun Şəki filialı ümummilli lider H.Ə.Əliyevin 13 iyun 2000-ci il tarixli «Azərbaycan Respublikasının Təhsil sisteminin təkmilləşdirilməsi haqqında» Fərmanı ilə Bakı Dövlət Universitetinin və Pedaqoji Kadrlarının İxtisasının Artırılması və Yenidənhazırlanması Baş İnstitutunun Şəki filialının bazası əsasında yaradılmışdır.

**AMİ-nin Şəki filialının tədris korpusu**



Yeni tipli ali təhsil müəssisəsi olan Azərbaycan Müəllimlər İnstitutu və onun filialları Fransa Respublikasının Versal Universitetinin modelinə uyğun təşkil olunmuş və onun strukturuna 3 əsas istiqamət – Bakalavr pilləsi üzrə ilkin müəllim hazırlığı (İbtidai təhsilin pedaqogikası və metodikası və Məktəbəqədər təhsilin pedaqogikası və metodikası ixtisasları üzrə), pedaqoji kadrların ixtisasının artırılması, təkmilləşdirilməsi və nəhayət, onların yenidənhazırlanması daxildir.

Ölkəmizin hüquqi, demokratik dövlət quruculuğuna qədəm qoyduğu və dünyanın mütərəqqi təhsil sistemlərinə inteqrasiyası şəraitində yaradılmış Azərbaycan Müəllimlər İnstitutu və onun Şəki filialı artıq 15 ilə yaxındır ki, fəaliyyət göstərir. Ötən müddət ərzində bu yeni ali məktəbin strukturlarının formalaşdırılması istiqamətində məqsədyönlü iş aparılmış, yeni təhsil ocağının işlək mexanizmi yaradılmışdır.

Filial «Əsasnamə»yə uyğun olaraq, üç istiqamət: ilkin müəllim hazırlığı, pedaqoji kadrların ixtisasının artırılması, təkmilləşdirilməsi və yenidənhazırlanma təhsili üzrə fəaliyyət göstərir. Fəaliyyətə başladığı ilk tədris ilində filiala bakalavr pilləsi üzrə qəbul planı 100 nəfər olmuş, İbtidai təhsilin pedaqogikası və metodikası və Məktəbəqədər təhsilin pedaqogikası və metodikası ixtisasları üzrə tələbə qəbulu aparılmışdır. 2001-2002-ci tədris ilində bölgədə müxtəlif ixtisaslara olan ciddi ehtiyac nəzərə alınaraq tarix, riyaziyyat, Azərbaycan dili və ədəbiyyatı və Xarici dil (İngilis dili) olmaqla 4 yeni ixtisas

üzrə qəbul aparılaraq tələbə qəbulu 170 nəfərə çatmışdır. Hazırda filialda bakalavr pilləsində 6 ixtisas üzrə (Riyaziyyat və fizika, Azərbaycan dili və ədəbiyyatı, tarix və coğrafiya, Xarici dil (İngilis və fransız dilləri), İbtidai təhsilin pedaqogikası və metodikası və Məktəbəqədər təhsilin pedaqogikası və metodikası) 800 nəfərdən artıq tələbə təhsil alır.

Filial birtipli layihə əsasında 1959-cu ildə internat məktəb təyinatı ilə tikilmiş binada fəaliyyət göstərir. Bina 2 və 3 mərtəbəli olmaqla ayrı-ayrı iki tədris korpusundan ibarətdir. Filialın binasının yerləşdiyi ərazi 3,12 ha-dır. Filialda bufet, yeməkxana, kitabxana və oxu zalı, idman qurğuları olan meydança və idman zalı fəaliyyət göstərir. Binanın əhatə olunduğu ərazidə 200-dən artıq dekorativ bitkilər və meyvə ağacları əkilmişdir.

İnstitutda 45 mühazirə və məşğələ otağı vardır. Hal-hazırda filialda 35 ədəd kompüter, eləcə də digər audio - video avadanlıqlarla təchiz edilmiş və internetə çıxışı olan kompüter mərkəzi fəaliyyət göstərir. Son 3 ildə filial üçün müxtəlif çeşidli inventar və avadanlıqlar alınmış, bütün auditoriyaların avadanlıqları yeniləşdirilmiş, akt zalı yeni mebellə təchiz edilmişdir. Son üç ildə ali məktəbdə əsaslı təmir işləri aparılmışdır.

Hal-hazırda filialda Bakı şəhəri və Naxçıvan Muxtar Respublikası daxil olmaqla 30 şəhər və rayondan qəbul olmuş gənclər gələcəyin müəllimləri kimi yetişdirilir.

Azərbaycan Müəllimlər İnstitutunun Şəki filialında direktorluq, tədris və tələbə şöbəsi, kadrlar və ümumi şöbə, mühasibatlıq, kitabxana, kompüter mərkəzi, təsərrüfat şöbəsi, Əlavə təhsilə metodiki xidmət, Müasir təlim metodları və dayaq məntəqələri ilə iş, Kredit sistemi və tələbə nailiyyətlərinin qiymətləndirilməsi kabinetləri, Humanitar elmlər, Təbiət elmləri və tədrisi metodikası, Ümumelmi fənlər və Dillər kafedraları fəaliyyət göstərir.



***Direktor, fizika-riyaziyyat üzrə elmlər doktoru R.Rasulov riyaziyyat-fizika ixtisasında dərs zamanı***

Ötən dövr ərzində filialın özündə vaxtaşırı seminarlar, elmi–nəzəri və elmi-praktik konfranslar keçirilmişdir. Konfrans və seminarlarda *«Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazirlığının milli konsepsiya və strategiyası» nın* layihəsi, *«Azərbaycan Respublikasının Yeni Təhsil Qanunu layihəsi», «Azərbaycan Respublikası orta təhsilin Milli Kurikulumu» layihəsi, «Ali məktəbdə mühazirə və seminar məşğələlərinin təşkili» «Yeni pedaqoji və metodiki təfəkkür müasir dərsin əsasıdır», «Azərbaycan təhsil sistemində innovasiya prosesləri və onların istiqamətləri», «Buraxılış işlərinin hazırlanmasının dövlət standartları»* və s. məsələlər müzakirə edilmişdir.

Filialının əməkdaşları bölgənin mədəni həyatında fəal iştirak edir. Vaxtaşırı olaraq burada respublika və regional əhəmiyyətli tədbirlər keçirilir. 2005-ci ilin oktyabr ayında *«Korrupsiyaya qarşı mübarizə üzrə Dövlət Proqramının (2004-2006-cı illər)»* həyata keçirilməsinə həsr olunmuş regional konfrans, 2005-ci ilin noyabr ayında *«Azərbaycançılıq»* mövzusunda bölgə müşavirəsi, 2007-ci ilin avqustunda Dini Qurumlarla iş üzrə Dövlət Komitəsi və Şəki Şəhər İcra

Hakimiyyəti ilə birlikdə *«Azərbaycanda dövlət və din münasibətləri»* mövzusunda seminar, 2008-ci ilin aprelində Şəki Şəhər İcra Hakimiyyəti və AMEA-nın A.Bakıxanov adına Tarix İnstitutu ilə birlikdə *«Şəki – sivilizasiyaların qovuşduğu məkan»* adlı Respublika elmi konfransı, həmin ilin may ayında Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin anadan olmasının 85 illiyi münasibətilə ***«Qəlblərdə yaşayan insan»*** mövzusunda zona elmi-nəzəri və praktik konfransı yüksək səviyyədə təşkil olunmuşdur.




***«Şəki -sivilizasiyaların qovuşduğu məkan» adlı Respublika elmi-praktik konfransı***



***Bəxtiyar Vahabzadənin vəfatının ildönümünə həsr olunmuş elmi konfrans***

Azərbaycan Müəllimlər İnstitutunun Şəki filialında elmi-tədqiqat işlərinin planlaşdırılması və həyata keçirilməsi Azərbaycan Respublikası Nazirlər Kabinetinin 6 noyabr 1995-ci il tarixli 242 N-li qərarı ilə təsdiq edilmiş «Ali məktəblərdə elmi-tədqiqat işlərinin təşkili və planlaşdırılması haqqında» Əsasnaməyə, Azərbaycan Respublikası Təhsil Nazirliyinin 11 oktyabr 1994-cü il tarixli, 595 N-li əmri ilə təsdiq edilmiş «Ali məktəblərin elmi- tədqiqat şübəsi haqqında» mğvəqqəti Əsasnaməyə uyğun olaraq həyata keçirilir. Filialda 5 istiqamətdə, 11 problem üzrə 63 nəfər elmi-tədqiqat işlərinə cəlb olunmuşdur, onlar müxtəlif istiqamətlərdə 67 mövzu üzrə elmi-tədqiqat işləri aparırlar. Filialının fəaliyyətə başladığı dövrdən ötən 15 il ərzində filial əməkdaş larının bir sıra dəyərli monoqrafiyaları, dərs və metodiki vəsaitləri çap olunuşdur. Onların sırasında fəlsəfə üzrə elmlər doktoru, prof. F.Q.İsmayılovun «XX əsr Qərb fəlsəfəsi tarixi» (B, 2000), «Klassik psixoanalizin əsasları» (B, 2003), «Dekart» (B, 2008), tarix üzrə elmlər doktoru, professor M.İ.Əmrahovun «Azərbaycanda ali məktəb quruculuğu, ali pedaqoji təhsilin təşkili və inkişafı tarixinin oçerkləri (1917-1941-ci illər). Dərs vəsaiti. ( B, 2007), «Qarabağ xanlığı». Dərs vəsaiti. (B,

2008), «XX əsrdə Azərbaycanda milli azadlıq hərəkatı». Dərslik. (B, 2009), «İkinci Dünya müharibəsi» (monoqrafiya), (B, 2010), «Stalinqadda tarixi qələbə» (B, 2013), «Mərkəzi Asiyanın türk xalqları müharibə illərində (1941-1945-ci illər) .Dərs vəsaiti. (B, 2015), p.e.d., dos.F.N. İbrahimovun «Təlim prosesinin mahiyyəti» (B, 2002), «Analitik və evristik məntiqlə həll olunan tapşırıqlar» (B, 2006), «Pedaqogikaya giriş» (B, 2008), fizika-riyaziyyat üzrə emlər doktoru, dosent R.A.Rasulovun «Adi differensial tənliklərin həlli üsulları» (B, 2008), pedaqogika üzrə fəsəfə doktoru.dos. N.Z.Çələbiyevin «Psixodiaqnostika məsələləri» (B, 2003), «Uşaq psixologiyası» (B, 2005), «Təhsil sistemində psixoloji xidmət: nəzəriyyə və təcrübə» (B, 2008), tarix üzrə fəlsəfə doktoru, b/m. Z.Ə.Cavadovanın «Şimal-qərbi Azərbaycanın əhali tarixi və tarixi demoqrafiyası» (XIX əsrin əvvəlləri -70-ci illər) (B, 2002), fizika-riyazyyat üzrə fəlsəfə doktoru, dosent Y.H.Şükürlünün «Структурные белки» (B, 2006), filologiya üzrə fəlsəfə doktoru, dosent U.B.Mürşüdovanın «İngilis dilində dinləmə dərslərinin mərhələləri» (B, 2008), «İngilis dilinin tədrisində aktiv və interaktiv təlim metodlarından istifadə qaydaları» (B, 2008), pedaqogika üzrə fəlsəfə doktoru, b/m. S.R.Bədiyevin «Fizikadan test məsələlərinin şagirdlərin intellektual səviyyəsinin yüksəldilməsində rolu və təsnifi» (B, 2003), «Fizikanın tədrisində fəal təlim metodlarından istifadə etməklə şagirdlərin yaradıcılıq qabiliyyətlərinin inkişaf etdirilməsi» (B, 2005), b/m. H.Ş.Manaflının «Öyünc və güvənc qaynağı» (B, 2007), «Gen yaddaşımızın poeziya dili» (B, 2008) və başqalarını göstərmək olar.

Filialın əməkdaşlarından dos. N.Z.Çələbiyev, dosent U.B.Mürşüdova, b/m. Ə.B.Əkbərova, müəllimlərdən T.B.Namazov, A.S.Məmmədova, İ.M.Abdulsəlimli, R.Ş.Əhmədova respublika elmi konfranslarında və seminarlarda iştirak etmiş, onların məruzələri konfransın materialı kimi çap edilmişdir.

2012-ci ildə filialda 2012-2015-ci illərdə aparılacaq elmi-tədqiqat işlərinin perspektiv planı tərtib edilmişdir. 2012-ci ildə filialda növbəti ildə yerinə yetiriləcək elmi-tədqiqat işlərinin «Qeydiyyat» və «İnformasiya» vərəqələri hazırlanmış və baza institutu olan Azərbaycan Müəllimlər İnstitutunun elmi hissəsinə təqdim edilmişdir.

2012-ci ildə filialda yüksək ixtisaslı elmi və elmi -pedaqoji kadrların hazırlanması, əldə edilmiş elmi nəticələrin tədris prosesinə tətbiq edilməsi, bakalavr pilləsində təhsil alan tələbələrin elmi-nəzəri və praktik hazırlığının yüksəldilməsi, təhsil müəssisəsinin digər ali məktəb və elmi müəssisələrlə əməkdaşlığının artırılması məqsəd və vəzifələri diqqət mərkəzində saxlamışdır. Hesabat ilində filialda müəyyənləşdirilmiş elmi istiqamətlər institutun profilinə uyğun olaraq seçilmiş, elmi - pedaqoji kadrların və gənc mütəxəsislərin yüksək səviyyədə hazırlanması diqqət mərkəzində saxlanılmışdır. Elmi və elmi-metodiki naliyyətlərin ümumiləşdirilməsi və yayılması, onun nəticələrinin tədris prosesinə tətbiq edilməsinə meyl artmışdır. Filialda elmi-tədqiqat işlərinin məzmunu və

mövzu seçimi elm və təhsilin inteqrasiyasının təmin edilməsinə yönəldilmişdir. Filialda çalışan əməkdaşlar kafedralarda aparılan elmi-tədqiqat işlərində fəal iştirak etmiş, elmi araşdırmalarda doktorant, magistr, dissertant və tələbələrin də iştirakı təmin edilmişdir.

Filialda yerinə yetirilən elmi – tədqiqatlar tədris prosesinin elmi və elmi-metodiki təminatının yüksəldilməsi, informasiya-resurs bazasının yaradılması məqsədinə istiqamətləndirilmişdir. Elmi tədqiqatların mövzu seçimində ayrı-ayrı fənlərin tədrisi prosesində yeni təlim metodlarının tətbiqi imkanları, yeni tədris texnologiyalarından istifadə və onların metodoloji və informasiya – texniki əsaslarının işlənilib hazırlanması, dil fənlərin tədrisi prosesində innovasiyanın tətbiqi problemləri və həlli yolları, elmi-texniki ideyaların və innovasiyaların reallaşdırılması və s. məsələlər diqqət mərkəzində saxlanılmışdır. Tədqiqatlar zamanı əldə edilmiş nəticələrin təbliğ edilməsi məqsədilə onların bir qisminin nəşri təmin olunmuşdur. Ötən dövr ərzində filialda tədris və elmi proseslərin vəhdətinin təmin edilməsi məqsədilə elmin və istehsalatın, xüsusilə ali məktəbdə tədris olunan fənlərlə orta ümumtəhsil məktəblərində tədris olunan fənlərin inteqrasiyasının formalaşdırılması məsələlərinə xüsusi diqqət yetirilmişdir. Tədris prosesi ilə əlaqədar professor-müəllim heyətinin, gənc tədqiqatçıların, doktorantların və tələbələrin elmi və texniki yaradıcılığının müxtəlif formalarının inkişaf etdirilməsi, onların elmi konfranslarının, olimpiada və bilik yarışmalarının keççirilməsinə, həmçinin filial tələbələrinin respublika və beynəlxalq miqyaslı elmi konfranslarda və olimpiadalarda iştirakı təmin edilmişdir. Hesabat ili ərzində filialda elmi-tədqiqat işlərinin planlaşdırılması, yerinə yetirilməsi və yekunları ilə bağlı Elmi Şura iclasında hesabatlar dinlənilmiş, açıq müzakirələr aparılmış və müvafiq qərarlar qəbul edilmişdir.

Azərbaycan Müəllimlər İnstitutunun Şəki filialı aşağıdakı elmi-təşkilati strukturdan ibarətdir:

- Tərkibi 21 nəfərdən ibarət olan Elmi Şura;
- Elmi işlər üzrə direktor müavini;
- Elmi Şuranın ictimai əsaslarla fəaliyyət güöstərən elmi katibi;
- Humanitar elmlər, Ümumelmi fənlər, Təbiət fənləri və tədrisi metodikası və Dillər kafedrası olmaqla 4 kafedra;

2012-ci ildə hazırlanmış, 4 istiqamət 6 problemi əhatə edən perspektiv iş planında fililda növbəti 3 il ərzində aparılacaq 54 mövzu üzrə elmi –tədqiqat işləri öz əksini tapmışdır. 2012-ci təqvim ilində yerinə yetirilmiş elmi-tədqiqat işlərinin hər biri əməli xarakter daşımış və fililda tədrisin keyfiyyətinin daha da yüksəldilməsi, yüksək ixtisaslı müəllim kadrlarının hazırlanması məqsədlərinə xidmət etmişdir. Planlaşdırılan elmi-tədqiqat işlərini yerinə yetirilməsi üçün filialın müəyyən səviyyədə kadr potensialı olmuşdur. 2012-ci ildə fililda elmi-tədqiqat işlərinin yerinə yetiriləsinə tədris prosesində iştirak edən 88 nəfərdən 54 nəfəri (61%) cəlb edilmişdir. Onlardan 1 nəfəri elmlər doktoru, dosent, 12 nəfər

elmlər namizədi (o cümlədən 5 nəfəri dosent, 2 nəfəri dosent əvəzi, 5 nəfəri baş müəllim) 19 nəfər elmi dərəcəsi olmayan baş müəllim, 22 nəfər müəllim olmuşdur.

2012-ci hesabat ilində Təbiət fənləri və tədrisi metodikası kafedrası üzrə 23 nəfərdən 14 nəfər, Humanitar elmlər kafedrası üzrə 18 nəfərdən 10 nəfər, Ümumelmi fənlər kafedrası üzrə 23 nəfərdən 13 nəfər, Dillər kafedrası üzrə 24 nəfərdən 17 nəfər elmi-tədqiqat işlərinə cəlb edilmişdir. Əməkdaşlardan 13 nəfəri magistr, 3 nəfəri elmlər doktoru pilləsi üzrə doktorant, 1 nəfəri fəlsəfə doktoru pilləsi üzrə doktorant, 8 nəfəri isə dissertant olmuşdur. 2012-ci tədris ilində filial əməkdaşlarından 4 nəfəri fəlsəfə doktoru dərəcəsi üzrə dissertasiya işlərini tamamlamışdır.

Professor-müəllim heyətinin 2011-2012-ci il tədris ili üçün tərtib etdikləri fərdi iş planları və filialın 2012-2015-ci illəri əhatə edən elmi-tədqiqat işlərinin 3 illik perspektiv iş plana əsasən 2012-ci ildə 4 dərs vəsaitinin, 2 monoqrafiyanın, 3 metodik vəsaitin, 1 metodik tövsiyənin, 42 adda məqalənin yazılması və çap edilməsi nəzərdə tutulmuşdur. Hesabat ilində filial əməkdaşları tərəfindən 1 dərs vəsaiti (G.A.Abdullayeva., Ş.N.Hümbətova. Müasir Azərbaycan dili. II hissədə) və 1 metodik vəsait (İ.R.Salmanov. Astronomiyadan laboratoriya işlərinin aparılması metodikası) və çapa təqdim edilmiş, 1 metodik vəsait (U.B.Mürşüdova., A.C.Mehdiyeva. İngilis dilinin tədrisində aktiv və interaktiv təlim metodlarından istifadə qaydaları. Bakı: Mütərcim, 2012, 188 s.) çap etdirilmişdir. 34 məqalə çap etdirilmiş, 2 monoqrafiya, 1 dərs vəsaiti, 1 metodik vəsait və 22 məqalə çapa hazırlanmışdır.

Filial əməkdaşlarından f.r.e.n., dos.R.A.Rasulov, fil.dos. G.A.Abdullayeva, ped.elm. doktoru, dos. F.N. İbrahimov, p.e.n., dos. N.Z.Çələbiyev, f.r.e.n., b/m. İ.R.Salmanov, p.e.n., b/m. S.R.Bədiyev, b/m. Ə.B.Əkbərova, b/m. D.S.Məmmədova, fil.e.n, b/m. Ş.N.Hümbətova, fil.e.n., dos.U.B.Mürşüdova, b/m. H.Ş.Manaflı, b/m. V.C.Aslanov, b/m. S.T.Feyzul layeva, t.e.n.R.F.Sadıqov, m.T.B.Namazov, b/m. K.A.Adışirinov, b/m. G.Q.Abdurahmanova, m.A.M.Adışirinova, m.X.İ.Naibova, b/m. Ə.Ə.Musa yeva daha səmərəli çalışmışlar.

2012-ci təqvim ilində filial əməkdaşlarının apardıqları elmi-tədqiqat işləri əsasən tədris prosesi, təhsil sisteminin ayrı-ayrı pillələri və sahələrinə aid olmuş, əldə olunmuş nəticələr əsasən tədris prosesində tələbələrin, müdavimlərin və müəllimlərin istifadəsi üçün tövsiyə xarakteri daşımışdır. Tələbələr və müdavimlər həmin tədqiqat işlərinin nəticələrindən seminar məşğələlərinə hazırlaşarkən, sərbəst və buraxılış işlərini yerinə yetirərkən habelə imtahanlara hazırlaşarkən istifadə edirlər.

2012-2015-ci illəri əhatə edən elmi-tədqiqat işlərinin perspektiv planına əsasən 2012-ci ildə filial əməkdaşları tərəfindən 54 elmi-tədqiqat işləri yerinə yetirilmişdir.

2012-ci ildə filial əməkdaşları bir sıra respublika və beynəlxalq səviyyəli konfranslarda iştirak etmiş və onların tezisləri çap olunmuşdur. Filial

əməkdaşlarından 14 nəfəri (N.Çələbiyev, F.İbrahimov, S.Bədiyev, U.Mürşüdova, X.Naibova, A.Adışirinova, Ə.Əkbərova, K.Lətifova, V.İsmayılov, T.Namazov, A.Məhərrəmova, M.Bəşirova, M.Əbdürrəhimova, İ.Şərifova) 28 iyin 2012-ci il tarixdə Təhsil Problemləri İnstitutunda keçirilmiş «Təhsil sistemində gənc nəslin təlim-tərbiyəsi üzrə işin təşkili və onun yaxşılaşdırılması istiqamətləri» adlı respublika elmi konfransında iştirak etmiş və onların tezisləri çap olunmuşdur. Filialın əməkdaşlarından b/m. S.T.Feyzullayeva, müəl.V.B.Baxışov, b/m. M.A.Əbdürrəhimova və müəl. K.Ş.Səmədova 2011-ci ilin dekabrında Azərbaycan Müəllimlər İnstitutunda keçirilmiş doktorantların və gənc tədqiqatçıların XVI respublika elmi konfransında, dosent Y.H.Şükürlü 3-6 oktyabr 2012-ci il tarixdə Bakıda keçirilmiş neft kimyası üzrə VIII Bakı Beynəlxalq Məmmədəliyev Konfransında, əməkdaşlarından 15 nəfər (İ.Abdusəlimli, A.Adışirinov, Ə.Əkbərova, G.Abdurahmanlı, X.Həmidova, F.İbrahimov, K.Lətifova, Ə.Musayeva, U.Mürşüdova, T.Namazov, N.Çələbiyev, A.Süleymanova, Y.Əliyeva, M.Eminova) 26-28 noyabr 2012-ci ildə Azərbaycan Müəllimlər İnstitutunda keçirilən «Müəllim hazırlığının müasir problemləri: təhsildə elmi və texnoloji innovasiyalar» adlı II Beynəlxalq konfransda iştirak etmiş və tezisləri çap olunmuşdur.

2012-ci hesabat ilində filial əməkdaşları (p.e.d.F.N.İbrahimov, p.e.d, dos.N.Z.Çələbiyev, dos.U.B.Mürşüdova, p.e.n.S.R.Bədiyev, b/m. A. Adışirin ova, b/m. Ə.Əkbərova, b/m.Ə.Musayeva, müəl. A.Abdusəlimli, b/m. G.Abdurahmanova, b/m.X.Həmidova, m.K.Lətifova, m.T.Namazov, b/m. A.Süleymanova, b/m. Y.Əliyeva, müəl. M.Eminova) tərəfindən 15 məqalə çap etdirilmişdir.

2012-ci təqvim ilində filial əməkdaşları tərəfindən başa çatdırılmış elmi-tədqiqat işləri nəticələrindən tədris prosesində geniş istifadə olunur. Məsələn, filologiya üzrə fəlsəfə doktoru, dos.U.B.Mürşüdova və müəllim A.C.Mehdiyevanın həmmüəllifliyi ilə hazırlanmış «**İngilis dilinin tədrisində aktiv və interaktiv təlim metodlarından istifadə qaydaları**» adlı metodik vəsaitdən İngilis dili ixtisasının müəllim və tələbələri geniş istifadə edirlər. Metodik vəsait İngilis dilini öyrənən tələbələr üçün zəruri ədəbiyyatın təmin edilməsində mühüm rol oynayır.

2012-ci il hesabat ilində filial əməkdaşlarından p.e.d.F.N.İbrahimov və Ə.S.Yunusovun «İnteraktiv kurikulumun planlaşdırılması üsulu», (Mediya və təhsil innovasiyaları jurnalı, N 4.), p.e.n, dos. N.Z.Çələbiyevin «Kompyüter və uşaqların psixo-fizioloji sağlamlığı. («Təhsil» jurnalı, № 5-6), b/m. M.N.Kəimovanın «Orta məktəb riyaziyyat kursunda irrasional tənliklərin həlli metodikasına dair» ( «ADPU-nun Xəbərləri», № 1), p.e.n.,b/m. S.R.Bədiyevin «Yeni təlim texnologiyalarının tətbiq olunduğu dərslərdə təlim məsələləri» («ADPU-nun Xəbərləri», № 3), b/m. A.M.Adışirinovanın «Məktəbqədər müəssisələrdə ətraf aləmlə tanışlıq prosesində nitq inkişafının reallaşdırılması imkanları» ( «Məktəbəqədər və ibtidai təhsil» № 2), b/m. Ə.B.Əkbərovanın

«Xarici dil dərslərində yeni təlim texnologiyalarından istifadə» («Dillər Universitetinin xəbərləri», № 3), fil.e.n.U.B.Mürşüdovanın («Azərbaycan folklorunda ənənəvi davranış», «Filologiya məsələləri», № 4) və «Azərbaycan folkloru Azərbaycan xalqının mənəvi davranışıdır», («Humanitar elmlərinin öyrənilməsinin aktual problemləri». № 1), «Folklor və davranış mədəniyyəti» («Humanitar elmlərinin öyrənilməsinin aktual problemləri», № 2), b/m. Ə.Ə.Musayevanın «Kurikulumun tədrisi prosesində dərsə verilən pedaqoji metodiki tələblər» (Dillər Universiteti. «Kurikulum» jurnalı, № 2) və s. kimi yeni mənbələrə tələbələr sərbəst işləri yazarkən, seminar məşğələlərinə və imtahanlara hazırlaşarkən tez-tez istinad edirlər.

2012-ci hesabat ilində filialda dövlət büdcəsindəн maliyyləşdirilən, təsərrüfat müqaviləli, dövlət qrantları əsasında yerinə yetirilən, respub likadaxili və beynəlxalq qarnatlar ayrılmış elmi-tədqiqat işləri aparılmamışdır.

Filialda tələbələrin elmi - tədqiqat işlərinə cəlb edilməsi, onların elmi-texniki məsələlərin müstəqil həlli texnologiyalarına yiyələnməsi, gələcəkdə elmi-yaradıcı kollektivlərdə işləmək vərdişlərinin formalaşdırılması məqsədlərinə istiqamətləndirilmişdir. Tələbələrin təhsilin sonrakı pillələrində elmi-ixtisas hazırlıqlarını yüksəltmələri məqsədilə filialda Tələbə Elmi Cəmiyyəti yaradılmış, onun işi yeni Əsasnaməyə müvafiq olaraq qurulmuşdur. 24 oktyabr 2012-ci il tarixdə filialda TEC-in yeni təsis konfransı keçirilmiş, konfransda ayrı-ayrı ixtisaslar üzrə tədqiqatçılıq qabiliyyətinə malik, elmi-tədqiqat işlərinə həvəsi olan 134 nəfər tələbə, həmçinin filialın rəhbərliyi və professor-müəllim heyətinin nümayəndələri iştirak etmişlər. Təsis konfransında TEC Şurasının 9 nəfərdən ibarət yeni tərkibi seçilmiş, qruplar və kafedralar üzrə tələbə elmi-tədqiqat işlərinə məsul şəxslər müəyyənləşdirilmişdir. Hər yeni tədris ilinin başlanğıcında Tələbə Elmi Cəmiyyəti Şurasının tərkibi keçirilən konfransda yeniləşdirilir, təhsili başa vuran tələbələrin yerinə yeniləri seçilir. Filialda Tələbə Elmi Cəmiyyətinin fəaliyyətinə cəmiyyətin sədri tarix üzrə fəlsəfə doktoru R.F.Sadıqov rəhbərlik edir.

2012-ci il aprel ayının 17-18-də filialda Azərbaycan Xalqının Ümummilli Lideri H.Ə.Əliyevin anadan olmasının 89 illiyinə həsr olunmuş VI tələbə elmi konfransı keçirilmişdir. Konfransın plenar iclasında 6, 3 bölmə üzrə keçirilən iclaslarda 47 tələbənin məruzəsi dinlənilmişdir. 29 aprel 2012-ci il tarixdə bölmə rəhbərlərinin hesabatları dinlənilmiş, hər bölmə üzrə I, II və III yer tutan ən yaxşı tələbə elmi işlərinin icraçıları müvafiq diplomlarla, digər tələbələr isə fəxri fərmanlarla təltif edilmişlər. Filialın tələbələri Azərbaycan Müəllimlər İnstitutunda və ali məktəb tələbələrinin Respublika Elmi Konfranslarında müntəzəm olaraq iştirak edirlər. Filial tələbələrindən 19 nəfəri AMİ-də keçirilən VI tələbə elmi konfransında iştirak etmiş, 1 nəfər tələbə (İslamzadə Göyçək – İTPM III kurs) III yerə layiq görülmüşdür. 13 nəfər tələbənin işi XXIII Tələbə elmi konfransına tövsiyə edilmişdir.

Tələbələrdən 3 nəfəri 27 aprel 2012-ci il tarixdə Qafqaz Universitetində keçirilmiş II Beynəlxalq tələbə elmi konfransında və 1 nəfəri 5 may 2012-ci il tarixdə Bakı Biznes Universitetində keçirilmiş respublika elmi konfransında iştirak etmiş və onların tezisləri çap olunmuşdur. 19 tələbə 10-11 may 2012-ci il tarixdə Bakı şəhərində keçirilmiş Ali məktəb tələbələrinin XVII fənn olimpiadalarında filialı təmsil etmişlər.

Filialın kafedraları və digər elmi strukturları respublikanın bir sıra ali məktəbləri ilə olduğu kimi, Azərbaycan Milli Elmlər Akademiyasının bəzi sahə institutları ilə sıx əməkdaşlıq əlaqələrinə malikdirlər.



**Kafedrada müzakirə**

Bunun nəticəsidir ki, filialın gənc tədqiqatçılarından 8 nəfəri AMEA-nın Riyaziyyat və Mexanika, Dilzilik, Ədəbiyyat, Mədəniyyət və İncəsənət, Radiasiya Problemləri, Arxeologiya və Etnoqrafiya və s. institutlarının doktorantura və dissertanturalarında öz təhsillərini davam etdirirlər. Filialın professor-müəllim heyətinin və gənc tədqiqatçılarının elmi işləri AMEA-nın müxtəlif nəşrlərində dərc olunur.

Son illər filialın dünyanın bir sıra ölkələri (ABŞ, Rusiya Federasiyası, Tğrkiyə, Fransa, Macarıstan, Qazağıstan və s.) ilə əməkdaşlıq əlaqələri yaranmışdır və bu əlaqələr uğurla davam etdirilir.

«**Azərbaycan Respublikasında 2009-2015-ci illərdə elmin inkişafı üzrə Milli Strategiya»nın və «Azərbaycan Respublikasında 2009-2015-ci illərdə elmin inkişafı üzrə Milli Strategiyanın həyata keçirilməsi ilə bağlı Dövlət Proqramı**»nın icrasını təmin etmək məqsədilə filialda 54 maddədən ibarət Strateji Fəaliyyət Proqramı hazırlanmış, qeyd olunan illər ərzində aparılacaq elmi-tədqiqat işlərinin problematikası, elmi istiqamətləri və əldə edilən nəticələrin tədris prosesinə tətbiqi imkanları müəyyənləşdirilmişdir. 2009-2015-ci illərdə filialda 2 dərsliyin, 13 dərs vəsaitinin, 8 metodik vəsaitin, 2 metodik tövsiyənin, 3 monoqrafiyanın hairlanması və çap etdirilməsi nəzərdə tutulmuşdur. Qeyd olunan dövr ərzində filialda elmi potensialın artırılması, doktorantların və dissertantların elmi-tədqiqat işlərinin yekunlaşdırılması və onların dissertasiya işlərinin vaxtında müdafiə edilməsinə diqqətin artırılması, gənc tədqiqatçıların və magistrlərin doktorantura və dissertantura yolu ilə təhsillərini davam etdirməsi məsələləri geniş əksini tapmışdır.

2012-ci ildə filialda elmi işlərin nəticələrinin tədris prosesinə tətbiq edilməsi meyli xeyli güclənmiş, aparılan elmi tədqiqatların keyfiyyətinin artırılnması və aktuallığının təmin edilməsi diqqət mərkəzində saxlanılmışdır. Filialda elmi tədqiqatların elm və təhsilin inteqrasiyasına yönəldilməsi, gənc tədqiqatçıların və tələbələrin müstəqil elmi axtarışlara istiqamətləndirilməsi sahəsində ardıcıl iş aparılır. Elm və təhsil strukturlarının bir-biri ilə inteqrasiyasının, təhsilin elmlə sintezinin təmin edilməsi filialda elmi tədqiqatların əsas məzmununu təşkil edir.

Filialda «**2009-2013-cü illərdə Azərbaycan Respublikasının ali təhsil sistemində islahatlar üzrə Dövlət Proqramı**»nın icrasını təmin etmək məqsədilə müvafiq tədbirlər planı hazırlanmışdır. Həmin proqramda 2009-2013-cü illərdə filialda fundamental və tətbiqi elmi tədqiqatların prioritet istiqamətləri müəyyən edilmiş, regionların sosial-iqtisadi inkişafı ilə bağlı Dövlət Proqramının həyata keçirilməsində filialın iştirakını təmin etməklə bölgədə elmin inkişafına nail olmaq üçün konkret təkliflər hazırlanmışdır. Filial əməkdaşlarının tamamlanmış elmi-tədqiqat işlərinin nüfuzlu jurnallarda, nəşriyyatlarda, həmzinin beynəlxalq elmi nəşrlərdə çap etrdirilməsi üçün təşəbbüslərin genişləndirilməsi nəzərdə tutulmuşdur. 2009-2013-cü illərdə dövlətlərarası elmi əməkdaşlığın genişləndirilməsi və birgə elmi layihə və proqramların həyata keçirilməsində, beynəlxalq konfrans və simpoziumların işində filial əməkdaşların fəal iştirakına nail olmaq məqsəd kimi qarşıya qoyulmuşdur.

«**Azərbaycan Respublikasında kitabxana–informasiya sahəsinin 2008-2013-cü illərdə inkişafı üzrə Dövlət Proqramı**»nın tələblərindən irəli gələn vəzifələrin yerinə yetirilməsi üçün filialda həmin illəri əhatə edən fəaliyyət proqramı hazırlanmışdır. Professor-müəllim heyətinin, gənc tədqiqatçıların və tələbələrin elmi-tədqiqat işlərinin yerinə yetirilməsində filialda fəaliyyət göstərən kitabxana və oxu zalının, 3 kompüter mərkəzinin müstəsna rolu vardır. Hal-

hazırda filialda 120-dən artıq kompüter, 7 proyektor və digər audio-video avadanlıqlar vardır. Filialın kitabxanasının, kompyuter mərkəzlərinin genişzolaqlı internet şəbəkəsinə qoşulması təmin edilmiş, filialın internet saytı yaradılmışdır və daim yeniləşdirilir. İnternetə çıxış eyni zamanda inzibati idarəetmə ilə yanaşı kafedralarda da təmin edilmişdir. Hal-hazırda filialın kitabxana fondu 13.338 nüsxə dərslik, dərs vəsaiti, monoqrafiya, metodik vəsait və digər elmi və bədii ədəbiyyatlardan ibarətdir. Son illər ərzində filialın kitabxana fondu üçün 400-dən artıq müxtəlif adda dərslik, dərs vəsaiti və digər zəruri ədəbiyyatlar alınmışdır. 2013-cü ilin sonunadək mövcud kitabxana və oxu zalının genişləndirilməsi və əsaslı təmir edilməsi nəzərdə tutulmuşdur.

Filialda 1 kitabxana və 1 oxu zalı fəaliyyət göstərir. Oxu zalından eyni vaxtda 40-a yaxın tələbənin isitifadə etmək imkanı vardır. Kitabxananın ən yeni nəşrlər hesabına elmi ədəbiyyatlarla zənginləşdirilməsi, fond haqqında elektron məlumat bazasının yaradılması sahəsində işlər davam etdirilir.

2012-ci təqvim ilində filialın professor-müəllim heyəti tərkibində 88 nəfər çalışmışdır. Onlardan 62 nəfəri əsas heyətdə, 22 nəfəri əvəzçilik qaydasında, 4 nəfəri isə saathesabı olmaqla işləmişdir. Əməkdaşlardan 3 nəfəri elmlər doktoru (o cümlədən 1 nəfəri professor, 2 nəfəri dosent), 15 nəfəri elmlər namizədi (o cümlədən 6 nəfəri dosent, 2 nəfər dosent əvəzi, 7 nəfər baş müəllim), 25 nəfər elmi dərəcəsi olmayan baş müəllim, 45 nəfər müəllimdir. Filial əməkdaşlarından 2 nəfəri doktorant, 9 nəfəri dissertant, 21 nəfəri magistrdir.

2013-cü ildə Azərbaycan Müəllimlər İnstitutunun Şəki filialında yüksək ixtisaslı elmi və elmi -pedaqoji kadrların hazırlanması, əldə edilmiş elmi nəticələrin tədris prosesinə tətbiq edilməsi, bakalavr pilləsində təhsil alan tələbələrin elmi-nəzəri və praktik hazırlığının yüksəldilməsi, təhsil müəssisəsinin digər ali məktəb və elmi müəssisələrlə əməkdaşlığının artırılması məqsəd və vəzifələri diqqət mərkəzində saxlamışdır. Hesabat ilində filialda müəy-yənləşdirilmiş elmi istiqamətlər institutun profilinə uyğun olaraq seçilmiş, elmi-pedaqoji kadrların və gənc mütəxəsislərin yüksək səviyyədə hazırlanması diqqət mərkəzində saxlanılmışdır. Elmi və elmi–metodiki naliyyətlərin ümumiləş-dirilməsi və yayılması, onun nəticələrinin tədris prosesinə tətbiq edilməsinə diqqət artırılmışdır. Filialda elmi-tədqiqat işlərinin məzmunu və mövzu seçmi elm və təhsilin inteqrasiyasının təmin edilməsinə yönəldilmişdir. Filialda çalışan əməkdaşlar kafedralarda aparılan elmi-tədqiqat işlərində fəal iştirak etmiş, elmi araşdırmalarda doktorant, magistr, dissertant və tələbələrin də iştirakı təmin edilmişdir.

Filialda yerinə yetirilən elmi – tədqiqatlar tədris prosesinin elmi və elmi-metodiki təminatının yüksəldilməsi, informasiya–resurs bazasının yaradılması məqsədinə istiqamətləndirilmişdir. Hal-hazırda Azərbaycan Müəllimlər İnstitutunun Şəki filialında 8 ixtisas üzrə bakalavr pilləsində pedaqoji kadrlar hazırlanır. Ona görə də elmi tədqiqatların mövzu seçimində ayrı-ayrı fənlərin

tədrisi prosesində yeni təlim metodlarının tətbiqi imkanları, yeni tədris texnologiyalarından istifadə və onların metodoloji və informasiya – texniki əsaslarının işlənilib hazırlanması, dil fənlərin tədrisi prosesində innovasiyanın tətbiqi problemləri və həlli yolları, elmi-texniki ideyaların və innovasiyaların reallaşdırılması və s. məsələlər diqqət mərkəzində saxlanılmışdır. Tədqiqatlar zamanı əldə edilmiş nəticələrin təbliğ edilməsi məqsədilə onların bir qisminin nəşri təmin olunmuşdur. Ötən dövr ərzində filialda tədris və elmi proseslərin vəhdətinin təmin edilməsi məqsədilə elmin və istehsalatın, xüsusilə ali məktəbdə tədris olunan fənlərlə orta ümumtəhsil məktəblərində tədris olunan fənlərin inteqrasiyasının formalaşdırılması məsələlərinə xüsusi diqqət yetirilmişdir. Tədris prosesi ilə əlaqədar professor-müəllim heyətinin, gənc tədqiqatçıların, doktorantların və tələbələrin elmi və texniki yaradıcılığının müxtəlif formalarının inkişaf etdirilməsi, onların elmi konfranslarının, olimpiada, müsabiqə və bilik yarışmalarının keçirilməsinə, həmçinin filial tələbələrinin respublika və beynəlxalq miqyaslı elmi konfranslarda və olimpiadalarda iştirakı təmin edilmişdir. Hesabat ili ərzində filialda elmi-tədqiqat işlərinin planlaşdırılması, yerinə yetirilməsi və yekunları ilə bağlı Elmi Şura iclasında hesabatlar dinlənilmiş, açıq müzakirələr aparılmış və müvafiq qərarlar qəbul edilmişdir.

2013-cü hesabat ilində Təbiət fənləri və tədrisi metodikası kafedrası üzrə 23 nəfərdən 14 nəfər, Humanitar elmlər kafedrası üzrə 18 nəfərdən 10 nəfər, Ümumelmi fənlər kafedrası üzrə 23 nəfərdən 13 nəfər, Dillər kafedrası üzrə 24 nəfərdən 17 nəfər elmi-tədqiqat işlərinə cəlb edilmiş, əməkdaşlardan 13 nəfəri magistr, 3 nəfəri elmlər doktoru pilləsi üzrə doktorant, 1 nəfəri fəlsəfə doktoru pilləsi üzrə doktorant, 8 nəfəri isə dissertant olmuşdur. 2013-cü tədris ilində filial əməkdaşlarından 4 nəfəri fəlsəfə doktoru dərəcəsi üzrə dissertasiya işlərini tamamlamışdır. Onlardan 2 nəfəri fəlsəfə doktoru dərəcəsi üzrə dissertasiya işlərini müdafiə etmişlər (Əbdürrəhimov Vüqar Əbülfət oğlu-riyaziyyat üzrə fəlsəfə doktoru və Adışirinov Kamil Fikrət oğlu-filologiya üzrə fəlsəfə doktoru). Filial əməkdaşlarından 1 nəfəri-Rasulov Rafiq Abduləli oğlu riyaziyyat elmləri doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya işini tamamlamış və AMEA-nın Riyaziyyat İnstitutunda müzakirəsi keçirilmişdir.

Filialın kafedraları üzrə 2012-ci ildə müəyyənləşdirilmiş istiqamət və problem müvzular üzrə aparılan elmi-tədqiqat işləri tamamlanmadığından kafedralar 2013-cü ildə də həmin mövzular üzərində elmi və elmi-metodiki araşdırmalarını davam etdirmişlər.

Professor–müəllim heyətinin 2012-2013-cü il tədris ili üçün tərtib etdikləri fərdi iş planlarına əsasən 2013-cü ildə 1 dərsliyin 3 dərs vəsaitinin, 2 monoqrafiyanın, 2 metodik vəsaitin, 1 metodik tövsiyənin, 37 adda məqalənin yazılması və çap edilməsi nəzərdə tutulmuşdur. Hesabat ilində filial əməkdaşları tərəfindən 1 dərslik (F.N.İbrahimov., R.L.Hüseynzadə. Pedaqogika, 2 hissədə, Bakı:Mütərcim, 2013, I hissə 708 səh., II hissə 548 səh.), 2 dərs vəsaiti

(G.A.Abdullayeva., Ş.N.Hümbətova. Müasir Azərbaycan dili. II hissədə. Bakı: Elm və təhsil, 2013, I hissə 346 səh., II hissə 308 səh.). 1 monoqrafiya (M.İ.Əmrahov. Stalinqradda tarixi qələbə. Bakı: ADPU, 2013, 114 səh.), 22 məqalə çap etdirilmiş, 1 monoqrafiya, 1 dərs vəsaiti və 16 məqalə çapa hazırlanmışdır. Filial əməkdaşlarından b/m. H.Ş.Manaflının «Unutdurulmuş zaman Əlabbas Qədimov» adlı monoqrafiyası haqqında Türkiyədə nəşr olunan «Türk yurdu» jurnalının avqust 2012-ci il tarixli sayında, Humanitar elmlər kafedrasının b/m. V.Aslanın poeziya yaradıcılığı haqqında isə Türkiyədə nəşr olunan «Denizlinin sesi» adlı qəzetin 17 iyul 2013-cü il tarixli sayında məqalə dərc olunmuşdur.

Tədris ilində filial əməkdaşlarından t.e.d., prof. M.İ.Əmrahov, f.r.e.n., dos.R.A.Rasulov, fil.dos.əv. G.A.Abdullayeva, ped.e.doktoru, dos. F.N. İbrahimov, p.e.n., dos. N.Z.Çələbiyev, f.r.e.n., b/m. İ.R.Salmanov, p.e.n., b/m. S.R.Bədiyev, fil.e.n, b/m. Ş.N.Hümbətova, fil.e.n., dos. U.B.Mürşüdova, b/m. H.Ş.Manaflı, b/m. V.C.Aslanov, b/m. X.F.Abdullayeva, b/m. S.T.Feyzul layeva, b/m. M.A.Eminova, t.e.n. R.F.Sadıqov, b/m. K.A.Adışirinov, b/m. G.Q.Abdurahmanova, A.M.Adışirinova daha səmərəli çalışmışlar.

2013-cü təqvim ilində filial əməkdaşlarının apardıqları elmi-tədqiqat işləri əsasən tədris prosesi, təhsil sisteminin ayrı-ayrı pillələri və sahələrinə aid olmuş, əldə olunmuş nəticələr əsasən tədris prosesində tələbələrin, müdavimlərin və müəllimlərin istifadəsi üçün tövsiyyə xarakteri daşımışdır. Tələbələr və müdavimlər həmin tədqiqat işlərinin nəticələrindən seminar məşğələlərinə hazırlaşarkən, sərbəst və buraxılış işlərini yerinə yetirərkən habelə imtahanlara hazırlaşarkən istifadə edirlər.

2012-2015-ci illəri əhatə edən elmi-tədqiqat işlərinin perspektiv planına əsasən 2013-cü ildə filial əməkdaşları tərəfindən 54 elmi-tədqiqat işi yerinə yetirilmişdir.

2013-cü ildə filial əməkdaşlarından 3 nəfəri p.e.n, b/m.S.R.Bədiyev, t.e.n.R.F.Sadıqov və b/m.M.A.Eminova 4 aprel 2013-cü il tarixdə AMEA-nın İnsan Hüquqları İnstitutunda keçirilmiş «**Soyqırımı və terror erməni ideologiyasının əsas amilləri kimi»** mövzusunda beynəlxalq konfransda, p.e.n.,dos.N.Z.Çələbiyev və m.K.F.Şirinova 3-4 may 2012-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetində keçirilmiş, Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin anadan olmasının 90 illiyinə həsr olunmuş **«Müəllim hazırlanma siyasəti və problemləri**» adlı beynəlxalq simpoziumda çıxış etmiş və onların tezisləri çap olunmuşdur. Filialın Təbiət elmləri və tədrisi metodikası kafedrasının dosenti, f.r.e.n. R.A.Rasulov və həmin kafedranın b/m. M.N.Kərimova 13-17 may 2013-cü il tarixlərdə Ukrayna Respublikasında keçirilmiş beynəlxalq konfransda çıxış etmişlər. Filial əməkdaşlarından 8 nəfəri p.e.d. F.N.İbrahimov, dos. N.Z.Çələbiyev, dos.U.B. Mürşüdova, b/m.S.R.Bədiyev, b/m. Ə.B.Əkbərova, b/m.V.N.İsmayılov, müəl.T.B.Namazov və müəl.

İ.M.Abdusəlimli 2014-cü ilin aprelində Azərbaycan Müəllimlər İnstitutunda keçirilməsi nəzərədə tutulmuş «Müəllim hazırlığının müasir problemləri: texnologiya, təhsil və inkişaf» mövzusunda III Beynəlxalq elmi konfransda iştirak etmək üçün tezislərini təqdim etmişlər. Filialın Təbiət elmləri və tədrisi metodikası kafedrasının müdiri dos.Y.H.Şükürlü 20-21 dekabr 2013-cü ildə Bakı Dövlət Universiteti Fizika Problemləri Elmi Tədqiqat İnstitutunda «Opto, nanoelektronika kondensə olunmuş mühit və yüksək enerjilər fizikası» mövzusunda keçiriləcək VII Respublika elmi-praktik konfransında iştirak etmək üçün tezisi təqdim etmişdir.

2013-cü təqvim ilində filial əməkdaşları tərəfindən tamamlanmış və çap edilmiş elmi-tədqiqat işləri nəticələrindən tədris prosesində geniş istifadə olunur. Məsələn, p.e.d., dosent.F.N.İbrahimov və R.L.Hüseynzadənin birgə müəllifliyi ilə çap olunmuş 2 hissədən ibarət «Pedaqogika» dərsliyi, fil.e.n., b/m.Ş.N.Hümbətova və fil.e.n.,b/m.G.A. Abdullayevanın Xarici dil (İngilis dili) ixtisası tələbələri üçün tərtib etdikləri 2 hissədən ibarət «Müasir Azərbaycan dili» dərs vəsaitləri tələbələrin zəruri ədəbiyyata olan ehtiyacının ödənilməsində mühüm rol oynayır. 2013-cü il hesabat ilində filial əməkdaşlarından p.e.d.F.N.İbrahimovun «İstedadlı uşaqların təliminin metodik sistemi» («Humanitar elmlərin öyrənilməsinin aktual problemləri», B, 2013, №1); «Təhsil tarixi kursunun pedaqoji kadr hazırlığında yerinə dair» («Humanitar elmlərin öyrənilməsinin aktual problemləri», B, 2013, № 2), dos.N.Z.Çələbiyevin «Uşaqların psixi inkişafının senzitiv yaş dövrləri («Təhsil» jurnalı, B, 2013, № 9), p.e.n., b/m . Ə.A.Süleymanovun «Sarıbaşın folklor dünyası» («Folklor və etnoqrafiya», B, 2013, №3), b/m. X.F.Abdul-layevanın «XIII-XIV əsrlər Azərbaycan ədəbi dilində tabeli mürəkkəb cümlə komponentləri inversiyasında aktuallaşmanın rolu» (AMEA, «Filologiya məsələləri», B, 2013, № 3), b/m. G.Q.Abdurah manovanın «Delphi mühitində elektron testlərin hazırlanması qaydası» («Mediya və təhsil innovasiyaları», B, 2013, № 3) məqalələri çap olunmuşdur.

Bundan başqa filial əməkdaşlarından dos. F.N.İbrahimovun Rusiya Federasiyyasında nəşr olunan nüfuzlu jurnallarda 2 məqaləsi (Образовании как непрерывный процесс. Философический аспект болонского процесса. Международная научно-практическая конференция. Полтава 2013. Воспитании в плоскости анализа «Система-структура». Фундаментальные и прикладные проблемы науче.Москва, 2013) məqalələri dərc olunmuşdur.

2013-cü hesabat ilində filialda dövlət bğdcəsindən maliyyləşdirilən, təsərrüfat müqaviləli, dövlət qrantları əsasında yerinə yetirilən, respublika daxili və beynəlxalq qarnatlar elmi-tədqiqat işləri olmamışdır.

2013-cü ildə filialda tələbələrin elmi–tədqiqat işlərinə cəlb edilməsi, onların elmi-texniki məsələlərin müstəqil həlli texnologiyalarına yiyələnməsi, gələcəkdə elmi-yaradıcı kollektivlərdə işləmək vərdişlərinin formalaş dırılması məqsədlərinə istiqamətləndirilmişdir.

2013-cü il aprel ayının 22-23-də filialda Azərbaycan Xalqının Ümummilli lideri H.Ə.Əliyevin anadan olmasının 90 illiyinə həsr olunmuş VII tələbə elmi konfransı keçirilmişdir. Konfransın plenar iclasında 4, 3 bölmə üzrə keçirilən iclaslarda isə 55 tələbə elmi işi üzrə məruzələr dinlənilmişdir. Filialın tələbələrindən 3 nəfəri 25 may 2013-cü il tarixdə AMİ-də poster formatında keçirilmiş 28 may Respublika gününə həsr olunmuş elmi konfransında iştirak etmişlər. 26 may 2013-cü il tarixdə filialın tələbələrindən ibarət 2 komanda «İrəli» İctimai Birliyi və «Xəzər» İntellektual Gənclər kulubunun dəvəti ilə Azərbaycan Respublikası Prezidenti yanında Gənclər Fondunun dəstəyi ilə Bakı şəhərində keçirilmiş «Nə? Harada? Nə zaman?» oyunu üzrə respublika tələbələrinin bilik yarışmasında iştirak üçün vəsiqə qazanmış və müsabiqədə iştirak etmişlər. Onlardan 1 nəfər tələbə (Abduləlimli Gülnar-X/d. III kurs) fərqləndirici yerə layiq görülmüşdür. 11 nəfər tələbənin işi isə XXIV Respublika Tələbə elmi konfransına tövsiyə edilmişdir.

01 dekabr 2013-cü il tarixdə «Xəzər» İntellektual Oyun Klubunun təşkilatçılığı ilə keçiriləcək VII Çağırış Kubokunda iştirak etmək üçün filialın seçim turunda qalib gəlmiş iki komandası dəvət almışdır.

Son illər filialın dünyanın bir sıra ölkələri (ABŞ, Rusiya Federasiyası, Tğrkiyə, Fransa, Macarıstan, Ukrayna, Qazaxıstan və s.) ilə əməkdaşlıq əlaqələri yaranmışdır və bu əlaqələr uğurla davam etdirilir.

**2014-cü hesabat ilində** filialda elmi-tədqiqat işləri 54 mövzu üzrə davam etdirilmişdir. 2014-cü ildə filialda elmi-tədqiqat işlərinə cəlb edilmiş əməkdaşlardan 13 nəfəri magistr, 2 nəfəri elmlər doktoru pilləsi üzrə doktorant, 2 nəfəri fəlsəfə doktoru pilləsi üzrə doktorant, 8 nəfəri isə dissertant olmuşdur. 2014-cü tədris ilində filial əməkdaşlarından 4 nəfəri fəlsəfə doktoru dərəcəsi üzrə dissertasiya işlərini tamamlamışdır. Filial əməkdaşlarından 1 nəfəri-Rasulov Rafiq Abduləli oğlu riyaziyyat elmləri üzrə ellər doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya işini tamamlamış və 31 oktyabr 2014-cü il tarixdə AMEA-nın Riyaziyyat İnstitutunda fəaliyyət göstərən ixtisaslaşmış müdafiə şurasında (D 01.111) «Qeyri- xətti parabolik və hiperbolik tənliklərin həllərinin keyfiyyət xassələri» (1212.01-riyazi-fizika tənlikləri) mövzusunda riyaziyyat üzrə elmlər doktoru elmi dərəcəsi almaq üçün dissertasiya işini müvəffəqiyyətlə müdafiə etmişdir.

Hesabat ilində filial əməkdaşlarından f.r.e.n.,dos.R.A.Rasulov, fil.dos. G.A.Abdullayeva, ped.e.doktoru, prof. F.N. İbrahimov, p.e.n., dos. N.Z.Çələbiyev, p.e.n., b/m.S.R.Bədiyev, fil.e.n, b/m. Ş.N.Hümbətova, fil.e.n., dos.U.B. Mürşüdova, b/m.N.R.Məsimova, b/m.H.Ş.Manaflı, b/m.V.C.Aslanov, b/m.S.T. Feyzullayeva, b/m. Ə.Ə.Musayeva, b/m.K.A.Adışirinov, b/m. G.Q. Abdurah-manova, müəl. İ.M.Abdusəlimli, müəl.T.B.Namazov, müəl. A.M.Adışirinova daha səmərəli çalışmışlar.

2014-cü ildə filial əməkdaşları tərəfindən 2 metodik vəsait (p.ü.f.d.,b/m.S.R.Bədiyev-«Yeni təlim texnologiyalarından mühazirə mətnləri». Bakı, 2014, 140 səh., fil.ü.f.d., dos.G.A.Abdullayeva, p.ü.f.d., b/m.Ə.A. Süleymanov- «Ali və orta məktəblərdə Azərbaycan dilinin inteqrativ tədrisi» Bakı: Müəllim 2014, 164 səh.), bir monoqrafiya (b/m.N.R.Məsimova-«Ferdinand de Süsser və onun elmi təlimi», Bakı: Elm və təhsil, 2014, 268 səh.), 2 fənn proqramı (fil.ü.f.d.,dos.G.A.Abdullayeva, fil.ü.f.d.,dos.Ş.N.Hümbətova. Müasir Azərbaycan dili. Bakı: Müəllim, 2014, 16 səh., fil.ü.f.d.,dos.G.A.Abdullayeva, b/m. V.C.Aslanov.Ədəbi tənqid tarixi (seçmə fənn), Bakı: Müəllim, 2014, 20 səh.) çap olunmuşdur.

2014-cü təqvim ilində filial əməkdaşları tərəfindən tamamlanmış və çap edilmiş elmi-tədqiqat işləri nəticələrindən tədris prosesində geniş istifadə olunur. Məsələn, p.ü.f.d.,b/m.S.R.Bədiyevin «Yeni təlim texnologiyalarından mühazirə mətnləri». (Müəllimlər üçün metodik vəsait. Bakı:Mütərcim, 2014, 140 səh.), fil.ü.f.d.,dos.G.A.Abdullayeva və p.ü.f.d.,b/m.Ə.A. Süleymanovun- «Ali və orta məktəblərdə Azərbaycan dilinin inteqrativ tədrisi». BakI: Müəllim, 2014, 164 səh.) adlı metodiki vəsaitlərindən tələbələr tədris prosesində faydalanırlar.

2014-cü ildə filialda tələbələrin elmi–tədqiqat işlərinə cəlb edilməsi, onların elmi-texniki məsələlərin müstəqil həlli texnologiyalarına yiyələnməsi, gələcəkdə elmi-yaradıcı kollektivlərdə işləmək vərdişlərinin formalaş dırılması məqsədlərinə istiqamətləndirilmişdir. Filialın tələbələri Azərbaycan Müəllimlər İnstitutunda və ali məktəb tələbələrinin Respublika elmi konfranslarında müntəzəm olaraq iştirak edirlər. Filial tələbələrindən 6 nəfəri (Aygün Hüseynova, Pərvin Rəhimov, Zülfiyə Mustafazadə, Aygün Məcidli, Əfsanə Bünyaminzadə, Nərgiz Rsulova), 7 may 2014-cü il tarixdə AMİ-də keçirilmiş Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin anadan olmasının 91-ci il dönümünə həsr VIII tələbə elmi konfransında iştirak etmişlər və onların tezisləri çap olunmuşdur.

2014-cü təqvim ilində filialın professor-müəllim heyəti tərkibində **95 nəfər** çalışmışdır. Onlardan 47 nəfəri əsas heyətdə, 17 nəfəri əsas əvəzi heyətdə, 25 nəfəri əvəzçi heyətdə, 6 nəfəri isə saathesabı qaydada işləmişdir. Əməkdaşlardan 3 nəfəri elmlər doktoru, professor, 18 nəfəri fəlsəfə doktoru (o cümlədən 8 nəfəri dosent, 10 nəfər baş müəllim), 30 nəfər elmi dərəcəsi olmayan baş müəllim, 44 nəfər mğəllimdir. Filial əməkdaşlarından 2 nəfəri doktorant, 8 nəfəri dissertant, 21 nəfəri magistrdir.

Qeyd edidiyi kimi, filialın fəaliyyət istiqamətlərindən biri müəllimlərin **ixtisasının artırılması, təkmilləşdirilməsi və yenidənhazırlanmasının** təşkilidir. Bu istiqamətlərdəki işləri əlaqələndirmək məqsədilə filialda əlavə təhsil üzrə direktor müavini vəzifəsi təsis olunmuş və *«Əlavə təhsilə metodiki xidmət»* kabineti təşkil edilmişdir.

Filialda diplomdan sonrakı təhsilin ayrılmaz hissəsi olan ixtisasartırma təhsilinin təşkili diqqət mərkəzindədir. Təhsilin bu növü yeni «tələb-təklif» prinsipi əsasında qurulur. Respublika Təhsil nazirliyinin 21 fevral 2000-ci il tarixli 164 nömrəli əmrinə uyğun olaraq pedaqoji kadrların ixtisasının artırılması prosesinin təkmilləşdirilməsi sahəsində yeni mexanizmin tətbiqi davam edir.

İxtisasartırma təhsili üzrə filialın dislokasiyasına Şəki, Oğuz və Qəbələ rayonlarının ümumtəhsil məktəbləri və məktəbəqədər tərbiyə müəssisələri daxildir. Hər il filialda adları qeyd olunan rayonlardan olan 450-500 nəfər müəllim ixtisasartırma təhsili kurslarında iştirak etməklə özlərinin peşə ustalığını artırır, yeni pedaqoji texnologiyalara, xüsusilə interaktiv (fəal) təlim metodlarına yiyələnirlər.

Filialda ixtisasartırma kurslarında dərsləri elmi dərəcəsi olan yüksək ixtisaslı mütəxəssislər, «Öyrədənləri öyrədən» statusu almış filial əməkdaşları və ümumtəhsil məktəblərinin tanınmış müəllimləri aparırlar. İxtisasartırma təhsili məşğələlərini aparan müəllimlərdən 3 nəfəri xarici ölkələrdə (ABŞ, Fransa) 3 aylıq ixtisasartırma kurslarından keçmiş və müvafiq sertifikat almış, 10 nəfər əməkdaş SOROS fondu və BRİTİSH COUNCİL tərəfindən təlimlər layihəsi çərçivəsində təşkil olunan treninq və seminarlardan keçərək sertifikatlara yiyələnmişlər.

Filialda ixtisasartırma təhsilinin təşkili üçün hər il kabinetlər tərəfindən iş planı tərtib edilir, rayon (şəhər) təhsil şöbələrinin metodiki kabinetləri ilə birlikdə sifarişlər hazırlanır, ixtisasartırma təhsilinə cəlb olunacaq kontingent müəyyənləşdirilir və təhsil şöbələri ilə müvafiq formada müqavilələr imzalanır. Bunun üçün ilk növbədə müəllimlərin ixtisasartırma təhsilinə olan tələbatını öyrənmək məqsədilə monitorinqlər, anket sorğuları keçirilir, dayaq məntəqələrində müşahidələr aparılır, yeni təlim texnologiyalarının tətbiqinə həsr edilmiş dərslər keçirilir, seminarlar, «dəyirmi masa»lar təşkil edilir. Əldə olunan nəticələr əvvəl məktəblər, daha sonra isə rayon üzrə ümumiləşdirilir. Təhsilin ayrı-ayrı pillələri üçün ixtisasartırma təhsili planlaşdırılarkən müəllimlərin kateqoriyası, iş stajları, peşəkarlıq səviyyəsi, peşə ustalığı, elmi – nəzəri bilikləri, metodiki hazırlığı və intellektual səviyyəsi diqqət mərkəzində saxlanılır.



*İxtisasartırma təhsilinin yekunları müzakirə olunur*

Aparılmış statistik təhllilər göstərir ki, filialda müəllimlərin ixtisas artırma təhsilinin inkişaf dinamikası yüksələn xətlə inkişaf etmiş, ixtisasartırma təhsilinə cəlb olunanların sayı ildən-ilə artmışdır. 2001-2002- ci tədris ilində 206 nəfər, 2002-2003-cü tədris ilində 257 nəfər, 2003-2004-cü tədris ilində 211 nəfər, 2004-2005-ci tədris ilində 586 nəfər, 2005- 2006-cı tədris ilində 519 nəfər, 2006-2007-ci tədris ilində 306 nəfər, 2007-2008-ci tədris ilində 383 nəfər, 2008-2009-cu tədris ilində 452 nəfər, 2009-2010-cu tədris ilində 478 nəfər, 2010-2011-ci tədris ilində 481 nəfər, 2011-2012-ci tədris ilində 465 nəfər, 2012-2013-cü tədris ilində 486 nəfər, 2013-2014-ci tədris ilində 505 nəfər, ümumilikdə 2001-2014-cü illərdə **5.000** nəfərdən artıq müəllim ixtisasartırma təhsilinə cəlb edilmişdir.

Filialın fəaliyyətinin üçüncü istiqamətini **yenidənhazırlanma təhsili** təşkil edir. Bu sahədə tədris prosesi baza insititutu olan AMİ tərəfindən hazırlanmış tədris planları və proqramları əsasında qurulur. Hesabatlardan aydın olur ki, hər il orta hesabla 30-50 nəfər müxtəlif ixtisaslardan olan pedaqoji işçilər ali təhsil bazasından ikinci pedaqoji ixtisasa yiyələnmişlər. Hazırda filialda 2 ixtisas (Azərbaycan dili və ədəbiyyatı, Məktəb psixologiyası) üzrə müəllimlərin yenidənhazırlanma kurslarına dinləyisi qəbulu həyata keçirilir.

Filialda yenidənhazırlanma kurslarında tədrisin keyfiyyətinin yaxşılaşdırılması daim diqqət mərkəzində saxlanılır. Kurslarda tədrisi filialın ən yaxşı müəllimləri aparırlar. Tarix üzrə elmlər doktoru, professor M.Əmrahov, fizika-riyaziyyat üzrə elmlər doktoru, dosent R.Rasulov, fizika-riyaziyyat üzrə fəlsəfə doktoru V.Abdurahmanov, pedaqogika üzrə fəlsəfə doktoru, dos. N.Z.Çələbiyev, filologiya üzrə fəlsəfə doktorları, dosentlər G.Abdullayeva, Ş.Hümbətova,

U.Mürşüdova, müəllimlərdən X.Həmidova və başqaları tədrisin keyfiyyətli təşkilində fəallıq göstərirlər. Tədris ili prosesində filialda keçirilən tədbirlərdə, əlamətdar günlərə həsr edilmiş yığıncaq, konfrans və elmi – nəzəri seminarlarda dinləyicilərin iştirakı təmin edilir. Dinləyicilər filialın kitabxanasından, kompüter zalından, internetdən və digər köməkçi vasitələrdən istifadə edirlər.

AMİ-nin Şəki filialına təsis olunan gündən ***Rasulov Rafiq Abduləli oğlu*** rəhbərlik edir.[485]

Filialın tədris işləri üzrə direktor müavini *Gülarə Abdullayevadır.*



***Gülarə Abdurahman qızı Abdullayeva*** *1970-ci ildə Şəki rayonunun Qoxmuq kəndində anadan olub. 1977-1987-ci illərdə Qoxmuq kənd orta məktəbində, 1987-1992-ci illərdə ADPU-nun filologiya fakültəsində, 1992-1995-ci illərdə həmin universitetdə «Xalqların dilləri» ixtisası üzrə aspiranturasında təhsil almışdır. 1995-ci ildən 2000-ci ilədək Bakı Dövlət Universitetinin Şəki filialında baş müəllim, ictimai əsaslarla Dillər kafedrasının müdiri, filologiya fakültəsinin dekanı vəzifələrində çalışmışdır.*

*G.Abdullayeva 2000-ci ildən Azərbaycan Müəllimlər İnsitutunun Şəki filialında pedaqoji fəaliyyətini davam etdirir. 2001-ci ilin avqustunda filialda tədris işləri üzrə direktor müavini vəzifəsinə təyin edilmişdir. Hazırda o, həmin vəzifədə işləyir.*

Filialda elmi işlər və metodiki məsələlər üzrə direktor müavini vəzifəsinə Nuralı Çələbiyev təyin edilmişdir.

**Çələbiyev Nuralı Zərbalı oğlu-***1959-cu ildə Vartaşen (indiki Oğuz) rayonunun Bucaq kəndində anadan olmuşdur. 1977-ci ildə Oğuz şəhər 2 nömrəli məktəbi, 1981-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU) Pedaqoji fakültəsini fərqlənmə diplomu ilə bitirmişdir.*



*N.Çələbiyev 1981-1983-cü illərdə Vartaşen (indiki Oğuz) rayonunun Astraxanovka və Qarabulaq kənd orta məktəblərində müəllim, 1983-1987-ci illərdə Muxas kənd orta məktəbində tədris işləri üzrə direktor müavini, 1987-1990-cı illərdə rayon təhsil şöbəsində metodist, 1990-1993-cü illərdə məktəb inspektoru vəzifələrində işləmişdir.*

*N.Çələbiyev 1987-1991-ci illərdə APİ-nin (idiki ADPU) aspiranturasında «Yaş və pedaqoji psixologiya» ixtisası üzrə qiyabi təhsil almış, 1991-ci ildə pedaqogika üzrə fəlsəfə doktoru dissertasiyası müdafiə etmiş, 2008-ci ildə dosent elmi adı almışdır.*

Nuralı müəllim 1993-cü ildən 2000-ci ilədək Bakı Dövlət Universitetinin Şəki filialında baş müəllim, dekan, kafedra müdiri vəzifələrində çalışmış, 2000-ci

ildən Azərbaycan Müəllimlər İnstitutunun Şəki filialında əmək fəaliyyətini davam etdirir. 2006-cı ildən filialda elmi işlər üzrə direktor müavini vəzifəsində çalışır. N.Çələbiyevin Respublikanın nüfuzlu jurnallarında 40-dan artıq elmi və elmi-metodiki məqaləsi dərc olunmuşdur. Onun «Məktəblilərdə qabiliyyətin inkişafı və tərbiyəsi» (metodiki tövsiyə, Bakı, 2000), «Psixodiaqnostika məsələləri (dərs vəsaiti, Bakı, 2003), «Uşaq psixologiyası (dərs vəsaiti, Bakı, 2005), «Təhsil sistemində psixoloji xidmət: nəzəriyyə və təcrübə». 2 cilddə, (dərs vəsaiti, Bakı, 2009) kimi əsərləri müəllim və tələbələrin stolüstü kitabına çevrilmişdir. Respublikada keçirilən beynəlxalq və respublika elmi, elmi-nəzəri konfransların fəal iştirakçısı olan N.Çələbiyev 2000 və 2002-ci illərdə Respublika Pedaqoji mühazirələrinin qalibi olmuş, Respublika Təhsil nazirliyinin və Şəki Şəhər İcra Hakimiyyətinin fəxri fərmanları ilə təltif olunmuş, 2011-ci ildə «Qızıl qələm» mükafatına layiq görülmüşdür.

Əlavə təhsil üzrə direktor müavini vəzifəsini X. Həmidova icra edir.



**Xuraman İsa qızı Həmidova** 1963-cü ildə Nuxa rayonunun Baş Layskı kəndində anadan olmuşdur. 1980-ci ildə Şəki şəhər 10 nömrəli məktəbi, 1985-ci ildə Bakı Dövlət Universitetinin tətbiqi-riyaziyyat fakültəsini bitirmişdir. Əmək fəaliyyətinə 1985-ci ildə Şəki Dəmir Beton Ağac Məmulatı və Metal Konstruksiyaları İstehsalı Eksperimental zavodunda iqtisadçı kimi başlayan X.Həmidova qısa müddətdə özünü bacarıqlı və savadlı işçi kimi göstərə bilmiş, həmin müəssisədə baş laborant vəzifəsinə təyin olunmuş, 1999-cu ildə pedaqoji sahədə əmək fəaliyyətini davam etdirmişdir.

2000-ci ildən filialda baş müəllim, dekan, kabinet müdiri vəzifələrində çalışan X.Həmidova 2009-cu ilin oktyabrından əlavə təhsil üzrə direktor müavini vəzifə sinə təyin olunmuşdur. 1998-ci ildən YAP-nın üzvü, ərazi qadınlar şrasının sədridir. Bir neçə elmi məqalənin müəllifidir.

# V FƏSİL

# MƏNƏVİYYATIMIZIN MEMARLARI. ŞƏKİNİN ƏMƏKDAR MÜƏLLİMLƏRİ. [486]

*Həyatını müəllimliyə həsr edən insanlar, həqiqətən, fədakar, xalqına, millətinə sədaqətli və eyni zamanda qəhrəmanlıq göstərən insanlardır.*

*Biz hamımız həyatımızda əldə etdiyimiz nailiyyətlərə, bütün varlığımıza görə müəllimlərə borcluyuq.*

***Heydər Əliyev***






**ABDULLAYEVA RUHƏNGİZ İSA QIZI (1954) -** 1954-cü ildə Nuxa şəhərində anadan olmuşdur. İlk təhsilini şəhər 11 nömrəli məktəbdə alan R.Abdullayeva 1971-ci ildə orta məktəbi bitirərək H.Zərdabi adına Kirovabad Pedaqoji İnstitutunun (indiki Gəncə Dövlət Universiteti) tarix fakültəsinə daxil olmuş, 1975-ci ildə ali məktəbi bitirərək Şəki şəhərindəki 11 nömrəli məktəbdə əmək fəaliyyətinə başlamışdır.

R.Abdullayeva işlədiyi dövrdə müəllim və şagirdlərin hörmətini qazana bilmiş, 1975-1979-cu illərdə məktəb komsomol təşkilatının sədri, 1980-1996-cı illər-

də tarix fənni üzrə məktəb fənn birləşməsinin sədri olmuşdur. 2002-ci ildən məktəb metodiki şurasının sədridir.



R.Abdullayeva 2004-cü ildə «İlin ən yaxşı müəllimi» Respublika müsabiqəsində III dərəcəli diplomla təltif olunmuş, 2005-ci il ilin oktyabrında Azərbaycan Respublikası Prezidentinin fərmanı ilə **«Azərbaycan Respublikasının əməkdar müəllimi»** fəxri adına layiq görülmüşdür.

**Abdullayeva Ruhəngiz İsa qızı** hazırda Şəki şəhərindəki 11 nömrəli məktəbdə tarix müəllimi işləyir.

**ADIŞİRİNOV AYDIN RƏSUL OĞLU (1950)** - 1950-ci il sentyabrın 9-da Nuxa rayonunun Oxut kəndində anadan olmuşdur. 1967-ci ildə həmin kənddəki orta məktəbi bitirdikdən sonra H.Zərdabi adına Kirovabad Dövlət Pedaqoji İnstitutunun (indiki Gəncə Dövlət Universiteti) riyaziyyat fakültəsinə qəbul olunmuş, 1971-ci ildə ali məktəbi əla qiymətlərlə bitirib doğma kəndində riyaziyyat müəllimi kimi fəaliyyətə başlamışdır.

A.Adışirinov 1972-1973-cü illərdə hərbi xidmət də olmuş, 1973-cü il sentyabrın 1-dən müəllimlik fəaliyyətini davam etdirmişdir. 1981/82-ci tədris ilində dərs dediyi şagirdlərdən 5 nəfəri «Qızıl medal»a layiq görülmüşdür. 2003-cü ildə Azərbaycan müəllimlərinin XII qurultayının iştirakçısı olmuşdur.



Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin ***4 oktyabr 2010-cu*** il tarixli sərəncamı ilə təhsil sahəsində səmərəli fəaliyyətinə görə A.Adışirinov **«Azərbaycan Respublikasının əməkdar müəllimi»** fəxri adına layiq görülmüşdür.

***Adışirinov Aydın Rəsul oğlu*** hazırda Şəki rayonundakı Oxut kənd tam orta məktəbində ixtisası üzrə müəllim işləyir.

**AXUNDOVA DİLƏFRUZ BAXŞƏLİ QIZI (1925) – 1925-ci ildə** Nuxada anadan olmuşdur. O, əvvəlcə Stalin adına Nuxa Pedaqoji məktəbində, sonra İkiillik Müəllimlər İnstitutunda qiyabi təhsil almış, 1942-ci ildən əmək fəaliyyətinə başlamışdır. Təyinatla Balakən rayonunun Tala kənd 1 nömrəli məktəbində işləyən gənc Diləfruz tez bir zamanda pedaqoji kollektivin hörmətini qazanmış, sonra Nuxaya qayıdaraq rayonun Baş Zəyzid kənd və 10 nömrəli şəhər məktəbində işləmişdir.

Diləfruz müəllimə 1964-cü ildə «Qabaqcıl maarif xadimi», 1970-ci ildə **«Rəşadətli əməyə görə»** medalı, 1971-1976-cı illərdə Fəxri fərmanlarla təltif olunmuş, ***1982-ci il sentyabrın 30-da Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fərmanı ilə*** 5 nömrəli məktəbin 150 illiyi münasibətilə **«Azərbaycan**

**SSR əməkdar müəllimi»** fəxri adına layiq görülmüşdür. Azərbaycan müəllimlərinin 1987-ci ildə keçirilən VII qurultayına nümayəndə seçilən ***Axundova Diləfruz Baxşəli qızı hazırda təqaüddədir.***



**ALLAHYAROV MƏMMƏD BAĞIR OĞLU *(1918-1993) -*** 1918-ci ildə Nuxada anadan olmuşdur. 1936-cı ildə Nuxa Pedaqoji Məktəbinə daxil olmuş, təhsilini başa vurduqdan sonra rayonun Aydınbulaq sovetliyinin Ağpillələn kəndində əmək fəaliyyətinə başlamışdır. Qısa müddətdə pedaqoji kollektivin və valideynlərin hörmətini qazanan Məmməd müəllim direktor vəzifəsinə irəli çəkilmiş, təhsil sahəsində əldə etdiyi müvəffəqiyyətlərə görə rayon xalq maarif şöbəsi tərəfindən dəfələrlə mükafatlandırılmışdır.

Məmməd müəllim bütün gənclər kimi ordu sıralarında xidmət etmişdir. Lakin sovet-alman müharibəsinin başlanması onun hərbi xidmətdən geri dönməsinə imkan verməmiş, döyüş cəbhələrində iştirak etmiş, 1946-cı ildə ordu sıralarından tərxis olunmuşdur. Döyüş xidmətlərinə görə orden və medallarla təltif olunmuşdur.

Ordudan tərxis olunan M.Allahyarov təhsilini artırmaq üçün M.F.Axundov adına Rus dili və Ədəbiyyatı İnstitutuna qəbul olunmuşdur. İkiillik təhsildən sonra əmək fəaliyyətinə başlayan Məmməd müəllim 1959-1988-ci illərdə Nuxa pedaqoji məktəbində pedaqoji fəaliyyətini davam etdirmişdir. Təhsil sahəsində qazandığı müvəffəqiyyətlərə görə «**Azərbaycan SSR əməkdar müəllimi**» fəxri adına layiq görülmüşdür.

Əmək fəaliyyətini 1988-1993-cü illərdə 91 nömrəli texniki peşə məktəbində davam etdirən ***Allahyarov Məmməd Bağır oğlu 1993-cü ildə dünyasını dəyişmişdir.***



**BABAYEVA AMİNƏ CABBAR QIZI (1914-1977) - 1914-cü ildə** Nuxa şəhərində anadan olmuş, Nuxa İkiillik Müəllimlər İnstitutunun və ADPU-nun tarix fakültəsini bitirmişdir. A.Babayeva Nuxa şəhərindəki 10 nömrəli məktəbdə müəllim, Nuxa Şəhər İcraiyyə Komitəsində sədr müavini, 1957-1967-ci illərdə Nuxa Pedaqoji Məktəbinin direktoru vəzifələrində işləmiş, *Azərbaycan SSR Ali Sovetinə deputat* seçilmişdir.

Hörmətli oxucu, Aminə Babayeva haqqında Sizin nəzərinizə çatdırılan məlumatlar heç bir yerdən götürül məmişdir. Bunlar böyük pedaqoqun rəhbəri olduğu dövr-də pedaqoji məktəbdə oxumuş, 14-18 yaşlarında Aminə Babayevanın qayğısını hiss etmiş bir tələbənin, kitabın

müəlliflərindən olan –M.Əmrahın ürək sözləridir.

Əmrahov Mais İsrail oğlu 1962-ci ildə Cəfərabad kənd məktəbinin 8-ci sinfini bitirib Nuxa pedaqoji məktəbinə sənədlərini verir. Məktəbi fərqlənmə şəhadətnaməsi ilə bitirdiyi üçün o zamankı qəbul qaydalarına əsasən məktəbə imtahansız qəbul olunmalı, lakin pedaqoji məktəbin «ibtidai sinif müəllimi» şöbəsinə sənəd verənlər musiqidən qabiliyyət imtahanı verməli idilər. M.Əmrahov da sənədlərini ibtidai sinif müəllimi şöbəsinə verdikdən sonra musiqidən imtahana hazırlaşmağa başlayır. M.Əmrahov söyləyir ki, texnikumda qabiliyyət imtahanlarına hazırlıq işi yaxşı təşkil edilmişdi. Aminə Babayevanın göstərişi ilə həftənin müəyyən günlərində məsləhət saatları təyin edilmişdi və tələbələr həmin məsləhət saatlarında iştirak edir, musiqi savadlarını artırırdılar. Çünki, o zaman heç bir kənd məktəbində musiqi dərsi tədris edilmirdi, əslində bu dərsin adı var idi. Nə musiqi savadlı müəllim vardı, nə də maddi – texniki baza.

Beləliklə, avqust ayı yetişir. Əsas hadisə də bu zaman baş verir. Sənəd verən əlaçı tələbələrə bildirilir ki, texnikumlara qəbul qaydalarında edilən dəyişikliyə əsasən sənəd verənlər ana dili və riyaziyyatdan imtahan verməlidirlər. Bu xəbər valideynləri və abituriyentləri məyus edir, hətta sənədlərini geri götürənlər də olur.

Nəhayət, imtahanlar başlayır. İmtahanlarda Aminə müəllimə şəxsən iştirak edir, yaxşı tələbələri seçir. Öncə tələbələrin, o cümlədən M.Əmrahovun musiqi savadını yoxlayır, onu xeyli sual-cavab edirlər. Təbii ki, tələbələrin, o cümlədən M.Əmrahovun musiqi savadım qənaətbəxş ola bilməzdi, ancaq qəbul komissiyası və Aminə müəllimənin riyaziyyatdan və Azərbaycan dilindən, həmçinin tarixdən verdiyi suallara cavablardan razı qaldığı üçün musiqidən ona məqbul yazılır.

O zaman tələbələr məktəbin yataqxanasında qalır, eyni zamanda Aminə müəllimin göstərişinə əsasən növbəti gün üçün dərslərini növbətçi müəl limlərin nəzarəti altında oradaca hazırlayırdılar. Bu isə tələbələrin təhlükəsizliyinə və hazırlığına müsbət təsir edirdi.

M.Əmrahov bir hadisəni böyük hörmət hissi ilə xatırlayır. Bildirir ki, «IV kursa keçmişdik. Son kurs tələbələrinə yataqxanada yer verilməmişdi. Mənim isə kirayə ev tutmağa imkanım yox idi. Bunu eşidən Aminə müəllimə məni yanına çağırdı, onun evində qalacağımı bildirdi. O zaman Aminə müəllimənin evi «Gəncəli məhəlləsi» ndə, Karsvansaraya yaxın yerdə idi. Oradan pedməktəbə piyada gəlib-getmək asan idi. Beləliklə, mən sonuncu kursu direktorun mənzilində başa vurdum və pedməktəbi fərqlənmə diplomu ilə bitirdim.

Bir epizodu-xeyirxahlığı yazmaya bilmərəm. Dövlət Attestasiya Komissiyasının sədri APİ-dən Ağəli müəllim idi. İxtisasca tarixçi olan alim xeyli sorğu-sualdan sonra mənim biliyimi əla qiymətləndirdi və mənə sənədlərimi APİ-yə verməyi məsləhət bildi. İş elə gətirdi ki, mən sənədlərimi APİ-nin tarix-filologiya fakültəsinə verdim, pedməktəbi fərqlənmə diplomu ilə bitirdiyim üçün medalçılar kimi bir imtahan verdim və əla qiymət alaraq instituta qəbul olundum».

Aminə müəllimə pedməktəbdə dəmir intizam yaratmışdı. Hər şey tələbələrin yüksək bilik almasına yönəldilmişdi. Məktəbdə müxtəlif dərnəklər fəaliyyət

göstərirdi. Tələbələrin əksəriyyəti bacarıqlı əllər, dram, tar dərnəklərinin üzvü idi. Məktəb divar qəzetləri müntəzəm çıxarılırdı. Ən maraqlısı o idi ki, məktəbin dəhlizində iki iri lövhə quraşdırılmışdı, onların biri ağ, digəri isə qara lövhə idi. Ağ lövhəyə günün sonunda «əla» qiymət alanların, qara löbvhəyə isə «iki» qiymət alanların adı yazılırdı.

Aminə Babayeva pedməktəbdə gözəl müəllim kollektivi formalaşdırmışdı. ***Azərbaycan dili müəllimi, əməkdar müəllim Mahtaban Yusifzadə, kimya müəllimi Məcid Əzəmmədov, rus dili müəllimi Məmməd Allahyarov, riyaziyyat müəllimi Şövkət Cəbrayılov, ədəbiyyat müəllimləri Mustafa Mustafayev, Bəxtiyar Əliyev, Fuad Axundov, pedaqogika müəllimi Binyət Abdullayeva, tarix müəllimi Tahirə Əkbərova, əmək təlimi müəllimi Ələsgər müəllim*** tələbələrin məsləhətçisi və sevimlisi idi. Tələbələr dərdlərini onunlarla bölüşür, çətinlikləri onların köməyi ilə aradan qaldırırdılar.

Aminə müəllimənin rəhbərliyi dövründə Nuxa Pedaqoji Məktəbi qeyri-rəsmi «**Nuxanın Qori Seminariyası»** statusunu almışdı. Bu gün Azərbaycan məktəblərinin çoxunda pedməktəbin məzunu çalışır.

Böyük pedaqoq**, əməkdar müəllim,** qayğıkeş ana, təpədən-dırnağadək vətəninin vurğunu olan Aminə müəllimənin xatirəsi onun tələbələrinin qəlbində daim yaşayacaqdır.

***Babayeva Aminə Cabbar qızı-*** 1977-ci ildə dünyasını dəyişmişdir.



**CƏLİLOV ƏLÖVSƏT İDRİS OĞLU (1949-1994) -** 1949-cu ildə Nuxa rayonunun Baş Zəyzid kəndində anadan olmuşdur. 1966-cı ildə orta məktəbi bitirən Ə.Cəlilov V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun fizika fakültəsinə qəbul olunmuş, 1970-ci ildə ali məktəbi fərqlənmə diplomu ilə bitirərək Şəki rayonunun Aşağı Küngüt kənd məktəbində əmək fəaliyyətinə başlamışdır. Hərbi xidmətə çağırılan Ə. Cəlilov ordu sıralarından qayıtdıqdan sonra doğma kəndlərində pedaqoji fəaliyyətini davam etdirmiş, 1973/74-cü tədris ilində məktəbdə təlim-tərbiyə işləri üzrə direktor müavini, 1974-1978-ci illərdə həmin məktəbin direktoru vəzifəsində işləmişdir.

Ə.Cəlilov işlədiyi dövrdə özünü təşkilatçı pedaqoq kimi göstərmiş, müəllim və şagird kollek tivinin hörmətini qazanmışdır. Təhsil sahəsində əldə etdiyi uğurlara görə 1985-ci ildə «Maarif əlaçısı» döş nişanı, 3-cü dərəcəli «**Əmək şöhrəti»** ordeni ilə təltif olunmuş, 1987-ci ildə «**Azərbaycan SSR əməkdar müəllimi**» fəxri adına layiq görülmüşdür.

Ə.Cəlilov Azərbaycan müəllimlərinin VII qurultayının (may,1987), xalq təhsili işçilərinin Ümumittifaq qurultayının (dekabr, 1988) iştirakçısı olmuşdur.

**Əlövsət İdris oğlu Cəlilov** 1994-cü ildə dünyasını dəyişmişdir.

**ƏSGƏROV FİKRƏT HÜSEYN OĞLU (1941) -** 1941-ci ildə Nuxa şəhərində anadan olmuşdur**.** 1958-ci ildə Nuxa şəhərindəki 10 nömrəli məktəbi, 1963-cü ildə ADPU-nun fizika-riyaziyyat fakültəsini bitirərək Zaqatala rayonunun Mamadabinə və Çobankol kəndlərində müəllim işləmiş, 1967-ci ildən 10 nömrəli məktəbdə pedaqoji fəaliyyətini davam etdirmişdir.



Fikrət müəllimin hazırladığı şagirdlər respublika və Ümumittifaq olimpiadalarında müvəffəqiyyətlə iştirak etmişlər. Onun şagirdlərindən Arzu Qurbanov Moskva Xalq Təsərrüfatı İnstitutunu, Natiq Şirinzadə Moskva Kimya Texnologiya İnstitutunu, Eldar Abdullayev Moskva Dəmiryol Mühəndisləri İnstitutunu, İlham İlyasov Kemerova Ali Hərbi Məktəbini, İlham Mustafayev Moskva İnşaat Mühəndisləri İnstitutunu bitirmişlər.

F.Əsgərovun pedaqoji fəaliyyəti dövlət tərəfindən yüksək qiymətləndirilmişdir. O, Azərbaycan müəllimlərinin VII (1987), XII (2003), XIII (2008) qurultaylarının, həmçinin 1988-ci ildə Moskvada keçirilən SSRİ müəllimlərinin qurultayının iştirakçısı olmuşdur. Respublika Təhsil Nazirliyinin və Şəki Şəhər Təhsil Şöbəsinin Fəxri fərmanlarını alan Fikrət müəllim 1986-cı ildə «**Əmək igidliyinə görə**» medalı ilə təltif olunmuş, ***2007-ci ildə*** **«Azərbaycan Respublikasının əməkdar müəllimi»** fəxri adına layiq görülmüşdür.

Gözəl insan, yaxşı ailə başçısı, səmimi dost, şagirdlərin və valideynlərin sevimlisi **Fikrət Hüseyn oğlu Əsgərov** hazırda Şəki şəhərindəki 10 nömrəli məktəbdə işləyir.

**ƏSGƏROV NİYAZİ HƏSƏN OĞLU (1946) -**1946-cı ildə Nuxa şəhərində anadan olmuşdur. 1953-cü ildə şəhərdəki 4 nömrəli məktəbin birinci sinfinə daxil olmuş, sonralar təhsilini 3 nömrəli məktəbdə davam etdirmiş və 1964-cü ildə həmin məktəbin XI sinfini bitirmişdir. 1964-1967-ci illərdə Bakı şəhərində müxtəlif müəssisələrdə fəhlə işləyən N.Əsgərov 1968-ci ildə Bakı Dövlət Universitetinin kimya fakültəsinin axşam şöbəsinə daxil olmuş, istehsalatdan ayrılmadan təhsilini davam etdirərək 1976-cı ildə universiteti bitirmişdir. Təhsil illərində hərbi xidmətdə olmuşdur.



N.Əsgərov 1976-cı ildən pedaqoji fəaliyyət dədir. O, şəhər 19 nömrəli məktəbdə bir il müəllim işləmiş, 1977-ci ildə irəli çəkilərək 10 nömrəli məktəbə təlim-tərbiyə işləri üzrə direktor müavini təyin edilmiş və 1982-ci ilə qədər həmin vəzifədə çalışmış, işlədiyi müddətdə özünü bacarıqlı pedaqoq, yaxşı təşkilatçı kimi göstərdiyinə görə 1982-ci ildə 10 nömrəli



məktəbə direktor təyin edilmiş və həmin vəzifədə 2005-ci ilə kimi işləmişdir. 2005-ci ildə şəhər qarışıq tipli internat məktəbinə direktor təyin edilmişdir. N.Əsgərov hazırda təqaüddədir.

Niyazi Əsgərovun əməyi dövlət tərəfindən layiqincə qiymətlən dirilmişdir. O, 1978-ci ildə «Azərbaycan SSR qabaqcıl maarif xadimi», 1982-ci ildə «SSRİ maarif əlaçısı» döş nişanları ilə təltif olunmuş, **2008-ci ildə** Azərbaycan Respublikası Prezidentinin Fərmanı ilə **«Azərbaycan Respublikasının əməkdar müəllimi»** fəxri adına layiq görülmüşdür.



**ƏYYUBOV MAHİR ƏLƏKBƏR OĞLU (1951) - 1**951-ci ildə Nuxada ziyalı ailəsində anadan olmuşdur. 1968-ci ildə Şəki şəhər 2 nömrəli məktəbi, 1973-cü ildə Azərbaycan Dövlət Universitetinin fizika fakültəsini bitirmişdir. 1973-cü ildən pedaqoji fəaliyyətə başlayan M.Əyyubov bir il 11 nömrəli məktəbdə, 1974-2008-ci ildə 20 nömrəli məktəbdə müəllim, 2008-2009-cu ildə 18 nömrəli məktəbdə direktor işləmişdir. O, hazırda 20 nömrəli məktəbdə işləyir. M.Əyyubov işlədiyi müddətdə dəfələrlə təhsil nazirliyinin, Şəki Şəhər Təhsil Şöbəsinin fəxri fərmanlarına layiq görülmüşdür. 1987-ci ildə «Metodist müəllim» adını almış M. Əyyubov 1994-cü ildə «Kompüter Proqramları» nın respublika turunda I yerə çıxmış, 1998-ci ildə Təhsil Nazirliyi Kollegiyasının və Özəl Türk Liseyinin fəxri fərmanlarına layiq görülmüşdür.

M.Əyyubov daim axtarışda olan pedaqoq lardandır. Onun yetirmələri xalq təsərrüfatının müxtəlif sahələrində uğurla çalışırlar.

**Əyyubov Mahir Ələkbər oğlu** Azərbaycan Respublikası Prezidentinin ***2000-ci il 18 mart*** tarixli fərmanı ilə **«Azərbaycan Respublikasının əməkdar müəllimi»** fəxri adına layiq görülmüşdür.

**HƏSƏNLİ GÜLNARƏ SADƏDDİN QIZI (1962) -** 1962-ci ildə Nuxa şəhərində anadan olmuşdur. 1969-cu ildə Şəki şəhər 10 nömrəli məktəbdə təhsil almağa başlamış, 1979-cu ildə həmin məktəbi bitirmiş, 1980-ci ildə Bakı Dövlət Universitetinin biologiya fakültəsinə daxil olmuşdur. 1985-ci ildə universiteti fərqlənmə diplomu ilə bitirən G.Həsənli Şəki şəhərindəki 2 nömrəli məktəbdə əmək fəaliyyətinə başlamış, sonrakı illərdə Bakı Dövlət Universitetinin Şəki filialında dəftərxana müdiri, tədris hissə müdiri vəzifələrində işləmişdir. 1993-cü

ildə Şəki şəhərindəki 10 nömrəli məktəbdə pedaqoji fəaliyyətini davam etdirən G.Həsənli özünü savadlı müəllim, yaxşı təşkilatçı və tərbiyəçi kimi göstərmiş, şəhər təhsil şöbəsi və yerli hakimiyyət orqanları tərəfindən qiymətli hədiyyələr və fəxri fərmanlarla təltif olunmuşdur.

Gülnarə Həsənlinin pedaqoji sahədəki fəaliyyəti yüksək qiymətləndirilmişdir. O, **2004-cü ildə «Azərbaycan Respublikasının əməkdar müəllimi»** fəxri adına layiq görülmüşdür.

G.Həsənli 2005-ci ildən ailə vəziyyəti ilə əlaqədar Bakı şəhərində yaşayır. 2005-2006-cı illərdə Bakı şəhəri Nizami rayonundakı 61 nömrəli məktəbdə, 2006-cı ildən Səbail rayonundakı 6 nömrəli məktəbdə müəllim işləyir. 2010-cu ildə «**İlin ən yaxşı müəllimi**» müsabiqəsinin qalibi olmuşdur.



**HÜSEYNOVA RUQİYYƏ RZA QIZI (1918-1999) -** 1918-ci ildə Nuxada anadan olmuşdur. İxtisasca riyaziyyat müəllimi olan Ruqiyyə müəllimə ömrünü məktəbə və şagirdlərin təlim və tərbiyəsinə həsr etmiş, valideynlərin və pedaqoji kollektivin hörmətini qazanmışdır. Əmək fəaliyyətinin böyük bir hissəsini Nuxa qəza məktəbinin varisi olan 5 nömrəli məktəbdə keçirən R.Hüseynova 1992-ci ildən Şəki şəhərindəki 3 nömrəli məktəbdə pedaqoji fəaliyyətini davam etdirmişdir.

R.R.Hüseynova ***1982-ci il sentyabrın 30-da Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin fərmanı ilə*** 5 nömrəli məktəbin 150 illiyi münasibətilə **«Azərbaycan SSR əməkdar müəllimi»** fəxri adına layiq görülmüşdür.

*Hüseynova Ruqiyyə Rza qızı 1999-cu ildə dünyasını dəyişmişdir.*



**İBRAHİMOV FİRƏDUN NADİR OĞLU (1952)-** 1952-ci ildə Nuxa rayonunun Qudula kəndində anadan olmuşdur. 1968-ci ildə Şəki şəhərindəki 3 nömrəli məktəbi, 1972-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun riyaziyyat fakültəsini bitirmişdir.

F. İbrahimov Şəki rayonunun Təpəcənnət kənd məktəbində (1972-1973) müəllim, Baltalı kənd məktəbində müəllim və direktor (1973-1982), Pedaqoji Kadrların İxtisasının Artırılması və Yenidənhazırlanması Baş İnstitutunun Şəki filialında direktor

(1983-2000), Şəki Şəhər İcra Hakimiyyətində şöbə müdiri (2000-2005) və Şəki Şəhər Təhsil Şöbəsinin müdiri (2005-2010) vəzifələrində çalışmışdır.

Hazırda Azərbaycan Müəllimlər İnstitutunun Şəki filialında işləyən pedaqogika üzrə elmlər doktoru F.İbrahimov 10 monoqrafiyanın, bir neçə dərs



vəsaiti və metodiki vəsaitlərin, 100-dən artıq məqalənin müəllifidir. **2010-cu ildə** Azərbaycan Respublikası Prezidentinin Fərmanı ilə **«Azərbaycan Respublikasının əməkdar müəllimi»** fəxri adına layiq görülmüşdür.



**MƏMMƏDOV YUSİF ZƏKƏRİYYƏ OĞLU (1897-1985) -** 1897-ci ildə Nuxada anadan olmuş, 1908-1911-ci illərdə Nuxadakı «Vətən məktəbi» ndə təhsil almış, sonra rus ibtidai məktəbinin III kursuna qəbul olunmuş və 1914-cü ildə məktəbi bitirmişdir. 1914-1919-cu illərdə Nuxa kişi gimnaziyasında oxumuşdur.

1919-1930-cu illərdə Nuxada əmək fəaliyyətini davam etdirən Yusif müəllim təhsil sahəsinin bütün pillələrində - maarif şöbəsində metodist, inspektor və maarif şöbəsinin müdiri kimi vəzifələrdə işləyərkən özünün pedaqoji ustalığı, təşkilatçılıq qabiliyyəti və insanpərvərliyi ilə şəhər ictimaiyyətinin hörmətini qazanmışdır.

Y.Məmmədov 1930-cu ildə İqtisadiyyat İnstitutuna qəbul olsa da, təhsilini başa vura bilmir, institutun ləğvi ilə əlaqədar 1932-ci ildə Nuxa Pedaqoji Texnikumuna direktor təyin olunur. Müəllimliyə sönməz həvəsi olan Yusif müəllim rus dili müəllimlərinin təkmilləşdirilməsi kurslarında olur, 1939-cu ildə Zaqafqaziya Pedaqoji İnstitutunun rus bölməsinin ədəbiyyat fakültəsinə daxil olur, 1941-ci ildə rus dili üzrə ikiillik kursu bitirir.

1941-1943-cü illər müharibəsinin iştirakçısı olan Y.Məmmədov müharibədən sonra təhsil sahəsində fəaliyyətini davam etdirir.

Y.Məmmədov müəllimliklə yanaşı partiya və sovet işlərində də işləmişdir. O, 1924-1929-cu illərdə Nuxa Uyezd Maarif İşçiləri İttifaqının məsul katibi, 1929-1930-cu illərdə Nuxa-Zaqatala dairəsi İcraiyyə Komitəsinin katibi, 1932-1933-cü illərdə Nuxa Şəhər Partiya Komitəsində kadrlar şöbəsinin müdiri, 1933-1935-ci illərdə Nuxa Rayon İcraiyyə Komitəsində təşkilat şöbəsinin müdiri vəzifələrində müvəffəqiyyətlə çalışmışdır.

**«Azərbaycan SSR əməkdar müəllimi»** fəxri adına layiq görülmüş Y.Məmmədov 1985-ci ildə dünyasını dəyişmişdir.



**NAİBOV NURMƏMMƏD HACIMƏMMƏD OĞLU (1909-1971)** - 1909-cu ildə Nuxa şəhərində anadan olmuş, 1929-cu ildə Nuxa Pedaqoji Texnikumunu, 1933-cü ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun fizika-riyaziyyat fakültəsini bitirmişdir. N.Naibov ömrünün sonunadək Nuxanın müxtəlif məktəblərində müəllim işləmiş, bilik və bacarığını gənc nəslin təlim-tərbiyəsinə sərf etmişdir.

N.Naibovun pedaqoji sahədəki fəaliyyəti yüksək qiymətləndirilmiş, 1960-cı ildə Azərbaycan SSR Maarif Nazirliyi tərəfindən «Qabaqcıl maarif xadimi» döş nişanı ilə təltif olunmuş, 1967-ci ildə respublika müəllimlərinin qurultayına nümayəndə seçilmişdir.

Nurməmməd Naibov əməkdə qazandığı nailiyyətlərinə görə **1967-ci ildə** «**Qırmızı Əmək bayrağı**» ordeni ilə təltif olunmuş və «**Azərbaycan SSR əməkdar müəllim**» fəxri adına layiq görülmüşdür.

*Naibov Nurməmməd Hacıməmməd oğlu 1971-ci ildə dünyasını dəyişmişdir.*



**RƏCƏBOV MUSA MUSTAFA OĞLU (1922-2002) - 1922-ci ildə** anadan olmuşdur. 1939-cu ildə Oxut kənd orta məktəbini bitirən M.Rəcəbov 1941-ci ildə Nuxadakı İkiillik Müəllimlər İnstitutuna daxil olmuş və həmin ildə cəbhəyə səfərbər olunmuşdur.

M.Rəcəbov 1943-cü ildə Kursk ətrafındakı döyüşlərdə yaralandığı üçün ordudan tərxis olunub, əmək fəaliyyətini Oxut kənd məktəbində davam etdirmişdir. Qiyabi yolla təhsilini davam etdirən Musa müəllim əvvəl rayon partiya komitəsində təlimatçı, sonralar Oxut kolxozunda partiya təşkilatı katibi işləyib. Ömrünü şagirdlərin təlim-tərbiyəsinə həsr edən Musa Rəcəbov 1971-ci ildə «**Şöhrət nişanı**» ordeni ilə təltif olunub.

Musa Rəcəbovun pedaqoji fəaliyyəti hökumət tərəfindən yüksək qiymətləndirilib. O, ***1976-cı il may ayının 17-də*** Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fərmanı ilə **«Azərbaycan SSR əməkdar müəllimi»** fəxri adına layiq görülüb.

Rəcəbov Musa Mustafa oğlu 2002-ci ildə dünyasını dəyişib.

**RƏSULOV HÜSEYN BƏXTİYAR OĞLU (1923-1990)-** 1923-cü ildə Nuxada anadan olmuşdur. 1938-ci ildə yeddiillik məktəbi bitirərək Nuxa Pedaqoji Mək təbinə daxil olmuş, 1941-ci ildə məktəbi bitirmişdir. 1941-1945-ci illər müharibəsində iştirak edən H.Rəsulov 3 il döyüşən orduda olmuş, aldığı yaradan tərxis olunmuşdur.

Ordudan tərxis olunduqdan sonra H.Rəsulov 1943-1945-ci illərdə Nuxa İkiillik Müəllimlər İnstitutunda oxumuşdur. 30 ilə qədər Şəki şəhər 6 və 10 nömrəli məktəblərdə dərs hissə müdiri işləyən H.Rəsulov uzun müddət 10 nömrəli şəhər məktəbinə rəhbərlik etmiş, şəhər təhsil şöbəsinin müdiri vəzifəsində işləmişdir.

H.Rəsulov rayon və şəhər sovetinin deputatı seçilmiş, Azərbaycan müəllimlərinin III, IV və VI qurultaylarının iştirakçısı olmuşdur. Onun əməyi dövlət tərəfindən yüksək qiymətləndirilmiş, «Qabaqcıl maarif xadimi» döş nişanı, **«Əməkdə igidliyinə görə»,** «**Torpağın müdafiəsinə görə**» medalları ilə təltif olunmuş, **əməkdar müəllim** fəxri adına layiq görülmüşdür.

**Rəsulov Hüseyn Bəxtiyar oğlu 1990-cı** ildə vəfat etmişdir.

**RASULOV RAFİQ ABDULƏLİ OĞLU (1958) -** 1958-ci il aprel ayının 10-da Nuxa şəhərində ziyalı ailəsində anadan olmuşdur.



1975-ci ildə Şəki şəhər 7 nömrəli orta məktəbi, 1980-cı ildə BDU-nu riyaziyyatçı, müəllim ixtisası üzrə bitirmişdir.

Ali təhsili başa vurduqdan sonra R.Rasulov təyinatla Şəki rayonunun Taxılçılıq sovxozu (indiki Turan qəsəbəsi) qiyabi orta məktəbinin Böyük Dəhnə tədris məsləhət məntəqəsində müəllim kimi əmək fəaliyyətinə başlamış, 1983-cü ilin iyun ayınadək orada işləmiş, 1983-cü ilin iyun ayından 1993-cü ilin sentyabr ayınadək Şəki Geofizika rəsədxanasında böyük texnik, mühəndis və geofizik vəzifələrində çalışmışdır.

R.Rasulov 1985-1989-cu illərdə Azərbaycan Elmlər Akademiyasının Geologiya İnstitutunun aspiranturasında təhsil almışdır. 1993-cü ilin oktyabr ayından 1994-cü ilin aprel ayınadək M.Ə. Rəsulzadə adına BDU-nun Şəki filialında kafedra müdiri, 1994-cü ilin aprel ayından 2000-ci ilin noyabr ayınadək həmin filialda direktor müavini, 2000-ci ilin noyabr ayından 2001-ci ilin avqust ayınadək AMİ-nin Şəki filialında tədris işləri üzrə direktor müavini vəzifəsində işləmişdir. 2001-ci ilin avqust ayından indiyədək həmin filialda direktor vəzifəsində çalışır. **2010-cu ildə** Azərbaycan Respublikası Prezidentinin Fərmanı ilə **«Azərbaycan Respublikasının Əməkdar müəllimi»** adına layiq görülmüşdür.

Fizika-riyaziyyat üzrə elmlər doktoru, dosent R.Rasulov iki monoqrafiya, bir dərs vəsaitinin, Azərbaycanda və xarici ölkələrdə dərc olunmuş onlarla elmi məqalənin müəllifidir.

**SULTANOVA AYNA CƏFƏR QIZI (1916-1991) - 1916-cı ildə** Nuxada anadan olmuşdur. Ayna xanım bəy qızı olduğu üçün uzun müddət ali təhsil almağa cəhd etsə də, mümkün olmamış, nəhayət 1937-ci ildə APİ-nin kimya-biologiya fakültəsinə qəbul olunmuş və 1942-ci ildə institutu bitirərək təyinatla Qax rayonunun Güllük kəndində müəllimliyə başlamışdır. A.Sultanova 4 il işlədikdən sonra 1946-cı ildə Bakıya qayıtmış, 1946-1954-cü illərdə Azərbaycan Tibb İnstitutunun anatomiya kafedrasında, 1956-1990-cı illərdə Bakı şəhərindəki 14 nömrəli məktəbdə müəllim işləmişdir.



Ayna Sultanova 1968-ci ildə **«Azərbaycan SSR əməkdar müəllimi»** adına layiq görülmüş, az sonra **«Qırmızı Əmək Bayrağı»** ordeni ilə təltif olunmuşdur.

**Sultanova Ayna Cəfər qızı** 1991-ci ildə Bakı şəhərində dünyasını dəyişmişdir.

**YUSİFOV BƏŞARƏT ŞAMİL OĞLU (1949) -** 1949-cu ildə Şəki rayonunun Baş Zəyzid kəndində anadan olub. 1966-cı ildə orta məktəbi, 1975-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun tarix fakültəsini bitirmişdir**.** 1975 -1982-ci illərdə 9 nömrəli, 1982-1997-ci illərdə 11 nömrəli məktəbdə müəllim işləmişdir. 1997-ci ildən hal-hazıra kimi Şəki şəhər fizika-riyaziyyat və humanitar təmayüllü liseydə tarix müəllimi kimi fəaliyyət göstərir. Əmək fəaliyyəti dövründə özünü təşkilatçı müəllim, ixtisasını bilən pedaqoq kimi göstərə bilmiş, «baş müəllim», «ali kateqoriyalı müəllim» dərəcəsinə layiq görülmüş, yerli hakimiyyət orqanlarının və Şəki ŞTŞ-nin fəxri fərmanları ilə təltif olunmuşdur.



Bəşarət Şamil oğlu Yusifov Azərbaycan Respublikası Prezidentinin 03 oktyabr 2011-ci il tarixli sərəncamı ilə **«Azərbaycan Respublikasının əməkdar müəllimi»** fəxri adına layiq görülmüşdür.

Şəki Pedaqoji məktəbində tələbələrin mənəvi ata-anası hesab olunan ***müəllimlər işləyirdi.*** Hər dəfə buraxılış mərasiminə həsr olunmuş fotolara baxdıqca o fədakar insanları xoş xatirələrlə yad edirik. Belə müəllimlərdən biri də Mahtəban Yusifzadə idi.



**YUSİFZADƏ MAHTƏBAN ƏHMƏD QIZI ( 1912-1977)** 1912-ci ildə anadan olmuşdur. O, ilk təhsilini Nuxa şəhərindəki 2 nömrəli məktəbdə almış, sonra Azərbaycan Dövlət Pedaqoji İnstitutunun filologiya fakültəsinə daxil olmuş, institutu bitirərkən ona ali məktəbdə qalmağı, baş müəllim vəzifəsində işləməyi

təklif etsələr də o, Nuxaya qayıtmış, pedaqoji məktəbdə əmək fəaliyyətini davam etdirmişdir.

Mahtəban müəllimə kitabın müəlliflərindən olan M.Əmrahova pedməktəbdə dərs demişdir. Tələbələrin xatirələrindən məlum olur ki, o, alçaq boylu, sərt və nüfuzedici baxışlı qadın idi. Heç vaxt səsini ucadan çıxarmazdı. Mahtəban müəllimə dərs dediyi tələbələrin ailə şəraitini, onların həyatındakı çətinliklərini öyrənər və onların aradan qaldırılması yolunda tələbələrin həmfikri olardı. Gözəl nitqi vardı, səlis, aydın və qısa danışar, tələbələrinin də danışıq prosesində artıq sözlər işlətməsinə yol verməzdi.

Mahtəban müəllimə hesab edirdi ki, ibtidai sinif müəlliminin məsuliyyəti daha böyükdür. Kiçik yaşlı körpələr digər fənn müəllimlərindən fərqli olaraq daha çox sinif müəllimlərini təqlid etməyə çalışırlar. Doğrudan da, sonralar pedaqoji fəaliyyət dövründə hiss etdik ki, şagirdlər ibtidai sinif müəllimi kimi yazmağa cəhd edir, hərəkətlərində onu təqlid edirlər. Odur ki, Mahtəban müəllimə həmişə dərs dediyi tələbələrə tövsiyə edərdi ki, ibtidai sinif müəllimi kiçik yaşlı məktəblilərə nümunə olmalıdır. O, ilk növbədə tələbələrdən səliqəli, hüsnxət qaydasında yazmağı öyrənməyi tələb edər, mənəvi saflığa, xeyirxahlığa səsləyərdi.

M.Yusifzadə «Qabaqcıl maarif xadimi» döş nişanı və «**Azərbaycan SSR əməkdar müəllimi»** fəxri adına layiq görülmüşdür. Onun ən böyük adı tələbələrinin ürəyində həkk olunmuşdur. «Əmək veteranı» olmuş Mahtəban müəllimənin pedaqoji irsindən neçə-neçə nəsillər faydalanacaqlar.



**YUSİFOV ƏLƏSGƏR ƏHMƏD OĞLU (1913-1985)** - 1913-cü ildə Nuxada anadan olmuşdur. 1930-cu ildə Nuxa Pedaqoji Məktəbini bitirən Ə.Yusifov 1936-cı ilədək şəhərin müxtəlif məktəblərində müəllim işləmiş, 1936-1940-cı illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU) filologiya fakültəsində təhsil almışdır. 1941-ci ildə müharibə başlayanda Nuxa gəncləri kimi Ələsgər müəllim də könüllü cəbhəyə getmiş, döyüş cəbhələrində Azərbaycan igidlərinə məxsus şücaət və qəhrəmanlıq göstərmiş, ağır yaralandığı üçün arxa cəbhəyə göndərilmişdir. O, 1944-1985-ci illərdə şəhərin müxtəlif məktəblərində müəllimlik etmişdir.

Ələsgər müəllim yuxarıda böyük hörmət hissi ilə yad olunan, Nuxa pedaqoji məktəbinin Azərbaycan dili və ədəbiyyatı müəllimi Mahtəban Yusifzadənin qaraşı idi və bu ailə Azərbaycan dili və ədəbiyyatının gənc nəslə öyrədilməsi və sevdirilməsində önəmli rol oynamışdır. Elə bu missiyanın yerinə yetirilməsi sahəsindəki nailiyyətlər idi ki, Ələsgər Əhməd oğlu Yusifzadə «Böyüməkdə olan nəslin… tərbiyəsi və təhsili sahəsində görkəmli fəaliyyətinə görə» Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin 1965-ci il 25 dekabr tarixli

Fərmanı ilə **«Azərbaycan SSR əməkdar müəllimi»** fəxri adına layiq görülmüşdür.

***Yusifov Ələsgər Əhməd oğlu 1985-ci ildə dünyasını dəyişmişdir.***

**Vahabzadə Cəvahir Məhərrəm qızı (1911-1995)– 1911-ci ildə** Nuxa şəhərində anadan olmuşdur. 1923-cü ildə ibtidai məktəbi, 1926-cı ildə Bakı darülmüəllimatını, 1948 -ci ildə Nuxa İkiillik Müəllimlər İnstitutunu bitirmişdir.

O, Azərbaycan müəllimlərinin III qurultayına nümayəndə seçilmişdir.

Cəvahir müəllimə müharibə illərində arxa cəbhədə səmərəli fəaliyyətinə görə **«Şərəf nişanı»** ordeni və «**Əməkdə fərqlənməyə görə**» medalı ilə təltif olunmuş, 1960-cı ildə **«Azərbaycan SSR əməkdar müəllimi»** fəxri adına layiq görülmüşdür.

C.Vahabzadə qayğıkeş ana olmuş, üç övlad böyüdüb başa çatdırmışdır. Böyük övladı Mikayılov Mənsür İsmayıl oğlu Azərbaycan Dövlət Xarici Dillər İnstitutunu bitirmiş, uzun müddət Şəki şəhər 19 nömrəli məktəbdə müəllim işləmiş, 2007-ci ildə vəfat etmişdir.



C.Vahadzadənin ortancıl oğlu Ənvər İsmayıl oğlu Mikayılzadə 1933-ci ildə anadan olmuş, Nuxa Pedaqoji Texnikumunu, Azərbaycan Dövlət Universitetinin jurnalistika fakültəsini və Bakı Ali Partiya Məktəbini bitirmişdir. Şəki Şəhər Partiya Komitəsində texniki katib, təlimatçı, partiya komissiyasının sədri, «Şəki fəhləsi» qəzetinin redaktoru, Azər.TAC-ın bölgə müxbiri, Şəki Kənd Təssərrüfatı Texnikumunda direktor müavini vəzifələrində işləmiş Ənvər müəllim 1990-cı ildə Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri fərmanı ilə **«Azərbaycan Respublikasının əməkdar jurnalisti»** fəxri adına layiq görülmüşdür. Ə.İ.Mikayılzadə 2009-cu ildə vəfat etmişdir.

C.Vahabzadənin kiçik oğlu Sahib Mikayılzadə 1950-ci ildə anadan olmuş, ingilis dili ixtisasına yiyələnmişdir. O, hazırda Şəki Pedaqoji Kollecində müəllim işləyir. C.Vahabzadə 1980-ci ildə təqaüdə çıxmış, 1995-ci ilə kimi şərəfli bir ömür yaşamışdır.

# VI FƏSİL

# ŞƏKİ TƏHSİLİNİN YETİRMƏLƏRİ. BİOBİBLİOQRAFİK MƏLUMATLAR[487]

Şəki təhsilinin yetirmələri elm və mədəniyyətin müxtəlif sahələrində öz sözünü demiş, müxtəlif dövlət vəzfələrində işləyən şəxslər öz töhfələri ilə Azərbaycan dövlətçiliyinin möhkəmlənməsində əzmlə çalışmışlar.

Bu gün həyat və fəaliyyəti birmənalı qiymətləndirilməyən, lakin tarixə öz adlarını yazmış və milli tariximizin bir hissəsini təşkil edən XX əsrin 20-80-ci illərində Azərbaycanda quruculuq işlərində çalışanların bir çoxu ilk təhsilini Nuxa məktəblərində almışdır. Bu məktəblərin məzunları Sovet Azərbaycanında savadsızlığın ləğvi, mədəni inqilabın həyata keçirilməsi, xalqlar dostluğunun möhkəmləndirilməsi, təsərrüfat quruculuğu və kollektivləşdirmə işlərində fəal iştirak etmişlər. Nuxa təhsilinin yetirmələri olan məşhur alim, mühəndis, bəstəkar, elm, ədəbiyyat və incəsənət xadimləri müstəqil Azərbaycanın dövlət quruculuğunun müxtəlif sahələrində müvəffəqiyyətlə çalışırlar. Onların adlarını sadalamaqla qurtarmaz.

Nuxa ədəbi mühiti Azərbaycan ədəbiyyatı üçün istedadlı insanlar yetişdirmişdir. Türk dünyasının böyük şairi Bəxtiyar Vahabzadə, təmsil janrının inkişafında xüsusi rolu olan Hikmət Ziya, tarixçi və yazıçı Mahmud İsmayılov, nasir-dramaturq Məmmədiyyə Yusifzadə, dilşünas-alim Ə.Dəmirçizadə, dramaturq Sabit Rəhman, şair Vaqif İbrahim, Nəzir Eltəkin, filoloq-alim Yaşar Qarayev, tənqidçi, ədəbiyyatşünas, türkoloq Aydın Məmmədov, ədəbiyyatşünas, şair, nasir Arif Abdullazadə, XX əsrin 100 türk şairlərindən biri olan Vaqif Aslan Şəki təhsilinə borcludurlar.

Odur ki, onlardan bir neçəsinin həyat tarixçəsinə nəzər salaq.

**ABDULLAYEV LÜTVƏLİ ƏMİR OĞLU (1914-1973)** 1914-cü il mart ayının 22-də Nuxada anadan olmuşdur. Oradakı yeddiillik məktəbi bitirmişdir. Bir neçə ay Nuxa fəhlə gənclər klubunun dram dərnəyində çalışmış, kiçik məsxərələrdə və tərcümə olunmuş, təbdil edilmiş vodevillərdə oynayıb.

1928-ci ilin sentyabrında Bakıya gələn Lütfəli Abdullayev Dövlət Konservatoriyasının valtorna sinfinin məşğələlərində iştirak etməyə başlamışdır. Vokal sənətinə marağı olduğuna görə paralel olaraq Berolskinin kursunda ifaçılıqla məşğul olmuş, səsinin oxu ölçü-quruluşunu cilalayıb müəyyən qəlibə salmışdır. Dərslərinin gedişatını müəyyən yönə salıb sistemləşdirdikdən sonra yaşının azlığına baxmayaraq, müsabiqə ilə opera teatrının xor heyətinə qəbul olunmuşdur. Tezliklə o, yardımçı aktyor kimi sözsüz və epizodik rollarda, qısa vaxtdan sonra «Arşın mal alan» operettasında Vəli rolunda oynamışdır.



1938-ci ildə Azərbaycan Dövlət Musiqili Komediya Teatrı yarananda Lütfəli Abdullayev truppaya qəbul edilib. Teatr 1949-cu ilin yazında maliyyə çətinliyi ilə bağlı fəaliyyətini dayandırmalı olanda Lütfəli Abdullayev Milli Dram Teatrına keçib. Burada Tulio («Rəqs müəllimi», Lope de Veqa), Rəşid («Kimdir

müqəssir?», Georgi Mdivani), Tağı («Köhnə dudman», Əbdürrəhim bəy Haqverdiyev), Oddamdı («Od gəlini», Cəfər Cabbarlı), Nadir («Çiçəklənən arzular», Məmmədhüseyin Təhmasib) rollarında çıxış edib. İki ildən sonra o, Azərbaycan Dövlət Filarmoniyasının nəzdində estrada ansamblı kimi çıxış edən muskomediya truppasında işləməyə başlayıb.

1956-cı ildə Azərbaycan Dövlət Musiqili Komediya Teatrının Azərbaycan və rus bölmələri Şəmsi Bədəlbəylinin bədii rəhbərliyi ilə yenidən fəaliyyətə başlayır. Lütfəli Abdullayev teatrın aparıcı sənətkarı kimi Musiqili Komediya Teatrının, demək olar, ən populyar, uğurlu və uzun ömürlü tamaşalarında çıxış edir.

Klassik operettalardakı rollar siyahısına Üzeyir bəy Hacıbəyovun əsərlərində oynadığı Vəli və Soltan bəy («Arşın mal alan»), Hambal, Cəfər və Məşədi İbad («Məşədi İbad»), Zülfüqar bəy Hacıbəyovun əsərlərində ifa etdiyi Kəblə Heydər («Evliykən subay»), Vəli və Sandro («Aşıq Qərib»), Qulu («Əlli yaşında cavan») obrazları daxildir.

Aktyorun klassik milli və tərcümə əsərləri əsasında müasir bəstəkarların musiqi bəstələdikləri komediyalardakı Kərim («Lənkəran xanının vəziri», Mirzə Fətəli Axundzadə və Niyazi), Qulaməli («Dərviş Məstəli şah», Mirzə Fətəli Axundzadə və musiqi tərtibçisi Şəmsəddin Fətullayev), Trufaldino («İki ağanın bir nökəri», Karlo Haldoni və musiqi tərtibçisi Şəmsəddin Fətullayev), Hacı Qara («Hacı Qara», Mirzə Fətəli Axundzadə və Vasif Adıgözəlov ilə Ramiz Mustafayev), Baqqal («Keçmişin məişət səhnələri», Mirzə Ələkbər Sabirin satirik şeirləri əsasında libretto müəllifi Soltan Dadaşov və bəstəkar Vasif Adıgözəlov) rollarını da buraya daxil etmək olar.

Tərcümə edilmiş musiqili komediyalarda oynadığı komik personajlar: Hamlet («Tiflis nəğməsi», Levon Cubabiriya və Şoto Milorava), Avo («Şirin arzular»), Zako («Keto və Kote», Vladimir Dolidze) tamaşaçılar tərəfindən maraqla qarşılanmışdır.

Aktyorun yaradıcılığında çağdaş sənətkarların yazdıqları musiqili komediyalarda oynadığı rollar çoxluq təşkil edir. Bunlardan əsasları Möhsün («Beş manatlıq gəlin», Məmməd Səid Ordubadi və Səid Rüstəmov), Qoşun («Toy kimindir?», Məhərrəm Əlizadə və Soltan Hacıbəyov), Qəhrəman («Gözün aydın», Məhərrəm Əlizadə və Fikrət Əmirov), Dursun və Kərim kişi («Durna», Süleyman Rüstəm və Səid Rüstəmov), Məhəmməd («Ulduz», Sabit Rəhman və Süleyman Ələsgərov), Güloğlan («Kəndimizin mahnısı», Kərim Kərimov və Zakir Bağırov), Şakir («Qızıl axtaranlar», Həsən Seyidbəyli və Tofiq Quliyev), Dilavərzadə («Rəisin arvadı», Məhərrəm Əlizadə və Səid Rüstəmov), Səməndər («Bir dəqiqə», Məhərrəm Əlizadə və Hacı Xanməmmədov), Hacı Kərim («Hacı Kərimin Aya səyahəti», Qulamrıza Cəmşidi ilə Əbülfəz Hüseyni və Azər Rzayev), Murtuzov və Alanzadə, Eynəkli («Özümüz bilərik», «Olmadı elə, oldu belə» və «Milyonçunun dilənçi oğlu», Şıxəli Qurbanov və Süleyman Ələsgərov), Darçmov («Səndən mənə yar olmaz», Məhərrəm Əlizadə və Əşrəf Abbasov), Səbzəli («Bizə bircə xal

lazımdır», Qulamrıza Cəmşidi ilə Bəşir Səfəroğlu və Telman Hacıyev), Qüdrət Səda («Haradasan, ay subaylıq?», Salam Qədirzadə və Süleyman Ələsgərov), Cabbar («Axırı yaxşı olar», Rəfiq Zəka Xəndan və Ramiz Mustafayev), Məmmədəli («Məmmədəli kurorta gedir», Atif Zeynallı və Tofiq Bakıxanov ilə Nəriman Məmmədov), Polad baba («Dağlar qoynunda», Ədil İsgəndərov və Əşrəf Abbasov), Ələsgər («Həmişəxanım», Salam Qədirzadə və Süleyman Ələsgərov), Mitoş («Hicran», Sabit Rəhman və Emin Mahmudov (Sabitoğlu) obrazlarıdır.

Lütfəli Abdullayev həm də populyar kino aktyoru idi. Kinoda ilk və son dərəcə uğurlu işi Rza Təhmasibin 1945-ci ildə lentə aldığı «Arşın mal alan» filmində Vəli rolu olmuşdur. O, bu rola görə 1946-cı ildə Stalin mükafatına (sonralar «SSRİ Dövlət mükafatı» adlandı) layiq görülmüşdür. Lütfəli Abdullayev həmçinin «Əhməd haradadır?» (Zülümov), «Ulduz" (Məhəmməd), «Qəribə əhvalat» (Kefçilov) filmlərinə çəkilmişdir.

Öz yaradıcılığında «Qaravəlli» oyun-tamaşa estetikasının «açıq yumor» üslubundan daha çox bəhrələnən Lütfəli Abdullayev tipik xarakterlər yaratmağa üstünlük verib. Bu istiqamətdə əsasən şarjla qroteskə əsaslanıb. Zil olmayan, lakin şirin ləhcəli avazını oynadığı obrazların xarakterinə uyğunlaşdırmağı məharətlə bacarmışdır.

Yaradıcılıq uğurlarına və Musiqili Komediya Teatrının inkişafındakı xidmətlərinə görə 17 iyun 1943-cü ildə «Azərbaycan SSR əməkdar artisti» və 24 may 1960-cı ildə Azərbaycan SSR xalq artisti» fəxri adları ilə təltif olunmuşdur.

**Lütfəli Abdullayev 9 dekabr 1973-cü ildə Bakıda vəfat edib. Məzarı ikinci Fəxri xiyabandadır. Bakıda adına küçə var.**

**Onun haqqında:** *Ənvər Mete. O torpağın övladları. Bakı: Nurlan, 2006, 608 s.,şəkilli. səh. 485-492; "http://az. wikipedia.org/w/index. php?title= L%C3%BCtf% C9%99li Abdullayev &oldid=1919059"*

**AXUNDOV MİRZƏ FƏTƏLİ MƏHƏMMƏDTAĞI HACI ƏHMƏD OĞLU (1812 - 1878) –** 1812-ci ildə Nuxada anadan olmuşdur. Fətəlinin atası Məhəmmədtağı Hacı Əhməd oğlu Təbriz vilayətinin Xamnə qəsəbəsində kəndxuda olmuş, vəzifədən çıxarıldıqdan sonra çərçilik edə-edə Nuxaya gəlib çıxmış, 1811-ci ildə nuxalı Axund Hacı Ələsgin qardaşı qızı Nanə xanımla evlənmişdir. Fətəlinin anasının ulu babası Nadir şahın zamanında İrandan Nuxa şəhərinə vergi toplamağa göndərilmiş Müzəffər adlı bir zənci olmuşdur.[488]



1807-ci ildə Nuxaya xan təyin olunmuş Cəfərqulu xan öldükdən sonra onun himayəsində yaşayan İran mühacirləri, bu sıradan da Fətəlinin atası Məmmədtağı ikinci arvadı Nanə xanım və körpə Fətəli ilə Xamnəyə, əvvəlki arvadı və uşaqlarının yanına qayıtmışdı. Ağır güzaran Nanə xanımı 4 ildən sonra oğlu Fətəli ilə birlikdə Cənubi Azərbaycanın Ərdəbil

mahalında Nuxanın keçmiş hakimi Səlim xanın yanında qulluq edən əmisi Axund Hacı Ələsgərin yanına qayıtmağa məcbur edir. Fətəlini oğulluğa götürən H.Ələsgər onun təhsilinin qayğısına qalır. Fətəli 11 il Cənubi Azərbaycanda yaşayır, ilk təhslini mollaxanada alır, ərəb və fars dillərini mükəmməl öyrənir. Nəhayət, Axund Hacı Ələsgər 1825-ci ildə Şimali Azərbaycana qayıdır, bir il Gəncədə yaşayır. 1826-1828-ci illərdə baş verən Rusiya-İran müharibəsi nəticəsində Gəncənin tutulması səbəbli Axund Hacı Ələsgərin var-dövləti qarət olunduğundan o, Nuxaya köçür.

Axund Hacı Ələsgər 1832-ci ildə Məkkə ziyarətinə gedir. Fətəlini dostu Molla Hüseyn Pişnamazzadəyə tapşırır ki, ziyarətdən qayıdana qədər ona məntiq və fiqh kitablarından dərs versin. Burada Fətəli M.Ş. Vazehdən də dərs alır. Fətəli yalnız atalığı Axund Hacı Ələsgər Məkkədən qayıtdıqdan sonra Nuxaya qayıdır və burada 1831-ci il dekabrın 30-da açılmış rus dilində məktəbdə təhsili ni davam etdirir. Lakin yaşının çoxluğu ona təhsilini davam etdirməyə imkan vermir.



***Şəki şəhəri. M.F.Axundovun doğulduğu ev***

O, 1834-cü ildə Tiflisə gedir və noyabrın 1-də Qafqazın baş hakimi baron Rozenin dəftərxanasında mülki hissə üzrə Şərq dilləri tərcüməçisinin şagirdi qulluğuna girir. Altı aydan sonra tərcüməçiliyə keçən Fətəliyə 1842-ci ildə praporşik, 1846-cı ildə podporuçik, 1850-ci ildə poruçik, 1852-ci ildə ştabs-kapitan, 1861-ci ildə mayor, 1869-cu ildə podpolkovnik, 1873-cü ildə polkovnik rütbəsi verilir, bu dövr ərzində müxtəlif orden və medallarla təltif olunur.

M.F.Axundov 1842-ci ildə Nuxaya gəlmiş, Axund Hacı Ələsgərin qızı Tubu xanımla evlənmişdir. Mirzə Fətəlinin 13 övladı dünyaya gəlmiş, oğlu Rəşid və qızı Nisə çox yaşamış, qalanları uşaq və gənc yaşlarında vəfat etmişlər.

1872-ci ildə Mirzə Fətəlinin qızı Seyidbəyim vəfat edir və onun iki uşağı yetim qalır. Nəvələrini başsız qoymamaq xatirinə Mirzə Fətəli qızı Nisə xanımı kürəkəni Xanbaba xana ərə verir.

Xanbaba xan Bəhmən Mirzə Qacarın oğludur. Bəhmən Mirzə əslən azərbaycanlı olub İran şahı Fətəli şahın nəvəsi, Qacarlar sülaləsinin 3-cü hökmdarı Məhəmməd şahın qardaşıdır. O, uzun müddət Təbrizin general-qubernatoru və Cənubi Azərbaycanın hakimi olmuşdur. Xatırladaq ki, Bəhmən Mirzə Qacarın 16 arvadı və 63 övladı olmuşdur. Onun gəlinləri və nəvələri Peterburqda, Kiyevdə, Tiflisdə və Avropada təhsil almışlar. B.M.Qacarın 15-dən çox oğlu İran və rus ordularında hərbi xidmətdə olmuşlar.[489]



***Axundovun həyat yoldaşı Tubu xanım***

M.F Axundovun Bəhmən Mirzə ilə tanışlığı 1851-ci ildən başlamışdır. Həmin ildə Bəhmən Mirzə Şuşaya köçüb gəlmiş, Axundovla dostluq əlaqələri saxlamış və bu münasibətlər qohumluğa çevrilmiş, qızı Seyidbəyimi onun oğlu Xanbaba xana ərə vermişdir.



M.F.Axundovun oğlu Rəşid bəy 1854-cü ildə anadan olmuşdur. Birinci Tiflis gimnaziyasında oxuyan Rəşid bəy atasından ərəb və fars dillərini öyrənmiş, musiqi təhsili almış, fransız dilini Kinyar adlı müəllimədən öyrənmişdir.

Rəşid bəy 1874-cü ildə təhsilini başa vurduqdan sonra Brüssel Universitetinin yol mühəndisliyi fakültəsinə daxil olmuşdur. Çox çəkmir ki, Mirzə Fətəli xəstələnir və xəstəliyi şiddətlənir, ədib oğlunun təhsilini başa vurub qayıtmasını görmür, ona toy edə bilmir. M *.F. Axundov 1878-ci il martın 10-da Tiflisdə vəfat edir.*

***Rəşid bəy və kiçik Fətəli***

Atasının ölümündən Rəşid bəy çox təsirlənir. 1882-ci ildə təhsilini başa vuraraq Tiflisə qayıdan Rəşid bəy, təhsilini tamamlamaq üçün yenidən Peterburqa gedir. Nəhayət, «yollar mühəndisi» diplomu ilə Tiflisə qayıdır və Qafqaz dairəsi yollar idarəsində işə başlayır. Rəşid bəy tərcüməçiliklə məşğul

olmuş, fransız yazıçısı Alfred-de Breanın «Bir balaca parislinin həyatı» romanını Azərbaycan dilinə tərcümə etmişdir.

***Rəşid bəy Axundov 1905-ci ildə Bakıda dünyasını dəyişmişdir***.

M.F.Axundov yaradıcılığına «Səbuhi» təxəllüsü ilə başlamışdır. O, 1850-1855-ci illərdə «Hekayəti-Molla İbrahimxəlil kimyagər», «Müsyö Jordan və Dərviş Məstəli şah», «Vəziri-xani-Lənkəran», «Hekayəti-xırs quldurbasan, «Sərgüzəşti-mərdi-xəsis və ya «Hacı Qara», «Mürafiə vəkilləri hekayəti» adlı komediyalarını yazır. O, 1857-ci ildə yazdığı «Aldanmış kəvakib, yaxud «Hekayəti-Yusif şah» povesti ilə Azərbaycan realist nəsrinin əsasını qoyur. Ədibin «Puşkinin ölümünə Şərq poeması», «Zakirə məktub» ları, «Yeni əlifba haqqında mənzumə» və b. şeirləri yüksək bədii səviyyəsi ilə seçilir.

«Kəmalüddövlə məktubları…» nda ədib islam ölkələrinin tərəqqi yolunda buxova çevrilən fanatizmin köklərini açmışdır**.** O, məktublarının birində: «Mənim məqsədim islam xalqlarını sarsıdan cəhaləti aradan qaldırmaq, elmləri öyrənmək, xalqımızın azadlığı, rifahı və sərvətinin arması üçün islamiyyətdən əvvəl babalarımızın malik olduğu şan və şöhrətin bərpa edilməsi üçün ədalətə rəvac verməkdir», deyə yazırdı. Məqsədinə nail olmaqda daha çox maarifçiliyə üstünlük verən ədib cəmiyyəti dəyişmək, yeni bir dünya yaratmaq məsələsində mütərəqqi ideyaların təbliğini birinci şərt hesab edirdi.

«Kəmalüddövlə məktubları…» əsəri ilə özünün dövlətçilik baxışlarını irəli sürən M.F.Axundov Azərbaycan mədəniyyəti tarixinə şair, yazıçı, dramaturq, pedaqoq, filosof, tarixiçi, hərbi və siyasi xadim kimi daxil olmuşdur. Bir müddət o, Tiflisdə canişinlik idarəsində işləmiş, bir çox Avropa ölkələrində olmuşdur. Avropa ölkələri xalqlarının mədəniyyəti ilə tanışlıq M.F.Axundovun dünyagörüşündə dəyişikliyə səbəb olmuş, yaradıcılığında Şərq və Qərb mədəniyyətini birləşdirə bilmişdir. 1851-ci ilin aprelin 3-də İmperator Rus Coğrafiya Cəmiyyətinin Qafqaz şöbəsinə seçilən 39 həqiqi üzv arasında M.F.Axundov da olmuşdur.[490]

M.F.Axundov çoxcəhətli yaradıcılığında feodal-patriarxal üsul-idarəsi və qayda-qanunlarına, zülm və özbaşınalığına, qanunsuzluq, nadanlıq, dini fanatizm, ətalətə qarşı çıxmış, doğma xalqının və ümumən, Şərq xalqlarının milli intibahı, iqtisadi-mədəni tərəqqisi, zəhmətkeş kütlələrin azad və xoşbəxt həyatı uğrunda fəal mübarizə aparmışdır.

M.F.Axundovun zəngin və çoxcəhətli irsində şeirləri əhəmiyyətli yer tutur. «Səbuhi» təxəllüsü ilə yazılmış «Zəmanədən şikayət» adlı şeiri onun bizə gəlib çatmış ilk bədii əsəri hesab edilir. Əsər fars dilində, məsnəvi formasında qələmə alınmışdır. Burada Axundov öz acı həyatından, onu əhatə edən mühitdən, dost-aşnadan acı-acı şikayətlənir.

M.F.Axundovun bizə gəlib çatmış ikinci poetik əsəri 1837-ci ildə yazdığı «Puşkinin ölümünə Şərq poeması»dır. Əsər fars dilində, klassik Şərq şeiri üslubunda yazılmışdır. Məhz bu poema ilə milli ədəbiyyatımıza yeni bir ədəbiyyatın, yeni bir mədəniyyətin nəfəsi, ruhu, ənənəsi daxil olmağa başlayır və

milli-ədəbi və ictimai fikrimizin inkişafında mühüm rol oynayan Azərbaycan-rus ədəbi əlaqələrinin əsasları qoyulur.

Mirzə Fətəli qüdrətli rus şairi Puşkinin ölümünə dərindən kədərlənir, onun qatillərinə lənət yağdırır və rus xalqının böyük dərdinə şərik çıxır, onun itkisinə yanır. Poema

*Torpağına saçmağa iki gül ətri*
*Qopar Baxçasaraydan bir incə rüzgar.*
*Tutulub bu xəbərdən ağ saçlı Qafqaz,*
*Səbuhinin şeirilə yasını saxlar*[491]- misraları ilə bitir.

M.F.Axundovun yaxın dostu Q.Zakirə zarafat tərzində, xəfif yumorla yazdığı mənzum məktubunda şairlə Xurşudbanu Natəvan arasında yaranmış dostluq əlaqələrindən söz açır. Zakirə xitabən yazılmış başqa bir mənzum məktub isə 1853-1855-ci illərdə Rusiya ilə Türkiyə, Fransa və İngiltərə arasında gedən müharibəyə həsr olunmuşdur. Bir mütərcim kimi Krımda hərb meydanında iştirak edən şair şeirində bu müharibədə Rusiyanın öz düşmənləri üzərində qələbə çalacağını söyləyir və rus dövlətinin qüdrət və şöhrətini tərənnüm edir.

M.F.Axundov maarifçilik məramnaməsində müsəlman xalqlarının müasir dövrdə inkişafı üçün əlifbanın dəyişdirilməsini başlanğıc sayaraq yazırdı ki, «…bütün işlərin əsası bilikdir, bilik isə əlifbanın açarıdır».

Böyük ədib əlifbanın dəyişdirilməsinə din bayrağı altında xalqların dövlətçilik ənənələrini dağıdan, mədəniyyətini məhv edən ərəb istilasının təzahürü saydığı mənəvi əsarətdən xilas olmaq vasitəsi kimi baxırdı. Böyük mütəfəkkir minillik səltənətimizin dağıdılmasından, vətənimizin xarabazara çevrilməsindən, xüsusilə öz əlifbasını zorla qəbul etdirdiklərindən ürək ağrısı ilə bəhs edərək baş verən müsibətləri əlifba ilə bağlayırdı. Ədib qeyd edirdi ki, ərəb əlifbasına qədər şərqdə işlədilən *kufi xəttinin durğu işarələri, hərflərin altında və üstündə nöq tələr yox idi.*

***Xatırlatma:***

***Müasir ərəb əlifbası üçün nöqtələri məşhur xəttat, ədəbiyyatşünas və dövlət xadimi İbn Müqlə icad etmişdir. XV əsrin ortalarına qədər cəmi iki durğu işarəsi: nöqtə və iki nöqtə mövcud olub. Azərbaycan müəllifləri XIX əsrin ortalarına qədər nöqtə əvəzinə ulduz işarəsi işlətmişlər. Üçüncü durğu işarəsi-vergülü yazıda Venesiya çapçısı Ald Manutsi (1450-1515) 1495-ci ildə tətbiq edib. Vergül işarəsi Azərbaycanda XIX əsrin ortalarınadək işlədilməyib. M.F.Axundov özü də 1859-cu ildə Tiflisdə nəşr olunan «Təmsilat» adlı ilk kitabında durğu işarələri işlətməmişdir. Durğu işarələrindən istifadənin vacibliyini M.F. Axundov irəli sürüb, yazıda və çapçılıqdakı çətinlikləri aradan qadırmaq üçün 12 durğu işarəsi işlədilməsini elmi şəkildə əsaslandırmışdır.***



***M.F.Axundovun əlifba layihəsi***

M.F.Axundov 1857-ci ildə ərəb qrafikası əsasında yeni əlifba tərtib etmiş və əlifba islahatı uğrunda fəal mübarizə aparmağa başlamışdır. Bu məqsədlə o, 1863-cü ildə İstanbula gedib, layihəni baş nazir Fuad Paşaya təqdim edir. Layihə baş nazirin göstərişi ilə «Cəmiyyəti Elmiyeyi Osmaniyyə» də müzakirə olunur. Burada M.F. Axundovun əlifba layihəsi təsdiq olunsa da, onu həyata keçirmək üçün heç bir tədbir görülmür.

M.F.Axundov insanın hərtərəfli inkişafında savadın, təhsilin və elmin roluna böyük əhəmiyyət verərək çoxlu xalq məktəblərinin açılmasını, həmin məktəblərin dinin təsirindən azad olmasını arzu edirdi.

Bu cəhətdən onun H.B.Zərdabiyə yazdığı məktubu diqqətəlayiqdir: «Sən hər qəzetində biz müsəlman tayfasına elmin fəzilətini və səməatını zikr edib,

bizə hey təklif edirsən elm öyrənin, elm öyrənin… Çox yaxşı sözün baməna və nəsihətin müfrid və xeyirxahlığın artir. İndi biz hazırıq ki, sənin nəsihətini əmələ gətirək. Bizə de görək, elmi harada öyrənək və kimdən öyrənək və hansı dillə öyrənək…Sənin muradın o vaxtda kamilən bitər ki, bizim hətta çobanlarımız da … oxumaq, yazmaq bilələr və ünas tayfamız da oxumaq bilə».

Böyük mütəfəkkir Azərbaycan xalqının azadlığa çıxacağına, yadellilərin ölkədən qovulacağına inanırdı və yazırdı: «…Yaxın gələcəkdə vətənimiz yadların ardınca gedənlərin mənhus vücudundan təmizlənəcəkdir! Yurdumuz yenidən gülüstana çevriləcəkdir».

M.F.Axundov azadlığa nail olmağın yollarından bəhs edərək yazırdı «…zülmü aradan qaldırmaq üçün heç də zalıma müraciət etmək lazım deyildir, bəlkə əksinə, məzluma demək lazımdır ki,…bəs nə üçün zülmə qatlaşırsan… Adamların damarlarına təzə və isti qan dağıtmaq və onları hərəkətə gətirmək lazımdır, göz qabağında olan bu əsas kökündən, dibindən qoparılmalıdır».




***M.F.Axundovun kötükcəsi Pəriruh xanım Şəkidəki Yuxarı Karvansarayda (ilk dəfə çap olunur).*** **Soldan:** *Azərbaycan KP Şəki Şəhər Komitəsinin Təbliğat və Təşviqat şöbəsinin müdiri, tarix elmləri namizədi* ***Mais Əmrahov, Pəriruh xanım*** *və onun əri, Tokio Universitetinin professoru* ***İraç Parseid Necad. 1985-ci il***

M.F.Axundov Azərbaycan xalqının sosial-iqtisadi, mədəni-mənəvi təşəkkülünü «millət» kimi dəyərləndirirdi. «Kəşkül» qəzeti bu təşəkküldən «türk milləti» deyərək bəhs edirdi.

Şəxsiyyəti və yaradıcılığı son zamanlar mübahisə obyektinə çevrilən Axundov milli özünüdərketmə şüurunun ziddiyyətlərini özündə cəmləşdirmişdir. O, bir tərəfdən antiottoman əhvali-ruhiyyədən xali deyildisə, digər tərəfdən doğma dilin ədəbi dirçəlişinə verdiyi töhvəyə görə türk xalqlarının milli özünüdərkinin formalaşdırılmasında mühüm rol oynamışdır.

M.F. Axundov əsərləri ilə Azərbaycan cəmiyyətinə yeni istiqamət vermiş, milli mədəniyyətin inkişafına böyük təsir göstərmişdir. Bu səbəbdən də, XIX əsr «**Mirzə Fətəli əsri»** kimi qiymətləndirilir.

2012-ci ildə böyük ədibin anadan olmasının 200 illiyi tamam olmuş, Şəki ziyalıları yubileyi böyük mütəfəkkirin adına layiq qeyd etmişlər.

***Əəsas işi:*** *Təmsilati-kapitan Mirzə Fətəli Axundzadə. Tiflis, 1859; Əsərləri 3 clddə. Bakı, 1952-1965; Избранное. М., 1956; Избранные философские произведения. М., 1962; M.F.Axundov. Komediyaları. Bakı, 1975; Əsərləri, 3 cilddə, Bakı, 1988;*

***Onun haqqında*:** *Köçərli F. Mirzə Fətəli Axundov. Tiflis, 1911; Dəmirçizadə Ə. M.F. Axundovun dili. Bakı, 1940; Cəfərov C. M.F.Axundovun dramaturgiyası. Bakı, 1953; Araqon Lui. «Qərb-Şərq divani» zəruriyyəti haqqında. «Ədəbiyyat və incəsənət», 1957, № 38; Qasımzadə F. M.F. Axundov. Həyat və yaradıcılığı. Bakı, 1962; Məmmədzadə N. M.F.Axundov və Şərq. Bakı 1971; Məmmədov N. M.F.Axundov realizmi. Bakı, 1978; Rəfili M. Mirzə Fətəli Axundov. Bakı, 1990; Talıbzadə K. Azərbaycan ədəbi tənqidinin tarixi. Bakı 1984;* ***Гусейнов Из истории общественной и философской мысли Азербайджане XŞX века. Баку, 1958; Меликова М.Ф. Общественно-политические взгляды М.Ф. Ахундова. Баку, 1958; Мамедов Ш. Мировозрение М.Ф.Ахундова.М., 1962; Джафаров ДЖ. М.Ф. Ахундов. Баку, 1987*; *Çingiz Hüseynov. Fətəli fəthi. Bakı: Yazıçı, 1996;***



Azərbycanın qadın bəstəkarları içərisində xüsusi sanbala malik olanlardan biri Şəfiqə Axundovadır.

**AXUNDOVA ŞƏFİQƏ QULAM QIZI (1924-2013)** 1924-cü ildə Nuxada anadan olmuşdur. *Atası Qulam Axundov 1877-ci ildə Nuxada doğulub. 1924-cü ildə Bakıya gələn Q.Axundov 1947-ci ilə kimi müxtəlif vəzifələrdə işləmiş, 1947-ci ildə dünyasını dəyişmişdir.*

İlk təhsilini Nuxada almış, 1943-1944-cü illərdə Asəf Zeynallı adına Bakı Musiqi Məktəbində oxumuş, dahi bəstəkar

Üzeyir Hacıbəyovdan dərs almışdır. Bu əməkdaşlıq sonrakı illərdə də davam etmiş, Şəfiqə xanım Azərbaycan Dövlət Konservatoriyasında həm musiqi nəzəriyyəsi, həm də bəstəkarlıq ixtisası üzrə V.Zeydmanın sinfini bitirmişdir.

Şəfiqə xanım Üzeyir bəyin ona, ümumiyyətlə, gənc bəstəkarlara münasibətindən bəhs edirək yazırdı «...Üzeyir bəy konservatoriyanın nəzdində hazırlıq kursları açmışdı. Həftədə üç dəfə bizimlə məşğul olurdu. Gah ümumi qrupda Azərbaycan xalq musiqisinin əsaslarını gənc bəstəkarlara öyrədir, gah fərdi olaraq əsərlərimizlə məşğul olur, yəni yazdıqlarımıza baxır, gah da muğamları nota köçürürdük. Üzeyir bəy gənc Azərbaycan musiqiçilərinə bəstəkarlıq sənətinin klassik qayda-qanunlarını daha dərindən öyrətmək üçün Leninqrad Konserva toriyasının görkəmli professoru Zeydmanı Bakıya dəvət etmışdi. Biz bu böyük ustaddan bəstəkarlığın sirlərini öyrənirdik».

Şəfiqə Axundova yaradıcılığa hələ müharibə illərində başlamış, Ü.Hacıbəyovun məsləhəti ilə 1944-cü ildə Azərbaycan himninin yaradılması müsabiqəsində işirak etmiş, Dövlət Komissiyası qarşısında ilk dəfə «Azərbaycan himni»ni ifa etmişdir.

Şəfiqə Axundova 300-ə yaxın mahnı və romans yazmışdır. «Ev bizim, sirr bizim» operettasında simfonik orkestr üçün suitaların, simli kvartet üçün pyeslərin, xor üçün silsilələrin bəstəçisidir. Dram teatrları üçün «Aydın», «Əlvida, Hindistan», «Nə üçün yaşayırsan» və bir çox digər tamaşaların musiqi müəllifidir. Bəstəkarın yaradıcılığında uşaqlar üçün yazılmış əsərlər də xüsusi yer tutur. «Təxəyyül nağılı», «Dovşanın ad günü» və digər uşaq pyeslərinin musiqi müəllifi Şəfiqə Axundovadır.

Şəfiqə Axundova 1972-ci ildə «Gəlin qayası» operasını yazmaqla Şərqin ilk opera yazan qadın bəstəkarı olmuşdur. «Gəlin qayası» operasında klassik musiqi ilə şifahi ənənəvi klassik muğamın qovuşması Üzeyir Hacıbəyov üslubunun saxlanmasını təsdiq edir. Operada qəhrəmanların ariya və ariozaları ifa etməsilə yanaşı, muğam parçalarının da səslənməsi bəstəkarın xalq musiqisini çox mükəmməl bilməsindən irəli gəlir və əsərə uğur qazandırır.

«Gəlin qayası» operası haqqında sənət adamları yüksək fikirlər söyləmişlər. İlk tamaşasından bu günə kimi böyük xalq məhəbbəti qazanan bu opera daim müəllifinə uğur gətirmişdir. Bu əsər indi də Azərbaycan Dövlət Opera və Balet Teatrının səhnəsində müvəffəqiyyətlə oynanılır.

Ş.Axundovanın bəstələdiyi «Qələbə marşı», «Qələbəmiz», «Vətənimiz», «Çiçək», «Arzular», «Hindli qız», «Anacan» və s. mahnılar müğənnilər tərəfindən sevə-sevə ifa olunur.

Bəstəkar C.Məcnunbəyovun «İliç buxtası», C.Cabbarlının «Nəsrəddin şah», «Aydın», M.Şamxalovun «Qayınana», K.Seyidbəylinin «Onun böyük ürəyi», B.Vahabzadənin «Vicdan» və s. dram tamaşalarına da mahnılar bəstələmişdir. Onun simfonik orkestr üçün bəstələdiyi «Cahanda», «Mənim qəlbim», «Mənim məhəbbətim», «Qələbə bizimdir», «Üç pyes» və s. əsərləri repertuardan düşmür.

Şəfiqə Axundova geniş yaradıcılıq diapazonuna malik bəstəkardır. Onun sənəti yeni nəslin təlim və tərbiyəsində mühüm rol oynayır. Şəfiqə xanım 1956- cı ildən 1982-ci ilə kimi Azərbaycan Dövlət İncəsənət İnstitutunda müəllim kimi fəaliyyət göstərmişdir. O, «Əməkdar incəsənət xadimi» fəxri adını almış və 1998-ci ildə «Azərbaycan Respublikası xalq artisti» adına layiq görülmüşdür.

Yorulmaz bəstəkarın həyat və yaradıcılığı haqqında çoxsaylı kitablar yazılmışdır.



Axundova Şəfiqə Qulam qızı 2013-cü ildə dünyasını dəyişmişdir.

***Onun haqqında***: *Ənvər Mete. O torpağın övladları. Bakı: Nurlan, 2006, 608 s, şəkilli. s. 252-257; 509-511; ASE, I c, Bakı, 1976,səh. 501;*

**ASLANOV VAQİF CUMAY OĞLU (VAQİF ASLAN) (1950)**[492] 5 iyul 1950-ci ildə Nuxanın Kiş kəndində anadan olmuşdur. Başlanğıcda «Vaqif Aslanov», «Vaqif Cumaoğlu» imzaları ilə yazmışdır. 1970-ci illərin ortalarından «Vaqif Aslan» təxəllüsü ilə yazır. Şair-publisist, araşdırmaçı və tərcüməçidir. Lirik-epik əsərlərin müəllifidir. Əsasən poeziya üzrə peşəkardır. Elmi-ədəbi məqalələr yazır. Fransız və rus dillərindən tərcümələr edir.

2009-cu il üzrə Prezident təqaüdçüsüdür.

Vaqif Aslan səkkizillik təhsilini Kiş, 10 illik təhsilini isə Oxut kənd məktəbində almışdır. 1968-1973-cü illərdə Azərbaycan Pedaqoji Xarici Dillər İnstitutunun fransız və Azərbaycan dili fakültəsini bitirmişdir. 1973-1993-cü illərdə Şəkinin Kiş kəndindəki orta məktəbdə ixtisası üzrə müəllimlik etmiş, 1994-1997-ci ildə Şəki Regional Elmi Mərkəzində «Folklor və el sənətləri» laboratoriyasının rəhbəri olmuşdur. 1997-ci ildən AMEA-nın Folklor İnstitutunun Şəki bölməsinə rəhbərlik edir və eyni zamanda AMİ-nin Şəki filialında pedaqoji fəaliyyətini davam etdirir.

V.Aslan 1994-cü ildə akademik Bəkir Nəbiyevin, AMEA-nın müxbir üzvləri Yaşar Qarayev və Tofiq Hacıyevin zəmanətləri ilə Azərbaycan Yazıçılar Birliyinə üzv qəbul olunmuşdur. Ədəbi fəaliyyəti boyunca böyük imza sahiblərinin, o cümlədən başda xalq yazıçısı Anar olmaqla Azərbaycan Yazıçılar Birliyi İdarə Heyətinin etimadını doğrultmağa çalışmışdır. Hal-hazırda Azərbaycan Yazıçılar Birliyi Şəki Şöbəsinin sədridir. Bölmə ictimai əsaslarla fəaliyyət göstərir və respublikanın şimal-qərb bölgəsini əhatə edir. O, Azərbaycan Yazıçılar Birliyinin X, XI və XII qurultaylarının iştirakçısı olmuşdur.

Vaqif Aslan XX əsrin sonlarına doğru lirik və epik şeir örnəkləri içərisində üslubu ilə seçilən, öz səsi və nəfəsi ilə geniş oxucu auditoriyasına sevgi və sevincin ağuşunda bir təravət, bir istilik, bir doğmalıq, bir varislik gətirən, nəfəsi və həniri duyulan şairlərdən biridir. O, adı üstündə olmağı həmişə üstün tutmuş, şəxsi üslubunu cilalamış, sözü qənaətlə, zərgər dəqiqliyi ilə işlətməyi bacar-

mışdır. Bununla Vaqif Aslan XX əsrlə XXI əsrin qovşağında özündən əvvəlki nəslin layiqli, bəzən də üstün olduğu varisi kimi özünü təsdiq etmişdir.

Vaqif Aslan şeirlərində səmimiyyət üstünlük təşkil edir. Toxunduğu mövzudan asılı olmayaraq onun yazıları dağ çeşməsi kimi təmiz, saf, uşaq gülüşü qədər səmimidir. Əslində isə gözünü dünyaya açandan bəri saf insanlar arasında yaşaması, təmtaraqdan uzaq, torpağında, daşında türkçülük həniri duyulan Kişin kənd həyatı onu saflaşdırmış, fikir və düşüncələrini ifadə etmək üçün ilham vermişdir.

V.Aslanın ilk kitabı «Aydın» poemasıdır.[493] 1993-cü ildə oxucuların ixtiyarına verilən poemanın özəlliyi ondadır ki, bədii ədəbiyyatımızda ilk olaraq məhz bu poemada ulu öndərin şəxsiyyətinə ümumxalq sevgisi öz əksini tapmışdır.

Vaqif Aslanın ikinci kitabı fransız səyyahı (XVII əsr) Jan Batist Şardənin «Səyahətnaməsi» nin 1711-ci il Amsterdam nəşrinin dilimizə tərcüməsidir. Bu, orijinaldan ilk tarixi tərcümə hesab edilə bilər. Burada İrəvanın məscidləri, oradakı qədim qüllə, keçirilən Novruz bayramının təsviri ilə bağlı verilən məlumatlar son dərəcə qiymətlidir. İrəvan bəylərbəyiliyinə daxil olan Şərur sultanlığı, Naxçıvan xanlığı, Noraşen, Culfa haqqında məlumatlar tarixi əhəmiyyət daşıyır. Kitab 1994-cü ildə «Elm» nəşriyyatı tərəfindən çap edilmişdir.[494]

Şairin 1997-ci ildə çap olunan «Ruhlarla söhbət» tarixi-fəlsəfi poeması müasirləri tərəfindən «yaddaşla dialoq», «türkün əzəmətl dastanı» adlandırılmışdır. [495] Xalqı kökə, qayıdışa səsləyən şair poemada yazır:

Ey əslini, nəslini, kökünü axtaran kəs,
Burda ehtiyatla gəz!
Bura - qəbiristan yeri.
Qəbiristan-bostan yeri.
Soyuq olsa, göyərməz
Bura əkilən toxum.
Yer üstə olan -varın,
Yer altda qalan-yoxun.
Yox olmasa, var olmaz,
Bir ağac-min bir budaq.
Hər budaqda bar olmaz
Düşünmə bu dünyanın suyu, günəşi bol-bol,
Kökünə muğayat ol.
Ey əslini, kökünü axtaran kəs,
Bura əkilən toxum imisti göz yaşıyla
Sulanmasa göyərməz. **(**«Ruhlarla söhbət»**)**[496]

Vaqif şeirinin əsas qayəsini həyatla həmahənglik, müdriklik təşkil edir. O, içində yaşadığı həyatı qələmə alır, oxucusunu onunla birgə düşünməyə, «papağını qabağına qoyub fikirləşməyə» dəvət edir.

Arazdan keçmirik-suyu sərindir.
Kürdən adlamırıq-dibi dərindir.
Araz aşığından, Kür topuğundan olan kişilər.
Nə qədər ucaymış boyunuz sizin.
Əsliniz, kökünüz, suyunuz sizin.
Axıb qanımıza dolan kişilər!

Şair sanki olub-keçənlərdən təəssüflənir, unutqan olduğumuz üçün bizi qınayır:

Getdi özünüzlə zorunuz sizin
Dolur gözümüzə qorunuz sizin.
Çatdam-çatdam olsun gorunuz sizin,
Daşımız qalmadı daşımız üstə,
Ay yurdu-yuvası talan kişilər!
Olunca dünyada olmasa yeymiş,
Qalınca dünyada qalmasa yeymiş,
Sizin yerinizdə qalan kişilər!
İndiki kişilər-yalan kişilər. («Kişilər»)

Göründüyü kimi, Vaqif Aslan sözündə hikkə, təhdid, qınaq yoxdur, nə deyirsə səmimi deyir, nə yazırsa ürəyini, beynini zorlamır, ürəyinin diqtəsi ilə yazır və yazısındakılar üçün heç kimi günahlandırmır, nəticəni oxucunun öhdəsinə buraxır. Diqqət edək: hamımız bulaq suyunun şırıltısını, yaxud quşların səsini dinləmişk, ancaq heç birimiz bu ilahi səsləri ifadə etmək, yaxud da bu səslərin içərisindən məna axtarmağı bacarmamışıq. Vaqif isə quşların oxumasında güllərin, çiçəklərin təbəssümünü tapır, bulaqların şırıltısında dağların sərtliyini, göylərinənginliyini, dəryaların dərinliyini, bulağı yaradan Tanrının möcüzələrini poeziyanın gücü ilə oxucuya çatdırır:

Bu dünyada qərənfil çox, lalə çox,
Amma sənin lalən kimi lalə yox.
Bulağının naləsi tək nalə yox,
Bulaqların nə nəğməkar bulaqdır.
Səndə şair olmamaq da günahdır.

Vaqif Aslan çoxsahəli biliyə, güclü yaddaşa, fenomen fəhmə malik şairdir. O, əsərlərini elə-belə, şeir xatirinə yazmır. Hər bir əsər üzərində aylarla, illərlə işləyir, ədəbiyyatı saf-çürük edir. O, «Ruhlarla söhbət» [497] poeması üzərində işləyərkən 208 mənbəyə müraciət etmişdir. Onunla söhbətdən insan ləzzət alır, ayrılmaq istəmir, sanki sehrə düşmüş kimi xəyallardan ayrılmır.

Vaqif Aslanı etnoqraf, tarixçi və dilçiyə bənzədənlər səhvə yol verməmişlər, o sözün həqiqi mənasında tarixçidir, etnoqrafdır, dilçidir. Bütün bunları

ümumiləşdirsək, V.Aslana *heyrət və qeyrət şairi, ürək və qəlb şairidir* - deyə bilərik.

Vaqif şeirinin mərkəzində insan dayanır. O qəlblərdə yuva salan biganəliyə, yad və buzlaşma dövrü keçirən hisslərə qarşı amansız və barışmazdır. Vaqifin yolu əyilməz idrak, səmimi qəlb, insanlara səadət bəxş etməyə hazır olmaq istəyidir. Elə bu səbəbdən də şair insanlara belə nəsihət edir:

Elə yaşayaq ki, yaşadıqca biz,
Bir ömrün min zəfər yoldaşı olsun.
Yer kimi müqəddəs, göy kimi təmiz,
Əməllər insana baş daşı olsun.

Vaqif Aslan poeziyası məhəbbət və sevgi selindən yaranmışdır. Yarı zarafat, yarıciddi, bəzən Şəki ləhcəsinin şirinliyi ilə yazır:

Sözündən pay umdum, gözünü süzdün,
Ay sənin süzülən gözünü yeyim.
Üzündən pay umdum, bəs niyə küsdün?
Allanan, güllənən üzündən yeyim.

Yaxud,

Olmaz idi Sara kimi gəlindən…
Sellər aldı, Xançobanın əlindən.
Ölləm bir tük əskik gəlsə telindən.
Vaqif Aslanın Sarası, ağlama!

Yaxud da,

Nazını çəkəsi əl quruyubsa,
Çiçəyim, quru!
Tale mürgüləyib, bəxt uyuyubsa,
Ay mənim gözəlim, göyçəyim, quru!
Gözün nə gördü ki, şehdən savayı**?**
Dilin nə dedi ki, ehdən savayı?
Səni kim öpdü ki, mehdən savayı?
Ay mənim gözəlim, göyçəyim, quru!

Vaqif Aslanın **on kitabı** işıq üzü görüb. Başqırd şairi Mustay Kərimin «Ay tutulan gecə», polyak dramaturqu Slavomir Mroyekin «Xoşbəxt hadisə» pyeslərini rus dilindən tərcümə etmiş və hər iki əsər S.Rəhman adına Şəki Dövlət Dram Teatrında tamaşaya qoyulmuşdur. Kinossenarilər müəllifi olan şair, həm də elmi fəaliyyətlə məşğuldur.

Müasir türk ədəbiyyatını diqqətlə izləyən Vaqif Aslan Adnalı şair-tədqiqatçı Ahmet Kaytançı ilə, İstanbuldan şair Asim Yekələrlə, İzmirdən Sevgi Dincalla yaradıcılıq əlaqələri saxlayır. «Türk edebiyyatları antolojisi» nin V cildində böyük Azərbaycan ədibləri ilə yanaşı, Vaqif Aslana da yer verilmişdir. Bir sözlə, tarixin son üç əsri Şəki ədibləri ilə qoşa çəkilməkdədir. XIX əsr ***«Mirzə Fətəli Axundov əsri»***, *XX əsr* ***«Bəxtiyar Vahabzadə əsri»*** *olmuşdursa*, **XXI əsr «Vaqif Aslan əsri» olacaqdır**.

Yaşayaq, görək!

**Əsas işi:** *«Aydın» poeması. Bakı: Elm, 1993, 52 s.; «Səyahətnamə». Bakı: Elm, 1994, 124 s.; «Ruhlarla söhbət». Bakı: Ozan,1997, 256 s.; «Oğuz elinə salam». Bakı:Mütərcim, 2000, 148 s.; «Qanımdan rəng alan gül. Bakı: Səda, 2003, 260 s.; «Kiş kəndi və onun məbədi (G.Məmmədova ilə birlikdə), Bakı: Çaşıoğlu, 32 s.; Seçilmiş əsərləri. 4 cilddə. I cild. Bakı: Uni Print, 2009, 718 s.; II cild. Bakı: «Təhsil» NPM, 2009, 350 s.; III cild, Bakı: «Təhsil» NPM, 2010, 552 s.; IV cild. Bakı: «Təhsil» NPM, 2010, 540 s.;*

**Onun haqqında:** *Allahverdi Tağızadə. Tanış olun. «Bilik» qəzeti, ARXDİ-nin orqanı, 1972-ci il; Aydın Məmmədov. Qələm dostumuz Vaqif Aslan, «Şəki fəhləsi» qəzeti, 1976, 9 oktyabr; İsa İsmayılzadə. Ruhumuz sağ olsun. «Xalq qəzeti», 1992, 18 aprel; Q.Yaşar. Epitafiya, yaxud baş daşına oxunan mahnı… «Ədəbiyyat qəzeti», 1993, 23 aprel; Akəm Məmmədzadə. «Aydın» poeması haqqında bir neçə söz. «Şəki» qəzeti, 1994, 13 aprel; Rasim Nəbioğlu. Bizim sorğu: XX əsrin sonudur: tənqidçi, nə düşünürsən. «Azərbaycan» jurnalı, 1998, № 5, səh.182.; Şamil Salmanov. Tarixlə, yaddaşla dialoq. «Ədəbiyyat qəzeti», 1998, 17 iyul.; Asif Rüstəmli. Səmimi hisslər, saf duyğular poeziyası. «525-ci qəzet», 2000, 7 sentyabr; Əli Məcid. Dost sözü. «Zaman» qəzeti, 1999, 26 iyun - 3 iyul; Bayraməli Vəli oğlu, Qurban Nurəddin oğlu. Vaqif Aslan və türkün poeziyası. «Azərbaycanın nicat yolu» qəzeti, 2009, 01-10 avqust; Rəsul İlməddinoğlu. Sevilməkdən korluq çəkməyən şair. «Elimiz. Günümüz» qəzeti, 2010, iyul; Rəsul İlməddinoğlu. Yer kimi müqəddəs, göy kimi təmiz əməllər sahibi. «Elimiz. Günümüz» qəzeti, 2011, yanvar; Dərviş Osman. Vaqif Aslan -60. «Meydan» jurnalı, 2011, aprel;*



**CƏLİLOV QURBAN NURMƏMMƏD OĞLU (1927-2000)** 1927-ci ildə Nuxada anadan olmuşdur. 1950-ci ildə Azərbaycan Dövlət Universitetinin (indiki BDU) fizika-riyaziyyat fakültəsini bitirib. Azərbaycan SSR EA Fizika və Riyaziyyat İnstitutunun aspiranturasını bitirən Q.Cəlilov 1954-cü ildə namizədlik, 1963-cü ildə doktorluq dissertasiyası müdafiə etmişdir. Azərbaycan SSR EA Dərin Neft və Qaz Yataqları Problemləri İnstitutunda mühəndis, kiçik elmi işçi, baş elmi işçi, laboratoriya rəhbəri işləyən Qurban müəllim 1974-cü ildə direktorun elmi işlər üzrə müavini təyin olunmuşdur.

Q.Cəlilov 1966-cı ildə professor elmi adı almış, 1972-ci ildə Azərbaycan SSR EA-nın müxbir üzvü, 1989-cu ildə həqiqi üzvü seçilmişdir.

Q.Cəlilov neft quyularının sulaşması və qarşılıqlı təsiri, su-neft sərhəddinin hərəkəti ilə əlaqədar məsələləri tədqiq etmiş, çoxlaylı neft və qaz yataqlarının işlənməsinin hidrodinamik hesablama üsullarını işləyib hazırlamış, müxtəlif kollektora malik bircinsli olmayan yataqların riyazi modellərini təklif etmişdir.

Yeraltı hidroqazodinamika, neft və qaz yataqlarının işlənib hazırlanması sahəsində görkəmli alimlərdən olan Qurban Cəlilov 1980-ci ildən Azərbaycan SSR EA-nın Yer Elmləri bölməsinin akademik katibinin müavini təyin edilmişdir. 170-dək elmi işin, 4 monoqrafiyanın müəllifi olan alimin rəhbərliyi altında 20-dən artıq elmlər namizədi hazırlanmış, onlarla elmlər doktorunun məsləhətçisi olmuşdur.

Q.Cəlilovun əməyi yüksək qiymətləndirilmiş, «Xalqlar dostluğu» ordeni və medalarla təltif olunmuş, İ.M.Qubkin adına mükafata layiq görülmüşdür.i



**Qurban Nurməmməd oğlu Cəlilov 2000-ci ildə dünyasını dəyişmişdir.**

**Əsas işi**: *Voprosı peremehenią kontura neftenonosti i obvojdenenią skvajen. Baku, 1974; Voprosı obvedenenią skvajen v mnoqoplastovıx mestorojdeniąx (başqaları ilə birlikdə). Baku, 1980;*

**Onun haqqında**: *Ənvər Mete. O torpağın övladları. Bakı: Nurlan, 2006, 608 s, şəkilli. səh.50-51; ASE, X cild, səh. 412;*

**DƏMİRÇİZADƏ ƏBDÜLƏZƏL MƏMMƏD OĞLU (1909-1979)** - 1909-cu il iyulun 7-də Nuxada anadan olmuşdur. O, 1917-1922-ci illərdə Nuxada «Həqiqətül-maarif» adlı yeni tipli məktəbdə ibtidai təhsil almış, 1923-1924-cü illərdə şəhərdəki zəhmət məktəbində oxumuş, 1925-ci ildə Nuxa Müəllimlər Seminariyasının 2-ci kursuna daxil olmuşdur. 1927-ci ildə təhslini başa vuran Əbdüləzəl 2 nömrəli şəhər məktəbində əmək fəaliyyətinə başlamışdır. O, müəllimliklə bərabər o dövrdə şəhərdə nəşr olunan «Nuxa fəhləsi» qəzeti ilə əməkdaşlıq etmiş, şeir və hekayələr yazmış, «Qızıl Qələm» cəmiyyətinin Nuxa şöbəsinin təşkilatçılarından biri olmuşdur.

Ə.Dəmirçizadə 1929-cu ildə Bakıya gəlir, Azərbaycan Dövlət Universitetinin filologiya fakültəsinə daxil olur, Səməd Vurğun, Süleyman Rüstəm, Əbülhəsən, Sabit Rəhman, Həmid Araslı, Cəfər Xəndan, S.Salamzadə və başqaları ilə bir sinifdə oxuyur. Bəkir Çobanzadə, Əbdürrəhim bəy Haqverdiyev, Yusif Vəzir Çəmənzəminli, Abdulla Şaiq kimi görkəmli şəxslərdən dərs alan gənc Əbdüləzəlin həyatında unudulmaz səhifələr açılır. Tələbə olarkən onun «Dan uluzu», «Gənc bolşevik», «Hücum», «Şərq qadını» jurnallarında bədii əsərləri çap olunur. Azərbaycan Proletar Yazıçılar Cəmiyyətinə üzv qəbul olunur.

Ə.Dəmirçizadə 1932-ci ildə təhsilini başa vuraraq Nuxaya qayıdır, Pedaqoji məktəbdə müəllimlik fəaliyyətinə başlayır. Lakin elmi yaradıcğa olan həvəs onu 1933-cü ildə yenidən Bakıya qaytarır, Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU) dillər kafedrasına aspirant qəbul edilir, professor Bəkir Çobanzadənin rəhbərliyi altında elmi araşdırmalarına başlayır. B.Çobanzadənin repressiyaya uğraması onun elmi yaradıcılığına mənfi təsir göstərir. Müəllimlərinin və dostlarının köməyi ilə Ə.Dəmirçizadə həvəsdən düşmür, aspiranturada oxuduğu müddətdə (1933-1937) dillər kafedrasında müxtəlif vəzifələrdə çalışır, ibtidai siniflər üçün «Türk dili» və ali məktəblər üçün «Azərbycan ədəbi dil tarixi xülasələri» kitablarını yazır.

Ə.Dəmirçizadə 1940-cı ildə namizədlik, 1944-cü ildə doktorluq dissertasiyaları müdafiə edir. 1945-ci ildə professor elmi adını alan alim 1952-1960-cı illərdə Azərbaycan SSR EA Nizami adına Ədəbiyyat və Dil İnstitutunda «Azərbaycan dili tarixi» şöbəsinə rəhbərlik edir, 1955-ci ildə EA-nın müxbir üzvü seçilir. 1956-cı ildə EA-nın ictimai elmlər bölməsinin üzvü, Terminologiya Komitəsinin sədr müavini olan alim 1960-cı ildə Moskvada keçirilən Şərqşünasların Beynəlxalq Konqresində Azərbaycanı təmsil edir. Onun *«Kitabi-Dədə Qorqud» dastanlarının dili», «Azərbaycan dilinin üslubiyyatı», «Müasir Azərbaycan dili»* (fonetika, orfoepiya, orfoqrafiya), iki hissədən ibarət «*Azərbaycan ədəbi dilinin tarixi», «50 söz»* kitabları alimlərin və tələbələrin stolüstü kitablarına çevrilmişdir. Ə.Dəmirçizadənin «Müasir Azərbaycan dili (I hissə)» əsəri 1974-cü ildə Respublika Dövlət mükafatına layiq görülür. Bu əsərdə Azərbaycan dilinin səs sistemi, orfoqrafiya və orfoepiya məsələləri tədqiq olunmuşdur. Xüsusilə ümumi fonetika məsələləri, səsin formalaşması mənbələri və mərhələləri, Azərbaycan dilinin səs sistemi, nitqin fonetik parçalanması, dilimizdəki fonetik hadisə və qanunlar, yazı və orfoqrafik tələffüz, orfoepiya və s. zəngin dil faktları ilə təhlil olunmuşdur.

Müasirləri yazırlar ki, ADPU-da «Azərbaycan dilçiliyi» kafedrasına başçılıq edən Ə.Dəmirçizadə istedadlı tədqiqatçı olmaqla yanaşı, həm də gözəl pedaqoq idi. Azərbaycan MEA-nın müxbir üzvü, əməkdar elm xadimi, filologiya üzrə elmlər doktoru, professor A.Qurbanovun qeyd etdiyi kimi, «…professor Ə.Dəmirçizadənin məhsuldar elmi tədqiqatı onun pedaqoji fəaliyyəti ilə vəhdət təşkil etmişdir…Böyük Ə.Dəmirçizadənin elmi irsi öz dəyərini saxlayaraq yaşayır və həmişə də yaşayacaqdır».

Filologiya üzrə elmlər doktoru, professor Nizami Xudiyev Ə.Dəmirçizadəni «…Azərbaycan dilinin və dilçilik elminin təəssübünü çəkən, on illər boyu onun keşiyində şərəflə dayanan, sanballı elmi əsərləri ilə dilçilik elminə başucalığı gətirən, özünəməxsus məktəb yaradan fədakar alim» kimi xarakterizə etmişdir. «…Dəmirçizadə dilimizin, xüsusilə ədəbi dil tariximizin təkamül yollarını, inkişaf pillələrini bütün ruhu, qanı ilə duymuş, onun ümumtürk miqyasında yerini, rolunu cəsarətlə qiymətləndirir və müdafiə edirdi».

Qocaman müəlim Azər Hüseynovu yazırdı ki, «Ə.Dəmirçizadə mahiyyətcə öyrədici bir insan varlığı olaraq prinsipi və tələbkarlıq xüsusiyyətilə son dərəcə səbr və təmkin sahibi kimi tərbiyə almış olduğunu sübut etmşdir.

Əsl elm adamı nümunəsi olan Əzəl müəllim unudulmaz insandır. O, Azərbaycan dilçiliyinin qəhrəmanlarından biridir».

ADPU-nun elmi işlər üzrə prorektoru, filologiya üzrə elmlər doktoru, professor, Respublika Dil Komissiyasının üzvü, əməkdar müəllim Vilayət Əliyev haqlı olaraq yazır ki, Bu gözəl və müdrik alim həyatdan cismən getsə də, Azərbaycan dilçiliyinin üfüqlərində parlaq günəş kimi şəfəq saçır, gələcək nəsillərə dilimizi sevməyin, öyrənməyin sirlərini açıqlayır, gənc alimlərə və müəllimlərə necə çalışmağın yollarını göstərir».



Görkəmli dilçi alim, filologiya üzrə elmlər doktoru, professor, əməkdar elm xadimi, Respublika Dövlət Mükafatı laureatı, Azərbaycan EA-nın müxbir üzvü **Dəmirçizadə Əbdüləzəl Məmməd oğlu 1979-cu ildə Bakıda vəfat etmişdir.**

***Əsas işi:*** *Azərbaycan ədəbi dil tarixi xülasələri. Bakı, 1938; «Kitabi Dədə Qorqud» dastanlarının dili. Bakı, 1958; Azərbaycan dilinin üslubiyyatı. Bakı, 1962; Müasir Azərbaycan dili (Fonetika, orfoepiya, orfoqrafiya). Bakı, 1972;*

***Onun haqqında:*** *V.İ.Lenin adına APİ-nin Elmi əsərləri, seriya II, 1969, №6; Ə.Dəmirçizadə. Biblioqrafiya. B, 1970; V.H.Əliyev. Müəllimlər müəllimi. Pedaqoji Universitet Xəbərləri. № 3. Təbiət, humanitar və pedaqoji-psixoloji elmlər bölməsi. Bakı, ADPU, 2011, səh. 3-7; ASE, III c, səh. 406;*

**ƏBDÜRƏHMANOV FUAD HƏSƏN OĞLU (1915-1971) Nuxada** anadan olmuşdur. İlk təhsilini Nuxada alan gənc Fuad 14 yaşında-1929-cu ildə ailəsi ilə birlikdə Bakıya köçmüş, həmin ildə indiki Ə.Əzimzadə adına rəssamlıq məktəbinə daxil olmuşdur.

F.Əbdürəhmanov 1935-1939-cu illərdə Y.Repin adına Leninqrad Boyakarlıq, Heykəltaraşlıq və Memarlıq İnstitutunda təhsil almışdır.

Yaradıcılığına portret janrı ilə başlayan F.Əbdürəhmanov M.F.Axındovun, Ə.Haqverdiyevin, Ü.Hacıbəyovun A.Zeynallının büst-portretlərini, Nizami adına Ədəbiyyat Muzeyinin fasadında qoyulmuş Füzulinin heykəlini yaratmışdır.

Müharibənin başlanması ilə Azərbaycan incəsənət xadimlərinin də yaradıcılığında müharibə mövzusu ön plana çıxır. Azərbaycan rəssamları 1943-cü ildə heykəltaraşlıq və qrafika üzrə bir sıra əsərlər işləyib hazırlayırlar. Bu əsərlər Moskva Şəhər Dövlət İncəsənət Muzeyində (fevral 1943), Tretyakov qalareyasında (aprel 1943) nümayiş etdirilir.

Sərgilərdə Mikayıl Abdullayevin «Dövlət Müdafiə Komitəsinin iclası», Azərbaycanın əməkdar incəsənət xadimləri Qəzənfər Xalıqovun və İsmayıl

Axundovun plakatları və təşviqat pəncərələri, Tağı Tağıyevin «Koroğlu epopeyası haqqında», Şərifzadənin «Babəkin yürüşü», Fuad Əbdürəhmanovun «Səməd Vurğunun büstü», «Qafqaz partizanları» əsərləri nümayiş olundu.

Müharibə Azərbaycan heykəltaraşlarına yeni mövzular üçün ideya verir. Müharibə başlananda Nizami abidəsinin modelini yenicə bitirən F.Əbdürəhmanov təyyarəçi Hüseynbala Əliyevin, snayper İsrafil Məmmədovun, döyüşçü Gəray Əsədovun büstlərini hazırlayır.

Müharibə illərində rəssamlardan F.Əbdürəhmanov, K.Kazımzadə, P.Topçubaşova və Ə.Hacıyev «Azərbaycan SSR əməkdar incəsənət xadimi» adına layiq görüldülər. **F.Əbdürəhmanov,** N.Fətullayev, L.Kərimova ordenlərlə, 40-dan artıq rəssam isə medal və fəxri fərmanla təltif olundular.

1947-ci ildə Dövlət mükafatına layiq görülən **F.Əbdurəhmanova** ikinci şöhrəti «Çoban» əsəri gətirdi. 1950-ci ildə hazırlanan bu əsər 1951-ci ildə tuncdan tökülmüş, uzun müddət Moskvada XTNS-də və Tretyakov qalareyasında nümayiş olunmuşdur. Bu əsərə görə F. Əbdürəmanov ikinci dəfə Dövlət mükafatına layiq görülmüşdür.

F.Əbdürəhmanovun S.Bəhlulzadə (1947), R.Mustafayev (1947), H.Aslanov (qəbirüstü abidə, 1949), B.Bağırova (1951), S.Vürğün (1957) kubalı Xesus (1962) və s. portretleri obrazların fərdi xüsusiyyətləri, xarakterlərin dolğunluğu ilə səciyyələnir.

XX əsrin 50-60-cı illərində yaratdığı «Çoban» (gips, 1950, Milli İncəsənət Muzeyi, tunc 1951, Tretyakov qalareyası, Moskva), Azərbaycanlı qadın (gips,1951), «Azadlıq» (tunc, 1957, hər ikisi Milli İncəsənət Muzeyi), və s. əsərlərdə milli xüsusiyyətlər üstünlük təşkil edir. 1951-ci ildə hazırlanan və 1960-cı ildə Bakıda ucaldılan «Azad qadın» heykəli (memar M.Hüseynov), Buxarada Əbu Əli İbn Sinanın, Düşənbədə Rudəkinin, S.Ayninin, Ulan-Batorda Suxe-Batorun və marşal X.Çoybalsanın abidələri monumental sənət əsərləridir. 1957-ci ildə «Azərbaycanın xalq rəssamı» adına layiq görülən F.Əbdürəhmanovun möhtəşəm əsərlərindən biri də, Səməd Vurğunun Bakıda qoyuluş heykəlidir. Sənətkarın son əsəri açılışı vəfatından iki il sonra - 1973-cü ildə olmuş Mehdi Hüseynzadənin monumental abidəsidir.



Azərbaycan SSR əməkdar incəsənət xadimi (1943), SSRİ Rəssamlıq Akademiyasının müxbir üzvü (1949), Azərbaycanın xalq rəssamı (1956), iki dəfə SSRİ Dövlət Mükafatı laureatı (1947,1951), **Fuad Həsən oğlu Əbdürəhmanov** 1971-ci il iyunun 15-də Bakıda dünyasını dəyişmişdir. Xatirə muzeyi vardır.

**Onun haqqında:** *Новрузова Дж. Монументальная скулптура Советского Азербайджана, Баку, 1960; yenə onun, Ǵ dtn*

*Fpzh, f q]f yşyşy ötqrzkf hf ıkşnş. <f rş, 1973; Наджафов М. Ф. Абдурахманов. М., 1954; ASE, IV cild, Bakı, 1980, səh.128-129; Ənvər Mete. O torpağın övladları. Bakı: Nurlan, 2006, 608 s., şəkilli. səh. 252-257;*

**ƏFƏNDİYEV ABDULLA BƏY İSMAYIL OĞLU (ABDULLA BƏY ƏFƏNDİZADƏ) (1872-1928)** 1872-ci il martın 3-də Nuxa şəhərində anadan olmuşdur. Abdulla bəy Əfəndiyev (Əfəndizadə) məşhur Azərbaycan pedaqoqu Rəşid bəy Əfəndiyevin kiçik qardaşıdır. Atası İsmayıl Əfəndi Türkiyədə təhsil almış bir maarifçi olmuşdur. İsmayıl Əfəndinin övladları Qazı Hüseyn Əfəndi, Rəşid bəy Əfəndiyev və Abdulla bəy Əfəndiyev Azərbaycanda elmin, maarifin, mədəniyyətin və ictimai fikrin inkişafında böyük xidmətləri olmuşdur. Abdulla bəy Nuxadakı rus məktəbini bitirdikdən sonra 1891-ci ildə Yelizavetpol Mixaylov sənət məktəbinin kənd təsərrüfatı şöbəsinə daxil olmuş, dördillik təhsilini başa vurduqdan sonra Nuxaya müəllim təyin olunmuşdur. Abdulla Əfəndiyev iki il Nuxada müəllimlik etdikdən sonra Tiflis Müəllimlər İnstitutunda təhsilini davam etdirmiş, 1899-cu ildə institutu bitirərək şəhər məktəbində müəllim işləmək hüququ almış, Bakıya gələrək rus-müsəlman məktəbində çalışmışdır.[498]

A.Əfəndiyev (Abdulla bəy Əfəndizadə kimi də oxunur) 1918- ci il dekabrın 7-də işə başlayan Azərbaycan Parlamentinə Nuxadan üzv seçilmişdir. Parlamentin xaricə göndərilən tələbələrin seçilməsi üçün M.Ə.Rəsulzadənin sədliyi ilə yaradılan 5 nəfərdən ibarət xüsusi müsabiqə komissiyasına Mehdi bəy Hacınskmi, Əhməd bəy Pepinov, Qara bəy Qarabəyov və Abdulla bəy Əfəndiyev daxil edilmişdir.

«Əhrar» partiyasının yaradıcılarındandır. O, 1920-ci ilin əvvəllərində yaratdığı «Əhrar» partiyasından çıxaraq müstəqil parlament üzvü kimi çıxış etmişdir. A.Əfəndiyev təkcə müəllimliklə kifayətlənməmiş, «Molla Nəsrəddin» jurnalının yaradanlarından biri olan Ömər Fatiq Nemanzadə (1872-1938) ilə birlikdə Nuxada M.F.Axundovun «Molla İbrahimxəlil kimyagər» və «Müsyö Jordan və dərviş Məstəli şah» komediyalarını tamaşaya qoymuş, Nuxa ətrafı kəndlərdən topladığı folklor nümunələrini rus dilinə tərcümə etmiş, «SMORK» məcmüəsinin 1894-cü il nömrəsində çap etdirmişdir. Onun rus poeziyasının nümayəndələri İ.A. Krılov və M.Y. Lermontovdan etdiyi tərcümələr çap olunmuşdur. Tiflisdə nəşrə başlayan «Şərqi-rus» qəzetində və digər mətbuat orqanlarında məqalələrlə çıxış etmişdir. Azərbaycan Müəllimlərinin I qurultayının (1906) nümayəndəsi olan Abdulla bəy həmin qurultayın qərarına əsasən Krıma gedir və müəllimlərə köməklik göstərir. Krımdan qayıtdıqdan sonra Fərhad Ağazadə və S.S.Axundovla birlikdə tədrisi asanlaşdırmaq üçün ərəb əlifasının islahı, ana dili və ədəbiyyatın tədrisi və dini dərsliklər yaratmaq barədə təşəbbüs irəli sürür və S. S.Axundovla birlkdə «Əlifba» kitabını yazır.

Abdulla bəy Azərbaycan əlifbası islahatının tərəfdarlarından olmuş, bu barədə məqalələrlə çıxış etmiş, «Son turk əlifbası» kitabı çap olunmuşdur.[499] Onun «Ya ölüm, ya Türkiyə» mənzuməsi zamanında məşhur idi.[500]

«Ya ölüm, ya Türkiyə» mənzuməsi 1919-cu ildə Şəkinin «Mədəniyyət mətbəsində (Şəhri-Nuxa-səneyi-1336) cüzi tirajla çap olunmuşdur. Kitabçada «Növhə, «Ümid», «Acı həqiqətlər qarşısında böyük ümidvarlıq» və «Qafqaza dəvət» mənzumələri toplanmışdır.

Abdulla bəy Əfəndiyevin «Ya ölüm, ya Türkiyə» mənzuməsində XIX yüzilliyn sonu XX yüzilliyn əvvələrində müsəlman aləminin düşdüyü ağır vəziyyətin səbəbləri açıqlanır, baş verən fəlakətlərin və bəlaların səbəbini xalqların taleyinə cavabdeh olan şəxslərin mənəmlik iddiasında görür və tarixin dərslərindən nəticə çıxarmağa çağırır:

*Yıxan türk aləmini əskidən qalmış bənəmlikdir.*
*Bu aləm içrə hər dəm təfriqə salmış bənəmlikdir,*
*Ayırmış milləti, dinə qılınc çalmış bənəmlikdir.*
*Tamam əyani-ixvani ələ almış bənəmlikdir,*
*Bənəmlikdən necə bizlər üçün bir qiyamətdir.*
*Yönəl tarixə doğru, gör bənəmlik bir nələr qoydu,*
*İgid Çingizin övladın ayırdı dərbədər qoydu,*
*Nə Baburdan, nə Nadirdən, nə Əkbərdən əsər qoydu,*
*Bənəmlik türklərə bəxş etdiyi yalnız zəlalətdir.*[501]

A.Əfəndiyevi Şərq xalqlarının məhkum vəziyyəti düşündürür. Nicat yolunu birlikdə, qardaşlıqda görür, Türkiyəni xilaskar hesab edir və bizləri vaxtilə əldə olunmuş qələbələrimizi yaddaşlarda canlandımağa dəvət edir. Doğrudan da, yaddaşımızı çözələsək görərik ki, N.Şəmsizadənin təbirincə desək «1071-ci ildə tarixi Malazgird döyüşündə qüdrətli Bizans imperatorunu məğlub edən Alp Arslan qızıl xaçı Bağdada aparıb xəlifənin ayaqları altına atandan bəri min ildir ki, xaç dünyası Avropa bunu türklərə bağışlamır, onu özlərinə əbədi düşmən sayır».




***Abdulla bəy Əfəndiyevin «Ya ölüm, ya Türkiyə» mənzuməsiyly wp üf, şnş. 1919-]e lk***

«Yüz illər boyu Avropa möhtəşəm türk-islam dünyasına bata bilmir. Ərəbin zehniyyəti, farsın lisanı, türkün ruhu və şücaətinin vəhdətindən yaranmış Şərqin iftixarı olan ümummüsəlman konteksti həm ideologiyada, həm də dövlətçilkdə elə bir təməl yaratdı ki, onun timsalında xilaskar görmüşdür». Abdulla bəy əsərində Azərbaycanın xilasını Türkiyədə görür, bircə yol ı «Ya ölüm, ya Türkiyə» olduğunu bildirir və «Qafqaza dəvət» mənzuməsində yazır:

*Hər ürəkdə səbt olubdur: «Ya ölüm, ya Türkiyə!»*
*Hər ağızdan yüksəlir fəryadi-şeyda Türkiyə!*
*Hər məqamda başqa söz yox, cümlə dua:Türkiyə!*
*Ən qəvi düşmən bu gün olmuşsa bərpa, Türkiyə!*
*Səbrimiz artıq tükəndi, durma gəl, mərdanə gəl!*

*Yurdumuz düşmən əlində olmamış viranə, gəl!*[502]

Azərbaycanda sovet hakimiyyəti qurulduqdan sonra A.Əfəndiyev Azərbaycan Dövlət Pedaqoji İnstitutunda dərs demiş, ali məktəb tələbələri üçün «Fənni-tərbiyə» adlı kitabı çap olunmuşdur.

Abdulla bəy Əfəndiyevin oğlu Ziya Əfəndiyev (Hikmət Ziyanın atası) Qori Müəllimlər Seminariyasında təhsil almışdır.

***Abdulla bəy Əfəndiyev 1928-ci ildə Bakıda vəfat etmişdir.***

**Əsas işi:** *Rüstəmin yuxusu, yaxud röyası. Bakı,1908; Şagirdlərə hədiyyə. Bakı, 1914; A.Əfəndizadə. «Ya ölüm, ya Türkiyə» Bakı: Mütərcim, 2005, 40 s.*

**Onun haqqında:** *Şəkidə məhəllə adları, soylar və ləqəblər (hazırlayanlar: Zəkəriyyə Mabudoğlu, Sevnc Bahəddinqızı). Bakı: «Natta-press» nəşriyyatı, 2004; Ənvər Mete. O torpağın övladları. Bakı: Nurlan, 2006, 608 s, şəkilli. s. 96; M.Əmrahov, H.Manaflı. Ə.Əfəndizadənin «Ya ölüm, ya Türkiyə» kitabına ön söz, səh.3-10;*



**ƏFƏNDİYEV RƏŞİD BƏY İSMAYIL ƏFƏNDİ OĞLU (1863 - 1942)** 1863-cü ildə Nuxada anadan olmuş, Nuxa şəhər rus məktəbində oxumuşdur.

Məlumdur ki,1879-cu ildə Qori Müəllimlər Seminariyası nəzdində Azərbaycan şöbəsi təşkil olunmuşdur. Həmin şöbəyə uşaq toplanması o dövrdə çox çətin və məsuliyyətli idi. Elə Rəşid bəyin yazdığı kimi, 1878-ci ildə Tiflisdə onun Mirzə Fətəli Axundovla görüşü və A.O.Çernyayevskinin 1879-cu ildə Nuxaya gəlişi və seminariyaya uşaq toplaması seminariyaya qəbuluna səbəb olmuşdur. Bu barədə tədqiqatçıların əlində təsdiqedici sənədlər vardır.

Sənədlər göstərir ki, A.O. Çernyayevski Qori Müəllimlər Seminariyasının Azərbaycan şöbəsinə ilk tələbə qəbulunun təşkilatçılarından olmuşdur. O, qısa vaxtda bölgələri gəzmiş, uşaqların toplanması ilə məşğul olmuşdur. Bu barədə onun 24 iyun 1898-cu ildə D.D.Semyonova göndərdiyi məktubu maraqlıdır. A.O. Çernyayevski yazırdı: «…Açığını desək, bu səyahət mənə çox baha başa gəldi. 3.600 km-dən artıq bir məsafənin 240 km-ni 30-40 dərəcə istidə, pis yollarla və özü də müxtəlif nəqliyyat vastələri ilə keçib getməli oldum…».[503]

Rəşid bəy Əfəndiyev 1882-ci ildə seminariyanın ikinci buraxılışı kimi məktəbi başa vurur və təyinatla sentyabr ayının 12-də Nuxa qəzasının Qutqaşen kəndində ibtidai məktəbə müdir göndərilir. Rəşid bəy yeni tipli «üsuli-cədid» məktəblərinin inkişafına yaxından kömək göstərir və 8 il orda müəllimlik edir.[504]

Rəşid bəy Əfəndiyev təkcə dərs deməklə kifayətlənməmiş, mərkəzi mətbuatda maraqlı məqalələrlə çıxış etmiş, öz müəllimi A.O.Çernyayevskinin tərtib etdiyi və Rəşid bəyin dəsti xətti ilə daşbasma üsulu ilə nəşr edilən «Vətən dili» dərsliyini sınaqdan keçirir, özünün gələcəkdə nəşr etdirəcəyi məşhur «Uşaq bağçası» əsərini hazırlayır.[505]

Rəşid bəy 1890-cı ildə Nuxanın Xaçmaz kəndinə gəlir, orada məktəb açır və iki il müəllimlik edir. 1892-ci ildə Tiflisdə Aleksandrovski Müəllimlər İnstitutunun dördüncü sinfinə daxil olur. Bir ildən sonra məktəbi bitirən Rəşid bəy 1899-cü ilədək şəhər məktəbində müəllim işləyir. Qadınların təhsilinə böyük əhəmiyyət verən pedaqoq 1895-1896-cı illərdə Tiflisdə müsəlman qadın məktəbi təsis etmək üçün vəsait toplayır.

R.Əfəndiyev 1900-cü ildə Qori Müəllimlər Seminariyasında şəriət və Azərbaycan dili müəllimi vəzifəsində işləyir. 17 il seminariyada çalışan Rəşid bəy elmi-pedaqoji və ədəbi fəaliyyətlə məşğul olur, «Uşaq bağçası» (1889) və «Bəsurətil-ətfal» (1910) dərsliyini yazır. [506]

Rəşid bəy Əfəndiyevin fəaliyyətində ədəbi yaradıcılıq mühüm yer tutur. O, beş pərdəli *«Qan ocağı»* komediyasından sonra *«Saqqalın kəraməti», «Qonşu qonşu olsa, kor qız ərə gedər», «Bir saç telinin qiyməti», «Tiflis səfəri», «Qızılgül», «Diş ağrısı», «Pul dəlisi»* səhnə əsərlərini yazır.



***Rəşid bəy Əfəndiyevin əsərlərindən ibarət sərgi (Xalq Təhsili Muzeyində stend)***

Rəşid bəy Əfəndiyevin ədəbi fəaliyyəti bütövlükdə maariflə bağlı olmuşdur. Onun *«Elmin şərafəti», «Nəsihət», «Məktəbə dəvət», «Vətən məhəbbəti», «Qələm», «Cəhalətdən şikayət», «Anna kimdir», «Bir qızın sualı», «Qadın kimdir», «Yonca çiçəyi», «Arsız uşaq və qarışqa», «Alma ağacının əhvalatı», «Tahir və Nəbi»* və s. kimi şeir və hekayələri qadın azadlığı, qadın təhsili, ailə tərbiyəsinə həsr edilmişdir.[507]

R.Əfəndiyev 1916-1917-ci illərdə İrəvan quberniyasındakı Azərbaycan məktəblərinə inspektor təyin edilmiş, Bakıda, İrəvanda, Naxçıvanda, Nuxada, Kuban vilayətinin tatarlar yaşayan Tiberda rayonunda və Qaraçay vilayətində qısamüddətli müəllimlər kursu təşkil etmişdir.[508]



***Rəşid bəy Əfəndiyev öyrəncilər arasında***

Rəşid bəy 1918-ci ildə Bakıda 2 əsas və 2 hazırlıq sinfindən ibarət müəllimlər seminariyası təşkil edir və müdiri olur. 1920-ci ildə Azərbaycanda sovet hakimiyyətinin qurulması Rəşid bəyin də həyatında dəyişiklik yaradır. O, Nuxaya 3 aylıq müəllimlər kursu açmaq üçün göndərilir, Nuxada qadın və kişilər üçün daha iki seminariya yaradır. 1920-cı ildə seminariyalar birləşdirilir və Nuxa pedaqoji texnikumu açılır. [509]

R.Əfəndiyev ərəb, fars və rus dillərini mükəmməl öyrənmişdir. Etnoqrafiyaya dair bir sıra əsərlər yazan ədib Azərbaycanı öyrənən cəmiyyətin Nuxa şöbəsinin katibi olmuş, 1928-ci ildə Nuxa şöbəsindən Azərbaycan Poletar Yazıçıları Birliyinə nümayəndə seçilmişdir.

«Nuxa qəzasındakı Dəhnələr və Suçma kəndlərinin etnoqrafiyası, iqtisadiyyatı, ***«Trud-Sarıca düzündə faydalı qazıntılar» (1929), «Şəki haqqında bir neçə qeydlər» (1930), «Şəki mahalına məxsus ipəkçilik haqqında tarixi materiallar» (1932), «Nuxa şəhərində mövcud olan sənətkarlıq və peşəkarlıq barəsində tarixi məlumat» (1934)*** etnoqrafik əsərlərinin müəllifi olan Rəşid bəy Qafqaz Arxeologiya Komitəsi ilə əməkdaşlıq edərək *«Qafqazın ərazi və*

*qəbilələrini təsvir edən materiallar məcmuəsi*» nin IX buraxılışında ***«Yelizavetpol quberniyası Nuxa qəzasında xalq təbabəti»*** (1887), XXXII buraxılışında «***Qəbələ mahalı»*** (1902) məqalələri çap olunmuşdur. Maarif xadimi, etnoqraf, tərcüməçi, şair, nasir və dramaturq kimi tanınan Rəşid bəy Əfəndiyevin əsərləri İstanbul, Bakı və Tiflisdə nəşr edilmiş, pyesləri Azərbaycan və Orta Asiya səhnələrində tamaşaya qoyulmuşdur. O, Puşkinin və Lermontovun əsərlərini, o cümlədən Firdovsinin «Şahnamə» sini tərcümə etmişdir.

Rəşid bəy Əfəndiyevin elmi və pedaqoji fəaliyyəti ictimaiyyət tərəfindən yüksək qiymətləndirilmiş, onun anadan olmasının 100 illiyi təntənə ilə qeyd olunmuşdur.

Hazırda Şəki şəhərində R.Əfəndiyevin ev muzeyi, adına küçə vardır. Onun haqqında professorlar Ə.Abdullayev, A Zamanov, Ə.Qarabağlı, filologiya üzrə fəlsəfə doktoru, dosent U Mürşüdova, habelə özbək alimi H.Baişova maraqlı əsərlər yazmız[510], elmi-pedaqoji və ədəbi fəaliyyətinə həsr olunan dissertasiyalar müdafiə olunmuşdur.

80 illik ömrünün 60 ilini xalqın maariflənməsinə həsr edən ***Rəşid bəy İsmayıl oğlu Əfəndiyev*** 1942-ci ildə Nuxada vəfat etmişdir.[511]

Rəşid bəy Əfəndiyevin oğlu **Məmməd Əfəndiyev** (1887-1977) 1919-cu ildə Peterburq Universitetinin fizika-riyaziyyat fakültəsini bitirmişdir. O, 1921-ci ildə Nuxa darülmüəlliminin, ilk pedaqoji kursların və ali pedaqoji institutun təşkilində böyük əmək sərf etmişdir.

M.Əfəndiyev 1934-1936-cı illərdə APİ-də (indiki ADPU) riyaziyyat elmləri fakültəsinin dekanı, 1935-1956-cı illərdə Azərbaycan Dövlət Universitetinin riyazi analiz kafedrasının müdiri işləmişdir. Ana dilində ali riyaziyyat kursundan ilk dəfə mühazirə oxuyan professor M.Əfəndiyevin nəşr etdirdiyi riyaziyyat terminləri kitabı və dərs vəsaitləri, «Adi differensial tənliklər» adlı sanballı kitabı, riyaziyyatın tədrisi metodikasına dair elmi məqalələri bu gün də əhəmiyyətini itirməmişdir.



***Rəşid bəy Əfəndiyevin oğlu Məmməd bəy və nəvələri professor Fəridə (sağda) və Adilə (solda) Əfəndiyevalar***

Görkəmli riyaziyyatçı, professor (1949), əməkdar elm xadimi (1944) Məmməd bəy Rəşid bəy oğlu Əfəndiyev bir çox orden və medallarla təltif edilmiş, 1941-1946-cı illərdə Azərbaycan Riyaziyyatçılar Cəmiyyətinin sədri olmuşdur. **M.Əfəndiyev 1 iyun 1977-ci ildə Bakıda vəfat etmişdir.**

***R.Əfəndiyevin əsas işləri:*** *Seçilmiş əsərləri. B, 1979; Несколько материалов по народному здравоохранению в Нухинском уезде-Сборник материалов по описанию местностей и племен Кафказа. Тифлис, 1889, вып.7; Мнение мусульман о начальном обучении грамоте.-Новое обозрение. Тифлис,1893, № 3427; Народное образование среди мусульман - Новое обозрение. Тифлис,1895, № 4114; Azərbaycan türklərinin ədəbiyyatı-Şərqi rus, 1903,29 oktyabr, № 89; Bəsirətül ətfal, İstanbul,1907; Nuxa şəhərinin etnoqrafiyasına dair materiallar. Изв.Азкомстариса. В., 1927, №3, № 10-17; Şəki mahalında Baş Layski kəndi və Eşşək qalası. Azərbaycanı öyrənmə yolu. 1930, № 4-5, səh. 77; Şəki haqqında bir neçə qeydlər.- Azərbaycanı öyrənmə yolu. 1930, № 4-5; Отчет о деятельности Нухинского отделения Общество обследования и изучения Азербайджана.-AR DTA f.1, siy.1, iş 70, v. 21, 46;*

***Onun haqqında:*** *Q.A.Baişeva. Общественная и педагогическая деятельность Р.Эфендиева-продолжателя дела великого русского педагога К Ушнского. М., 1955; M.M. Mehdizadə. R.Əfəndiyevin ədəbi-pedaqoji fəaliyyəti və irsi. Azərbaycan məktəbi, 1964, № 2; Ə.Abdullayev. Maarif pərvanəsi. Bakı, 1982; Ə.Abdullayev. Rəşid bəy Əfəndiyev. Bakı,1987; F.Ə.Seyidov. Qori seminariyası və onun məzunları. Bakı, 1988, səh. 201-207; Ş.Qurbanov. Ömrün fikir karvanı. Bakı, 1991; T.Həsənzadə. Bir əlyazma haqqında-«Elm» qəzeti, 2001, 4 oktyabr; B.Kərimov. Azərbaycanda ilk rəsmi dövlət muzeyi.-Azərbaycan arxeologiyası, 2002, №1-2, s. 115, 118; T.Əhmədov. XX əsr Azərbaycan yazıçıları. Ensiklopedik məlumat kitabı. Bakı, 2004, səh. 741; AR DTA, f.387, siy.1, s.v.70, v.21,46; Azərbaycan Respublikası Xalq Təhsili Muzeyinin arxivi, f. 633-645; Azərbaycan tarixi muzeyinin sənədli mənbələr fondu - R.Əfəndiyevin şəxsi fondu*

Azərbaycanın məktəb və pedaqoji fikir tarixində öz mütərəqqi ideyaları ilə şöhrət tapmış maarif xadimlərindən biri də, **Rəcəb Əsədulla oğlu Əfəndiyevdir (noyabr 1893 – 20.12.1956).**



**ƏFƏNDİYEV RƏCƏB ƏSƏDULLA OĞLU** 1893-cü ildə Nuxada xırda dükançı ailəsində dünyaya gəlmiş, uşaqlıq və gənclik illərini orada keçirmişdir. Atasını vaxtsız itirən Rəcəb əmisi Həbibullanın himayəsində qalmışdır. Dövrünün təhsilli adamı olan Həbibulla kişi oğulluğa götürdüyü qardaşı oğlu Rəcəbin oxumasına çalışmışdır.

Rəcəb Əfəndiyev iki il mollaxanada oxumuş, ərəb və fars dillərini öyrənmiş, Şərq ədəbiyyatı ilə tanış olmuşdur. Lakin o dövrün təhsil ocaqlarından olan mollaxananın təhsil sistemi məhdud olduğundan şəhər məktəbinə keçən gənc Rəcəb yeni məktəbdə Quranın tərcüməsi ilə yanaşı, ana dili, ədəbiyyat, rus dili, tarix, coğrafiya və riyaziyyatı öyrənmişdir.

1909-cu ildə Rəşid bəy Əfəndiyevin məsləhəti ilə Qori Müəllimlər Seminariyasına daxil olan Rəcəb Əfəndiyevin [512] təhsil illəri maraqlı keçir. Seminariya onun dünyagörüşünə güclü təsir edir. R.Əfəndiyev tələbəlik illərində öz fəallığı ilə tələbələr arasında rəğbət qazanır,1911-ci ilin noyabrında M.F. Axundovun 100 illiyi münasibətilə keçirilən xatirə gecəsində tamaşaya qoyulan «Hekayəti Müsyö Jordan və dərviş Məstəli şah» komediyasında Məstəli şah rolunda çıxış edir.

R.Əfəndiyev Qori Müəllimlər Seminariyasını 1914-cü ildə fərqlənmə diplomu ilə bitirir, Bakı quberniyasının sərəncamına göndərilir və Göyçay qəzasının ikisinifli ibtidai məktəbinə müəllim təyin olunur. Tezliklə məktəbin maddi-texniki bazasını möhkəmləndirir, təhsildən kənarda qalan uşaqlar məktəbə cəlb olunur, məktəbin nəzdində yaşlılar üçün savad kursları açılır.[513]

XX əsrin əvvəllərində əyalətlərdəki məktəblər, əsasən ibtidai məktəblərdən ibarət idi. Orta məktəblər isə Bakı, Gəncə, Şuşa kimi iri şəhərlərdə açıldığından gənclərin əksəriyyəti bu məktəblərdə oxumaq imkanından məhrum idi. XX əsrin əvvələrində müəllimlik fəaliyyətinə başlayan R. Əfəndiyev millətin əsl səadətini maarifin inkişafında gördüyündən şəhər və kəndlərdə yeni tipli məktəblər, yaşlılar üçün savad kursları, qiraətxanalar, mədəniyyət və səhiyyə ocaqları açılmasında, ədəbi-bədii məclislər, teatr tamaşaları təşkilində əməyini əsirgəməmişdir[514]. Nuxanın ziyalıları, o cümlədən Rəcəb Əfəndiyev şəhərdə orta məktəb açmaq məsələsini yuxarı dairələr qarşısında qaldırsalar da, vəsait çatışmazlığı bəhanəsi ilə hökümət dairələri məktəb tikməkdən imtina edir. Vəziyyətin çətinliyini başa düşən xalq vəsaitin yarısını toplamağı öz üzərinə götürür. Qalan hissəsini isə «Xeyriyyə cəmiyyəti» toplayır. Nəhayət, 1914-cü ilin axırında Nuxada orta məktəb açılır. Yeni məktəbin açılması Nuxanın qonşu rayonlarının gənclərinin də təhsilə marağını artırır.

1914-cü ildə Nuxada açılan qadın və kişi gimnaziyasına 1915-ci ildə direktor təyin olunan gənc Rəcəb Əfəndiyev Rəşid bəy Əfəndiyevlə birlikdə Nuxada  üç aylıq müəllimlər kursu təşkil edir. Onun 1917-ci ildə Nuxada 160 səhifəlik «Türk qiraəti» dərsliyi çap olunur.

Rəcəb Əfəndiyevin təşəbbüsü ilə Nuxanın kəndlərində ibtidai məktəblər açılır. Bu məqsədlə köhnə binalar təmir edilir, sinif otaqları avadanlıqlar və tədris vəsaitləri ilə təchiz olunur.

Rəcəb Əfəndiyev 1922-ci ildə Nuxa Pedaqoji Texnikumuna müdir təyin olunur.[515] O, yaxından tanıdığı Mahmud Nəbiyev, Ələşrəf Hacıyev, Mabud Əfəndiyev kimi müəllimləri texnikuma tədrisə cəlb edir.

Pedaqoji texnikum açılan zaman Nuxada «Darülmüəllim» adlı qızlar üçün ikinci bir texnikum da fəaliyyət göstərirdi. Bu tədris ocağının direktoru Rəşid bəy Əfəndiyevin qızı Mahtəban xanım idi. Burada Rəşid bəy Əfəndiyev, Məmmədəli Xəlifəzadə, Əhməd Bayramov, Yusif Əfəndiyev kimi müəllimlər dərs deyirdilər. Texnikumlar müxtəlif binalarda yerləşsələr də bir – biri ilə sıx əlaqədə idilər. Bu əlaqələrdə həm qız, həm də oğlan məktəblərində dərs deyən Rəşid bəy Əfəndiyev və Rəcəb Əfəndiyev mühüm rol oynayırdılar. Nəhayət, 1924-cü ildə texnikumlar birləşdirilir. Bu birləşmə tələbə sıxlığına, müəllimlərin mənzillə təminatında çətinlik yaratmaqla yanaşı, həm də müəllim kadrları çatışmazlığına səbəb olur. Rəcəb Əfəndiyevin fəaliyyəti nəticəsində yeni təyinat alaraq məktəbə gələn müəllimlər boşalan evlərdə, fəhlə yataqxanalarında yerləşdirilirlər. Təhsilin keyfiyyətini yaxşılaşdırmaq məqsədilə 3 aylıq ixtisasartırma kursu açılır. Bu kurslarda Nuxa ilə yanaşı Balakən, Qutqaşen (indiki Qəbələ), Qazax, Qax, Zaqatala müəllimləri də iştirak edirlər.

XX əsrin 20-ci illəri Azərbaycanın mədəni həyatında bir sıra çətinliklərlə xarakterikdir. Xüsusilə respublikanın ucqarlarında təhsilin vəziyyəti ürəkaçan deyildi. Bu bir tərəfdən dağətəyi kəndlərdəki uşaqların qış dövründə aran kəndlərindəki məktəblərə gələ bilməməsi ilə əlaqədar idisə, digər tərəfdən yeni məktəblərin açılması üçün bina və müəllim çatışmazlığı var idi. Yeni tipli

məktəblərə qarşı din xadimlərinin müqaviməti də çətinliklər yaradırdı. Qonşu respublikalarda yaşayan azərbaycanlıların uşaqlarının təhsilə cəlb edilməsində çətinliklər aradan qaldırılmamışdır. Bu səbəbdən də, Azərbaycanın maarif təşkilatları, bir qrup qabaqcıl müəllimlər, xüsusilə Qori Müəllimlər Seminariyasının məzunları olan müəllimlər Ermənistan və Gürcüstan Xalq Maarif Komissarlıqlarının sərəncamına göndərilmişdir. Bu sıradan Rəcəb Əfəndiyev də 1927-ci ildə Gürcüstana gedir və Tiflis şəhərindəki Azərbaycan pedaqoji texnikumuna müdir təyin olunur.

Rəcəb Əfəndiyev 1929-cu ildə Tiflisə köçür və Nuxa Pedaqoji Texnikumunda topladığı təcrübə onun köməyinə gəlir. Əlbəttə, Tiflis mədəni mühiti fərqli olsa da, texnikumun özünəməxsus çətinlikləri vardır. Burada qızlar azlıq təşkil edirdi. Ucqarlardakı azərbaycanlı qızlar məktəbə buraxılmırdılar. Bina darısqal olub, tədris üçün yararsız idi. Azərbaycan dilində dərslik və proqramlar yox dərəcəsində idi. Sözsüz ki, sadalanan çətinliklər R.Əfəndiyev tərəfindən aradan qaldırılır, tədris öz məcrası ilə davam etməyə başlayır.

İki il-1927-1929-cu illərdə Tiflis Pedaqoji Texnikumunda işləyən R.Əfəndiyev 1929-cu ildə Bakıya qayıdaraq Azərbaycan Xalq Maarif Komissarlığında kadrlar üzrə baş inspektor təyin olunur və məktəblərin yenidən təşkilində fəal iştirak edir. [516]

R.Əfəndiyev təhsilini artırmağı yaddan çıxarmır. 1930-cu ildə Azərbaycan Dövlət Universitetinə qəbul olunan Rəcəb Əfəndiyev pedaqogika fakültəsini birinci dərəcəli diplomla bitirir və Bakının ali məktəblərində pedaqogikadan dərs deyir. Onun 1933-1950-ci illərdə yazdığı «*İş yeri seçiminin pedaqoji prinsipləri*» (1931), *«İş otağı»* (1933), «*Müəllimlərin ixtisasını artırmaq işinin təşkili*» (1934), «*Qiyabi təhsil sistemində şifahi konsultasiya»* (1935) kimi elmi-pedaqoji əsərləri bu gün də aktuallığını itirməmişdir.[517]

R.Əfəndiyevin yaradıcılığında ailə-məişət, gənclərin əxlaq və vətənpərvərlik tərbiyəsi məsələləri mühüm yer tutmuşdur. Onun «*Gimnazist Vahid*», «*Kimdir o»*, «*Bədbəxt Əhməd»* və s. əsərləri bu qəbildəndir. [518]

R.Əfəndiyev 1931-ci ildən ömrünün sonunadək müəllimlər institutunda, ali pedaqoji institutda kafedra müdiri, institut direktorunun müavini vəzifələrində işləmişdir. Azərbaycan Xalq Maarif Komissarlığının Elmi Şurası 1933-cü ildə ona dosent elmi adı vermişdir.

R.Əfəndiyev 1921-ci ildə Ümumrusiya müəllimlər qurultayının nümayəndəsi, 1948-ci ildə Zaqafqaziya pedaqoji elmlər üzrə çağırılan müşavirənin iştirakçısı, Xalq Maarif Komissarlığının kollegiyasının üzvü olmuşdur. ***Rəcəb Əfəndiyev*** *Rəşid bəy Əfəndiyev, Cəmo Cəbrayılbəyli, Süleyman Sani Axundov, Əli Səbri, Pənah Qasımov, Fuad İbrahimbəyli, Ələkbər Mahmudov* və başqaları ilə əqidə yoldaşlığı etmişdir.

R.Əfəndiyev istər seminariyada oxuduğu vaxt, istərsə də müəllimlik fəaliyyəti illərində dövri mətbuatda hekayələr və müxtəlif məzmunlu məqalələrlə çıxış etmişdir. «Yeni İrşad» və «İqbal» qəzetində hekayələri, «Məktəb» jurnalında

«İlin axır çərşənbəsi» pyesi dərc olunmuş, 1918-ci ildə «Türk çələngi» dərsliyini yazmışdır.

R.Əfəndiyev Azərbaycan Dövlət Elmi Tədqiqat Pedaqogika İnstitutunun əməkdaşı olmuş, bir sıra məşhur pedaqoqların əsərlərini tərcümə etmişdir.

**Rəcəb Əfəndiyev 1956-cı ildə Bakıda vəfat etmişdir.** Övladları-böyük oğlu Hüseyn Əfəndiyev Azərbaycan Neft Kimya İnstitutunun dosenti, böyük qızı Münəvvər xanım Azərbaycan Dövlət Pedaqoji İnstitutunun dosenti olmuşdur. Kiçik qızı Pirayə memardır.

Rəcəb müəllimin oğlanlarından biri də, tanınmış pedaqoq Əziz Əfəndiyzadədir.



**ƏZİZ RƏCƏB OĞLU ƏFƏNDİZADƏ (1924-1996)** *1924-cü ildə Nuxada anadan olmuşdur.* 1943-cü ildə Azərbaycan Dövlət Universitetinin filologiya fakültəsini fərqlənmə diplomu ilə bitirmiş, aspiranturada saxlanılmışdır. Ə.Əfəndizadə 1954-cü ildə namizədlik, 1975-ci ildə doktorluq dissertasiyası müdafiə etmişdir. 300–ə yaxın elmi əsərin, o cümlədən 60-dək kitabın, 300-dən çox qəzet məqaləsinin müəllifi olan Əziz müəllim uzun müddət Azərbaycan Elmi Tədqiqat Pedaqogika İnstitutunun «Azərbaycan dili və ədəbiyyatın tədrisi metodikası» şöbəsinə rəhbərlik etmiş, 1996-cı ildə dünyasını dəyişmişdir.

***Rəcəb Əfəndiyevin əsas işi:*** *Gimnazist Vahid. Bakı, 1911; Kimdir o. Bakı, 1912; Yaşamaq istəyirəm. Bakı, 1913; Namus. Bakı, 1915; Türk qiraəti. Dərslik. Bakı, 1918; İş yeri seçiminin pedaqoji prinsipləri.* Bakı,1931; *İş otağı.* Bakı,1933; *Müəllimlərin ixtisasını artırmaq işinin təşkili.* Bakı,1934; *Qiyabi təhsil sistemində şifahi konsultasiya».* Bakı,1935;

***Onun haqqında****: XX əsr Azərbaycan nəşri (tərtib edən X. Məmmədov). Bakı, 1992; Hikmət çələngi (tərtib edən X. Məmmədov). Bakı, 1997; Qiyasbəli M.N. Rəcəb Əfəndiyev. Tərtib. Bakı: Çaşıoğlu, 2001; Seyidov F.Ə. Qori seminariyası və onun məzunları. Bakı,1988; ASE, VII c., səh. 141;*



**ƏLİBƏYOV MUSTAFA BƏY CABİR OĞLU (1872, Nuxa – 1943, Daşkənd)** bəy ailəsində anadan olmuşdur. Mollaxanada və 3-cü dərəcəli şəhər məktəbində oxumuş, 1892-ci ildə Tiflis gimnaziyasını bitirmişdir. M.Əlibəyov 1892-1920-ci llərdə Bakı quberniyası dairə məhkəməsində baş müstəntiqin tərcüməçisi və vəkil işləmişdir.

M.Əlibəyov 1905-ci ildə H.Z.Tağıyevin sədrliyi ilə yaradılan «Hidayət» xeyriyyə cəmiyyətinin katibi olmuş, 1907-ci ildə həyat yoldaşı, həkim Xədicə Əlibəyova-Sübhanquliyevanın redaktorluğu ilə «İşıq» adlı ilk qadın jurnalını (1911-1912) nəşr etmişdir.

1917-ci ildə Fevral inqilabından sonra siyasi proseslərə qoşulan M.Əlibəyov «Əhrar» partiyasına və «Möhtaclara kömək» cəmiyyətinə üzv qəbul edilmişdir. Bakı mətbuatında məqalələrlə çıxış edən Mustafa bəy «Yaşıl qələm» birliyinə üzvü idi.

1920-ci il aprel çevrilişindən sonra Mustafa bəy Nuxaya köçmüş, mühüm işlər üzrə xalq hakimi, hüquq bürosunun müdiri, Gəncə «müdafüyün heyəti» nin üzvü olmuşdur.

Mustafa bəyin həyat yoldaşı Xədicə Əlibəyova 1920-ci ildən 1946-cı ilə kimi Nuxada yaşamış, həkim işləmişdir.



*Xədicə Əlibəyova*

**M.Əlibəyov haqqında**: *Məmmədov X. Mustafa bəy Əlibəyovun irsi qiymətli söz xəzinəsidir. «Təzə həyat» qəzeti, 2000, 19 sentyabr; Ağabəyli F. Vəkil Mustafa bəy Əlibəyov. O bizə şərəfdir, biz ona övlad. Bakı, 2003; Azərbaycan Xalq Cümhuriyətinin Ensiklopediyası. İki cilddə. I cild, Bakı, 2004, səh. 339.*

*O xalq xoşbəxtdir ki, onu dünyada tanıdan övladları var. Azərbaycan xalqı da dünya mədəniyyəti tarixində iz qoyan böyük dahilər, şəxsiyyətlər yetirib. Görkəmli bəstəkar Firəngiz Əlizadə dünya miqyasında tanınan və ölkəmizi dünyada tanıdan sənətkarlardandır.*



**ƏLİZDƏ FİRƏNGİZ ƏLİAĞA QIZI** 1947-ci ildə Bakıda anadan olmuşdur. Anası şəkili, atası lənkəranlı olmuşdur. Şəkililər Firəngiz xanımı həmyerliləri hesab etdiklərindən onun haqqında məlumat verməyi məqsədəuyğun saydıq.

İlk təhsilini Bülbül adına musiqi məktəbində alan F. Əlizadə Azərbaycan Dövlət Konservatoriyasını (1970, U.Xəlilovun fortepiano sinfini (1972), Q.Qarayevin bəstəkarlıq sinfini bitirmişdir. Fortepiano sonatasının (1970), fortepiano ilə orkestr üçün konsertin (1972), simli kvartet (1974), simfoniya (1976), «Vətən haqqında nəğmələr» oratoriyası (N.Xəzrinin sözlərinə), violonçel ilə fortepiano üçün «Habilsayağı» (1979), orqan üçün fantaziya (1982), «Ağ atlı haqqında əfsanə» rok-operası (1985), «Üç akvarel» vokal silsiləsi (N.Rəfibəylinin sözlərinə), simli kvartet üçün «Dilogiya-1» (1988), «Dilogiya-II» (1989), «Boş beşik» (1993) baletinin, «Dərviş» (Nəsiminin sözlərinə, 2000) əsərinin, kinofilmlərə musiqi və s.-nin müəllifidir.

1970 -ci ildən Azərbaycan Dövlət Konservatoriyasında (indiki Bakı Musiqi Akademiyası) dərs deyir. O,1990-cı ildən Azərbaycan Bəstəkarlar İttifaqı İdarə Heyətinin katibidir.

«Ağ atlı haqqında əfsanə» birtaktlı operanın, «Boş beşik» baletinin, «Ölümsüzlüyə səyahət» oratoriyasının, instrumental konsertlərin, kamera ansamblı üçün «Miraj», «İtirilmiş zaman axtarışında», «Üç akvarel» vokal silsiləsinin, violençel üçün «Eşq havası», «Dərviş» septeti, «Abşeron» kvinteti və b. əsərlərin müəllifi olan F.Əlizadə Azərbaycan musiqisini xarici ölkələrdə müvəffəqiyyətlə təmsil etmiş, Almaniya, İngiltərə, ABŞ, Hollandiya, İsveç, Fransa, İtaliya və Polşada keçirilən nüfuzlu festivallarda həm bəstəkar, həm də ifaçı kimi çıxış etmişdir.

F.Əlizadənin əsərləri dünyanın müxtəlif ölkələrində ifa olunmuş, 1983-cü ildə «Varşava payızı» festivalında onun «Habilsayağı» əsəri böyük müvəffəqiyyət qazanmışdır. 1999-cu ildə Almaniyanın akademik Qarşılıqlı Mübadilə Xidmətinin təqaüdçüsü, İsveçrənin Beynəlxalq musiqi seminarında birinci qadın bəstəkar-rezidenti, 2001-ci ildə Bonn şəhərinin «Bethovenxalle» orkestrinin bəstəkar-rezidenti seçilmiş, 2003-cü ildə Kembric Bioqrafiya Mərkəzi tərəfindən medal və diplomla təltif edilmişdir. O, «XXI əsrin görkəmli intellektualları» siyahısına daxil edilmişdir. Alman rejissoru F.Əlizadə haqqında «Azərbaycanlı maestro» adlı film çəkmişdir.

F.Əlizadə yalnız bəstəkar kimi deyil, həm də virtuoz pianoçu kimi də tanınır. Onun ifasında ilk dəfə Messinın, Keyçin, Krambın əsərləri səslənmişdir. Onun təşəbbüsü və rəhbərliyi ilə Bakıda və Qəbələdə müasir musiqi festivalları təşkil olunur.

F.Əlizadə pedaqoq kimi də fəaliyyət göstərir. Musiqi tənqidçisidir. «Qara Qarayev» və «Azərbaycan simfonik musiqisi» kitablarının, 150-dən artıq məqalənin müəllifidir.

Fəal ictimai xadim olan F.Əlizadə 1974-ci ildən Azərbaycan Bəstəkarlar İttifaqının üzvü, 1979-1985-ci illərdə və 1990-cı ildən 2007-ci ilə qədər Azərbaycan Bəstəkarlar İttifaqı İdarə Heyətinin katibi olmuş, 2007-ci ildə Azərbaycan Bəstəkarlarının VIII qurultayında həmin ittifaqın sədri seçilmişdir.

. Azərbaycan Respublikasının xalq artisti, professor F. Əlizadə 2007-ci ildə YUNESKO tərəfindən «Dünya artisti» tituluna layiq görülmüşdür.

***Əsas işi:*** *İ.Takubokunun sözlərinə 3 ifaçı – soprano, fleyta, piano /vibrafon/ çelesta üçün vokal silsilə (1990); Piano üçün 2 saylı Sonata (1990); 2 ifaçı – klarnet və vibrafon /çelesta/ üçün «Crossing-I» / «Çarpazlaşma-I»/ (1991); 11 ifaçı üçün «Crossing-II» / «Çarpazlaşma-II»/ (1992); «Boş beşik» – iki pərdəli Balet /Nicat Cüməlinin poeması əsasında/ (1993); Simli kvartet, zərb alətləri və sintezator üçün «Muğamsayağı» (1993); Solo-Gitara üçün «Fantaziya» (1994); N.Hikmətin sözlərinə bariton, xor və kamera ansamblı üçün «Ölməzliyə səyahət» (1997); Ud və kamera ansamblı üçün «Miraj» / «İpək yolu» silsiləsindən/ (1998); Fleyta, iki gitara və zərb alətləri üçün «Azərbaycan pastoralı» (1998); Simfonik orkestr üçün «Sturm und Drang» (1998); solo-Violonçel üçün «Eşq havası» / «İpək yolu» silsiləsindən/ (1998); Simli kvartet və maqnit yazısı üçün «Oazis» / «İpək yolu» silsiləsindən/ (1999); Zərb alətləri və*

*kamera orkestri üçün «Silkout road» Konserti (1999); Müəllifin sözlərinə soprano və kamera ansamblı üçün «İtirilmiş zaman axtarışında» (1999); A.S.Puşkinin sözlərinə tenor və simli kvartet üçün «Vlast krasotı» Romansı (1999); N.Hikmətin sözlərinə bariton, xor və simfonik orkestr üçün «Ölümsüzlüyə yolculuq» Oratoriyası (1999); Azərbaycan şairlərinin və Y.V.Qotyenin «Şərq-Qərb Divanı» poemasını sözlərinə kiçik həcmli xor, orqan, arfa və zərb alətləri üçün «Gottes ist der Orient» /alman və azərb. dil./ (2000); Qiraətçi, solo-violonçel və ansambl üçün «Dərviş» Septeti (2000); Piano /prepare/ və simli kvartet üçün «Abşeron» Kvinteti (2001); Vokal kişi kvarteti üçün «Bayatılar» (2001); İki arfa və maqnit yazısı üçün «Deyişmə» (2001); Marimba və simli orkestr üçün Konsert (2001).*

***Kitabları***: *Qara Qarayev fotoalbomu /Q.Qarayevin 80-illiyinə həsr edilib/ (azərb., ing. və rus dillərində). B., 1997; Azərbaycanın simfonik musiqisi. B., "Şur", 1998.*

**Onun haqqında:** *Şəki. Alim və Ziyalılar. Bakı: Elm, 2007, 428 s. (Tərtibçilər: Ələfsər Bəxtiyar oğlu Məmmədov, Fikrət Ramazan oğlu Xalıqov) səh.110-112; Səadət Təhmirazqızı, Mədəniyyət.- 2010.- 28 may.- s. 6.*; *http://az. wikipedia. org/w/index.php?title=Fir%C9%99ngiz_%C6% 8Flizad%C9%99&oldid=1953115"*



**ƏMİRCANOV ƏBDÜLƏLİ BƏY ŞİRƏLİ BƏY OĞLU (1870- 1948)** Nuxada anadan olmuşdur. O, 1876-1883-cü illərdə Nuxa şəhər məktəbində oxumuş, 1888-ci ildə Tiflis Aleksandr Müəllimlər İnstitutunu bitirmiş, Nuxa şəhər məktəbinə müəllim təyin olunmuşdur.

Ə.Əmircanov XIX əsrin sonunda Lənkəranda, 20-ci əsrin əvvəllərində Bakıda müəllim, dövlət idarələrində müxtəlif vəzifələrdə işləmiş, «Nəşri-maarif» cəmiyyətinin təftiş komissiyasının üzvü, Bakı Müsəlman Xeyriyyə Cəmiyyəti sədrinin müavini olmuşdur.

Ə.Əmircanov Fevral inqilabından sonra siyasi proseslərə qoşulmuş, Bakı Müsəlman İctimai Təşkilatlarının Müvəqqəti İcraiyyə Komitəsinin üzvü, AXC-nin II Hökumət kabinetində (1918, iyun-oktyabr) maliyyə naziri, dövlət nəzarətçisi (1918 oktyabr-dekabr) olmuş, AXC Parlamentinə üzv seçilmiş, Parlamentdə bitərəflər qrupuna daxil olmuşdur. Parlamentdə maliyyə-büdcə və sorğu komissiyasının üzvü olan Əbdüləli bəy xarici ölkələrlə ticarət əlaqələri yaratmaq üçün 1919-cu ilin ortalarında Bakıda «Dəyanət» şirkətinin təşkilində yaxından iştirak etmişdir.

Ə.Əmircanov Aprel çevrilişindən sonra İstanbula mühacirət etmiş, orada fəaliyyət göstərən Azərbaycan Milli Mərkəzinin üzvü olmuşdur.

**Əmircanov Əbdüləli bəy Şirəli bəy oğlu 1948-ci ildə vəfat etmişdir.**



***Fuad Əmircan***

Əbdüləli bəyin oğlu **Fuad Əmircan (Əmircanov)** Azərbaycan siyasi mühacirətinin tərkibində səmərəli fəaliyyət göstərmişdir.

**ƏMİRCANOV FUAD ƏBDÜLƏLİ OĞLU** 1911- ci ildə Bakıda anadan olmuşdur. Fuad bəy 1923-cü ildə ailəsi ilə birlikdə Türkiyəyə getmişdir. İstanbulda Qalata-saray məktəbində ilk təhsilini alan Fuad bəy 1932-ci ildə Fransada Siyasi Elmlər İnstitutunda, sonradan isə Almaniyada hüquq təhsili alır. Təhsilini başa vurduqdan sonra bir müddət qəzetlərdə işləyən F.Əmircan 1941-ci ildən «Təsviri-Əfkar» qəzetinin hərbi müxbiri olaraq Almaniyaya gedir və orada Azərbaycan legionerlərinin problemləri ilə maraqlanır. Almaniyada M.Ə.Rəsulzadə ilə tanış olan F.Əmircan 1943-cü ildə Berlində keçirilən Milli Azərbaycan Qurultayının iştirakçısı olur, Azər baycan Milli Birlik Məclisinin sədr müavini seçilir.

İkinci Dünya müharibəsindən sonra F.Əmircan Avropa Şurasının Parlamentində Türkiyənin təmsilçisi təyin edilir, 1955-1961-ci illərdə Almaniyanın Bonn şəhərində Türkiyə səfirliyinin mətbuat attaşesi vəzifəsində işləyir.

1961-ci ildə Türkiyəyə qayıdan F.Əmircan Türkiyə Mətbuat İşləri Komitəsində direktor müavini işləyir, 70-ci illərdə «Amerikanın səsi» radiosunun Türkiyə şöbəsinin direktoru olur. Nəhayət, F.Əmircan 1993-cu ildə 70 il ayrı düşdüyü Azərbaycana gəlir.

**Fuad Əmircan 1995-ci ildə Bonn şəhərində vəfat etmişdir.**

***Ə.Əmircanov haqqında:*** *Azerbaydjanskaə Respublika. Dokumentı i materialı. 1918-1920 qq. Baku, 1998; Azərbaycan Demokratik Respublikası: Azərbaycan hökuməti (1918-1920). Bakı, 1990, Azərbaycan Xalq Cümhuriyyəti Ensiklopediyası. İki cilddə. I cild .Bakı, 2004, səh. 363*

***Fuad Əmircanov haqqında***: *Əmrahov M.İ. XX əsrdə Azərbaycanda mill azadlıq hərəkatı. Dərslik. Bakı, 2009, 370 səh., səh.269-270*; *N.Yaqublu. Azərbaycan legionerləri. Bakı,2005, 336 s., səh. 299*

**ƏSGƏROV SALMAN MƏMMƏDEMİN OĞLU (SALMAN MÜMTAZ) (1884-1941).**



Görkəmli ədəbiyyatşünas və mətnşünas alim, istedadlı jurnalist, mollanəsrəddinçi şair Salman Əs-gərov 1884-cü ildə Nuxada anadan olmuşdur. Salman iki yaşında olanda ailəsi Aşqabada köçmüş və az sonra atası vəfat etmişdir. Salman Aşqabadda xalxallı Əsədullanın məhəllə məktə bində oxumağa başlasa da, ehtiyac üzündən məktəbi tərk edir, 30 il tacirliklə məşğul olur.[519]

Salman Mümtaz müstəqil mütaliə sayəsində Şərq ədəbiyyatını, ərəb, fars və urdu dillərini öyrən-mişdir. Orta Asiya, Sibir, Zabaykalye və Qafqazın

şəhərlərində ticarətlə məşğul olan S.Mümtaz 1908-ci ildən Azərbaycan mətbuatı ilə əlaqə yaratmış, *«Molla Nəsrəddin», «Zənbur», «Kəlniyyət», «Tuti», «Qurtuluş» jurnallarında, «Səda», «Tərəqqi», «Günəş», «İqbal», «Yeni iqbal», «Açıq söz»* qəzetlərində şeir və felyetonları dərc edilmişdir.

S.Mümtazın «Molla Nəsrəddin» jurnalının əməkdaşlarından C.Məmmədquluzadə, M.Ə.Sabir, Ə. Haqverdiyev, N.Nərimanov, M.S.Ordubadi, F.Köçərli, M. Hadi, A.Səhhət, Ə.Qəmgüsar, Ə.Nəzmi, R.Axundov və b. ilə yaxından dostluğu olmuşdur.

S.Mümtazın «Molla Nəsrəddin» də ilk məqaləsi 1906-cı il avqustun 25-də çap olunmuşdur. Mümtazın avtobioqrafiyasından məlum olur ki, 25 mətbu, o cüm- lədən «Molla Nəsrəddin» də 14 şeirin mətləsini vermişdir. «Xortdan bəy», «Sərçəqulu bəy» imzaları ilə şeirlərini dərc etdirmidir.O, həmçinin «Eşşək arısı», «Sağsağan», «Qorxaq» kimi imzalarla da məlumdur.[520]

S.Mümtaz «Molla Nəsrəddin» də çıxış etməklə kifayətlənməmiş, həm də onun yayılmasına kömək etmişdir. O, bu məqsədlə 1907-ci ildə İranda, Orta Asiyanın müxtəlif yerlərində, Sibirin Barnaul şəhərində, 1908-ci ildə TİflisdƏ, 1910-cu ildə Bakıda və Tiflisdə, Vladiqafqazda və Qoridə, nəhayət Daşkənddə, Orenburqda və b. şəhərlərdə olmuşdur.[521]

Salman Mümtaz 1918-ci ildə Aşqabaddan Bakıya köçmüş, AXC-nin mədəni quruculuq işlərində yaxından iştirak etmişdir, «Yaşıl qələm» cəmiyyətinin üzvü olmuşdur. 20-ci illərdə onun «Fiqaro Füyuzatı», «Mədəniyyət», «Şərq qadını», «Qızıl Şərq» jurnallarında, «Kommunist» qəzetində məqalələri dərc olunmuş, 1925-ci ildə onun «Kommunist» nəşriyyatı rubrikası altında kitabları işıq üzü görmüşdür. 1926-cı ilin may ayında Mümtaz Azərbaycan yazıçılar cəmiyyətinə üzv qəbul edilmişdir.

Klassik Şərq ədəbiyyatının bilicilərindən olan Salman Mümtaz 1934-cü ildə Firdövsinin anadan olmasının 1000 illiyi tədbirlərində iştirak edir, yubiley komissiyasına öz kitabxanasından Firdövsinin «Şahnamə» poemasının əlyazma şəkillərini və miniatürləri bağışlayır. Sovet Yazıçılarının Birinci Ümumittifaq qurultayına nümayəndə seçilən ədib M.Qorki, A.Tolstoy, S.Ayni ilə tanış olmuş [522], R.Taqor, şərqşünas alimlərdən Y.Marr, A.Samoyloviç, Meşaninov, A.Krımski, Y.Bertelslə görüşmüş, onların bəziləri ilə məktublaşmışdır.

Azərbaycanda sovet hakimiyyəti qurulduqdan sonra şifahi xalq ədəbiyyatının və klassik irsin toplanması ilə məşğul olan S. Mümtaz 1920-1937-ci illərdə 24 kitab, 70-dən çox məqalə çap etdirmiş, 100-dən çox Azərbaycan və Yaxın Şərq şairi haqqında tədqiqat aparmışdır.[523]

Elmi fəaliyyətində məşhur təzkirəçilərə-Məhəmməd Ovfi, Dövlətşah Səmərqəndi, Lütfəli bəy Azər, Azad Hüseyn Belqirami, Əmin Əhməd Razi, Rzaquluxan Hidayət, Həsən Çələbi, Şəmsəddin Sami bəy Şair Mirzə, Mirxond, Hurhüseyn, M.M.Nəvvab və b müraciət edən Mümtaz rus tədqiqatçılarını da unutmamışdır. V.A.Dorn (1805-1881),A.Y.Krımski (1871-1942), V.V.Bartold (1869-1930) A.Y Samoyloviç (1880-1938), Y.N.Marr (18931935), Y.A.Bertels (1890-1957) kimi alimlərin Şərq xalqlarının tarixi və ədəbiyyatına dair tədqiqat-

larını yüksək qiymətləndirmiş və onlardan faydalanmışdır.[524] 1926-cı ildə Bakıda keçirilən I Ümumittifaq Türkoloji qurultayında iştirak edən V.V.Bartold akad. S.F. Oldenburqla birlikdə Mümtazın kitabxanasında olmuş və onun topladığı nadir əlyazmalara heyran qalmışdır.[525]

S.F. Oldenburq o zaman demişdir ki, dünyada «Kitabi Dədə Qorqud»un 2 nüsxəsi saxlanılır, biri Vatikanda, digəri Drezdendə. S.Mümtazda isə onun 3-cü nüsxəsi vardır. [526]

S.Mümtaz folklor materiallarının toplanması və nəşri sahəsində də titanik fəaliyyət göstərmişdir. Alimin folklor sahəsində tədqiqatında «El şairləri» və «Sarı Aşıq» kitabları xüsusi yer tutur.[527]

S.Mümtaz xalq ədəbiyyatı nümunələri kimi 1927-ci ildə «Şəki savları» kitabını çapa hazırlamışdır.[528] «Azərbaycan ədəbiyyatı» başlığı ilə çap olunmuş kitabları, çoxsaylı məqalələri və araşdırmaları Azərbaycan ədəbiyyatı tarixinin öyrənilməsində dəyərli qaynaqlardır.

Salman Mümtaz 25 ilədək davam edən elmi- ədəbi fəaliyyətində Azərbaycan ədəbi irsinin tədqiqi və nəşri sahəsində çox səmərəli tekstoloji iş aparmışdır. Onun tərtib edib buraxdığı kitablar - «Hasif İsfahani» (1913), «Ağa Məsih Şirvani» (1925), «Molla Pənah Vaqif» (1925), «Məmməd Hüseynxan Müştaq» (1925), «Qövzi Təbrizi» (1925), «Sarı Aşıq» (1925),



***Ümumittifaq Türkoloji qurultayın iştirakçıları.***



*Sağdan:***S.Mümtaz, M.D.Hüseynov, S.Ağamalıoğlu, M.P.Pavlovi S.Mümtaz Sovet Yazıçılarının I Ümumittifaq qurultayında nümayəndələr arasında:**
**Sağdan** *oturanlar:* **S.Vurğun, A. Tolstoy, M.Qorki, S.Mümtaz**
**Soldan** *ayaq üstə duranlar:* **Y.Şirvan, M.Rəfili, Əli Səbri, A.Darbin, C.Cabbarlı, M.Hüseyn**

«Qasım bəy Zakir» (1926), «Mirzə Şəfi Vazeh» (1926), «Seyid İmadəddin Nəsimi» (19260, «Baba bəy Zakir» (1926), «Ağababır Şirvani» (1927), «El şairləri. I hissə» (1927), «El şairləri. II hissə» (1928), «Molla Vəli Vidadi» (1936), «Molla Pənah Vaqif» (1937) onun yaradıcılıq diapazonunu göstərir. S.Mümtazın tərtib etdiyi siyahıda 483 Azərbaycan şairinin adı vardır. 1933- cü ildən başlayan 10 il ərzində 104 şair haqında 2000 vərəqəlik əsər hazırlamağı nəzərdə tutmuşdur.[529]

S.Mümtazın M.P.Vaqif, M.V.Vidadi, M.Ş.Vazeh haqqında maraqlı tədqiqatları vardır. Onun «Qasm bəy Zakir» adlı kitabına şairin 230 şeiri (87 mürəbbe, 19 gəraylı, 63 qəzəl, 5 tərcibənd, 14 müxəmməs, 7 müstəzad, 8 təcnis, 4 həcv, 3 maddeyi-tarixi qəsidə, hekayə, saqinamə, vəsfi-hal, bahariyyə və s.) daxil edilmişdir.[530]

Salman Mümtaz milli baxışlarına görə təqib olunmuş, repressiyaya məruz qalmışdır**.** O, həbs olunan zaman onun mənzilində axtarış aparılmışdır. Mənzilin axtarışına dair tərtib olunmuş protokolda şəxsi sənədlərin, 3 kisə və bir çemodan müxtəlif kitabların, bir bağlama şəkillərin neqativinin götürüldüyü qeyd olumuşdur.

S.Mümtazın istintaq-arxiv sənədləri 2 cilddən ibarətdir. Birinci cilddə istintaqın gedişi, dindirilmələrin nəticələri toplanmışdır. Alim 10 oktyabrdan 7 dekabr 1937-ciilədək dəfələrlə dindirilmiş, lakin onun iradəsini qırmaq mümkün olmamış, ona qarşı irəli sürülən ittihamları rədd etmişdir.

S.Mümtazın arxiv-istintaq işinin 2-ci cildi bütövlükdə itmiş kitabxanaya həsr olunmuşdur. Azərbaycan Yazıçılar İttifaqı-başda sədr S.Rəhimov, Azərbaycan Elmlər Akademiyasının prezidenti Y.Məmmədəliyev, qohumları, elm və mədəniyyət xadimləri Azərbaycan SSR DTK müraciət edərək alimin kitabxanasının axtarılmasını xahiş etmişlər. S.Mümtazın şəxsi kitabxanasına daxil olan ədəbiyyatın təxmini siyahısını hazırlamaq məqsədilə alimlərdən, mütəxəssislərdən və tanışlardan ibarət komissiya yaradılmışdır. Aparılmış araşdırmaların nəticəsi kimi müəyyənləşdirilmişdir ki, həbs zamanı götürülmüş əlyazmalar və kitablar Azərbaycan SSR DTK-da olmuş, bir hissəsi təsərrüfat məqsədləri üçün istifadə olunmuş, qiymətli əlyazmalar insafsızcasına məhv edilmişdir. O zamanlar DTK-da yuva salmış erməni əsilli «çekistlər» in bu sahədə «xüsusi xidmətləri» olmuşdur.

S.Mümtaz antisovet, pantürkist təşkilatın üzvü olmaqda, sovet hakimiyyətini yıxmaq və burjua-millətçi dövlət yaratmaq məqsədilə silahlı üsyan hazırlamaqda günahlandırılmışdır. SSRİ Ali Məhkəməsinin Səyyar Kollegiyasının Sessiyası onu şəxsi əmlakı müsadirə olunmaq və 5 il siyasi hüquqlardan məhrum edilmək şərtilə 10 il müddətinə azadlıqdan məhrum etmişdir. S.Mümtazın şəxsi əmlakı isə yaşadığı mənzil və qiymətli kitablardan ibarət olmuşdur.

***Salman Məmmədemin oğlu Əsgərov 1941-ci iidə Oryolda, faşistlərin şəhəri tutmasından bir az əvvəl güllələnmişdir. 1956-cı ildə ona bəraət verilmşdir.***

***Əsas işləri:*** *Azərbaycan ədəbiyyatı qaynaqları. Bakı, 1986, 445 s.; El şairləri, I hissə, Bakı: Azərnəşr, 1927, II hissə, Bakı: Azərnəşr,1928;*

***Onun haqqında:*** *R.Tağıyev. Salman Mümtaz. B.,1974; N.Nəcəfov. Bir məqsəd uğunda-Ədəbiyyat və incəsənət, 1975, 15 fevral; N.Nəcəfov. Salman Mümtaz-Azərbaycan mətnşünaslıq məsələləri. B, 1997; Dadaşzadə A. Salman Mümtaz. / «Fikir karvanı» kitabında. Bakı, 1983; Azərbaycan Sovet Ensiklopediyası, VIII cild. B,1984, səh. 274; Ağayev Ə. Şəxsiyyətinə vurulduğum insan //Azərbaycan, 1984, № 10; Azərbaycan Sovet yazıçıları. Ədəbi sorğu kitabı. B, 1987; Nəcəfov Həsən Nəcəf oğlu. S.Mümtazın ədəbi və elmi fəaliyyəti. Müəllimlər üçün vəsait. Bakı: «Maarif», 1987, 97 s.; S.Mümtaz. //*

*Молодость, 1988 № 9, səh.36-37; Z.Bünyadov. Salman Mümtaz. «Elm» qəzeti, 1988, 13 avqust; Ə.Tahirzadə. Salman Mümtaz. Bakı, 2002;*

**Hacı Seyid Əbdülhəmid Əfəndi**[531] Nuxada anadan olmuşdur. İlk təhsilini mədrəsədə almışdır. Onun yetkinləşməsində müəllimi İsmayıl bəy Sədrəddinbəyovun-Nakamın böyük rolu olmuşdur. Məkkə, Mədinə, Qahirə, İsgəndəriyyə, Şam, İstanbul, Trabzon şəhərlərini səyahət edən Hacı Seyid Əbdülhəmid əfəndi Tiflisə gəlmiş, sonralar bir müddət Qazax, Gəncə və Şamaxı şəhərlərində yaşamışdır. O, seyidlərin nəcabəti təhqiq olunan komissiyada işləmiş, xidmətləri çar hökuməti tərəfindən üç qızıl saat, bir qızıl ənfiyadan, bir cəvahirli qızıl üzük və ildə iki yüz manat məvaciblə təltif edilmişdir.[532]

Azərbaycan ziyalıları Hacı Seyid Əbdülhəmid əfəndini bir tarixçi kimi də tanıyırlar. Onun «Şəki xanları və onların nəsilləri» adlı tarixi əsəri Şəki xanlarının, o cümlədən Azərbaycan tarixinin öyrənilməsində qiymətli mənbə olub, ilk dəfə 1939-cu ildə Azərbaycan Elmi-Tədqiqat İnstitutunun tarix-etnoqrafiya şöbəsi tərəfindən nəşr edilmişdir.

**Əsas işi:** *Şəki xanları və onların nəsilləri. Bax:Şəki xanlığının tarixindən. Bakı: «Azərbaycan Ensiklopediyası» Nəşriyyat – Poliqrafiya Birliyi, 1993, 32 səh.;*

**Onun haqqında***:* *Ə.Tahirzadə. Şəkinin tarixi qaynaqlarda. Bakı: Master, 2005, 256 səh., səh.10, 18, 19, 21, 98, 124, 125, 126.*



**HACIYEV ƏHMƏD CÖVDƏT İSMAYIL OĞLU (1917-2002)** 1917-ci ildə Nuxada anadan olmuşdur. 1935-1938-ci illərdə Azərbaycan Dövlət Konservatoriyasında (L.M. Rudolfun bəstəkarlıq sinfində), 1938-1941-ci illərdə Moskva Konservatoriyasında (A.N. Aleksandrovun sinfində) oxumuş,1947-ci ildə D.Şostakoviçin sinfini bitirmişdir. C.Hacıyev 1957-1969-cu illərdə Azərbaycan Dövlət Konservatoriyasına rəhbərlik etmişdir.

Cövdət Hacıyev Azərbaycanda milli simfonizmin yaradıcılarından biridir. Onun musiqisi vətəndaşlıq istiqaməti, demokratizmi və dərin məzmunu ilə fərqlənir. O, 1936-cı ildə yazdığı ilk böyük əsəri olan bir hissəli «Simfoniya»sı ilə musiqiyə yeni bir nəfəsin gəldiyini bildirmişdir. Tələbəlik illərində-1936-cı ildə «Sosialist Azərbaycanı», 1937-ci ildə A. Puşkinin ölümünün 100 iliyinə həsr etdiyi «Sibirə məktub» simfonik poemalarını, 1939-cu ildə 3 hissəli «Azərbaycan suitası»nı, 1941-ci ildə simli kvartet və s. bəstələmişdir. 1945-ci ildə Qara Qarayevlə birlikdə müharibəyə həsr edilmiş «Vətən» operasını bəstələmiş və bu opera 1946-cı ildə SSRİ Dövlət mükafatına layiq görülmüşdür.

C.Hacıyev 6 simfoniya bəstələmişdir. O, həmçinin orkestr üçün simfoniyanın (1938), xor, solist və orkestr üçün oratoriyanın (1949), fortopiano üçün

ballada (1952), sonata (1956), skesonun (1957), kvartet-poemanın (1972), eləcə də xor üçün əsərlərin müəllifidir.

Azərbaycan bəstəkarı, pedaqoq, Azərbaycanın xalq artisti (1960), 2 dəfə SSRİ Dövlət Mükafatı laureatı (1946, 1952), Azərbaycan Bəstəkarlar İttifaqının İdarə Heyətinin katibi olmuş C.Hacıyev «Oktyabr İnqilabı», «Qırmızı Əmək Baryağı» və «Şərəf nişanı» ordenləri və medallarla təltif olunmuşdur.

**C.Hacıyev 2002-ci ildə dünyasını dəyişmişdir**.

**Onun haqqında:** *Abbasova E. Cövdət Hacıyev. Bakı, 1967, Шейн С. Ахмед Джевдет Гаджиев. М., 1962; Абезгауз И.В. Развитие традиции. «Советская музыка», 1963, № 4; Мурадова Е.Г. Джевдет Гаджиев. Баку, 1965; Тагизаде А. Джевдет Гаджиев. Баку, 1979; ASE, X cild, Bakı,* ***1986,*** *səh. 152-153;*



**HÜSEYNOV CƏLİL YUSİF OĞLU (1896-1979)** 20 dekabr 1896-cı ildə Nuxada anadan olmuşdur. Kiçik yaşlarından atasını itirən Cəlil çətinliklərə sinə gərməli olsa da, 1905-1907-ci illərdə Nuxa rus məktəbində oxumuş, təhsilini 1908-1918-ci illərdə Tiflisdə birinci kişi gimnaziyasında davam etdirmişdir. 1919-cu ildə Tiflis ikinci kişi gimnaziyasını bitirən C.Hüseynov Bakı Dövlət Universitetinin tibb fakültəsinə qəbul olunmuş, oxuya-oxuya Bakıda fəhlə fakültəsində dərs demişdir.

C.Hüseyov 1924-cü ildə universiteti bitirmiş, bakterioloji və kliniki laboratoriya metodlarını öyrənmək üçün Moskvaya göndərilmişdir. O, 1924-1925-ci illərdə universitetin patoloji anatomiya kafedrasında prozektor işləyir, eyni zamanda Muğanda malyariya ekspedisiyasına başçılıq edir. 1926-1935-ci illərdə patoloji anatomiya kafedrasında assistent və sonra dosent işləyən C.Hüseynov pedaqoji işlə məşğul olmuş,1936-cı ildə doktorluq dissertasiyası müdafiə etmişdir.

1941-ci ildə başlayan sovet-alman müharibəsi tibb işçilərinin qarşısına mühüm vəzifələr qoyur. Azərbaycanın səhiyyə orqanları müharibənin ilk günlərindən öz işlərini yeni qaydada qurmağa başlayır. Respublika ərazisində yaradılan hospitalların avadanlıqlarla təmin olunmasına, evlərdə və ictimai yerlərdə sanitar qaydalarına riayət olunmasına nəzarət gücləndirilir. Yeni tibb kadrları hazırlanmağa başlanır. DMK - nın 22 sentyabr və ÜİK (b) P MK-nın 8 oktyabr 1941-ci tarixli qərarlarına uyğun olaraq səhiyyə orqanları yüksək keyfiyyətli tibbi xidmətin təşkili üçün tədbirlər müəyyənləşdirirlər.

Azərbaycan SSR Səhiyyə Komissarlığı döyüşən orduda və hospitallarda yaralılara xidmət və yardım etmək məqsədilə 2.462 həkim və tibb mütəxəssisi göndərir. Azərbaycandan cəbhəyə səfərbər edilmiş 30 min nəfərdən artıq tibb bacısı, şəfqət bacısı və sanitar drujinaçıları çox çətin şəraitdə ordu əsgərlərinə fasiləsiz tibb yardımı göstərirlər.

Orta ixtisas və ali tibb təhsili alan mütəxəssislərin hazırlanmasında respublikanın 24 orta tibb məktəbi və 3 ali tibb müəssisəsi (ATİ, AHTİ və Diş Həkimləri İnstitutu) yaxından iştirak edirlər. Orta tibb məktəblərində və respublika Qırmızı Aypara cəmiyyəti xətti ilə hazırlanan tibbi kadrların sayı iki dəfədən artıq yüksəlir. Əgər 1941-ci ilin ortalarında, yəni müharibəyə qədər respublikada 3.082 nəfər orta təhsilli tibb işçisi vardısa, 1945-ci ildə onların sayı 7.084 - ə çatdırılır.

Müharibə illərində respublika Qırmızı Aypara cəmiyyəti xətti ilə 6.500 nəfər tibb *bacısı* və sanitar, 13 min sanitar durujinaçısı, 1 mln. nəfərdən artıq adam «Sanitar müdafiəsinə hazır ol!» proqramı ilə işləyən hərbi-tibbi təhsil müəssisələri tərəfindən hazırlanır.

Əhaliyə sanitar-profilaktika xidmətinin yaxşılaşdırılması işində 1944-cü ildə yaradılmış Respublika Sanitar Epidemiologiya stansiyası sanitar profilli bütün təşkilatların fəaliyyətinə nəzarət edir, onların işinin səmərəli şəkildə yenidən qurulmasına yaxından köməklik göstrir.

Respublikanın əhalisinin epidemioloji vəziyyətinin yaxşılaşdırılmasına nəzarət etmək məqsədilə daimi fəaliyyət göstərən Respublika Fövqəladə Tibbi Komissiyası yaradılır. Bu təşkilatın köməyi ilə respublikanın kənd yerlərində 1943-cü ildə 2.125 sanitar məntəqəsi fəaliyyət *göstərirdi.* Respublika Virusologiya, Mikrobiologiya və Gigiyena İnstitutu da səmərəli işləyirdi.

Respublikada sanitar-profilaktik işin yeni şəraitə uyğun qurulmasında Azərbaycan SSR Səhiyyə Komissarlığı nəzdində fəaliyyət göstərən Baş Apteklər idarəsi (BAİ) ordunun və arxa cəbhənin dərmanlar, tibb ləvazimatları və digər əşyalarla təchizinə xüsusi köməklik edir. Müharibə dövründə xəstələrə xidmət göstərilməsi və sarğı materialları üçün 531 milyon 051 min manat vəsait xərclənmişdir.

Azərbaycan K(b)P MK-nın və respublika XKS - nin 9 mart 1942 - ci il tarixli «Yerli ehtiyat bazalarından istifadə etmək hesabına kimyəvi əczaçılıq dərman və cihazlarının istehsalının təşkili haqqında» qərarı ilə Bakıda Səhiyyə Komissarlığı nəzdində kimyəvi-əczaçılıq zavodu təşkil edilir. Respublikada tibb preparatları və onlar üçün xammal, kalsium-xlorid, natrium-xlorid, yodlu kalium, ağ streptosid, cərrah ipək sapı, tənzif, pambıq, şpris istehsal olunur.

Müharibə dövründə ana və uşaqların mühafizəsinə, uşaq evlərində, internatlarda, uşaq bağçalarında, məsləhət məntəqələrində, habelə respublikaya cəbhə rayonlarından köçürülən qadın və uşaqlara, onların sağlamlığına xüsusi qayğı göstərilirdi.

1941-ci ildə respublikada 76 hərbi hospital fəaliyyət göstərirdi. Naxçıvan, Şuşa, Nuxa, Hacıkənd, Mərdəkan və Buzovnada yerləşən sanatoriyalar, istirahət evləri hərbi hospitallara çevrilmişdir.

1942-ci ilin yanvarında tibb elmləri doktoru, professor Əziz Əliyevin sədrliyi ilə «Yaralı Döyüşçülərə və Xəstələrə Kömək Komitəsi» yaradılmışdır.

1943-cü ildə respublikada 66 təxliyyə hospitalı, o cümlədən Bakıda 63, respublikanın şəhər və rayonlarında 3 hərbi hospital yaradılmışdır.

Müharibə illərində respublikada donor hərəkatı genişlənir. Bu vətənpərvərlik təşəbbüsünə əhalinin bütün təbəqələri qoşulur. 1941-1945-ci illər ərzində yaralı döyüşçülər üçün cəbhəyə 41.609 litr qan göndərilir, 7.229 litr qanı əvəz edən preparatlar hazırlanır. Müharibə dövründə respublikanın 149.170 vətəndaşı donorçu olmuşdur.

Azərbaycan həkimlərindən tibb elmləri doktoru, professor M.A.Topçubaşov yüzlərlə döyüşçünün həyatını xilas etmiş, həkimlər M.Abbasov, S. Axundov 200-dən çox döyüşçünün gözünü müalicə edərək onların görməsini bərpa etmişdilər. Professor M.Mirqasımov, F.Əfəndiyev, M.Məlikov, Z.Məmmədov və başqaları xidmətlərinə görə yüksək dövlət mükafatları ilə təltif olun muşdular.

Beləliklə, hərb illərində respublikanın səhiyyə işçiləri düşməni darmadağın etmək uğrunda ümumxalq hərəkatında iştirak edərək xalqın və ordunun sağlamlığının mühafizə edilməsində öz vəzifə borclarını yerinə yetirmişdilər. Həyata keçirilən tədbirlərdə C.Hüseynov fəal iştirak etmişdir.

C.Hüseynov müharibə illərində Azərbaycanda təşkil edilmiş hərbi hospitalların baş patoloji anatomu işləmiş, 1943-cü ildə «Səhiyyə əlçısı» döş nişanı ilə təltif olunmuşdur.

Müharibədən sonra - 1946-cı ildə C.Hüseynov ATİ-nun patoloji anatomiya kafedrasının müdiri seçilir və ömrünün sonuna qədər kafedraya rəhbərlik edir. Həmin ildə o, həmçinin patoloji anatomiya cəmiyyətinin sədri seçilir və respublikanın baş patoloji anatomu təyin olunur. 1947-1949-cu illərdə Azərbaycan SSR EA Eksperimental Təbabət İnstitutunun patoloji anatomiya şöbəsinin rəhbəri təyin olunan C.Hüseynov1949-cu ildən ATİ Elmi Şurasının üzvü, 1953-cü ildə ömrünün sonuna qədər Səhiyyə Nazirliyi Elmi Şurasının sədri olmuşdur.

Respublikanın əməkdar həkimi olan C.Hüseynov 1959-cu ildə Azərbaycan SSR EA müxbir üzvü, 1967-ci ildə həqiqi üzv seçilmişdir. Ümumittifaq Patoloji Anatomiya Elmi Cəmiyyətinin fəxri üzvü (1971), Azərbaycan EA biologiya bölməsinin akademik katibinin müavini (1972), ASE elmi redaksiya şürasının üzvü olan akademik C.Hüseynov 1978-ci ildə Azərbaycan SSR Dövlət Mükafatına layiq görülmüşdür. 130-dan artıq elmi əsərin müəllfi olmuş C.Hüseynovun rəhbərliyi ilə 30-dan çox elmlər namizədi, 10 nəfər elmlər doktoru yetişmişdir.

Akademik Cəlil Hüseynovun əməyi 2 «Lenin», 2 «Qırmızı Əmək Bayrağı», «Şərəf nişanı» ordenləri və medallarla qiymətləndirilmişdir.

**Akademik Cəlil Yusif oğlu Hüseynov 1979-cu il martın 21-də** Bakıda dünyasını dəyişmişdir.

**Əsas işi:** *Ümumi patoloji anatomiya. h.1-2.Bakı, 1963; К патоморфологии периферической нервной системы рецепторов и синапсов. Баку, 1957; К структурным изменениям рецепторов синапсов в услових патологии. Баку, 1949; К микро-электромикроскопической патоморфологии ганглиев и некоторых органов. Баку, 1975;*

**Onun haqqında:** *Ə.Mete. O torpağın övladları. Bakı, Nurlan,2006, 608 s, şəkilli, səh.333-335; yenə onun, Loğmanlar. Bakı, Nurlan, 2008, 48 s., səh.247-248*; *ASE, X cild, Bakı, 1987, səh.280*



**HÜSEYNOV CƏBRAYIL MUXTAR OĞLU (1913-14.12. 1974)** – Nuxada dünyaya göz açmışdır. 1920-1927-ci illərdə Nuxa şəhərindəki 3 nömrəli məktəbdə, 1927-1929-cu illərdə Ağdam Kənd Təsərrüfatı Texniku munda, 1930-1934-cü illərdə Gəncə Kənd Təsərrüfatı İnstitutunda oxumuşdur. C.Hüseynov ali məktəbi bitirdikdən sonra 2 il Azərbaycan Kənd Təsərrüfatı İnstitutunda assistent, Azərbaycan Elmi Tədqiqat Kimya İstitutunda baş elmi işçi işləyib, 1936-cı ildə Ümumittifaq Elmi Tədqiqat Aqrokimya İnstitutunda aspiranturaya qəbul olunub. 1939-cu ildə dissertasiya müdafiə edən gənc Cəbrayıl 1939-1941-ci illərdə SSRİ EA Azərbaycan filialının torpaqşünaslıq bölməsində baş elmi işçi, 1944-cü ildə SSRİ EA Azərbaycan filialı Aqrokimya və Torpaqşünaslıq İnstitutunun direktor müavini, 1945-1952-ci illərdə həmin institutun direktoru vəzifələrində işləyir. 1947-ci ildə V.V.Dokuçayev adına Torpaqşünaslıq İnstitutunun Elmi Şurasında doktorluq dissertasiyası müdafiə edən C.Hüseynov 1948-ci ildə professor elmi adı alır, 1949-cu ildə Azərbaycan SSR EA-nın müxbir üzvü seçilir, 1950-ci ildə Dövlət Mükafatına layiq görülür və Azərbaycan Sülhü Müdafiə Komitəsinə üzv seçilir.

C.Hüseynov 1952-1953-cü illərdə Azərbaycan EA Torpaqşünaslıq İnstitutunda baş elmi işçi, 1953-1954-cü illərdə aqrokimya laboratoriyasının müdiri, 1954-1957-ci illərdə şöbə müdiri, 1952-1959-cu illərdə BDU-nun biologiya fakültəsində professor işləmişdir.

Cəbrayıl Hüseynovun tədqiqatları neft və kimya sənayesi qalıqları əsasında boy stimulyatorlarının mineral mikrokübrələrin əldə edilməsinə həsr edilmişdir. Keçmiş SSRİ-də ilk dəfə C.Hüseynovun rəhbərliyi ilə torpağa verilmiş azotlu kübrələrdən azot itkisinin öyrənilməsinə dair iş aparılmış və bu itkinin qarşısını almaq üçün tədbirlər hazırlanmış, neft sənayesində çoxlu miqdarda işlənmiş kükürd turşusundan superfosfat alınmışdır.

C.Hüseynova 1960-cı ildə əməkdar elm xadimi adı verilmişdir. O, 1963-cü ildən ömrünün sonunadək Azərbaycan EA Torpaqşünaslıq və Aqrokimya İnstitutna rəhbərlik etmiş, 1964-cü ildən Respublika Ali Sovetinin kənd təsərrüfatı və meliorasiya daimi komissiyasının sədri olmuşdur. O, 1966-cı ildə keçirilən IX Mendeleyev qurultayının iştirakçısı, 1979-ci ildən həmin cəmiyyətinin üzvü olmuşdur. Ümumittifaq Torpaqşünaslıq Cəmiyyəti Azərbaycan filialının sədri olan C.Hüseynov Beynəlxalq Torpaqşünaslar Cəmiyyətinin işində (1958), ABŞ-da keçirilən torpaqşünasların konqresində (1960) iştirak etmişdir.

Akademik C.Hüseynovun elmi və ictimai fəaliyyəti 2 «Şərəf nişanı» ordeni ilə qiymətləndirilmişdir.

**Akademik Cəbrayıl Muxtar oğlu Hüseynov 1974-cü ildə vəfat etmişdir.**

**Əsas işi:** *Neft sənayesi qalıqlarından alınan kübrələr. Bakı, 1949; Kənd təsərrüfatı bitkilərinin məhsuldarlığını artırmaq məqsədilə işlənmiş qumbrinlərin tətbiqi.Bakı, 1951; Azərbaycan SSR Lənkəran subtropik zonası torpaqlarının dəyişdirilməsinə dair təcrüblər. Bakı, 1955;*

**Onun haqqında:** *Хромов К. НРВ. «Литературный Азербайджан», 1961, № 9; Медведев Ю.Л. Защитница полей. «Новый мир», 1964, № 3; Левитник К., Меламед А. Патент НРВ. М., 1964; Католн А. Эликсир академика Гусейнова. «Дружба народов», 1965, № 3, йеня онун, Волшебник нефтяного города, в кн. «Пути в незнакомое. М., 1965; Ənvər Mete. O torpağın övladları. Bakı: Nurlan, 2006, 608 s,* ***şəkilli. s****. 257-259, ASE, X c, Bakı, 1986, səh.290;*

**HÜSEYNOV ŞİRMƏMMƏD AĞAMƏMMƏD OĞLU** 1924-cü ildə anadan olmuşdur. 1940-cı ildə Nuxa şəhər 2 nömrəli məktəbi bitirmiş, 1941-1943-cü illərdə Nuxa İkiillik Müəllimlər İnstitutunun fizika-riyaziyyat fakültəsində təhsil almışdır. 1943-1944-cü illərdə Zaqatalanın Varxiyan, Nuxanın Aşağı Göynük və Oxut kənd məktəblərində işləyən Şirməmməd Hüseynov 1944-1945-ci illərdə «Nuxa fəhləsi» qəzetində ədəbi işçi kimi fəaliyyət göstərmişdir.



Ş.Hüseynov 1945-1950-ci illərdə Bakı Dövlət Universitetinin filologiya-jurnalistika şöbəsində təhsil almışdır. Ədəbi fəaliyyətinə görə 1966 və 1972-ci illərdə «Qızıl qələm» mükafatı, 1991-ci ildə H.Zərdabi, 1992-ci ildə Yusif Məmmədəliyev, 1998-ci ildə M.Ə. Rəsulzadə mükafatları almış, 1988-ci ildə «Əməkdar jurnalist» fəxri adına layiq görülmüşdür.

Ş.A.Hüseynov 1950-1954-cü illərdə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin aspiranturasında oxumuş və 1954-cü ildə həmin universitetin jurnalistika fakültəsinin Elmi Şurasında «Azərbaycan mətbuatı 1917-1918-ci illərdə» mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdir.

Şüurlu həyatını jurnalistikaya həsr edən professor Ş.Hüseynovun rəhbərliyi altında onlarla istedadlı kadr hazırlanmışdır.

Ş.A.Hüseynov hazırda Bakı Dövlət Universitetində pedaqoji fəaliyyətini davam etdirir.

Ş.Hüseynovun tədqiqatları ziyalılar tərəfindən daim izlənmişdir. Böyük şair B.Vahabzadə Ş.Hüseynovun «Mənəvi irsimiz və gerçəklik» adlı kitabında getmiş «Ləyaqət mücəssəməsi» sərlövhəli məqaləsində onu «əxlaqın, haqqın öz səsi, ləyaqət, dəyanət mücəssəməsi» adlandırır və yazırdı: «Əziz dostum, sən

vətənpərvərlik, düzgünlük, haqsevərlik, gözütoxluq kimi bir çox mənəvi xüsusiyyətlərinlə mənə həmişə XIX əsrin sonu, XX əsrin əvvəlində yaşamış böyük əqidəli ziyalılarımızı xatırlatmısan. H.Zərdabi milli mətbuatımızın təməl daşını qoydusa, sən bu böyük işin davamçısı kimi bir neçə jurnalist nəslinin müəllimi olmusan».

Jurnalistlərin ağsaqqalı Ş.Hüseynov Azərbaycanda sovet rejimi quruluşuna qədər dövri mətbuatı çox böyük səbr və həssaslıqla izləmiş, «iynə ilə gor qaza-qaza» M.Ə.Rəsulzadə, Əhməd bəy Ağaoğlu, Əlibəy Hüseynzadə, Ömər Faiq Nemanzadə, Üzeyir bəy Hacıbəyli və b. bu kimi qələm sahiblərinin bu gün bizim üçün lazım olan fikir və mülahizələrini üzə çıxarmışdır. Ş.Hüseynovun müxtəlif qəzetlərdə dərc olunmuş yazılarında onun vahid prinsipi, fikri və əqidəsi öz əksini tapmışdır. Məqalələri oxuduqca Şirməmməd müəllimin vətəndaş obrazı göz önündə canlanır, onun sınmaz, dönməz, əyilməz şəxsiyyət olduğu bir daha təsdiq olunur.

Cahangir Məmmədli «Talisman» məqaləsində yazırdı: «Şirməmməd müəllimin simasında Səhhət, Əbdürrəhim bəy, Çəmənzəminli...tipli klassik müəllim obrazları durur gözümüzün qabağında. Sərt və qayğılı. Sərt və içi tələbəyə məhəbbət dolu bir insan. Sərt və ədalətli. Sərt və təmiz. Sərt və elmi…həyatının bütün anlarında sərtlik onun fəaliyyətinin birinci komponenti olub. Dünyanı zarafat sayanlara bu zarafatın olmadığını anlatmaq sərtliyi».



Ş.Hüseynov M.Ə.Rəsulzadə ideallarını qəbul etmişdi və sonadək ona sədaqətlilik göstərir. Min bir çətinliklə Türkiyə, İran və Azərbaycan məkanlarını nəzərə alınması ilə böyük öndərin əsərlərini toplamış, tərtib etmiş, oxuculara təqdim etmişdir.

Şirməmməd müəllim yaşının ahıl vaxtında da axtrışdadır. Tanrı köməyi olsun.

**Əsas işi:** *Müstəqilliyin çətin yolu… biz hara gedirik. Bakı, 1996; Milli haqq və ədalət axtarışında. Bakı, 2004, 420 s.; Mənəvi irsimiz və gerçəklik. Bakı: «Adiloğlu» nəşriyyatı, 2004, 526 s.; Milli irsimizdən səhifələr. Bakı: Çənlibel NPM nəşriyyatı, 2007, 484 s., 40 şəkil.*

**Onun haqqında:** *Şamil Qiyas oğlu Vəliyev. Şirməmməd Hüseynov. Biblioqrafiya. Bakı: «Bakı Universiteti» nəşriyyatı. 2009, 88 s. ;Şəki. Alim və Ziyalılar. Bakı: Elm, 2007, 428 s. (Tərtibçilər: Ələfsər Bəxtiyar oğlu Məmmədov, Fikrət Ramazan oğlu Xalıqov), səh.173-175; http://www.anspress. com/index.php?a=2 &lng=az&nid=17791↑ http://www.azadliq.org/content/article/1904336. html*

**Xoyski Fətəli xan İsgəndər xan oğlu (1875-1920).** Fətəli xan İsgəndər oğlu Xoyski 1875-ci il dekabrın 7-də Nuxa şəhərində anadan olmuşdur. Atası rus ordusunun general-leytenantı idi. F. Xoyskinin əsli-nəsli Cənubi Azər-

baycanın Xoy şəhərindəndir. Ulu babası Xoy xanı Cəfərqulu xan İran şahı Fətəli xanla müharibədə məğlub olduqdan sonra 20 minlik qoşunla Eçmədzinə (3 kilsə) sığınmışdır. O, 1803-1806-cı illər rus-İran müharibələri dövründə rus qoşunlarına qoşulmuşdur. I Aleksandr tərəfindən bahalı brilyantlarla bəzədilmiş qızıl medal və lələklə təltif edilmişdir. 1807-ci ildə Nuxa xanı təyin edilən Cəfərqulu xana general-leytenant rütbəsi verilmişdir.

Cəfərqulu xan 1814-cü ildə vəfat etmişdir. Ondan sonra oğlu İsmayıl Nuxa xanı olmuşdur. 1819-cu ildə İsmayıl xanın müəmmalı şəkildə ölümündən sonra Nuxa xanlığı ləvğ olunmuş və Rusiyanın tərkibinə qatılmışdır.

Fətəli xan Xoyski Gəncə klassik gimnaziyasını, 1901-ci ildə Moskva Universitetinin hüquq fakültəsini bitirmişdir. Gəncə, Suxum, Batum və Kutais dairə məhkəmələrində müxtəlif vəzifələrdə işləmiş, 1907-ci ildə Yekaterinador dairə məhkəməsinə prokuror təyin edilmişdir. Yeliza vetpol quberniyasından II Dövlət Dumasına deputat seçilmişdir. O, kadet partiyasının üzvü olsa da, müsəlman fraksiyasına daxil idi.

Müxtəlif illərdə Bakı və Gəncə dairə məhkəmələrində işkəsmək üzrə andçı - müvəkkil vəzifəsini icra edən Fətəli xan 1917-ci il Fevral inqilabından sonra martın 27-də Bakıda yaranmış Milli Müsəlman Şurasının Müvəqqəti İcariyyə Komitəsinin üzvü seçilmişdir. Apreldə çağırılan Qafqaz müsəlmanları qurultayının iştirakçısı olmuşdur.

Fətəli xan Xoyski 1917-ci ilin dekabrında yaranan Zaqafqaziya seyminin üzvü və Zaqafqaziya Federativ Respublikasının ədliyyə naziri olmuşdur. O, AXC-nin üç hökumətinə başçılıq etmişdir. BDU-nun yaranmasının təşəbbüsçüsü olmuş, onun dövründə Gəncənin adı özünə qaytarılmış, Qaryağin Cəbrayıl adlandırılmış, pul və poçt markaları buraxılmış, ana dilində məktəb və seminariyalar açılmışdır. F. Xoyski N. Yusifbəylinin 1919-cu il dekabrın 23-də təşkil etdiyi V hökumət kabinəsində xarici işlər naziri vəzifəsini icra etmişdir. Azərbaycanşn beynəlxalq aləmdə tanınmasında F. Xoyskinin xidmətləri böyük olub. O, dəfələrlə Çiçerinlə məktublaşaraq Azərbaycanın müstəqilliyini qorumuşdur.

XI Ordu Bakıya yaxınlaşdıqdan sonra Fətəli xan öz ailəsi ilə Tiflisə getmişdir. 1920-ci il iyunun 19-da Tiflisdə ***Ərzurumlu iki terrorçu Aram Erkanyan və Mişaq Qriqoryan adlı erməni qatillərinin*** gülləsi ilə qətlə yetirilmişdir. M.F.Axundovun qəbri yanında dəfn edilmişdir.

Fətəli xanın ailəsinin taleyi də faciəli olmuşdur. Atası İsgəndər bəyin 5 övladı olmuşdur. Rus ordusunun general-leytenantı, Yelizavetpol quberniyası dumasının deputatı İsgəndər İsmayıl oğlu Xoyski beş uşaqdan ikisini-böyük oğlu Cahangir və qızı Tutubəyimi Gəncədə dəfn etmişdir. Qalan uşaqların taleyi isə faciəli olmuşdur. Fətəli Tiflisdə erməni qatili tərəfindən öldürülmüş, kiçik oğlu Rüstəm 1939-cu ildə Moskvada vəfat etmiş, Novodeviçye qəbiristanlığında torpağa tapşırılmışdır.

Fətəli xan Xoyskinin böyük qardaşı, Gəncə şəhər general-qubernatorunun müavini olan Hüseynqulu xan 1920-ci il Gəncə üsyanında iştirak etmiş, Polşa rəhbəri marşal Yuzef Pilsudskinin dəvəti ilə bir müddət Polşada yaşamış, yenidən İstanbula qayıtmış, 1925-ci ildən sonra Atatürkün göstərişi ilə oğlu İsgəndər xanla birlikdə hərbi məktəbdə tərcüməçi işləmişdir.



Hüseynqulu xan 1955-ci ildə İstanbulda vəfat etmiş, «Fəri köy» qəbiristanlığında dəfn olunmuşdur.

Xoyskinin qardaşı general-leytenant Cahangir xanın oğlu Əmiraslan Xoyski 1888-ci ildə Nuxada anadan olmuşdur. AXC dövründə Bakı qubernatorunun birinci müavini, Gəncə qəzasının rəisi, AXC hökuməti DİN Qazax qəzası üzrə xüsusi səlahiyyətli nümayəndəsi və Quba qəzasının rəisi olmuşdur. Ə.Xoyski Gəncə üsyanının təşkilatçılarından biri olmuşdur. Üsyan yatırıldıqdan sonra Türkiyəyə mühacirət etmiş və 1954-cü ildə dünyasını dəyişmişdir.

**F. Xoyski haqqında:** *Fətəli xan Xoyski: həyat və fəaliyyəti.(Sənəd və materiallar). Bakı, 1998; Azərbaycan tarixi 7 cilddə, V cild, Bakı, 2001; Qasımlı M. Azərbaycan Xarici İşlər Nazirliyinin şəxsi heyəti. Bakı, 2002; Qasımlı M., Hüseynova E. Azərbaycanın xarici işlər naziri. Bakı, 2003; Seyidzadə D. Azərbaycan XX əsrin əvvəllərində. Müstəqilliyə aparan yol. Bakı, 1998; Сеидзаде Д. Азербайджанские депутаты в Государственной Думе России. Баку, 1991; M.İ.Əmrahov. XX əsrdə Azərbaycanda milli-azadlıq hərəkatı. Dərslik. Bakı: ADPU-nun nəşriyyatı, 2009, 370 s.,səh.148-159;*

**İSMAYILOV RƏŞİD BƏY (1877, İrəvan -1941, Bakı)** İrəvan Müəllimlər Seminariyasını bitirmiş, «Şərqi-rus» qəzetində fəaliyyətə başlamışdır. Eyni zamanda Qafqazda və Rusiyanın mərkəzində çap olunan rusdilli mətbuatda (Санкт-Петербургские новости) məqalələri dərc olunmuşdur.

Publisist, tarixçi, pedaqoq R.İsmayılov dövrünün görkəmli şəxsiyyətləri C.Məmməd quluzadə, Məmməd ağa Şaxtaxtlı, Əhməd bəy Ağayev, Əlimərdan bəy Topçubaşov və b. ilə əlaqə saxlamışdır. «Şərqi–rus» qəzetinin nəşri dayandırıldıqdan sonra «Новое обозрение» qəzetinin müsəlman həyatı və Yaxın Şərq şöbəsinə rəhbərlik etmişdir. «**Müxtəsər Qafqaz tarixi və Zaqafqaziyada zühur edən məşhur türk ədib və şairlərin müxtəsər tərcümeyi halları»** kitabını (Tiflis, 1905) yazmış, Z. Antonovun «Koroğlu» pyesini gürcü dilindən çevirmişdir.

Rəşid bəy İsmayılov Azərbaycan Xalq Cümhuriyyəti dövründə Nazirlər Şurasında məsul vəzifələrdə çalışmış, Cümhuriyyətin süqutundan sonra Bakıdakı 18 nömrəli məktəbdə tarix müəllimi işləmişdir. Onun 1923-cü ildə «Azərbaycan tarixi» kitabı nəşr olunmuşdur. Əsərdə «Məvareyi-Qafqazın elani-istiqlalı» hissəsi Azərbaycan Xalq Cümhuriyyəti qurulması ərəfəsində vəziyyətə, «Azər-

baycan Cümhuriyyəti» bölməsi bilavəsitə onun qurulmasına və fəaliyyətinə həsr edilmişdir.

***Əsas işi:*** *Müxtəsər Qafqaz tarixi və Zaqafqaziyada zühur edən məşhur türk ədib və şairlərin müxtəsər tərcümeyi halları.Tiflis, 1905; Azərbaycan tarixi. Bakı, 1923 ;*

***Onun haqqında:*** *Azərbaycan Xalq Cümhuriyyəti Ensiklopediyası.İki cilddə. II cild, Bakı, «Lider nəşriyyat» , 2005, 472 s., səh. 71*

**KƏRİM AĞA FATEH (1783 – 1858)**[533] 1743-1755-ci illərdə Nuxa xanı olmuş Hacı Çələbi xan Qurban oğlunun nəslindəndir. Fətəli xanın yeganə oğlu olan Kərim ağa 1783-cü ildə  Nuxada doğulub.

1804-cü ildə Fətəli xanın qardaşları Məhəmmədhəsən xan və Səlim xan Şamaxı xanına əsir düşdükdən sonra Nuxa bəyləri Kərim ağanı Nuxa xanı elan etmişlər. Babası Məhəmmədhüseyn xan Hacı Çələbi xanın nəslindən olmuş, «Müştaq» təxəllüsü ilə şeirlər yazmışdır. 1925-ci ildə «Kommunist» nəşriyyatında Müştaqın şeirlər toplusunu nəşr etdirən Salman Mümtaz Məhəmmədhüseyn xanın Mola Pənah Vaqif, Molla Vəli Vidadi. nuxalı Nəbi, nuxalı Raci, Ağsayazılı Zari, Kəlbirli Rafe və başqaları ilə dostluq etdiyini yazmışdır.

Azərbaycanda ilk xanlıq Nuxa xanlığı olmuşdur. 1743-cü ildə yaranan Nuxa xanlığından sonra yaranmış xanlıqlar, ilk növbədə Qarabağ xanlığı güclənd ikcə onu özləri üçün təhlükə hesab edənlər kömək məqsədilə Nuxa xanlığına müraciət edirlər.

Quzey Azərbaycanda ilk olaraq yaranmış, güclü və sayılan Nuxa xanlığı XVIII yüzilliyin ikinci yarısının əvvəllərində hakim rolu oynayırdı. Xanlıqlar arasında baş verən münaqişə və çəkişmə zamanı müraciət olunan ilk hakim Nuxa xanı Hacı Çələbi idi.



Mirzə Camal Bayat qalasının bərpasından sonrakı olaylarla bağlı belə yazır: «Şəki və Şirvan hakimləri Pənah xanın Qarabağdakı şöhrətini gördükdən sonra onu özləri üçün təhlükəli hesab edib hər ikisi onu aradan götürmək üçün birləşdilər». Qarabağ xanlığında baş vermiş münaqişədə yenilən Cavanşir, Otuziki ellərinin başçıları və Xəmsə məlikləri Nuxa xanı Hacı Çələbiyə üz tutdular. Tarixçi Mirzə Adıgözəl bəy yazır: «O zaman bütün Şirvanatda əbədi ixtiyar sahibi və hökmran olan Hacı Çələbiyə ərizələr yazdılar. Ona bildirdilər ki, Pənah xan burada taxta çıxmış, qala və səngər tikdirmişdir. Əgər dəfində bir qədər təxir edilsə, sonra onun qarşısında durmaq mümkün olmayacaqdır». «1748-ci ildə Hacı Çələbi məktubu aldıqdan sonra çoxsaylı bir qoşun düzəldib Qarabağa yürüş edir. Pənahəli xan öncə müdafiə mövqeyi tutsa da, sonradan hücuma keçməyi qərara alır. Vəziyyət kəskinləşərək qala savaşından meydan müharibəsinə çevrilir. Nuxa qoşunu ilə Qarabağ qoşunu paytaxt Bayat qalası civarında qarşılaşdır».

Nuxa xanlığının tarixindən yazmış tarixçilər Kərim ağa Fateh və Hacı Seyid Əbdülhəmid əfəndinin yazılarında nədənsə bu savaşdan bəhs olunmur.



***Pənahəli xan***

Güney Azərbaycan tarixçisi Səməd Sərdariniya yazır: «Şirvan və Nuxa hakimləri birləşib Pənah xanı aradan götürmək üçün çoxlu qoşunla Bayat qalasına hücum edib onu mühasirəyə aldılar. Pənah xan 2-3 gündən bir təcrübəli, seçmə atlıları ilə qaladan çıxıb Qarabağ hakimliyinə iddiaçı olan Nuxa xanlığının hakimi Hacı Çələbi ilə vuruşdu. O, şücaəti ilə Nuxa və Şirvan qoşunlarına qələbə çaldı və Nuxa döyüşçülərini Kür çayının o biri tərəfinə qovdu.Nuxa və Şirvan xanlarının əlindən heç nə gəlmədi. Mühasirə bir aydan çox çəkdi. Xanlar hər gün əsgərlərinin ölümünün, at və ulaqlarının oğurlanmasının şahidi olurdular. Onlar peşiman və pərişan halda dönüb öz vilayətlərinə getdilər».

1758-ci ildə Pənahəli xan Nuxaya yürüş edir. Hacı Çələbi xanın oğlu Ağakişi bəyin var-dövlətini yağmalayıb geri qayıdır.

1759-cu ildə Qazıqumuq hakimi Məhəmməd xan Nuxaya hücum edib Ağakişi xanı öldürür. Özü xanlıq etməyə başlayır. Hacı Çələbi xanın nəvəsi, Həsən ağanın oğlu Məhəmmədhüseyn xan Məhəmməd xana qarşı üsyan qaldırıb Pənahəli xanı köməyə çağırır. Pənahəli xan Məhəmmədhüseyn xanın xahişinə müsbət cavab verərək qoşunla Nuxaya daxil olur. Məhəmməd xan ilk toqquşmada basılıb Dağıstana qaçır.

İbrahimxəlil xan hakimiyyətinin ilk illərində Məhəmmədhüseyn xanla dostluq etmiş, qızı Tubu bəyimi almışdı.



***M.P.Vaqif***

Xanlığın baş vəziri Molla Pənah Vaqif Məhəmmədhüseyn xanın şairliyindən xəbərdar idi. Hətta ondan tüfəng də istəmişdir.

Saray ərkanı olan şair Rafe Məhəmmədhüseyn xanın sarayına göndərilmişdi.

**M.P.Vaqif Nuxa xanına xitabən yazırdı:**

Qıvrılır gönlüm tüfəngdən dəm vuranda mar tək,
Od çıxır ağzından ol dud ilə çaxmaq bar tək.
Gülləsi əşkim əsər çeşmim şərari nar tək,
Müşk, barut ətrilə həm türreyi-tərrar tək,
Etmədi mütləq dimağımı müəttər bir tüfəng.

**Məhəmmədhüseyn xan Müştaq Molla Pənah Vaqifə cavabında yazırdı:**

Sən Qarabağ içrə qurmusan tələb meydanını,
Tutmusan dildə olan bədü vəfa mizanını,
Görməyibsən əsri-ehsanın məgər cövlanını,
Bir tüfəngin bu qədər sən çəkmisən hicranını
Eylədim təslimi-Rafe çeşmi pa bərsər tüfəng.[534]

İbrahimxəlil xanla Məhəmmədhüseyn xanın qohumluğu və dostluğu uzun sürmür, aralarına ədavət düşür. Nuxa xanı ilə dostluq edən baş vəzir Molla Pənah Vaqif bu nifaqı aradan qaldıra bilmir. İbrahimxəlil xan Məhəmmədhüseyn xanın oğlu Məhəmmədhəsən ağanı Şuşa qalasında dustaq saxlayır.

Çıldır valisi Süleyman paşanın 1780-ci il 26 oktyabr tarixli təhriratında deyilirdi ki, qubalı Fətəli xan və nuxalı Məhəmmədhüseyn xanla qarabağlı İbrahimxəlil xan arasında ədavət olduğundan İbrahimxəlil xan Məhəmmədhüseyn xanın oğlunu, həmçinin Qaradağ və Bakı xanlarını da həbs etmişdi. Fətəli xan Məhəmmədhüseyn xanla birgə İbrahim xanın üzərinə yürüşə hazırlaşarkən Məhəmmədhüseyn xan 1779-cu ildə öz əmisi Hacı Əbdülqadir bəy tərəfindən İbrahim xanın təhriki ilə qətlə yetirilir.

**Molla Vəli Vidadi Hüseyn xan Müştaqa həsr etdiyi «Müsibətnamə» adlı tarixi mənzuməsində yazır:**

Ol Qarabağ hakimi dövlətli İbrahim xan,
Əvvəlü axır onunla ta yaman idi, yaman,
Gördü fürsət gəldi, fövt etmək deyil əqlə nişan,

Oldu Əbdülqadir ilə müttəfiq həm ol zaman
Yığıldılar bihəddi-ləşkər, cəm edib hər yanə bax.

1784-cü ildə Fətəli xan İbrahimxəlil xanın üstünə hücum edir. Bu zaman Hacı Əbdülqadir xanın qoşunla Quba tərəfində olması İbrahimxəlil xanı

əsəbiləşdirir və Məhəmmədhüseyn xanın oğlu Məhəmmədhəsən ağanı zindandan azad edib Car-Balakən camaatının yanına göndərir ki, qoşun toplayıb taxt uğrunda mübarizəyə başlasın. Məhəmmədhəsən ağa qoşun toplayıb Nuxaya hücum edir, şəhəri tutub Hacı Əbdülqadir xanı qovur, özünü xan elan edir.

1795-ci ildə Məhəmmədhüseyn xanın ikinci oğlu Səlim xan hakimiyyəti ələ keçirir. İbrahimxəlil xan Tuti bəyimlə evləndiyindən Qarabağ xanlığı ilə dostluq münasibəti qurur.

1797-ci ildə Məhəmmədhəsən xan şirvanlı Mustafa xanla birləşib Səlim xanın üzərinə hücum edir. Səlim xan duruş gətirə bilməyib Qarabağa qaçır.

Müasirlərinin şəhadətinə görə Kərim ağa xoşxasiyyətli olmuş, atasının sarayında xüsusi təhsil almış, ərəb və fars dillərinə mükəmməl yiyələnmişdir. Babası «Müştaq» kimi şeirlər yazmışdır. Özünə götürdüyü «Fateh» təxəllüsü də bundan irəli gələ bilərdi. Ərəb və fars dillərinə mükəmməl yiyələnməsinə baxmayaraq əlimizdə olan iki qəzəli Azərbaycan dilindədir.

Firudin bəy Köçərli Kərim ağa Fatehi gözəl təlim görmüş savadlı ziyalı və şair, Mirzə Fətəlinin müasiri olduğunu bildirmişdir. [535]

Məlum olduğu kimi, Nuxa xanlığı Rusiyaya birləşdirilikdən sonra Xoylu Cəfərqulu xan (Dünbülü) Rusiya çarı I Aleksandr tərəfindən Şəkiyə xan təyin olunur. Bundan sonra Kərim ağa Şəkinin «Otaq eşiyi» adlanan hissəsindəki ata-baba mülklərindən olan və hazırda «Şəkixanovların evi» adlanan evdə yaşamağa başlayır. Yada salaq ki, Kərim ağanın qayıtmasından bir az əvvəl əmisi Səlim xan general Nebolsinin dəstələri ilə toqquşmuş və İrana qovulmuş, o biri əmisi Məhəmmədhəsən xan Həştərxana sürgün edilmişdir.

Kərim ağa Fatehin 6 övladı-İsmayıl ağa, Cəfər ağa, Əbdülhəmid ağa, Mustafa ağa adlı 4 oğlu, iki qızı olmuşdur.

Nuxa xanlarının dəfn olunduğu qəbiristanlıq indi də şəkililərin ehtiram göstərdiyi memarlıq abidə komplekslərindən biridir.

Kərim ağa Fateh 12 iyul 1858-ci ildə dünyasını dəyişmiş, Nuxada xan məscidinin arxasında xanların nəslinə aid qəbiristanlıqda dəfn edilmişdir. Nuxada yerli əhali tərəfindən «Xan qəbiristanlığı» adlanan yerdə qalmış Nuxa xanlarına və onların nəsillərinə aid olan başdaşıları üzərindəki kitabələr istər Nuxanın, istərsə də xanlıqlar dövrünün tarixinin öyrənilməsində mühüm əhəmiyyətə malikdir. Tarixi ədəbiyyatda qeyd edildiyinə görə, vaxtilə həmin yerdə 15-20-yə qədər qəbir daşı olmuşdur ki, bunlardan 10-u hazırlanma üslubuna görə incəsənət üçün maraqlı ola bilər. Burada bərk daşlardan başqa, əhəngdaşı və mərmərdən düzəldilmiş və digər memarlıq məktəblərinə aid ediləcək başdaşları da vardır.




*Xan qəbiristanlığı*

**Fətəli xanın** epitafiyasının **(2-ci şəkil)** dövrəsi qərənfil çiçəklərindən hörülmüş haşiyə ilə əhatə olunmuşdur. Başdaşının yuxarı hissəsində qərənfil, zanbaq, altıyarpaqlı çiçək, sətirlərarası haşıyələrdə isə çiçək yarpaqları toxuması həkk olunmuşdur. ***Fətəli xanın*** başdaşının orta hissəsində ərəb dilində **nəsx xətti ilə beş sətirdə həkk olunmuş kitabənin oxunuşu belədir:**




هذا مرقد الاميرالكريم المرحوم جليل المرحوم الشوكة والشان
فتحعلی خان ابن الاميرالكريم المغفوراجل الخوانين
العظم حسين خان ادخلهماالله تعالى فى اعلى الجنان

قدارتحل من دارالفناء الى دارالباء ومات فى ثانى من
هرجمادى الاخر فى يوم الجمعه بعد الظهرالتاريخ قى سنه

T ə r c ü m ə s i: *Bu qəbir, kəramətli ağa, əmir, bağışlanmış, xanların böyüyü, əzəmətli Hüseyn xanın oğlu-allah, onların hər ikisini cənnətlərin ən*

*yüksəyində yerləşdir, rəhmətlik kəramətli əmir, şə'n-şövkətli, böyük Fətəli xanınındır. 1230-cu il tarixdə, cəmadiülaxır ayının ikisində puç və mənasız həyat evindən daimi evə köçdü və vəfat etdi.*



**Kərim ağanın** epitafiyası **(4-cü şəkil)** bərk daş üzərində xüsusi ustalıqla işlənmişdir. Başdaşı bütöv bir daşın üzərində çatmatağ formasında həkk olunmuş, dövrəsi isə bişmiş kərpiclə tikilmişdir. Başdaşının çatmatağlı yuxarı hissəsində şanagülü, altıyarpaqlı çiçək və b. bitki naxışları həkk olunmuşdur.

Abidənin kitabə olan hissəsi və kitabələrin sətirarası boşluqları çiçək naxışları ilə bəzədilmişdir. Çiçək haşiyələrindən içəridə Quran ayəsi yazılmış kitabələrdən əmələ gətirilmiş ikinci bir haşiyə də vardır ki, bu abidəyə xüsusi gözəllik verir. Usta-həkkak buradakı kitabələrdən, eyni zamanda başdaşı-nı bəzəmək məqsədilə böyük məharətlə istifadə etmişdir.

Ərəb dilində Nəsx xətti ilə yazılmış kitabələr belə oxunur;

Sağ haşiyədə:

الهی لست للفر دوس اهلا
ولا احری لی نار الجحیم فهب لی زلتی فاغغر ذنوبی
فانك غافرالذنب العظیم

T ə r c üm ə s i: *Ey mənim Allahım, cənnət əhli deyiləm, cəhənnəm oduna da ləyaqətim yoxdur. Mənim günahlarımı bağışla və səhvimdən keç, çünki sən böyük günahları bağışlayansan!*

S o l h a ş i y ə d ə:

تجاوز عن ضعیف قد اتاك
مفراًً بالذنوب قددعاك
فان ترحم فانت اهل لذاك
و ان تطرد فمن یر حم سواك

T ə r c ü m ə s i: *Sənin yanına gələn zəifin günahından keç. Öz günahlarını iqrar edərək səni çağırır. Əgər rəhm etsən, sən buna layiqsən, əgər qovsan, səndən başqa kim ona rəhm edər*?!

O r t a d a :

هذا مر قد الامیر الکریم جلیل الشو کة و

الشان خادم الفرقان عاليجاه کریم آقا بن الامیر
الاکریم علیجاه فتحعلی خان اسکنهما الله فی الجنان وقف
و قد ار تحل من الفناء الی البقاء فی خمس و سبعین و ماتین بعد الف
و قد توفی جماد الاولی فی یوم الرابع

T ə r c üm ə s i: *Bu qəbir, yüksək cəlallı, kəramətli əmir, Fətəli xanın oğlu, şə'n-şövkətli əmir, Qurana xidmət edən bəxşişkar, alicah Kərim ağanındır – Allah onların hər ikisini cənnətdə yerləşdirsin – doğrudan da (onun qəlbi) dayandı və min iki yüz yetmiş beşinci ildə puç evdən daimi evə köçdü, yəni vəfat etdi. Cəmadiüləvvəl ayında dördüncü gün vəfat etmişdir (=7. XII 1858).*

Kərim ağa Fatehin «Şəki xanlarının müxtəsər tarixi» əsəri XVIII əsrin birinci yarısından XIX əsrin ilk illərinə qədərki dövrdə Şəki xanlarının tarixini əks etdirir. V.Dorn Azərbaycan dilində yazılmış bu əsərin əslini ilk dəfə 1858-ci ildə «Əl-ntixibat-l- bəhriyyə» adlı külliyyatda topladığı tarixi əsərlər sırasında Peterburqda nəşr etdirmişdir.[536]

N.Xanıkovun səhvi nəticəsində əsər Əbdüllətif Əfəndinin adına çap olunmuşdur. Təəssüf ki, bu səhv 1926-cı il Bakı nəşrində də təkrar olunmuş, yalnız 1929-cu ildə Salman Mümtaz əsərin Kərim ağa Fatehə məxsus olduğunu müəyyənləşdirmişdir. S. Mümtaz həmin əsəri tədqiq edərək belə nəticəyə gəlir: «Fətəli xan, məşhur Hacı Çələbi xanın nəticəsi, Həsən ağanın nəvəsi və Məhəmməd Hüseyn xan Müştaq təxəllüsünün oğludur. Məhəmməd Hüseyn xanın üç oğlu var idi ki, onlar da Məhəmmədhəsən xan, Fətəli xan və Səlim xandan ibarət idi. Məhəmməd həsən xan ilə Səlim xanın hər birinin üç oğlu olduğu hada, Fətəli xanın yalnız bir oğlu var idi ki, o da türki və farsı şeirləri ilə məşhur olan Kərim ağa Fatehdir».[537]

Əsər Nuxanın XVIII – XIX əsrlər siyasi tarixinə aid ilk mənbələrdən biridir. Nuxanın qədim dövrünə aid olan hissə rəvayət və əfsanələrə əsaslandığı halda, əsərin digər hissələrində XVIII əsrin ikinci yarısı və XIX əsrin birinci rübündə Nuxada baş verən tarixi hadisələr haqqında çox maraqlı və Nuxa xanlığı tarixini tədqiq edənlər üçün olduqca qiymətli məlumatlar vardır».[538] Bu əsər bəhs olunan dövrdə Şəkidə, o cümlədən Azərbaycanda gedən hadisələrin öyrənilməsi baxımından əhəmiyyətli mənbədir.

Görkəmli tədqiqatçı, əslən şəkili olan Salman Mümtaz Kərim ağa Fatehin oğlu Mustafa ağanın «Şuxi» təxəllüsü ilə şer yazdığı haqqında da məlumat vermişdir. İstedadlı tədqiqatçı Ədalət Tahirzadənin «Kərim ağa Fatehin həyat və yaradıcılığından qeydlər» adlı məqaləsindən məlum olur ki, Mustafa ağa Şuxi 1857/58-ci ildə atasından alınıb Peterburqa aparılmış, orada böyüyüb kornet rütbəsinə yüksəlmişdir. Mustafa



***Mustafa ağa Şuxi***

ağa 5 il konvoyluq edib, 1861-ci ildə kornet çini alıb geri qayıtmışdır.

Mustafa ağa Şuxi atasını bir daha görə bilmədiyi, dəfnində iştirak edə bilmədiyi üçün, onun borcundan çıxmaqdan ötrü tərcümeyi-halını yazmağı qərara almışdır. Kornetdən qayıtdıqdan sonra Mustafa ağa Şəkidə murov köməkçisi işləmiş, 5 illik xidmətdən sonra ömrünü özünə məxsus Qaraqoyunlu (indiki Çay Qaraqoyunlu) kəndində keçirir və orada 1895-ci ildə dünyasını dəyişmişdir. Onun cənazəsi Şəkiyə gətirilmiş, Hüseyn xan məscidinin həyətində Kərim ağa Fatehin (Şəkixanovun) yanında dəfn edilmişdir.[539]



Mustafa ağanın iki divanından ibarət əlyazması və şeirləri bizə gəlib çatmışdır.

Kərim ağanın oğlanlarından olan İsmayıl ağa XX əsrin 30-cu illərinə qədər «Şəkixanovların evi» ndə yaşamış, ev 1938-ci ildə sovet hökuməti tərəfindən əlindən alınmışdır. Ümumiyyətlə, xan nəslinə məxsus evlər sovet hakimiyyəti illərində müsadirə olunmuş, nəslin üzvləri təqib olunmuş, tutulmuş, bəziləri soyadlarını dəyişməklə canlarını qurtarmışlar. İsmayıl ağanın Bikəxanım adlı bir nəticəsi Bakı şəhərində, Cəmsilxan Şəkixanov adlı başqa birisi Moskvada yaşamışdır. Kərim ağanın 4-cü oğlu Cəfər ağanın nəticəsi Cəfərağa Cəfərov hazırda Şəkinin «Otaq eşiyi» adlanan hisəsindəki evdə yaşayır.[540]

***Əsas işi:*** Şəki xanlarının müxtəsər tarixi. Bax: *Şəki xanlığının tarixindən. Bakı: «Azərbaycan Ensiklopediyası» Nəşriyyat – Poliqrafiya Birliyi, 1993,32 səh.*

***Onun haqqında:*** *Köçərli Firidun bəy. Azərbaycan ədəbiyyatı. İki cilddə. İkinci cild. Bakı:Elm, 1981, səh.370; Tahirzadə Ədalət. Kərim ağa Fatehin həyat və yaradıcılığından qeydlər // Əlyazmalar xəzinəsində. VIII cild. Bakı: Elm, 1987, səh. 58; yenə onun,. Şəkinin tarixi qaynaqlarda. Bakı: Master, 2005, 256 s.,səh. 6, 19, 21, 84, 88, 92, 93, 94, 112, 123, 125, 134, 223; Əmrahov Mais, Çingizoğlu Ənvər, Həsənov Habil. Qarabağ xanlığı, Bakı: Mütərcim, 2008, 220 s., səh. 87-89; Ənvər Mete. O torpağın övladları. Bakı: Nurlan, 2006, 608 s, şəkilli. s,50-51;*

**QAFAROV TAHİR BAQİ OĞLU (1950-2006). Tarix üzrə elmlər doktoru, professor** Tahir Qafarov 1950-ci ildə Nuxada anadan olmuş, 1969-1973-cü illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun tarix fakültəsində təhsil almışdır. 1983-cü ildə namizədlik, 1992-ci ildə doktorluq dissertasiyası müdafiə etmişdir.

Tarixçi-alim T.Qafarov «Azərbaycan tarixi» (1920-1991), «Azərbaycan tarixi: XX əsrin 80-90-cı illəri», «Azərbaycan kənd əhalisinin həyat tərzi.1960-1990» və s. kitabların müəllifidir. Orta məktəblər üçün tarix dərsliklərinin müəllifi olan Tahir Qafarov AMEA-nın Tarix İnstitutunda şöbə müdiri, institut Elmi Şurasının üzvü, İxtisaslaşdırılmış Müdafiə Şurasının elmi katibi, «Tarix» üzrə Respublika Elmi-Koordinasiya Şurası»nın sədri, yeddicildlik «Azərbaycan

tarixi» nin Baş Redaksiya Şurasının üzvü, yeddinci cildin məsul redaktoru və əsas müəllifi olmuşdur. Azərbaycan, rus və ingilis dilində Bakıda, Moskvada, Nyu-Yorkda, Monrealda və Londonda əsərləri çap olunmuşdur.

«Azərbaycan Respulikası: əsrə bərbər on il 1991- 2001» adlı monoqrafiyası 2001-ci il üçün «Elm» nominasiyası üzrə «Humay» Milli – İctimai mükafatına layiq görülmüşdür.

Tahir Qafarov «Azərbaycan tarixi (1920-1991)» adlı kitabı ilə Azərbaycan tarixinin bu dövrü haqqında müasir elmi konsepsiyanın əsasını qoymuşdur. Orta və ali məktəblər üçün dərsliklərin və proqramların müəllifi olan tarixçi-alim yüksək ixtisaslı elmi kadrların hazırlanmasında fəal iştirak etmişdir.

Tarix üzrə elmlər doktoru Tahir Qafarovun çapa hazırlanan sonuncu əsəri «Azərbaycanın ən yeni tarixi (XX əsrin sonları-XXI əsrin əvvəlləri)» monoqrafiyasıdır. Azərbaycanın 1988-2002-ci illər tarixini əks etdirən bu əsərdə diqqəti cəlb edən mühüm cəhət ondan ibarətdir ki, müəllif hadisələri dəqiq xronoloji ardıcıllıqla şərh etməklə yanaşı, xalqımızın yaşadığı dövrün təhlilini vermiş, 1988-ci ildən başlayaraq ermənilərin keçmiş SSRİ-nin şovinist və imperiyapərəst dairələrinə arxalanaraq Azərbaycana qarşı ərazi iddiaları irəli sürmələri, sovet imperiyasının süqut etmə səbəbləri, Azərbaycanın müstəqillik qazanması zərurətini faktların köməyi ilə aça bilmişdir. Əsərin ən qiymətli cəhətlərindən biri də odur ki, müəllif bütün hadisələrə tarixçi mövqeyindən yanaşmış, hadisələrin mahiyyətini açarkən qərəzkarlıqdan və şovinizmdən uzaq olmuşdur.[541]

**Tahir Baqi oğlu Qafarov 2006-cı ildə** dünyasını dəyişmişdir.

**Əsas işi:** *Azərbaycan kənd əhalisinin həyat tərzi. 1960-1990. Bakı, 1991; Azərbaycan tarixi. XX əsrin 80-90-cı illəri. Bakı, 1997; Azərbaycan tarixi.1920-1991. Bakı, 1999; Türklərə qarşı erməni terrorizmi. Bakı, 2000; Azərbaycan Respublikası: əsrə bərabər on il-1991-2001. Bakı, 2001; Armenian terrorism ağainst Turks. Baku, 2001;. January 20, 1990.Red an Blask. Reasons, Fakts, Lesson And Results.Baku, 2002; The genoside And terrorism ağainst Azerbaijan are the constituents of the Armenian rolicu of ethinc clearing-Azerbaijans, 2002, № 7-8, r.44-48; «Azərbaycanın ən yeni tarixi (XX əsrin sonları-XXI əsrin əvvəlləri). Bakı, 2005*

**Onun haqqında:** *Ə.Mete. O torpağın övladları. Bakı, Nurlan,2006, 608 s., səh.59-60;*



**QARAYEV YAŞAR VAHİD OĞLU (1936-2004)** 1936-cı ildə Nuxada sənətkar ailəsində anadan olmuşdur. 1946-cı ildə ailəsi ilə birlikdə Bakıya gələn kiçik Yaşar əvvəlcə 31 nömrəli orta məktəbi bitirmiş, 1954-1958-ci illərdə Azərbaycan Dövlət Universitetinin filologiya fakültəsində təhsil almışdır. Əsasən Nizami adına Ədəbiyyat İnstitutunda işləyən Yaşar Qarayev institutun direktoru vəzifəsinədək yüksəlmişdir. Filologiya üzrə elmlər dokoru (1980), əməkdar elm xadimi (1982) Yaşar Qarayev M.Qorki adına Dünya

Ədəbiyyatı İnstitu tunun hazırladığı doqquzcildlik «Dünya ədəbiyyatı tarixi», Nizami adına Ədəbiyyat İnstitutunun hazırladığı yeddicildlik «Azərbaycan ədəbiyyatı tarixi» əsərlərinin müəlliflərindən biridir. «Faciə və qəhrəman», «Sənətimiz və müasirlərimiz», «Tənqid: poblemlər, portretlər», «Poeziya və nəsr», «Realizm: sənət və həqiqət», «Ədəbi üfüqlər» kimi sanbalı kitabların müəllifi olan Y.Qarayev «Dünya ədəbiyyatının qanunauyğunluqarı» problemi üzrə əlaqələndirmə şurasının sədr müavini, bir sıra elm və tədris müəssisələrinin, qəzet və jurnal redaksiya şuralarının üzvü kimi ictimai vəzifələri yerinə yetirmişdir.

Yaşar Qarayev XX əsr tənqidinin yeni mərhələsinə və nəslinə mənsubdur. Bu mərhələ ötən əsrin 60-cı illərindən sonra başlamış və yeni əsrin başlanğıc dövründə də davam edir. Ədəbi tənqiddə «60-cı illər ədəbiyyatı», «60-cı illər nəsli» anlayışları formalaşmış və artıq ədəbi düşüncədə sabitləşmişdir. «60-cı illər ədəbiyyatı» anlayışı altında yalnız yeni şairlər və nasirlər nəsli yox, yeni tənqidçilər nəsli də yer almışdır. Çünki «60-cı illər ədəbiyyatı» anlayışının özü tənqidin kəşfidir - tənqid bu ədəbiyyatın yeniliyini hiss etmiş və dəyərləndirmişdir. Tənqidin bu nəslini və mərhələsini öz yaradıcılığında, öz tənqidçi təfəkküründə və şəxsiyyətində təmsil edən tənqidçi barədə düşünəndə ilk olaraq göz önünə Yaşar Qarayev gəlir.

Yaşar Qarayev sözün həqiqi və geniş mənasında **tənqidçi** idi. O, bədii əsər, onun daxili mövzusu və aləmi, əsərdə obrazı yaradılan insan haqqında mütəfəkkir kimi mühakimə yürüdürdü, onun ədəbi təhlili təfəkkürlə aşılanmış bir təhlil idi. O, müasir ədəbiyyatdan yazanda da, realizmdən yazanda da, romantizmdən, maarifçilikdən, renessansdan, sosialist realizmindən yazanda da tənqidçi idi, o, hadisələri, qanunauyğunluqları müasirliklə, müasir fəlsəfi təfəkkürlə qavrayır, izah edir və qiymətləndirirdi. Onun 1976-cı ildə çap olunan «Tənqid: problemlər, portretlər» əsəri ədəbi-tənqidi münasibətlərə vurulan yekun aktı kimi qiymətlidir.

Yaşar Qarayevin tədqiqatında «M.F.Axundov realizmi», «Mirzə Cəlil realizmi», «Sabir realizmi» öz həqiqi miqyas və dərinliyini tapa bilmişdir.

Y.Qarayev əsas etibarilə XIX-XX əsrlər Azərbaycan ədəbiyyatının tədqiqatçısı və mütəxəssisi olsa da, orta əsrlər poeziyasından, Şərq renessansından, Nizamidən və Füzulidən də yazmış, «Dədə Qorqud» eposundan söz açmış bir sözlə, Azərbaycan ədəbiyyatı bütövlükdə, bütün mərhələ və hadisələrilə birlikdə Y.Qarayev nəzəri görüşlərinin və təhlillərinin predmeti olmuşdur.

Yaşar Qarayevin 1982-ci ildə «Hüseyn Cavid» və «Cəfər Cabbarlı» kitabları rus dilində, «Mirzə Fətəli Axundov» adlı kitabı həm rus, həm də ingilis dilində Bakıda nəşr edilmiş, 1983-cü ildə «Azərbaycan realizminin mərhələləri» rus dilində, «Molla Pənah Vaqif» əsəri ingilis dilində, 1985-ci ildə Bəxtiyar Vahabzadənin yaradıcılığından bəhs edən «Poeziyanın kamilliyi» (Ş.Salmanovla birlikdə) adlı kitabları nəşr olunmuşdur. Yaradıcılığının zirvəsi sayılan «Tarix: yaxından və uzaqdan» əsəri 1996-cı ildə ədəbi elmi hadisə olmuşdur.

Yaşar Qarayevin əsərləri Türkiyədə çox böyük maraqla qarşılanmış, bir neçə kitabı orada nəşr edilmişdir.

**Yaşar Vahid oğlu Qarayev** 26 avqust 2002-ci ildə dünyasını dəyişmiş, II Fəxri Xiyabanda dəfn olunmuşdur.

**Əsas işi:** *Faciə və qəhrəman. Bakı,1965; Sənətimiz və müasirlərimiz. Bakı, 1972; Tənqid: problemlər portretlər. Bakı,1976; Poeziya və nəsr. Bakı, 1979; Realizm: sənət və həqiqət. Bakı, 1980; Mirzə Fətəli Axundov. Bakı, 1982; Poeziyanın kamilliyi. Bakı,1985; Ədəbi üfüqlər. Bakı,1985; Tarix yaxından və uzaqdan. Bakı, 1996;*

**Onun haqqında**. *Ü.Süleymanova. Yaşar Qarayev meyarları. Bakı,2006; Vaqif Aslan. Ədəbiyyatşünaslığımızın Yaşar Qarayev məsələsi və ya ədəbiyyatımızda işıqla qaranlığın kəsişdiyi nöqtələrə baxış. Əsərləri, IV cild. Bakı: Təhsil» NPM, 2010.-540 s., səh. 374-380;*



**QƏRİBOV ADİL ABDUXALIQ OĞLU** 1950-ci ildə Nuxada anadan olmuşdur. Azərbaycan Dövlət Universitetinini bitirmişdir. Kimya üzrə elmlər doktoru, professordur. 2007-ci ildə AMEA-nın müxbir üzvü, 2014-cü ildə həqiqi üzvü seçilmişdir.

A.Qəribov 145 elmi əsərin, 9 müəllimlik şəhadətnaməsinin və 5 patentin müəllifidir. 120 elmi əsəri xaricdə nəşr olunmuşdur.

Onun rəhbərliyi altında onlarla elmlər namizədləri və elmlər doktorları hazırlanmışdır. Əsas elmi nailiyyətləri neft karbohidrogenlərinin katalitik krekingi proseslərinin katalizatorlarının aktivliyi və selektivliyinin artırılmasının və radiasiya katalitik krekinq proseslərinin effektiv araşdırılmasının elmi əsaslarının, nüvə enerjisinin universal enerji daşıyıcısı olan hidrogen vasitəsilə cevrilməsinin effektiv yolları məsələləri işlənib hazırlanmasıdır.

A.A.Qəribov hazırda AMEA-nın Radiasiya Problemləri İnstitutunun direktoru vəzifəsndə işləyir.



**QULİYEV CAVANŞİR RƏHİM OĞLU** 1950-ci ildə Nuxada dünyaya gəlmişdir. Orta təhsillə yanaşı musiqi təhsili alan C. Quliyev 1975-ci ildə Ü.Hacıbəyov adına Azərbaycan Dövlət Konservatoriyasının (İndiki Bakı Musiqi Akademiyası) bəstəkarlıq fakültəsini (professor C.Hacıyevin sinfini) bitirmişdir.

C.Quliyev 1969-1990-cı illərdə Azərbaycan Teleradiosunda artist, səs rejissoru, 1990-1993-cü illərdə «Azkonsert» də bədii rəhbər, eyni zamanda Bakı Musiqi Akademiyasında müəllim, 1995-2003-cü illərdə Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetində



müəllim, eyni vaxtda Azərbaycan Dövlət Akadeik Milli Teatrında musiqi hissə müdiri, 2003-cü ildən 2009-cu ilə kimi Azərbaycan Milli Konservatoriyasında dosent vəzifələrində işləmişdir. Hazırda Kipr Türk Cümhuriyyətində çalışır.

C.Quliyev 1992-ci ildən əməkdar incəsənət xadimidir. 10-dan yuxarı musiqi əsərinin, simfonik və kamera orkestrləri, piano, xor üçün müxtəlif əsərlərin, 200-dən çox teatr tamaşalarının musiqisinin müəllifidir. Onun 500-ə yaxın mahnısı müğənnilərin repertuarındadır. Azərbaycanda bəstələnmiş ilk əsgər marşının müəllifi olan C.Quliyevin adı Amerika Bioqrafiya İnstitutunun Ensiklopediyasına daxil edilmişdir.

***Əsas işi: Musiqi əsərləri-*** *«Məhəbbət oyunu»-operetta-libretto müəllifi Q.Rəsulov; «Yeddi məhbusə»- operetta-libretto müəllifi Ə.Əmirli; Birinci, ikinci, üçüncü və dördüncü simfoniyalar; «Birinci və ikinci simli «Kvartet»; Simfonik orkestr və zurna üçün «Üvertura»; Violino və saz üçün «Sonata»; Taxta nəfəslilər üçün «Kvartet»; Mis nəfəslilər üçün «Kvintet»; Trio «Karvan»; Poema «Bayatı»;*

***Simfonik və kamera orkestləri, piano xor üçün əsərlər****-Ayrıca on bədii; Çoban bayatı; Araqarışdıran; Süd dişinin ağrısı; Qəm pəncərəsi; Girişmə, öldürər!: Lətifə; Şirbalanın məhəbbəti; Aşıq Qərib (Gürcüfilm); Fəryad; Tövbə;*

***sənədli filmlərə yazılan musiqilər-*** *Lahıc; Sovet Azərbaycanı; DQMV-60; Anarla üz-üzə;*

***Marşlar****: Əsgər marşı*

***Onun haqqında:*** *Şəki. Alim və Ziyalılar. Bakı: Elm, 2007, 428 s. (Tərtibçilər: Ələfsər Bəxtiyar oğlu Məmmədov, Fikrət Ramazan oğlu Xalıqov), səh. 238-240*

**QULİYEV MUSTAFA ZƏKƏRİYYƏ OĞLU (1893-1938).** Ədəbiyyatşünas, tənqidçi, dövlət xadimi Mustafa Quliyev 1893-cü ildə Nuxada xırda tacir ailəsində anadan olmuşdur. 1913-cü ildə Tiflis gimnaziyasını bitirmiş, Kiyev Universitetinin fizika-riyaziyyat fakültəsinə daxil olmuşdur. M.Quliyev Qırmızı Professorlar İnstitutunda təhsil almış, Kommunist Akademi yasını bitirmişir.

M.Quliyev 1919-cu ildə Azərbaycana gəlmiş və 1921-1922-ci ildə AK (b) P Qaraşəhər təşkilatının katibi olmuşdur. 1922-1928-ci illərdə Azərbaycan SSR Xalq Maarif Komissarı işləmişdir. Həmin illərdə Xalq Maarif Komissarlığı orta və orta ixtisas təhsili məsələləri ilə yanaşı, ədəbiyyatın inkişafına və respublikada kitab nəşrinə rəhbərlik edir, faktiki olaraq Yazıçılar İttifaqının, Mədəniyyət Nazirliyinin və Poliqrafiya Nazirliyinin funksiya larını həyata keçirirdi. M.Quliyev bu vəzifələri ləyaqətlə yerinə yetirməklə bərabər, «Maarif və mədəniyyət» (1923-1926), «İnqilab və mədəniyyət» (1929-1931) jurnallarında redaktor işləyir.

Görkəmli dövlət və ictimai xadim olan M.Quliyev 1926-1936-cı illərdə mədəniyyət cəbhəsində təşkilatçılıq fəaliyyəti ilə, Azərbaycan ədəbiyyatı və

teatr incəsənəti məsələləri və ədəbiyyat tənqidi ilə məşğul olur, maarif və elmin təşkili məsələlərinə dair əsər və məqalələr yazır.

M.Quliyev «Maarif və mədəniyyət» jurnalının nəşrində xüsusi rol oynayır. Onun 1926-1930-cu illərdə jurnalda elmin, maarifin, mədəniyyətin, o cümlədən teatr, musiqi, incəsənət, fəlsəfə, ədəbiyyatşünaslıq məsələlərinə dair çoxlu məqalələri dərc olunur. 1930-cu ildə «Oktyabr və türk ədəbiyyatı» monoqrafiyası nəşr olunur.

M.Quliyev fəlsəfə və etikaya dair məqalələr yazmışdır. 30-cu illərdə onun «Fransız materialistlərinin estetik görüşləri», «Təbiətin dialektikası və materiya problemi» əsərləri işıq üzü görür.

M.Quliyev Qazaxıstana, Çimkəndə göndərilmiş, orada partiya komitəsinin katibi seçilmişdir. Həbsdən qabaq Odessa Vilayət Komitəsinin katibi vəzifəsində çalışmışdır.

M.Quliyev 1937-ci ildə həbs olunmuş, 1938-ci ildə respublika DİK orqanları tərəfindən güllələnmişdir.

***Əsas işləri***: *Sevimli mürəbbimiz Şaiq Talıbzadənin 20 illik əməyinə qarşı-Talıbzadə Abdulla Şaiq. B, 1923; Yoldaş Nərimanov haqqında –Yeni məktəb, 1925 № 3-4, səh. 3-7 (ərəb əlifbası ilə); Роль Нариманова в Азербайжанском просвешении-Бакинский рабочий, 1925, 22 mart; Azərbaycanda teatr məsələləri. B, 1926; Azərbaycanda müsiqi kültürünün inkişafı məsələləri-Maarif və mədəniyyət, 1926, №7; Azərbaycanda Oktyabr düşmənləri. B, 1927, 30 s.; Aşıq Pəri və müasirləri-İnqilab və mədəniyyət, 1928, № 9; Mədəni inqilab və din-Bolşevik, 1928, №5, səh. 11-19; Quliyev M. («Tənqidçi» imzası ilə) Baba bəy Zakir –İnqilab və mədəniyyət, 1928, № 2; Mədəni inqilab və islam. B.,1928, 52 s.; Zaqafqaziya xalqının mədəni birliyi – İnqilab və mədəniyyət, 1929, № 6, səh. 1-2; Октябрь и тюркская литература. Б., 1930, 46 s.; Fransız materialistlərinin estetik görüşləri-Maarif və mədəniyyət, 1931, B, İzd-vo Az QNİİ, 1930, 70 s.; Sabir füqarə şairidir. M.Ə. Sabir məqalələr məcmuəsi. B, 1962.*

**Onun haqqında:** *Активные борцы за Советскую власть в Азербайджана. Б, 1957, стр. 238-239; Musayev. Mustafa Quliyev teatr tənqidçisi kimi// «Azərbaycan» jurnalı, 1970, №11, səh. 189-208; З.Геюшев. Философская мысль в Советском Азербайжана. Б., 1979, səh. 26-27; S.Salmanov. Azərbaycan Sovet şeirinin ənənə və novatorluq problemi. B.,1980, səh. 53-54, 102-104, 110-116; A.Abbasov. Mətbuat və ədəbiyyat (1920-1930). B., 1986, səh. 23, 28-29, 46, 94-95; Azərbaycan sovet yazıçıları (ədəbi sorğu kitabı). B., 1987, səh. 19; Караван высоких дум. Б., 1989, str.168-180; Q.Babayeva. M.Quliyev və Azərbaycan mədəniyyəti. Gənc alim və aspirantların respublika konfransı. B., 1997; Q.Babayeva. Mustafa Quliyev (taleyi və irsi). B., 1999, s.134; T.Əhmədov. XX əsr Azərbaycan yazıçıları. Ensiklopedik məlumat kitabı. B.,2004, səh. 632*

**Azərbaycan MEA-nın müxbir üzvü, tarix üzrə elmlər doktoru, professor İSMAYILOV MAHMUD ƏLİABBAS OĞLU (1920-2001)** 1920-ci ildə Nuxada anadan olmuşdur. 1946-cı ildən AMEA Tarix İnstitutunda əmək fəaliyyətinə başlayan İsmayıl müəllim laborantlıqdan institut direktorunun elmi işlər üzrə direktor müavini vəzifəsinədək yüksəl mişdir.

M.İsmayılov 1949-cu ildə «Azərbaycanda neft sənayesində iltizam sisteminin ləğvi» mövzusunda namizədlik, 1961-ci ildə doktorluq dissertasiyası müdafiə etmişdir. Mahmud İsmayılov 200 çap vərəqi həcmində elmi işin, o cümlədən 15 monoqrafiyanın, 40-dan artıq elmi-kütləvi məqalənin müəllifi olmuşdur.



M.İsmayılov 7 cildlik «Azərbycan tarixi» nin IV və V cildlərinin redaktoru olmuş, 1962-ci ildə «Dünya xalqları» seriyasından nəşr edilən «Qafqaz xalqları» əsərinin hazırlanmasında və «Kənd təsərrüfatı» bölməsinin yazılmasında iştirak etmişdir**.**

M.İsmayılov ASE–nın elmi məsləhətçilərindən olmuş, 1966-cı ildə Romada keçirilmiş sovet və İtaliya tarixçilərinin II Beynəlxalq konfransında aqrar münasibətlər mövzusunda məruzə etmişdir. O, həmçinin Leninqradda (indiki Sankt-Peterburq) iqtisadçıların V Beynəlxalq konqresinin və Moskvada keçirilən tarixçilərin XII Beynəlxalq konqresinin iştirakçısı olmuşdur.

M.İsmayılov həm də tarixi romanların müəllifidir. Onun «Ağ yapıncı», «Xaqani», «El üçün yan», «İki od arasında», «Sənin ulu baban», «Qara Yusif», «Uzun Həsən» roman və povestləri oxucular tərəfindən rəğbətlə qarşılanmışdır.

1941-1945-ci illər sovet-alman müharibəsinin iştirakçısı olan M.İsmayılov 2-ci dərəcəli «Vətən müharibəsi» ordeni və medallarla təltif olunmuşdur.

M.İsmayılovun ömür-gün yoldaşı Şövkət xanım Tağıyeva da tarixçi alimdir. AMEA-nın Şərqşünaslıq institutunun əməkdaşıdır.

***Mahmud Əliabbas oğlu İsmayılov 2001-ci idə dünyasını dəyişmiş, Fəxri Xiyabanda dəfn olunmuşdur.***

**Əsas işi:** *XX əsrin əvvəllərində Azərbaycan kənd təsərrüfatı. Bakı, 1960; Капитализм в сельском хозяйстве Азербайджане на исходе ХЫХ – начало ХХ в. Баку, 1964; Промышленность Баку в начале ХХ века. Баку, 1976; Социально-экономическая структуре Азербайджане в эпоху империализма. Баку, 1982;*

**Onun haqqında:** *ASE, X cild, səh. 597; Ənvər Mete. O torpağın övladları. Bakı: Nurlan, 2006, 608 s., şəkilli. səh. 55-57*



**MAHMUDOV SABİT KƏRİM OĞLU (SABİT RƏHMAN) (1910-1970)-**1910-cu ildə Nuxada anadan olmuşdur. İbtidai təhsilini Nuxada almış, Bakı Müəllimlər Seminariyasını bitirmiş və üç il Nuxa nümunəvi şəhər məktəbində müəllimlik etmişdir**.** O, 1932-ci ildə Azərbaycan Pedaqoji İnstitutunu, 1936-1937-ci illərdə Moskvada Kinomatoqrafiya İnstitutunun ssenari kurslarında oxumuşdur.

1926-1927-ci illərdə «Molla Nəsrəddin» jurnalında «Şeyx Sabit» imzası ilə felyetonlar çap etdirən gənc Sabit institutu bitirdikdən sonra «Gənc işçi» qəzeti redaksiyasında ədəbi işçi, «İnqilab və mədəniyyət» jurnalı redaksiyasında məsul katib olmuşdur.[542]

Sabit Rəhman 1933–1934-cü illərdə «Mübariz» qəzeti redaksiyasında işləmiş, 1934-1936-cı illərdə Azərbaycan Dövlət Dram Teatrında ədəbi hissə müdiri, 1935-ci ildə eyni zamanda üzv olduğu Yazıçılar İttifaqında uşaq bölməsinin rəhbəri, 1937-1938-ci illərdə Bakı kinostudiyasında ssenari şöbəsinin müdiri, 1938-ci ildə Yazıçılar İttifaqında nəşr üzrə məsləhətçi, 1939-1940-cı illərdə C.Cabbarlı adına Teatr Muzeyində elmi işçi işləmişdir.

S.Rəhmanın 1931-ci ildə ilk hekayələr toplusu olan «Pozğun» əsəri, sonralar «Şirin bülbül», «Vəfasız», «Gənclik hekayələri», «Şirin arzular», «Xəyal plov» kitabları çap olunur. Yazıçıya ən çox şöhrət gətirən «Toy», «Xoşbəxtlər», «Aşnalar», «Aydınlıq», «Nişanlı qız», «Əliqulu evlənir», «Yalan», «Dirilər», «Küləklər» və s. komediyaları bu gün də teatr səhnələrində müvəffəqiyyətlə oynanılır.

S.Rəhman ssenarist idi. O «Arşın mal alan», «O olmasın, bu olsun», «Koroğlu», «Əhməd haradadır» filmlərinin ssenarisini, «Ulduz», «Hicran» musiqili komediyalarının librettosunu yazmışdır.

Müharibə illərində və müharibədən sonrakı dövrlərdə yazdığı «Bir sevincin tarixi», «Qohumlar», «Arzular», «Sevinc yaşları» və s. hekayələrində adamların mənəvi aləmi, müharbədən qayıtmış əsgərlərin taleyi və ailə-məişət məsələləri, «Nina» romanında Bakı fəhlələrinin mübarizəsi, «Böyük günlər» romanında müasir kənd həyatı təsvir olunmuşdur.

Böyük yumorist qələmini tərcüməçilikdə sınamış, V.Şekspir, K. Qodini, Ş.V. Molyer, N.V. Qoqoldan tərcümələr etmişdir.

S.Rəhman Mikayıl Müşfiq, Rəsul Rza və Mehdi Hüseynlə dostluq etmiş, H.Cavid, S.Vurğun, Mir Cəlal, A.İsgəndərov, Səid Rüstəmov, Şəmsi Bədəlbəyli, Ənvər Məmmədxanlı, Rza Təhmasib, İsmayıl Hidayətzadə, Qara Qarayev, Soltan Hacıbəyovla yaradıcılıq əlaqələri saxlamış, onlar S.Rəhmanın evində qonaq olmuşlar.[543]

***Sabit Rəhman 1970-ci ildə* Bakı şəhərində dünyasını dəyişmişdir.**

**Əsas işi:** *Şirin bülbül. Bakı,1932; Vəfasız. Bakı,1933; Gənclik hekayələri. Bakı,1934; Şirin arzular. Bakı,1936; Xəyalplov. Bakı,1938;* ***komediyaları - «****Toy» (1938), «Xoşbəxtlər» (1941), «Aşnalar» (1945, «Aydınlıq» (1949), «Nişanlı qız» (1953), «Əliqulu evlənir» (1961), «Yalan» (1965) «Dirilər», («Küləklər»,1967)*

***Onun haqqında:*** *ASE,VII c, Bakı, 1983, səh. 245; Şəki. Alim və Ziyalılar. Bakı: Elm, 2007, 428 s. (Tərtibçilər: Ələfsər Bəxtiyar oğlu Məmmədov, Fikrət Ramazan oğlu Xalıqov****).səh.246-250;***



S.Rəhmanın oğlu Mahmudov Emin Sabit oğlu (**EMİN SABİTOĞLU)** mahnı janrı sahəsində şöhrət qazanmış bəstəkarlardandır. O, 1937-ci ildə Bakıda anadan olmuşdur. 1944-cü ildə Azərbaycan Dövlət Konservatoriyası nəzdindəki onillik musiqi məktəbinə daxil olub. Məktəbdə professor Kövkəb Səfərəliyevadan, evdə Saveli Ayzendən dərs almışdır. Eminin bəstəkarlığa meyl etməsi və istedadı Qara Qarayevin diqqətindən yayınmamış və onu öz sinfinə qəbul etmişdir. Üç ildən sonra E.Sabitoğlu Q.Qarayevin məsləhəti ilə Moskva Dövlət Koservatoriyasında təhsilini əvvəlcə professor Y Şaporin, sonra D. Rodal-Levitskinin sinfində davam etdirmişdir. 1961-ci ildə təhsilini başa vuran gənc bəstəkar «Azərbaycanfilm» kinostudiyasında musiqi şöbəsində müdir, 1963-cü ildən Azərbaycan Dövlət Koservatoriyasında müəllim işləməyə başlayır.

Respublikanın əməkdar incəsənət xadimi Emin Sabitoğlu müxtəlif janrlarda musiqi əsərləri yaratmış, kinofilmlərə, teatr tamaşalarına musiqi bəstələmişdir. Atası Sabit Rəhmanın «Yalan», «Xoşbəxtlər», «Əliqulu evlənir», «Nişanlı qız», «Küləklər» «Hicran» komediyalarının da musiqisini Emin Sabitoğlu bəstələmişdir.

Emin Sabitoğlu kinonun ruhunu duyan bəstəkarlardandır. Musiqinin bir çox janrında dəyərli əsərlərin müəllifi kimi tanınan Emin Sabitoğlunun kinoda səslənən mahnıları və musiqiləri bu gün də dillər əzbəridir, müğənnilərin fərdi repertuarında geniş yer tutur. O, 600-dən çox mahnının, 9 musiqili komediyanın, 40-a yaxın filmdəki musiqilərin müəllifidir. Emin Sabitoğlunun istər teatr tamaşalarına («Hicran», «Xoşbəxtlər» və s.), istərsə də filmlərə yazdığı musiqiləri bədii əsərlərin təcəssümü olan zamanın ruhunu bizə çox dəqiqliklə hiss etdirə bilir, hadisələrin məğzini açır.

Bəstəkarın teatr və kino yaradıcılığında mahnı, estrada, simfoniya və digər janrlar yer alıb. Bu mənada bəstəkar yaradıcılığının çoxşaxəliliyi teatr və kinoda yaratdığı əsərlərinin fərqliliyində özünü göstərib. Məsələn, bəstəkar görkəmli dramaturq Sabit Rəhmanın «Hicran» (rejissor Ş.Bədəlbəyli) əsərinə bəstələdiyi musiqi kompozisiyası hadisələrin mənasını açır, personajların xarakterlərini

müəyyənləşdirir, ümumilikdə musiqili komediyanın bədii təsir qüvvələrini möhkəmləndirir. Ədəbi əsərlərin səhnə təcəssümündəki hadisələri müxtəlif çalarlarla dilləndirən uverturalar, aktyorların dialoqlarını müşayiət edən vokal musiqilər, monoloqları əvəzləyən ariyalar, hərəkət etüdlərini açıqlayan rəqslər vahid bəstəkar duyumu, istedadı ətrafında cəmlənib. Emin Sabitoğlunun kino musiqiləri də bədii komponentlərin dəyərli vasitəsi kimi həmişə milli kinomuza zənginlik gətirib. O, müxtəlif kinorejissorlarla (A.Babayev, F.Əliyev, R.Ocaqov, H.Seyidbəyli və s.) işləyib. Ən zəif süjet xəttinə malik olan filmlər belə, Emin Sabitoğlu musiqisinə görə emosional ekran poeziyası kimi baxımlıdır.

Azərbaycan kinosunun əsas dayaq sütunlarından biri olan musiqi estetikası Ü.Hacıbəyli, Q.Qarayev, F.Əmirov, T.Quliyev, A.Məlikov, X.Mirzəzadə, F.Qarayev, P.Bülbüloğlu və s. bəstəkarların bacarığı sayəsində filmlərin emosional dilini zənginləşdirib, geniş tamaşaçı auditoriyası toplanmasına şərait yaradıb. Emin Sabitoğlunun kino musiqisi filmlərdəki hadisələrə tamaşaçının daha çox ürəkdən təmas etməsinə, daxilən obrazlarla ünsiyyət qurmasına təkan verir. Onun bəstələrinin müşayiət etdiyi filmlər bitdikdən sonra da tamaşaçını öz emosional təsirində saxlayır.

Sovet dövründə çəkilən filmlərin ümumi kompozisiyası dramaturq, rejissor, bəstəkar ideyalarının vahid yaradıcılıq təntənəsi kimi cəmiyyətin ümumi maraq larına, mənəvi ehtiyaclarına cavab verməli, ekran yaradıcılığı bütünlüklə estetik dəyərlərin yüksəlişinə xidmət etməli idi. Bu mənada həmin illərdə çəkilən filmlərin bir çoxunda məhz istedadlı bəstəkar yaradıcılığı müəyyən texniki çatışmazlıqları kölgədə qoyurdu, filmlər həyat hadisələrinin səmimi təsviri kimi xarici tamaşaçıların diqqətini çəkirdi. Görkəmli kinorejissor H.Seyidbəylinin çəkdiyi «Bizim Cəbiş müəllim» filmində İkinci Dünya müharibəsi illərində arxa cəbhədəki insanların psixoloji sarsıntılarını, məhv olmuş gənclik, uşaqlıq təəssüratlarını sözsüz kadrlardakı lirik melodiyalarda belə hiss edirik, hadisələrin dərinliyinə varırıq.




Emin Sabitoğlunun peşəkar yaradıcılığı 40-a yaxın filmə uzunömürlü ekran həyatı bəxş edib. Bunlara «Gün keçdi» (rejissor A.Babayev), «Dədə Qorqud» (T.Tağızadə), «Dantenin yubileyi» (Ə.Əzimzadə) və s. filmləri nümunə göstərmək olar. Görkəmli kinorejissor Rasim Ocaqovla Emin Sabitoğlunun yaradıcılıq əlaqələri tamaşaçı «aclığını» qismən ödədi. Tamaşaçı müxtəlif janrlı ekran əsərlərindəki kadrların mənasını, obrazların xarakteristikasını məhz onun emosional ruhu, dili olan musiqiləri vasitəsi ilə daha

dərindən anladır, həyatın, insanlığın inkişafına mane olan neqativ halları («İstintaq», «Bağlı qapı» və s.) yekdilliklə qınayır. Bəstəkarın filmlərin əvvəlində səslənən musiqiləri filmin ideyasını anons edir, ekran hadisələrini yalnız müşayiət etmək yox, şərh etmək məqsədi daşıyır.

Rasim Ocaqov çəkdiyi filmlərin bir çoxunun musiqi taleyini Emin Sabitoğlu yaradıcılığına etibar etmişdi. Bunlardan «Bağlı qapı», «Həm ziyarət, həm ticarət», «Ad günü», «İstintaq», «Ölsəm… bağışla» və s. filmlərin adlarını çəkmək olar. Bu filmlərin musiqiləri, mahnıları («Bayatı», «Bir axşam» və s.) nəinki müğənnilərin fərdi repertuarlarında, həmçinin televiziya («Səni axtarıram») və teatr tamaşalarında uğurla istifadə edilib.

Emin Sabitoğlunun bütün kino musiqiləri dramaturq mədəniyyətini, intellektini, zəngin dünyagörüşünü, romantik dünyasını, bütünlükdə bədii əsərlərin səviyyəsini yüksək formada təqdim edir. Onun müxtəlif səpkili musiqiləri filmlərin mövzusu ilə paralel olaraq sosial problemləri təhlil edir, həyat hadisələrinin fəlsəfi dərinliklərini açıqlayır, kadraltı mənalara aydınlıq gətirir. Həmin musiqiləri bu gün də geniş tamaşaçı auditoriyası rəğbətlə dinləyir. Bu o deməkdir ki, hər evdə, hər məkanda Emin Sabitoğlunun nəfəsi duyulur və duyulacaq.

***Emin Sabit oğlu Mahmudov (Emin Sabitoğlu) 2000-ci ildə Bakıda vəfat etmişdir*.**

**Onun haqqında:** *"http://az. wikipedia.org/w/index.php?title=Emin_Sabito% C4%9 Flu&oldid = 1958720"; Şəki. Alim və Ziyalılar. Bakı: Elm, 2007, 428 s. (Tərtibçilər: Ələfsər Bəxtiyar oğlu Məmmədov, Fikrət Ramazan oğlu Xalıqov*), səh.246-250;



**MAHMUDOV YAQUB MİKAYIL OĞLU (1939)**

Yaqub Mahmudov 1939-cu il fevralın 10-da Şəki rayonunun Baş Göynük kəndində anadan olmuşdur. Azərbaycan Dövlət Univer sitetinin tarix fakültəsini bitirmişdir. 1956-cı ildən Balakən rayonunun Sarıbulaq kənd orta məktəbində müəllim işləmişdir. 1966-cı ildən Azərbaycan Sovet Ensiklopediyası redaksiya sında elmi redaktor, böyük elmi redaktor, redaksiya müdiri, baş redaktorun elmi işlər üzrə müavini, 1974-cü ildən Azərbaycan Dövlət Pedaqoji İnstitutunda baş müəllim, dosent, 1981-ci ildən Azərbaycan Dövlət Universitetində dosent, kafedra müdiri, tarix fakültəsi dekanının müavini, 1992-ci ildən Azərbaycan Respublikası Ali Attes tasiya Komissiyası sədrinin müavini, «Azərbaycan Ensiklopediyası» Nəşriyyat-Poliqrafiya Birliyinin baş direktoru vəzifələrində çalışmışdır. 1986-2004-cü illərdə Bakı Dövlət Universiteti tarix

fakültəsinin dekanı olmuşdur. 2004-cü ildən AMEA-nın Tarix İnstitutunun direktorudur.

Yeni Azərbaycan Partiyası Siyasi Şurasının üzvüdür.

İkinci çağırış Azərbaycan Respublikası Milli Məclisinin deputatı olmuşdur.

2005-ci il noyabrın 6-da 114 nömrəli Şəki kənd birinci seçki dairəsindən, 2010-cu ildən 113 № li Şəki şəhər seçki dairəsindən yenidən parlamentin deputatı seçilmişdir. Milli Məclisin sosial siyasət komitəsinin üzvüdür. Azərbaycan-Xorvatiya parlamentlərarası əlaqələr üzrə işçi qrupunun rəhbəri, Azərbaycan-İtaliya, Azərbaycan-Özbəkistan parlament lərarası əlaqələr üzrə işçi qruplarının üzvüdür. Parlamentlərarası İttifaqda Azərbaycan nümayəndə heyətinin üzvüdür.

2012-ci il mayın 25-də Azərbaycan Respublikasının elm sahəsində Dövlət mükafatının verilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı ilə ona Dövlət mükafatı verilmişdir.[2]

700-dən çox elmi əsərin və elmi-publisistik məqalənin müəllifidir. Rus və ingilis dillərini bilir.

Evlidir, 3 övladı var.

***Əsas işi:***

- Azərbaycanın Avropa ölkələri ilə əlaqələri. Ağqoyunlu dövrü (XV əsrin II yarısı). Bakı: 1986
- Ağqoyunlu və Səfəvi dövlətlərinin Avropa ölkələri ilə qarşılıqlı əlaqələri (XV əsrin II yarısı – XVII əsrin əvvəllləri). Bakı: 1991 (rus dilində)
- Azərbaycan diplomatiyası. Bakı: 1996 (təkrar nəşr – 2007)
- Azərbaycan: qısa dövlətçilik tarixi. İslamabad: 2005. Bakı: 2005 (Azərbaycan, ingilis və rus dillərində)
- Qarabağ: real tarix, faktlar, sənədlər. Bakı: 2005 (Azərbaycan, ingilis, ərəb, fransız, alman və rus dillərində)
- Naxçıvan: tarixi və abidələri. Bakı: 2007 (Azərbaycan və ingilis dillərində)



MƏMMƏDOV AYDIN MİRSALEH OĞLU **(1944 -1991)** **[544]** 16 yanvar 1944-cü ildə Nuxa rayonunun Kiş kəndində anadan olmuşdur. Orta təhsilini qızıl medalla başa vuran gənc Aydın 1960-cı ildə Bakı Dövlət Universitetinin filologiya fakültəsinə daxil olmuş, ali məktəbi fərqlənmə diplomu ilə bitirmiş, 1980-ci ildə filologiya elmləri namizədi alimlik dərəcəsi almışdır.

A.Məmmədov 1985-1987-ci illərdə Respublika EA-nın ədəbiyyat incəsənət bölməsində elmi katib, sonra «Советская тюркология»

jurnalında baş redaktorun birinci müavini, 1989-cu ildə isə Bədii Tərcümə Ədəbi Mərkəzinin sədri olmuşdur.

A. Məmmədov 1976-1989-cu illərdə ədəbi tənqid sahəsində fəaliyyət göstərmişdir. Onun ədəbi -tənqidi qeydləri, dialoq və mükalimələri



***Şəkildə soldan sağa:***
***Kamal Abdullayev, Oljas Süleymenov, Aydın Məmmədov, Kamil Vəliyev***

1988-ci ildə nəşr edilmiş «Sözümüz eşidilənədək» adlı kitabda toplanmışdır.

Aydın bədii tərcümə sahəsində qələmini sınamış, B. Kuznetsovun «Eynşteyn və Dostayevski», B.Yıldızın «Kərbəla» əsərlərini ana dilimizə çevirmişdir.

1989-cu ildə Aydın Məmmədov siyasi fəaliyyətin daha da genişləndirir, Azərbaycanın ərazi bötövlüyü və müstəqilliyi uğrunda mübarizəyə qoşulur.

Tənqidçi, ədəbiyyatşünas, Azərbaycan Respublikası Ali Sovetinin deputatı (1990) olan A.Məmmədov elmi yaradıcılıqla yanaşı, ictimai xadim kimi də fəal iş aparırdı. XX əsrin sonlarında başlayan mitinqlərdəki nitqləri, Moskvada, Türkiyədə, İranda, Fransadakı çıxışları onun xalq üçün döyünən ürəyinin arzuları idi. Əslində onun yazısını oxuyanlar Azərbaycanın mənzərəsi ilə tanış olurdular. B.Vahabzadənin təbirincə desək, «Aydının ağlı və istedadı Azərbaycanın milli sərvəti idi».

Dilçi-türkoloq A.Məmmədov Azərbaycan dilini tarixi-müqayisəli şəkildə öyrənməyi tövsiyyə edirdi. O, yaxşı bilirdi ki, çiyinlərində türkologiya adlanan elmin ağır yükü vardır. Bu yükü ayrı-ayrılıqda çəkmək heç kəsin qüvvəsi daxilində deyildir. Onu görkəmli türkoloq Ədhəm Tenişevlə, Oljas Süleymenovla, bir çox Anadolu türkoloqları ilə, o cümlədən Azərbaycan türkoloqlarından F. Zeynalovla, T.Hacıyevlə, K.Vəliyevlə, F.Cəlilovla yaxınlaşdıran səbəblərdən biri elə bu idi.

Ömrünün təxminən son onilliyini bütünlüklə ictimai-siyasi hadisələrə həsr edən A.Məmmədov **1988**-ci ilin fevralından başlayan Azərbaycan Xalq Hərəkatının ön sıralarında dayanmışdır. Onu həmişə tətil edən fəhlələrin, yerli ağalara etiraz edən kəndlilərin, tələbələrin, ziyalıların içərisində, özü də ən narahat, ən ağrılı anlarda görmək mümkün idi. Ayıq siyasətçi və ardıcıl demokrat olan Aydının hadisələrə öz şəxsi münasibəti və onlara öz şəxsi yozum üslubu vardı. Güclü məntiqə malik alovlu natiq Aydın Məmmədov minlərcə insanı arxasınca aparmağı bacarırdı. Xalqın sevgisini qazanmış, millət vəkili seçilmişdir. O, milli birlik yaratmaq, azadlıq və demokratiya uğrunda hərəkatımızı düz yolla aparmaq üçün ciddi işlər görürdü. Respublika Ali Sovetinin millətlərarası münasibətlər üzrə daimi komissiyasının sədri idi. **Qarabağa Xalq Yardımı Komitəsinin** sədr müavini olmuşdur. **Azərbaycan Yazıçılar Birliyi** katibliyinin heyətinə seçilmişdir.

Aydının fikirləri özü üçün də, xalq üçün də aydın idi. O, xalqının azad, müstəqil, firavan yaşamasını, qəsbkar əllərin Azərbaycan torpağından qoparılmasını istəyirdi. Onu bir sual həmişə düşündürürdü: küçədə rastlaşdığı, meydanlarda seyr etdiyi, efirdə dinlədiyi insanlar hansı amal uğrunda mübarizə apardıqlarını anlayırlarmı. Millətin bütövlüyü, özünüdərki qarşıdakı sabahın aydınlığı, yolları Aydını daim düşündürürdü. Qorxurdu ki, ürəyindəki arzularını həyata keçirməyə ömrü çatmasın. Özünün yazdığı kimi, bir gün deyəcəklər: «…gəlmişəm, çatmısan, sən də artıq mənzil başındasan». Belə də oldu. 1991-ci ilin aprelin 19-da avtomobil qəzasında faciəli sürətdə dünyasını dəyişdi. Dünyaya göz açdığı Kiş kəndində torpağa tapşırıldı. Mitinqlərdə, Ali Sovetin iclaslarındakı çıxışlarını, qəzet səhifələrindəki yazılarını səbirsizliklə gözləyən xalq onu son mənzilə yola saldı. Təskinlik yalnız onda idi ki, Aydının tribunadakı yeri ürəklərə köçmüşdü.

Müasirləri A.Məmmədovun elmi, ictimai və vətəndaşlıq fəaliyyətini yüksək qiymətləndirmişlər. «Torpaq və dil faktına Aydın vahid milli etnik qövm, ümumtürk tarixi və taleyi miqyasında müştərək amil və dəyər kimi qiymət və təhlil verirdi»(Y.Qarayev). Müasirləri inanırdı ki, türk xalqlarının önündə gedən Azərbaycan, Azərbaycan xalqının önündə gedənlərdən biri də Aydın» (O.Süleymenov) olacaq. «Aydını türk xalqlarına yaxınlaşdıran onun qan yaddaşıdır. Və bu qan yaddaşından süzülüb gələnlər röya deyil». (Lev Qumilyov).

Azərbaycanın böyük tənqidçi alimi Yaşar Qarayev Aydın Məmmədov haqqında yazmışdır: «Universal humanitar hazırlıq, təhlil və proqnoz fəhmi, həm tarixi-coğrafi, həm də çağdaş, cari yaxını bir yerdə görən, nişan verən fasiləsiz

ağıl və baş, sinir və intellekt fəaliyyətini, impulsu birinci qəbul etmək, kompüterdən də sürətli beyin hesablamaları apramaq- Aydın belə məqamlardan yaranan, üst-üstə cəm olan qəribə möcüzə, ədəbi-elmi fenomen idi».

**Əsas işi:** *Sözümüz eşidilənədək. Bakı, 1993;*

**Onun haqqında:** *İsa İsmayılzadə. Ruhunuz şad olsun, ölümdaşlar. «Yeni fikir», 18 aprel, 1992; V.Aslan. «Aydın» poeması. Bakı, 1993; Y.Qarayev. Epitafiya, yaxud baş daşına oxunan mahnı… «Ədəbiyat qəzeti», 1994, 23 aprel; Akəm Məmmədzadə.«Aydın» poeması haqqında bir neçə söz. «Şəki» qəzeti, 1994, 13 aprel; Əmrahov M.İ. «XX əsrdə Azərbaycanda milli-azadlıq hərəkatı». Dərslik. Bakı, 2009, 370 səh. səh.336-337;*



**MUSAYEVA TAMİLLA HƏŞİM QIZI** 1931-ci il dekabrın 31-də Nuxada anadan olmuşdur. 1949-cu ildə Bakıdakı 46 nömrəli məktəbi bitirən Tamilla xanım Azərbaycan Dövlət Universitetinin tarix fakültəsinə daxil olmuş və 1954-cü ildə universiteti fərqlənmə diplomu ilə bitirmiş, AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunda əmək fəaliyyətinə başlamışdır.

T.Musayeva 1962-ci ildə namizədlik, 1980-ci ildə doktorluq dissertasiyası müdafiə etmiş, 1992-ci ildə ona «professor» elmi adı verilmişdir. «İnqilab və Azərbaycanda xalq maarifi» (rus dilində) monoqrafiyasına görə 1984-cü ildə Azərbaycan SSR Dövlət Mükafatı laureatı olmuş, 2005-ci ildə əməkdar elm xadimi fəxri adına layiq görülmüşdür.

T.Musayevanın elmi axtarışlarının əsas istiqamətlərini Azərbaycanda xalq təhsilinin inkişaf tarixi təşkil edir. O, respublikada birincilərdən olaraq savadsızlıqla mübarizə, azərbaycanlı qadınların təlimi və təhsili kimi həlledici problemin araşdırılması ilə məşğul olmuş, onun tədqiqatlarında XX əsrin 20-30-cu illərində Azərbaycanda həyata keçirilən əlifba islahatı, yazı problemləri axtarışlarının əsas istiqamətlərini təşkil etmişdir.

Tamilla xanım olduqca fədakar tarixçidir. O, üççildlik «Azərbaycan tarixi» nin (Bakı, 1963, III c, I-II hissə) müəlliflərindən, 2000-ci ildə çap olunmuş «Azərbaycan tarixi» nin VI cildinin müəllifi və redaksiya üzvlərindən biridir.

Tamilla Musayeva 100-dən artıq elmi əsərin, o cümlədən 4 monoqrafiyanın müəllifidir. Beynəlxalq və respublika konfranslarının, simpoziumların və sessiyaların iştirakçısı olan alimin rəhbərliyi altında 12 nəfər namizədlik, 3 nəfər doktorluq dissertasiyası müdafiə etmişdir. O, 27 namizədlik və 12 doktorluq dissertasiyasının opponenti olmuşdur.

T.Musayeva bir sıra ümumiləşdirilmiş əsərlərin yazılmasında iştirak etmişdir. O, 1917-ci ildən 1941-ci illədək olan dövrü əhatə edən, 1975 və 1976-cı illərdə Moskvada nəşr edilmiş «SSRİ-də mədəni həyat» xronologiyasının I və II cildlərinin hazırlanmasında tərtibçi kimi iştirak etmişdir.

Mədəniyyət məsələləri ilə yanaşı, T.Musayeva kənd təsərrüfatı, kolxoz quruculuğu, kolxoz təsərrüfatının texniki cəhətdən yenidən qurulması məsələlərini də tədqiq etmişdir. O, «1927-1929-cu illərdə Azərbaycanda kənd təsərrüfatının kollektivləşdirilməsi» (Bakı, 1982) sənədlər və materiallar toplusunun tərtibçilərindən biri və toplunun «Giriş» inin müəllifidir. T.Musayeva 2003-cü ildə nəşr olunmuş «Ermənilərin Azərbaycan torpaqlarında törətdikləri əməllər barədə tarixi həqiqətlər» adlı çox əhəmiyyətli əsərin tərtibçi redaktoru və müəlliflərindən, 2005-ci ildə nəşr olunmuş «Azərbaycan Milli Elmlər Akademiyasının yaradılması və elmi ziyalı kadrların formalaşması yollarında (1920-1945-ci illər)» adlı monoqrafiyanın və Birinci Türkoloji qurultayının 80 illiyinə həsr olunmuş «Azərbaycan xalqının əlifbasının inkişafı yolunda mühüm mərhələ» adlı 2006-cı ildə çap olunmuş monoqrafiyanın həmmüəllifidir.

T.Musayeva hazırda «Azərbaycan mədəniyyəti əsrlərin ayrıcında (XIX əsrin sonu-XX əsrin birinci yarısı)» adlı monoqrafiyasını çapa hazırlayır.

Tarix üzrə elmlər doktoru, professor, əməkdar elm xadimi T.H.Musayeva hazırda AMEA-nın A. Bakıxanov adına Tarix İnstitutunda əmək fəaliyyətini davam etdirir.

**Əsas işi:** *Мусаева Т.А. Революция и народное образование в Азербайджане. Баку, 1980; Борьба за ликвидацию неграмотности в Азербайджане (1928-1932 гг.). 40-летие Азербайджанской Советский социалистической Республики. Баку, 1960*

**Onun haqqında:** *Şəki. Alim və Ziyalılar. Bakı: Elm, 2007, 428 s. (Tərtibçilər: Ələfsər Bəxtiyar oğlu Məmmədov, Fikrət Ramazan oğlu Xalıqov), səh. 309-311;*



**MUSTAFAZADƏ VAQİF ƏZİZ OĞLU (1940-1979)** 1940-cı ilə anadan olmuşdur. O, 1963-cü ildə A.Zeynallı adına Bakı Musiqi Məktəbini bitirmişdir. O, 1969-1970-ci illərdə Azərbaycan Dövlət Estrada Orkestrinin solisti-pianisti olmuş, 1970-ci ildə «Leyli» adlı ilk qadın vokal kvartetinə, 1971-1977-ci illərdə «Sevil» vokal-instrumental ansamblına, 1977-1979-cu illərdə isə «Muğam» instrumental ansamblına rəhbərlik etmişdir.

V.Mustafazadə ilk dəfə olaraq Şərq muğamını Qərb dinləyicisinə yeni caz dilində çatdırmışdır. O, «Tallin-66», «Tbilisi-78», Ümumittifaq caz festival larının iştirakçısı olmuş, bəstəkarların Monte Karloda VIII Beynəlxalq caz müsabiqəsində (Monaka, 1978) birinci mükafata layiq görülmüşdür. «Muğam» simfoniyasının müəllifi olan Vaqif Mustafazadə 1979-cu ildə Azərbaycanın əməkdar artisti fəxri adına, 1982-ci ildə ölümündən sonra Azərbaycan SSR Dövlət Mükafatına layiq görülmüşdür.

**Mustafazadə Vaqif Əziz oğlu 1979-cu il dekabr ayının 16-da vəfat etmişdir.**

**Onun haqqında:** *Ənvər Mete. O torpağın övladları. Bakı: Nurlan, 2006, 608 s, şəkilli. s,50-51;511-514;*



**OSMANLI İSMAYIL OSMAN OĞLU (1902-1979).** Realist aktyor məktəbinin görkəmli nümayəndə lərindən biri, xarakterik epizod rolların məşhur ifaçısı, şirəli və duzlu komediya ustası İsmayıl Osman oğlu Osmanlı 24 aprel 1902-ci ildə Nuxada kasıb ailədə doğulub. Keçəçi ailəsində dünyaya göz açan İsmayıl ilk təhsilini Nuxada «Vətən» məktəbində almışdır. 11 yaşında anasını itirən balaca İsmayıl gah əmisinin, gah dayısının himayəsində yaşamağa məcbur olur, əmisi onu 1914-cü ildə Nuxa rus məktəbinə qoysa da, maddi vəziyyətlə əlaqədar oxuya bilmir. Teatra olan həvəsi İ.Osmanlını Nuxada açılmış dram dərnəyinə gətirir. O zamanlar mədəniyyət evinin müdiri olan Baxşəli Əfəndiyevin və dram dərnəyinə tez-tez dəvət olunan Mövsüm Sənaninin İ.Osmanlının yetişməsində böyük zəhməti olmuşdur.

1923-cü ildə İ.Osmanlı Gəncə dram dərnəyinə qəbul olunur. Gündüzlər işləyən İ.Osmanlı gecələr aktyorluqla məşğul olur, tezliklə dərnəyin rəhbəri seçilir və kollektivdə rejissor kimi fəaliyyət göstərir. Həmin dövrdə Gəncə dram dərnəyində fəaliyyət göstərən Adil İsgəndərovla İ.Osmanlı arasında səmimi münasibətlər yaranır.

İ.Osmanlının yaradıcı sənətkar kimi yetişməsində Tiflis Azərbaycan Teatrının böyük rolu olmuşdur. Görkəmli sənətkar 1929-cu ildən ömrünün sonuna qədər Azərbaycan Akademik Dövlət Milli Dram Teatrında işləmişdir.

İsmayıl Osmanlı dram və faciə janrında xarakterik obrazların, dramatik pyeslərdə yumorlu surətlərin, komediyalarda məsxərəli və satirik rolların ifaçısı olub. Əsas rolları bunlardır: Keçəl Aslan, Fon Hols, Şaliko («Xanlar», «İnsan» və «Vaqif», Səməd Vurğun), Əmrah («Pəri cadu», Əbdürrəhim bəy Haqverdiyev), Şeyx Hadi, Vali, Şakro («Şeyx Sənan», «Səyavuş» və «Knyaz», Hüseyn Cavid), Munis, Kərim Rəhimli («Nizami» və «Alov», Mehdi Hüseyn), Əliş («Qatır Məmməd», Zeynal Xəlil), Nikita Pavloviç («Qızıl çeşmə», Qurban Musayev), Məşədi Cəfər («Dağılan tifaq», Əbdürrəhim bəy Haqverdiyev), Mirzə Qərənfil, Zakir, Əhməd bəy, Xəlil, Qasım («Xoşbəxtlər», «Aydınlıq», «Küləklər», «Əliqulu evlənir» və «Nişanlı qız», Sabit Rəhman), Mirzə Heydərqulu, Şəkinski, («Həyat» və «Kəndzi qızı», Mirzə İbrahimov), Koxa Məmməd («Qaçaq Nəbi», Süleyman Rüstəm), Məşədi Oruc, Hacı Naib («Ölülər» və «Dəli yığıncağı», Cəlil Məmməd-

quluzadə), Xaspolad, Mirzə Cavad («Oqtay Eloğlu» və «Aydın», Cəfər Cabbarlı), Kefli Bəşir («Bahar suları», İlyas Əfəndiyev), Cəbi («Hacı Qəmbər», Nəcəf bəy Vəzirov), Səfər bəy («Hacı Qara», Mirzə Fətəli Axundzadə), Əşrəf («Türkiyədə», Nazim Hikmət), İsidor Cakeli («Darıxma, ana!», Nodar Dumbadze), Aleksandrov («Canlı meyit», Lev Tolstoy), General Berqoyn («Şəxsi iş», Aleksandr Şteyn), Baş senator, Feste, Gilderstern («Otello», «On ikinci gecə» və «Hamlet», Vilyam Şekspir), Krutitski, Tixon və Karandışev («Müdriklər», «Tufan» və «Cehizsiz qız», Aleksandr Ostrovski).

İsmayıl Osmanlı «Azərbaycanfilm»in istehsal etdiyi «Kəndlilər» (Daxili işlər naziri), «Bir məhəlləli iki oğlan» (Mahmud), «O olmasın, bu olsun» (Rza bəy), «Həqiqi dost» (Usta Şirəli), «Yenilməz batalyon» (Yusif), «Mən ki gözəl deyildim» (Poçt müdiri), «26-lar» (Şahbazov), «Ulduzlar sonmür» (Hacı Zeynalabdin Tağıyev), «Nəsimi» (Nəimi), «Tütək səsi» (Poçtalyon), «Yeddi oğul istərəm» (Kələntər) və sair filmlərdə çəkilib. «Bəxtiyar» da restoran xidmətçisi, «Bir məhəlləli iki oğlan»da Mahmud, «O olmasın, bu olsun» da Rza bəy, «Yeddi oğul istərəm» də Kələntər dayı, «Ulduzlar sönmür» də Hacı Zeynalabdin Tağıyev, «Mən ki gözəl deyildim» də Şərif kişi, «Dəli Kür» də faytonçü Məmmədəli obrazları sənətkara xalq məhəbbəti qazandırmışdır.

İsmayıl Osmanlı, ilk növbədə epizodik xarakterlər ustasıydı. Ən kiçik epizodda da səhnəyə çıxanda salona canlılıq, xoş ovqat və çox cazibəli, könül oxşayan səmimiyyət bəxş edirdi. Xalq gülüşünün bütün vasitələrindən səmərəli və yaradıcılıqla istifadə edirdi. Obrazın danışığındakı sözlərin yumor, satira və məsxərə şirəsini hərəkətlərlə paralel verməklə rola psixoloji təsir, həyatilik və təbiilik gətirirdi. Çeşidli ifadə vasitələrini obrazın dramatizmınə sərf edir, yaradıcılığının mayasında olan təbii yumoru inandırıcı səmimiyyətlə tamaşaçıya çatdırmağı ustalıqla bacarırdı.

İsmayıl Osmanlı yaradıcı aktyor idi. C.Cabbarlının «Solğun çiçəklər»indəki Heydərqulu, S.Rəhmanın «Toy», «Xoşbəxtlər». «Əliqulu evlənir» tamaşalarındakı Surxay, Mirzə Qərənfil, Xəlil, Ə.B.Haqverdiyevin «Pəri cadu» sundakı Əmrah, C.Məmmədquluzadənin «Ölülər», «Dəli yığıncağı»ndakı Məşədi Oruc, Hacı Mail, V.Şekspirin «Kral Lir»indəki Təlxək, N.Dumbadzenin «Darıxma ana»sındakı İsidor və s. bir-birindən fərqli digər obrazlar tamaşaçıların yaddaşından silinməmişdir.

İsmayıl Osmanlı 4 may 1940-cı ildə «Azərbaycan SSR əməkdar artisti», 21 iyul 1949-cu ildə «Azərbaycan SSR xalq artisti», 1 avqust 1974-cü ildə «SSRİ xalq artisti» fəxri adlarına layiq görülmüş, bir çox orden və medallarla təltif olunmuşdur.

**İsmayıl Osman oğlu Osmanlı 1978-ci il iyunun 22-də dünyasını dəyişmişdir.**

**Onunhaqqında:** *http://az.wikipedia.org/w/index.php?title=%C4%B0smay% C4%B1l_ Osmanl % C4% B1&oldid=1773646"*

**RƏSULOV MƏCİD LƏTİF OĞLU (1916-1993)** 1916-cı ildə Nuxa şəhərində anadan olmuşdur. 1934-cü ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun riyaziyyat fakültəsinə qəbul olunmuş, 1938-ci ildə institutu birinci dərəcəli diplomla bitirərək aspiranturaya qəbul olunmuşdur.



M.L.Rəsulov İkinci Dünya müharibəsinin iştirakçısı olmuşdur. 1939-cu ildə ordu sıralarına xidmətə çağırılan M.Rəsulov əvvəlcə artilleriya alayının hesablayıcı bölməsinin komandiri vəzifəsini tutmuş, 1941-ci ilin əvvəllərində yaralanmış, müalicədən sonra Qafqaz cəbhəsinə getmişdir. Qvardiya leytenantı rütbəsini alan döyüşçü M.Rəsulov 10-cu qvardiya briqadasının xüsusi diviziyasının kəşfiyyat vzvodu komandiri olmuşdur. 1942-ci ilin sonunda Qroznı şəhərində 223-cü Azərbaycan atıcı diviziyasının təşkili ilə əlaqədar olaraq, Qafqaz cəbhəsinin ön xəttindən geri çağırılmış, bu diviziyanın artilleriya alayında ştab batareyası komandirinin müavini, sonra komandiri olmuş, baş leytenant rütbəsi almışdır. M.Rəsulov bu vəzifədə müharibə qurtaranadək qalmışdır.

1945-ci ildə ordudan tərxis olunan M.Rəsulov Bakı Dövlət Universitetinin aspiranturasına bərpa olunmuş, elmi rəhbəri Y.V. Lopatinskinin Lvov şəhərinə köçməsi ilə əlaqədar olaraq 1946-cı ilin sentyabrında Ukrayna EA Lvov filialının aspiranturasına keçmiş, burada namizədlik dissertasiyası yazmış, 1949-cu ilin əvvəllərində Bakıda, BDU-nun mexanika-riyaziyyat fakültəsinin Elmi şurasında müdafiə etmişdir. 1953-cü ilə qədər Bakıda işləyən gənc alim M.Rəsulov 1953-cü ildə yenidən Lvov Universitetinin dəvətinə əsasən oraya köçmüş, doktorluq dissertasiyası üzərində işləmiş və SSRİ EA Riyaziyyat İnstitutunda doktorluq dissertasiyası müdafiə etmişdir.

Dissertasiya müdafiəsindən sonra M.Rəsulov yenidən Bakıya qayıtmışdır, universitetdə Ümumi riyaziyyat kafedrasının müdiri vəzifəsini tutmuşdur.

Məcid Rəsulovun tədqiqatları funksional analiz və differensial tənliklər sahəsidir. Öz-özünə qoşma olmayan operatorların spektral funksiyası anlayışlarını vermiş, Banax fəzalarında funksionalın yeganə davamı haqqında teorem isbat etmiş, xətti differensial operatorların normallıq şərtini tapmışdır. Elastiklik nəzəriyyəsinin kompleks parametrdən asılı olan və özlü plastik mühitin hərəkət tənlikləri sistemlərinin fundamental matrislərini sonlu şəkildə qurmuşdur. Dəyişən əmsallı xətti differensial tənliyin həlli üçün çıxıqlar və kontur inteqral üsullarını, habelə tənlik üçün spektral məsələ həllinin çıxıqlarına nəzərən funksiyaların təkrar ayrılış düsturunu, qarışıq məsələlərin həlli üçün çıxıq və kontur inteqral düsturlarını ilk dəfə M.Rəsulov vermişdir.

M.Rəsulovun tədqiqatlarının yekunu 1964-cü ildə «Наука» nəşriyyatı tərəfindən çap olunmuş «Метод контурного интеграла» monoqrafiyasında tapmışdır. Bu kitab sonralar Londonun sifarişi ilə ingilis dilinə tərcümə olumuş,

Hollandiyada və ABŞ-da yüksək tirajla çap olunmuşdur. M.Rəsulovun təklif etdiyi üsullardan Moskva, Sankt-Peterburq, Minsk, Sibir, Ural və s. elm mərkəzlərində çalışan alimlər istifadə etmişlər.

M.Rəsulovun 1975-ci ildə çapdan çıxan «Primenenie metoda konturnoqo inteqrala» və 1989-cu ildə nəşr olunan «Primenenie vıçetnoqo metoda k reşeniö zadaç differenüialnıx uravneniy» monoqrafiyaları elm adamları tərəfindən rəğbətlə qarşılanmıhdır. 80-dən çox elmi əsərin müəllifi, SSRİ EA-nın məruzələrində 25 məqaləsi çap olunan M.Rəsulov Ümumittifaq riyaziyyat qurultayının (Moskva,1956), beynəlxalq konqreslərin (Moskva, 1966, Fransa-Nitsa, 1970) iştirkçısı olmuşdur. Bir çox yerli və xarici jurnalların redaksiya üzvü olan M.Rəsulov 1968-ci ildə Azərbaycan EA-nın müxbir üzvü, 1983-cü ildə həqiqi üzvü seçilmişdir.

Məcid Rəsulovun tələbəsi Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü Y. Məmmədov hazırda Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektorudur.

***Fizika-riyaziyyat üzrə elmlər doktoru, professor, əməkdar elm xadimi, akademik Məcid Lətif oğlu Rəsulov 1993-cü ildə dünyasını dəyişmişdir***.

**Əsas işi:** *Метод контурного интеграла. М., 1964; Применение метода контурного интеграла. М., 1975; Применение вычетного метода к решению задач дифференциалных уравнений.М.: 1989;*

**Onun haqqında:** *Епугин Н.П. и др. Меджид Лятифович Расулов (к 60 летию со дня рождения). «Дифференциальные уровнения», т. 12, 1976, № 7; АСЕ, ВЫЫ ъ, сящ. 137-138;*



**SƏDRƏDDİNBƏYOV İSMAYIL BƏY (NAKAM) DƏRVİŞ MƏHƏMMƏD OĞLU (1829-1906).** XIX əsr və XX əsrin əvvəllərində Azərbaycan milli-bədii fikrinin səciyyəvi xüsusiyyətlərini qabarıq ifadə edən regionlardan biri də Nuxa (Şəki) ədəbi mühiti idi.

XVIII-XIX əsrlərdə Nuxada Məhəmməd Hüseyn xan Müştaq, şair Nəbi, Süleyman, M.F. Axundov, nuxalı Xəstə Qasım, Kərim ağa Fateh, Mustafa Şuxi, Zövqi, Hüzni, Dəli Bəbir, Molla Məhəmməd, Molla Qasım Zakir, Hacı Rəsul, İbrahim əfəndi Nicati, Hacı Məhəmməd əfəndi Nafe, Xəstə Qədir Məhəmməd Səməndüz, Molla İbrahim Dodui, İsmayıl bəy Nakam kimi söz sərrafları yaşayıb-yaratmışlar. Bunların sırasında **Nakam** yardıcılıq fondunun həcminə və forma-məzmun xüsusiyyətlərinə görə **İsmayıl bəy Nakam** başqalarından fərqlənir.

İ.S.Nakam 1829-cu ildə Şəkinin «Sarı torpaq» məhəlləsində Dərviş Məhəmməd ağanın ailəsində dünyaya göz açmışdır. Babası Hacı Sədrəddin bəy

XVIII əsrin sonlarında Şamaxıdan köçərək Şəkiyə gəlmiş, şəhərdə xeyriyyəçiliklə məşğul olumşdur.

O, Nuxa əhalisinin suya olan tələbatını ödəmək üçün öz hesabından su xətti çəkdirmiş və «Sarı torpaq» məhəlləsində məscid tikdirmişdir.

Nakamın atası Dərviş Məhəmməd ağa şair təbiətli şəxs olmuş, Şərq ölkələrini səyahət etmiş, «Fani» təxəllüsü ilə bir sıra şeirlər yazmışdır.[545]

Nakamın əsil adı *İsmayıl* olmuş, bəy ailəsinə mənsub olduğu üçün **İsmayıl bəy** kimi tanınmışdır. Lakin bir sıra tədqiqatçılar (Əbdül Məbud Behcet, Baxşəli Axundov) şairin adını *İsmi bəy* kimi qeyd etmişlər.

Nakam varlı ailədə doğulub tərbiyənləndiyi üçün xüsusi təhsil almışdır. Ərəb və fars dillərini mükəmməl bilmişdir. İki il yarım şəhər məktəbində rus dilində təhsil alsa da, qaranlıq mühitin təsiri altında məktəbi buraxmışdır. Lakin fasiləsiz şəxsi təhsil sayəsində tarix, ədəbiyyat, tibb, dinə dair kitabları lazımınca mütaliə etmişdir. Şair dövrünün görkəmli siyasi və ədəbi şəxsiyyətləri ilə, xüsusilə Hacı Zeynalabdin Tağıyev, M.F. Axundov, Seyid Əzim Şirvani, Səid və Cəlal Ünsizadə qardaşları ilə dostluq münasibətləri saxlamışdır. «Məclisi-üns» ədəbi məclisləri ilə sıx əlaqə yaradaraq Xurşidbanu Natəvan və Kərim ağa Fəna ilə məktublaşmışdır.

İsmayıl bəyin «Nakam» təxəllüsü ilə şeirlər yazması ömrünün məşəqqətləri ilə bağlı olmuşdur. Şairi tanıyanların xatirələrindən alınan məlumata görə, həyat yoldaşı Fatma xanımı gənc yaşlarından itirməsi və övladsız olması şairi sonsuz kədərləndirmişdir.

İsmayıl bəy Nakam 1906-cı ildə xərçəng xəstəliyindən vəfat etmiş və Nuxanın qədim qəbiristanlıqlarından olan ***Xoçih*** qəbiristanlığında dəfn olunmuşdur.

İsmayıl bəy Nakam XIX əsr romantik ədəbiyyatının görkəmli nümayəndəsi kimi tanınmış, yaradıcılığını klassik üslubda davam etdirərək lirik və epik əsərlərində dahi Nizami və Füzuli ənənələrini davam etdirmişdir. Şairin ümumi yaradıcılığı 20 min beytdən ibarətdir ki, bunun 12 min beytini lirik şeirləri təşkil edir. Lirik şeirlər sırasında müxəmməs, müsəddəs, təxmis, tərkibənd, tərcibənd, müləmmə, qəsidə, müsəmməm, qitə kimi klassik şeir janrları vardır.

İsmayıl bəy Nakamın ədəbiyyat tarixmizdəki yerini möhkəmlən dirməyə haqq verən əsas amillərdən biri onun epik əsərləridir. O, 1897-ci ildə Nizami və Füzulinin «Leyli və Məcnun» poemalarının təsiri altında «Dastani-Məcnun və Leyli», Nizaminin «Xosrov və Şirin» poemasının təsiri altında 1898-ci ildə «Dastani-Fərhad və Şirin», həmçinin Nizaminin «Sirlər xəzinəsi» poemasının təsiri altında 1904-cü ildə «Gəncineyi-ədəb» poemasını qələmə almışdır. [546] Hazırda M.Füzuli adına Respublika Əlyazmalar İnstitutunda şairin qeyd olunan əsərləri ilə yanaşı «Divani-bədii», «Xəyalati-pərişan» adlı divanları da saxlanılır.[547]

İ.Nakam XIX əsr Azərbaycan şeirində geniş tanınmamışdır. Sovet ideologiyasının daşıyıcıları olan bəzi tədqiqatçılar şairin dilinin ağır olmasına görə onu kəskin tənqid etmiş, bununla da sanki onun əsərlərinin yayılmasının

qarşısına səd çəkmişlər. Ancaq bir sıra tədqiqatçılar (S.Əfəndiyev, Əliabbas Münzib, Yusif Piriyev) şairin yaradıcılığının bədii dəyərini yüksək qiymətləndirərək Nizami və Füzuli ədəbi irsinin layiqli davamçısı hesab etmişlər.

XX əsrin sonlarında əldə edilən tarixi müstəqillikdən sonra ədəbiyyat tarixinin qaranlıq səhifələrini yenidən nəzərdən keçirməyə imkan yarandığından İ.Nakam irsinin araşdırılmasına başlanmış, AMİ-nin Şəki filialının müəllimi Kamil Adışirinov şairin maraqlı, zəngin və məşəqqətli həyat və yaradıcılıq yolunu əks etdirən «İsmayıl bəy Nakam: həyat və bədii yaradıcılığı» adlı monoqrafiyasını 2006-cı ildə nəşr etdirmişdir.

***Əsas işi:*** *Nakam. Seçmə parçalar (tərtib edəni Əliabbas Münzib). Bakı: Azərnəşr,1928; Nakam. Divan əlyazması.-M.58.№11561, vərəq 36; Nakam. Divan əlyazması.-M.217.№7770, vərəq 20; Nakam. Divan əlyazması.-M.40. №9086, vərəq 118-194;*

***Onun haqqında****: Əfəndiyev S. Nakamın poemaları // V.İ.Lenin adına APİ-nin elmi əsərləri.-cild XXII.-1962; Əfəndiyev S. İ.Nakamın «Dastani Fərhad və Şirin» əsəri haqqında // V.İ.Lenin adına APİ-nin elmi əsərləri.-cild XXVI.-1963; Əfəndiyev S. Nakam və onun lirikası // V.İ.Lenin adına APİ-nin elmi əsərləri.-cild XXII.-1982; Piriyev V. İsmayıl bəy Nakam // Ulduz,1969, № 8; Seyidov F. Azərbaycan SSR EA Mərkəzi Elmi kitabxanasının Şərq şöbəsində olan nadir əlyazmaların təsvirindən /Nakamın külliyyatı. Divan haqqında.- Azərbaycan SSR EA Xəbərləri.-1946, №7; Ənvər Mete. O torpağın övladları. Bakı: Nurlan, 2006, 608 s., şəkilli. s.94-95; Adışirinov K. İsmayıl bəy Nakam: həyatı və bədii yaradıcılığı. Bakı: Nurlan, 2006, 172 s.*



**SƏFƏROV YUSİF HƏBİBULLA OĞLU (1921-2002)** 1921-ci ildə dünyaya göz açmışdır. 30-cu illərin çətinliklərinə baxmayaraq o, 1939-cu ildə Nuxa şəhərindəki 11 nömrəli məktəbi bitirərək Bakı Dövlət Universitetinin tarix fakültəsinə imtahansız qəbul olunmuşdur. 1941-ci ildə müharibənin başlanması ilə əlaqədar Y.Səfərov ordu sıralarına səfərbər olunmuş, Kerç, Krım, Sevastopol, Qroznı, Mogilyov, Varşava, Krakov və digər şəhərlərin azad edilməsində iştirak etmiş, 1945-ci il aprelin 19-da Frankfurt şəhəri uğrunda döyüşlərdə qıçından ağır yaralanmış, ağır cərrahiyyə əməliyyatlarına məruz qalmışdır. *«Qırmızı Bayraq», «Qırmızı Ulduz», I və II dərəcəli «Vətən müharibəsi» ordenləri, «Qafqazın müdafiəsinə görə», «Varşavanın azad edilməsinə görə»* və bir çox digər medallarla təltif olunan və ikinci qrup əlil kimi ordudan tərxis olunan gənc Yusif BDU-da təhsilini davam etdirmiş, 1951-ci ildə təhsilini fərqlənmə diplomu ilə başa vurduğu üçün universitetin aspiranturasında saxlanılmışdır.

Y. Səfərov M.V. Lomonosov adına Moskva Dövlət Universitetinin tarix fakültəsinə məqsədli aspirant kimi ezam edilmiş və 1954-cü ildə «1806-1812-ci

illər Rusiya–Türkiyə müharibəsi (Qafqaz cəbhəsi)» mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdir.

Y.Səfərovun pedaqoji fəaliyyəti Bakı Dövlət Universiteti ilə bağlıdır. Onun «*Buxarest sülh müqaviləsində Qafqazda Rusiya-Türkiyə sərhəddi məsələsi haqqında», «M.V.Lomonosovun ictimai-siyasi görüşləri», «İnqilabçı demokrat A.İ.Gertsen», «SSRİ xalqlarının tarixşünaslığı», «Azərbaycan XIX əsr rus tarixşünaslığında», «Xalqın qəhrəmanlıq epopeyası»* əsərləri tarixçilər tərəfindən rəğbətlə qarşılanmışdır.

Y.Səfərov 1994-ci ildə *«Azərbaycanın qədim tarixinin tarixşünaslığı»* mövzusunda doktorluq dissertasiyası müdafiə etmiş, tarix üzrə elmlər doktoru alimlik dərəcəsi almışdır. 100-dən çox elmi əsərin, metodik və dərs vəsaitlərinin müəllifi olan Y.Səfərov **«Tərəqqi**» medalına layiq görülmüşdür.

***Yusif Həbibulla oğlu Səfərov 2002-ci ildə dünyasını dəyişmişdir.***

**Əsas işi:** *Buxarest sülh müqaviləsində Qafqazda Rusiya -Türkiyə sərhəddi məsələsi haqqında. Bakı, 1960; M.V.Lomonosovun ictimai-siyasi görüşləri. Bakı, 1961; İnqilabçı demokrat A.İ.Gertsen. Bakı, 1968; SSRİ xalqlarının tarixşünaslığı. Bakı, 1969; Azərbaycan XIX əsr rus tarixşünaslığında. Bakı,1972; Xalqın qəhrəmanlıq epopeyası». Bakı,1975; Azərbaycanın qədim tarixinin tarixşünaslığı. Bakı, 1994*

**Onun haqqında:** *Şəki. Alim və Ziyalılar. Bakı: Elm, 2007, 428 s. (Tərtibçilər: Ələfsər Bəxtiyar oğlu Məmmədov, Fikrət Ramazan oğlu Xalıqov), səh. 348-354*



**SÜLEYMAN SALEH OĞLU – MOLLA CÜMƏ (1854-1920)** XIX əsrin sonları və XX əsrin əvvəllərində fəaliyyət göstərən görkəmli Azərbay can aşıqlarından biri də Molla Cümədir.

Molla Cümə onun təxəllüsüdür. O, heç vaxt mollalıq etməmişdir.

Molla Cümə 1854-cü ildə anadan olmuşdur. Savadlı olduğu üçün ona «Molla» təxəllüsü verilmişdir. O, əsasən qoşma, gəraylı və müxəm məslər yazmışdır. Aşığın şeirlərinin çoxu məhəbbət və vətənpərvərlik mövzusunda olub. Aşıq «Mən» rədifli bir vicudnamə yazmışdır. Burada özü, yaşadığı yeri, ailəsi haqqında məlumat vermişdir.

*Aşıq anasıyam, şairlər kökü,*
*Gəzərəm dünyada divanə təki.*
*Mahalım Göynükdür, şəhərim Şəki,*
*Layisqi kəndinin binasıyam mən.*

*Binəm Layisqiyə düşübdür mehman,*
*Pədərim Salahdır, madərim Reyhan.*

*Vəsədim Həsəndir, adım Süleyman*
*Famlim Molla Oruc, ədnasiyam mən.*

Şeirdən də göründüyü kimi, Molla Cümə Şəki rayonunun Layisqi kəndində anadan olmuş və ömrünün sonuna qədər orada yaşamışdır. Şeirlərinin mövzusu bəşəri, saf, təmiz, ülvi məhəbbət, yaşadığı dövrdə qarşılaşdığı ziddiyyətlər, ictimai bərabərsizliklər, islam dəyərləri və sairədən ibarət olmuşdur.

Molla Cümənin əksər şeirlərində İsmi Pünhanın adı çəkilir, çoxlu şeirləri də İsmi Pünhana müraciətlə yazılıb:

*İsmi pünhan, niyə məndən küsübsən?*
*Yaxşı yaman ya bir olar, ya iki.*
*Bu gün ölsəm hamı deyər yazıqdır,*
*Canı yanan ya bir olar, ya iki.*

*Sən şöləsən dörd yanında fanaram,*
*Bülbülünəm gülşənindən kənaram.*
*Hər məclisdə od tutuban yanaram,*
*Dərdim qanan ya bir olar, ya iki.*

*Hilal qaşa nə layiqdir o sürmə,*
*Meylin qılıb, üzün məndən çevirmə.*
*Cümə deyər, hər yetənə sirr vermə,*
*Dost mehriban ya bir olar, ya iki.*

**İsm** - *ad,* **pünhan** - *gizli* deməkdir. Nədənsə Molla Cümə şeirlərində sevgilisinin adını gizlətmişdir. Bu sahədə çoxlu rəvayətlər var. Məsələ belədir ki, aşığın sevgilisi öz zəmanəsində çox dindar bir adamın qızı olub. El-oba onu müqəddəs hesab eləyib. Ona görə də, aşıq onun adını çəkməmişdir. Ancaq İsmi Pünhan dünyadan vaxtsız köçəndə Molla Cümə ona mahnı qoşmuşdur.[548]

*İsmi Pünhan köçdü fəna dünyadan*
*Qarışdı torpağa iz, hayıf oldu.*
*Xudanın tədbiri beləymiş bizə*
*Soldu yanaqları üz, hayıf oldu.*

Molla Cümə gəncliyindən başlayaraq ustad sənətkarların ədəbi irsini dərindən öyrəndiyi üçün onun yaradıcılığı getdikcə zənginləşmiş və bənzərsiz bir orijinallıq kəsb etmişdir. O, özündən əvvəlki poeziyanın bəzi xüsusiyyətləri ilə səsləşən əsərlər yaratmış və onlara oxşamalar yazmışdır. Ən başlıcası isə ulu ustad

özünə qədər deyilməyən fikirləri böyük ustalıqla müxtəlif şəkildə təcəssüm etdirmişdir.

Molla Cümə, hər şeydən əvvəl gözəllik aşiqidir. Onun «Pəri» rədifli müxəmməsində gözələ xas olan bütün əlamətləri görmək olar:

*Yəqin bil kərəm kanı,*
*Mən yanıram ataşına.*
*Mayılam camalına,*
*Həm gözünə, həm qaşına.*

*Yıxılım ayağına,*
*Durub dolanım başına,*
*Həm sənə qurban olum,*
*Həm də sənin yoldaşına,*
*Yoldaşın pərvazdı, gəlin,*
*Xub yerişin qazdı, gəlin,*
*Bu necə əndazdı, gəlin,*
*Baxışın şahbazdı, gəlin,*
*Doğmuşsan şəmsü qəmər,*
*Gül didarın yazdı gəlin.*

*Ey bahar yazım,*
*Durna avazım,*
*Əlimdə sazım,*
*Eşit niyazım,*
*Aç qolunu qucaqlaşaq,*
*Demək nə lazım,*
*Oynatsın Molla Cümə,*
*Şamama tək səni pəri.*

Misralardakı axıcılıq, şirinlik, canlı portret gözəlliyi oxucunu vəcdə gətirir. Aşıq bir qitədə dörd dəfə şeirin şəklini dəyişdirir. Eyni qitədə bir hissədən o birisinə elə ustalıqla keçir ki, oxucu onun sənətkarlığına heyran qalır. Hecaların sayı dəyişərkən, bir hissədən o biri hissəyə keçirilərkən əlaqə yaradan sözlər işlədilir. Məsələn, birinci səkkiz misranın sonunda gələn «yoldaş» sözü ikinci hissəyə, ikinci altı misranın sonunda rədif kimi işlənən «yaz» sözü üçüncü hissəyə keçid vasitəsi kimi işlədilir. Bu cür sənətkarlıq xüsusiyyətlərinə görə aşıqlar Molla Cüməni müxəmməsin atası adlandırmışlar.[549]

Kəndlərdə, eldə, obada, elin bəzəyi, yaraşığı olan el qızlarını Molla Cümə böyük ilhamla vəsf etmişdir. El-obanın tərcümanı olan sevimli sənətkar hər yetən

gözəli tərifləməmişdir. Onun vəsf etdiyi gözəllər sazın-sözün, sənətin qədrini bilən ləyaqətli, vəfalı el qızları idi. El sənətkarının gözəllərə həsr etdiyi mahnılardan gül-çiçək, bənövşə qoxusu gəlir, baharın təravəti duyulur. Aşığın gözəlləmələrində el qızlarının orijinal portretləri sözlə böyük ustalıqla rəsm edilmişdir:

*İncə belli, şümmad əlli,*
*Fəsih dilli, şirin sözlü,*
*Orta boylu, gözəl xoylu,*

*Əmbər boylu, qəmər üzlü,*
*İnci dişli, şux baxışlı*
*Qəmər qaşlı, maral gözlü.*[550]

Ümumiyyətlə, şifahi ədəbiyyatımızda, xüsusilə dastanlarımızda xalq belə bir ideyanı müdafiə edir ki, əsil, səmimi, ülvi məhəbbət dünyada hər şeydən qiymətlidir. Onu heç nə əvəz edə bilməz. Qoca dünyanın mehrabını eşq sayan xalqın əsrlər boyu mənəvi-bədii sərvətimizdə qoruyub yaşatdığı bu bəşəri, ənənəvi motiv ustad aşıqlarımız tərəfindən el məclislərində sazın müşayiətilə təbliğ və tərənnüm edilmişdir.

Molla Cümə eşqində sadiqdir. O, ayrılıqda keçən ömrü bihudə sayır. Çünki onu yaşadan, onun həyatına rövnəq verən İsmi-Pünhandan ayrı yaşamaq istəmir.

*Səndən ayrı ömür sürüb neylərəm,*
*Molla Cümə istər ölsün səninlə.*

Molla Cümənin ədəbi irsi içərisində Qədim Şərq, Azərbaycan əfsanə və əsatirləri, xüsusilə İslam dünyası ilə əlaqədar çoxlu şeirlər vardır. Qeyd edək ki, bu məzmunlu şeirlər vaxtilə əlyazmasına yazıldığı üçün gəlib bizə çatmışdır.

Böyük ustad sənətkar heç bir şerində İslamı təbliğ etmir, insanları dinə çağırmır. Ancaq İslamın böyüklüyünü, müqəddəsliyini və toxunulmazlığını ürəkdən gələn sözlərlə bədii şəkildə ifadə edir. Molla Cümə bəzi din kahinləri kimi insanları bu dünyadan, həyatdan, zövq-səfadan əl çəkməyə səsləmir. Aşığa görə, İslama hörmət və məhəbbət bu dünyadan əl çəkmək demək deyil. Bu mövzuda şeirləri oxuyanda aydıncasına görürsən ki, İslamın müqəddəs qanunlarını, Quranı əlində tutub bu dünyada ömür sürməyə, gözü açıq olmağa, halal zəhmətlə yaşamağa, düzlüyə çağırır.

«Mən içdiyim Xızır Nəbi verəndir» - deyən ustad Allahdan gələn vergini qəbul edərək bəzən eşq-məhəbbətdən, bəşəri hisslərdən çox danışdığı üçün günahının bağışlanmasını rica edirdi. «Mədəd», «Bax», «Dünya», «Qalacaqmı», «Yarəb» və başqa şeirlər, Aşıq Könül ilə deyişmələri aşığın İslam dünyasına

dərindən bələd olduğunu nümayiş etdirməkdədir.[551] Xüsusilə dünyaya müraciətlə söylədiyi bir neçə şeir bu cəhətdən çox səciyyəvidir:

*İslamın çırağı, haqqın həbibi,*
*Məhəmməd Mustafanı neylədin,dünya?*

Aşığın yaradıcılığında adları çəkilən tarixi, əfsanəvi, dini şəxslərin adları onlar haqqında olan əfsanə və xatirələrdən bəllidir: Habil, Qabil, Mənsur, Davud, Süleyman, İsa, Musa, İbrahim Xəlil, Əyyub, Yunis, Adəm, Nuh, Yəqub, Şəddad, Firon, İsgəndər, Nuşirəvan, Keykavus, Xosrov Pərviz, Namrud və başqalarının adları onlar haqında əfsanə və rəvayətlərdən məlumdur.

Aşığın şeirlərində bəzən bir-iki misra ilə böyük bir hekayətə, yaxud dini-fəlsəfi adlara işarə olunur. Molla Cümə bunların hamısını məktəbsiz, institutsuz, akademiyasız təkbaşına öyrənmişdir. Bunları oxuduqca onun eridusiyası, üləmalığı qarşısında baş əyirsən:

*Yüz iyirmi dörd min Nəbi*
*Dünyaya qılmış zühur,*
*Yeddi qat yer, yeddi qat göy,*
*Ərş, kürs, Qafin, Tur.*

*Şəms, Qəmər, mələk, nücum,*
*İnsi, cins, mari, mur,*
*Yüz sühufnan endi Tövrat,*
*Furqani, İncil, Zabur,*
*İxlasnan Yasin, maha*
*Oxuyan dildən mədəd.*

Molla Cümə eşq odu ilə yanıb-yaxılan aşiqdir. O, özünü ən məşhur, cəfakeş, əzabkeş aşiqlərin cərgəsində sayır. Qeys, Fərhad, Yusif, Tahir, Kərəm, Qərib, Vərqa, Qənbər, Şeyx Sənan kimi aşiqlərlə özünü müqayisə edir.

Aşığın həyatı, ömrü, dərin və ziddiyyətli yaradıcılığı sirli bir xəzinədir. Bir əlində insanı ucaldan, yaşadan, həyata bağlayıb qanadlandıran, bəşəri məhəbbəti vəsf edən şeirləri, o biri əlində isə həmin insanı ruhən, daxilən təmizləyən, xeyirxahlığa, əliaçıqlığa, comərdliyə, mənəvi təmizliyə çağıran Quran surələrindən çözülüb gələn minacat və surələrlə aşıq böyük bir varlığa - İnsana xidmət etmişdir.[552]

Süleyman Saleh oğlu – Molla Cümənin «Qızla gəlinin deyişməsi», «Aşıq Könüllə deyişmə», «Baxşı bəy və Leyla xanım» kimi iri həcmli əsərləri bu gün də sevilə-sevilə oxunur

***Molla Cümə faciəli sürətdə həlak olmuşdur. 1920-ci ilin yazında XI Qızıl Ordunun hissələri Şəkidən Qaxa gedərkən yolda Molla Cüməyə və onun əmisi uşaqlarına rast gəlir və onları qətlə yetirirlər.***

Hazırda aşığın doğma kəndində onun ev muzeyi təşkil edilmiş, qəbirüstü abidəsi ucaldılmışdır.[553]

***Əsas işi****: Şeirlər. Bakı, 1966; Şeirlər «Sazım, sözüm» kitabında. Bakı, 1978;*

**Onun haqqında:** *F.Qazımzadə. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. Bakı, 1974, səh. 384; Əfəndiyev P. Azərbaycan şifahi xalq ədəbiyyatı. Bakı, 1987; ASE, VII cild, Bakı, 1983, səh. 38; Ənvər Mete. O torpağın övladları. Bakı: Nurlan, 2006, 608s., şəkilli. səh. 156-158;*http://www.google. az/imgres?imgurl=http: //upload. wikimedia.org/wiki pedia/ az/thumb/3/33/%C

## VAHABZADƏ BƏXTİYAR MAHMUD OĞLU (1925 -2009)[554]



Şəki dağlar qoynunda yerləşir. Bu dağların başı dümağ, aşağısı isə yaşıllıqlara qərq olmuşdur. Məhz elə bu ucalıq Nakam sənətinə, Molla Cümə yaradıcılığına, Bəxtiyar şerinə ucalıq gətirmişdir.

Türkün poeziya günəşi Vahabzadə Bəxtiyar Mahmud oğlu 1925-ci ildə Nuxada anadan olmuşdur. Orta təhsilini başa vurduqdan sonra 1942-1947-ci illərdə ADU-nun filologiya fakültəsində təhsil almış, universitetin aspiranturasında saxlanılmışdır. O,1951-ci ildə «S.Vurğunun lirikası» mövzusunda namizədlik, sonralar isə «S.Vurğunun həyat və yaradıcılığı» mövzusunda doktorluq dissertasiyaları müdafiə etmişdir**.** B.Vahabzadə 40 ildən artıq BDU-da dərs demiş, 1990-cı ildə təqaüdə çıxmışdır. 1980-ci ildə AMEA-nın müxbir üzvü, 2001-ci ildə həqiqi üzvü seçilmişdir.

B.Vahabzadə 70-dən artıq şeir kitabının, 2 monoqrafiyanın, 1 elmi-publisistik kitabın və yüzlərlə məqalənin müəllifidir. O, 1974-cü ildə əməkdar incəsənət xadimi, 1975-ci ildə respublika, 1984-cü ildə SSRİ Dövlət Mükafatı laureatı adlarına layiq görülmüşdür. «Qırmızı Əmək Bayrağı» ordeni ilə,1995-ci ildə Azərbaycan xalqının milli-azadlıq uğrunda mübarizəsində xüsusi xidmətlərinə görə **«İstiqlal**» ordeni ilə təltif olunmuşdur.

B.Vahabzadə bədii yaradıcılığa 1943-cü ildə başlamış, sonrakı yaradıcılığında dövrün problemləri lirik-fəlsəfi planda öz əksini tapmışdır. Onun *«İkinci səs», «Vicdan», «Yağışdan sonra», «Yollara iz düşür», «Fəryad», «Hara gedir bu dünya», «Özümüzü kəsən qılınc», «Dar ağacı»* və başqa pyesləri Azərbaycan Akademik Milli Dram Teatrında tamaşaya qoyulmuşdur. Bayronun «Abidos

gəlini» poemasını,  A.S Puşkin, M.Y Lermontov, N.A.Nekrasov, A. Qraşi və b. şairlərin şeirlərini tərcümə etmişdir. 1945-ci ildən Azərbaycan Yazıçılar Birliyinin üzvü olan şair 1983-cü ildə Azərbaycanın xalq şairi adına layiq görülmüşdür. Azərbaycan SSR Dövlət mükafatı və M.F. Axundov adına mükafat laureatı, filologiya üzrə elmlər doktoru, professor, AMEA -nın həqiqi üzvü B. Vahabzadə həm də ictimai xadimdir. O, 1980-2000-ci illərdə 5 dəfə millət vəkili seçilmişdir.

Böyük şairin ictimai-siyasi lirikası M.Ə.Rəsulzadənin «İnsanlara hürriyyət, millətlərə istiqlal» ideyası ilə səsləşir. Daim tərəqqidə olan milli istiqlal ideyası Bəxtiyar poeziyasının əzəli ideyası kimi dəyişməmiş, böyük şair sovet hakimiyyəti dönəmində də, sərt senzura şəraitində də istiqlal ideyasından əl çəkməmişdir. Milli istiqlal hərəkatının lideri Əbülfəz Elçibəyin təbiri ilə desək, 60-cı illərdə B.Vahabzadənin şeirləri hər yanda oxunur, «Gülüstan» poeması əldən-ələ gəzirdi.

Böyük sənətkarın «İstiqlal»[555], «Neo»[556], «Vətəndən vətənə»[557], «Riyakar»[558], «Anamın kitabı»[559], «Dan yeri»[560], «Qoruq»[561], «Azadlıq»[562], «Əsarət-azadlıq»[563] və başqa şeir və poemalarında istiqlal ideyası öncül yer tutur.

B.Vahabzadənin istiqlal məfkurəsində ana dili xüsusi səhifə təşkil edir. Şair dilimizlə bağlı problemləri dilçiliyin hüdudlarından kənara çıxararaq psixologiya, etnoqrafiya, sosiologiya, tarix və etika ilə bağlı məsələlərlə dialektik vəhdətdə götürmüş, ana dilinə xalqa məxsus olan bütün xarakterik xüsusiyyətlərin məcmusu kimi baxmışdır. Əhməd Şmidenin (Almaniya) təbirincə desək, bir insanın öz xalqını və doğma dilini dəlicəsinə sevə bilmək qabiliyyətini Vahabzadədən öyrənməlidir.[564]

Şair 1954-cü ildə yazdığı «Ana dili» şeirində yazırdı:

Ey öz doğma dilində danışmağı ar bilən
Fasonlu ədəbazlar,
Qəlbinizi oxşamaz qoşmalar, telli sazlar.
Qoy bunlar mənim olsun
Ancaq Vətən çörəyi
Bir də ana ürəyi
Sizlərə qənim olsun.[565]

B.Vahabzadənin vücudu Vətən torpağı, nəfəsi Xəzər dənizindən əsən rüzgar, qanı Kür və Araz çaylarıdır (Əli Yavuz Akpinar). Onun düşüncəsi dərin, ürəyi nazik, dili kəskin və qələmi itidir (Cavad Heyət). Bəxtiyar ona görə bəxtiyardır ki, onu xalqı sevir, xalqı ona görə bəxtiyardır ki, onun Bəxtiyarı var (Niyazi).[566]

Vahabzadə poeziyası həyat dərsliyidir. Onun içərisində vətəndaşlıq, mübarizlik, üsyankarlıq, mərdlik, qeyrət, namus, ar və nəhayət, kökə bağlılıq vardır. Şairin davranışındakı özünəməxsusluq yaradıcılığında da özünü göstərir. Şair təkcə Azərbaycan türklərinin deyil, bütün türk dünyasının nümayəndəsidir. Bu yerdə 2007-ci ildə Türkiyənin Kocaeli Universitetində keçirilən uluslararası sim-

poziumda Los-Ancelesdən gəlmiş gənc amerikalı xanımın türk dilli xalqların nümayəndələrinə müraciətlə dediyi sözlər yada düşür. O, yarı ciddi, yarızarfat demişdir:

«... Bayaqdan fikir verirəm, bir-birinizə bu qədər bənzərliyiniz ola-ola birləşə bilmirsiniz. Ağlınızı işə salsanız, Yer kürəsinə hegemonluq edərsiniz. Az qala dünyanın yarısı-gözəl, münbit və bərəkətli torpaqlar türkdilli xalqlara məxsusdur. Əl-ələ versəniz, sizlərə batan qüvvə tapılmaz. Axı erməni kimdir ki, qabağında aciz qalmısınız, gülünc deyilmi?» Elə bu fikirlərin məngənəsində sıxılan və daim birliyi düşünən şair yazırdı:



***Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyev, xalq şairi Bəxtiyar Vahabzadə və İlham Əliyev Şəkidə. 2002-ci il***

Ey xalqımın böyükləri,
Böyük olun, kiçilməyin,
Əyilməyi hörmət üçün yol bilməyin.
Siz millətə söykənsəniz,
Arxanızda millət durar.
Qorxunuzdan əyilsəniz,
Qarşınızda daha böyük zillət durar.

Kürsü uğrunda mübarizə, vəzifəsindən dördəlli yapışan, hər rayonda villa tikmək arzusuna (xəstəliyinə) tutulan rəhbərlərimizin xalqı unutması Bəxtiyarı rahat buraxmır və gileylənir:

Özümüz yanırıq öz dərdimizə,
Dünyanın qulağı kar olmuş bizə
Bizim haqqımızı boğur siyasət,
Haqqı sübut edən şahidimiz yox –

deyərək atəşkəs olmasına baxmayaraq, şəhid olan övladlarımız haqqında xəbərlərə susduğumuzdan narahatdır və bunun səbəbini mütilikdə görür. «*Mütilik millətləri dəfn edir diri-diri»*- deyir və ayağa qalxmağa çağırır:

Qalx ayağa,
Diz qatlamaq yaraşarmı
Bilgə xaqan nəvəsinə?
Tülkülərin qabağından qaçmağını
Axı, sənə bağışlamaz qurd babamız.[567]

Deməli, Bilgə xaqanın dediyi kimi, türk silkinməli və kəndinə dönməlidir.

Bir çox xalqların, xüsusilə türk mənşəli xalqların taleyində faciələrə səbəb olmuş Rusiyanın işğalçılıq siyasəti B.Vahabzadənin ictimai-siyasi lirikasının əsas mövzularındandır. Bu baxımdan «Gülüstan»[568] və «Şəhidlər»[569] poemaları, «150 il»[570], «Yevtuşenkoya məktub»[571], «İkibaşlı qartal»[572], «Qatilinə pənahım deyir»[573] şeirləri olduqca səciyyəvidir.

Ey ikibaşlı qartal,
Üç yüz ildir dünya dad çəkir sənin əlindən.
Düşən qurtara bilmir o qanlı çəngəlindən.
Sən ağ oldun Allaha.
Bizim nağıllardakı yeddibaşlı əjdaha
İkibaşlı qartalın doğmaca əcdadıymış-
Zülmün başqa adıymış.
İçin qara, çölün ağ, başdan başa boyasan,
İftirasan, riyasan.
O biri dünyada da hələ gözün var sənin
İki qanad, iki baş, iki üzün var sənin.
Həm qərbə, həm də şərqə gərib qanadlarını
Bəsdir kölgə saldığın.
Baxıb iki tərəfə həmişə çaş qaldığın.
Sən həm dünən, həm bu gün
İki başla düşündün.
Kəsilsəydi bir başın, qan içməkdən doyardın.
Sən də bu aləm kimi
Bir baş ilə düşünüb dünyanı dinc qoyardın[574] –

deyən şairə görə Rusiya imperiyasının ambisiyalarına son qoyulmayınca bəşəriyyət üçün təhlükə sovuşmayacaqdır.

Şair istiqlal arzularını Azərbaycan tarixinin faciəvi səhifəsinə həsr olunan «Gülüstan» poemasında daha da inkişaf etdirmiş, əsarətdə qalan xalqlara ismarıc göndərmişdir.

«Gülüstan» poeması tarixi həqiqətlərin qadağan edildiyi Sovet İttifaqında bomba kimi partlamışdı. B.Vahabzadənin imperiyanın işğalçılıq siyasəti yeritdiyini söyləməsi rəsmi dairələr tərəfindən «top-tüfənglə» qarşılanmışdır. İstiqlaliyyətimizin itirilməsinə, vətənimizin Rusiya ilə Qacar sülaləsinin idarə etdiyi dövlət arasında bölünməsinə üsyan edərək:

Atıb imzasını hər kəs varağa
Əyləşir sakitcə keçib yerinə.
Eynəkli cənabla, təsbehli ağa,
Qalxıb əl də verir biri-birinə.

Onların birləşən bu əlləriylə
Ayrılır ikiyə bir el, bir Vətən.
Axıdıb gözündən yaş gilə-gilə,
Bu dəhşətli hala nə deyir Vətən?

Bir deyən olmadı, durun ağalar!
Axı bu ölkənin öz sahibi var.
Siz nə yazırsınız, bayaqdan bəri-
Bəs hanı bu yurdun öz sahibləri?

Bəs hanı həqiqət, bəs hanı qanun?
Qocadır bu yurdun tarixi, yaşı.
Bəs hanı köksünə sərhəd qoyduğun,
Bir vahid ölkənin iki qardaşı?[575] – deyən ustad

Necə ayırdınız dırnağı ətdən-
Ürəyi bədəndən, canı cəsəddən?
Axı kim bu haqqı vermişdir Sizə,
Sizi kim çağırmış, Vətənimizə?-

sualına cavab axtarır, cavab olmadıqca poemasında xalqımızın istiqlaliyyətdən məhrum edilməsi və ikiyə bölünməsindən kədərlənsə də, Azərbaycanın müstəqil olacağına, Təbrizin də Bakı kimi doğma yurda qatılacağına inanaraq yazırdı:

Ağalar bilmədi birdir bu torpaq

Təbriz də, Bakı da Azərbaycandır.
Bir elin ruhunu, dilini ancaq
Kağızlar üstündə bölmək asandır.
Böl, kağız üstündə, böl, gecə-gündüz,
Torpağın üstünə dirəklər də düz,

Gücünü, əzmini tök də meydana,
Qoşundan, silahdan sədd çək hər yana.
Torpağı ikiyə bölərsən, ancaq
Çətindir bədəni candan ayırmaq![576]

B.Vahabzadə yaradıcılığında azadlıq məfkurəsi ana xətti təşkil edir. Şair əmin idi ki, azadlıq olmayan yerdə ədalətsizlik, rəzalət hökm sürəcək, insanlıq itəcəkdir. Odur ki, şairin inamı onun azadlığa olan sevgisinin təsdiqinə çevrilir.

Azadlıq!
Azadlıq əldən getdimi
Dünya xəyala da darısqal gələr;
İnsan azadlığı itirən kimi
Bütün fəlakətlər dalbadal gələr.

Gedər ağızlardan dad da, ləzzət də
Ağıl da, ürək də gülər arzuya.
Azadlıq olmayan bir məmləkətdə
Həqiqət riyadır, ədalət boya!

İnsan urəyində kin də, nifrət də,
Əbədi köz bağlar, bir anlıq olmaz.
Azadlıq olmayan bir məmləkətdə
Adamlar yaşayar, insanlıq olmaz.

Düşünən beyinlər sönər zulmətdə -
Yalanla həqiqət üzbəüz olar.
Azadlıq olmayan bir məmləkətdə
Düz əyri adlanar, əyri düz olar.

İdrak da boğular, söz də, sənət də
Ağıl kilidlənər dildə, dodaqda;
Azadlıq olmayan bir məmləkətdə
Nadan başda gəzər, aqil ayaqda.[577]

B.Vahabzadə tarixin müxtəlif mərhələlərində düçar olduğumuz bəlaların kökünü və bu günkü vəziyyətə düşməyimizin səbəblərini tarixə münasibətimizdə axtarır. Mənəvi təmizlik, rəhimlilik, şəfqətlilik, kin-kudurətdən uzaq olmaq, abır-həyaya qısılmaq, pislikləri tez unutmaq kimi dəyərləri yada salaraq yazır:

Əsrin əvvəlini unutmuşuq biz,
Saldın yadımıza dünənimizi
Sadəqəlbliyimiz, təmizliyimiz
Tarixdə nə qədər aldatmış bizi!

Erməni zülmündən yüz ildən bəri
Daşdan-daşa dəydi bu xalqın başı.
Unutdu çəkdiyi müsibətləri,
Niyə oğurlandı onun yaddaşı!

Biz başdan ayağa rəhimik, şəfqətik,
O kin dağarcığı, o goreşəndir.
Biz əvvəl insanıq, sonra millətik.
O, insan olmadan millətləşəndir.

Bilmədik, içini gəmirir bu kin,
Sözü keçməyəndə üzdən həlimdir.
Unutduq, nifrətlə mayalanmışın
Fikri-intiqamdır, qəsdi-zülmdür...

Biz boğub vicdanı, qəhr edib arı,
Şərə yoldaş olub haqqı danmırıq.
Heç vaxt unutmarıq yaxşılıqları,
Amma pislikləri unudanlarıq.[578]

Böyük şairin yazdığı yuxarıdakı səbəblərdən də, 1988-ci ilin fevralında Dağlıq Qarabağın Ermənistana birləşdirilməsi tələbilə imza toplanması kompaniyasına və Azərbaycan türklərinin öz dədə-baba ərazilərindən-İrəvandan, Vedidən, Göyçədən, Zəngəzurdan, Dilicandan vəhşiliklə qovulmasına göz yumulduğu halda, bu qanunsuzluqlara son qoyulması tələbilə Azərbaycanda 1988-ci ilin noyabrında başlanan etiraz hərəkatı zorakı tədbirlərlə boğuldu. Moskvanın ikiüzlü, ikibaşlı siyasətini kəskin tənqid edən B.Vahabzadə «Şəhidlər» poemasında xalqların hüquq bərabərliyi ideyasının kağız üzərində sözdən başqa bir şey olmadığını bildirdi:

Mərkəz dəyişdirir gündə rəngini,

Mərkəz məni görür, heç onu görmür.
Bizdən yığışdırıb quş tüfəngini,
Amma erməninin topunu görmür.

Anladıq xalqların bərabərliyi,
Kağız üzərində bir quru sözmüş.
Bu qətldən sonra bildik çox şeyi,
Bizim günahımız türklüyümüzmüş![579]

B.Vahabzadə xalqımızın həyatında, taleyində kəskin dönüş ili olan 1988-ci ildə təkcə yaradıcılığı ilə kifayətlənməmiş, həm də fəal içtimai-siyasi fəaliyyəti ilə milli-azadlıq hərəkatının önündə getmişdir. O, şəxsi nümunəsi ilə xalqına, vətəninə sevgisini təkcə yaradıcılığı ilə deyil, həm də fəaliyyəti ilə təsdiq etdi. 1988- ci ilin 17 noyabrından başlanan və 19 gün davam edən «Meydan» hərəkatının iştirakçılarından biri oldu. Onun çıxışları geniş xalq kütləsi tərəfindən hərarətlə qarşılandı.

Məlum odluğu kimi, 1989-cu il mart ayının 26-da SSRİ Ali Sovetinə seçkilər keçirildi. Azərbaycan rəhbərliyi özünə gərəkli olan şəxsləri deputat «seçdi». Yeni seçilən deputatlar isə Ali Sovetin iclaslarında susmağa üstünlük verdilər. Onların bu cür «fəaliyyəti» şairi hiddətləndirdi. Deputatların fəaliyyətindən bəhs edən «Xalq deputatlarına açıq məktub»[580] şeirini yazdı.

Sənə səs verdim ki, yoldaş deputat,
Yüksək kürsüdə səsin gur olsun.
Sənə öz səsimi vermədim ki, mən,
Qulağın kar olsun, gözün kor olsun.

Sənə səs verdik, hər qarış yerin
«Əzəli sahibi mənəm», -deyəsən.
Sənin torpağına göz dikənlərin
Dərsini verməkdən çəkinməyəsən.

Sənə səs verdik ki, elin, obanın
İstəyi, arzusu axsın səsindən.
Bar - bar bağırasan: Suyun, havanın
Millətin kökünü çürütməsindən.

Dedinmi bunları?
Yox! Bir dinsənə!
Sənə şəklənmişdi qulaqlarımız.
Ağzına su alıb susdun...Bəs sənə
Millətin vəkili necə deyək biz?

Xalqını söydülər üzünə qənşər,
Sən susdun...
Vəzifən susmaqmış məgər,
Xalqın şərəfini qorumayan kəs,
Millətin vəkili necə oldu bəs?

Sovetlər dönəmindəki 70 ildə Azərbaycan xalqı hər şeyə-sərvətinin daşınıb aparılmasına, yoxsul həyat tərzinə, ona qarşı edilən ədalətsizliklərə dözdü, lakin şərəf rəmzinə çevrilmiş torpağına əl uzadıldıqda dözümü tükəndi, səbr kasası daşdı. Böyük şair torpağının zəbt edilməsinə yönələn hər cür əmələ dözməyərək haykırdı.

Bir soruşan olmadı nədir sənin bu davan?
Bəlkə çatışmır suyun, bəlkə çatışmır havan?
Yaşasa da bu millət lap dilənçi kökündə,
Yoxsul güzəranından danışmadı bir gün də.
Daxmalarda yaşadı, özünü sındırmadı,
Meydanda «mənzil»-deyə bir dəfə qışqırmadı.
Qara qızıl çıxartdı yerin yeddi qatından.
«Nədir bunun qiyməti?» -deyə bir
dəfə qışqırmadı,
Onun qızıl neftini qızıla da satdılar.
Qızılın sahibini söz ilə aldatdılar.
Bu millətin sərvəti özünə düşmən oldu,
Becərdiyi pambığı əyninə kəfən oldu
O, yenə də dinmədi
Dözdü, heç deyinmədi.
Nə istəyir bəs bu xalq?
O istəyir sərvəti manat olub özgənin
Xəzinəsinə dolsa da,
Dərisi soyulsa da
Onun ləyaqətinə,
Namus və qeyrətinə
Bir daha qıymasınlar
Min illik torpağını hərraca qoymasınlar.[581]

Şairin dili ilə söylənmiş xalqın bu istəyi Mərkəzin xoşuna gəlmədi. 1990-cı ilin Qanlı şənbə gecəsi törədildi. Çünki Mərkəzin iradəsinə qarşı çıxaraq torpaqlarımızın «qızıl sinidə» ermənilərə verilməsinə müqavimət göstərmişdik.

Dedim: - Günahımı başa sal mənə,
Dedin: - Anlamadın məni sən yenə.
Bilmədin, günahın bir deyil, mindir.
Amma ən böyüyü gözəlliyindir.

Məndən icazəsiz axı çox şeyi
Sən qanmaq istədin, duymaq istədin.
Sən öz ayağını mənim çəkdiyim.
Cızıqdan kənara qoymaq istədin.
Budur günahın!

Sən öz torpağında qul olduğunu,
Bağırmaq istədin, budur günahın.
Zülmün girdabında boğulduğunu,
Çığırmaq istədin, budur günahın.
O torpaq istədi səndən bir qarış.
Niyə tələbkarın xətrinə dəydin?
Onun istəyilə dedim, sən barış
Sənsə tərəzinin gözünü əydin.
Budur günahın!

Bu qanlı çəkişmə düşəndən bəri,
Bir dəm ayağını qoymadın geri
Sən də neçəsinin qanını tökdün
Erməni qıranda sizinkiləri.
Budur günahın!

Mən sənin qanını tökdüyüm zaman,
Baxdın nifrət ilə... Budur günahın!
Sən mənim tankıma çırtma vurmusan,
Hansı cürət ilə?-Budur günahı![582]

B.Vahabzadənin 1990-cı ildə qələmə aldığı **«Şəhidlər»** poemasının ötən yüzilliyin sonunda Azərbaycanda baş vermiş milli-azadlıq hərəkatına həsr olunmuş əsərlər sırasında özünəməxsus yeri vardır.[583]

Şəhidlər bu torpağa, xalqa səcdə qıldılar,
Haqsızlığın üstündən haqqa körpü saldılar,

Vətəni sevmək üstə günahkar sayıldılar,
Vətəni sevmək niyə günah olmuş, ay allah?

20 Yanvar şəhidləri Azərbaycan xalqının əsrin əvvəlindəki, lap elə dünənki xalq olmadığını sübut etdi, əsarətdən xilas olmaq uğrunda mübarizəyə ruhlandırdı.

Azadlıq verilmir, alınır,dayan!
Onun elçisidir, ölüm, qan-qada
Ölümə, cəfaya hazır olmayan,
Millət hazır deyil azadlığa da,

Yalın əllər ilə tanklar üstünə,
Atılan cavanlar, eşq olsun sizə!
Siz təsdiq etdiniz azadlığın da
Halal olduğunu millətimizə!

Şəhid rütbəsinə qalxan cavanlar,
Sinəsi hər zülmə qalxan cavanlar
Böyük Nəsiminin, ulu Babəkin,
Xeyir-duasını aldı o gecə.
Zamandan irəli sıçrayıb yəqin,
Tarixdə tarix tək qaldı o gecə[584]

Tarixin ən faciəli qətlamı olan Xocalı faciəsi göstərdi ki, Rusiyanın siyasi dairələri özlərinin imperiya ambisiyalarına son qoymaq fikrində deyildilər. Bu siyasətin nəticələrini hamıdan yaxşı hiss edən şair «Əgər qorunmazsa istiqlalımız» şeirində xalqı Rusiya tərəfindən gözlənilən yeni-yeni təhlükədən xəbərdar edirdi.

Çıxsa da əlindən xalqlar, ölkələr
Ölməyib o iblis, o şeytan hələ.
Üç yüz il dünyaya qan udduran taxt
Çürüyüb, sahibi inana bilmir.
Ondan üz döndərib bu dövran, bu vaxt
Böyük gələcəyi o qana bilmir.
Həqiqət, ədalət məhkəməsinə
Qol çəkir, qoluna  inana bilmir.
Tərgitmək bilmir köhnə vərdişi,

Anlaya bilmir ki, qırılıb dişi.[585]

B.Vahabzadə imzasının Azərbaycanın azadlıq mücadiləsində öz yeri vardır. Bu imza təkcə şeirlərdə, poemalarda deyil, həm də azəri türklərinin ürəyindədir.

**Əsas işi:** *Bəxtiyar Vahabzadə. Əsərləri. On iki clddə.* ***I cild*** *(1949-1959) Bakı: Elm, 2008.- 612 səh.;* ***II cild*** *(1960-1969 ). Bakı: Elm, 2008.-616 səh;* ***III cild*** *(1960-1969). Bakı: Elm, 2008, 577 səh.;* ***IV cild*** *(1970-1979), Bakı: Elm, 2008, 662 səh.;* ***V cild*** *(1980-1989), Bakı: Elm, 2008, 584 səh.;* ***VI cild*** *(1990-1999), Bakı: Elm, 2008, 738 səh.;* ***VII cild*** *(2000-2004), Bakı: Elm, 2008.- 463 səh.,* ***VIII cild*** *(Son illərdə yazılmış, müvafiq cildlərə düşməyən və yenidən işlənən şeirlər), Bakı: Elm, 2009, 518 səh.;* ***IX cild*** *(Mərsiyə. Rekviyem, hekayələr, pyeslər, tele-radio pyesləri), Bakı: Elm, 2009,828 səh****.; X cild*** *(Məqalələr: Ədəbiyyat və sənət), Bakı: Elm, 2009, 831 səh.;* ***XI cild*** *(Publisistika), Bakı: Elm, 2009, 826 səh.;* ***XII cild*** *(Publisistika), Bakı: Elm, 2009, 838 səh.;*

**Onun haqqında:** *Azərbaycan sovet ədəbiyyatı tarixi, 2 clddə, c.2, Bakı, 1967; ASE, II c, Bakı, 1978,səh.422-43;*

**ZÜLFÜQAROV ZÜLFÜQAR HÜSEYNQULU OĞLU (1913-1992**) 1913-cü il dekabrın 3-də Nuxada anadan olmuşdur. Orta təhsilini Nuxada alan gənc Zülfüqar Bakıda ali təhsil almış, 1936-1940-cı illərdə Bakıdakı neft emalı zavodunda mühəndis, böyük mühəndis işləmiş, 1940-cı ildən Azərbaycan SSR EA Kimya İnstitutunda əmək fəaliyyətini davam etdirmiş, baş elmi işçidən institutun direktoru vəzifəsinədək yüksəlmişdir.



Professor Zülfüqarovun elmi işlərinin əsasını alumosilikatların, mürəkkəb oksid tərkibli katalizatorların və müxtəlif adsorbentlərin sintezi və tətbiqi sahəsi təşkil edir. O, Azərbaycanın bentonit gilləri və təbii seolitlərinin fiziki-kimyəvi xassələrini tədqiq etmiş, neft kimyası sənayesində işlədilən katalizatorların bir çoxunun sintezi şəraitinin onun aktivliyinə təsirini öyrənmiş, kataliz məsələlərinə dair çağırılan 1968-ci il Moskva beynəlxalq konfransında, 1971-ci ildə Bolqarıstanda, 1975-ci ildə Monqolustanda keçirilən simpoziumlarda məruzələrlə çıxış etmişdir.

Kimya elmləri doktoru (1957), professor (1958), Azərbaycan SSR EA-nın müxbir üzvü (1976), Respublika Dövlət mükafatı laueratı (1976), əməkdar elm xadimi (1974) **Zülfüqarov Zülfüqar Hüseynqulu oğlu 1992-ci ildə vəfat etmişdi.**

**Əsas işi:** *Вилияние условий синтеза крекирующих катализаторов на их физико-химические свойства. Баку, 1957; Исследование физико-химических свойств и отбливающих спосопностей глин месторождений Азербайджанской ССР и гумбина. Баку, 1957; Вилияние кислотности и природы носителей на активность хромокислых катализаторов. Изв. Отделения химических наук Болгарской АН, т.4, кн.1, 1973; Окислительное дегудрирование алкиларом а-тических углеводородов в на-формах разлияных цеолитов. Изв. АН ССР (серия химическая), 1978, № 6 ( совм. с др.)*

**Onun haqqında:** *Ənvər Mete. O torpağın övladları. Bakı: Nurlan, 2006, 608 s,* ***şəkilli. s.*** *233-234; ASE, IV cild, səh. 350;*

# SON SÖZ ƏVƏZİ

Əziz həmvətənlərimiz, hörmətli müəllim həmkarlarımız! Sizə təqdim olunan kitab Şəki təhsilinin tarixinə, onun keçmişinə, bu gününə həsr olunmuşdur. Məqsədimizə nə dərəcədə nail olduğumuzu müəyyənləşdirmək Sizin öhdənizə buraxılmışdır. Amma kitabı oxuyan hər bir kəsdən bircə təvəqqəmiz var. Kitabda verilən materialları oxuyarkən göz önünə baba və nənələrimizi, bugünkü müstəqil respublikamızın qurulmasında canlarından keçən soydaşlarımızı gətirin, onların məşəqqətli həyat yolunu övladlarınıza izah edin. Onda yetişməkdə olan balalarımız gələcək Azərbaycanın layiqli vətəndaşları olacaqlar.

Kitabda 100-dən artıq şəkil verilmişdir. Bu şəkillərin əksəriyyəti ilk dəfə çap olunur. Həmin şəkilləri arxivlərdən, ayrı-ayrı şəxslərdən əldə etmək üçün çətinliklər olsa da, müəlliflər bunu özlərinin vətəndaşlıq borcu hesab etmiş və keçmişimizi oxuculara çatdırdığımız üçün qürur hissi keçiririk.

Müəlliflər təhsil tariximizin şərəfli bir səhifəsini işıqlandırmaqla kifayətlənməmiş, Şəki təhsilinin yetirmələri ilə oxucuları tanış etmişlər.

İrad və təklifləriniz üçün əvvəlcədən təşəkkür edirik.

# ƏDƏBİYYAT

[1] Mahmud İsmayıl. Azərbaycan tarixi. Bakı: Azərnəşr, 1993, 271 s., səh.12-18
[2] M.İ.Əmrahov, N.N.Əsədov, H.İ.Həsənov. Şərqi Avropada türk tayfa birlikləri. Bakı: ADPU nəşriyyatı, 2010, 67 s.
[3] Azərbaycan tarixi. Dərslik. Bakı: Azərnəşr, 1994, 680 s., səh.149
[4] Yenə orada, səh. 103
[5]Seyidova S. Türk xalqlarının etnogenezi. Bakı: «Ağaoğlu» nəşriyyatı, 2002, 139 s., səh.9
[6] A.B.Məmmədov. Qarabağ, onun qədim tayfaları və toponimləri. Bakı: Mütərcim, 2008, 480 s., səh. 45
[7] Yenə orada, səh.45-46
[8] Abdulla Fazili. Ulusunu tanımayan tanrısını tanımaz. (Atropatena e.ə. IV-e. VII əsri). Bakı: Elm, 1992, 216 s., səh.11
[9] Gəncə (tarixi oçerk). Bakı: Elm, 1994, 152 s., səh.6-7
[10]A.B.Məmmədov. Qarabağ, onun qədim tayfaları və toponimləri. Bakı: Mütərcim, 2008, 480 s., səh.46
[11]Məmmədli Atamoğlan. Gəlmələr. Ermənilərin gerçək tarixi. Bakı: «Çaşıoğlu» nəşriyyatı, 2008, 444 s., səh.40
[12]Bax:Seyidov M.Ə. Azərbaycan xalqının soykökünü düşünərkən. Bakı: Yazıçı, 1983, 326 s.
[13] Bax: Хазанов А. Социальная история скифов. М., 1985
[14] Məmmədli Atamoğlan. Göstərilən əsəri, səh.40
[15]Yenə orada, səh.40-41
[16] Azərbaycan tarixi. Dərslik. Bakı: Azərnəşr, 1994, 680 s., səh.149
[17] Yusifov Y.B. Qədim Şərq tarixi. Dərslik. Bakı: Bakı Universiteti Nəşriyyatı, 1992, 496 s., səh.73
[18] Azərbaycan Sovet Ensiklopediyası 1-10-cu cildlər. Bakı: «Azərbaycan Ensiklopediyası» Nəşriyyat-Poliqrafiya Birliyi, 1976-1988. *V cild, Bakı, 1981, səh. 414;* Gülcöhrə Məmmədova, Vaqif Aslan. Kiş kəndi və onun məbədi. Bakı: «Çaşıoğlu» nəşriyyatı, 2003, 31 s., səh.4
[19]Yenə orada, səh.6
[20]Azərbaycan tarixi. Dərslik. Bakı: Azərnəşr, 1994, 680 s., səh.149-150
[21] Dəmirçizadə Ə. 50 söz. Bakı: Gənclik, 1968, 103 s., səh.29-30
[22]Yenə orada, səh.32
[23] A.B.Məmmədov. Qarabağ, onun qədim tayfaları və toponimləri. Bakı: Mütərcim, 2008, 480 s., səh.15
[24]A.Bakıxanov. Gülüstani-İrəm. Bakı: Azərnəşr, 1951, 256 s., səh.22
[25]Ətraflı bax: Moisey Kalankatuklu. Albaniya tarixi. (müqəddimə, qeyd və şərhlər akademik Z.Bünyadovundur). Bakı : Elm, 1993, 265 s.; Həbibulla Manaflı. Öyünc və güvənc qaynağı. Bakı: Nurlan, 2007, 224 s. səh.15-16.
[26] Həbibulla Manaflı. Öyünc və güvənc qaynağı. Bakı: Nurlan, 2007, 224 s.,səh.16.
[27] M.İsmayılov Şəki. Bakı: Azərnəşr, 1981, 151 s., səh.7.
[28]A.A.Bakıxanov. Gülüstani – İrəm». Bakı: Azərnəşr, 1951, 256 s., səh.102
[29] Azərbaycan tarixi. 7 cilddə, IV cild ( XIX əsr), Bakı: Elm, 2000, 508 s., səh.76
[30] Yenə orada, səh.86
[31] http://sites.google.com/site/sheki tarixi/emir teymurun shekiye hucumlari
[32] Məmmədov E. Türk dünyasının görkəmli şəxsiyyətləri. Bakı: Mütərcim, 2010, 148 s. , səh.61
[33]Yenə orada
[34]Yenə orada, səh.61-62
[35]http://sites.google.com/site/sheki tarixi/emir teymurun shekiye hucumlari

[36] Azərbaycan tarixi. Dərslik. Bakı: Azərnəşr, 1994, 680 s., səh.330
[37] http://sites.google.com/site/sheki tarixi/emir teymurun shekiye hucumlari
[38]Azərbaycan tarixi. Dərslik. Bakı: Azərnəşr, 1994, 680 s., səh.331
[39] Ətraflı bax: Nizaməddin Şami. Zəfərnamə ( türk dilindən tərcümə Z.Bünyadovundur). Bakı: Elm, 1992, 40 s.,; http://sites.google.com/site/sheki tarixi/emir teymurun shekiye hucumlari
[40] http://sites.google.com/site/sheki tarixi/emir teymurun shekiye hucumlari; Azərbaycan tarixi. Dərslik. Bakı: Azərnəşr, 1994, 680 s., səh.331
[41] Məmmədov E. Türk dünyasının görkəmli şəxsiyyətləri. Bakı: Mütərcim, 2010, 148 s. , səh.80
[42] Məmmədov Süleyman. Azərbaycan tarixi (Ən qədim zamanlardan 2006-cı ilədək). Bakı: «Çaşıoğlu» nəşriyytı, 2007, 392 s., səh.76
[43]http://sites.google.com/site/sheki tarixi/emir teymurun shekiye hucumlari; Azərbaycan tarixi. Dərslik. Bakı: Azərnəşr, 1994, 680 s., səh.331
[44] http://sites.google.com/site/sheki tarixi/emir teymurun shekiye hucumlari
[45]http://sites.google.com/site/shekitarixi/emirteymurunshekiyehucumlari
[46] Azərbaycan tarixi. Dərslik. Bakı: Azərnəşr, 1994, 680 s., səh.332
[47] Azərbaycan tarixi, 7 cilddə, IV cild (XIX əsr), Bakı: Elm, 2000, 508 s., səh.46-47
[48]http://sites.google.com/site/sheki tarixi/emir teymurun shekiye hucumlari
[49]Şəki xanlığının tarixindən. Bakı: «Azərbaycan Ensiklopediyası» Nəşriyyat – Poliqrafiya Birliyi, 1993, 32 s., səh.10.
[50] Əfəndiyev O. Azərbaycan Səfəvilər dövləti. Bakı: Azərnəşr, 1993, 301 s., səh.71
[51] Yenə orada., səh.71-74
[52]Şəki xanlığının tarixindən. Bakı: «Azərbaycan Ensiklopediyası» Nəşriyyat – Poliqrafiya Birliyi, 1993, 32 s., səh.11-12; Əfəndiyev O. Azərbaycan Səfəvilər dövləti. Bakı: Azərnəşr, 1993, 301 s., səh.79
[53] Azərbaycan tarixi üzrə qaynaqlar. Bakı: «Çıraq» nəşriyyatı, 2007, 400 s.,səh 227; Azərbaycan tarixi. 7 cilddə, III cild, Bakı: Elm, 1999, 525 s., səh.201; Əfəndiyev O. Azərbaycan Səfəvilər dövləti. Bakı: Azərnəşr, 1993, 301 s., səh.79
[54]Azərbaycan tarixi. 7 cilddə, III cild, Bakı: Elm, 1999, 525 s., səh.362-372; 402; Məmmədov Süleyman. Azərbaycan tarixi.(Ən qədim zamanlardan 2006-cı ilədək). Bakı: «Çaşıoğlu» nəşriyyatı, 2007, 392 s., səh. 167
[55] Kərimov K. Şəki (bələdçi). Bakı: Azərnəşr, 1969, 61 s., səh.7
[56] Ənvər Mete. O torpağın övladları. Bakı: Nulan, 2006, 608 s., şəkilli, səh.314
[57]Azərbaycan tarixi üzrə qaynaqlar. Bakı: «Çıraq» nəşriyyatı, 2007, 400 s., səh 237-238
[58]Şəki xanlığının tarixindən. Bakı: «Azərbaycan Ensiklopediyası» Nəşriyyat – Poliqrafiya Birliyi, 1993, 32 s., səh.12
[59] Həbibulla Manaflı. Öyünc və güvənc qaynağı. Bakı: Nurlan, 2007, 224 s., səh.42
[62]Şəki xanlığının tarixindən. Bakı: «Azərbaycan Ensiklopediyası» Nəşriyyat-Poliqrafiya Birliyi, 1993, 32 s., səh. 19; Azərbaycan tarixi. Dərslik. Bakı: Azərnəşr, 1994, 680 s., səh.524
[61] Məmmədov Süleyman. Azərbaycan tarixi. (Ən qədim zamanlardan 2006-cı ilədək). Bakı: «Çaşıoğlu» nəşriyatı, 2007, 392 s., səh. 191-192
[62]M.İsmayılov. Şəki. Bakı: Azərnəşr, 1981, 151 s., səh.23
[63]Rəşid bəy İsmayılov. Azərbaycan tarixi. Bakı: Azərnəşr, 1923, 163 s., səh.79
[64]Cavadova Z.Ə. Şimal-Qərbi Azərbaycan (tarixi-demoqrafik tədqiqat). Bakı: «Altay» nəşriyyatı, 1999, 106 s., səh.87; Ədalət Şərif oğlu Tahirzadə. Şəkinin tarixi qaynaqlarda. Bakı, «MASTER» nəşriyyatı, 2005, 256 s.
[65]Şəki xanlığının tarixindən. Bakı: «Azərbaycan Ensiklopediyası» Nəşriyyat-Poliqrafiya Birliyi, 1993, 32 s., səh. 17
[66] Azərbaycan tarixi. Dərslik. Bakı: Azərnəşr, 1994, 680 s., səh.530
69.Şəki xanlığının tarixindən. Bakı: «Azərbaycan Ensiklopediyası» Nəşriyyat-Poliqrafiya Birliyi, 1993, 32 s., səh. 19
[68]Azərbaycan tarixi. Dərslik. Bakı: Azərnəşr, 1994, 680 s., səh.570

[69] Azərbaycan tarixi. Yeddi cilddə, IV cild (XIX əsr). Bakı: Elm, 2000, 508 s.. səh. 19
[70]Azərbaycan tarixi. Dərslik. Bakı: Azərnəşr, 1994, 680 s., səh.572
[71] Azərbaycan tarixi üzrə qaynaqlar. Bakı, «Çıraq» nəşriyyatı, 2007, 400 s., 301-305; Трактат между Карабахским ханом Российской империей о переходе ханства под власть России от 14 мая 1805 года. Bakı: Şərq-Qərb, 1992; Azərbaycan tarixi. Yeddi cilddə, IV cild (XIX əsr). Bakı: Elm, 2000, 508 s., səh. 22
[72]Azərbaycan tarixi,7 cilddə, IV cild (XIX əsr). Bakı :Elm, 2000, 508 s.,səh. 22; Трактат между Карабахским ханом Российской империей о переходе ханства под власть России от 14 мая 1805 года. Bakı: Şərq-Qərb,1992
[73]Azərbaycan tarixi. Bakı: Azərnəşr, 1994, 680 s., səh. 573
[74] AKAK, T.II, dok. 1389, Тифлис, 1873
[75]Azərbaycan tarixi,7 cilddə, IV cild (XIX əsr). Bakı: Elm, 2000,508 s., səh. 26
[76]Azərbaycan bayraqları. Kataloq. Bakı: Elm, 2005, 88 s., səh.20
[77] Yenə orada, səh.20-21
[78] Yenə orada, səh.22-23
[79] Yenə orada, səh.24-25
[80]Cavadova Z.Ə. Şimal-Qərbi Azərbaycan (tarixi-demoqrafik tədqiqat). Bakı: «Altay» nəşriyyatı, 1999, 106 s., səh.76
[81] Yenə orada, səh.77
[82]Yenə orada, səh.44-45
[83] Azərbaycan tarixinə dair materiallar. Azərbaycan tarixi muzeyinin əsərləri. V cild. Bakı: Azərbaycan SSR Elmlər Akademiyası Nəşriyyatı, 1962, 219 s., səh.87-88
[84]Azərbaycan tarixi, 7 cilddə, IV cild (XIX əsr), Bakı, 2000, 508 s., səh.109; Cavadova Z.Ə. Şimal-Qərbi Azərbaycan (tarixi-demoqrafik tədqiqat). Bakı: «Altay» nəşriyyatı, 1999, 106 s., səh.85
[85] Yenə orada, səh.86
[86]Cavadova Z.Ə. Şimal-Qərbi Azərbaycan (tarixi-demoqrafik tədqiqat). Bakı: «Altay» nəşriyyatı, 1999, 106 s., səh.86-87; Həbibulla Manaflı. Öyünc və güvənc qaynağı. Bakı: Nurlan, 2007, 224 s., səh. 64.
[87] Yenə orada, səh.88
[88] Милман А.. Политической строй Азербайджана XIX –начале XX века. Баку, 1966; ASE, VII cild, Bakı, 1983, səh. 305
[89] Azərbaycan tarixi 7 cilddə, IV cild (XIX əsr). Bakı: Elm, 2000, 508 s.,səh. 69
[90] Закафказский календарь. Тифлис, 1913 г., стр.304
[91]Kərimov K. Şəki (bələdçi). Bakı: Azərnəşr, 1969, 61 s., səh.4
[92] Закафказский календарь. Тифлис, 1913 г., стр.304
[93] Bax: V.V.Linde. İpəkçiliyə dair dərslik. M.,1940, səh. 21
[94] Закафказский календар. Тифлис, 1913 г., стр.306
[95] Yenə orada
[96] «Kommunist» qəz.,1972, 9 may
[97] Обзор деятельности правительства за 1925 и 1926 гг. Баку, 1927, стр.165
[98] Azərbaycan Xalq Cümhuriyyəti Ensiklopediyası. İki cilddə, II cild, Bakı: «Lider nəşriyyat», 2005, 472 s., səh. 269-270;
[99] Шелковая промышленность Закафказья. //Вестник Закафказья, 1923, стр.84
[100] Zəkəriyyə Əlizadə, Nazim İbrahimov. Şəki ipəyi uzaq karvan yollarında. Bakı: «Master» nəşriyyatı, 2007, 244 s., səh.138-139
[101]M.İ.Əmrahov. XX əsrdə Azərbaycanda milli-azadlıq hərəkatı. Ali məktəblər üçün dərslik. Bakı: ADPU nəşriyyatı, 2009, 370 s., səh.193-194
[102] Bünyadov Z. Qırmızı terror. Bakı: Azərnəşr, 1993, 331 s., səh. 21-22

[103] Qasımlı M. Azerbaycan türklerinin milli müsadele tarihi.1920-1945. İstanbul, 2006, səh.412
[104] Azərbaycan Xalq Cümhuriyyəti Ensiklopediyası. İki cilddə, II cild, Bakı: «Lider nəşriy yat»,2005, 472 səh., səh. 230
[105]M.İ.Əmrahov. XX əsrdə Azərbaycanda milli-azadlıq hərəkatı. *Ali məktəblər üçün dərslik.* Bakı: ADPU nəşriyyatı, 2009, 370 s., səh.194
[106] Bax: Həbibulla Manaflı. Öyünc və güvənc qaynağı. Bakı: Nurlan, 2007, 224 s., səh. 141-171
[107]Qasımlı M. Azerbaycan türklerinin milli müsadele tarihi.1920-1945. İstanbul, 2006, səh.412
[108] Yenə orada
[109] Manaflı Həbibulla. Şəki üsyanı. Tarixi faktlar və həqiqətlər. Bakı: UniPrint, 2010,160 s.,səh.47
[110]Yenə orada, səh.65-69
[111] Azərbaycan Xalq Cümhuriyyəti Ensiklopediyası. İki cilddə, II cild, Bakı: «Lider nəşriyyat», 2005, 472 s., səh. 256-257;
[112] Yenə orada, səh. 257;
[113]M.İ.Əmrahov. XX əsrdə Azərbaycanda milli-azadlıq hərəkatı. Ali məktəblər üçün dərslik. Bakı: ADPU nəşriyyatı, 2009, 370 s., səh.194
[114] Manaflı Həbibulla. Şəki üsyanı. Tarixi faktlar və həqiqətlər. Bakı: UniPrint, 2010,160 s., səh.117-143
[115] Yenə orada, səh.121
[116] Bax: Nəzir Eltəkin. Qaçaq Abbas (poema). Bakı: Gənclik. 2001, 228 s.; yenə onun, Sarı Laçın. Bakı: Azərnəşr,1996, 56 s., səh.31-38
[117]M.İ.Əmrahov. XX əsrdə Azərbaycanda milli-azadlıq hərəkatı. *Ali məktəblər üçün dərslik.* Bakı: ADPU nəşriyyatı, 2009, 370 s. səh. 221-225; Ağ ləkələr silinir. Bakı, 1991, səh.8
[118] Hacıyev Nemət. Unudulmaz qəhrəmanlıq. Bakı: Gənclik, 1969, 80 s., səh. 68-69
[119]Провалинский М. Кавалеры солдатского ордена. Баку: Азербайджанское Государственное Издательства, 1975, стр. 25-27; ASE, III c., səh. 598
[120]Nuxa fəhləsi, 1943, 29 oktyabr
[121] Əfəndiyev S.T. Şəki Böyük Vətən müharibəsi illərində. Mingəçevir: Mingəçevir Poliqrafiya Müəssisəsi, 2010, 124 s., səh.16
[122]Hacıyev Nemət. Unudulmaz qəhrəmanlıq. Bakı: Gənclik, 1969, 80 s., səh.67
[123] Yenə orada, səh.68
[124] Они освобождали Молдавию, они штурмовали Берлин: (Воспоминания и очерки о 5-ой ударной армии) /Сост. Свиридов И.К. Марчук Ю.А/. Кишинев: Картя Молдовеняскэ, 1984, 194 с., (Библ. Серия МССР), стр. 133
[125] Hacıyev Nemət. Unudulmaz qəhrəmanlıq. Bakı: Gənclik, 1969, 80 s., səh.67
[126] «Nuxa fəhləsi» qəzeti, 1945, 16 mart
[127] Bax: Məmmədov S. Azərbaycanın şanlı qızları. Bakı: İşıq, 1988, 160 s., şəkili, səh.113
[128] Yenə orada, səh.33-34
[129]Yenə orada, səh.28
[130] Hacıyev Nemət. Unudulmaz qəhrəmanlıq. Bakı: Gənclik, 1969, 80 s., səh.72
[131] Əmrahov M. İkinci Dünya müharibəsi. Bakı: Mütərcim, 2010, 552 s., səh.386
[132] http://209.85.229.132/search?q=cache:Q4Ic1VNiy0oJ:press.az/news1_ru.php%3FId%3D91+воспоминания,+Ахмедия+Джебр аилов&hl=ru&ct=clnk&cd=10&gl=az; http://life.trend.az/
[133] «Бакинский рабочий» qəz.1997, 15 yanvar
[134] http://209.85.229.132/search?q=cache:Q4Ic1VNiy0oJ:press.az/news1_ru.php%3FId%3D91+воспоминания,+Ахмедия+Джебр аилов&hl=ru&ct=clnk&cd=10&gl=az; http://life.trend.az/
[135] Hacıyev Nemət. Unudulmaz qəhrəmanlıq. Bakı: Gənclik, 1969, 80 s., səh.74
[136] Nuxa fəhləsi, 1943, 24 noyabr
[137] Nuxa fəhləsi, 1943, 8 iyul
[138] Nuxa fəhləsi, 1943, 1 yanvar

